*Bu kitab “**Mirzə İbrahimov**. Seçilmiş əsərləri. Dörd cilddə. IV cild” (Bakı, Azərnəşr, 1972) və “**Mirzə İbrahimov**. Əsərləri. On cilddə. I, II cildlər” (Bakı, Yazıçı, 1978) nəşrləri əsasında təkrar nəşrə hazırlanmışdır*

Tərtib edəni və
ön sözün müəllifi: **Vaqif Yusifli**

**894.3613 - dc 21**
**AZE**
**İbrahimov Mirzə. Seçilmiş əsərləri.** İki cilddə. I cild. “Şərq-Qərb”, Bakı, 2005, 432 səh.

Xalq yazıçısı Mirzə İbrahimov Azərbaycanın sovet dövrü ədəbiyyatının beşiyi başında dayanan, onun zənginləşməsi yolunda istedad və əməyini əsirgəməyən, bütün varlığını, duyğu və düşüncəsinin var gücünü insan dühasının nailiyyətlərinə əsaslanaraq bədii təfəkkürün hüdudlarını genişləndirmək, sənətdə yeni yollar açmaq kimi nəcib və mürəkkəb vəzifənin şərəflə yerinə yetirilməsi işinə verən görkəmli sənətkarlarımızdandır.

“Seçilmiş əsərləri”nin bu cildində tanınmış ədibimizin, hər biri ayrılıqda özünə məxsus bədii ümumiləşdirmə xüsusiyyətlərinə, fabula və kompozisiya bitkinliyinə malik “Cənub hekayələri” (1946-1947) silsiləsindən bir neçə nümunə, “Həyatdan hekayələr” silsiləsindən ədəbiyyatımızın ən qüvvətli psixoloji hekayələri sırasında olan “Mədinənin ürəyi”, “Metamorfoza” və s., eləcə də “Çandranın üsyanı”, “Fırtına quşu”, “Güləbətin” və “Pərvizin həyatı” povestləri toplanmışdır.

Klassiklərimizin ölməz ənənələrini davam və inkişaf etdirərək Azərbaycan səhnəsinə “Həyat”, “Madrid” və “Məhəbbət” kimi orijinal əsərlər bəxş edən Mirzə İbrahimovun dramaturgiyası cilddə “Kəndçi qızı” pyesi ilə təmsil olunur.

**ISBN 9952-418-78-4**



Azərbaycan Respublikasının Prezidenti
İLHAM ƏLİYEVİN
**“Azərbaycan dilində latın qrafikası ilə kütləvi nəşrlərin həyata keçirilməsi haqqında”**
12 yanvar 2004-cü il tarixli sərəncamı ilə nəşr olunur və ölkə kitabxanalarına hədiyyə edilir



## ÖN SÖZ

Onun həyatı, doğrudan da, zəngin və çoxşaxəlidir. Fərəhsiz və faciəli keçən uşaqlıq illəri, qaynar gəncliyin oxumaq, öyrənmək ehtirası, fabrik-zavod təhsili, ədəbi mühitdə ilk addımlar və ilk sevinclər... və sonra həyat dərsləri – müxtəlif vəzifələr, partiya-sovet aparatında, ədəbiyyat-mədəniyyət sahəsində rəhbər mövqelər, bütün bunlarla bir sırada bir-birinin ardınca yazılan sənət əsərləri (pyeslər, romanlar, hekayələr, povestlər, elmi-tənqidi yazılar, publisistik əsərlər, xatirələr, memuarlar), dünyanın müxtəlif ölkələrinə səyahətlər, ictimai-siyasi fəaliyyət... ustad tənqidçi Məmməd Arifin təbirincə desək, görkəmli klassik və müasir yazıçılarımızın çoxu eyni zamanda ictimai xadim olmuşlar, onlar dövlət işi ilə yaradıcılığı bir-biri ilə uyuşdurmuşlar. Bu uyuşma yazıçıları xalqla, həyatla daha möhkəm bağlamış, onları müasirlik mövqeyindən uzaqlaşmağa qoymamışdır.

Mirzə İbrahimovun yaradıcılığından və ictimai fəaliyyətindən söz açan xalq yazıçısı İsmayıl Şıxlı yazırdı: “Mirzə İbrahimovun bir sənətkar və ictimai xadim kimi geniş əhatəli fəaliyyəti mənə fransız maarifçilərini xatırladır. O da ensiklopedistlər kimi, hər şeydən əvvəl, öz xalqına yeni söz demək, yeni fikir aşılamaq istəyir”.

Bir anlığa təsəvvür edək ki, son 75 ildə ədəbiyyatımızda nə “Həyat”, “Madrid”, “Kəndçi qızı” kimi pyeslər, nə “Cənub hekayələri”, nə “Fırtına quşu” povesti, nə “Gələcək gün”, “Böyük dayaq”, “Pərvanə” kimi romanlar, nə də “Böyük demokrat” kimi ehtirasla qələmə alınmış elmi-publisistik əsər var. O zaman ədəbiyyatımız, əlbəttə, Azərbaycan ədəbiyyatının sovet dövrü bu əsərlərsiz hardasa bir az yoxsul görünməzdimi! Bu əsərləri “zamanla səsləşən” əsərlər kimi də təhlil eləmək olar, maraqlı ədəbi nümunələr kimi də... Və bu əsərlər barədə yazılan saysız-hesabsız məqalələr, monoqrafiyalar, namizədlik və doktorluq dissertasiyaları belə bir həqiqəti təsdiq edir ki, son 75 ildə – ədəbiyyatımızın bütün mərhələlərində Mirzə İbrahimov realist bir sənətkar kimi öz sözünü deyib. İlk hekayələrində ölkəmizdə gedən ictimai-siyasi mübarizə və toqquşmaları, qadın azadlığı problemini, quruculuq işlərini əks etdirən gənc Mirzə İbrahimov çox tez bir zamanda həyatın, ədəbi mühitin ritmini, ahəngini tuta bilir. Naxçıvan MTS siyasi şöbəsinə – “Sürət” qəzetinə redaktor göndərilməsi, Ukrayna-Donbas şaxtalarına, Dnepropetrovsk sənaye müəssisələrinə ezam olunması gənc Mirzə İbrahimovu üzvü olduğu bolşe-

viklər partiyasının və sosializm ruhlu ədəbiyyatın fəal nümayəndələrindən birinə çevirir. Qeyd edək ki, marksizm-leninizm ideyalarına inam onu ömrünün axırında da tərk etməmişdi. Son illəri o belə fikirləşirdi ki, ölkənin, respublikanın bu ağır vəziyyəti partiyanın günahı üzündən olmayıb, bu, partiya sıralarındakı bürokratiyanın, rüşvətxorlar dəstəsinin, bacarıqsız, savadsız, nadan kommunistlərin əməlləridir.

* * *

Mirzə İbrahimov şəxsiyyət idi. Azərbaycan ziyalılığını təmsil edən böyük şəxsiyyət ona qiymət verərkən hansı partiyanın üzvü olduğunu, hansı böyük vəzifələrdə işlədiyini yox, yalnız Böyük insanlığını və şəxsiyyətini göz önünə gətirmək lazımdır.

O, çox təmkinli şəxsiyyət idi. Ömrünün müdriklik çağlarından dönüb arxaya boylananda bəlkə nəyəsə təəssüflənməyi olub – hansı əsərinisə tamamlamayıb, hansı işisə yarımçıq qoyub, amma heç vaxt özünə xas olan təmkinini pozmayıb. Həmişə çalışıb ki, tərəflər arasında sülh yaratsın, humanizm, barışdırıcı mövqe onun ictimai fəaliyyətinin başlıca xüsusiyyətlərindən biri idi. Amma yeri gələndə həmin təmkin müdrikliklə qoşa addımlayıbdı.

Təmkin və soyuqqanlılıq hətta ən gərgin və dramatik anlarda da onun xasiyyətini tərk etmədi. Neçə dəfə yaradıcılıq müzakirələrində tribunaya qalxıb sakitcə, qızışan tərəflərin odunu necə söndürməyini öz gözlərimlə görmüşəm. Hətta ona söz atıblar, kürsüdən aşağı düşsün deyə çəpik çalıblar, amma o, təmkinini pozmayıb. Bu təmkin və soyuqqanlılığa necə heyrət etməyəsən ki, uzaq Nikoziyada, Hilton otelində Asiya və Afrika ölkələri ilə Sovet həmrəyliyi komitəsinin sədri kimi tribunaya qalxanda bir qrup terrorçu iclas zalına daxil oldu və onun gözləri qarşısında Yusif əs Səbaini güllələdilər, üç gün müddətində bütün nümayəndə heyəti girov saxlanıldı.

Mirzə İbrahimov 1932-ci ildən partiya və hökumətin sınanmış adamı kimi böyük vəzifələrə irəli çəkildi. Bütün bu illər ərzində Mirzə İbrahimov xalqın və inandığı ideyaların qulluğunda dayandı. Dəyişən onun vəzifələri olub (Opera və Balet Teatrının direktoru, XKS yanında İncəsənət İşləri İdarəsinin rəisi, Maarif naziri, Nazirlər Sovetinin sədr müavini, Azərbaycan SSR Ali Soveti Rəyasət Heyətinin sədri, Asiya və Afrika ölkələri ilə Sovet Həmrəylik Komitəsinin sədri), şəxsiyyəti, insanlığı və ziyalılığı isə sabit qalıb, dəyişməyib. Həmişə fikirləşmişəm ki, görəsən böyük vəzifələrdə olanda Mirzə İbrahimovun öz insanlığını, xeyirxahlığını, humanizmini itirməməsinə

səbəb nə olub? Xüsusilə, 37-ci il hadisələrinə biz yenidən qiymət veririk, sənədlər canlı şahid kimi çox ağsaqqalın qalın paxırını üzə çıxarır, görəsən, o dövrdə Mirzə müəllim öz təmkinini itiribmi? Vaxtilə "Azərbaycan" jurnalında xalq artisti Fatma Qədrinin xatirələri çap olunmuşdu. O yazının bir yerində Fatma Qədri yazırdı ki, 37-ci ildə məni işdən çıxardılar, heç kim qorxusundan salamımı almırdı. Hansı tanışıma, dostuma rast gəlirdimsə, üzünü yana çevirirdi. Ancaq bir gün küçədə Mirzə İbrahimovla rastlaşdım. O, məni yanına çağırdı, halımı soruşdu, vəziyyətimi öyrənəndən sonra kömək əlini uzatdı, beləliklə, Dram Teatrına qayıtdım.

Başqa bir misal. Tərcüməçi-şair Səyavuş Məmmədzadə deyir ki, 42-ci ildə, rayonların birində müəllim işləyən atamı nahaqdan ilişdirib tutmaq istəyirdilər. Bəzi yoldaşları üzünə durub onu sovet quruluşuna böhtan atmaqda, zərərli ideyalar yaymaqda təqsirləndirirdilər. Atam o zaman böyük vəzifədə işləyən Mirzə İbrahimova məktub yazır, günahı olmadığını inandırıcı dəlillərlə açıb göstərir. Həmin məktuba görə Mirzə müəllim atamın işlədiyi rayona gəlir və kişinin doğrudan da böhtana düşdüyünün şahidi olur, buna görə maarif şöbə müdirinin abrını alır, "özünüz işləmirsiniz, namuslu adamları isə dolaşdırırsınız" deyir. Atam tutula da bilərdi və yeddi yaşından onun üzünü heç görməzdim də. Ömrü boyu atam Mirzə müəllimin bu xeyirxahlığını mənə xatırladıb və həmişə də tapşırıb ki, bax, o kişinin sözündən çıxma. Necə oldusa, bir dəfə Mirzə müəllimlə söhbətimdə həmin əhvalatdan söz saldım. Lakin nə qədər çalışdısa, heç cür xatırlaya bilmədi.

Amma mənimlə – bu sətirlərin müəllifiylə söhbətində Mirzə İbrahimov həmin illəri xatırlayıb dedi: "Təkcə Fatma Qədriyə yox, başqalarına da kömək eləmişəm. Bir dəfə Mirzəağa Əliyev yanıma gəldi. Gördüm ki, çox pərişandır. Dedi ki, ay Mirzə, məni işdən çıxardıblar, hansı bir səyyar teatra isə göndərmək istəyirlər. Özü də "xalq düşməni" adı ilə...

Mirzəağa Əliyev barədə lazımi idarələrlə danışdım, onun böyük aktyor olduğunu, Azərbaycan səhnəsinin bir də ona bənzər komik yetirməyəcəyini söylədim və deyəsən, inandılar mənə. Möhsün Sənaninin başına da belə bir oyun açmışdılar. Bir gün Gəncədə, "Sərdar bağı"nda gəzəndə İran konsulu girib qoluna. Dərhal DTK-ya xəbər çatıb. Gəldi yanıma. Kömək əlimi uzatdım.

Səməd Vurğun barədə o zaman çox söz-söhbət gedirdi. Bağırov öz kabinetində bir dəfə ona əl uzatmadı, dedi ki, get, sənin əllərin qanlıdı. Və o da yadımdadır ki, Bağırov sonra məni çağırıb Səməd haqqında soruşdu. "Səməd Vurğun böyük şairdir, onun haqqında hər şayiəyə inanmayın" dedim. Cəllad mənə baxmadan: "Axı, onun haqqında podvalda yatanlar donos veriblər:

"İnanmayın! Səməd elə bir istedaddır ki, Azərbaycan xalqı bir də bu nəhənglikdə sənətkar yetirməz" – dedim".

O zaman mən Mirzə İbrahimova belə bir sual verdim: "Mirzə müəllim, indi arxivləri qaldırır, bir-bir sənədlərə baxır və xalqın gözündə mələk görünənlərin bir çoxunun paxırları açılır. Bu baxımdan özünüzü rahat hiss edirsinizmi?".

Mirzə İbrahimov dedi: "İnsan dünyaya bir dəfə gəlir. Mən özümü bu barədə tam arxayın hiss edirəm. Heç bir sənəddə mənim imzama rast gəlməzsiniz. Buna görə xalqın gözünə dik baxıram".

...Mirzə İbrahimovla həmin o bağ söhbətində Qanlı Yanvar hadisələri zamanı bir əhvalatı da xatırladım. Dedim ki, Mirzə müəllim, o zaman Azərbaycan yazıçılarının bir çoxu partiya biletlərindən imtina etdilər. Sizə də zəng edib partiya biletini atıb-atmayacağınızı soruşdular, siz "yox" dediniz.

Mirzə İbrahimov təsdiq elədi ki, doğru deyirsən. Bilirsənmi, heç bir partiya havadan yaranmır, müəyyən ictimai zərurətdən meydana gəlir. O cümlədən, kommunist partiyası. Onun proqramı var, nizamnaməsi var. Lakin partiya sıralarında çoxlu karyeristlər, vicdansızlar, rüşvətxorlar, xalqın qanını içənlər var. Yadında saxla, partiya rəhbərliyində çox zaman namuslu adamlar həlledici rol oynamayıblar. Əksər vəzifəli adamlar bir məqsədlə o vəzifəyə gəliblər: rüşvət alsınlar, kapital toplasınlar. Mənim Seyid Hüseyn haqqında yazdığım bir məqaləni oxu. Orada mən S.Hüseynin "Daxiliyyə naziri" hekayəsi ilə Çexovun "Kameleon" hekayəsi arasında bir yaxınlıq olduğunu göstərirəm. Müəllim nazirə deyir ki, yüz yaşında pristav da, qubernator da rüşvət alır. Nazir isə cavab verir ki, burada qeyri-adi bir şey yoxdur, xariqüladə olardı ki, deyərdin qubernator rüşvət almır. Bütün milli bəlalarımızın kökü rüşvətlə bağlıdır.

Məncə, Mirzə İbrahimovun necə bir şəxsiyyət olduğu, əqidəsindən, məramından dönməməsi yetərincə təsdiq olundu.

* * *

Mirzə İbrahimovun uşaqlıq və gənclik illəri barədə heç bir kitabda lazımi və dolğun məlumat yoxdur. Heç kəs bunu Mirzə müəllimdən soruşmayıb və Mirzə müəllimin özü də bu barədə heç yerdə yazmayıb.

Həmin o bağ söhbətində bu avtobioqrafik boşluğu doldurmağa çalışdım. Belə bir sual verdim ona: ağsaqqal yazıçı Mirzə İbrahimov balaca Mirzə Əjdər oğlunu necə xatırlayır?

Sonra başladım Mirzə müəllimin verdiyi cavabları öz dilimdən vərəqlərə düzməyə...

...Bir anda 80 yaşlı ağsaqqal bir kişi gözlərim önündə 3-4 yaşlı balaca, sısqa bir uşağa döndü. Nəzərimdə Cənubi Azərbaycanın Evə kəndinin bir-birinə oxşayan, öz yoxsul görkəmi ilə seçilməyən, çiy kərpicdən tikilən balaca evləri, komaları canlandı... Zəhra ana kiçik Mirzənin başını dizləri üstə qoyub ona nağıl danışır. O balaca, çəlimsiz uşaq nağılın şirinliyini canına sindirir. Bu nağıllar o balaca uşağın xəyalına, yaddaşına əbədi həkk olacaq və ömrü boyu o nağıllarla həyat arasında bir uyarlıq arayacaq. Evlərinin qabağından kiçik bir çay da axırdı və balaca Mirzə bütün günü o çayın necə axmasına tamaşa edirdi. Vay onda ki, yaz ola, o balaca çay az qala nəhrə dönür. Mirzəgilin evini, həyətlərini az qala qabağına qatıb aparırmış.

Əjdər kişi hər gün əkindən, biçindən yorğun-arğın qayıdır, oğlanları Rzanın, Mirzənin üzünə gücsüz halda gülümsəyib içəri keçər, Zəhra ana kişinin qabağına çay-çörək qoyar, hamılıqla şam edərdilər. Sonra isə yoxsul güzəranlarından giley-güzar, ev, kənd söhbətləri və daş kimi dərin bir yuxu. Amma balaca Mirzəni uzun müddət yuxu aparmazdı. Anasının söylədiyi nağıllar, əfsanələr, bayatılar rahat buraxmazdı onu, səhəri gözləyərdi. Günlər keçir və balaca Mirzə o nağılların, əfsanələrin təsiriylə özü nağıllar, əfsanələr uydurardı.

Yeddi yaşını yaş kimi yox, ölüb bu dünyaya təzədən gəlmək kimi xatırlayır. O il Evə kəndinə dəhşətli aclıq düçar olur.

...Mirzə qonşularındakı o xeyirxah, nəcib qadını da (heyif, adını unudub) uzun müddət unutmayacaq. Sonralar, şöhrətli çağlarında yolu Cənubi Azərbaycana düşəcək, amma o dəhşətli faciəni unuda bilmədiyi üçün bir daha doğulduğu kəndə ayaq basmayacaq. Həmin qonşu qadının əri aclıqdan bir il əvvəl Bakıya – neft mədənlərinə fəhləliyə getmişdi, amma nə üçünsə ondan xəbər-ətər yox idi. Həmişə Novruz bayramı olanda Mirzəyə noğul, nabat, qırmızı yumurta gətirən o xeyirxah, gülərüzlü qadın dəhşətli aclığa tab gətirmir, deyirlər ki, 2-3 aylıq uşağını yeyir.

Allaha, müsəlmanlığa, şəriətə, Qurana zidd hərəkət idi bu və balaca Mirzə öz gözləriylə görür ki, kənd camaatı o arvadı daşqalaq edir, üzünə tüpürür, söyür, qovur. Saçları çiyinlərinə tökülən o qadın heç kimdən imdad diləmir, beləcə daşa, ağaca, söyüşə tab gətirə-gətirə ayaq üstə ölür. Bircə Əjdər kişi və balaca oğlanları bu axına qoşulmurlar. Mirzə onu da xatırlayır ki, atasının saqqalından üzü aşağı göz yaşları axır...

O dəhşətli ildə Mirzənin anası da aclığa tab gətirmir. Oğluna söyləyəcəyi nağılları, əfsanələri, bayatıları da özü ilə aparır. Mirzə kiçik bacısının da ölü-

münü gözləri ilə görür (O, hələ neçə əzizini beləcə göz yaşları ilə yola salacaq).

Əjdər kişi iki oğlunu götürüb Bakıya gələcək, soraqlaşa-soraqlaşa Mirzənin dayısını axtaracaqlar.

Bakı elə o vaxtlar da gur şəhər idi. Mirzə Balaxanı, Suraxanı, Sabunçu neft mədənlərini, daş döşənmiş küçələri, fəhlələrin işdən sonrakı yorğun-arğın görkəmini, Bakıya çörək pulu qazanmağa axışan həmyerlilərini təfərrüatına kimi xatırlayır. Onu da xatırlayır ki, özündən 2 yaş böyük qardaşı Rza, sonra da atası gözlərinin qabağında necə can verdilər. Tək qaldı, yetim qaldı Mirzə.

Bir dəfə Z.Q.Filiştinskaya adlı bir tənqidçi (o, "Gələcək gün" romanı haqqında "Novıy mir"də çıxış etmişdi) Mirzə İbrahimova deyir ki, həyatınızdan mənə söz açın. Mirzə müəllim həmin bu kədərli hadisələri nəql edir. Filiştinskaya deyir ki, görünür, hamısından üzü bərk siz çıxmısınız. Mirzə müəllim də cavabında belə deyir: "Elə mən özüm də sağ qalmağıma bir möcüzə kimi baxıram".

Atasının ölümündən az sonra dayısı Mirzəni tapır. O, tək yaşayırdı. Mantaşevin mədənlərində dartayçı işləyirdi. Zabrata gedən yolda bir fəhlə kazarması vardı, orada yaşayırdı. Səhər saat 6-da işə yollanır, bir də axşam 7-də qayıdırdı.

Dayısının işlədiyi mədəndə bir usta Qiyas vardı, dartayçıların böyüyüydü. Bir gün Mirzəni görüb dayısına deyir ki, ver bu uşağı mənə, evdə-eşikdə işlədim. Dayısı razılaşır. Mirzə Qiyasgildə hər gün həyəti süpürür, ovdandan su gətirir, bir də toyuq-cücəyə baxırdı. Onların həyəti çox da böyük deyildi, hasara almışdılar. Arvadı bütün günü qonşularda olardı, həyətdən çıxanda Mirzəyə tapşırırdı ki, bax, qapını açmayasan ha, toyuqlar qaçar küçəyə, oğru çoxdur. Götürüb apararlar.

Bir gün hasarın üstündən bir oğlan uşağı Mirzəni çilingağac oynamağa çağırır. Mirzə arvadın tapşırığını unudub küçəyə çıxır. Axşam Qiyas evə qayıdanda bir şivən qoparır ki, gəl görəsən. Sən demə, oğrular toyuqları aparıblarmış. Qiyas istəyir Mirzəni döysün. Mirzə qaçır dayısının yanına.

Çox sonralar Mirzə İbrahimov Qorkinin "Özgə qapılarında" əsərini oxuyub için-için göynəyəcək, öz taleyi ilə Peşkovun taleyi arasında bir doğmalıq hiss edəcək.

Dayısı bir müddət yanında saxlayandan sonra Mirzəni Zabrata aparacaq, Yunis bəyin arvadı Fatmanisəyə tapşıracaq. Yunis bəy rəhmətə getmişdi və adı bəy olsa da, bu ikimərtəbəli evdə arvadı Fatmanisənin, yeganə oğlunun, bir-birindən gözəl, amma ərə getməyən qızlarının davranışında bəylik-

xanımlıq ədası hiss olunmurdu. Yenə də eyni işlər, eyni buyuruqlar. Amma Fatmanisənin qızları Qiyasın arvadından fərqli olaraq çox mehriban idilər. Mirzəni ailənin bir üzvü kimi yeməyə çağırırdılar.

Mirzənin ilk müəllimi də dayısı olub. "Quran"ı öyrədib, əməlli-başlı oxuduğunu görüb əllərini göyə qaldırıb: "Xudaya, kəréminə min şükür!". Dayısı Allah adamı idi, heç vaxt etiqadından dönməzdi. Əgər Mirzə təsadüfən küçədə bir abbası tapsaydı, dayısı deyərdi ki, sən də qoy dilənçinin ovcuna, ya da apar məscidə. Ağlı kəsəndə Mirzəyə üç şeydən çəkinməyi dönə-dönə tapşırardı: birincisi – qumar oynama, içki içmə, ikincisi – papiros çəkmə, üçüncüsü – həyasız arvadlardan özünü gözlə.

20-ci illərin əvvəllərində, sovetləşmədən sonra dayısına ev verirlər, o da Mirzəni özgə qapılarından birdəfəlik xilas edir. Dayısı onu Sabunçuda açılan ilk sovet məktəbinə gətirir.

Dayısı evlənmişdi və buna görə də Mirzə bu ailəyə ağır yük olmamaq üçün dərsdən sonra, Sabunçu vağzalında su satırdı. Tək deyildi, özü kimi yetim uşaqlara qoşulmuşdu. Həmişə çalışırdı ki, ona dərs deyən müəllimlərinin gözünə görünməsin, necə oldusa İbrahimov familiyalı bir müəllim onu görür: "Gəl səni fabrik-zavod məktəbinə düzəldim, 4 saat oxuyub 4 saat işləyəcəksən, işləməyinə görə də pul alacaqsan". Dayısı onu həmin məktəbə gətirir, amma boyu bir neçə sm çatmadığı üçün birinci il qəbul eləmirlər. Amma ikinci il arzusuna çatır və Mirzə həvəslə Balaxanıdakı bu məktəbdə təhsilini davam etdirir. Fabrik-zavod məktəbi Mirzənin həyat məktəbinə çevrilir, ilk universiteti kimi gələcək yollarına işıq saçır.

Fabrik-zavod məktəbini bitirdikdən sonra Mirzə mədəndə usta köməkçisi işləyir, sonra Neft Sənaye Texnikumuna daxil olur. Yaxşı oxuyurdu, hətta riyaziyyata böyük həvəsi vardı. Xatırlayır ki, bir dəfə beş misalı hamıdan tez həll elədiyinə görə İbrahimov familiyalı müəllim ona loqarifma cədvəlini bağışlayır. 30-cu ildə Mirzə İbrahimov texnikumu da bitirir, bu zaman partiyanın da üzvü idi, qüvvəsini, enerjisini sərf etməyə imkan və yer axtarırdı. Və sonralar bu imkan yaranacaq. Mirzə İbrahimovu müxtəlif vəzifələrə irəli çəkəcəklər... Lakin o, hansı vəzifədə olursa olsun, yazıçı kimi, sənət adamı kimi tanınacaq. 50-ci illərdə Azərbaycan SSR Ali Soveti Rəyasət Heyətinin sədri işləyəndə Azərbaycan dilinin bütün idarə və müəssisələrdə dövlət dili kimi işlədilməsi barədə məsələ qaldıracaq, buna görə də Kremldə oturanların xoşuna gəlməyəcək, o dövrdə "millətçi" kimi xoşagəlməz bir ada "layiq görüləcək".

* * *

Neft Sənaye Texnikumunun tələbəsi Mirzə eşitmişdi ki, Seyid Hüseyn adlı məşhur bir yazıçı tez-tez Zabrata, Sabunçuya gəlib ədəbiyyat həvəskarları ilə görüşür, onların şeir və hekayələrini dinləyir, dəyərli məsləhətlər verir. Mirzə də fəhlə ədəbiyyat dərnəyinə üzv yazılır. Burada Seyid Hüseynin ədəbiyyat haqqında söhbətlərinə qulaq asır, utana-utana ilk hekayələrini ("Zəhra", "Mələk") ustada oxuyur. Seyid Hüseynin köməyi ilə həmin hekayələr dövri mətbuatda da çap olunur.

* * *

Mirzə İbrahimov bütün yaradıcılığı və şəxsiyyəti ilə XX əsr Azərbaycanını təmsil edir. Əgər XX əsr Azərbaycanın mənəvi-əxlaqi, sosial-siyasi mənzərəsi haqqında dolğun təsəvvür əldə etmək istəyiriksə, Mirzə İbrahimovun da yaradıcılığından çoxlu öyrənməliyik. Azərbaycanın şimalı və cənubunda baş verən bütün olaylar (XIX və XX əsrdə) M.İbrahimovun əsərlərində tarixi əsərlərdən daha dolğundur. "Gələcək gün" romanı Azərbaycan sovet ədəbiyyatının yox, ümumən Azərbaycan milli-mənəvi fikrinin gerçəkliyini ifadə edir. "O gün gələcək" – bu şüar deyildi, bütöv Azərbaycan arzusunun ifadəsi idi.

Qətiyyətlə demək olar ki, poeziyada Süleyman Rüstəm, nəsrdə Mirzə İbrahimov Azərbaycanın birliyi ideyasını hər iki Azərbaycan müstəqil olmayanda irəli sürmüşdülər. Şeirlə, nəsr əsərləri ilə. İndi Şimali Azərbaycan müstəqildir, azaddır. Lakin bütövlük ideyası hələ yaşayır.

"Cənub hekayələri" və "Gələcək gün" Mirzə İbrahimovun şah əsərlərindəndir. Bu günün özündə də o əsərlər öz vətənpərvərlik missiyasını uğurla yerinə yetirirlər.

* * *

Mirzə İbrahimovun "Pərvanə" romanı klassik Azərbaycan romanının ən möhtəşəm nümunələrindən biri və bəlkə də sonuncusudur. 1887-ci ildə Zeynalovun Marağalının "İbrahimbəyin səyahətnaməsi" romanı ilə başlayan epik nəsr ənənəsini Mirzə İbrahimov "Gələcək gün", "Böyük dayaq" və "Pərvanə" romanlarında davam etdirdi. "Gələcək gün" neçə nəsli azərbaycançılıq ruhunda tərbiyə etdi, "Böyük dayaq" xalq və şəxsiyyət probleminin bədii həllini verdi, "Pərvanə" Azərbaycan xalqının sinfi-siyasi, mədəni-əxlaqi mənzərəsini, mənəvi intibahını əks etdirdi.

Mirzə İbrahimov bu əsərlərdə əsil realist kimi çıxış edir. Həyatı, insanları necə təsvir etməyi “Gələcək gün”dən, “Böyük dayaq”dan, “Pərvanə”dən öyrənmək olar və lazımdır.

Obrazı bütöv, bütün mənəvi dünyası ilə əks etdirməyin də böyük ustası idi Mirzə İbrahimov.

Azərbaycan dilinin həm rəsmi, həm də bədii incəliklərini öyrənməyə gələndə də ilk müəllimlərdən biri Mirzə İbrahimov olacaq.

Mirzə İbrahimovun heç bir əsərini kənara qoyub onu “sovet dövrünün ideologiyasını əks etdirən” əsər kimi qiymətləndirmək yanlışlıq olardı.

Bəli, Mirzə İbrahimov sovet yazıçısı idi, amma bu sovet yazıçısı Azərbaycan dilinin saflığı uğrunda mübarizə aparırdı, onun rəsmi dövlət dili olmasına can atırdı, bunun üçün vəzifəsini itirəcəyindən qorxmurdu. Sovet yazıçısı Mirzə İbrahimov həm də (həm də yox, lap elə özəl) böyük Azərbaycan yazıçısı idi. O, Azərbaycan xalqının yetirdiyi dahilərlə fəxr edirdi. Ədəbi-elmi yaradıcılığı başdan-ayağa bu ədəbiyyatın təbliğinə həsr olunmuşdu.

Mirzə İbrahimov çox ölkələr gəzib-dolaşdı, Hindistanın Cəvahirləl-Nehru mükafatını aldı, dünyada baş verən ictimai-siyasi olaylarından yazdı, Xosrov Ruzbehin həyatını qələmə aldı. Çandranın üsyanına səs verdi. Lakin onun bütün yaradıcılığı Azərbaycanla bağlı idi.

Mirzə İbrahimov bütün janrlarda yazıb-yaratdı və heç bir janrda bədii söz ustası kimi kəsəri azalmadı. “Həyat”, “Madrid”, “Məhəbbət”, “Kəndçi qızı”, “Közərən ocaqlar” Azərbaycan teatrlarının bəzəyi oldu.

Mirzə İbrahimov akademik idi. Və onun akademikliyi Azərbaycan ədəbi-nəzəri fikrinin uğurlarını, yetişdiyi yüksək inkişaf mərhələsini əks etdirirdi. Və nəhayət, Mirzə İbrahimov böyük şəxsiyyət idi. İndi belə universal insanlar nadir hallarda yetişir.

***Vaqif Yusifli***

## AZAD

Həyatın qəribə sirləri vardır. Mən həmişə o hadisəni xatırlarkən, hələ mənasını dərk etmədiyimiz sirlər həyatda çox-çoxdur, deyə düşünürəm... Mən sirr deyərkən təbiətin kəşf olunmamış gizli qüvvələrinə işarə etmirəm. Bizim gündəlik, adi həyatımızda baş verən yüzlər və minlərlə hadisə bizə çox zaman sadə və təbii görünür. Onlarda gizli bir məna axtarmaq da adamın fikrinə gəlmir. Lakin dərindən nəzər saldıqda biz bu adi və məlum hadisələrdə nə böyük sirlər, nə böyük mənalar tapırıq!

Azad mənim uşaqlıq və gənclik yoldaşım idi... Bir həyətdə doğulmuş, bir həyətdə böyüyüb məktəbə getmişdik... Gəncliyimizin də böyük bir qismini bir yerdə keçirmişdik. Uşaqlıqda bir-birimizlə yaxşı oynadığımız kimi, dalaşdığımız zamanlar da olmuşdu. Lakin belə hallar çox tez unudulmuşdu. Çünki biz bir evin uşağı kimi tərbiyə almış və bir-birimizə doğma qardaşdan artıq ünsiyyət bağlamışdıq... İkimiz də təqribən eyni şəraitdə yaşadığımız üçün bir-birimizin xasiyyətini çox gözəl bilirdik. Onun sakit və lal-dinməzliyi mənim nəzərimdə təbii bir şeydi... Mən bunda heç bir pis məna görməzdim. Lakin böyüdükcə onun bu xasiyyəti mənim acığıma gəlməyə başlayırdı. Hərdənbir qızışanda:

– Azad, bir hərəkətə gəl, de, danış, gül, ağla, – deyə yaxasından tuturdum. – Ölü kimi oturub gözlərini yumursan... Söz danışan da bilmir ki, sözü sənin acığına gəlir, yoxsa xoşuna... Dediyindən razısan, ya narazı... Dirisənsə bir diriliyini bildir, ay rəhmətlik oğlu!

Mənim bu cür məzəmmətim də ona təsir etməzdi. Kirpiklərini qaldırıb qaşlarının altından mənə baxar, yenə də gözlərini yumar, ya da məchul bir nöqtəyə dikib durardı.

Çox qəribədir ki, bu xasiyyət onda lap uşaqlıqdan qalma bir xasiyyət idi. Mənə elə gələrdi ki, Azad, ana bətnindən lüt-ətcə bu soyuq dünyaya (o, qışda doğulmuşdu) qədəm qoyduğu zaman belə səsini çıxarmamışdır. Bütün doğulanlar bir səs çıxardıqları halda o elə beləcə

lal-dinməz dünyaya gəlmişdir... Qışın soyuğu da onu dilləndirə bilməmişdir... Hətta bir dəfə yarızarafat, yarıgerçək anası Səlimə xanımdan, doğulanda onun ağlayıb ağlamadığını soruşmuşdum... Arvad gülümsəyərək əli ilə onun başını sığallamış və cavab verməmişdi.

Yoldaşlar arasında çox vaxt onu adı ilə çağırmazdılar. Sükuti deyib durardılar... Hətta sonradan tanış olanlar adının Azad olduğunu da bilməzdilər. Sükuti gəldi, Sükuti getdi deyərdilər. Bu təsadüfi sözü də sonralar o özü üçün sicilli seçmişdi: Azad Sükuti!..

Bəzən mənə elə gələrdi ki, onun üzündəki bulud, keçirdiyi ağır günlərin qubarıdır. Axı, o, dünyaya gəldiyi zamandan xoş bir gün görməmişdi... Aclıq, ehtiyac, soyuq otaq, torpaq döşəməyə salınmış yırtıq həsir, – gözünü açdığı gündən gördüyü bu idi. Azad, doğulmamışdan iki ay əvvəl atası ölmüşdü... Anası Səlimə xanım evdə tək qalmışdı... Çünki o da yetim idi, əri də... Təbrizlilər demişkən ikisi də lat-lütün biri idi. Kişinin ölümündən sonra arvad qapılara düşüb iş axtarmağa məcbur olmuşdu. Birinin ev-eşiyini təmizlər, birinin paltarını yuyar, birinə yun çırpardı... Azadı da elə şəhərin ərbablarından birinin evində yun çırpan yerdə doğmuşdu... Uşaq olandan sonra o bir həftə belə yorğan-döşəkdə rahat yata bilməmişdi. Acından ölməmək üçün dördgünlük uşağı bələyə büküb yenə qapılara düşmüşdü. Bu qayda ilə bir qarın ac, bir qarın tox o, Azadı böyütmüşdü... Dünyada yeganə ümidi və həyatının məqsədi o idi... Ondan əziz, ondan mehriban bir şeyi yox idi. Səlimə xanım Azadı yalnız bir oğul kimi yox, həm də dünyada bir pənah, bir qohum, bir ata, bir qardaş kimi istəyirdi. Azada baxdıqca, bütün bu nakam hisslər onun ürəyində baş qaldırırdı.

Yaxşıca yadımdadır... Bizim beş-altı yaşımız olanda hər axşam Səlimə xanım yatmamışdan qabaq bizə nağıl danışardı... Onun nağıllarına qulaq asa-asa bizi yuxu aparardı... Sabah nağılın mabədini soruşardıq... O yenə başdan başlayardı... Yenə bizi yuxu aparardı. Hər axşam o məni qucağına alıb divarın o üzündəki anama verərdi. Onun nağılları hərdən bir xəyal kimi, bir yuxu kimi yadıma düşür. Ayırd edə bilmirəm. Bir nağıldakı hadisəni o birisilə qarışdırıram... Amma yenə də bu xatirə mənə çox şirin və xoş görünür... Ara-sıra Səlimə xanım nağılı kəsər, bizə layla deyə-deyə həzindən oxuyardı... Aman, dostum... Bu səs bizə nə qədər mehriban görünərdi!.. Onun nəvazişkar, munis və ahənglə dolu mahnıları indi də harada isə qəlbimin dərinlərində səslənməkdədir... İndiyə qədər heç bir musiqi, heç bir mahnı

onlar qədər ruhumu oxşamamışdır. Mənə elə gəlir ki, o xəyalat dünyasında aldığım bir ləzzət imiş ki, təkrarı heç bir zaman mümkün olmayacaqdır...

Bəzən də o, nağıl yerinə bizə anlaşılmaz görünən sözlər söylərdi. Mən onun gah şikayətləndiyini, qarğışlar yağdırdığını, gah da kimə isə yalvardığını eşidərdim... Lakin o, bütün bunları oxuya-oxuya, mahnılar içində əridə-əridə axar çay şırıltısını andıran bir musiqi yaradardı... Xəyalımızı onun sözləri yox, hara isə uzanıb gedən həzin və ahəngdar səsi çəkib aparardı... Biz nə zaman yuxuya getdiyimizi bilməzdik. Bir dəfə adi payız axşamlarından birində o bizim başımızı dizi üstə alaraq yenə həzin-həzin oxuyur, söylənir, mahnılar deyirdi... Yarpağı tökülmüş ağaclardan, qərib və yuvasız quşlardan, arxlara dolmuş xəzəllərdən danışır, tez-tez Azadın adını çəkir, gah da əyilib üzündən öpürdü... Mən yuxuda getdikcə onun uzaqlardan gələn səsini eşidirdim. Qulağıma kəsik-kəsik sözlər gəlirdi... Tək balam, yuvamın quşu balam.. Yurdumun daşı balam... Azad isə sakit-sakit yuxulayırdı. Böyüyüb ağlım bir şey kəsəndə mən Azadın Səlimə xanım üçün doğrudan da həyatda yeganə ümid olduğunu anladım... Yox, mən bundan da artıq bir şey anladım. Mən anladım ki, bu yazıq arvadın bütün həyat telləri Azadın varlığına bağlıdır. Bunu anladıqdan sonra da təəssüf etməyə başladım. Azadla Səlimənin arzu və ümid etdiyi bir həyatı quracaq qabiliyyət görmürdüm... Qaradinməz Azad bədbəxt bir ananın ayağını qapılardan kəsib ona bir tikə çörək və bir isti ocaq düzəldə biləcəkmidir, deyə düşündükdə, fikrimdə “yox” qərarına gəlirdim... Məncə, həyat girdabında Azad əl-qol açacaq qüvvəyə malik deyildi... Ondan yüz dəfə zirəklərini ac və susuz qoyan əjdahalarını görür və Səlimə xanımın halına qəlbən yanırdım. Azadı udacaqdılar... Diri-diri yeyəcəkdilər... Onun meydandan çıxması üçün uzaqlara demirəm, bircə gün Təbriz bazarına gedib qolunun üstə iki corab alması kifayət idi... Mənim Azadda tapdığım keyfiyyət bu idi... Mən onda başqa bir keyfiyyət, başqa bir məna axtarmazdım...

İki il o mənimlə bir yerdə məktəbə getdi... Orada da o heç kəsə qoşulmaz, tənəffüslərdə bütün uşaqlar bir-birilə oynaşdığı halda, o bir küncdə durub baxardı. Müəllim ona bir sual verərsə, qıpqırmızı olardı. Lap yaxşı bildiyi bir şeyi belə söyləyə bilməzdi. Doqquz yaşı olanda anası onu oxuda bilməyib məktəbdən aldı. Qonşuların köməyi və yalvar-yaxarla Təbrizin Liləvan məhəlləsindəki kiçik bir dərzi şagirdli-

yinə düzəltdi. İllər gəlib keçdi, mən orta məktəbi qurtardım, o, yerindən tərpənmədi. Bir daş kimi dərzi dükanında düşüb qaldı. Onun dərzi şagirdi olması, təbiidir ki, bizim əlaqəmizi kəsmədi. Əksinə, böyüdükcə bizim ünsiyyətimiz daha da artdı. Həyat bizi daha da yaxınlaşdırdı. Həyatın hadisələri məni haldan çıxardığı bir zamanda, o bu hadisələrə qarşı sakit, laqeyd görünərdi. Heç bir ehtiyac, heç bir dərd onun adi halını pozmadı. Bir axşam evimiz şam tapmasaydı, mən deyinməyə başlardım. O isə bütün günü ac qalmış olsa belə bir kəlmə söz danışmazdı... Bununla belə mən istər şad və istər qəmli zamanlarımda, başqa birisi ilə danışmaq, söhbət etməyə ehtiyac duyduğum zamanlarda, həmişə onu axtarıb tapardım. O mənim hər cür sözümə dözərdi. Özü də eyni bir vəziyyət, eyni bir sakitliklə mənə qulaq asardı... İstər yaxşı sözlər danışım, istər pis, fərqi yox idi.

Acıqlı olduğum günlərdən birisi yadıma düşür. Kirayə pulunu gecikdirdiyimiz üçün ərbab bizi evdən qovmaqla təhdid etmişdi. Pul yox idi. Qazanmağa da iş tapılmırdı. Küçələri boş-boş gəzib yorulduqdan sonra Azadın yanına getdim.

– Azad, – dedim, – dərd ürəyimi dağıdır. Ağlamaq istəyirəm. Gözlərimdən yaş gəlmir. Bu nə güzəran, bu nə dirrikdir? Azad! İşləməyə yer yox, danişgahda oxumağa imkan yox, oğurluqmu edim, qardaş? Əlim sağ, qolum sağ, özümdə dağ gücü hiss edirəm, mən nələr edə bilmərəm? Əlimdən nə gəlməz? Nəyə gücüm çatmaz? Vallah, od dəryasını yar keç desələr, keçərəm! Bəs indi də işləməyəndə mən nə zaman işləyəcəyəm?.. Hara gedim, tiryəkxanayamı?.. Ömrümün baharını əli fanuslu qonaq axtaran evlərdəmi keçirim?..

O nə isə tikirdi. Mən sözə başlayarkən əl saxlayıb ani olaraq üzümə baxdı, yenə iynəsini götürərək öz işilə məşğul oldu. Söz bura çatan kimi o, iynəsini yerə qoyub sakit nəzərlərini mənə çevirdi...

– Azad, – dedim, – bizim hərəmizin iyirmi dörd yaşımız var... İyirmi dörd! Kim bilir, bəlkə də biz ömrümüzün yarısını artıq yaşamışıq... Bəlkə də çoxunu yaşamışıq... Bəlkə də lap bir illik ömrümüz qalır... Bu iyirmi dörd ildə biz nə görmüşük? Bizdən soruşsalar ki, həyat nədir, nə cavab verə bilərik? Bəli, həyat nədir, insan ömrünün mənası nədir, nə üçün insan dünyaya gəlir və bir müddət sonra yox olur, ölüb gedir, deyən bir fikir son günlər mənə rahatlıq vermir, bir il və ya bir ay sonra ölə biləcəyimi təsəvvür etdikdə, məni vahimə basır... Həyatda mən nə gördüm, nəhayət, nə qoyub gedirəm?.. Ölən günün sabahısıca bizi

unudacaqlar... Bir daş da yonmamışıq ki, ona baxanda bizi xatırlasınlar... Bizim üçün həyat nədən ibarət olmuşdur? ... İdraksız uşaqlıq dövründən sonra başlanan aclıq, ehtiyac və avaraçılıqdan başqa biz nə görmüşük?.. Mənə elə gəlir ki, bir quşun, bir qarışqanın həyatı bizimkindən daha faydalı, daha ağıllıdır. Biz heç bir şey gözləmədən, heç bir şey arzu etmədən, məqsədsiz, qayəsiz bu günü sabah eləmişik... Səhər bütün heyvanlar yuxudan duran kimi biz də durmuşuq... Bütün heyvanlar kimi tövləmizdən çıxmış, avara-avara dolanıb gün batanda yenə yatmışıq və bu qayda ilə günlərimizi keçirmişik... Bir tikə çörək, qışda bir manqal kömür dərdindən başqa hansı bir fikir, hansı bir əməl qəlbimizi döyündürmüşdür? Məgər həyat budur?.. Yaşayışın qayəsi budurmu?.. Sən elə bilmə ki, məni danışdıran pulsuzluq və ya aclıqdır... Yox, Azad!.. Fikrimdə başqa şeylər dolanır. Bizim bu fasid mühitə baxıram, ürəyim bulanır. Sahibi-mənsəblərimizi götür... Onlardan bəzilərini mən tanıyıram... Onlar yaşayışın mənasını məgər bizdən artıq qanmışlar?.. Hansı əməl üçün onları öldükdən bir gün sonra yad edəcəklər? Tiryəkə və fahişəliyə rəvac verdikləri üçünmü?.. Bir heyvanın həyatı onların həyatından daha faydalıdır... Heç olmazsa heyvanın bir şeyə xeyri olur... Onlar isə yeyir, yatır, işsizlikdən şişir, toxluqdan harınlıq etməyə başlayır, xalqa min cür əziyyət verirlər. Heç olmazsa bir tikə çörək dərdi bizim fikrimizi məşğul edir!.. Onların başı nə ilə məşğuldur?.. Cəmiyyətimizdəki pis əməllər, pozğun ehtiraslar məgər onlardan çıxmır?.. Tutaq ki, yedilər, hər il otuz batman düyünün plovunu, beş batman yağı, on beş qoyunu yedilər, hər ay bir xanımın ağuşunda gecələrini səhər etdilər. On il, iyirmi ki, otuz il ömürlərini mütəmadi bu minvalla keçirtdilər. Nə olsun?.. Bir səhər yuxudan duran kimi yenə yemək istəyəcəklər, həm də bizdən artıq bir acgözlüklə özlərini plovun üstə atacaqlar, bir arvar gördükdə gözləri heyvan gözü kimi yanacaqdır. Hər bir zaman qarınlarını tox, ehtiraslarını soyumuş görməyəcəklər. Qazandıqları da xalqın nifrət və qəzəbi olacaqdır. Həyat bundanmı ibarətdir?.. Mən ki, belə həyatı istəməzdim... Bir iş görmək istəyirəm, Azad!.. Elə bir iş ki, bizdən beş gün sonra gələnlər də ondan bir xeyir görsünlər... Kəndə gedəcəyəm... Bir ərbaba nökər olub bağbanlıq edəcəyəm... Heç olmazsa ağac əkərəm, bağ salaram, öləndən beş il sonra insanlar bir xeyir görərlər. Adımı rəhmətlə çəkərlər!..

Mən bu qədər danışdım, Azad heç dodaqlarını da tərpətmədi... Gözlərini bir nöqtəyə dikib durdu... Mən onun heç bir zaman, heç bir

şey başa düşməyəcəyi bir aləmdən danışdığımı güman etdim... Mənə elə gəldi ki, o ömründə bir dəfə də belə məsələlər haqqında düşünməmişdir... Hətta bu fikirlər ona təəccüblü görünür. Bəlkə məndən acığı da gəlir... Məni naxoş və ya xudbin hesab edir... Papağımı götürüb dükandan çıxmaq istədim... O, yerindən tərpənmədi. Mən onun üzünə baxdım:

– Dünyada sən olmasaydın, mən çoxdan özümü öldürmüşdüm, – dedim. – Çünki sənə baxıram, məndən də faydasızları var, deyə təskinlik tapıram... Yazıq, min yazıq bizə baxıb övladlarım var deyən vətənə! Yazıq bu gül kimi Azərbaycan torpağına ki, üstündə sən və mən gəzirik... O, bizdən nə xeyir gördü? Hansı şəhərini abad etdik?.. Hansı karxanaları yaratdıq, hansı maşınları qayırdıq? Bu torpaq başqalarının əlində olsaydı, hər qarışını bir qızıla dəyişməzdi. Burada bir cənnət düzəldərdilər ki, üstündəki hər vətəndaş sənin bir ərbabından xoş və ali həyat keçirərdi... Bəli, əzizim Azad Sükuti, sən bir məzar kimi sussan da mən sözümü deyəcəyəm... Bizim həyatımız bir qara quruşa dəyməz!.. Çünki bizcə həyat yeməkdən, yatmaqdan, yenə yeməkdən və yatmaqdan ibarətdir... Biz ölüm qapımızı döyən günə kimi də belə yaşayacağıq... Biz ölmək üçün yaşayırıq... Yaşamaq üçün ölən insanlardan xəbərsizik!.. Buna görə də cənazəmiz qəbrə çatmamış bizi unudacaqlar... Səni də, məni də, bizim tanış və dostlarımızı da. Yox, bəlkə səni bir yad edən tapıldı... Deyəcəklər ki, dərzi Azad yaxşı yamaq salardı... Allah rəhmət eləsin!

Özümü dükandan küçəyə atarkən onun səsini eşitdim.

– Fərda, Fərda!

Cavab verməyib çıxıb getdim. Bir müddət sonra bu hərəkətimin peşmançılığını çəkməyə başladım. Mən bu yazığı niyə incitdim?.. Onun təqsiri nədir? Bir könlü ki, tikə bilməyəcəksən, niyə yıxırsan? – deyə düşündüm. Gün batıb qaş qaralana qədər küçələri dolandım. Şeylərimizi həyətə atılmış görəcəyim fikri ilə evə qayıtdım... Anam astanada oturub məni gözləyirdi.

– Nə var, ana, hələ ərbabın adamı gəlməyib ki?..

– Gəlmişdi, oğul.

– Nə dedi?

– Nə deyəcək, pulunu alıb getdi.

– Pulu hardan tapdın, ana?

– Necə hardan tapdım, oğul! Azad gətirdi, dedi ki, sən vermisən.

Mən barmağımı dişlədim. Anamın qolundan tutub içəri apardım. Sonra Azadla görüşdükdə təşəkkür etdim. Keçən kobud rəftarım üçün üzr istədim. O heç bir söz demədi, gözlərini bir nöqtəyə dikib durdu.

Bir ay sonra mən anamı da kəndə getməyə razı saldım. Səlimə xanım və Azadla halallaşıb Təbrizdən ayrıldıq.

* * *

Tam beş il mən Azadı görmədim. Nə o kəndə gəldi, nə də mən Təbrizə getdim. Buna baxmayaraq Təbrizə səfər edənlər vasitəsilə ondan xəbər tuturdum, özümdən də ona xəbər çatdırırdım. Bu beş ildə çox sular axtarmış, çox əhvalatlar baş vermişdi. Cahan hərbi başlamış, Rza şah taxt-tacdan əl çəkərək İranı tərk etmiş, polis, jandarm və ağzı elli mürtəcelərin zülmü xeyli azalmış, müxtəlif hizblər, ittihadiyyələr meydana çıxmışdı. Azərbaycanın istər şəhər, istərsə kəndlərində camaat hərəkətə gəlmişdi. İclaslardan, mitinqlərdən başqa, evlərdə də azadlıqdan, yaxşı yaşayışdan, elmdən, ana dilindən danışırdılar. Nəhayət, 1945-ci ilin sentyabr ayının 3-də Azərbaycan demokratlarının deklarasiyası intişar tapdı... Tez bir müddətdə bizim kənddə də demokrat təşkilatı yarandı. Mən də başqa yoldaşlarım kimi tudədən demokrata keçdim... Tezliklə məni kəndimizdəki demokrat təşkilatının sədri seçdilər... Mən günlərimin nə cür gəlib keçdiyini bilmirdim. Biz Azərbaycan üfüqlərində işıqlı bir günəş doğduğunu hiss edirdik... Bu günəş hamının qəlbini böyük bir ümidlə doldururdu... Hadisələr də çox şiddətlə inkişaf edirdi... Bir neçə ay sonra biz kənddə mitinq keçirib Azərbaycan xalq konqresinə nümayəndələr seçdik. Nümayəndələr içində mən də var idim.

Noyabr ayının 18-də biz Təbrizə gəldik. Mən Təbrizi nə qədər dəyişmiş gördüm. Küçələrdə qeyri-adi bir canlanma və hərəkət vardı... Ürəyim, Azadı görmək həvəsi ilə döyünürdü... Elə birinci gün köhnə həyətimizə getdim, Səlimə xanımı gördüm. Alnımdan öpdü, anamı xəbər aldı, ağladı. Azadı soruşdum...

– Təbrizdə yoxdur, – dedi, – Zəncana gedib, demokrat düzəltməyə göndəriblər... Axı, indi o da demokratdır. Mən də demokrat olmuşam, oğul. Allaha təvəkkül. Deyirlər ki, gərək Azərbaycana azadlıq alaq. Hamıya iş verək, hamının çörəyi olsun. Uşaqlar öz dilimizdə oxusun. Xoşuma gəldi. Getdim yazıldım. İndi də komitəmizdə iclas olacaq, gəl otur, sənə bir stəkan çay verim, sonra gedərəm.

Mən sevinc, heyrət və təəccübümü gizlədə bilməyərək:

– Sağ ol, Səlimə xala, – dedim. – Get, iclasa gecikmə. Təəssüf ki, Azadı görə bilmədim. Məndən ona salam deyərsən.

– Deyərəm, oğlum, deyərəm. Sən də gecəni heç yerdə qalma. Evimizə gəl, gözləyəcəyəm, gəl ha, – deyib getdi. Mən də dərin fikrə dalmış halda Mərkəzi Komitəyə qayıtdım. Orada mənə Təbrizə köçməyi, Mərkəzi Komitənin təlimatçısı olmağı təklif etdilər. Xalq konqresi qurtaran kimi mən kəndə qayıtdım. Bir müddət sonra təşkilatın işlərini təhvil verdim. Anamı götürüb Təbrizə köçdüm. Yenə də köhnə evimizi kirayə etdik. Anam, başqa yerə getmək istəmədi – əvvəldən öyrənmişəm, Səlimə xanım da oradadır, – dedi. Mən də razı oldum. Səlimə xanım bizim gəlişimizdən çox sevindi. Azadın iyini sizdən alıram, deyib ağladı. Anam ona təskinlik verdi.

– Nə olacaq, – dedi, – inşallah tezliklə Azad da qayıdar, bir iş, bir tikə çörək sahibi olar. Evləndirərsən, sən də birçəyinin ağ vaxtında bir gün görərsən.

– Nə bilim, deyirlər ki, Zəncan tərəfdə qarışıqlıqdır. Zülfüqari qan-qan deyir. Başına adam yığıb demokratlarla vuruşur.

Burada mən sözə qarışdım:

– Qorxma, Səlimə xala. Zülfüqari-zad bir qələt eləyə bilməz. Bir xalq ki, azadlıq üçün ayağa durdu, onu yatırmaq asan iş deyil.

Təbrizə köçəndən sonra işdən başım açılmırdı. Gecələri də Mərkəzi Komitədə işləyirdik. Məclis və dövlət işini tərtibə salır, kəndlərdə demokrat təşkilatlarının möhkəm bir qayda və nizam üstündə qurmaq tədbirləri tökürdük. O günlər bizdə təsvirəgəlməz ruh yüksəkliyi vardı. Elə bil ki, qüvvəmiz də birə-min artmışdı. Yorulmaq bilmirdik. İşlərin bu şiddətli zamanında Zəncandan pis xəbərlər gəlirdi. Bir yandan Zülfüqari, bir yandan da Tehran mürtəceləri orada cürbəcür fəsadlar törədirdilər. Demokratları öldürür, ayaqlarını nallayır, alınlarına odlu dəmir basırdılar. Azərbaycanın hər tərəfindən narazı və mürtəce ünsürlər Zülfüqarinin başına toplanırdı. Belə bir zamanda Mərkəzi Komitə bir neçə yoldaşımızı Zəncana göndərməyi qərara aldı. Göndərilənlərin içində mən də vardım. Mən Təbrizdən çıxmamış Səlimə xalaya baş çəkməyi özümə borc bildim. O, Azada salam göndərdi. Bir cüt corab, bir də yun şərf büküb verdi. Soyuqdur, ona yetir, dedi. Mən də onu anama, anamı da ona tapşırdım. Hər ikisinə ürək-dirək verib yola düşdüm. Sabahısı günü biz Zəncana çatdıq. Şəhər demokratların

əlində idi. Zülfüqari neçə gün əvvəl şəhərdən çıxıb qaçmışdı... Başına yığdığı adamlarla cənub tərəfdəki kəndlərdə terror yaradır, Zəncana hücum etməyə hazırlaşırdı. Onun bu fikrini pozmaq üçün Zəncanın demokrat hökuməti fədailərdən bir neçə dəstə cənuba göndərmişdi... Azadın bu dəstələrdən birinə başçılıq etdiyini mən Zəncanda öyrəndim... Doğrusu neçə ildən bəri ayrıldığım və hələ də fikrimdə sakit, hədsiz dərəcədə mülayim bir adam kimi canlanan Azadı çox görmək istəyirdim. Onun indi nə halda olduğunu, nələr düşündüyünü, nə cür dəyişdiyini təsəvvür etməyə çalışırdım... Lakin aydın bir qərara gələ bilmirdim. O biri tərəfdən də köhnə bir yoldaş bir qardaş kimi onu könlüm istəyirdi... Elə bu zaman Zəncana xəbər gəldi ki, Zülfüqari ilə fədailərin ilk dəstəsi... "X" kəndinin yaxınlığında qarşılaşmışdır... Azca atışmadan sonra Zülfüqari kəndə çəkilmiş və ətrafı möhkəmlətmişdir... Fədailər dəstəsi kəndi dörd tərəfdən mühasirəyə almışdır... Bu dəstənin başçısı Azad idi... Çox gərgin və məsuliyyətli bir vəziyyət yaranmışdı. Biz fədailərin mütləq qələbəsini təmin etməyi və mümkün qədər az tələfat verməyi düşünürdük. Həmin gecəni biz Zəncandan çıxdıq və atışmanın şiddətli zamanında gəlib Azadın dəstəsinə çatdıq... Azad fədailəri uzun müddət kəndin ətrafında açıqlıqda, soyuq havada saxlamağın çətinliyini görərək dörd tərəfdən kəndə hücuma keçmişdi... Bərk atışma gedirdi, fədailərdən bəziləri hətta kəndin içinə girmişdi. Zülfüqari, deyəsən, kəndi rahatca vermək istəmirdi... Onlar ciddi müqavimət göstərirdilər... Lakin fədailərin təzyiqi getdikcə artırdı... Bir neçə saat sonra qaş qaralanda şərq tərəfdən Azad özü qabaqda olmaqla fədailər kəndə doluşdular. Bu zaman Zülfüqari ağır tələfatdan sonra bir neçə nəfərlə kəndin qərb tərəfindən qoyub qaçdı və aradan çıxdı... Biz həmin vuruşmada Azadın yaralandığı xəbərini aldıq... Mən tez özümü ona çatdırmağa çalışdım... Bu mənim beş illik ayrılıqdan sonra onunla ilk və son görüşüm oldu... Onu kənd evlərindən birində bir fərşin üstə uzatmışdılar. Başının altında yastıq vardı. Çuxasını üstünə salmış, beşaçılan tüfəngini yanına qoymuşdular. Onun ətrafında halqa vurmuş fədailərdən kimisi oturmuş, kimisi əmrə müntəzir durmuşdu... Mən içəri girən kimi onun üzünə baxdım... Ağarmış halda gözlərini yummuş və səssizcə uzanmışdı... Mən yavaş addımlarla onun başı üstünə gəldim, diz çöküb əlini əlimə aldım, alnından öpdüm.

– Azad, sənə nə olub?

O, heyrət və təlaşla gözlərini açdı... Üzümə baxdı. Bütün siması qəribə bir təbəssümlə işıqlandı. Mehribanlıqla başını dizimin üstə qoyub:

– Bu saat səni düşünürdüm, – dedi, – nə yaxşı gəldin. Yoxsa bu dünyadan ürəyi nisgilli gedəcəkdim...

– Nə danışırsan. Azad, qardaşım? – dedim, – biz hələ təzəcə yaşamağa başlayırıq... Dünyadan getmək nədir, bu nə sözdür sən ağzına gətirirsən?.. Sənə nə olub, haradan yaralanmısan?

O, əli ilə sağ çiyninin altını göstərdi... Güllə qabaqdan dəyib daldan çıxmışdı... Ciyərlərini də zədələmişdi. Mən ona təskinlik vermək istərkən o, sözümü kəsdi:

– Bunlara ehtiyac yoxdur, – dedi. – Mən ölürəm... Artıq ayaqlarımın soyuduğunu hiss edirəm... Sözümü kəsmə, mənə yaxşı qulaq as, mən danışmaq istəyirəm... Yadındadırmı, Fərda, beş il əvvəl Təbrizdə, dərzi dükanında sən məndən nə üçün yaşayırıq, həyatın mənası nədir, deyə soruşmuşdun? Onda mən sənə cavab verməmiş, susmuşdum. Sən isə mənim bu cür şeyləri qanmadığımı güman edərək acıqlanıb getmişdin, yadındadırmı?.. Lakin o zaman mən də sənin kimi düşünürdüm... Mən düşünürdüm ki, həyatımızın mənası vətənimizin səadəti üçün çalışmaqdadır... Amma o zaman mən danışa bilməmişdim... Çünki danışmaqda da bir məna yox idi... İndi isə sənə deyirəm, qardaşım Fərda, sizə deyirəm qardaşlarım (o, azca boylanıb fədailəri gözdən keçirdi), bəli, sizə deyirəm. Bizim hamımızın səadəti, bax, bu alçaq daxmaların azadlığında, bu doğma yurdun, bu ana torpağın istiqlaliyyətindədir... Yerə qoymayın o tüfəngləri ki, onları bu doğma torpaq sizə tapşırmışdır... Bir zaman bu oğlan, məqsədsiz, amansız keçən həyatı heyvani həyat adlandırmışdı... Bu sözlərdəki böyük məna həyatın mənasıdır... Bəli, heyvan kimi yaşamaq istəməyənlər gərək vətənlərinin övladı olsunlar... Mən ölürəm, Fərda, amma mən yaşamaq üçün ölürəm... Ölmək üçün yaşayanların dövrü qurtardı, bundan sonra zaman bizimdir, yaşamaq üçün ölməyə hazır olanlarındır!..

O, azca dayanıb udqundu, yenidən ahəstə-ahəstə davam etdi:

– Anam, yurdum, doğma Azərbaycan, məni bağışla!.. Sənə az fayda verdim, az yaşadım, tez öldüm! – deyib qalxdı və fərşin ucunu qaldıraraq torpağı öpdü.

– Öpünüz, səcdəyə qapılıb hamınız bu torpağı öpünüz! Bizim əzəli və əbədi beşiyimiz budur...

Mən onu qucaqlayaraq yerində uzandırdım...

– Sakit ol, Azad, özünü üzmə, qardaşım! – dedim. Özüm də bilmədən gözümdən süzülən yaş damcıları onun alnına düşdü... O, kirpiklərini qaldırıb gözümə baxdı və yenə də gülümsədi:

– Budur həyatın mənası, – dedi. – Dövrəmdə silah yoldaşlarım, başımın üstündə məslək qardaşım, yanımda vətənin azadlığı üçün qaldırılmış silah... Bu, şərəfli bir ölümdür, Azad!.. Əziz qardaşlarım, mənim qəbrimi uca bir yerdə qazarsınız... Elə yerdə qazarsınız ki, oradan Azərbaycanın geniş çölləri, duru çayları, güllü çəmənləri və bağları görünsün. Elə yerdə qazarsınız ki, qəbrimin üstünə gələn adamın nəzərlərində geniş üfüqlər açılsın. Həm də o yer böyük bir yol kənarında seçərsiniz... Qoy gələcəyin azad nəsillərinin ayaq səsi qəbirdə də olsa qulaqlarıma çatsın... Bəlkə onlar da bizi rəhmətlə yad etdilər... Elədirmi Fərda!..

Mən artıq özümü saxlaya bilməyərək ağlaya-ağlaya:

– Yox, Azad, gələcək nəsillərin yaşaması üçün ölənlər əbədi həyat qazanırlar, – dedim...

Alnına xəfif bir tər gələndə o, gözlərini bir daha mənə tərəf çevirdi:

– Anamı öp, öldüyümü ona söyləmə, yazıqdır... – dedi və əbədi olaraq gözlərini yumdu.

Mən qeyri-ixtiyari ayağa durdum... Üzlərində sərt bir ifadə, gözləri qəzəblə yanan fədailərə baxdım:

– Qardaşlarım, gəlin silahlarımızı ürəyimizə basıb onun pak ruhu qarşısında and içək... And içək ki, ölüm bizi Azərbaycanın səadəti yolundan, böyük amalımız yolundan döndərə bilməz!.. Yadımızda saxlayaq ki, onun hələ soyumamış qanı bizi intiqama çağırır, azadlıq yolunda mərd durmağa çağırır. Zülfüqarilərə ölüm!.. Xainlərə lənət!.. Eşq olsun qəhrəmanlara! Xalqın yaralı qəlbini ancaq onlar sağalda bilər, ancaq onlar azadlıq bayrağını ucalara qaldıra bilərlər!.. Yaşasın azadlıq!..

Fədailər bir səslə:

– Yaşasın azadlıq! – deyə qışqırdılar və tüfənglərini havaya qaldırdılar.

* * *

Biz onu, öz vəsiyyətinə görə uca bir yerdə basdırdıq. Bu yer Təbrizlə Zəncanı birləşdirən böyük yolu qoynuna almış Təbriz gədiyidir... Onun ən uca təpəsindəki tənha qəbrin üstündə duran adamın nəzərlərində geniş üfüqlər açılır, oradan Azərbaycanın həm cənub, həm də şimal sahələri görünür...

Bir neçə gün sonra mən Təbrizə qayıtdım... Səlimə xala Azadın mənimlə gəlmədiyini gördükdə narahat oldu. Mən onun vəsiyyətinə əməl edərək ölümünü anadan gizlətdim. Zəncanda bərk məşğul olduğuna, işini qurtaran kimi mütləq gələcəyinə inanırdım... Səlimə xanım indi də ona corab toxuyur, yaxşı bir xörək bişirəndə onu yad edib durur, səbirlə yolunu gözləyir...

Azadın həyatı və ölümü gözlərim önündə canlandıqca həyatın qəribə sirlərini və dərin mənalarını mənə xatırladır...

*Bakı, 1946*

# TONQAL BAŞINDA

1

Həzin dekabr küləyi adamın iliyinə işləyirdi. Havada kəskin şaxta olmasa da, soyuq bir külək vardı... Həm də bu külək adamı tir-tir titrədirdi.

Təbrizi qərb tərəfdən mühasirə etmiş Marağa fədailəri artıq bu soyuğa alışan kimi idilər. Onların böyük bir qismi, ömrünü gecə səhərə qədər çöllərdə keçirmiş kəndlilər idi. Nə payızın sazağı, nə də qışın şaxtası onları qorxutmurdu... Digər qismi də kürkə bürünmək, bir-birinə qısılaraq yatmaq, tonqal qalayaraq ətrafında qızınmaqla özlərini payızın soyuq küləyindən qoruyurdu...

1945-ci il dekabrın 13-də qaranlıq bir gecədə bir dəstə fədai belə bir tonqalın başına toplanmışdı... Qədim Azərbaycan adətinə görə onlar odun ətrafında halqa vurmuşdular... Göylər buludlu, üfüqlər qaranlıq idi... Bütün ətrafda ağır bir sükut hökm sürürdü... Payızın həzin küləyi gecəyə məxsus bir ağır sükutu xələldar edə bilmirdi... Sanki bütün varlıq yuxuya getmiş, əsrarəngiz bir pərdəyə bürünərək yatmışdı... Tonqalın alovu sönüb közə döndükcə onun başındakı fədailərin halqası daralırdı... Onlar bir-birinə qısılmış, gözlərini gecə qaranlığında sanki min hekayət oxuyan tonqal közünə dikmişdilər. Zülmət qaranlıq içərisində çırtlayan közlərə baxdıqca xəyallarında əfsanəvi və xülyəvi bir aləm canlanırdı... Bu təəssürlə də həyat və mübarizələrindən çox uzaq görünən əhvalatdan söhbət açırdılar. Kimisi nağıl deyir, kimisi min illərlə ağızdan-ağıza gəzmiş bir əfsanə söyləyirdi... Adətən belə hallarda olan kimi bir söhbət başqasını doğurur, danışıq tez-tez məcrasını dəyişir və eyni zamanda fikrin incə telləri ilə bir-birinə bağlanır, bir silsilə kimi davam edirdi. Bütün danışanlar içərisində altmış yaşlı Kərim kişi hamıdan artıq maraq oyandırmış və hörmət qazanmışdı... Dünyanın isti və soyuğunu görmüş bu qoca ağıl mücəssəməsini xatırladırdı. Onun qar kimi ağarmış saqqalı bütün simasını örtmüşdü. Başının tükləri və hətta qalın qaşları belə ağarmışdı... Boynu, boğazının altı və bütün siması ağ tüklərlə örtülmüşdü. Yalnız hələ də işığını itirməmiş gözləri bu ağ tüklərin arasından görünür, qalın meşəlikdəki bulaq kimi işıldayırdı... Bütün siması qeyri-adi və sonsuz bir mərhəmət ifadə edirdi... Xüsusilə gülümsədiyi zaman bu daha artıq gözə çarpırdı...

– Kərim dayı, dünya görmüsən, saç-saqqal ağartmısan, bizə yaxşı bir şey danış, ibrətamiz bir əhvalat nağıl elə... ya gördüyün, ya eşitdiyindən elə bir şey danış ki, eşitməmiş olaq, – deyə cavan və şux xasiyyətli fədai Saleh, Kərim kişiyə müraciət etdi... Fədailər hamısı "danış, danış!.." deyə səsləndikdə, Kərim kişi gözlərini qıydı, azca fikrə getdi, tonqalın közünü eşələyərək sözə başladı:

– Mən sizə bir hekayət danışacağam. Bu qədim zamanlardan qalma bir hekayətdir. Nə bilim, bəlkədə min il bundan qabağın söhbətidir. Ola bilər ki, cavanlara o qədər də xoş gəlməsin. Amma bizlərə çox xoş gələrdi. Bəyənməsəniz də ona qulaq asın... Görün bu qoca dünya necə igidlər yola salıb... Görün bu qara torpaq necə oğullar çəkib aparıb... Heç kəs "dünya mənə qalacaq" deyib qürrələnməsin... Bu torpaq çox mənəm-mənəm deyənlərin başını yeyib. Bu külək çox ocaqlar söndürübdür... Elə ocaqlar ki, oduna min ev isinərdi... Bu çarxın altında çox sümüklər əzilib toza dönübdür. Heç kəs də bu qapıdan çıxanda "doydum" deməyibdir... İstər şah ol, istər gəda, əvvəl-axır bu dünyadan köçüb gedəcəksən, gedəndə bircə şey aparacaqsan. Ya rəhmət, ya lənət... Ürəyini köz kimi qızardıb xalqa od gətir, işıq gətir ki, rəhmət aparasan!.. Mən sizə belə bir igidin nağılını deyəcəyəm...

– Ay sağ ol, Kərim dayı, – deyə fədailər oturduqları yerdə tərpəndilər və dərhal sakit olub gözlərini ona dikdilər.

O, gözləri yol çəkir kimi bir xəyal içində sözünə davam etdi.

– Deyirlər ki, qədim zamanlarda bu torpaqda bir el yaşarmış... Bu el nə zindan bilərmiş, nə zəncir... Orada güclü gücsüzə zülm etməzmiş... Aclıq və yoxsulluq da olmazmış. Hamı azad yaşarmış... Quş kimi azad yaşarmış! Bir adam o birisinə əziyyət verməz, heç kəsin heç kəsə pisliyi dəyməzmiş... Onlar zəhməti sevərmişlər...

Hamı başını aşağı salıb səhərdən axşama kimi işlər, çalışarmış... Onlar öz zəhməti nəticəsində torpaqdan qızıl götürərmişlər... Eh... hanı indi elə adamlar... Birinin pis günündə elliknən ona əl tutarmışlar... Qarı arvadlara, qoca kişilərə, yetim uşaqlara pənah çıxarmışlar. Hər kəs öz çörəyini pənahsızlara verməyə, öz ocağının yanında onları qızdırmağa çalışırmış... O torpağın hər tərəfində bağlar, bağçalar, zəmilər yetirərmişlər... Yaz olanda hər gül bir ətir iyi verər, hər quş bir hava oxuyarmış... O elin adamları paxıllıq və yalan bilməzmişlər... Deyirlər ki, onlar çox qəribə bir tayfa imişlər... Gün batanda onlar dəstə-dəstə yığışıb qəmli havalar oxuyarmışlar... Ona görə ki, qaranlıqdan, gecədən xoşları gəlməzmiş, qorxarmışlar... Sonra od qalayıb ətrafına yığışar və oxuyub

oynarmışlar... Çünki işıqdan, oddan xoşları gələrmiş... Deyirlər ki, onlar işığı Allah bilər, ondan qüvvət və təsəlli alarmışlar... Bu el çox qəhrəman bir el imiş. Pis gündə bir dağ kimi birləşərmiş. Vətən yolunda ölmək onların nəzərində müqəddəs sayılarmış... Onların meyitini ocaqların dibində basdırarmışlar... Dünyada heç bir səadət əbədi deyil, oğullarım!.. Heç şey əbədi deyil. Hər şeyin bir qənimi, bir zavalı var! Bir gün o elə də bir zaval üz verir. O yerin tərifini eşidən düşmən qoşun çəkib üstünə gəlir... Düşmənin başında Alpars adlı qanlı bir hökmdar durarmış. Alpars o elin uca ağaclarının kölgəsində sərinlənmək, dadlı meyvələrini yemək, sərin çeşmələrinin suyunu içmək, gözəl-göyçək gəlinlərinin sinəsinə baş qoymaq fikrinə düşür... Düşmənin qoşunları çəyirtkə kimi oraya hücum edir... Dəmir paltar geyib gəlir. Bu elə də səs düşür. İgidlər at belinə qalxırlar. Gəlinlər, qızlar da cəngavər olub, qılınc götürür, igidlərə qoşulurlar... O elin adəti belə imiş, oğullarım. Yaxşı gündə ceyrana oxşayan gözəllər, pis gündə şirə dönərmişlər. Uşaqlar da, qocalar da igidlərə qoşulur... Sel kimi gələn düşmənin qabağına dağ kimi çıxarlar... Oxlar atılır, qılınclar oynayır, leş-leş üstünə qalanır, başlar bədənsiz, bədənlər başsız qalır. Düşməni doğma yurda buraxmırlar... O igidlərin başında elin pənahı olan Elcan adlı bir qəhrəman dururmuş... Elcan dava zamanı pələngə dönərmiş, düşmən əsgərlərini baş-başa vurub öldürərmiş... Nərildəyəndə çöllər, dağlar da vahiməyə gələrmiş. Bir dəfə qanlı Alpars özü dəmir geyib davaya qoşulur. Elcanı öldürmək, eli qəhrəmansız qoymaq istəyir... O, davadan qabaq həmişə adam ürəyi yeyib qızışarmış. Sonra meydana girərmiş. Bir əsirin ürəyini yeyib Elcanın qabağına çıxır. Lakin qəhrəman Elcan meydandan qaçmır. Alparsla üz-üzə gəlir... Qılıncını vurub salır, qulağının birini kəsib meydandan qaçmağa məcbur edir. O gündən Alparsın adı tayqulaq qalır... Düşmən yenə də öz şum fikrindən əl götürmür. Qol gücü ilə onlarla bacara bilməyəcəyini gördükdə hiyləyə əl atır... Onların sevdikləri bir şeyi öldürmək fikrinə düşür. Etiqadlarını öldürməyi qərara alır... Onları odsuz-işıqsız qoymaq istəyir. Allah dünyanı hiylədən saxlasın... Hiylənin yıxmadığı bir ev, söndürmədiyi bir ocaq yoxdur... Hiyləgər düşmən dilənçi paltarında onların içinə adamlar göndərir... Bir gecə bu dilənçilər hamını yuxuya verərək o elin odunu oğurlayırlar.

Hiyləgər düşmən onları odsuz qoyur... Onlar ocaqlarının külünü eşələyib od tapmırlar... Gecə qaranlıq düşəndə fəryad qoparıb ağlayırlar. Heç kəs onlara kömək etmir. Qanlı və çiy ət yeməyə başlayırlar. Qan qanı qızışdırır... O eldə pis adətlər baş verir... Dərd və bəla

onları bir qul kimi alçaldır... Fikirləri dağılır, torpaqları bozarır, bağları quruyur. Qarı düşmən onları özünə tabe edir. Amma bununla da onlardan əl çəkmir... Zalımın əlinə fürsət düşəndə bəsdir deməz... Qarı düşmən də o eli həsrət içində öldürmək üçün hər gün axşam bir dağın başında bir tonqal qalayır. Özü də "oda yaxın duranları odda yandıracağam" deyə hökm edir. İşığa öyrənmiş el hər axşam qaranlıq düşəndə həsrətlə od yanan tərəfə baxıb ağlayır... Əsarət bir qurd kimi o elin ürəyini yeyir... Cəsarətini öldürür, dizlərində taqət, qollarında qüvvət qoymur... Bax, igidin qeyrəti belə gündə bilinər, oğullarım... İgid odur ki, elinin dərdli günündə dadına çatsın. Elcan da belə igidlərdən idi. Elcanın ürəyi ocaqların sönməsinə, bağların qurumasına, elin fəryadlarına dözmür... Bir axşam o, düşmənin qaladığı tonqalın odunu götürüb elə paylayır. Qapılarda ocaqlar yandırır... Ocaqların yenidən yandırıldığını görən tayqulağı vahimə basır... "Bunların ocağı od görsə heç bir qüvvəyə baş əyməzlər!" deyə qorxuya düşür... Doğrudan da ocaqları yenidən yanmış elin ürəyi ümidlə dolur... Gözlərinə işıq gəlir... Etiqadı özünə qayıdır... Əsarət zəncirlərini qırmaq fikrinə düşür. Qarı düşmən qəzəb və qorxusundan titrəyir... Bütün eli bir yerə yığır... "Odu gətirəni verin!.." deyə hökm edir. Eldən səs çıxmır. Tayqulaq böyük bir tonqal qalatdırır. Elə cəza verməyə başlayır... Diri-diri qocaları oda atdırır... "Odu gətirəni verin!" – deyə bağırır... Yenə eldən səs çıxmır... Axı, dünyada el qədər vəfalı şey yoxdur. Mənim əzizlərim, elin ürəyinə sığınanlar ölməzlər... Əbədiyyətin beşiyi elin qucağıdır. El Elcanı düşmənə vermir ki, vermir... Düşmən körpə uşaqları da yandırmağa başlayır. Elcanın ürəyi buna dözmür. Birdən-birə, elə bil ki, göylər guruldayıb şimşək oynayır. Az qalır ki, üfüqlər çatlasın. Yerin bağrı yarılsın. El gözünü silib baxanda görür ki, Elcan bir dağ kimi düşmənin qabağında durmuşdur. "Odu gətirən mənəm!" deyir. – Sən bizi əsir etməklə kifayətlənmədin, qızlarımızı, gəlinlərimizi apardın, ürəyin soyumadı. Bağlarımızı qurutdun doymadın, axırda məbudumuzu yıxdın. Ürəyimizin odunu, gözümüzün işığını söndürmək fikrinə düşdün. Bu el odsuz yaşaya bilməz... Odu mən gətirmişəm!.. Tayqulaq Elcanı tanıyır... Canına üşütmə düşür... Bir addım geri çəkilir... Acıqlı-acıqlı Elcanın cəsarətli gözlərinə baxır. "Biz səni odda yandırarıq!" – deyir... "Məni yandırsanız da elimin işığını söndürə bilməzsiniz! Bir də bu el odu əlindən verməz!.."

Tayqulaq Elcana baxır. Canavar kimi dişlərini qıcıdır. Cəlladlar onun nə demək istədiyini bilib Elcanın üstünə atılmaq istəyirlər...

Elcan cəlladları baş-başa vurub Alparsın qabağına atır: "Götür, bunların ürəyini ye!.." deyir. Tayqulaq titrəyərək: "Yox, mən sənin ürəyini yeyəcəyəm! Bunun ürəyini çıxarın!" – deyə hökm edir. Elcan bir addım irəli atıb Alparsın qabağında durur. "Mən sənin bir qulağını kəsmişəm. Əvəzində ürəyimi sənə verəcəyəm. Ye, doy!" – deyir, xəncərini belindən çıxarır. Heyrət və dəhşət hər tərəfi bürüyür... Qızlar, gəlinlər dəsmal çəkib ağlayırlar... Göylərdə şimşəklər oynayır... Qəhrəman Elcan bir dəqiqədə ürəyini köksündən çıxarıb Alparsın qabağına atır: "Ye, daha başqa ürək görməyəcəksən, ye!"

Alpars onun buğlanan ürəyini havada qapıb ağzına təpir. Son tikəsini udmamış qan qusmağa başlayır. Laxta-laxta olmuş ciyəri ağzına gəlir. "Zəhər, zəhər!" deyə qışqırır və ağlayır. Elcan, yanan ocaqlara baxaraq: "Bəli, mən ürəyimə zəhər qatmışdım. Ocaqlarımız sönməyəcəkdir!" deyir. Alparsın can verib öldüyünü görən qoşunları dağılır, qaçmağa üz qoyurlar. El azad olur. Ürəyini çıxarıb elinə azadlıq gətirən qəhrəman Elcanı basdırırlar, qəbri üstündə əbədi ocaq yandırırlar. Deyirlər ki, onun ruhu hər axşam ocaqların başında dolanıb durur, işıqsız evlərin qapısında çıraq kimi şölələnir... Keçmişdə belə igidlər olub, mənim əzizlərim...

Kərim dayı söylədiyi əfsanəni qurtardı, öz danışığından özü də mütəəssir olmuş kimi gözlərini qapayıb, susdu, bəlkə də dərin bir fikrə getdi...

2

Tonqal başındakılar xəyala dalmışdılar. Heç kəs danışmırdı. Kərim dayının nağıl etdiyi əcaib və xəyali əhvalatda onlar ruhlarını oxşayan qəribə bir zövq tapırdılar. Ürəklərində təsəvvür edilməz bir qəhrəmanlıq arzusu oyanırdı. Gecənin qaranlığında, qışın həzin, lakin soyuq küləyini unutmuş kimi idilər. Sanki qarşılarında, geniş bir sahədə uzanıb gedən, sakit və müəmmalı Təbrizin ulduz kimi çırpınan işıqlarını belə görmürdülər. Hətta nə üçünsə bu gecə gözü soyuq torpaq üstündə uzandıqlarını, özlərinin harada olduqlarını da unutmuşdular. Onlar xəyala dalmışkən tonqalın yanında içi közlə dolu samovar pıqqıldayıb qaynamağa başladı. Kərim kişi samovarın səsinə fikirdən ayıldı. Üzünü dəstənin xidmətində hazır durmuş Salehə tutdu:

– A bala, bir o çayniki yaxalayıb dəmlə görək...

Saleh dağ sudan çaynikə açıb çalxaladı və əlini kənara uzadıb qaranlığa səpələdi. Kərim kişi nəsihətamiz bir əda ilə:

– Oğul, – dedi, – gecə isti su atanda bismillah deyərlər. Allah-taala gözə görünməyən min bir məxluq yaradıb, onlardan biri də əcinnələrdir. Kim bilir o dağ su ilə neçə əcinnəni yandırdın. Günahdır... özünə də xatası dəyər.

Saleh, çaynikə çay atıb, etinasızlıqla samovarın altına tutdu:

– Qorxma, Kərim dayı, – dedi, – Allah-taala dünyada insanlardan böyük əcinnə yaratmayıb. Yer üzündə adamdan başqa nə varsa əfsanədir.

– Əstəğfürullah de, oğul... Ağzın, gözün əyilər... Allah eləməsin, dilin tutular. Qulaq as, mən sənə bir hekayət danışım, gör əcinnə var, ya yoxdur. Öz gözümlə gözmüşəm. Mən danışım, sən də tövbə elə...

Əcaib bir söhbətə qulaq asmaq həvəsi hamını maraqlandırırdı. Dəstə yenə yerində qımıldandı. Oturanlar nəzərini Kərim kişiyə dikdi. Fədailərdən kim isə:

– Kərim dayı, zəhmət çək bu çuxanı da qolunun altına qoy, rahat olsun, – deyə çuxasını dördqat büküb mütəkkə kimi Kərim kişinin sağ qolunun altına qoydu. Kərim kişi bir-iki dəfə salavat çevirdi. Doğrudan da, qarşısında görəgörünməz əcaib qüvvələr durmuş kimi ciddi və vahiməli bir vəziyyət alaraq yeni bir hekayə danışmağa başladı:

– Söz vaxtına çəkər, qırx-qırx beş il bundan qabaq elə gecənin belə bir zamanı idi. Kənddə kürsü qurub, dövrəsinə yığışmışdıq. Mənim 14-15 yaşım ancaq olardı. Rəhmətlik dədəm sağ idi. Uzun qış gecələrini onun nağıllarına qulaq asardıq. Uzun qış gecələrini onun nağıllarına qulaq asardıq. Qonum-qonşu da gələrdi. Xırda uşaqlar, cavan gəlinlər də olardı. Allah əcinnəyə lənət eləsin. Görəsən harda yamanlıq elədi ki, indi burda söhbəti düşdü. Onda da gecələr atam, məlunun pis əməllərindən danışardı. Zahı arvadların ürəyini çəkib apardığını, gecələr tək çay qıraqlarında, pəyələrdə, evlərin bacasında gəzdiyini, uşaqlar oğurladığını deyərdi. Kafirin xasiyyəti pisdir. Hər kəsin adını bilər. Bəzən qoca kişi, bəzən cavan uşaq şəklinə düşüb aparmaq istədiyi adamı güdər... Xəlvət bir yerdə adını çağırar, baxarsan heç kəs yoxdur. Amma adını çağırırlar. Onda gərək cavab verməyəsən. O saat “bismillah” deyib salavat çevirəsən. Vay o adamın halına ki, çağıranda səs verə. “Bəli” dedi, işi qurtardı. O adamın səsini oğurlayır... Kimin ki, səsini oğurladı, əsir edib aparacaq. Apardığı adama daş daşıtdırar, dağların, qayaların ucundan asar, qurd mağaralarının ağzında gəzdirər, qərəz, olmazın əziyyət verər. O, insan nəslinin düşmənidir. Çağıranda gərək səs verməyəsən. Çox zaman da o qoyunların içində gizlənər.

Yaxşı yadıma gəlir. Qonşumuza iki ay ola-olmaya bir gəlin gətirmişdilər. Adı Ruqiyyə idi. Ruqiyyənin on səkkiz yaşı olardı. Qar kimi ağ üzü, qara qaşları və saçları, ürək gözləri vardı. Heç vaxt adamın gözünə baxmazdı. Həyalı, abırlı bir gəlin idi. Dinməz-danışmaz oturardı. Dədəmin söhbətlərinə qulaq asanların içində hər axşam Ruqiyyə də olardı. O başında çadra, yaşmaq tutub arvadların içində əyləşərdi. Bir axşam yenə qonşular bizə yığışmışdılar. Atam kafirin bəd əməllərindən danışırdı. Hamının fikri onda idi. Bədbəxtlikdən bu zaman Ruqiyyə ayaqyoluna getməli olur. O, utandığından heç kəsə deməyib yavaşca həyətə çıxır. Kənd yeridir, ayaqyolu həyətin o biri başında olurdu. Onun da yanında tövlədə qoyunlar saxlanırdı. Başımız o qədər söhbətə qızışmışdı ki, Ruqiyyənin nə vaxt evdən çıxdığını bilməmişdik... Amma evə necə qayıtdığını qiyamətə qədər yadımdan çıxarmaram. Bir vaxt onu gördüm ki, Ruqiyyə qışqıra-qışqıra içəri girdi. “Qoymayın, qoymayın, məni aparırlar” deyə özünü qayınanasının qucağına atdı. İndi də yadımdadır. Qızın gözləri kəlləsinə çıxmışdı. Ağzından köpük tökülürdü. Əlləri, ayaqları titrəyirdi. Qayınanasının qucağında çırpınaraq kimə isə cavab verib deyirdi: “Hə, gəlirəm... gəlirəm, bu saat gəlirəm”. Özünü dartıb çölə atmağa can atırdı. “Gəlirəm, gəlirəm” – deyə qışqırırdı. Onu tutub saxlamaq istəyənlərin əlində üz-gözünü didib tökürdü. Onu görən atam “lənətə gəlmiş, qoyunların içində gizlənmiş imiş, qızı yoldan çıxarıb, səsini oğurlayıb” deyə bir neçə dua oxudu. Lakin heç birinin təsiri olmadı. Ruqiyyə “gəlirəm, gəlirəm” deyə yorulub haldan düşənə qədər çırpındı. O gündən qız saralıb-solmağa başladı. Özü də oldu bir lal-dinməz... Səhərdən axşama qədər tək-tənha oturub bir adamla bir kəlmə söz danışmazdı. Hər gün axşam gün batıb qaş qaralan kimi biz Ruqiyyənin narahat olmağa başladığını görərdik. O, səfərə gedər kimi paltarını geyər, hazırlaşardı. Qaranlıq düşən kimi “gəlirəm” deyə qışqırır və özünü evdən çölə atmağa çalışardı. Bir dəfə samovardan qaynar su götürüb içdiyini özüm görmüşəm. Dili, dodağı pörtlənib qalmışdı. Bu minval ilə hər gün qaranlıq düşəndə o, çırpınıb, “gəlirəm, gəlirəm” deyə qışqırardı. Heç bir dua və dava ona kömək etmədi. Çünki kafir yaman ziyankardır, tutduğunu buraxmaz. İki ay sonra yazıq Ruqiyyə ölüb getdi...

Kərim dayı salavat çevirdi, nə isə bir dua oxudu.

– Harada sözü düşsə kafir ora yığışar, – deyə sanki tonqalın ətrafında doğrudan da mövcud olan dəhşətli bir şeyi qovur kimi hərəkətlər etdi. Saleh yarıistehzalı bir əda ilə:

– Kərim dayı, bu cin-şəyatin olmasaydı, indi biz də bir günə çıxmışdıq, – dedi. – Elə millətin evini belə şeylər yıxdı. Gözə görünməyən hər şey əfsanə və heçdir. Elcanın hekayəti ilə bu heç tutmur.

Görünür ki, Kərim dayı Salehin ürəyinə dəymək istəmədi.

– Sənin nə xoşuna gəlir, onu da yanında saxla, oğul. Dünyada hər kəsin xoşuna gələn yaxşıdır, – deyə əllərini ovuşdurdu və stəkanı götürüb çay süzdü...

3

Gecədən xeyli keçmişdi. Bütün varlıq yatmışdı... Sanki hər yanda sakitlik və cansızlıq hökm sürürdü. Hətta uzaqlarda görünən Təbrizin işıqları belə indi mürgüləyir kimi idi. Fədai dəstələri də yatmışdı. Yalnız gözətçilər yatmır, fit çalaraq, yaxud dodaqaltı zümzümə edərək gəzişirdilər. Bir-iki yerdə tonqal yanırdı. Gecənin sərt qaranlığında onun işıqları uzaqlara axıb gedirdi. Bu tonqalların başına toplanmış beş-on nəfər söhbətcil adamlar da yatmamışdılar. Bəzən onlar da susurdu. Ancaq uzaqlarda itlərin qış gecələrinə məxsus uzun bir səslə hürüşməsi gecənin sükutunu pozurdu. Bəzən də gecənin heybətli və əsrarəngiz pərdəsini yırtaraq, insan ruhunun dərinlərinə işləyən xoş və xəyali bir səs, bir ahəng ətrafa yayılırdı. Kim isə sonsuz bir ilham və eşqlə ney çalırdı. Ürəyi dərd və məhəbbətlə dolu birisi bu neyin səsinə yanıqlı-yanıqlı oxumağa başladı. Onun səsində kədərlə sevinc, ümidlə yas qəribə bir halda bir-birinə qarışmışdı. Bu səs qeyri-ixtiyari olaraq insanın ürəyinə işləyirdi. Xəyalında dumanlı arzular, qəlbində uzaq və qəribə duyğular oyadırdı. Neyin səsi gah ucalır, gah eşidilməyəcək dərəcədə zəifləyirdi. Oxuyan adam özünü tamamilə neyin ixtiyarına vermiş kimi idi. Səsini onun ahənginə uyduraraq həzin-həzin deyirdi:

Təbrizin küçələri.
Banlamaz beçələri.
Girəydim yar qoynuna
Payızın gecələri...

Hamı diqqətlə bu səsə qulaq asırdı. Kərim dayı da susur və gözlərini uzaqlara dikərək dinləyirdi. Görünür ki, bayatı və ney səsləri onun müxəyyələsini oynatmış, gənclik xatirələrini gözlərində canlandırmışdı. O, dərin bir hüznlə köksünü ötürdükdə, Saleh ona baxıb dedi:

– Hə, Kərim dayı, deyəsən xoşuna gəldi.

– Xoşuma gəldi nədi, ürəyimi dağladı, oğul... Keçən günləri, cavanlığı yadıma saldı.

– Onda bir az da özündən danış. Öz gördüklərindən de. Nağıl elə görək, dünyada altmış il yaşadın, nə gördün, nə öyrəndin? Qoyub getdiyin nədir, apardığın nə?..

– Apardığım təmiz addır, qoyub getdiyim namus... Bir adam tapılmaz ki, desin Kərim kişi dünyadan bişərəf getdi. Pis yaşadım, ağır yaşadım, amma təmiz yaşadım. Çox dərd-bəla çəkdimsə şad günüm də az olmadı... Dünyanın acısını gördümsə ləzzətindən də məhrum qalmadım. Bədbəxt o adamdır ki, dünyadan narazı, gözü ac gedə, oğul... Məni anam təzədən doğsa, yenə elə bu cür yaşaram; çünki çirkin bir əməlim yoxdur ki, yadıma düşəndə ürəyimi sıxsın... Biləks, xoş xatirələrim çoxdur.

– Birini danış, Kərim dayı, yadına düşən bir yaxşısını danış!

Kərim dayı samovardan bir stəkan da çay süzüb qabağına qoydu, ani olaraq fikrə getdi:

– Məmmədəli şahın zamanıydı... Yaşım iyirmi beş olardı. Elə vaxtım idi ki, dişimlə dəmiri əyərdim, qıfılı sındırardım. Qış günündə çayın buzunu qırıb çimərdim, dişim-dişimə dəyməzdi... Bir oturuma bir toğlunun kababını yeyərdim, doydum deməzdim. Üç gün, üç gecə kövşəndə qalardım, gözümə yuxu gəlməzdi. Özüm yaşda da bir yoldaşım vardı. Adı Azər idi. Azər mənə yoldaş deyildi, doğma qardaş idi. Heç doğma qardaşda da o sədaqət, o məhəbbət olmaz... Eh... hanı indi elə yoldaşlar! Hazır idi ki, yolumda canından keçsin... Mənsiz bir tikə çörək yeməz, mənsiz bir stəkan su içməzdi. Bəli, Azər belə yoldaş idi. Hər il kənd işləri qurtaranda, payızın axır aylarında biz Təbrizə gələrdik. Azər yaxşı bənna idi. Mən də çox gözəl xarrat idim. Biz Təbrizə gəlib iki-üç ay orada, ərbablara, tacirlərə təzə evlər tikərdik. O ili də Təbrizə gəlib məruf ağalardan Mükərrəmüddövlə üçün yaxşı bir imarət tikməyə başladıq. Bizdən başqa da on-on iki adam işləyirdi. Kimi kərpic gətirir, kimi palçıq basır, kimi torpaq daşıyırdı. Bənnaların içində Azər, xarratların içində məndən başı yox idi. Azər işə qızışanda yorulmaq bilməzdi. Kişi pərvanə kimi özünü oda çırpardı. Təki iş yaxşı olsun, tez başa gəlsin. Mən də ona baxıb həvəslənərdim. Bu minval ilə biz imarəti tikirdik. Bir neçə dəfə ağayi Mükərrəmüddövlə özü də gəlmiş, işlərə nəzarət yetirmiş, "əhsən" deyib çıxıb getmişdi... Bir dəfə də gəlib bizi yaşadıqları mülkə apardı. Orada bir həftənin ərzində təzə bir otaq

tikməyi bizə tapşırdı. Biz işə başladıq. O qədər yaxşı işləyirdik ki, ağa razılıqdan bilmirdi nə etsin. Hətta bizə hər gün çay-çörək də verirdi... “Yaxşı ustaya nə versən halaldır” deyirdi. Elə burada da mənim başıma böyük bir əhvalat gəldi. Demə ki, bəxtimdə var imiş. Adamın da ki, bətninə nə yazılıb, o olacaqdır. Heç kəs taleyin hökmündən boyun qaçıra bilməz. Fələyin çarxını saxlamaq mümkün deyil. Sən nə eləyirsən elə, o dolanır, dolandıqca da bəxtimizdə yazılanlar qabağımıza çıxır. Qərəz, mənim də bəxtimdə belə yazılmış imiş. Gərək Təbrizə gələydim və onu görəydim... Bir gün qollarımı çirməyib işləyirdim. Hava aydın, göyün üzü açıq idi. Yaxşı gün çıxmışdı. Təbrizdə qış günəşinin başqa ləzzəti olur. Bu günəş adamın canını qızdırır, ürəyini həvəslə doldurur. Mənim də ürəyimdə bir həvəs vardı. Qanım qaynayırdı. Bərk işləyirdim. Bu halda elə bil ki, qulağıma bir səs gəldi, ürəyimə qeybdən bir işıq düşdü. Başımı qalxızdım. Nə gördümsə, yerimdə donub qaldım. Dilim tutulan kimi oldu. Gözlərim qamaşdı. Mələk kimi bir qız divarın dibində durmuşdu: günəşin qabağına başqa bir günəş çıxmışdı. O, maraqla mənə baxırdı. Mən onun səliqəli və təmiz geyimini, gözəl vücudunu görüb heyran olmuşdum. İlahi, deyirdim, bu məxluqdur, ya göydən enmiş bir huri, bir pəridir!.. Qız mənim heyrətlə ona baxdığımı görüb gülümsədi:

– Ağa, niyə elə baxırsan? – dedi.

İndi də saç-saqqalımın bu ağ vaxtında da o səs qulaqlarımdan çəkilməmişdir. Bu insan səsi deyildi. Bir bulaq şırıltısı idi, bir ney nidası idi, bir kaman idi. Mən bihuş olmuşdum, nə danışdığımı bilmədim...

– Xanım, – dedim, – sən Allah, de görüm sən məxluqsan, yoxsa sehr-cadusan? Adam şəklinə düşmüş bir xəyalsan? Sənə baxıram, huşum başımdan çıxır... Bu gözəllik insanda ola bilməz!

O, mənə baxdı. Gülümsədi. Lap ürəyimi yerindən çıxaracaq bir əda ilə gülümsədi. Bu gülüşlər, elə bil ki, məni tilsimə saldı. Bəli, mənim əzizlərim, hələ Allah dünyada arvad kimi bir tilsim yaratmayıb. Bu tilsimin sirrinə hələ heç kəs əl apara bilməyibdir. Hələ heç kəs bu tilsimdən çıxıb qaça bilməyibdir. O gün mən də bu tilsimə düşdüm və yaman düşdüm. O gülümsəyə-gülümsəyə, mənim palçıqlı, tozlu üst-başıma nəzər saldı, sağlam və qabarlı əllərimə baxdı. Yonulmamış, lakin maraqlı bir qayaya tamaşa edər kimi məni süzdü.

– Özün taxta yonan olsan da, ruhun şair ruhudur, – dedi.

– Xanım, – dedim, – bacarığım olsaydı, əlimə külüng alıb Fərhad kimi daşları, qayaları çapardım. Sənin şəklini yonardım. Şirindən də şirin bir surət çəkərdim.

– Faydası nədir?..

– Pərvanə oda yananda fayda ki axtarmır, xanım... Məcnun çöllərə düşəndə zərərini fikir eləmirdi, xanım.

– Adın nədir, oğlan?..

– Nökərinizin adı Kərimdir. Xanımın adını bilsəm, günah olmaz ki?

– Böyük günah olar. Adımı neyləyirsən, özümü görürsən bəsdir. Odur, ağa da gəlir, istəsən o sənə mənim adımı deyər, xudahafiz...

O gülümsəyib getdi. Mən onun, ərbabın qızı olduğunu anladım. Ümidsizlik məni aldı. Mən hara, ağayi Mükərrəmüddövlə hara, deyə fikirləşdim... Əlim, ayağım işdən düşdü... Hərəkət edə bilmədim. Kaş bu qız satın alma bir kəniz olaydı, mən onu götürüb qaçaydım. Kaş o, divlərin əlinə düşmüş olaydı, mən onu xilas edərdim, amma onu almaq, ona evlənmək mahal işdir!.. O gündən mənim fikrim dağıldı... Gözlərim qapılarda qaldı. Hər yerdə o qızı axtarmağa başladım. Gecələr yuxuma da o girdi. Onun fikrini ürəyimdən çıxarda bilmədim ki, bilmədim. – Axır dərdimi açıb Azərə dedim. O azca fikirləşdi və böyük bir həvəslə:

– Heç qəm çəkmə, – dedi, – bir gün yaranan bir gün də öləcək. İndi ki xoşuna gəlib, aşiq olmusan, gəl götürək qaçaq. Nə olacaq olsun, götürək qaçaq.

– Nə deyirsən, canım, dərimizə saman təpərlər... Dədəmizi dalımıza səriyərlər, biz cəhənnəm, o qız bədnam olar.

– Heç-zad olmaz. Öldürərlər–öldürsünlər. Nədən ehtiyat edirsən? Arzun ürəyində qalınca, ölmək yaxşıdır. Gəl qızı götürək qaçaq!..

– Ölümdən qorxmuram, Azər. Bircə şeydən qorxuram, qorxuram ki, qız məni istəməyə. Onu bədnam eləyəm. Özüm də bişərəf iş görəm. Bundan qorxuram.

– Onda, göz yetir, fürsət axtar. Bir də rast gələndə əhvalatı aç, gördün ki, ürəyində bir şey var, mənə him elə, qulluğunda hazıram. Götürək qaçaq.

Səhərdən axşama qədər əlim taxta yonur, gözüm qapıları gəzirdi. Hər yanda onu axtarırdım. İki gün o, həyətdə görünmədi. Ümidsizlik və fikir məni lap üzüb əldən salmışdı.

Nəhayət, üçüncü gün həyətə çıxdığını gördüm. Tez ona yaxınlaşdım.

– Salam, xanım! Ay buludda gizlənən kimi birdən yox oldunuz...

– Yoxsa siz məni axtarırdınız?..

– Hər gün, hər saat, hər dəqiqə...

– Mənə yaxınlaşmayınız, oğlan, özünüzə yazığınız gəlsin... Bu təhlükəli oyundan qaçınız... Əcəl sizi girləməsin...

– Onsuz da bu dünyada bir qonağıq, xanım... Bir can ki, bir gün çıxacaq, qoy dost yolunda çıxsın.

– Başına elə oyun açarlar ki, ölümü axtararsan əlinə düşməz, oğlan...

Gördüm ki, yox, xanım məni sınamaq istəyir, qeyrət mənə güc gəldi, özümü yığışdırıb dedim:

– Xanımın canı sağ olsun.

Yar yolunda çovğun olar, qar olar.
Qorxu çəkmək igidlərə ar olar.

Ay uşaqlar, baxdım ki, sözüm ona təsir etdi... Gördüm ki, bərk fikrə getdi. Lap gözümün içinə baxıb soruşdu:

– Deməli, heç şeydən qorxmursan? Nə desəm hazırsan? Hə?..

– Lap desən ki, başını qoy qılıncın altına, qoyaram. Bu canım, bu da sən!..

– Onda gecə saat on ikidən bir rüb keçəndə gələrsən danışarıq. Gecədən bir rüb keçəndə. Qapını döyməzsən. İtələrsən, açıldı içəri girərsən, açılmadı gözlərsən, ta açılana qədər... xudahafiz...

O getdi. Məni bərk ürək döyünməsi tutdu. Sevinc, maraq və vüsal həsrəti məni öldürürdü. Dəqiqələri saymağa başladım. Günü nə cür başa vurduğumu bilmədim. Axşam əhvalatı Azərə danışdım, hərəkətim ona xoş gəldi.

– Bax, belə qızın yolunda ölmək kişilikdir, – dedi. – Yoxsa elçiynən alınan arvad, hinində tutulan toyuq kimi bir şeydir. Ləzzəti olmaz. Amma bu başqa məsələ. Ölsəm də eybi yoxdur. Halaldır.

Saat on iki tamamda biz mənzilimizdən çıxdıq. On ikidən bir rüb keçəndə qapını itələdik, açılmadı. Küçədə gəzməyə başladıq. Yarım saat keçdi, bir saat keçdi, bir hənirti olmadı, qapıya əl vurduq açılmadı. Başımıza min bir fikir gəldi. Gecə saat birdə küçələrdən get-gəl tamam kəsildikdə, mən davam gətirə bilmədim:

– Azər, – dedim, – belə qayıdıb getmək əbləhlikdir... Belə getsəm, qiyamətə qədər bu dərdi ürəyimdən çıxarda bilmərəm. Gərək içəri girəm. – Azər fikrimi anlayıb heç bir söz demədi, dizlərini yerə qoyub məni çiyninə aldı və divara dırmaşmağa kömək etdi.

– Yavaşca yerə sıçrarsan, bir az sağ tərəfdən, ora yumşaqdır... Bir şey olsa, fit çalarsan, özümü yetirərəm, – dedi.

Mən azca divarın üstü ilə yeriyib həyətə sıçradım... Əlləri üstə yerə düşüb tez özümü dikəltdim. Heç bir səs-səmir yox idi. Yavaşca birinci həyətdən keçib arvadlara məxsus ikinci həyətə girdim. Ətrafa göz gəzdirdim. Bütün otaqların işığı sönmüş, hamı yatmışdı. Yalnız onun pəncərəsinin dalından zorla görünən zəif bir işıq çıxırdı. Bu da çıraq yox, şam işığı idi. Mən ahəstə addımlarla oraya yaxınlaşdım. Durub nəfəs almadan qulaq asdım. Heç bir səs yox idi. Azca da irəliləyib qulağımı pəncərəyə dayadım. Hənirti duydum, maraq və həyəcandan bağrım çatlayırdı. Daha artıq pəncərəyə qısıldım. Eşitdiklərimə inanmadım. O mələk, kimin isə qarşısında ağlayır, yalvarırdı:

– Sizi and verirəm ananızın qəbrinə, məndən əl çəkiniz. Bir şam ki, sizə işıq salmayacaq, onu alışdırmayınız. Bir ocağın ki, odunu görməyəcəksiniz, külü ilə niyə oynayırsınız. Məndən sizə arvad olmayacaq... Bir daş, bir divarla evlənsəniz daha xoşdur... Məndən əl götürünüz.

Mən cılız və tiryəki bir adamın səsinə oxşar bir səs eşitdim:

– Xanım Minirə (mən onun adının Minirə olduğunu anladım), mən nə ki, lazım idi sizə dedim. Siz ki, öz xanıvadənizin səadətini istəmirsiniz, özünüz bilərsiniz. Bir də sizə deyirəm, xoşluqla razı olun. Biləks bu mülk, bu var-yox əlinizdən gedəcəkdir. Yurdunuz viran qalacaq!..

Onlar uzun müddət danışdılar. Tanımadığım adam Minirənin nə təhdidlərinə, nə göz yaşı və yalvarmasına qulaq asmadı, yumşalmadı. O, əlinə maral düşmüş bir canavar kimi arxayın, xudbin və təkəbbürlə danışırdı. O, ölümlə öz arasında olan məsafədən xəbərsiz idi. Mən Minirənin yaralı bir maral kimi çırpındığını gördükdə davam gətirə bilməyib özümü qapıdan içəri atdım. Solğun şam işığında onların hər ikisi heyrətlə mənə baxdılar. Mən aman verməyib qarşımda durmuş, bayaqdan bəri özünü bir əjdaha bilən nazik, qarayanız adamın boğazından tutdum. İki əlimlə gücüm gəldiyi qədər sıxdım. O, bıçaq altındakı toyuq kimi çapaladı. Əl-qol atdı. Bir şey eləyə bilmədi... Beşcə dəqiqə keçməmiş mən onun kömürə dönmüş ənazəsini bir küncə atdım, sonra qar kimi ağarmış və mat-məbhut kənardan mənə baxan Minirəyə döndüm:

– Xanım, məni bağışlayın, – dedim. – Bu ilanı boğmasaydım, sizi zəhərləyə bilərdi.

O, şaşqınlığını bildirən bir səslə:

– Siz nə etdiniz? Nə etdiniz? – dedi.

– Bir şey olmayıb, xanım. Narahat olmayın. Elə beləcə də mən onu götürüb gedərəm.

Mən cənazəni dalıma alıb çıxmaq istərkən, onun səsini eşitdim:

– Doğrudan da igid adamsınız!

– Qulunuzam, xanım! Mürəxxəs ola bilərəm?.. İcazə buyurursunuz?..

O azca düşünüb mənə tərəf gəldi və əlimdən tutdu:

– Bəs məni hara qoyub gedirsən?.. – Artıq mən burada qala bilmərəm. Dayan, bir yerdə gedək, – dedi.

Üççə dəqiqədə şeylərini yığışdırdı, balaca bir çamadanı mənə verdi. Mən bir əlimlə cənazəni dalıma atıb o biri əlimlə Minirənin kiçik çamadanını götürdüm. Minirə otağın qapısını örtdü, qabağa düşdü. Biz sakitcə həyət qapısını açıb küçəyə çıxdıq... Azər tez bizə yaxınlaşdı. Mən çamadanı ona verdim... Cılız adamın cənazəsini Təbrizin kənarında Marağa yolundan bir az kənarda dərin bir yerdə basdırdıq. Sonra birbaş kənd deyib şəhərdən uzaqlaşdıq. Cılız adamın dərbara yaxın bir adam olduğunu Minirə mənə dedi. O, istədiyi adamın evini yıxa bilərdi. Sürgünə göndərə bilərdi. Dardan asdıra bilərdi. Mülk-malını talan elətdirə bilərdi... Bunların hamısını da, dərbarın gücünə, dövlətin, qanunun gücünə... Dünya elə əvvəldən belə qurulmuşdur, mənim əzizlərim... Qanun ki, deyirlər, avamın ayağında zəncirdir. Böyüklərin əlində tələdir. Dövlət ki, deyirlər, rəiyyət üçün qılıncdır, hakimlər üçün bir qara dəmir parçasıdır. Dünya elə əvvəldən də belə olub. İndi də belədir. Qərəz, Minirəni götürüb kəndə gəldim. Bir müddət onu hamıdan gizlin saxladım. İşin üstü açılacağından qorxub uzaq bir yerə çəkilməyi qərara aldım. Azər də fikrimi bəyəndi. Götürüb Urmi tərəfə, bizim Borçalı elinin içinə çəkildim. Onlar igid tayfadır. Pənah gətirəni satmazlar. Azər də bizimlə getdi. Dəbdəbəyə, cah-calala öyrənmiş Minirə bir kürd qızı kimi igid və dözümlü çıxdı. At belində dağlara-daşlara düşdü, soyuqda çöldə, quru yerdə qaldı, odsuz-ocaqsız dolandı, bir kəlmə nə uf dedi, nə şikayət etdi... Özünün də od kimi isti ürəyi vardı. Onu görməsəydim, dünyanın ləzzətindən xəbərsiz gedərdim. Bəli, mənim əzizlərim, indiki zamanda elə arvad tapmaq olmaz. Minirə kimi arvad, Azər kimi yoldaş tapılmaz...

– Bəs onlar nə oldu, Kərim dayı? – deyə Saleh tələsik sual etdi.

– Nə olacaq, oğul, dedim ki, bu qara torpağın yemədiyi bir adam yoxdur. Onları da bu acgöz torpaq apardı. Amma onlar bu dünyadan şərəflə getdilər. Qulaq as oğul, səndən də qabaq tüfəng götürüb vuruşanlar olubdur. Qulaq as gör azadlıq yolunda nə qanlar tökülüb... Çünki azadlıq mübarizəsi qurbanlar tələb edir. Qulaq as! İyirmi beş-otuz il əvvəl Təbrizdə demokratiya qurulduğu zamanlar idi... Onda da indiki

kimi kəndlər, şəhərlər qaynaşırdı. Camaat azadlıqdan, demokratlıqdan dəm vururdu. Deyirdilər ki, Rusiyada da padşahı qovublar. Hökumət keçib xalqın əlinə. Onda biz də meydana çıxdıq. Dəstəmizə Azadi adlı müəllim başçılıq edirdi. Mən özüm onu görmüşdüm. Hətta əlinin altında da işləmişdim. Çox məruf, çox pak, çox da ağıllı, tədbirli bir vücud idi. Azərbaycanı bərk sevirdi. Deyirdi Azərbaycanın xarabalarını gərək abad edək, yerində azadıstan və abadıstan düzəldək. Lap yaxşı yadımdadır, deyərdi: bu torpağın dünyada misli yoxdur. Burada gərək azadıstan və abadıstan yaradaq. Bu sözləri mən öz qulaqlarımla onun ağzından eşitmişəm. Onda biz silah götürüb Azadinin başına yığışmışdıq. Mən də, Azər də, Minirə də demokrat yazılmışdıq, fədai olmuşduq. Əvvəllər işlərimiz çox yaxşı gedirdi. Təbrizdə əncümən qurmuşduq. Hökumət xalqın əlinə keçmişdi. Xain və oğru məmurları tamam Azərbaycandan qovub çıxarmışdıq. Amma sonradan işlər dəyişdi. Gah osmanlı konsulu, gah ingilis konsulu işə barmaq soxdu. Bilirsiniz, mənim əzizlərim, bu İran torpağında bir qatıq maya bağlamaz; çünki barmaq uzadan çoxdur. Allah bizi indiki nəhzətimizi də bu xarici əllərdən saxlasın... Sözün düzü ki, indi də işlərin aqibəti məni qorxudur... İngilisin havası heç xoşuma gəlmir. Onda da ingilis konsulxanası bu Təbrizdə başımıza bir oyun açdı, bir əməllərdən çıxdı ki, heç deyiləsi deyil. Rəhmətlik Azadi deyərdi ki, biz Tehranın noxtasını gərək Azərbaycanın başına keçməyə qoymayaq. Həm də ki, bu noxta başqalarının əlindədir, bizi də çəkib çox pis dərələrə salarlar. Qərəz, nə başınızı ağrıdım... Qiyamdan altı ay keçər-keçməz ingilislər Müxbirissəltənəni iş başına gətirdilər. O da əvvəllər indiki bəzi ağalar kimi azadxahlıq donuna bürünmüşdü... Amma elə ki, fürsət əlinə keçdi, Şümrün də görmədiyi narəva işlər gördü. Danışıq apara-apara hökumət qoşunlarını üstümüzə çəkdi. Bizi xəfiləyib alaqapını tutdu. Dəstəmiz Saman meydanına tərəf çəkildi. Payızın ortalarında çaharşənbə axşamı gecə səhərə kimi atışma oldu. O günlər Minirə məndən ayrılmırdı. Elə hər dəqiqə yanımda olurdu. Gah yaralanan yoldaşlarımızı rahatlandırır, gah da tüfəng götürüb atışırdı. Amma bir saat məndən aralanmırdı. Ürəyi çox naziklışmişdi. Adamın pis günündə vəfalı arvaddan yaxşı şey yoxdur, mənim əzizlərim. Bəli, vəfalı arvad!.. Üstünə dağ da tökülsə, ağırlıq bilmirsən. Dərd-qəm dəvə yükü ilə gəlsə, onun bir sözü hamısını vurub dağıdar. Arvad mehribançılığı hər baldan şirindir. Ələlxüsus ki, adamın pis günündə!.. Minirə də belə idi. O, ağır günlərimdə mənim dayağım, ümidim olmuşdu. Fələyin çərxi dönsün. Mənə bir dağ çəkib

ki, acısı qiyamətdə də ürəyimdən getməz. Bir gün yaman atışma başlamışdı. Müxbirissəltənənin dəstələri bizi əhatə edib ya qırmaq, ya da diri-diri tutmaq istəyirdilər. Bizimkilər də yaman vuruşurdular. Minirə bir igid kimi papaq qoymuş, patrondaş bağlayıb beşaçılanı sinəsinə basmışdı. Eh... oğullarım... onu bir görəydiniz, arvad deyil, bir tərlan balası idi... Bir göyərçin idi, qara tüklü papağın altından üzü bir ay kimi işıq verirdi. Dodaqları lalə kimi yanırdı. Acıqlı gözləri bir cüt ulduz kimi parıldayırdı. Nə deyim fələyə! Onun da dağını mənim sinəmə vurdu. Atışmanın ağır bir yerində yoldaşlarımızdan biri yaralanıb səngərin o tayına düşdü. Minirə onu düşmənlərə verməmək üçün səngərdən sıçradı. Onu gördüm ki, yaralı yoldaşımızı çiyninə alıb o yana atıldı. Əli qurusun düşmənin!.. Bir güllə onu kürəyindən vurdu. Minirə yaralı ilə bir yerdə bir tərəfə yıxıldı. Mən özümü onun üstünə atdım, onu tez bir kənara çəkdim, başını dizlərimin üstünə aldım. O, dizlərimi qucaqlayıb altdan-yuxarı məlul-məlul mənə baxırdı.

– Kərim, bir azdan sonra məni basdıracaqsan, – deyirdi. – Səndən bircə xahişim var, tez məni buradan çıxart apar. Meyitimi aralarda qoyma. Yaxşı bir yerdə basdır. Qəbrimi nişanla, cümə axşamları qəbrimin üstünə gəl. Sənin ayağın torpağıma dəyəndə ruhum şad olar. Amma aralarda qalsam, meyitimi it-qurd ayaqlar. Sən məni axtarıb tapa bilməzsən. Ruhumu yetim qoyarsan... Bu dünyadan bizə qalan nədir? Bir qəbir daşından başqa heç nə. Mənə yaxşı bir qəbir daşı yondurarsan...

O danışdıqca mən əllərini, saçlarını öpürdüm. Onu duz kimi yalayırdım. Mən nəfəsimi onun nəfəsinə qatmaq, onu yaşatmaq istəyirdim. Amma heyf, heyif ki, çarə yox idi. Ölüm öz kölgəsini yavaş-yavaş onun üzünə salırdı. Onun ölmək istəmədiyini mən görürdüm. Dünyada insanın ölümündən də ağır bir şey yoxdur. O mənim dizlərimin üstündə bir şam kimi əriyirdi. Bir gün kimi batıb gedirdi. Mən aciz bir qul kimi, səhralarda tək qalmış bir nökər kimi durub baxırdım. Ürəyim bir dərya kimi çalxalanırdı. Onu bağrıma basırdım, ölümə vermək istəmirdim. Amma ölüm gəlirdi. Onun dodaqlarını, gözlərini bağlamaq istəyirdi... Son nəfəsində də o həsrətlə gözlərini mənə dikib durmuşdu. Üzündə xoş bir təbəssüm vardı. Günəş batandan sonra göy üzündəki qızartıları görmüşsünüzmü? Bax, eləcə onun da üzündə, dodaqlarında bir təbəssüm, bir həyat xatirəsi qalmışdı. Mən onun cənazəsini bu halda qara torpağa verdim. Xatirəsini isə ürəyimdə basdırdım. Hər iki qəbrə indiyə qədər yabançı bir əl dəyməmişdir.

Kərim dayı, gözlərini yumaraq susdu. Bir dəri və bir sümükdən ibarət olan üzündə əzab və iztirabın işarələri göründü. Gənclik xatirələri skeletə oxşayan vücudunda bir həyat qığılcımı yandırmış olmalıdır ki, o, yerində qımıldandı və oturanlara nəzər salıb köksünü ötürdü.

– Fələk Minirənin dağını mənə az gördü... Onun üstündən də Azərin dağını basdı. Amma o yazığın başına gələn heç düşmənin də başına gəlməsin. Müxbirissəltənənin qoşunları alaqapını alanda, biz Azərdən ayrı düşdük. O, Azadinin başında geri çəkilən fədailərin içində idi. Onlar Azadini bir can kimi qoruyurdular. Amma neyləmək olar. Olacağa çarə yoxdur. Yazılan pozulmamış. Onların da bəxtində yazılan bu imiş. Azadini diri-diri tutmaq istəyən düşmən üstünə çoxlu qoşun göndərmişdi. Azadinin adamları şir kimi vuruşurdular... Lakin birdənbirə onlar mühasirəyə düşdülər. Görürlər ki, xeyr, işin aqibəti pisdir, Azadini tutacaqlar. Onda Azər başda olmaqla bir dəstə özünü düşmənin qabaq səflərinə vurur. Düşmən səfləri dağılır. Azadini aradan çıxarırlar. Həmin vuruşmada Azər yaralanır. Bir neçə yoldaşı ilə əsir düşür. Müxbirissəltənə onların hamısını dara çəkdirib cənazələrini şəhərin küçələrində sürütdürdü. Belədir, mənim əzizlərim, azadlıq yolunda verilən qurbanların sayı-hesabı yoxdur. Görənlər nağıl edirdilər ki, Azər dar ağacının altında da: "Yaşasın azadlıq!" – deyə qışqırıbdır. Kəndiri boğazına atanda: "Yoldaşlarımız bizim intiqamımızı alarlar!" deyibdir. Saqqalımın bu ağ vaxtında tüfəngi bihudə yerə çiynimə salmamışam, mənim əzizlərim.

Hamı Kərim dayının söhbətini düşünərək susurdu. Artıq tonqalın da gözlərini kül basmışdı. Gecə yarısından xeyli keçdiyindən tonqal başındakıların da çoxlarını yuxu aparmışdı. Bəziləri də mürgüləməyə başlayırdı. Adamlar bir-birinə söykənərək, bir-birinə qısılaraq yatırdılar. Kərim dayının da gözləri qapanırdı. Azca sonra artıq o, tüfəngini qucağına sıxaraq başını özü kimi cırıq çuxalı, keçə papaqlı birisinin böyrünə söykəmiş, ölümlə həyat arasında olan vücudunu yuxuya tapşırmışdı.

Bir az o yanda Təbrizin sönük işıqları görünürdü. Ay da buludları yararaq çıxmağa başlayırdı. O, arasıkəsilməz insan faciə və sevinclərinin əbədi hərəkətini xatırladır kimi buludların arasında tərpənir, soyuq işıqlarını torpağın üstünə tökürdü.

*Bakı, 1957*

# ON İKİ DEKABR

O günü xatırladıqca sən gözlərimdə canlanırsan... Yox, gözlərimdə canlanırsan demək azdır, hərdən mənə elə gəlir ki, qəlbimin döyüntüsündə sənin səsini eşidirəm. Hətta, indi mənə yuxu kimi, uzaq bir xəyal kimi görünən o günlərin xatirəsinə daldıqda hissiyyat bütün varlığıma hakim olurkən, elə bilirəm ki, sən yanımda oturmuş, əlini çiynimə qoymuşsan... Biz söhbət edir, xəyalata sonsuz bir azadlıq verir, üfüqlərə baxıb fikrə gedirik... Bu zaman mən sənin nəfəsini duyur, səsini eşidirəm: "Mahmud, dostum, bu günü unutmaq, yaddan çıxarmaq olarmı? – deyirsən. – Zülmətlərə işıq: məhbəslərə azadlıq, aclara çörək ümidi gətirən bu günü unutmaq olarmı?.. Bir xalqın, bir torpağın azadlıq müjdəsi olan bir günü unudarlarmı?.. Yox! yox! Azərbaycan torpağı heç bir zaman bu günü unutmayacaqdır!..".

Zamanın təkəri hərləndikcə, günlər aylara, aylar fəsillərə çevrildikcə, şahidi olduğumuz hadisələr bir xatirəyə dönüb qəlbimi həsrətlə doldurduqca sənin sözlərindəki mənə və həqiqəti anlayıram... Anlayıram ki, doğrudan da, o günü unutmaq olmaz. Gələcək nəsillərin hökmünü bilmirəm, amma bizim üçün o gün böyük və əziz bir gündür... Qəbrə qədər o gün qəlbimizdə yaşayacaq, xəyalımızdan silinməyəcəkdir!.. Bəli, o günü, 1945-ci ilin çaharşənbə gününü, on iki dekabr gününü biz heç bir zaman unutmayacağıq!..

Xatirində varmı, o gün biz səhər çox tezdən durmuşduq. Daha doğrusu, biz bütün gecəni yata bilməmişdik. Üstünü duman almış Təbrizdə xəfif bir şaxta vardı... Eynal-Zeynal dağlarının çılpaq və qırmızı rəngli yamacları qarla örtülmüşdü... Uzaqlarda, qərbdə bağlı-bağatlı Marağanın üstündəki Səhənd dağının zirvəsi buludların içində itmişdi... Başı qarlı, zirvəsi dumanlı bu dağlar bir sərkərdənin salamına durmuş qoşun kimi Təbrizə baş əymişdilər. Ah, o gün, Təbrizin nə qədər əzəmətli, nə qədər xəyali bir görkəmi vardı!.. O, öz zindanını uçurtmuş bir məhbus, ölkəsini xilas etmək üçün ölümə gedən bir əsgər kimi qürurlu idi. O, fırtına qabağı sakit duran bir dəryanı andırırdı... Onun hər daşında bir sirr, bir məna görünürdü... O zaman Təbrizə baxan hər kəs bir hadisə baş verəcəyini, nə isə qeyri-adi və böyük bir iş olacağını gözləyirdi... Hamı intizarda idi... Lakin heç kəs bir saat sonranı xəbər verə bilmirdi...

O zaman bütün Azərbaycanın, bütün İranın gözü Təbrizdə idi... Hamı Təbrizə baxırdı. Onun nə edəcəyini gözləyirdi... Bizim taleyimiz onun

hərəkətindən asılı idi. Azərbaycan torpağının gələcəyi, İran azadlığının taleyi onun əlində idi. Dönə-dönə qılınc götürüb qanlı mübarizələrə girişmiş, səadət qapılarını açacağı, azadlıq bayrağını əbədi olaraq qaldıracağı yerdə bədbəxtliyə uğramış, taleyin qəzəbinə rast gəlmiş, qolları bağlanaraq yenidən zülmət zindanlara atılmış bu qəhrəman bir daha ayağa qalxmaq, qılınc vurmaq üçün özündə bir mətanət və qüdrət, ruh və rəşadət tapacaqdımı?.. Biz Təbrizə baxır və belə düşünürdük... Biz deyirdik ki, "Yox!.. Bu dəfə məğlubiyyət ola bilməz!.. Bu dəfə heç bir hiylə və təzvir bu qəhrəmanın əlindən əbədi azadlıq bayrağını qopara bilməz. Bu son və qəti vuruşdur... Bu vuruşda Təbriz qalib gələcəkdir!.. O gün bizim qəti inamımız belə idi... Sənin atanı xatırlayıram, əzizim!.. O, bizim bu danışıqlarımıza qulaq asarkən Səttarxan xiyabanındakı xarici kitab mağazasını və hər gün Londonun, Anqaranın fars dilində verilişlərini Təbrizə yayan oradakı böyük radionu göstərib deyərdi:

– Əgər qoysalar...

Biz o zaman bu sözlərdəki mənanı o qədər də anlamaz və qoca kişinin etiqad süstlüyündə ittiham edərdik... O, buna cavab olaraq gülə-gülə təbrizlilərin 1942-ci ildə düzəltdikləri bir havanı dodaqaltı oxuyardı:

Almanın həvəsi pisdi,
Rusların börkü misdi...
Bizi bu dərdə salan
Köpək oğlu ingilisdi...
Ay nənə tank gəldi...
Ürəyimə yank gəldi...
Kişmişlə çay içməkdən
Dişlərimə sank gəldi...

Çox vaxt biz onun bu gülməli mahnısını yarımçıq qoyub gedərdik... Xüsusilə Məlusə yanımızda olduğu zaman biz tezcə otaqdan çıxardıq... Çünki o, bu mahnıya sakit qulaq asa bilməzdi... "Bu bir millətin acizliyimi, yoxsa nifrətimidir?" deyə min cür mülahizələr yürüdərdi... Ah, dostum, bu nəcib və incə təbiətli qızda nə güclü bir ruh vardı... Onun hazırcavablığı və açıqlığı, iti fikir sahibi olması bizə nə qədər xoş gələrdi... O, hər həftə düzəltdiyimiz yoldaşlıq məclislərinin yaraşığı idi... Xatırlayırsanmı, o bir dəfə Mopassanın "Madumazel Fifi"sindən tərcümə etdiyi bir parçanı bizə ən qızğın bir həvəs və məlahətli bir səslə oxumuşdu... Bütün oğlanlar ağızlarını unutmuş kimi idilər... Bəli, dostum, biz hamımız onun vurğunu

idik... Hamımız o qıza xoş gəlməyi böyük səadət sayırdıq... O, təbiətinə xas bir açıqlıq və rayihə ilə bizi heyran etmişdi... Bilmirəm nədənsə bizlərdən hər kəs özünün Məlusəyə daha artıq xoş gəldiyini düşünürdü... O, bizim hamımızla gülə-gülə, nəvazişlə danışardı... Lakin biz onun gözünə baxarkən aydınlıqdan və duruluqdan başqa bir şey görməzdik... Yalnız səninlə qarşılaşdığı zaman mən bu gözlərdə ani bir təlaş və ciddiyyət görərdim... Hətta sonralar müşahidə etdikdə, onun sənə baxmaqdan qorxduğunun da fərqinə varmışdım... Bir hadisə onun qəlbində yalnız sənə qarşı əsl məhəbbət olduğunu mənə bildirdi... Yadındadırmı, 1944-cü ilin axırlarında biz Gülütan bağında, sovet mədəniyyət evindəki bir müsamirədən çıxmışdıq?.. Gecəni Məlusəgilin evində toplaşacaq idik. Sən hara isə getdin və çox gec gəldin... Biz onların evində oturmuş, şirin söhbət edirdik... Məclisimizdə həm oğlanlar, həm də qızlar vardı. Gah ictimai məsələlərdən, cəmiyyətlərin, xalqların və qövmlərin tarix səhnəsinə çıxmasından, yox olmasından, gah da günün siyasi hadisələrindən danışırdıq... Bəziləri nərd, bəziləri şahmat oynayırdı... Sonra biz patefonda oyun havası çalıb xanımlarla rəqs etdik... Bütün bu müddətdə Məlusə bircə dəfə otaqda görünmüş, dostlarla salamlaşdıqdan sonra gözləri ilə kimi isə axtararaq yox olmuşdu... Dalısınca gedən xanımlar boş qayıtmışdılar. O, nə isə bir şeyi bəhanə edərək, otağa gəlməmişdi... Düz iki saat sonra sən gəldin... Yalnız bundan sonra Məlusə otaqda göründü. O zaman mən Məlusənin səni sevdiyini qəti olaraq kəsdirdim. Ondan iki gün sonra soyuq bir axşamda biz gəzə-gəzə gedib Ərk qalasına çıxmışdıq... Onun qalın və sökük bürclərinin üstündə durub keşikçinin bağına tamaşa edir, danışırdıq... O zaman ilk dəfə sən mənə Məlusəni sevdiyini açıb söylədin... Mən dedim:

– Xob... nəyi gözləyirsən, elçi göndər, işi tamam elə getsin, o ki səni sevir.

Sən qüssəli bir səslə:

– Sevirmi? Gözlər bunu bildirsə də dil etiraf etmir, – dedin. – Bu qəribə bir qızdır, dostum. Özünə məxsus mühakimələri və düşüncələri vardır. Hissiyyat üstündə qurulmuş eşq həyatın boranları içində çox tez sönəcək bir qığılcımdır, deyir... Mən niyə sevdiyimi və niyə sevildiyimi bilmədən heç kəsə ürək vermərəm.

Bu qayda ilə aylar gəlib keçdi... Yoldaşlar hamısı Məlusənin bir gün səni görmədikdə darıxdığını, səni gördükdə qızardığını hiss etdilər... Lakin heç kəs bir eyham və ya bir işarə ilə bunu qıza andırmağa, onunla bu barədə söhbət açmağa cəsarət etmədi... Günəş çiçəklərə,

otlara həyat və təravət verən kimi, məhəbbət də Məlusənin məlahət və gözəlliyini yüz qat artırmışdı... Yoldaşlar bunu gördükcə aranızdakı gizli məhəbbətin uzun sürməsini arzu edirdilər. Sən isə:

– Vətənimiz azad olmayınca mənə səadət yoxdur, – deyirdin...

Mən hiss edirdim ki, Məlusə sadə bir qız deyil, vətənin həqiqi övladıdır. Həssas və uca təbiəti onu mübarizələrə, ictimai döyüş meydanlarına çəkirdi... Buna görə də o, sənə qəti cavab vermir, həyatda yanılmaqdan qorxur, ilk hissiyyata tabe olmaq istəmirdi. Bunu sən də hiss edirdin... O, tez-tez söhbətlərində Qürrətüleyn Tahirədən və Janna d'Arkdan danışar, bu qadınları asimani bir vücud kimi tərifləunder... Onun bu söhbətlərinin mənasını və səbəbini sən də başa düşürdün, mən də... Bu qız, səadəti ailə çərçivəsində axtaranlardan deyildi. Onun qəlbinin başqa arzuları vardı...

Bunu hiss etdikcə də sən ona daha artıq məftun olur və məftunluğunu da gizli saxlaya bilmirdin. Axı, o həyat yolunu ki, sən seçmişdin, ancaq Məlusə ona layiq mübarizə yoldaşı ola bilərdi... Bir dəfə biz üçümüz Gülüstan bağında gəzə-gəzə "Səadət nədir" deyə söhbət edirdik. Mən: "Səadət ehtiyacın məhv edilməsidir, – dedim. – İnsan həyatında ehtiyac aradan qaldırıldıqda əsl səadət yaranacaqdır". Məlusə etiraz etdi:

– Deyəsən siz tərəqqi və təkamülü dayandırmaq fikrindəsiniz. Necə yəni ehtiyacı yox etmək?! Məgər insanın yaxşı bir musiqi parçasını dinləmək, ətirli bir gülüstan becərmək arzuları dəruni bir ehtiyacdan doğmur? Bu ehtiyacı məhv etsəniz, həyatı məhv etmiş olarsınız.

– Mənim:

– Bəs səadət nədir? – sualıma o:

– Əbədi əmək və fəaliyyətdir, – dedi, – elə əmək ki, torpağı abad edir. Elə fəaliyyət ki, vətənin şərəfini artırır... Əsl səadət budur!

Sən böyük bir vəcdlə:

– Məlusə can, belə əmək və fəaliyyət insanı zindanlara aparsa necə, siz onu xoşbəxt hesab edərsinizmi? – deyə soruşduqda, o, belə cavab verdi:

– Nəinki onu xoşbəxt hesab edərəm, hətta gecə-gündüz zindanın qapısında ona şərqilər deyib dərdlərini yüngülləşdirməyi özümə səadət bilərəm! Çünki insan vətən üçün, camaat üçün yaşamalıdır!

Əziz dostum!.. Biz o gündə, dekabrın on ikisində belə düşünürdük... O gün səhər tezdən Şahpur xiyabanının kələ-kötür səkisindən Səttarxan xiyabanına gedərkən, ürək döyüntüsü içərisində susur və belə düşünürdük... Yadındadırmı, Təbrizin ətəklərindən, lap Eynal-

Zeynal dağının dibindən havaya bir güllə atıldı? Biz bir-birimizə baxıb danışmadıq... Sanki ona cavab olaraq Təbrizin qərb üfüqlərindən havaya ikinci, üçüncü bir güllə atdılar. İntizar sükutu içərisində durmuş Təbrizin bir küçəsi, bir evi olmadı ki, bu güllə səslərini eşitməsin. O güllələr təbrizlilərə ölüm xəbəri gətirən bayquş səsini yox, baharın başlandığını xəbər verən bir göy gurultusunu xatırlatdı. O səslər bizdə gənclik arzu və xəyallarının həqiqətə çevrildiyi ümidini doğurdu. Biz bu güllə səslərini eşidərkən mənalı olaraq:

– Başlandı... – deyə yenicə açdıqları dükanlarını bağlayan adamlara baxaraq gülümsədik.

– Bəli, başlandı...

O zaman şəhərdə dərhal bir təlaş, bir hərəkət əmələ gəldi. Səttarxan xiyabanında bir-birinin ardınca düzülmüş faytonlara oturub hara isə tələsən müxtəlif adamlara baxaraq biz də ayaqlarımızın sürətini artırdıq. Bizdaş mağazalara, Mərkəzi Komitə binasına doğru yönəlirkən, "Bəlkə, doğrudan da, başlandı?" deyə düşünürdük. Qarşımıza çıxan və tələsik gedən polis və jandarm nəfərləri bizim bu fikrimizi möhkəmlətmişdi... Üçüncü Azərbaycan leşkəri fərmandehinin bütün əsgərləri kazarmalara yığdığını və əməliyyata hazır olduğunu eşitdikdə qəti olaraq:

– Doğrudan da başlandı... – demişdik...

O gün bələdiyyə idarəsinin və əyalətin damlarında silahlar qoyulmuşdu... İki gün əvvəl müəyyən vahimə törədən bu silahlara, indi, Təbrizin ətəklərində ilk fədai güllələrinin səsi eşidildikdən sonra heç kəs fikir vermirdi... Lakin məclis açılmamış, milli hökumət təşkil olmamış, fədai dəstələrinin Təbrizi əhatə etməsi bizə, nə qədər qəribə görünürdü. Marağadan, Mərənddən və Azərbaycanın başqa yerlərindən tökülüb gəlmiş bu fədai dəstələrini saxlamaq olacaqdımı?

Onlar Təbrizi azad etməyə, onu mürtəce dövlət hakimlərinin əlindən almağa gəlmişdilər... Onlar, qarşısına çıxacaq hər maneəni yandırıb külə çevirən bir vulkan kimi yalnız irəliləmək hissi ilə çırpınırdılar... Mərkəzi Komitədə bizə dərhal fədailərin içinə getməyi tapşırdılar... Biz məclis açılmamış, milli dövlət yaranmamış onların şəhərə girməsinə, hərbi əməliyyatın başlanmasına yol verməməli idik...

– Başa salın ki, biz işin qansız qurtarmasına çalışırıq. Deyin ki, qardaş qanı axıtmaqda heç bir fayda yoxdur. Mürtəcelər hökumət qoşunlarının əli ilə bizi qan içində boğmaq istəyirlər. Fədailəri soyuqqanlı, dözümlü və intizamlı olmağa dəvət edin. Əmri gözləsinlər... Özbaşınalığa yol verməsinlər!..

Biz Mərkəzi Komitədə göstəriş aldıqdan sonra Təbrizi mühasirə etmiş fədailərin içinə getdik... Onlar heyrət ediləsi bir intizamla dəstələrə bölünmüş, keşikçilər qoymuş, başçılar ayırmış, səngərlər düzəltmişdilər... Ayağı çarıqlı, əynində cırıq çuxa, boğazına yun şərf sarıyıb ucunu börkünün üstündə düyünləmiş bir fədai bizi saxladı... Onun yaşı iyirmidən artıq olmazdı... Əsgəri bir ifadə ilə kim olduğumuzu soruşdu. Vəsiqələrimizi yoxladı və Mərkəzi Komitədən gəldiyimizi bildikdə gülümsədi... Kənardan Əli adlı birisini haraylayıb başçılarının dalınca göndərdi... Biz onunla söhbətə başlayıb adının Hümmət olduğunu, özünün Mərənddən gəldiyini öyrəndik... Onlar üç qardaşdılar... Ondan böyüyünün otuz yaşı, kiçiyinin on səkkiz yaşı vardı. Hər üçü fədaidir. Evdə qoca anaları qalmışdır... Sən ondan:

– Niyə bu tüfəngi götürmüsən, nə istəyirsən? – deyə soruşdun.

O, heç bir şey düşünmədən, bir uşaq sadəliyi ilə cavab verdi:

– Azərbaycana azadlıq istəyirik!

Sən onu imtahan edər kimi soruşdun:

– Yaxşı, bu azadlığın sənə nə faydası olacaq?..

O eyni hazırcavablılıq və sadəliklə dedi:

– Oğlan, məni sərimə, necə nə faydası olacaq? Əmniyyənin zülmündən qurtaracağıq... Özümüzün bir tikə torpağımız olacaq... Evimin ixtiyarı öz əlimə keçəcək... Məktəbim, kitabım olacaq.

Onun bu cavabından sonra sən yaşarmış gözlərinlə mənə baxdın. Yanaqlarına süzülən o sevinc yaşlarını indi də unutmamışam, dostum... İndi də sözlərin qulaqlarımda cingildəyir:

– Görürsənmi, Mahmud, yüz minlərlə həmvətənimizin müqəddəs arzusu belədir. Azadlıq arzusu ilə yaşayan bir milləti əbədi əsarətdə saxlamaq qeyri-mümkündür!

Biz fədai dəstələrini gəzdik... Onların başçıları və böyükləri ilə görüşdük. Bir neçə yerdə ayaqüstü mitinqlər oldu... Mərkəzi Komitənin tapşırığını onlara çatdırdıq:

– Səbir edin, tələsməyin, – dedik. – Təbrizdə hərc-mərclik salmaq, xalqın malına və canına qəsd etmək istəyənlər çoxdur... Düşmənlərimizin əlinə heç bir vəsilə verməyin... Onlar, özləri qırğın və talan düzəldib bizi dünyada abırdan salmaq istəyirlər... Ehtiyatlı olun!... Azərbaycanın azadlığı sizdən bunu istəyir.

Onlar bir ağızdan:

– Yaşasın Azərbaycan!.. Yox olsun xainlər!.. – deyə qışqırdılar.

Üç gün onlar bu qayda ilə Təbrizin ətrafında durdular... Gecə-gündüz şaxtada, açıq havada qaldılar. Cırıq çuxalarına bürünüb bir-birinə söykənərək, bir-birinin nəfəsi ilə isinərək onlar Təbrizin keşiyini çəkdilər... O zaman onların ara-sıra havaya atdığı güllələr təbrizliləri bidar etmirdi... Bu güllələr xalq səadətinin keşiyində durmuş mübarizlərin ayıq olduğunu şəhər əhalisinə bildirir, xainləri vahiməyə salır, mürtəceləri dəhşətə gətirirdi... Biz o zaman hərəkətə gəlmiş xalq kütlələrindəki ecazkar mənəvi qüvvəyə və böyük əxlaqa heyran olmuşduq... Ayrı-ayrılıqda savadsız, elmsiz və dünya işlərindən xəbərsiz görünən bu insanla bir yerə toplandıqda nə böyük bir mənəviyyat, nə yüksək bir şüuru təcəssüm etdirirdilər... Onların arasındakı intizam və başçılarına olan hörmət bizi heyran etmişdi. Bu intizam və əxlaqı yalnız yüksək qayələr yolunda vuruşan ordularda tapmaq olardı... Biz onlara baxır, "bunlar balaca bir xalqın səadəti yolunda vuruşa qalxmış olsalar da, qayələri böyükdür... Onların azadlıq adlı bir tanrısı vardır... Onlar doğrudan da azadlıq fədailəridir"... deyirdik.

Biz Mərkəzi Komitə tapşırığını fədailərə çatdırdıqdan sonra tezliklə şəhərə qayıtmaq, bu gün açılacaq birinci Azərbaycan məclisində iştirak etmək istəyirdik. Bu zaman bizdən xeyli aralı bir dəstə fədainin "ura" basdığını eşitdik... Maraqla onlara yaxınlaşdıq, fədailər bir dəstə qızı əhatə etmiş, onlardan nə isə alır və şadlıqla təşəkkür edirdilər. Bunlar Təbriz xanımlarından fədailərə hədiyyə gətirmiş qızlar idi. Biz Məlusəni də onların arasında gördükdə bir-birimizə baxdıq və nə qədər də sevindik. Məlusə də bizi görüb gülümsədi... Gözləri sənin gözünə sataşarkən yanaqlarında ani bir qızartı əmələ gəldi... Sonra o özünə məxsus azad bir hərəkətlə bizə yaxınlaşaraq salam verdi... Sən də, mən də onun əlini sıxdıq, od kimi yanan gözlərinə baxdıq. Mən həyəcandan sənin dilinin tutulduğunu hiss etdim. Həmişə olduğu kimi ona yarızarafatla söz atdım.

– Məlusə xanım, siz bu gün fövqəladə gözəlsiniz, – dedim. – Lap ilk bahar laləsi kimi gözəl və mənalısınız!

O, qaşaltı məni süzərək bir an içində cavab verdi:

– Bu gün hər şey gözəl, hər şey mənalıdır, – dedi. – Bu torpaq, bu göylər, bu dağlar məgər gözəl deyil?.. Bu yüzlərlə insanlar, onlara hədiyyə gətirmiş bu qızlar, nəhayət, siz özünüz gözəl və mənalı deyilsinizmi?.. Ümid və səadət qapısında hər şey gözəl, hər şey mənalı olur!..

Mən:

– Təbiətən nəcib olanlar daha artıq!.. – dedim.

O, yenə, sənin ürəyinə işləyən bir təbəssümlə gülümsədi... Nə isə demək istərkən, fədailərdən birisi ona yaxınlaşaraq, əsgəri bir nizamla qarşısında durub dedi:

– Xanım, buyurunuz!.. Hər şey hazırdır!..

Məlusə:

– Mən fədailərə təbrizli bacılarımın salamını yetirməliyəm... Yoxsa məni şəhərə buraxmazlar, – deyib fədainin arxasınca getdi... Bütün bu söhbət əsnasında sən bir kəlmə də danışmadın. Sakit və azca qüssəli nəzərlərini ona dikib durdun. Mən isə bilirdim ki, onun dili mənimlə danışırsa, qəlbi səninlə söhbət edirdi... Sizin gözləriniz bir hekayət söyləyir, bir kitab oxuyurdu...

Bu dəfə o getdikdən sonra, sən mənə heç bir söz demədin... Elə beləcə sakit halda da biz şəhərə qayıtdıq... Sənin öz xəyalların, öz qəlbinlə söhbət etdiyini görərək mən sükutu pozmağa çalışmadım...

Biz Təbrizə daxil olanda artıq günəş çoxdan çıxmış, buludları dağıdaraq ılıq və xoş ziyasını dağlara, bağlara, küçələrə və evlərə yaymışdı... Meydan-bazar qızışmışdı... Küçələr böyük-kiçik, arvad-uşaqla qaynaşırdı... Xüsusilə Səttarxan xiyabanı adamla dolu idi... Biz məclis-millinin açılacağı "Didəban" kinosuna getdik... Oraya yaxınlaşdıqca küçədən keçmək çətinləşirdi... Təbrizlilər maraqla bu binanın qabağına toplaşmış, böyük sevinclə onun bəzənmiş qapısına baxır, içəri girən vəkilləri barmaqla nişan verirdilər...

...Demokrat firqəsinin başçıları gələndə əhali "ura" səsləri qopartdı; çəpik çalındı... Hələ məclis açılmamış vəkillər bir-birilə görüşür, mübarəkbadlıq edir, şadlıqdan göz yaşlarını saxlaya bilmirdilər. Ah!.. Onlarda nə böyük bir sevinc vardı... Gözlər, baxışlar böyük bir ümidlə dolu idi... O gün hamıda Azərbaycan tarixinin, xalqımızın azadlıq tarixinin yeni bir səhifəsi yazıldığına sarsılmaz bir inam vardı... Biz o balaca zalda, məclisin ilk sadə və sakit iclasında oturduğumuz zaman xəyalımızda böyük bir gələcəyin səhnələri canlanırdı... Tənəffüsdə vəkillər hamısı, Azərbaycan şəhər və kəndlərinin abad olacağından danışırdılar... Onlar məktəblər, həkimxanalar, müalicə və tərbiyə evləri yaratmaqdan işsizlik və səfaləti əbədilik məhv etməkdən şirin-şirin danışır, Asiyanın kiçik bir guşəsində düşmüş Azərbaycanı yüksək mədəniyyət və tərəqqi yoluna çıxarmaq, qabaqcıl bir məmləkət halına salmaq planını tuturdular... Bunlar bir xəyal, bir təsəvvür, bir arzu da olsa, o zaman bizə çox sadə və təbii görünürdü.

Ah!.. O günü, biz unuda bilərikmi, əziz dostum!.. Min illər gəlib keçsə, əbədi hərəkətdə olan siyasət dəryası min fırtına qoparsa, hər şeyi udub məhv etsə də o günü nəsillərin xəyalından silə bilməyəcəkdir!..

Xatırlayırsanmı, o günü axşam biz yenə Məlusəgilin evinə yığışmışdıq... Danışır, gülür, bir-birimizi dəruni bir sevinclə təbrik edirdik... Məlusə də fədailərin içərisindən qayıtmış, sənin sevdiyin və ona çox yaraşan qırmızı ipək paltarını geymişdi... Yanaqları da ipəyin rəngi kimi, lakin təbii bir rənglə alışıb-yanırdı... O gün Məlusə bütün məclisdə heç kəsə macal vermir, min bir xəyalın doğurduğu şirin və mənalı sözlər danışırdı... Kim isə birdən-birə:

– Uşaqlar, görək dünya bizim işlərə necə baxır? – deyə radionu qurdu. Hamımız maraqla onun başına toplandıq. Anqara Londonun guya Tehrandan alıb yaydığı bir xəbəri təkrar edərək Azərbaycanda vəziyyətin ağır olduğunu, Təbrizdə talan və qırğınlar başlandığını deyir, Azərbaycan demokrat və azadxahlarını “macəracu və asi” adlandırırdı. Bunu eşidən Məlusə:

– Dadaş, onun səsini kəs! – deyə mənə müraciət etdi. Mən radionu bağladım... Məlusə böyük bir kədərlə:

– Biz azad yaşamaq, öz evimizin sahibi olmaq istəyirik... Onlar bizi asi və cani adlandırırlar... Mübarizə uzun gedəcəkdir... Dostlar, bu səs imperialistlərin səsidir.

Mübarizə uzun gedəcəkdir!..

Uşaqlardan birisi eyni mənalı və kədərli səslə dedi:

– Onlar Şərqin üstünü bir bulud kimi kəsmişlər, başının üstündə bir cəllad bıçağı kimi durmuşlar!.. Nə qədər ki, Yer üzündə imperializmin bu qara və heybətli əli var, Şərqə səadət yoxdur!..

Biz o şad günümüzdə, xalqın böyük bayram keçirdiyi o gündə bu məşum əlin sanki boğazımıza uzandığını hiss etmiş və susmuşduq... Sanki otağımıza qaranlıq, ümidlərimizə şübhə gətirən bir kabus önümüzdə durmuşdu... Mən o anda yoldaşlarımın gözündə gördüyüm sonsuz qəzəbi heç bir zaman unuda bilmərəm. Məlusənin ağır sükutu pozan səsi indi də qulaqlarımda cingildəyir:

– Hər halda mən inanıram ki, möhkəm ruhu və pozulmaz təşkilatı olan bir xalq ölər, amma öz azadlığını əldən verməz...

Azadlıq və tərəqqidən başladığımız söhbətlə biz o mənhus kabusun xəyalını evimizdən qovmuş, yavaş-yavaş yenə deyib-gülməyə başlamış, xoş xəyallara qapılmışdıq... Sonra nədənsə yenə söhbət, zəmanəmizi bürümək istəyən o qara kabus, onun mənhus kölgələri

üstə qayıtmış, yenə də azad gələcəyin xəyalatı ilə əvəz olunmuşdu... O gün, sən vəcdə gələrək, ruhun saf bir ilhamla dolduğu anda bizi öpdün və üzünü Məlusəyə tutub:

– Məlusə can, ürəyimi sənə açıram, – dedin. – Bu azadlıq yolunda bizə məbud seçmək lazım gəlsəydi, mən səni özümə məbud seçər, gecə-gündüz dizlərində dua oxuyardım. De görüm, sən də məni sevirsənmi, Məlusə can?

Məlusənin yeni rənglərlə qızarmış üzündə bir təbəssüm göründü:

– Mən bu gün hər şeyi sevirəm... Hamını sevirəm... Bax, bu evi də, bu torpağı da, bu divarları da. Hər şeyi sevirəm... Hər şeydə bir məna, bir ruh görürəm... Mən sizin hamınızı sevirəm.

Sən daha artıq bir ciddiyyət və ürək döyüntüsüylə:

– Bəs məni, məni necə?.. – deyə soruşdun.

Məlusə:

– Səni hamıdan artıq... – deyib bir xəyal kimi otaqdan çıxdı... Sən qeyri-ixtiyari onun dalınca getdin... Azca sonra siz otağa qayıdarkən biz gözlərinizdə əbədi bir məhəbbət və ilqarın andını gördük... Biz sizin sağlığınıza badə qaldırarkən, sən sözümüzü kəsdin.

– Dostlar, – dedin, – bu gün vətənimizin üfüqlərində azadlıq günəşinin doğduğu gündür... Biz bu günü gördüyümüz üçün xoşbəxtik. Bu günün xatirəsi dərdli vaxtlarımızda belə qəlbimizə təsəlli və qüvvət verəcəkdir!..

Dostum! Tarixin sizi ağır imtahanlara çəkdiyi bu günlərdə, sənin sözlərin yadıma düşür.

O günün xatirəsi nəsillərin qəlbini mübarizə həvəsi ilə dolduracaqdır... Düşmən, evləri uçura bilər, adamları öldürər, kitabları yandırar, məktəbləri bağlaya bilər... Lakin tarixin çarxını geri döndərə bilməz... On iki dekabrı – iyirmi bir azəri – tarixdən silə bilməz!.. O günü unutmayaq... Qoy o gün həmişə qəlbimizə təsəlli və qüvvət versin!..

*Bakı, 1946*

## İZTİRABIN SONU

Fəlakət Təbrizin üstünü birdən almışdı. Üfüqlərdən aşıb gələn qara buludlar, bütün göy üzünü örtən kimi, Təbrizin də üstündə ölüm öz qanadlarını gərmişdi. O, ürəkləri vahimə ilə doldurmuş, qəlblərə sonsuz iztirab gətirmişdi. Minlərlə insanların həyatını matəm, göz yaşı, nalə və ümidsizlik pərdəsi ilə örtmüşdü. İdrak və vicdan sahiblərini meydandan çıxaran, cani və bıçaqçıları küçələrə tökən də bu fəlakət olmuşdu.

Bircə gün əvvəl sakit bir həyatla yaşayan, tezliklə artıb böyük və mədəni bir paytaxta çevrilmək ümidi ilə ruhlanan şəhərin küçələri insan cənazələri ilə dolmuşdu. Burda, orda, su arxlarının içində, ağacların dibində başı kəsilmiş, qarnı yırtılmış, əl-qolu sındırılmış meyitlər gözə dəyirdi. Bu meyitlərin içində cavan fədailər, günahı məlum olmayan ağ saçlı qocalar, körpə uşaqlar və lüt arvadlara rast gəlmək olardı. Belə bir mənzərəni seyr edən insanı iztirab və dəhşət bürüyür, qəlbində bu cəhənnəm içərisindən çıxıb qaçmaq, sonsuz səhralara baş alıb getmək arzusu oyanırdı. Gecə qaranlığında, ağacların kölgəsində gizlənə-gizlənə sərsəri kimi küçələri dolanan, gah bu, gah o biri cənazəni qaldıraraq baxan və uzaqlaşan adamın da qəlbinə belə bir hiss hakim idi. Cəhənnəm tüstüsü beynini dumanlatmış kimi onun başı ağrıyırdı. O qaçmaq, qaçmaq, ayağı gəldiyi qədər buradan çıxıb qaçmaq istəyirdi. Lakin qaça bilmirdi. Ölümdən daha qüdrətli bir hiss onu hara isə çəkib aparır, şəhərin küçələrində dolandırırdı. O, qaldırıb baxdığı cənazələrin bəzisini tanıyırdı. Onlar Azərbaycan demokrat firqəsinin görkəmli və ya fəal üzvləri idilər. Onların içərisində məşhur olmayan, adi ziyalı və fəhlələr də vardı. Onlardan bəzisinin başı su arxına düşmüş, ayaqları və bədəninin yarısı asfaltın üstündə qalmışdı. Bu zavallılardan çoxusu ikicə gün əvvəl böyük bir həvəslə bu asfaltı çəkmiş, tozlu və nahamar küçələri ayna kimi parıldatmışdılar. İndi haman asfaltlı küçələr onların günahsız qanı ilə islanmışdı.

Qəhrəman da bu cür ağır hisslərlə küçələri dolaşır, hələ də mühasirədə olan demokratların müdafiə etdiyi bəzi ictimai binalar və xüsusi evlərin yanından ehtiyatla keçirdi. Şəhərdə atışma səsləri kəsilmirdi. Müxtəlif cəhətlərdən eşidilən qadın və uşaq nalələri, böyüklərin nifrətlə dolu söyüşləri də bu səslərə qarışırdı. Nəhayət, o, daş mağazaların dar küçələrindən birisində divar dibindəki çuxurdan ürək dağlayıcı bir inilti eşidərək dayandı. Divarın dibinə qısıldı və dinləməyə

başladı. Görünür, bu, can üstdə olan bir yaralının iniltisi idi. Buralar səssiz idi. Nə gələn, nə gedən vardı. Evlərin qapı və pəncərəsi bərk-bərk bağlanmışdı. O, dar küçənin o tərəf-bu tərəfinə nəzər salıb iniltiyə doğru getdi. Əyilib çuxurdakı adamı qaldırmaq istədi. Bacarmadı. Çuxur çox dərin idi. Atılıb oraya düşdü, dərhal bir əlin qıçlarına sərildiyini hiss etdi. Bunun dalınca imdad istəyən bir yalvarış eşitdi. Zarıldayan adamı qollarına alıb küçənin qırağına qoydu. Qalxıb yanında oturdu. Cib fənərini çıxarıb onun üzünə tutdu. Onu dəhşətli bir vahimə aldı. Ürəyi həyəcanla çırpındı.

– Rəhim, qardaşım! – deyən Qəhrəman, yaralını köksünə basdı.

Yaralı son nəfəslə:

– Qəhrəman!.. Şükür ki, sən sağsan!.. – dedi və başını onun sinəsinə qoydu. Qəhrəman tez onu çiyninə alıb qaçırmaq istədi. Yaralı, sonsuz bir sevinclə:

– Zəhmət çəkmə, qardaşım, – dedi. – Gəlmisən bəsdir. İkicə dəqiqə gözlə, mən öləcəyəm. Sonra qaç, başını qurtar. Bacarsan gözlə, dizinin üstə can verim, sonra get...

– Bəs səni kim bu hala saldı? Kim sizin yerinizin üstünü açdı?

Yaralı nəfəsi gələr-gəlməz bir səslə:

– Əmir Cahani, – dedi. – Bizim yerimizi o bilirmiş. Yoldaşlarımızın öləni öldü, tutulanı tutuldu. Sən qaç qurtar, Azərbaycana lazım olarsan, qardaşım, bu faciələrin intiqamını çəkmək üçün lazım olarsan...

Əmir Cahani adını eşidən kimi Qəhrəman "Ah lənətə gəlmiş", deyə hayqırdı... Neçə gündən bəri Tehran işğal ordularının qabağına düşüb demokratların və onlarla əməkdaşlıq etmiş adamların yerini göstərən, bir-bir evlərini talan etdirən, arvad və uşaqlarının başına pislik gətirən mənfur sima gözlərində canlandı. Qəhrəman:

– Mən heç yerə getməyəcəyəm, sizin intiqamınızı alacağam, – deyib Rəhimə doğru əyildiyi zaman artıq onun taxta kimi quruduğunu gördü. Şahidi olduğu sonsuz cinayətlər və beynini gəmirən dəhşətli intiqam fikri ürəyini daşa döndərmiş, gözlərinin yaşını qurutmuşdu. Axşamdan bəri onu sərsəri kimi gəzdirən dostluq hissi Rəhimin cənazəsini küçədə qoyub getməsinə yol vermədi. Onu paltosuna büküb dalına aldı. Yenə kölgələrdə, qaranlıqlarda gizlənə-gizlənə, hər kəsdən qaça-qaça onu Gülüstan bağının yanında yaşayan tanışı Hacı Həsənin həyətinə gətirdi. Gecə ilə cənazəni badam ağacının altında basdırıb yola düşərkən Hacı Həsən onun qabağını kəsdi:

– Qoymaram degəsən!.. Öldürərlər! Gecəni qal, bu vaxtı hara gedirsən?

O, Hacı Həsənə təşəkkür edib:

– Xanım Susəngilə, – dedi.

Hacı Həsən bütün Təbrizdə məşhur olan bu adı eşitdikdə təəccüblə Qəhrəmana baxdı və heyrət içərisində qapını açaraq dedi:

– Xoş gəldin.

– Gecəniz xeyrə qalsın.

O bir kölgə kimi gözdən itib Şeşkilana, xanım Susənin evinə tərəf yollandı...

* * *

Xanım Susən, ömrünün ən gözəl, ən təravətli bir zamanını yaşayırdı. Onun iyirmi dörd yaşı qurtarmış, iyirmi beşə keçmişdi. Bu yaşda hər bir qadının ona pis nəzərlə baxmağa da cəsarət etməzdi. Yalnız həyat haqqında öz tərbiyəsi, mühiti və mövqeyinə müvafiq, məxsusi təsəvvür və əqidəsi olur. Bu təsəvvür və əqidəyə görə də o öz yaşayışını təşkil edir. Bu yaşda onun anlayışları kimi bütün hərəkət və rəftarında da müəyyən bir daimilik gözə dəyir, onlar müəyyən bir şəklə düşmüş olur. Qızlıq dövrünün tez-tez dəyişən sadə və romantik təsəvvürləri bu yaşda həyati və əməli cizgilər kəsb edir. Eyni zamanda bu yaşda təbiət də bütün qızğınlığı ilə özünü göstərməyə başlayır. Cismani qüvvələr, bədənin üzvləri artıb yetişdikləri kimi, onların bəslədiyi ehtiraslar da püxtələşir, tərbiyənin mahiyyətindən, keçdiyi yoldan asılı olaraq özlərinə təzahür şəkli tapırlar. Xanım Susənin keçdiyi həyat yolu, onun təbiətində olan zəngin hissiyyatın çılpaq ehtiraslar şəklində meydana çıxmasına səbəb olmuşdu. Onun həyatı son dərəcə inkişaf etmiş ehtiraslardan ibarət idi desək, daha doğru olar... Onun təsəvvür və görüşləri də, düşüncə və təfəkkürü də bu ehtirasların qanunlarına tabe idi, onların dönük, lakin qüdrətli hökmü ilə idarə edilirdi... Xanım Susən kimi qadınlar bu yaşda həyatlarının ən fırtınalı dövrünü yaşamağa başlayırlar. Bu yaşda onlar həyatın bütün ləzzətini duymaq, onun şirəsini sormaq həvəsi ilə yanaraq varlıqlarını ehtiraslara qurban edirlər. Bu fırtınalı dövrün uzun və ya gödəkliyi qadının cismani və ruhi aləmindən, gözəllik və təravətinin ömründən asılıdır. Onlardan bəzisi otuz beş yaşlarına doğru artıq tamamən iflas etmiş olur, bəzisi də daha uzun müddət öz ehtiraslarını və onları cazibədar edən gözəl zahiri surəti saxlayıb yaşada bilir. Xanım Susən

gözəllik və ehtirasları solduqda bütün pərəstişkarlarını itirib rəzalət içərisində yaşayan həmkarlarını çox tez görmüş və özünün aqibətini fikir edərək düşdüyü yolda öz nemətlərindən ehtiyatla istifadə etməyə başlamışdı. O, satmağa məcbur qaldığı bədəninə, öz matahnı dərhal bazara tökən və qəpik-quruşla kifayətlənən bir xırdavatçı kimi yox, hər sikkə və hər malın öz mövqeyini, öz bazarını bilən tədbirli bir tacir kimi yaxınlaşmışdı. Buna görə də xanım Şusənin qapısı Təbrizin bəzi küçələrindəki qapılar kimi hər zaman və hər kəsin üzünə açılmazdı. Hətta, bəzən həftələrlə bir adam cəsarət edib xanım Susənin qapısını döyə bilməzdi, çoxları şəhərdə adlı-sanlı və məruf familiyadan olan ağalar, sahibmənsəblər xanım Susənin xidmətinə yetişməyi özlərinə şərəf bilər və yeri düşəndə də bununla fəxr edərdilər. Xanım Susən isə zabitlərlə dostluğu daha artıq xoşlardı. Lakin o, bu tayfanın xasiyyətini də yaxşı bilirdi. Gözləri doyduğu hər şeyə onların nifrət etdiklərini görmüşdü. Buna görə də o, ən çox xoşuna gələn, ən gözəl və səxavətli zabitləri belə nə zaman qovmaq lazım gəldiyini həssas bir instinktlə təyin edərdi. Heç bir adamla dostluğunu özünə qarşı laqeyd və ya etinasız əlaqə yaranacaq günə qədər uzatmazdı. Hər kəsin ürəyində azca da olsa həsrət və həvəs qoyub qapısından qovardı... Onun evi həmişə ancaq ehtiraslı və qızğın ürəkli məşuqların məskəni idi. Son zamanlar onun bu cür məşuqları içərisində sərtib Əmir Cahani də vardı... Dəvə kimi uzunboylu, porsuq kimi dolğun olan bu adamda dönük və iblisanə bir təbiət vardı. O, zahirən mütəkəbbir və məğrur, batilən alçaq və rəzil idi. Özündən böyük və güclülərin yanında o, belini əyər, sinəsini içəri çəkər, cücə kimi büzüşüb balacalanardı. Özündən zəiflərin yanında isə onsuz da şişkin köksünü daha da irəli verər, başını hind toyuğu kimi daha da dikəldər, əzəmətli və təmkinli görünərdi... Boy və cismcə balaca, lakin mənsəbcə böyük olan birisinin yanında o özünü pis hiss edərdi. Özünün belə cüssəli və iri gövdəli olması üçün ürəyində yaradana lənətlər yağdırardı. Bu rəzil və çirkin təbiət onun daima hərlənən, heç bir zaman bir nöqtədə durmayan köz bəbəklərində inikas etmişdi. Onlarda, insan təbiətinə xas olan sədaqət və yüksək məhəbbətdən, munislik və istilikdən əlamət yox idi. Onlar bir ilan qabığı kimi parıldayır, hər baxanın qəlbinə soyuq bir iynə kimi sancılırdı.

Dekabrın on beşi idi. Tehran ordularının Təbrizə daxil olmasından iki gün keçmişdi. Əmir Cahani bütün günü küçələri gəzib, onlarla demokratı evlərindən çıxartdıqdan sonra gecəni, Tehran qoşunları ilə gəlmiş dostu sərhən Səfaini götürüb xanım Susənə qonaq gətirmişdi.

Əvvəlcə xanım Susən onları kiçik zalda qəbul etmiş, çay və ayaqüstü içilən konyakdan sonra şam hazır etdirərək böyük zala keçirmişdi. Dəbdəbə və təntənə ilə bəzənmiş bu zaldakı stolun üstündə hər cür yemək və içmək tapmaq olardı. Xanım Susən çalğıçılar gətirtmiş, şəhərdə ən məşhur xanəndə qızı da çağırmışdı. Sərhəng Səfaini əyləndirmək üçün xanım Avropaini dəvət etmişdi... Bu, xanım Susəndən dörd yaş böyük olsa da, incə və zərif vücudu onu xeyli cavan göstərir və balaca boylu, lakin motala oxşayan sərhəng Səfainin yanında ona bir gözəllik və məlahət də verirdi... Xanım Susən, Səfai ilə xanım Avropaini yanaşı əyləşdirmiş, özü isə əks tərəfdə Əmir Cahaninin yanında oturmuşdu. O, tez-tez içən, içdikcə ağzına gələni danışan Səfainin nə həyasız sözlərinə, nə də onun ehtiraslı gözlərinə fikir verirdi. Daha doğrusu o, qəsdən belə edirdi. Çünki o, Əmir Cahaninin onu başqalarına nə cür qısqandığını xatırlayırdı. Dəfələrlə Əmir Cahani onu öldürəcəyini, məşuqlarını qıracağını, intihar edəcəyini demiş, ayaqlarına düşüb ağlamış, təhdid etmişdi. Buna görə də xanım Susən arada dalaşma düşməsindən ehtiyat edərək və öz qiymətini saxlamağa çalışaraq sərhəng Səfainin nəvazişlərini cavabsız buraxırdı...

Şərab içildikcə ehtiras və şəhvətin doğurduğu min cür sözlər içərisində qəhqəhələr göyə ucalırdı. Belə səhnələrə adət etmiş çalğıçılar və xanəndə qız isə öz işində idi. Onlar ruhsuz və bəzən mürgüləyə-mürgüləyə çalıb oxuyurdu. Xanəndə qız sanki mahnının sözlərini duymadan, anlamadan qırıb tökür, hərəkətlərinə süni məlahət verərək oxuyurdu:

Aşiqəm gözəllər baharına,
Eşqdən yananlar üzarına.
Kənar eylə o zülflərin,
Baxım sənin o gül camalına.
Gəl, ey sevgili yar,
Yox ürəkdə qərar.
Qoy bir də baxım gül camalına,
Eşqinlə, ey gözəl yanıram,
Ayrılıq oduna yanıram,
Taqətim qalmayıb yar fəraqına.

Artıq stol arxasında oturanların beyinləri kifayət qədər dumanlanmışdı. Onların bütün varlığına ehtiras və şəhvət hakim kəsilmişdi. Səfai əlini xanım Avropainin saçlarında gəzdirir, busə üçün yaranmış

dodaqlarından öpürdü... Xanım Susən isə öz təsəvvürlərinə sadiq qalaraq Əmir Cahaninin hərəkətlərini məhdudlaşdırmaqla istəklərini daha da alovlandırırdı. Əmir Cahaninin tamamən özünü unutduğu dəqiqələrdən birisində qulluqçu qız içəri girib nəzakətlə bir dəqiqəliyə xanım Susəni o biri otağa çağırdı.

Xanım Susən o biri otağa keçdiyi zaman heyrətdən gözlərinə inanmadı. Kef məclisində dodaqlarına qonmuş təbəssüm sönərək, ciddi bir ifadəyə çevrildi:

– Necə? Ağayi Qəhrəman! Bizim evdə?! Heç gözlərimə inana bilmirəm. Doğrudan da bizə təşrif gətirən sizsinizmi?..

Gördüyü faciələrin və ciddi düşüncələrin ağırlığı altında tunc kimi dayanmış Qəhrəman, zinət və bəzək içində itmiş, hər tərəfə ətir saçan Susənin gözlərinə baxdı.

– Heyrət etməyin, xanım Susən! – dedi. – Yanınıza gələn doğrudan da mənəm...

Artıq özünü düzəldərək ani şaşqınlıqdan çıxmış xanım Susən gözlərini oynadaraq gülümsədi:

– Hə, ağayi demokratlar, deyəsən işiniz xarabdır? Sizin gününüzdə olan adamın yadına belə yerlər düşməsin gərək. Amma mən böyük məmnuniyyətlə gecəni sizinlə keçirərdim. Təəssüf ki, qonağım var. Heç eybi yoxdur. İndi ki, gəlmişsiniz, sizi bu evdən buraxmayacağam. Bax, buradaca oturarsınız. Qonaqları başdan eləyib yanınıza gələrəm. Bütün gecəni sizin ixtiyarınızda... Mənə uşaqlığınızdan danışarsınız. Ah, o günləri xatırlamaq mənə nə qədər xoşdur!.. Nə yaxşı da gəlmişsiniz! Bütün gecəni sizin ixtiyarınızda olmaq üçün hamını qovacağam...

– Nə danışırsınız, xanım Susən? Məni başqa məqsədim var. Mən elə çirkin bir iş üçün bura gəlməmişəm.

– Ah, siz yenə də təkəbbürlü və məğrursunuz?.. Deyiniz, yenədəmi mənə alçaq nəzərlə baxırsınız?.. Aya, heç insafınız yoxdur?

– Mən sizə heç vaxt alçaq nəzərlə baxmamışam. Lakin həmişə təəssüf etmişəm. Sizə yazığım gəlib, ürəyim yanıb. Çünki qadın mənliyi üçün bu sənətdən böyük bir təhqir ola bilməz. Amma nə etməli... Sizi alçaldan, öz vücudunuzu satmağa sürükləyən mühitə yaxşı aşinayam. Nə isə, xanım, mən sizinlə ciddi bir məsələdən danışmalıyam.

Bu zaman zalda oturanlar “Susən, Susən” deyə onu çağırmağa başladılar. Bu səslər arasında qəhqəhələr eşidildi. Qəhrəman məsələnin nə yerdə olduğunu anlayaraq üstündə dirsəklik olan divana oturdu. Susən onun qolundan tutdu:

– Burada səni tez görərlər. Dur yataq otağımda gözlə, – deyib onu kiçik bir dəhlizdən keçirtdi, zalın dal tərəfində döşəmə və divarları Kaşan xalıları ilə bəzənmiş və içərisində iki çarpayı və yumşaq səndəli olan otağa gətirdi.

– Burada otur. Yuxun gəlsə, soyunub yata da bilərsən. Bu gecə bura heç kəs gəlməyəcəkdir. Yuxun gəlməsə, darıxsan, bu xalçanı qaldırıb bu xırda güzgüdən zala tamaşa edə bilərsən. Bu elə qayırılıb ki, sən hamını görsən də səni görən olmaz... Bu əyləncə də xoşuna gəlməsə, al bu Xəyyam, bu da Saib Təbrizi, mütaliə et. Çalışaram ki, tez qayıdım. Sənin ciddi söhbətinə qulaq asım.

O, bir rəqqasə incəliyi ilə dönüb gözlərini süzdürərək otaqdan çıxdı. Qəhrəman, hər rəngində böyük bir sənətin nəfəsi duyulan xalıları, çarpayıların üstündəki zərif ipək örtükləri, döşəmədəki yumşaq səndəlləri nəzərdən keçirtdi, səadət və istirahət üçün yaranmış bu gözəlliklər içərisində hər gün oynanan faciə və çirkin işləri təsəvvürünə gətirdikdə ürəyi daha artıq sıxıldı... Təqribən yaşıdı olan xanım Susənlə qonşuluqlarını xatırladı. Uşaqlıqda hər səhər evdən bir çıxaraq xiyaban uzunu bir yerdə məktəbə getdikləri yadına düşdü. Sonra xanım Susənin böyük bir qız olduğu, hər tərəfdən ona elçilər gəldiyi günlər gözlərində canlandı. Nəhayət, əyalətdə işləyən görkəmli bir vücud xanım Susəni götürüb Tehrana apardı... Altı aydan sonra xanım Susən indiki peşənin sahibi olaraq Təbrizə qayıtdı.

Onu arvad naminə Tehrana aparmış ağanın mahir bir qadın dəllalı olduğu haqqında danışılan müxtəlif əhvalatlar da Qəhrəmanın fikrindən keçdi. Bütün bu xatirələr beynini yorur, onsuz da ağır olan iztirablarını artırırdı. O, fikirləşdikcə işgəncə verən bu acı və əzablı xatirələrdən uzaqlaşmaq üçün əlini atıb Saibi götürdü. Lakin heç bir vəchlə fikrini bir yerə yığa bilmədi. Sətirlər gözlərində səpələnib bir-birinə qarışdı. Özünə zor gəlib diqqətini kitaba toplamaq istədi. Bu zaman zalda çox uzun sürən qəhqəhələr qopdu. Kitabı bir kənara qoyub xalçanın yanını qaldırdı. Doğrudan da yumruq boyda dairəvi bir güzgüdən hər şey görünür və hər şey eşidilirdi. Qulağına dəyən Azərbaycan sözü onu diqqətlə baxmağa və qulaq asmağa məcbur etdi. Bir əlində qədəh tutmuş Səfai o biri əli ilə xanım Avropainin başındakı tükləri sayar kimi saçlarını qarışdırır, böyük bir vəchlə danışırdı:

– Azərbaycan!.. Azərbaycan!.. Azərbaycan bizim gözümüzdür... Bizim ürəyimizdir... Biz onu əlimizdən verə bilmərik. Azərbaycan cüzi layənfəkü İran...

O birdən-birə əlindəki badəni yerə qoyaraq barmağındakı qızıl üzüyü çıxartdı, ovcunun içinə qoyub bərk sıxdı. Üzünü xanım Susənə, sonra xanım Avropaiyə tutub dedi:

– Açın, çıxarın görüm, necə çıxaracaqsınız. Bacarmazsınız. Heç kəs bacarmaz, heç bir qüvvə onu çıxarda bilməz. Azərbaycan budur. Onu kimsə bizim ovcumuzdan çıxara bilməz.

O, danışdıqca qızışır, qarşısında əli-qolu bağlı bir düşmənə, ayaqları altında zəncirli bir əsirə qəzəblənir kimi təpiklərini Təbriz xalısına döyüb deyirdi:

– Budur Azərbaycan! Ayaqlarım altında titrəyən Azərbaycandır! Baxın, baxın görün necə titrəyir!

Sonra, böyük bir qəhrəmanlıq etmiş kimi üzünü Əmir Cahaniyə tutub soruşdu:

– Hə, siz də təsdiq edirsinizmi, sərtib? Titrəyir, ya titrəmir?

Əmir Cahani ayağa durub təzimlə baş əydi, çənəsi döşündə dedi:

– Necə titrəmir!.. Lap qamış kimi əsir. Qalib və şücaətli qoşunun ayağı altında küreyi-ərz titrəyir, nəinki Azərbaycan!

Səfai stolun üstündə büllür qablardakı qovrulmuş badam içini, püstəni və sarı kişmişi ovucladı:

– Azərbaycan bizimdir!.. Bizimdir!.. Onun sarı buğdası, gözəl əriyi, durna gözü kimi yanan kişmişi, badamı bizimdir!.. Hər şeyi bizimdir!..

Əmir Cahani, yenə təzim etdi:

– Qurbandır sizə Azərbaycan! Onun hər şeyi sizindir! Buğdası da, badamı da...

Səfai, əlini xanım Susənin çənəsinə ataraq sıxdı və:

– Gözəl qızları da, dadlı arvadları da! – deyə yarıamiranə, yarısualedici bir əda ilə Əmir Cahaniyə baxdı. Əmir Cahani dərhal:

– Arvadları da, qızları da sizə qurbandır! – dedi.

Səfai bu sözü eşidən kimi dedi:

– Onda bu tərəfə keç. Xanım Susəni dizlərimdə oturtmaq istəyirəm.

Əmir Cahani dərhal müti bir qul kimi yerindən o tərəfə keçmək istədi. Bayaqdan bəri susan xanım Susən heyrətlə ona baxdı, düzəltdiyi qısqanclıq səhnələri gözündə canlandı... Onun qolundan çəkib yerində oturtdu:

– Kişi ol, kişi miyançılıq etməz!

Özünü təhqir olunmuş hiss edən Səfai səsinə ciddiyyət verdi:

– Xanım Susən dizimin üstündə oturmursa, ayaqlarımdan öpməlidir!.. Eşidirsənmi, sərtib, ayaqlarımdan öpməlidir... Tut qolundan gətir!

Əmir Cahani qar kimi ağardı. Lakin işi zarafata salmağa çalışdı.

– Xanım Susən, sizin ayaqlarınızdan öpməyi özünə şərəf bilər. Buyur xanım, – deyib süni gülüşlərlə Susənin qolundan tutdu. Susənin acığından səsi titrədi:

– Əlini çək!

Səfai əmr edib dururdu.

– Belə olanda xanım Susən bir ayağımdan, ağayi Əmir Cahani o biri ayağımdan öpməlidir!.. Tez! Bu saat!

Əmir Cahani bir də Susənin qolundan tutub o tərəfə keçirmək istədi.

– Xanım Susən, xahiş edirəm, mən özüm razıyam. Bu gecəliyə razıyam.

Xanım Susən özünü saxlaya bilməyib əlini qaldırdı və Əmir Cahaninin üzünə bərk bir sillə vurdu.

– Alçaq!.. Bişərəf!..

O dönüb otaqdan çıxarkən hələ barmaqlarının izi Əmir Cahaninin üzündən getməmişdi. Bu zaman heç kəsin gözləmədiyi halda Səfai tərpənə-tərpənə uzun bir qəhqəhə ilə gülməyə başladı. Qəhrəman xalçanı salıb əlləri ilə başını qucaqlayaraq fikrə getdi. Əziz və fəlakətzadə vətənin müsibətləri qarşısında gözlərindən axan yaşları saxlaya bilmədi... Başını qaldırdıqda hələ də dodaqları titrəyən Susənin öz qarşısında durduğunu gördü. Gözlərini silib onun üzünə baxdı. Susən dedi:

– Gördünmü? Hələ mən belə bişərəflərə rast gəlməmişəm. Onların fikri Tehran əxlaqsızlarına gedib. Elə bilir ki, mən hər rəzilin təhqirinə dözəcəyəm... – O davam gətirməyib üzü üstə çarpayıya yıxıldı və hıçqıraraq ağlamağa başladı. O, ağladıqca Qəhrəman danışırdı:

– Susən, bacım, onlar bu müsibəti bir sənin başına açmırlar. Azərbaycanın hər guşəsindən nalə və fəryad səsi göylərə ucalır. Azadlığa həsrət qalan bir torpağın nəsibi belədir!.. Gərək onun ismət və namusu ayaqlar altında getsin!.. Qalx, ağlama, qalx, intiqam almaq lazımdır. Bu, dünyada müqəddəs bir mələyin gözündən axsa belə, göz yaşına qiymət verən yoxdur. Acizləri, gücsüzləri tapdalayırlar. Qalx, gözlərinin yaşını sil, qoy ürəyin daş kimi olsun. İntiqam al!..

– Necə? Necə intiqam alım? Mənim əlimdən nə gələr!..

– Sən tək deyilsən. Qalx, mən sənə intiqamın yolunu göstərərəm. Mən bunun üçün də sənin yanına gəlmişəm. O alçağın burada olacağını bilirdim. Dur ayağa və mənə qulaq as. Ömrünü zəhərləyən bu zinət və dəbdəbədən əl çək. At, ehtirasları şəhvətə çevirən bu rənglər

və boyalardan uzaqlaş!.. İntiqamını al, gəl qəfəsimizi yırtıb azad quşlar kimi pak və təmiz səhərlərin qucağına atılaq!

Xanım Susən başını qaldırıb ona baxdı. Təhqir edilmiş qadın mənliyi hələ də sakit olmamışdı. Qəhrəman onun hər cür fədakarlığa hazır olduğunu qətiyyətlə dolu baxışlarında gördü. Pencəyinin altından gümüş kimi parıldayan bir xəncər çıxartdı.

– İntiqamının yolu budur, – dedi. – Sən qorxma, oraya qayıt. Onlar sənin yurdunu zəhərləmişlər. Onlar sənin həyatını və ömrünü zəhərləmişlər. Yüzlərlə, minlərlə sənin kimi susənlər onların qurbanıdır. Qayıt və mütləq o alçağı burada qalmağa razı sal.

Susən par-par parıldayan xəncərə baxıb otaqdan çıxdı. Qəhrəman xalçanı qaldırıb zala baxırdı. Oradakılar azca əvvəl vaqe olanları unutmuşdular. Xanım Avropai Səfainin qucağında oturmuş, ayaqlarını Əmir Cahaninin dizləri üstə uzatmışdı. O bir uşaq kimi şıltaqlanır, əylənirdi. Azca keçməmiş xanım Susən əlində podnos içəri girdi. Podnosa şərbət dolu dörd piyalə qoyulmuşdu. O içəri girən kimi oturanlar ura çəkib əl vurdular.

– Siz mənə acı sözlər desəniz də mənim borcum sizə nəzarəlıq etməkdir. Sizə şərbət gətirmişəm, – dedi. – İçiniz, barışaq!

Onların hərəsinə bir piyalə verib özü də axırıncı piyaləni götürdü. Onlar “mersi” deyib piyalələri başlarına çəkdilər. Səfai, piyaləni podnosa qoyarkən:

– Şərbət deyil, can dərmanıdır, – dedi.

Xanım Susən qəhqəhə çəkib güldü:

– Nuş olsun! – dedi. – Ağalar, artıq istirahət vaxtıdır. Buyurun yataqlara. Xanım Avropai, sizin otağınız hazırdır. Ağayi Səfaini aparınız.

O, Səfai və xanım Avropaini götürüb getdi. Bir azdan sonra qayıtdı, üzr istəməyə, könlünü almağa başlayan Əmir Cahaninin sözlərinə fikir vermədən qolundan tutdu, zaldan çıxarıb yataq otağına tərəf gətirdi.

Qəhrəman qapının açılan tayının dalında durduğundan Əmir Cahani içəri girərkən birdən-birə onu görmədi. Yalnız Susən daxil olub qapı örtüldükdə onun gözləri Qəhrəmanın qəzəbli gözlərinə sataşdı. O dərhal tələyə düşdüyünü anlayıb iki addım geri çəkildi. Əlini tapançasına atdı. Lakin belində tapança yox idi. Onu Susən çoxdan açmışdı. O qorxusundan titrəyərək divara söykəndi. Qəhrəman xəncəri belindən çəkdi:

– Ağayi Əmir Cahani, vəsiyyətiniz varsa, buyurun.. Susən, kağız götür, yaz... Qoy etdiyi rəzalətləri sadalasın. Bəlkə bir tapşırığı var, biz

onlar kimi adamları məhkəməsiz, qanunsuz öldürmürük. De görək axır sözün nədir?

Dizləri əsən Əmir Cahani nazik bir səs çıxartdı:

– Mənim günahım nədir?

– Yetim qalmış uşaqların göz yaşı. Oğulsuz anaların ah-naləsi, közü sönmüş ocaqlar, işıqsız qapılar, didilib parçalanmış Azərbaycan. Budur sənin günahın!.. İndi sən mənə de görüm, Azərbaycanı satmağa kim səni vəkil seçib? Onun irz-namusunu hər itin ayağı altına atmaq ixtiyarını sənə kim verib?.. Cavabın yoxdur. Məhkəmə qurtarır. Susən, o teşti bura çək. Bu bişərəfin qanı xalıya tökülməsin, xalı heyfdir...

Əmir Cahani özünü onun üstünə atmaq istədikdə xəncər qarnına keçdi. O nərildəyib yıxıldı.

Azca sonra o biri otaqda xanım Avropai Səfainin qışqırtısına oyandı və heç bir söz deməyib üzünü divara çevirərək yenidən yuxuya getdi.

Xoruzların ilk banında onlar hər iki cənazəni balaca həyətdəki meynələrin dibində basdırdılar.

O gündən Qəhrəman və xanım Susəni görən olmadı. Bir nəfər onlardan soraq verən tapılmadı... Onlar göyə uçdular, yerə keçdilər, heç kəs bilmədi.

Nəhayətsiz çarpışmaların beşiyi olan torpaq isə, zaman keçdikcə qoynuna aldığı cənazələri əridir, ağır iztirablara son qoymuş intiqamın izlərini itirirdi.

*1947*

# ÇOBANIN MƏSLƏHƏTİ

Təbriz Azərbaycanın qədim şəhərlərindəndir. Özü də çox səfalı və gözəl şəhərdir. Yaxşı bağ-bağatı var. Kəhrizlərindən yay-qış dumduru su axır. Həyətlərindəki bağçaların ortasında gözəl su hovuzları var. Bu hovuzlarda payız aylarında yaşıl həmayilli ağ göyərçinlər çimib oynar.

Amma Təbrizdə hər şeydən gözəl, hər şeydən qiymətli olan oranın adamlarıdır. Onlar nəcib və nəzakətlidirlər, şeri, sənəti sevərlər, gözəl bağ becərərlər, xalı toxuyarlar, naxışlı evlər tikərlər, yaxşı çalıb-oynarlar. Təbrizlilərin söhbəti də çox şirin olar, şirin nağıllar və rəvayətlər danışarlar. Əziz balalar, budur, onlardan eşitdiyim bir rəvayəti sizə nağıl edirəm.

Qədim zamanlarda Təbrizdə bir padşah vardı. O, çox zalım, özünü sevən və axmaq adam idi. Heç bir fikrində möhkəm durmazdı. Birdən qızıb, birdən də soyuyardı. Belə hökmdarın yanında ağıllı və vicdanlı vəzir davam gətirə bilməz. Hiyləgərlər, paxıllar və ikiüzlülər onun ətrafında toplanar. Saray qulluqçularının çoxu bu cür adamlar idi. Onların ürəyində insaf yoxdu, yazığa-məzluma rəhm qalmamışdı. Heç bir əməlində xalqı düşünməzdilər, fikirləri ancaq özlərində idi, özlərinə pul, dövlət yığmağa cəhd edirdilər. Saray vəziri bu pis əməllərdə qulluqçuların hamısını vurub keçmişdi. Öz xeyiri üçün məmləkətdə fitnə-fəsad qalmırdı ki, törətməsin. Rüşvət almasa, bir adamın işini yoluna salmazdı.

Vəzir yağlı dili ilə axmaq padşahın qılığına girmişdi, gecə-gündüz təklikdə də, camaat içində də onun qabağında ikiqat olub deyirdi:

– Əlahəzrət, Yer üzündə səndən böyük adam yoxdur, Allah səndən böyük alim yaratmayıb, sən peyğəmbər kimi gələcəyi görürsən, Allah-taala bizim ömrümüzdən kəsib sənə versin ki, millətin gözünün işığısan, ümidisən, pənahısan!

Bu cür sözlərlə hiyləgər vəzir, axmaq padşahı çullayıb minmişdi, hara istəyirdi, ora sürürdü, kimi istəyirdi tutdururdu, sürgün elətdirirdi,

başını vurdururdu, əmlakını əlindən alırdı. Qulluqçular və camaat padşahdan artıq bu vəzirdən qorxurdu, deyirdilər:

– Padşah zülmündən qurtarmaq olar, vəzirin hiyləsindən yox.

Lakin vəzirin özü də bütün məmləkətdə bircə adamdan qorxurdu. Bu adam alim idi. O, şəhərdə rəsədxana yaratmışdı. Gecə-gündüz orada oturub ulduzları seyr edirdi, göylərin sirrini açmağa çalışırdı. Camaat bu alimə çox inanırdı, onu çox sevirdi. Çünki hələ ondan pis bir söz eşidən olmamışdı, pis bir əməlini görən olmamışdı. Dərdli olanlar ağır gündə onun yanına gedərdi, təsəlli alıb qayıdardı. Müşkülə düşənlər onun qapısını açardı, xeyirli bir məsləhət alıb çıxardı. Onun rəsədxanası ikinci bir saraya çevrilmişdi. Xalqın məhəbbət dolu gözü bu sarayda idi. Çünki bu, düzlük və xeyirxahlıq sarayı idi. Şəhərin gündoğanındakı bu saray, şəhərin günbatanındakı o saraya qarşı durmuşdu.

Günlər gəlib keçdikcə, xalq arasında bu sarayda oturmuş alimin hörməti artır, onun məsləhətinə gedənlərin sayı çoxalırdı. Vəzirin qulağına çatırdı ki, alim zülmə və hiyləgərliyə lənət oxuyur, camaatın fikrini işıqlandırır, ümidsizliyə düşməyə qoymur, deyir ki: – Ədalətə inanın, həqiqətə inanın, əvvəl-axır onlar qalib gələcək!

Bu sözləri eşidən və alimin gündən-günə camaatın nəzərində böyüdüyünü görən vəzir, bu fikrə gəldi ki, onu aradan aparsın. Bu məqsədlə yavaş-yavaş axmaq və xudbin padşahın nəzərini alimin üstünə çəkdi:

– Bir məmləkətdə iki məbud olmaz! – dedi, – bizim məbudumuz əlahəzrətdir!

Vəzir öz casuzları vasitəsilə işi elə qurdu ki, axmaq padşahı böyük bir yalana inandırdı. İnandırdı ki, guya alim gizlincə padşah olmaq fikrinə düşüb. Bunu eşidəndə padşah az qaldı hirsindən boğulsun. Alimi məhv etməyi qərara aldı. Lakin nə cür? Alimə nə deyəsən, onu nədə ittiham edəsən ki, camaat da inansın, səsini çıxarda bilməsin? Hiyləgər vəzir buna da çarə tapdı. Padşahın qulağına nə isə pıçıldadı. Bir gün padşah saray qulluqçularının hamısını yığdı, alimi də yanına çağırtdırdı. Ona dedi:

– Sən alimsən, eşitdiyimə görə, hər şeyi bilirsən, bizim kimi qafil bəndələrdən gizli qalan sirlərə də aşinasan. İndi biz sənin alimliyini yoxlamaq istəyirik, görək, doğrudan bir şey bilirsən, yoxsa dörd divarın arasında oturub sehr-cadu ilə məşğulsan. Bu gün tərəziyə qoyub bir qoyun çəkdirmişəm, onu sənə verəcəyəm. Üç ay o qoyunu saxlayacaqsan, hər gün mənim təyin etdiyim qaydada yemini, suyunu

verəcəksən. Üç ay tamam olanda qoyunu səndən geri alıb tərəziyə qoyacağam, çəkəcəyəm, bir misqal artmış və ya əskilmiş olsa, onda deyəcəyəm ki, sən alim deyilsən, yalançısan. Camaatı barmağına dolayıb ələ salırmışsan, başını vuracağam. Yox, əgər qoyun əvvəlki çəkisini saxlamış olsa, alimliyini təsdiq edəcəyəm, sənə xələt verəcəyəm, özüm də hər həftə ziyarətinə gələcəyəm.

Bu sözlərlə padşah qoyunu verib alimi buraxdı. Alim ağır fikirdən bulud kimi tutulmuş halda evinə gəldi. Alimin arvadı çoban qızı idi, atası ömrünü dağlarda, qoyun sürülərinin içində keçirmişdi. Qız da atası kimi səbirli, dözümlü və sədaqətli idi. Ərini fikirli görüb tez yanında oturdu:

– Sənə nə olub, belə? – deyərək dərdinə qaldı.

Alim əhvalatı danışdı.

– Padşahın qoyduğu qaydada qoyunu yedirdib-içirtsəm, üç ayda gərək iki dəfə kökəlib ətlənsin. Yaman işə düşmüşəm, arvad, heç bilmirəm nə edim?

Çoban qızı ərini heç bu halda görməmişdi. Ona yaman ürəyi yandı, ancaq özünü itirmədi.

– Ay kişi, – dedi, – gecənin xeyrindən gündüzün şəri yaxşıdır, dur şam elə, bir az bağçada gəz, sonra gəl yat, səhər açılsın görək nə edirik.

Özü isə gecə ikən dağlara, atasının dalınca adam göndərdi. – "Dədə, başının bir tərəfi qırxılmış o biri tərəfi qırxılmamış olsa qoy gəl, dayanma".

İki gün də keçməmiş, çoban özünü Təbrizə yetirdi. Qızını və yeznəsini dərd içində görüb narahat oldu, lakin məsələnin nə yerdə olduğunu öyrəndikdə bircə anlığa fikrə getdi. Sonra başını qaldırıb gülümsədi, alimə dedi:

– Heç fikir eləmə, dağa qayıdıb bir canavar tutaram, göndərərəm sənə. Hər gün padşahın qoyduğu qayda ilə qoyunun yemini, suyunu verərsən, ancaq gündə bircə dəfə gətirib canavarı ona göstərərsən, nə yeyib, hamısını tökəcək. Arxayın ol!

Alim çobanın dediyi kimi etdi. Üç aydan sonra padşah qoyunu tərəziyə qoydurdu, çəkdirdi, qoyun bir misqal da artıb-əskilməmişdi. Camaat alimi ürəkdən alqışladı. Padşah alimin doğrudan da cadugər olduğunu düşünüb qorxusundan bir söz demədi, vəzirin isə paxıllıqdan ürəyi partladı. O gündən camaatın nəzərində alimin hörməti birə on artdı.

*1959*

## ŞAİRİN YADİGARI

Şair Üsgü dərəsində yaşayırdı, padşah Təbrizdə.

O zaman Təbriz çox böyük şəhər idi. Onun neçə yüz min əhalisi, geniş xiyabanları, qırmızı kərpicdən tikilmiş ikimərtəbə evləri vardı. Hündür hasarları da qırmızı kərpicdən idi. Bunlar şəhəri çox yaraşıqlı və dəbdəbəli göstərirdi. Hamısından da dəbdəbəli padşahın sarayı idi. Sarayın ala qapılarında həmişə silahlı adamlar durardı. Saraydakı otaqların sayını bilən yox idi, kimi deyirdi əlli otaq var, kimi deyirdi yüz əlli. Padşah fəxr edirdi ki, belə bir sarayda yaşayır, fəxr edirdi ki, Təbriz kimi böyük bir şəhərdə hamı ona tabedir, ona baş əyir, ondan qorxur.

Üsgü dərəsi isə balaca bir kənd idi. Bu kənddə cəmi beş yüz – altı yüz adam yaşayırdı. Evlərinin çoxu boz palçıqdan tikilmişdi. Kəndlilər palçığa saman qatırdılar ki, qışda evin divarlarını yağış yumasın, yayda quruyub çatdaq-çatdaq olmasın. Üsgü dərəsində də bir neçə yaxşı ev vardı. Bu evlərin divarı çiy kərpicdən hörülmüşdü. Lap böyüyündə mülkədar yaşayırdı. Bir qədər balacaları isə az-çox varlı kəndlilərin idi. O zaman bu cür kəndlilərə hampa deyərdilər.

Şair nə hampa idi, nə də mülkədar. Amma onun da ikiotaqlı evi çiy kərpicdən tikilmişdi. Şair öz əliylə burada kiçik bir bağca da salmışdı. İlin doqquz ayını bu bağçada keçirərdi. Hər gün yanına gələn kəndlilərlə bu bağcada söhbət edərdi. Camaat şairi çox sevərdi, vaxt-bivaxt yanına gəlib şerlərinə qulaq asardı. Şair fəxr edirdi ki, kəndlilər ona inanır, ürəyini açır, dərdini-sərini danışır, yüngülləşib gedirdi.

Şairin adı yavaş-yavaş Üsgü dərəsini aşdı, başqa kəndlərə yayıldı. Hər yerdə onun ağıl-kamalından, xeyirxahlığından danışmağa başladılar. Şerləri ağızdan-ağıza düşdü. Bir neçə şeri Təbrizə də gəlib çıxdı. Alim və bilikli adamların tərifini qazandı. Saray qulluqçuları şairin xəbərini padşaha da çatdırdılar.

Padşahın bir azarı vardı, istərdi ki, hər sənətdə onu birinci desinlər, hər yerdə onu tərifləsinlər. Bu azarın adı şöhrət azarıdır. Ona tutulan hakimləri sağaltmaq çətindir. Çünki yaltaqlar hey bu közün üstünə yağ tökür, hey qızışdırıb alovlandırırlar. Xudbin padşah məmləkətin abadlığını düşünüb bir iş başlamazdı. Fikri-zikri özündə idi. Lakin bilik və ağıl sahibi olmadığından hökmdarlara doğrudan da şöhrət yaradan tədbirlər ağlına gəlməzdi. Ağıllı adamların da fikrinə qulaq asmazdı, sözlərini yarıda kəsərdi, üstlərinə qışqırardı, hətta acığı tutanda zindana saldırardı. Buna görə də saray yaltaqlarla, ikiüzlülərlə, yalançı və hiy-

ləgərlərlə dolmuşdu. Onlar özlərini padşaha çox ağıllı, tədbirli, uzaq-görən dövlət qulluqçuları kimi tanıtmışdılar.

Şairin hörməti artanda padşah qərara aldı ki, onu saraya gətirsin. Bununla da padşah bir ox ilə iki ov vurmaq fikrində idi. Əvvəla şairi əlinin altında saxlayacaqdı. Hər işinə göz qoyacaqdı. Saraydan uzaq olduqca xalqın fikrini çaşdıra bilərdi. Sarayda isə hər hərəkəti nəzarət altında olacaqdı. İkinci də şairi saraya gətirməklə padşah camaatın nəzərində öz hörmətinin qalxacağını güman edirdi. Xalq deyəcəkdi ki, "Padşahımız yaxşı adamdır, şeri, sənəti sevir, başına ağıllı adamlar yığır. Sağ olsun!"

Bu fikirlə padşah şairin dalınca elçilər göndərdi. Onlar şairə qiymətli hədiyyələr və padşahın salamını gətirdilər. Dedilər ki, hökmdar səni saraya çağırır.

– Sənin kimi bir çıraq, bu qaranlıq dərədə tez sönüb gedər. Saraya gəl ki, işığın hər tərəfə yayılsın.

Şair dərin fikrə getdi, Üsgü dərəsindən ayrılmaq ona ağır gəldi, saraya gedib padşahların qoltuğuna sıxılmaq istəmədi. Azadlığı dövlətdən üstün tutdu.

– Hökmdara mənim salamımı yetirin, – dedi, – Üsgü dərəsinə çox öyrənmişəm, qorxuram saray havasına davam gətirməyəm.

Padşah əl çəkmədi, ikinci və üçüncü dəfə elçiləri şairin yanına qaytardı. Axırda özü Üsgü dərəsinə gəldi. Şairin əlacı kəsildi. Ürəyindən qara qanlar axdığı halda saraya getməyə məcbur oldu. İlk zamanlar padşah şairə bir söz demirdi. Hərdənbir şerlərinə qulaq asaraq yaxasından əl çəkirdi. Üsgü dərəsi üçün, sadə ürəkli kəndlilər üçün ürəyi darıxan şair daha yanıqlı şeirlər yazırdı. Bu şeirlərdə yavaş-yavaş saray qulluqçularının əməllərinə də işarə vururdu. Üstüörtülü də olsa xalqın dərdlərinə yanırdı. Bu şeirlər tezliklə camaatın ağzına düşürdü, şairin hörməti və şöhrəti daha da artırdı.

Bunu görən padşah ürəyində şairə qibtə etməyə başladı: "Niyə camaat bu şairi bu qədər sevir? Mən dura-dura hər yerdə onun sözünü danışırlar. Niyə?!". Belə düşündükcə padşah bu qərara gəldi ki, özü də şeir yazsın. Çünki, şairə hörmət qazandıran onun əsərləridir. Deməli, padşah əlinə qələm alıb şeir yazarsa, şairdən də artıq hörmət və şöhrət sahibi olar. Padşah bu fikrə gələndə şairlik gözündə çox böyüdü, hətta hökmdarlıqdan da artıq göründü.

Dünyaya saysız-hesabsız hökmdarlar gəlib gedib, indi onların çoxunun adını da bilən yoxdur. Padşahdan qalan nə olacaq? Tikilən ev-

lər, qalalar, şəhərlər, küçələr, lakin onlar çoxmu qalacaq? Yox, zaman bir gün onları vurub dağıdacaq, söküb tökəcək. Amma şeri heç şey məhv edə bilməz. O min il sonra da oxunacaq, yazanın adını gələcək nəsillərə çatdıracaqdır!

Bu fikirlər padşahın şeir yazmaq həvəsini daha da artırdı. Artıq hazırkı şöhrəti onu təmin etmirdi. Bundan sonrakı nəsillərin də xəyalında yaşamaq istəyirdi. Bu məqsədlə də əlinə qələm alıb şeir yazdı. Saray əhli bu şerə qulaq asanda bir ağızdan "bəh, bəh" – deyib durdu, hələ bu cür mənalı və gözəl kəlam eşitmədiyini bildirdi. Padşah isə saray əhlinə fikir vermədi, üzünü şairə tutdu:

– Necə şeirdir?

Şair paxıllıqdan boğulan yaltaqları və padşahı süzüb başını buladı:

– Çox pis şeirdir, hökmdar, – dedi, – buna şeir demək günahdır!..

Padşahın acığı tutdu, fərraşlara əmr etdi:

– Bu şair qudurub, danışığını bilmir. Atın samanlığa, ağlı başına gəlsin!

Şairi samanlığa atdılar. Samanlıqda da o, fikrindən dönmədi, padşahın mənasız və çürük şerini xatırlayıb güldü. Padşah isə qəzəbini soyutmaq üçün ova çıxdı. Beş gün meşədə, dağda ov elədi. Qayıdıb eyş-işrətə başladı. Bir müddət sonra yenə qələmi əlinə alıb yeni bir şeir yazdı.

– O şairi yanıma gətirin! – deyib əmr etdi.

Şairi samanlıqdan çıxartdılar, üstünü-başını çırpıb padşahın qabağına gətirdilər. Padşah yeni şerini oxudu. Saray əhlinin tərifi göyə çıxdı. Hətta vəzir yerindən qışqırdı:

– Şeir deyil, Allah kəlamıdır!

Padşah yenə saray əlinə fikir vermirdi, gözü şairdə idi. Şair isə üzündə istehzalı ifadələr oynadığı halda susurdu. Padşah davam gətirə bilməyib soruşdu:

– Necə şeirdir?

Şair padşaha cavab vermək əvəzinə fərraşlara döndü:

– Məni samanlığa qaytarın! – dedi.

Padşah qəzəbləndi və şairi birdəfəlik saraydan qovdu. Şairin son sözü isə zərbi-məsəl kimi saray əhlinin və sonra da xalqın dilinə düşdü. Mənasız və axmaq bir hərəkətə gülmək istəyəndə deyərdilər:

– Məni samanlığa qaytarın!

Söz, şairdən insanlara yadigar qaldı.

*1959*

# PƏLƏNG VƏ İNSAN

Nəzər kişinin sarı rəngli bir pişiyi vardı. O qədər sarı idi ki, görən deyərdi dərisinə xına çəkiblər. Özü də yaman tüklü pişikdi. Əl-qolunu, boyun-boğazını sarı tük basmışdı. Başının tükü iki il qırxılmamış qoyun yunu kimi pırpızlanmışdı. Qaşlarının da üstünü sarı tük örtmüşdü. Bu tüklərin arasından göy gözləri zorla seçilirdi. Amma özü ayıq idi, hər şeyi görürdü. Yaman da ağır pişikdi. Yemək görəndə heç vaxt tələsməzdi, ora-bura atılmazdı. Ağır-ağır gəlib götürər, ağır-ağır yeyərdi. Uzun sarı bığları onu bir az da qorxulu göstərirdi. Nəzər kişidən başqa heç kəsin qucağında oturmazdı, heç kəsi qoymazdı başını sığallasın. Evdə pələng kimi yeriyərdi, pəncəsinin birini götürüb, o birini qoyardı, amma həyətdəki tut ağacının budağında sərçə görəndə, ya anbarda gözünə siçan dəyəndə göz açmağa qoymazdı, birdən sıçrayıb boğazından yapışardı.

– Pişik deyil, pələngdir! – deyib Nəzər kişi iftixarla ona baxardı.

Bir dəfə sarı pişik meşəyə quş ovuna getmişdi. Hündür palıd ağacının başında quş gördü. Onlar budaqdan-budağa sıçrayıb civildəşirdilər. Sarı pişiyin ağzı sulandı. Quşların birini tutub yemək istədi. Palıda yaxınlaşdı ki, yavaşca yuxarı dırmaşsın. Elə bu zaman qəribə bir hənirti duyub ayaq saxladı. Tikanlı sıx ağacların arasından böyük bir pələng sıçrayıb pişiyin qabağında durdu. Qorxudan sarı pişiyin canına üşütmə düşdü. Tüklərini bir az da pırpızladıb müdafiəyə hazırlaşdı. Lakin pələng ona baxıb dayandı, təəccüblə soruşdu:

– Deyəsən sən də bizdənsən, pələngə oxşayırsan. Bəs niyə bu günə düşmüsən, niyə belə balacalanmısan?

Sarı pişik bir az özünə gəldi, ürəklənib cavab verdi:

– Çünki insan əlinə düşmüşəm.

Pələngin acığı tutdu:

– O insan dediyin necə şeydir ki, səni bu hala salıb? Onu mənə göstər, gör sənin acığını necə çıxacağam!

Elə bu zaman Nəzər kişi çuvalı çiyninə salıb meşəyə çıxmışdı, fındıqdan, qozdan yığmaq fikrində idi. Sarı pişik onu pələngə göstərib:

– Bax, insan odur, gəlir, – dedi və özü ağaca dırmaşdı, yuxarıdan pələnglə Nəzər kişinin davasına tamaşa etmək istədi.

Acığından gözü qızmış pələng Nəzər kişiyə yaxınlaşdı:

– Ey insan, dayan, səninlə davam var! – dedi və sarı pişiyi göstərdi, – niyə bizim həmcinsimizi bu hala salmısan?

Nəzər kişi məsələnin nə yerdə olduğunu o saat başa düşdü. Özünü itirmədi, fənd işlətməyi qərara aldı:

– Neynək, davan var, gəl dava eləyək. Ancaq mən evdən xəbərsiz çıxmışam. Birdən sən mənə qalib gələrsən, meyitimi də götürən olmaz. Qarım yazıqdır, nigaran qalar. Qoy gedim xəbər verim, gəlim, vuruşaq.

Pələng razı oldu:

– Yaxşı, get qarına xəbər ver, amma tez qayıt.

– Qayıtmağına mən qayıdacağam. Ancaq qorxuram, sən məni aldadasan, qoyub qaçasan. Zəhmətim hədər gedə.

Nəzər kişinin bu sözü pələngin kefinə toxundu:

– Boş-boş danışma! Hələ pələngin meydandan qaçdığını görən olmayıb.

– Acığın tutmasın, pələng qardaş. Mən işimi ehtiyatlı görən adamam. Özüm də kasıb kişiyəm, nə vaxtımı, nə də qüvvəmi boş yerə sərf eləyə bilmərəm. Mən arxayın olmaq üçün ki, sən qoyub qaçmayacaqsan, gəl zəhmət çək gir bu çuvala otur, məni gözlə, gedim qarıma xəbər verim, qayıdım, çuvaldan çıx, davamızı həll edək.

Pələng razı olub çuvala girdi. Nəzər kişi səliqə ilə çuvalın ağzını bağladı, çomağını götürüb düşdü pələngin üstünə, vur ki, vurasan. Nəzər kişi vurur, pələng çığırırdı. Onun nəriltisinə bütün heyvanlar qaçıb mağarasına girdi, bütün quşlar yuvalarında gizləndi.

Nəzər kişi o qədər döydü ki, özü də yoruldu, pələng də candan düşdü. Çuvalı açıb onu buraxdı:

– İndi get, bir də mənim yolumu kəsmə! – dedi və çuvalını çiyninə atıb işinə getdi.

Sarı pişik ağacdan düşdü, zarıldayan pələngin yanına gəldi, yaralarına baxıb:

– Hə, indi bildin ki, insan necə şeydir? – deyib soruşdu.

– Bildim, qardaş, bildim!

– Şükür elə ki, sən onun əlindən bu cür qurtarmısan!

Pələng axsaya-axsaya sürünüb meşənin içində gizləndi.

Sarı pişik evə qayıtdı. Səbirsizliklə Nəzər kişinin meşədən gəlməsini gözlədi. İndi Nəzər kişi onun gözündə bir az da böyümüşdü və çox istəyirdi ki, gəlib başını sığallasın.

*1959*

# MUROVDAĞIN ƏTƏYİNDƏ

1

Ayazın on iki yaşı keçən il may ayında tamam olub. Özü də 32 nömrəli məktəbin V sinfində oxuyur. Lakin kənardan baxan elə bilər ki, on yeddi yaşı var, azı onuncu sinfi qurtarıb. Ayaz əvvəldən sümüyü iri uşaqdır. Sinif yoldaşlarının hamısından canlı-gövdəli və boy-buxunludur, həm də diribaş, zirəkdir.

Ata-anasının bircəsi olduğuna baxmayaraq, Ayaz şıltaq və ərkö-yün deyil, üzüyoladır, mülayimdir. Məktəbdə də, evdə də yaxşı ad çı-xardıb. Ancaq necə deyərlər, hər gözəlin bir eybi olan kimi, Ayaz da eyibsiz deyil. Onun hələ ki, sağalmaz bir azarı var: “Kitab oxumaq azarı!” “Bu, necə azardır?! – deyib təəccüb etməyin, – kitab oxumaq ki, yaxşı şeydir!” – düzdür, yaxşı şeydir, bu şərtlə ki, yerini və vaxtını biləsən. Ayaz kitabı əlinə aldı, yerinə qoyan deyil, – dərsdə də, tənəf-füsdə də, süfrə başında da oxuyacaq. Anası:

– Bəsdir, ay bala, kitabı bük, dərslərini hazırla, sonra oxuyarsan! – deməkdən cana gəlib. Anası bircə adamın yanında Ayaza söz deməz. O da Ayazın babasıdır. Bəlkə elə buna görə də babası onlara gələndə Ayaz üçün toy-bayram olur. Sevincdən atılıb-düşür. Az qalır evin altını üstünə çevirsin. Əslinə baxsan anası ondan ikiqat artıq sevinir – o, həm babanın gəlişinə, həm də Ayazın sevinməsinə şadlanır. Fərəhli, gülən gözləri ilə qaşaltı babaya baxıb deyir:

– O qədər gəlmirsən ki, uşaq səni görəndə bilmir neyləsin...

Anasına elə gəlir ki, Ayazın bu qədər sevinməsinin səbəbi babanın kənddə yaşaması və onlara az-az gəlməsidir, yəni uşağın baba üçün darıxmasıdır. Lakin Ayaza görə əsil səbəb heç də bu deyil – axı, ba-badan da uzaqda yaşayan və ondan da az gəlib-gedən qohumları var ki, onları görəndə Ayaz bu cür sevinmir. Soruşsalar ki, “Ayaz niyə ba-banı bu qədər sevirsən?” – donub qalır.

– Necə yəni niyə? Babanı da sevməmək olar?! Bir uşaq tapılar ki, bir dəfə mənim babamı görə və ömürlük sevməyə?! Tapılmaz!!!

2

Ayazın babasını bu qədər sevməyi təsadüfi deyildi. Bu məhəbbət anasından ona keçmişdi. Çünki gözünü açan gündən tez-tez anası onu divardakı şəklin qabağına gətirər “baba, çiçə baba” deyə papaqlı,

bığlı-saqqallı kişini göstərərdi. Dil açanda isə anası da atası da ona üç söz öyrətmişdi: baba, Bakı, Yanşaq...

Niyə bu sözləri öyrətmişdilər? Aydındır niyə – baba babadır, evin ən əziz adamıdır. Bakı – yaşadıqları şəhərdir, Yanşaq da – babanın olduğu kənd.

Əlbəttə, bu üç sözdən əvvəl Ayaz iki söz də bilirdi: Ana və ata!.. Bu sözləri nə vaxt öyrənmişdi, deyə bilməz. Ona elə gəlir ki, bu sözlər anadan onunla birlikdə doğulmuşdur. Çünki o, atasını da, anasını da çox sevir. Lap elə birinci gündən sevir. Bircə dəqiqəliyə siz də uşaqlığınızı yadınıza salın: kim sizə atadan yaxın, anadan mehriban olub: – Heç kim! "Ana hanı?" – deyib soruşanda hansı uşaq sevinclə qollarını açıb, özünü anasının üstünə atmaz? "Ata gəldi!" – desən, hansı uşaq ayağı dolaşa-dolaşa qapıya qaçmaz?!

Ayaz da həmişə ata və anasını çox istəyib, onun nəzərində ana və ata hər şeydir. Yatmaq istəyəndə, acanda, üşüyəndə, qorxulu bir şey görəndə başqa uşaqlar kimi, o da həmişə anasının sinəsinə sıxılmış, atasının yanına qaçıb ona qısılmışdır. O indi də belə düşünür ki, anasının sinəsindən isti beşik, atasının sinəsindən möhkəm sığınacaq yoxdur. İndi də anasının danışdığı nağıllardan doymur. Atası ilə gəzməyə çıxanda elə bilir ki, dünyanı ona bağışlayırlar. Bəli, "ana və ata" – sözlərini Ayaz çox tez anlayıb. Lakin baba, Bakı və Yanşaq sözlərini bir az çətin və gec başa düşüb. Hətta körpə vaxtlarında babasından qorxub ürkərdi də. Çünki elə o zamanlarda da babası onlara az-az gələrdi. Ayaz onu yad adamlardan seçə bilməzdi. İndi də bəzən anası şəklin qabağında durub fikrə gedir və Ayaza baxaraq:

– Qorxurdum ki, böyüyəsən, babanı tanımayasan, – deyib gülümsəyir.

– Heç elə şey olar? Babamı hamıdan çox istəyirəm.

– İndi istəyirsən, çünki ağlın kəsir. Onda isə körpə idin, ağlın kəsmirdi. Mən səni şəklin qabağında saxlayıb, "baba, baba" deyə öyrədərdim. Şükür ki, babana belə tez mehr saldın.

Ayaz anasından "mehr saldın nədir?" – deyib soruşmur. O, anasının bu cür şirin və şəhər yerində az-az işlənən sözlərinin mənasını tez duyub anlayır.

– Ana, babam da məni çox istəyir ey – deyib anasını daha da razı salmağa çalışır.

– Əlbəttə, istəyir! Sənin üçün ürəyi bir tikədir.

Beləliklə həm "baba" sözü, həm də baba özü Ayazın xəyalında və ürəyində yaşayır. Anasının dediyinə görə Ayaz əvvəllər Bakı sözünün mənasını daha qəribə şəkildə anlayarmış.

– Soruşardım, Ayaz biz harda oluruq? Deyərdin Bakıda.

– Bəs Bakı hanı, balası? Bakını göstər görüm.

O zaman Ayaz toppuş əlini uzadıb yaşadıqları evi göstərərdi. Çünki onun uşaq xəyalında Bakı ancaq yaşadıqları evdən ibarət idi. İndi anası bu əhvalatı nəql edəndə Ayaz inanmır, elə bilir ki, bunlar hamısı nağıldır, ana özündən düzəldir ki, Ayazın ürəyi açılsın. Axı, necə ola bilər ki, bu boyda Bakının balaca evdən seçməyəsən? Hər halda Ayaz indi yaxşı bilir ki, Bakı böyük şəhərdir: burada onların yaşadığı dördmərtəbəli evdən başqa saysız-hesabsız böyük evlər, uzun küçələr, meydanlar, bağlar, kino-teatrlar, məktəblər, bulvar, Dağüstü park, stadion, cürbəcür fabriklər və zavodlar var.

Yanşaq sözünü başa düşməyi də məzəli olub. "Hanı Yanşaq?" deyib soruşanda o nədənsə şirin-şirin gülərmiş. Ayaz buna adət etmişdi. "Yanşaq" sözünü dilinə gətirəndə özü də gülərdi, qulaq asanları da güldürərdi. İndi isə bu söz onun ürəyini qızdırır, indi bilir ki, bu sözdə gülməli bir şey yoxdur. Bilir ki, babası Yanşaq kəndində yaşayır. Evlərinə təzə adam gələndə o ilk tanışlıqdan sonra mütləq divardakı şəkli göstərəcək:

– Babamdır, Yanşaqda olur... Bilirsiniz Yanşaq necə yerdir? Cənnət kimi! Kiçik Qafqaz sıra dağlarının başındadır. Lap hündür dağların təpəsində.

– Ayaz bəsdir, az təriflə Yanşağı, qonağı yorma! – deyib anası söhbətə qarışanda belə Ayaz əl çəkmir.

– Yanşağın mənası bilirsən nədir?

– Sənin kimi çox danışan! – deyib anası gülür.

– Heç də yox. Əsil mənası söz qoşub, saz çalan aşıq deməkdir, hə, babam özü deyir!..

Ayaz hələ indiyə qədər Yanşağı görməyib. Babası neçə dəfə istəyib ki, onu özü ilə kəndə aparsın. Ancaq anası və atası razı olmayıb. Gözlərindən qoymaq istəməyiblər, qorxublar ki, soyuq dəyər və ya başqa bir hadisə baş verər.

Yanşağa getmək üçün Ayazın ürəyi əsir. Babası və anası kəndin gözəlliyindən o qədər danışırlar ki, o, çox zaman kəndi yuxuda görür. Babasının sözünə görə dünyada hələ bu cür səfalı bir yer yoxdur,

Yanşağın dörd tərəfi uca dağlar, qalın meşələrdir. Ətrafında çaylar, bulaqlar şırıldayır... Ayaz Yanşağın, deyiləndən də gözəl olduğuna inanır. Çünki ondan söz düşəndə anasının üzü işıqlanır, gözləri dolur, az qalır ağlasın! Axı, anası Yanşaqda doğulub, uşaqlığını orada keçirib... Ancaq neçə ildir ki, gedə bilmir, neçə ildir ki, dağlarından kəklikotu yığmayıb, bulaqlarından su içməyib, odur ki, ürəyi darıxıb. Yox, anası "darıxıb" demir, başqa söz deyir, Ayaz bu sözü əvvəl dəftərinə yazmışdı. İndi əzbərdən bilir.

– Anamın ürəyi kənd üçün nisgil bağlayıb.

İndi Ayaz atasının otağında divardan asılmış "Azərbaycan xəritəsi"ndə Yanşaq kəndini tapıb anasına göstərəndə o, gülümsəyir, əlini oğlunun başına çəkir. Ayağı inandırmağa çalışır ki, körpəlikdə onun üçün Yanşaq anlaşılmaz, lap xəyali bir şey imiş. Ayaz heyrətlə anasına baxsa da, mübahisə etmir. Çünki elə indinin özündə də Yanşaq onun nəzərində doğrudan da xəyali bir şeydir. Məlik Məmmədin divlərlə vuruşduğu tilsimlər kimi, Koroğlunun dəliləri ilə birlikdə sığındığı dağlar kimi xəyalidir. Bir dəfə də Yanşaqda olmadığına baxmayaraq, Ayaz onu çox sevir. Təəccüb edirsiniz, hə? Görmədiyin bir yeri necə sevmək olar?! Lakin Ayaz sevir. Çünki Yanşağı çox yaxşı tanıyır. Anası, babası Yanşaqdan o qədər danışıblar ki, onu evlərinin içi kimi tanıyır və sevir. Ayaza elə gəlir ki, babasını sevdiyi gündən Yanşağı da sevməyə başlayıb.

Ayazın yadında qalan odur ki, babasını birinci dəfə beş yaşı olanda görüb. Elə o gündən də babasına qanı qaynayıb, ona mehr salıb, əlbəttə babası əvvəllər də onlara bir neçə dəfə gəlib-gedib, kənddən sovqat da gətirib. Hətta Ayazı qucağına alıb gəzməyə də aparıb. Ancaq bunlar Ayazın yadında deyil. Yadında qalan o gəlişdir ki, onu Ayaz birinci hesab edir və yəqin ki, heç zaman unutmayacaq...

... Payız idi. Axşam yenicə düşmüşdü. Bakıya məxsus xəzri küləyi birdən başlayaraq, pəncərələri, qapıları titrədirdi, toz-torpağı göyə sovururdu. Karvan-karvan qara buludlar gəlib şəhərin üstünü almışdı. Xəzərin mavi suları da qara rəngə çalırdı.

Uşaqlıqdan Ayaz xəzrini sevmir. Çünki xəzri əsəndə anası tutqun olur, hey pəncərə qabağına gedib nigaran gözlərini dənizə tərəf zilləyir. Axı, Ayazın atası neftçidir, dənizdə işləyir. Şiddətli külək başlayanda anası istər-istəməz ayazıyıb bikef olur. Belə hallarda Ayazın da kefi pozulur.

Yenə anasını dalğın görən Ayazı birdən yuxu basdı, əsnəmə tutdu:

– Ana, mən yatıram...

– Tezdir, oğlum. Şəngülümü gətir, otur yanımda, oxuyum, qulaq as.

– Mən yatmaq istəyirəm! – deyib Ayaz inad etdi. Anası otağın ortasında durub təəccüblə ona baxdı. Çünki Ayaz heç vaxt belə tez yatmazdı. Elə bu zaman qapının zəngi çalındı. Ana yerindən tərpənib qapını açanda, Ayaz diqqətlə baxırdı ki, görsün gələn kimdir. Uzun ağ saqqalı sinəsinə tökülmüş ucaboylu, motalpapaqlı bir kişi içəri girdi. Onu görən kimi anası "ah!" eləyib doluxsundu və tez:

– Dədə, xoş gəlmisən! – deyib əl-ayağa düşdü. Kişi ağzına qədər dolu xurcunu çiynindən aşırıb dəhlizin bir küncünə qoydu və Ayaza döndü, iki qolunu da açdı:

– Gəl babaya! – dedi. Qocanın məhəbbətlə dolu iri qara gözləri Ayazı çağırırdı. Bu gözlər qaranlıq gecədə parlayan ulduz kimi işıqlı idi. Ayaz hələ də mat-mat qocanı süzərkən, qoca geri döndü, xurcunun bir gözünü açdı. Oradan iki balaca bardaq, bir neçə başqa şey çıxarıb yerə qoydu. Anaya baxıb başı ilə "yığışdır" işarə verdi. Sonra xurcunun o biri gözünü açdı, onu da boşaltdı. Lap axırda, balaca bir qutu çıxartdı, qutunu açdı:

– Ayaz tut! – deyib nə isə yerə buraxdı.

Ayazın birdən yuxusu qaçdı. Pişik balası boyda xırda at tüklü bir heyvan əvvəlcə düşdüyü yerdə qısılıb qalmışdı, sonra tərpəndi, hoppana-hoppana özünə xəlvət guşə axtarmağa başladı. Qaçıb dəhlizdəki stolun altına girdi:

– Dovşan balasıdır, sənə gətirmişəm! – deyib baba Ayaza cürət verdi, – tut, məktəbə apararsan!

Ayaz tez stolun altına əyildi və bala dovşana baxdı. Onun burun pərəkləri aramsız qalxıb enir, gözləri qırmızı mərcan kimi yanırdı. Ayaz qorxa-qorxa əlini uzadıb onun yumşaq ağ tüklü dərisinə toxundu, sonra cürətlənib qucağına aldı:

– Sağ ol, baba! – deyib otağa keçmiş babasının dalınca getdi. Onun dizi üstündə oturdu.

Bala dovşanı xeyli oynadıb yorulduqda, Ayaz babasının göstərişi ilə stulu ayaqları yuxarı qoydu, dörd tərəfinə pərdə çəkdi, dovşana orada yer hazırladı. Qabağına bir nəlbəki süd gətirdi. Onu rahatladıqdan sonra, özü babasının yanında divana uzandı. Babası Ayaza Yanşaqdan, dovşanı necə tutduğundan, ceyran, cüyür, pələng, ayı ovundan danışmağa

başladı. Gecə yarıdan keçənə qədər Ayaz babasının nağıla oxşar şirin və maraqlı söhbətinə qulaq asdı. Yavaşdan ona cürbəcür suallar verdi. Babası meşələrlə örtülmüş sıldırım dağlardan, qış-yay qarı əskik olmayan hündür və çılpaq dağ zirvələrindən, qoynunda şırıl-şırıl çaylar axan, yaxasında şəlalələr şırıldayan dərələrdən həzin-həzin danışdıqca, xəyal Ayazı görmədiyi, bilmədiyi cazibədar yerlərə aparırdı...

Yuxusunda da o, meşələri, dağları, dərələri görür, gah dovşan, gah kəklik, gah da ceyranlarla oynayırdı...

Ayazın babasını sevməyinin tarixi belədir.

3

O zamandan illər gəlib keçdi. Ayaz çanta götürüb məktəbə getdi. Birinci sinfi qurtardı. İkidə, üçdə, dörddə oxudu. Həmişə bir sinifdən o birinə əla qiymətlər alaraq, ata və anasını hədsiz dərəcədə sevindirərək keçdi. Siz bilirsinizmi övladın yaxşı əməlini görəndə ana ürəyi necə dağa dönür?! Ayazın anası valideynlər iclasına, pioner yığıncaqlarına alnıaçıq, üzügülər gəlib-getməyə, başını dik tutmağa haqlı idi. Ayazdan bütün müəllimlər razılıq edirdi. Ayazın da üzü həmişə açıq olardı. Adama baxanda iri qara gözləri xoş təbəssümlə işıqlanardı.

Bu gün də Ayaz məktəbdən evə şad qayıtmışdı. Qapını açan kimi çantasını mizin üstünə atıb tövşüyə-tövşüyə:

– Ədəbiyyatdan yazı işi oldu, beş aldım! – deyə tez-tez danışdı.

Anası onun tələsik hərəkətlərinə və danışığına adət etmiş olsa da, barışa bilmirdi, hey çalışırdı ki, onu təmkinli danışmağa, təmkinli oturub-durmağa öyrətsin. Lakin bu gün kefinə dəyməyib "tələsmə, yavaş danış!" demədi. Ayaz yüngülcə nahar edib otağa keçdi. Anası mətbəxdə qaldı. Bu gün o, ağ önlüyü bağlamış, qollarını dirsəyə qədər çırmamışdı. Ayaz başa düşdü ki, anası mətbəxi əsaslı surətdə yığışdıracaq. Bütün qab-qacağı, bütün ləmələri, döşəməni və tavanı yuyacaq, silib-təmizləcəyəkdir. Deməli, saatlarla mətbəxdən çıxmayacaqdır. Buna görə də "Spartak" romanını əlinə alıb arxayınca oxumağa başladı. Saatların nə vaxt gəlib keçdiyini bilmədi. Bir də onda ayıldı ki, qaranlıq düşüb, şəhərin işıqları pəncərələrdə əks edir, anası başının üstünü almışdır:

– Bircə bük bu kitabı! Mən də deyirəm dərslərini öyrənir, səsi çıxmır, bük!

Ayaz yerindən tərpənmədi:

– Ana, izin ver buracan oxuyum, duraram, – deyib barmağını kitabın arasına qoydu.

Anası qəti səslə:

– Dur dedim, dur! Gün-gündən dərsə az baxırsan!

– Qiymətlərim ki, əladır! – deyib Ayaz anasını razı salmaq istədi.

– Yuxunun bahasına əladır! – deyib anası da sözündə israr etdi. – Sabah naxoşlayanda, bir yerin ağrıyanda qalacayıq yana-yana! Bük, dur ayağa! Birdəfəlik sırğa elə as qulağından – əvvəl dərs, sonra nağıl, roman! Saat onda da zəhmət çək, gir yerinə!

Ayaz yenə də kitabı əlindən yerə qoya bilmədi. Romanın ən maraqlı yerini oxuyurdu. Spartak qladiatorları başına yığıb ilk vuruşa hazırlaşırdı.

– Sözü kimə deyirəm, Ayaz! – deyib anası əl çəkmədi, – axı, belə yaxşı deyil, atan evdə olsaydı, çoxdan kitabı büküb qoymuşdun bir kənara. Atanın yanında bir cür, dalda başqa cür? Belə olar?!

Ayaz bir anlığa gözünü kitabdan çəkib anasına baxdı. Özünü də fikir apardı, doğrudan da, axı, deyəsən yaxşı olmur! Atası evdə olanda Ayaz qeyri-ixtiyarı olaraq əvvəlcə dərslərini hazırlayır, sonra başqa işlərlə məşğul olur. Nə qədər maraqlı kitab olsa da, saat on olar-olmaz büküb bir kənara qoyur, soyunub yerinə girir. Atası olmayanda isə, belə! Bu ani fikir Ayazı utandırdı, lakin marağını öldürə bilmədi. Kitabı büküb qoltuğuna aldı. Ayağa durdu. Anasının qabağına gəldi:

– Xahiş edirəm, ana, yarımca saat icazə ver. Elə şirin yerindəyəm ki!

– Elə hünər də odur ki, şirin yerində kəsəsən durasan ayağa, vacib işi görəsən. Kitab qaçmır ki...

Ayaz çar-naçar kitabı bükdü:

– Ey, babam burda olsaydı, qoymazdı məni bu qədər incidəsən! – deyib stolun üstünə qoydu. Gündəliyi açdı.

## 4

Ayaz məktəbə hamıdan erkən gəlmişdi. Əlində sarışın çantadan başqa, səliqəli bir bağlama da vardı. Bağlama qırmızı lent ilə ortadan çarpaz bağlanmışdı. Lentin ucları düyünlənməmiş, ilgək salınmışdı ki, asanca açmaq olsun. Ayazın gözlərindən sevinc qığılcımları çıxırdı. O hələ məktəbin uzun dəhlizində pəncərə qabağında durub yoldaşlarını gözləyirdi. Nəhayət, uşaqlar gəlməyə başladılar.

– Bu nədir? – deyib hər şeylə maraqlanan balacaboylu Nadir Ayazın əlindəki bağlamaya bir yumruq vurmaq istədi. Lakin Ayaz tez bağlamanı yana çəkdi.

– Eyy, olmaz... Bir az yavaş...

– Bu nədir ey? – deyib Nadir soruşdu.

Ayaz demək istəmədi.

– Tap görüm, nədir?

Nadir bic-bic güldü:

– Aha... a... bildim, baban gəlib. Dağdan sənə mərmər gətirib!

– Bilmədin! – deyib Ayaz məktəb formasını səliqə ilə ütüləyib geymiş Gülzara döndü. – Sən tap, görüm nədir?

Gülzar qızardı və yavaşca:

– Kəklikdir, – dedi.

– Ha... ha... ha... Kəklik... kəkliyə bax, aa!.. – deyib Nadir ucadan güldü və yenə də bağlamaya toxunmaq istədi. Yenə Ayaz qoymadı.

– Yavaş, əzərsən.

– Yumurtadır, nədir bu belə?! – deyib Nadir güldü.

Bu zaman zəng çalındı, uşaqlar hay-küylə siniflərə doluşdular. Ayaz da sirli bağlaması əlində gedib üçüncü cərgədə öz yerində oturdu. Ayazın əlindəki bağlamanı və üz-gözündəki qeyri-adi ifadələri görən botanika müəllimi dedi:

– Ayaz, göstər görək baban kabinetimiz üçün daha nə gətirib?

Ayaz müəllimin bu həssaslığından çox razı halda bağlamanı təntənə ilə gətirib stolun üstünə qoydu, qayıdıb yerində oturdu. Müəllim ilgəyi dartaraq bağlamanı açanda uşaqların maraq dolu gözləri onun əlinə dikilmişdi. Müəllim tələsmədən bağlamadan açdığı ağ kağızın qatlarını düzəldərək səliqə ilə bükür və güman edirdi ki, bağlamadan qurudulmuş bir qartal cəsədi və ya cüyür başı çıxacaqdır. Lakin o birdən heyrət edib duruxdu, uşaqların marağı daha da artdı. Dərhal hamı stolun ətrafına toplandı, uşaqlar bir-birinin çiyninə söykənərək boylanmağa başladılar. Bağlamadan tükü yumşaq və sapsarı, dişləri sədəf kimi ağappaq, gözünün giləsi isə almaz parçası kimi parıldayan bir pələng başı çıxmışdı. Uşaqlar heyrətlə ona baxırdılar, xeyli baxdıqdan sonra geri döndülər və gözlərin Ayaza dikdilər. Ayaz məğrur halda:

– Babam özü vurub! – dedi, – söz verib məni də dağa aparacaq. Ova gedəcəyik.

Uşaqlardan kim isə dedi:

– Mən də gedəcəyəm, atam icazə verər...

– İndi danış görək baban bunu necə ovlayıb? – deyərək müəllim Ayaza müraciət etdi. – Uşaqlar, oturun yerinizdə, qulaq asın.

– Müəllim, hələ babam onu mənə danışmayıb bu gecə danışacaq.

– Yaxşı, diqqətlə qulaq as. Gələn dərs sən də bizə danışarsan! – deyib müəllim dərsə başladı.

5

Lakin Ayaz gecə nə qədər çalışdısa, babası pələngi necə ovladığı barədə bir kəlmə də danışmadı. Bu dəfə kişi çox fikirli görünürdü. Dağlar, budaqlar, qarlı zirvələr və pələng haqqındakı sualların hamısına bircə cavab verirdi.

– Daha böyük oğlansan, sağlıq olsa, aparaaram, özün görərsən.

Bu dəfə babası ən çox üzünü böyüklərə tutub, onları maraqlandıran məsələlər barədə söhbət edirdi:

– Dədə işiniz-gücünüz necədir, güzəranınız xoş keçirmi? – deyib Ayazın anası soruşanda, baba əlini saqqalına çəkdi, qeydli gözlərlə qızını süzüb dedi:

– Qızım, yaman çətinliyə düşmüşük. Heç bilmirik necə edək?!

– Nə olub, əmi? – deyərək adəti üzrə gözucu qəzetə baxaraq babanın söhbətlərinə qulaq asan ata da maraqlandı və qəzeti kənara qoydu, – heç səni belə buludlu görməmişəm.

– Necə buludlu olmayım, bala? Heç bilmirik malı, heyvanı qışdan necə çıxardacağıq. Şaxta-boran başımızın üstünü alıb. Köhnə pəyələrimiz damır, dörd tərəfi sınıq-salxaq. Təzə tikdiyimiz damın da üstünü örtməyə şifer tapmırıq. Beş ay qabaq söz verib arxayın salıblar, indiyəcən əldə bir şey yoxdur.

Birinci dəfə idi ki, Ayaz babasından şikayət eşidirdi. Nəyinsə qabağında aciz qalıb qüssələndiyini görürdü. Buna görə də ona ürəyi yandı. Təsəlli verməkdən artıq, çarə tapmaq qəsdilə:

– Baba, sabah dərsdən gələrəm, bir yerdə gedərik nazirin yanına, – dedi, – şifer alarıq. Pəyələrin üstünü örtərsən.

Babası həm sevinc dolu, həm də istehzalı bir təbəssümlə gülümsəyib, nəvəsinə baxdı, heç bir söz demədi. Atası isə ciddi səslə:

– Fikir eləmə, əmi, gecənin xeyrindən gündüzün şəri yaxşıdır, deyiblər. Dur yat, səhər bir tədbir tökərik...

Yatmazdan əvvəl baba üzünü böyüklərə tutdu:

– Bu dəfə kəndə qayıdanda Ayazı da özümlə aparacağam. Yekə kişidir, qoyun isti-soyuğa öyrənsin... Qış tətilindəsə dağ havası udsun...

Babası bu sözləri elə dedi ki, heç kəsdə etiraz etməyə cürət qalmadı – anası və atası mat-mat bir-birinə baxıb durdular. Ayaz isə babasını qucaqladı:

– Sağ ol baba! İndi yoldaşlarım deyə bilməz ki, bəs necə oldu, neçə ildir eşidirik dağa gedirsən?! Gedəcəyəm, hələ Nadirə bir sovqat da gətirəcəyəm!..

6

Qırmızı rəngli avtobus dağ döşlərinə dırmaşaraq, meşənin içində o tərəf-bu tərəfə burularaq, çay qırağı yollarda şütüyərək yorulmadan irəliləyirdi. Ayaz üzünü pəncərə şüşəsinə yapışdırıb tanımadığı yerlərin bir-birini əvəz edən maraqlı mənzərəsinə həvəslə tamaşa edirdi. Yanında oturmuş babası ona hər meşə zolağının, hər dağın, hər dərənin adını deyirdi. Yanından ötüb keçdikləri xırda kəndlər haqqında məlumat verirdi. Hər 50-60 kilometrdən bir yolçuların dincəlməsi üçün tikilmiş düşərgələrdən danışırdı. Bu düşərgələrdən təzə dəmlənmiş çay, qovurulmuş ət iyi gəlirdi. Xüsusən, Mardakertdən sonrakı meşələrin və Tərtər çayının sahilindəki dağların mənzərələri Ayazı valeh etmişdi. Burada yolu tez-tez o tərəf-bu tərəfə burularaq, dolama pillələr kimi gah dağ zirvələrinə qalxır, gah da sıldırım qayaların altından keçirdi. Bəzən bu qayalar əzəmətli nəhəng bir qalxan kimi yolun üstünə sallanır, bəzən də geri qalxıb nizə kimi göylərə sancılırdı. Ayaza elə gəlirdi ki, hər dağ, hər dərə, meşələrdəki hər ağac eşitmədiyi bir nağıldır. Onlar hərəsi bir şərqi deyirdi, həvəslə oxuyaraq yoldan ötəni səsləyirdi. "Gəl ey cavan yolçu! Beləcə ötüb getmə, əylən, bizimlə söhbət elə, sonra get!"

– Ah, baba, nə gözəl Vətənimiz var! – deyib Ayaz bir anlığa babasına tərəf döndü və yenə üzünü pəncərə şüşəsinə yapışdırıb geri qaçan dağların, təpələrin tamaşasına daldı.

– Hələ bu nədir, əsil gözəllik qabaqdadır! – deyib babası uşaq sevincilə köksünü ötürdü...

Bir az sonra Ayaz gördü ki, babasının sinə dolusu ah çəkməsi nahaq deyilmiş! Avtobus şose yolunun ortasındakı körpünü keçib dayandı. Onlar xurcunu və iki böyük çamadanı daşıyıb yerə düşürdülər.

Avtobus hərəkət edib Kəlbəcərə getdi. Ayazgil şeyləri yolun kənarına qoyub başqa bir minik gözləməyə başladılar, onlar buradan sağa gedəcəkdilər.

– Atdan, maşından bir şey düşər, oturarıq aparar bizi kəndə! – deyib babası Ayazın əyninə nəzər saldı. – Üşümürsən ki?

Dağların sərin havası Ayaza xoş gəlirdi. Nəfəsi havada buxarlandıqca ayrıca ləzzət alırdı. Canı balaca gizildəsə də, babasının yanında özünü o yerə qoymadı:

– Soyuq deyil, baba...

Babası gözlərini qıyıb Kəlbəcərdən üzü aşağı enən yük maşınına baxdı, əlini qaldırdı, lakin maşın dayanmadı. Gəlib onların yanından birbaş Bakı yolu ilə ötüb getdi. Ayaz düşündü ki, nə olaydı, heç maşın gəlməyəydi, piyada yola düşəydilər. Meşədə gecələyəydilər. Tonqal qalayıb isinə idilər. Canavar və çaqqal uğultusuna qulaq asaydılar.

Babası onun xəyala getməsini darıxmaq kimi başa düşüb fikrini bir şey ilə məşğul etmək istədi. Bütün günü axarına qarşı gəldikləri çayın iki kiçik çaydan yarandığını söylədi:

– Bax, bu Tərtər çayıdır! – deyib yolun sağ əlində qranit kimi möhkəm qayaların, sal qaya parçalarının altından şırıltı ilə axan və göz yaşı kimi dumduru çayı göstərdi. – Bu biri isə Lev çayıdır. Murovdağ tərəfdən gəlir. Arada sarı torpaqlı düzənlikdən keçdiyi üçün belə bulanıqdır. Biz Lev çayının boyu gedəcəyik. Onda görərsən necə yerlər var!

Doğrudan da kolxozun Kəlbəcərdən qayıdan yük maşınına oturub sağa buruldugları andan hər addımbaşı dəyişən və daha gözəl, daha əzəmətli olan mənzərələr Ayaza nağıl kimi qəribə görünürdü. Yanşaq yolunun üstündəki qalın meşədən keçərkən artıq günəş qərb tərəfdəki dağların dalına yatmışdı. Dağların, meşələrin kölgəsi qatılaşmağa başlayırdı:

– Baba, tülkü! – deyib Ayaz maşında atılıb-düşdü. Kolluqdan boylanıb tezcə gizlənən boz rəngli şələquyruğu babasına göstərdi. – Sabah ova gedirikmi, baba?

– Yağış-yağmur olmasa, yəqin gedərik! – deyib babası cavab verdi, onu arxayın salmaq üçün sal buludların parçalandığı qərb üfüqündəki qızartılara baxıb əlavə etdi:

– Yağana oxşamır!

Ayaz da o tərəfə baxdı, nə gözəl mənzərə! Qarşıdakı böyük silsilə dağların aşağı hissələrini çılpaq qalın ağaclar, yuxarı hissəsini isə qar

örtmüşdür. Dağın boz qayalardan ibarət olan ortası enli bir kəmər kimi qaralırdı. Yuxarıda qarlı zirvələrdə batmaqda olan günəşin qıpqırmızı son işıqları əriməkdə idi...

– Hə, Yanşağa az qalıb, bir azdan çatarıq! – deyib babası yeni bir dağ silsiləsini göstərdi. Lakin, Ayaz nə qədər baxdısa, qabaqda ucalı-alçaqlı dağlardan başqa bir şey görmədi. Artıq ona elə gəlirdi ki, bu dağların axırı yoxdur. Maşın yoxuşu qalxıb bir dağın üstünə çıxmamış, o biri dağ qabağı kəsirdi... Dibi görünməyən dərələrin birini adlayıb keçməmiş, o biri görünürdü. Sayı-hesabı olmayan dağ silsilələri bir-birini əvəz edirdi. Ayaz dağların bu nəhayətsizliyi, bu gözəlliyi, dağ mənzərələrinin bitməz, tükənməz rəngarəngliyi haqqında düşünməyə başladı. Xəyal onu uzaqlara apardı. Bu zaman sanki lap dağların ürəyinin içindən qaynayıb qalxan bir mahnı eşitdi:

Məni binadan bəslədi
Dağlar qoynunda, qoynunda...
Tülək tərlanlar səslədi
Dağlar qoynunda, qoynunda.

Bu mahnını oxuyan babası idi. Onun ağ tüklərlə örtülmüş nurani üzü bir az da işıqlanmışdı, gözləri dağ zirvələrindəki qartal gözü kimi açılaraq, uzaqlara dikilmişdi. Ayaz ürəyində coşan məhəbbət duyğusu ilə onu qucaqlayıb öpmək istədi! Lakin mahnısını pozmaq istəməyib özünü saxladı...

## 7

Maşın Yanşağa girəndə artıq qaş qaralmaqda idi. Dağlara, meşələrə gözəl bir axşam enirdi. Yanşağın günbatan tərəfini böyük bir dağ kəsdiyindən kənd tez qaranlıqlaşır. Evlər dağın döşünə, dərə və təpələrə səpələnmişdi. Bu evlərdən ətrafa yayılan işıqlar sanki adamı çağırırdı.

– İndi qarı yaman sevinəcək! – deyib baba artıq daxmasını, ev-eşiyini fikrə gətirdi.

Ayazın da ürəyi titrəyib əsdi. Axı o, nənəsini ömründə ikicə dəfə görmüşdü. Arvad kənddən aralanmağı sevməzdi. Xəyalına gəldi ki, nənəsi necə qabağına qaçacaq, qırış-qırış titrək əlləri ilə necə boynunu qucaqlayıb öpəcək, – "ay ağrın alım, ay sən gələn yollarda güllər bitsin, nə yaxşı gəlibsən!" – deyib onu duz kimi yalayacaqdır...

Lakin onlar birdən-birə evlərinə gedə bilmədilər. Maşın birmərtəbəli üçgözlü bir binanın qabağında duran kimi bir dəstə adam onları əhatə etdi:

– Ay baba, xoş gəlmisən!

– Şəhərdə nə var, nə yox?

– Bir düş aşağı gəl idarəyə, qarı qaçmır, gedərsən.

– Bu kimdir, ay baba? – deyib kim isə Ayazı göstərdi.

– Nəvəmdir...

– Aaa, göz dəyməsin, Koroğludur lap. Xoş gəlib. Girin içəri görək...

Ayaza qəribə gəldi ki, heç kəs babasını adı ilə çağırmır, hamı ona “baba” deyirdi. Eyni zamanda, ürəyində məğrur bir duyğu oyandı – hamı babasına hörmət edir, onu böyük yerinə qoyur!

Onları içəri, balaca otağa apardılar. Uzunboğaz çəkməli cavan bir oğlan stolun dalından çıxıb babanı qucaqladı:

– Xoş gəlibsən, ay baba. Hamı yollardan sağlıqla...

Ayaz bildi ki, bu kolxoz sədridir. O, babanı yanındakı divana oturtdu. Özü də onunla üzbəüz oturdu:

– Baba, bircə məni rahat sal görüm, şifer düzəldi, ya yox? Deyən qış yaman sərt gələcək.

Baba adəti üzrə cavab verməyə tələsmədi. Öz istədiyini soruşdu:

– İnəklər döl atırmı?

– Cinslərin üçü əkiz doğdu, baba! – deyərək sədr sevinclə xəbər verdi. – Yerləri də istidir.

Babanın rəngi açıldı. Saqqalını tumarladı:

– Fikir eləmə, şifer də verdilər, – dedikdə sədr yerindən qalxıb onu bir də qucaqladı:

– Sağ ol, ay baba...

Bu zaman o biri otaqdan baba kimi yaşlı bir kişi başını içəri saldı:

– Ay sədr, gəl gör bu radio niyə səsini kəsdi. Xan ağzını təzəcə açmışdı, şirin yerində xırp dayandı.

Onlar o biri otağa keçdilər. Bu, nisbətən böyük otaq idi. Ortada uzun stol qoyulmuş, üstünə qəzet, jurnal səpələnmişdi. Küncdəki dəyirmi stolun üstündə radiotutan vardı. Bir dəstə kolxozçu onun ətrafına toplanmışdı. Babanın və sədri görən kimi hamı kənara çəkildi. Baba ilə görüşüb sakit dayandılar.

– Bəs, klub müdiri haradadır ki, – deyib baba soruşdu, – radionuz oxumur?

– Rayon mərkəzinə gedib. Sabah qayıdacaq.

Sədr üzünü hamıdan cavan olan bir oğlana tutdu:

– Qardaş, lətifəsi sənə gəlməsin, deyirlər ki, itin böyüyü ol, qardaşın kiçiyi olma. Hamıdan kiçiksən, qaç Kərim kişinin oğlunu çağır, bu radionu düzəltsin.

Ayaz tərəddüd və həyəcan içində bir babasına, bir də sədrə baxdı. Axı, o, radiotexniki dərnəyə getmişdi, radiotutanlardan başı çıxırdı. Eyni zamanda, qorxdu ki, buradakını düzəldə bilməyə, elə birinci gündən Yanşaqda özünü biabır edə! Birdən içərisindən bir səs ona cəsarət verib dedi: – "Qorxma, Kərim kişinin oğlu gəlməmiş keç irəli düzəlt!"

– Baba, olar, mən baxım? – deyib titrək səslə soruşdu.

Hamı Ayaza baxdı. Kim isə:

– Gəl, qoçaq oğlan! – deyib ona ürək verdi.

Ayaz radiotutanın dal qapağını açdı, həyəcan və iztirabını boğmağa çalışaraq səliqə ilə yoxlamağa başladı. O yan-bu yana əl gəzdirdi, gördü ki, bir lampası yanıb, tez lampa istədi, alıb dəyişdi. Bir az sonra radio xırıldamağa və yavaş-yavaş işləməyə başladı. Ayaz sevincək halda Bakını tutdu. Xanın kəsmə şikəstəsi otağa dolduqca hamını fərəh bürüdü:

– Sağ ol, var ol, belə oğul! – deyib yer-yerdən səsləndilər.

Sədr isə əlini Ayazın çiyninə qoydu:

– Səni şəhərə-zada buraxan deyiləm, qal babanla kolxozda işlərsən...

Ayaz sevincindən qanadlanıb uçmaq istəyirdi.

8

Ayazın kəndə gəldiyi üç gün idi. Amma hələ də ova çıxmamışdılar. Birinci gün babasının dediyi kimi hava "ov havası" olsa da, Murovdağa getmək mümkün olmadı. Çünki kolxoz sədri hələ axşamdan xəbər göndərdi ki, sabah iclas çağırıb, babanın orada olması vacibdir, "onsuz keçinə bilmərik". Ayaz bu sözü eşidəndə bir yandan sevindi ki, babası kənddə bu qədər lazımlı adamdır, onu sevirlər. O biri yandan ürəyində kolxoz sədrinin dalınca deyindi: "Bu da iclas çağırmağa vaxt tapdı!". İkinci gün ov dəsgahını axşamdan hazırladılar. Babası beşaçılan ov tüfəngini yağladı, fişəngləri yoxladı, göz qabağında olsun deyə meşin çantanı qapının ağzındakı mıxdan asdı, nənəsi soyutma ət, bir neçə

yumurta bişirib dəsmala bükdü, duz qoydu. Termosa çay doldurdu. Xoruzların ilk banında babası tərpənən kimi Ayaz da yerindən qalxdı:

– Baba gedirik?

– Qoy görüm, bala, hava necədir? – deyib kişi qapını açanda həyət-bacanı qar basdığını gördü, – yox, ov havası deyil, bala, cığırı-izi qar tutub, dağa qalxmaq olmaz.

Üç gün beləcə keçdi, hava açılmadı. Ayaz kənd uşaqları ilə dostlaşdı. Gündüzlər onlarla kolxozun balaca klubunda şahmat, nərd, domino oynadı, həyətdə qar topasına çıxdı. Səhəngi dalına alıb bulaqdan nənəsinə su gətirdi. Ot tayasının dibində toyuqlara dən verdi. Kitabxanaya baş çəkdi, saatlarla kitab oxudu. Yenə də artıq vaxtı qaldı. Ona elə gəlirdi ki, kənddə, şəhərə görə vaxt birə on yavaş keçir, gün bitib qurtarmaq bilmir.

Ova çıxmaları isə tamamilə gözlənilməz və qəribə oldu. Axşamüstü babası hündür bir divar kimi şimal üfüqlərini tutmuş Murovdağa tərəf baxıb dedi:

– Hə, Ayaz hazırlaş, sabah ov havasıdır.

– Nədən bilirsən, baba? – deyib Araz maraqlandı.

– Murovun üstü açılır, deməli qar-yağış gözləmə. Gəl yataq. Gözümüzün acısı getsin, alaqaranlıqdan düşək yola...

Ayaz dağ kəndinin hər şeyini, lap ilk axşamdan yatmaq adətini də sevməyə başlamışdı. Başını yastığa qoyub zil qaranlıq içərisində ətrafa qulaq asırsan, necə sirli, necə pozulmaz bir sükut kəndi bürüyür! Ancaq dağın dibindən axan çayın şırıltısı eşidilir. Bu şırıltı özü də sanki sükutun içində əriyib gedir. Ara-sıra itlər qalın, boğuq, davamlı səslə hürərək, bu sükutu pozurlar, adamın canına soyuq bir üşütmə salırlar – axı, itlər boş-boşuna hürmür, ya toyuq hininə yaxınlaşan çaqqalın, tülkünün, ya da qoyun-quzu aparmağa gələn ac canavarların iyini alırlar. Səhərki ovun həvəsi ilə, itlərin təkbir hürməsinə və babasının həzin xorultusuna qulaq asdığı halda Ayazı yuxu apardı.

Həyətdə səs eşidəndə ona elə gəldi ki, bir saat yox, iki saat yox, on saat, on beş saat yatmışdır. Tez qalxıb yerində oturdu və qaranlığın içindən gələn danışığa qulaq asdı:

– Nə var, bala? – deyib babası kimdənsə soruşurdu.

– Ay baba, Mərcan gecə yarısından çapalayır, gəl, bəlkə bir əlac eləyəsən! – deyən bir uşaq səsi cavab verdi.

Baba deyinə-deyinə qayıdıb içəri girdi:

– Ağzından süd iyi gələn uşağa ferma tapşırmaq olar? – deyib qaranlıqda geyinməyə başladı.

Ayaz dərhal yerindən sıçradı:

– Baba, mən də gedirəm.

Babası pıçıltı ilə danışdı:

– Yaxşı. Ehmalca geyin, qarı oyanmasın, yoxsa burnumuzdan tökər. Qoymaz belə erkən evdən çıxaq...

Tələsik və çox ehtiyatlı hərəkət etmələrinə baxmayaraq, qaranlıqda Ayazın ayağı kətilə ilişdi. Kətilin üstündəki fincan gedib taxtın ayağına dəydi. Qarıdan səs çıxmadığını görən baba yenə pıçıltı ilə dedi:

– Hə, yaxşı qurtarmışıq Ayaz, qarı oyanmadı, gəl çıxaq.

Tüfəngi, çantanı, termosu götürdü. Otaqdan çıxanda səs eşidərək ikisi də yerində donub qaldı.

Qarı nənə qapıda durub, nə isə Ayaza uzatdı:

– Al, bala, başlığı da götür. Dağa etibar yoxdur. Çovğuna-zada düşərsən.

Həyətdən çıxanda baba nənəyə dedi:

– Dovşandan da ayıq yatırsan, ay imansız!

Baba bu sözləri elə məzəli dedi ki, Ayaz da, malabaxan gənc də uğunub getdilər.

Şaxtalı gecə idi. Göy üzündə seyrək ulduzlar sayrışırdı. Ay girdə, büllur ayna kimi dağın təpəsindən asılmışdı. Malabaxan Ayaz yaşda bir yeniyetmə idi. O, babanın yuxusuna haram qatdığı üçün, günahını yumağa çalışaraq deyirdi:

– Baba, gecə gözü heç kəsin qapısına gedə bilmədim. Dedim, dünyagörmüş adamsan, bir çarə taparsan... Nə doğana oxşayır, nə də naxoşa. Dörd-beş saatdır zarıyıb durur...

Artıq, baba yumşalmışdı:

– Yaxşı eləmisən ki, mənim qapıma gəlmisən. Boğaz inək çox yazıq heyvandır. Gərək vaxtında halına qalasan...

Oğlan kəndli uşaqlarına məxsus utancaqlıqla cavab verdi:

– Dədəm axşamdan nənəmi götürüb Mərzli kəndindəki xəstəxanaya aparıb, gərək indiyəcən qayıdıb gələydi. Nə oldusa ləngidi. Mənə deyib ki, mallara yaxşı baxam...

– Nənənə nə olub?

– Sətəlcəmdir, baba...

– Sağalar, fikir eləmə, – deyib baba uşağı arxayın saldı. – Yetim böyüyər, yamanlıq Əzrayıla qalar, inək də doğacaq, nənən də sağalacaq, heç fikir eləmə...

Onlar uzunsov, alçaq damlı mal tövləsinə girəndə, isti heyvan nəfəsi və mal iyi Ayazı vurdu. Lakin o, geri çəkilməyib babasının dalınca yeridi. Qabağa getdi. Malların bəzisi mışıltı ilə yatmışdı, bəzisi tövşüyürdü, bəzisi axurdakı quru otun qalıqlarını yeyirdi. Ayrıca bir gözdə iri gövdəli, biz rəngli, alnında ağ qaşqası olan Mərcan yatmışdı. O, ayaqlarını uzatmış, quyruğunu yana atmışdı, ağır-ağır nəfəs alır və gücənirdi.

Baba hələ uzaqdan:

– Mərcan, Mərcan, sənə nə olub? – deyərək böyük bir məhəbbətlə oxşaya-oxşaya inəyə yaxınlaşdı. Başını, boynunu sığalladı, o tərəf-bu tərəfinə baxdı:

– Doğacaq, – dedi. – Birinci balasıdır, ağır gedir. Özü də pis yatıb. Sağ ayağı gör necə bükülüb. Bu saat düzəldərik.

Baba Mərcanın sağrısından yapışıb qaldırdı. Sağ ayağını altından çıxarıb düzəltdi, yenə yumşaq isti sarğısını, alnını sığalladı. Mərcan sanki bu mehribanlıqdan isinib dirçəldi. Gözünü qaldırıb babaya baxdı və gücəndi. Baba daha artıq bir hərarətlə Mərcanı oxşayır, orasını-burasını sığallayırdı...

Bir qədər sonra eynən anasına oxşar qaşqa bir buzov Mərcanın qabağında uzanmışdı.

Mərcan yatdığı yerdəcə bütün qüvvəsilə onu yalayır, yalayırdı. Ana nəfəsinin ilıq hərarəti ilə onu qurudur, ona həyat verirdi...

Ayaz heyrət və maraq içində Mərcana və onun körpə balasına baxmaqdan doymurdu...

– Baba bu, ovdan da ləzzətli oldu! – deyib babasına baxanda qoca da sevinclə gülər gözlərini nəvəsinə çevirdi.

– Yox, bu gün ovumuz da uğurlu olacaq! – deyib qapıya yollandı.

## 9

Onlar Murovdağa çatanda səhərin gözü yenicə çırtlayırdı. Ayaz hündürlüyü dörd min metrdən artıq olan bu əzəmətli dağa tamaşa etdikcə ürəyi dağa dönürdü. Necə nəhəng, necə böyük bir dağ. Ayaz onun ətrafındakı saysız-hesabsız xırda dağlara, dərələrə və təpələrə baxırdı, baxdıqca da ürəyi qəribə bir sevinclə dolurdu. Qar qalaqları ilə dolu

dərələrdə, sıldırım buzlaqların altında dumduru bulaqlar və çaylar şırıldayırdı. Öz nəhəng görkəmi ilə başqa dağlardan seçilən Murov nə əvvəli, nə də axırı olan uca, qalın qrant külçələrdən əmələ gəlmiş sədd kimi günçıxandan günbatana tərəf uzanıb gedirdi. O, nəhəng-nəhəng qayalardan, saysız-hesabsız qara, qırmızı, sarı və boz rəngli sal qaya parçalarından yaranmışdır. Çox yerdə bu qayalar bülöv kimi hamar, ülgüc kimi itiuclu idi. Babanın dediyinə görə ən yaxşı atlar da bu qayaları aşa bilmir, onların zirvəsinə dırmaşıb keçə bilmir, üstündə dırnaq tökürlər. Bu açıq, bu buludsuz qış səhərində də Murovun zirvələri bulud və duman içində itmişdi. Döşlərini qalın qar layları örtmüşdü. Yalnız orta hissələri açıqdı. "İtyolu" adlanan cığırın solundakı qara, qumsal və daşlı-çınqıllı cənub yamacları da çılpaq idi. Bura o qədər sürüşkən və sıldırım idi ki, qar da dayanmayıb aşağı – dərələrə süzülürdü...

Baba böyük bir qayanın dalında gizləndi, qabaqdakı sıldırım dağın belindən qara zolaq kimi burulub keçən balaca, dar cığırı Ayaza göstərdi:

– Sürü oradan gəlib bulağa ötəcək, səsini, cınqırını çıxarma. Gözlə!

Ayaz da, baba da diqqət kəsilərək gözlərini cığıra dikmişdilər. Soyuq-şaxta onların yadından çıxmışdı. Gözləri, yanaqları yanır, ürəkləri həyəcanla döyünürdü...

Səhərin çəni-dumanı seyrəkləşib hava azca açılar-açılmaz, təkə cığırda göründü. Onun iti, gözəl buynuzları alnından xeyli yuxarı çıxaraq, çarpazlaşmışdı. O, iri gövdəsini şax dartaraq, çevik hərəkətlə bərədən adlayıb sivrim uclu qayanın arxasında gizləndi. Təhlükə olub-olmadığını bilmək üçün ayıq gözlərlə ətrafı süzdü. Qorxulu bir şey görməyib arxayınlaşan kimi irəlilədi. On-on iki dişidən ibarət sürü qayaların kölgəsindən çıxdı, təkənin dalınca hərəkət etdi. Təkə irəlidə gedir, arabir dayanaraq dörd tərəfə göz yetirir, yenə sürünün ağzını dərəyə "güzgü" bulağa tərəf çəkirdi. Təkə ayaq saxlayan kimi, sürü qayaların dalında gizlənib, onun işarəsini gözləyirdi.

Təkə isə ehtiyatlı, ayıq gözlərlə dərələrə, sıldırım qayaların dalına baxıb sürünü irəli aparırdı. Ayaza elə gəldi ki, dağ keçilərinə başçılıq edərək, hər an öz həyatını təhlükə altına atan bu heyvan qəribə bir qürurla yeriyir və məhz buna görə də, babanın gözü ondadır, sanki məğrurları vurub yıxmağın ayrıca ləzzəti varmış! Bir anda Ayazın özünü də bu ehtiras bürüdü: "Nə yaxşı da buynuzları var! Lap məktəbimizin dəhlizindəki böyük divardan asılmalıdır. Hamının ağzı açıla qalacaq!.."

Təkə qayaların dalından batıb-çıxaraq, boylana-boylana və çox ehtiyatla irəliləyirdi. Artıq sürünün dərədəki bulağa yaxınlaşmasına iki-üç keçid qalmışdı. Babanın gözləri yanmağa başlayırdı, yanaqları allanmışdı, səbirsizliklə sürünün bərəyə yaxınlaşmasını gözləyirdi. Hətta acığı da tuturdu ki, niyə təkə belə yavaş tərpənir. Ayaz da darıxırdı. Ən maraqlı dəqiqənin – sürüyə atəş açacaqları dəqiqənin tez gəlib çatmasını istəyirdi...

Budur, dərəyə yaxın böyük bir qayanın dalından təkənin başı göründü və göz yumub-açınca yox oldu. Təkə çox təcrübəli idi. Qorxulu yerlərdən cəld və ehtiyatla keçirdi. Sürünü axırıncı keçidə yaxınlaşdırdı. Burada cəmi beş-altı metrlik düz bir yer var idi. Lakin bu yerdə vurulan ov heç olurdu. Çünki keçilməz bir uçurum aranı kəsmişdi. Təkə oranı da bir anda sıçrayıb gözdən itdi. Sürü eyni hərəkətlə təkənin dalınca gedirdi. Sürünün içində iri bir keçi Ayazın diqqətini cəlb etdi. O, öz gözəlliyi ilə bütün sürüdən seçilirdi: nazik beli tarım çəkilmişdi. Qarnının altında alası vardı, boynunu, belini şax tutub yeriyirdi. Tamamilə özünə bənzəyən balası da yanında ayrılmırdı. Onun da beli çəkik və qarnının altı ala idi. O, bir dəqiqə anasından kənar düşmür, gah sağına, gah soluna keçib onunla yanaşı gedirdi. Ayazın başına ani olaraq bir fikir gəldi: “Nə olaydı, balanı diri-diri tutaydıq!”

Təkə son keçiddə dayanıb dörd tərəfə boylandı. Hətta, Ayazgilin daldalandığı qayaya tərəf də baxdı. Lakin pusquda duranları görməyib tez yoluna davam etdi. Adəti üzrə iti sürətlə bərədən qarşıdakı keçidə sıçradı. Baba “ay kafir, yaman zirəksən!” – deyib barmağı tüfəngin tətiyində, sürünün bərəyə gəlməsini gözlədi. Bu qərara gəldi ki, qabaqda yeriyən bir-ikisini buraxsın, sürünün ortasına atəş açsın. O zaman şübhəsiz ki, ikisini, üçünü vura biləcəkdir. Babanın bu qəsdini anlayan Ayaz düşündü ki, yəqin ana və onun gözəl balası da keçiddə vurulacaq...

Düşündü və kədərləndi – qəribə idi! O, nə bu gözəl balanın, nə də onun gözəl anasının ölməyini istəmirdi. Elə bu an bala başını bu tərəfə çevirdi, gözəl gözləri ilə məlul-məlul Ayaza tərəf baxdı. Ürəyində baş qaldıran qəribə bir duyğudan Ayazın canına üşütmə düşdü. Sanki kim isə qulağına pıçıldayıb dedi: “Bu da işdir?! Xəlvətcə bir daşın dalında yat, dağların yaraşığı olan bu gözəl heyvanlara hər an, hər dəqiqə ölüm hazırla. Nə qədər insafsız, nə qədər amansız bir iş!” Yalnız indi, barmağını tüfəngin tətiyinə bircə dəfə basmaqla heyvanlardan hansınınsa

yaralanıb öz qanına bulanacağı dəqiqədə Ayaz bu hərəkətin bütün amansızlığını duydu və anlaya bilmədi ki, babası kimi yumşaqürəkli, mehriban bir adamın belə işə necə də ürəyi gəlir!

– Hə, hazırlaş, lap bərəyə yaxınlaşırlar, ikisini, üçünü vuracağam! – deyib baba pıçıldadı və tüfəngi sinəsinə sıxdı, əlini tətiyə qoyub gözünü qıydı.

Ayaz gördü ki, onun geniş alnındakı, çıxıq yanaqlarındakı nazik damarlar qızarıb. Qırış-qırış əlləri belə başqa rəngə çalır. Bu əllər tüfəngi bərk-bərk sinəsinə sıxmışdı. Baba bütün vücudu ilə atəş açmağa hazır idi. İki-üç dəqiqə keçməz ki, səhər suyuna gedən bu gözəl heyvanlardan biri, bəlkə də bir neçəsi al qanına bulanar. Sürü təkənin dalınca bərədən adlamaq istəyəndə ana keçi öz balası ilə güllə mənzilinə yaxınlaşdı. Hətta bala yazıq gözlərlə yenə Ayaza tərəf baxdı. Bu zaman baba barmağını tətiyə basdı. Ayaz qeyri-ixtiyarı olaraq ildırım sürətilə babasının sinəsindəki tüfəngin lüləsindən yapışıb havaya qaldırdı. Nagahani gurultu dağları sarsıdanda sürü bir anın içində qayaların arasına səpələnib gözdən itdi...

Ayaz tüfəngin lüləsini yuxarı qaldıranda az qala arxası üstə yıxılıb dərəyə uçacaqdı. Qoca ani sürətlə nəvəsinə çəpəki bir nəzər saldı:

– Nə qayırırsan, dəli-zad olmamısan ki?! – deyib özü də hiss etmədən əsəbi hərəkətlə nəvəsinin sinəsindən itələdi.

Ayaz səndələdi və bir anda sıldırım qayaların altındakı dərənin dibini görər kimi oldu. Gözləri qaraldı, boğazı qurudu. Uçuruma yuvarlanmamaq üçün qeyri-iradi bir cəldliklə yandakı sivrim qayadan yapışdı, ayağını kəsik qaya parçasına söykədi. Lakin qaya ayağının altından qaçdı, əli boşa çıxdı, müvazinətini itirdi. Bir anda sanki bütün dağlar başına fırlandı. Əl-qolu havada, üzüaşağı yumbalanan yerdə gözünə ilişəcək dəydi, pişik kimi sürətlə arxadakı qaya parçasını qucaqlaya bildi. Bütün ağırlığı ilə onun üstünə düşdü. Artıq ovçuluq ehtirası soyumuş və nəvəsinin başının üstünü alan təhlükəni duymuş qoca da özünə gəlmişdi. Gözucu aşağıdakı uçurumun dərinliyinə baxdı – bircə an qaya parçasını gec qucaqlasa, Ayazın həmin uçurumun təkində olacağını anladıqda gözlərini yumub dodaqlarını dişlədi. Tüfəngi bir kənara atıb nəvəsini uçurumun ağzından bu yana çəkdi və bağrına basdı.

Ayaz onun hələ də heyrət və sual dolu gözlərinə baxdıqda dedi:

– Baba, bir də ceyrana, keçiyə güllə atma...

Bu bir cümlə sanki qoca ovçu ilə ömründə toyuq başı da kəsməmiş balaca nəvənin arasındakı soyuq uçurumun dərinliyini ifadə edirdi...

Baba cavab verməyib dağdan enməyə və yavaş-yavaş kəndə tərəf yeriməyə başladı.

Baba qabaqda, tüfəngi ağzı aşağı çiynindən asıldığı halda yavaş addımlarla irəliləyirdi. Nəvə ondan on beş-iyirmi addım geridə yeriyir, ayaqlarının altında parıldayan qarın xırçıltısına qulaq asaraq düşünürdü ki, yəqin baba məni aciz-avara bir şey hesab edir... Bu düşüncə onu əzir və ürəyində tezliklə şəhərə, anasının yanına qayıtmaq həvəsi oyadırdı.

Baba isə başıaşağı, heç bir söz demədən uçurumların, dərin dərələrin ağzından keçdikcə, dar cığırlarda ehtiyatla irəlilədikcə sanki doxsan illik ömür kitabını vərəqləyir və doğru yaşayıb-yaşamadığını düşünürdü. Yalnız kəndə girəndə o, qayıdıb nəvəsinin dağ havası ilə qızarmış üzünə baxdı, açıq və işıqlı alnından öpdü.

– Sən haqlısan, bala! – dedi, – haqlısan!

Baba ilə nəvə arasında açılmış uçurum bağlandı.

Ayazın üstündən elə bil ki, bir dağ götürdülər... İndi o, kəndə gəldiyinə nə qədər sevinirdi. İndi onun sinəsində anasına, məktəb yoldaşlarına deməli bir kitab söz vardı.

*1964*

# MƏDİNƏNİN ÜRƏYİ

1

Yavər, arvadı Mədinəni sevirdi, ürəkdən sevirdi, öz sevgisi ilə xoşbəxt idi. Qış yuxusundan oyanan ağaclar yaz günəşinə tərəf boylanıb ılıq şüaları içdikcə çiçəklənərək açıldığı kimi, Yavər də bu sevgidən qüvvət alırdı. Təmiz məhəbbət onun həyatını səadətlə, şirin xəyallar və arzularla doldurmuşdu. Mədinəyə xoş gəlmək, Mədinəni razı salmaq həvəsi daima kişinin fikrini oynadır, cürbəcür hərəkətlərə sövq edirdi. Mədinə tamahkar deyildi ki, deyəsən Yavər ona dəbdə olan bir paltar almaq və yaxud yayda hansı kurorta isə aparmaq üçün pul tapmağa cəhd edir, əldən-ayaqdan olur. Buna ehtiyac yox idi, çünki Mədinə təmtərağı və israfı sevməzdi. Yavərin müəllimlik maaşı ilə güzəranları pis keçmirdi. Mədinə ərinin qazancı, maşını, şöhrəti ilə qürrələnən, bir paltarı beş dəfədən artıq geymədiyini ağız dolusu ilə söyləyən arvadları sevməz, gen qaçardı. Lakin onların paxıllığını da çəkməz, qeybətini də etməzdi, sözləri aralığa gələndə xəfifcə gülümsəyib durardı.

Mədinə balıq və gül-çiçək aşiqi idi. Elə güman etməyin ki, söhbət dənizdən tutulub tavada qızarılan balıqdan gedir. Yox, şüşə qablarda saxlanan xırdaca balıqlar Mədinənin evinin yaraşığı idi. Buna görə də Yavər demək olar ki, hər həftə balıq satılan dükana baş çəkər, dost-aşnadan soraqlaşar, təzə, "əntiqə" balıq axtarardı. Mədinənin qablarında müxtəlif rəngdə irili-xırdalı balıqlar olardı. Yavərin pillələri çıxmasından, qapının zəngini basmasından Mədinə onun balıqla gəldiyini bilər, əvəzində hər dəfə boynunu qucaqlayıb öpərdi. Yavərə ləzzət verən Mədinənin uşaq kimi sevinməsi, xoşbəxtlik duyması idi.

Çiçəkləri də Mədinə beləcə sevərdi. Biz gül dükanlarında biri əlli qəpiyə satılan qızılgülü, zanbaq gülünü, məxməri gülü və ya nərgizi demirik. Əlbəttə may ayında Yavərin bir dəstə xoş ətirli məxməri gül ilə evə gəlməsi Mədinəni sevindirərdi. Onları vazaya doldurub stolun üstünə qoyar, hər gün sularını dəyişər, saplağından azca qayçılamaqla ömürlərini bir həftəyə qədər uzadardı.

Lakin Mədinə dibçəklərdə saxlanan, yay, qış yaşıllığını itirməyən Çin çiçəyini, şamdangülünü və sairəni daha çox sevirdi. Onun aynabəndi bayırdan baxanda bir tamaşa idi. Burada dibçəklərdə cürbəcür yaşıl ağaclar və güllər gözə dəyirdi. Bunların da çoxunu Yavər tapıb gətirmişdi.

Yavər bilirdi ki, Mədinənin ürəyi yumşaqdır, dünyada bir adamın pisliyini istəməz. Qonşulara və tanış-bilişə bədbəxtlik üz verəndə Mədinə ürəkdən kədərlənər, bacardığı köməyi edərdi. Xüsusən mübarizəyə hazır olmayan qadınların və uşaqların başına bir iş gəldiyini eşidəndə, az qalardı ağlasın. Bir dəfə ağlamışdı da.

Qonşuluqda Məryəm adlı savadsız və aciz bir arvad yaşayırdı. Məryəmin əri Balaş otuzuncu illərdə kənddən Bakıya gəlmiş və neft sənayesində işə girmişdi. O, adi fəhləlikdən başlamış, yavaş-yavaş irəliləmişdi. Son illər qazmaçı vəzifəsində çalışırdı. Həmyerlisi olan Məryəmlə qırxıncı illərdə, lap müharibə ərəfəsində evlənmişdi. O zaman Məryəmin iyirmi yaşı vardı. Özü də cəmi dördüncü sinfə qədər oxumuşdu. Tez tutulan, tez sıxılan bir qızdı, heç zəmanə adamına oxşamırdı. Buna görə də Məryəmin bütün həyatı, dolanacağı ərinə bağlı idi. Bədbəxtlikdən il yarım bundan qabaq kişinin mədəsində xərçəng yarası tapıldı. Bu riyakar xəstəliyin üstünü vaxtında almaq çətin məsələdir. Balaşın da mədəsində onu gec gördülər, çayır kimi qol-budaq verib hər tərəfi tutmuşdu. Həkimlər heç bir əlac edə bilmədi. Altı ay xəstəxanada yatıb kişi vəfat etdi. Məryəm beş yaşlı qızı Sona və on yaşlı oğlu Nazimlə başsız qaldı. Balaşın meyitini evə gətirəndə Mədinə də onlara qoşulub ağladı. Bununla Məryəmin dərdini azaltmaqdansa artırdığını görüb özünü ələ aldı. Gecə-gündüz ondan ayrılmadı. Ev işlərini gördü, uşaqlara hayan durdu. Gəlib-gedəni qəbul edib, yola saldı. Məryəmi ümidsizliyə qapılıb ruhdan düşməyə qoymadı. Gecədən xeyli keçmiş yorğun-arğın evə çəkiləndə də onun halına yandı.

– Ay Yavər, yaman yazıq arvaddır, tikəsini ağzından çıxartsalar deməyə söz tapmaz!

Yavərin məsləhəti və göstərişlərilə ora-bura qaçdı. Məryəmin iki uşağına pensiya təyin etdirdi, özünü isə mədəndə işə düzəltdi.

Məryəm səhər gedir, axşam qayıdırdı. Çünki iş yeri uzaq idi. Nazim tərbiyəli və şüurlu uşaq olduğundan məktəbdən qayıdıb dərslərini hazırlayır, həyətdə oynayırdı. Lakin balaca Sona başsız qalırdı. Onu tək qoyub işə getmək ana üçün ağır idi. Məryəm işdən qayıdana qədər bir neçə gün Mədinə uşağı evlərinə apardı. "Nə edək? Adam-adama yaman gündə lazım olar" – dedi. Çox keçməmiş Sonanı da yaxındakı uşaq bağçasına verdi. Məryəmgilin həyatı yoluna düşdükcə, Mədinə nəhayətsiz sevinc və səadətdən atılıb-düşmək istəyirdi. Onun sevincinə sevinən Yavər də açıldı.

– Hə, indi rahat oldunmu, mənim əzizim? – deyib soruşdu.

– Elə rahat olmuşam, heç sözlə deyə bilmirəm. Hiss eləyəndə ki, bir adama lazımsan, öz gözündə də qiymətə minirsən.

– Elədir, mənim gözəlim, – deyib Yavər onu oxşadı. – Yadında saxla ki, sən hamıdan artıq mənə lazımsan... Sənsiz həyatımın bir dəqiqəsi olmasın.

Mədinə "xoşbəxtəm ki, Yavər kimi yaxşı adama rast gəlmişəm"– deyib düşündü və ərinin üzünə gülümsədi.

2

Beləliklə, Yavərin ailə həyatı pozulmaz bir ahənglə üstündə qurulmuş kimi görünürdü. Hər halda Yavər özü bu fikirdə idi, o inanırdı ki, ancaq ölüm Mədinəni ondan, onu Mədinədən ayıra bilər. Dünyada elə bir şey yoxdur ki, aralarında soyuqluq yarada bilsin. Doğrudan da onları birləşdirən nə rəsmi nikah, nə adət, nə qohum-əqrəba hörməti, nə ictimai əxlaqın tələbləri idi. Hələ bu günə qədər onların həyatında rəsmiyyətin bu halqalarına ehtiyac oyanmamışdı. Çünki bu ər-arvadı bir-birinə bağlayan tellər daha güclü idi. Rəsmiyyətin bəndedici iplərindən çox-çox davamlı idi. Məlumdur ki, təbii meyl, təbii həvəs, təbii anlaşma və cazibə olan yerdə, zahiri bağlara ehtiyac qalmır.

Yavər Məcnun deyildi Mədinə də Leyliyə oxşamırdı. Lakin Yavər doğrudan da arvadının vurğunu idi, arvadı doğrudan da gözəl idi. Axı, belə hallar həyatda çox-çoxdur. Sevilən və ərini həqiqi məhəbbətlə sevən gözəl qadınlar az deyil. Yavər bilirdi ki, Mədinənin bəstə boyu, yaraşıqlı gərdəni, girdə ağ üzü, buruq xurmayı telləri, qara gözləri gözəldir. Çox kişilərin nəzərini cəlb edir. Amma Yavər darılmırdı, Mədinəyə arxayındı... Gözəllikdən zövq almaq hamının ixtiyarıdır. Əvvəla bütün gözlər tamahkar deyil, əyri baxmır. Gözəlliyə düz baxan və onun təmiz qalmasına çalışan adamlar da çoxdur. İkinci də bu gözəllik ətrini, ahəngini, cazibəsini yalnız Yavərə vermişdi. Sədaqətdə Mədinəyə doğrudan da Leyli demək olardı.

Buna baxmayaraq Yavərin ürəyi qısqanclıq duyğularından azad deyildi. Qeyri-ixtiyari olaraq hirsləndiyi, əsəbiləşdiyi, az qala kobudluq edəcəyi hallar da olurdu. Yəni on illik ailə həyatında iki-üç dəfə Yavər bu vəziyyətə düşmüşdü. Bu da o zaman baş vermişdi ki, Mədinə ancaq əri üçün olan təbəssümlə başqa birisinin üzünə gülmüşdü, müqəddəs daxili işıqdan bircə zərrə başqasının üstünə salmışdı.

Yavərin Kərəm adlı köhnə bir tanışı vardı. Kərəm az danışan və qaraqabaq idi. Subay vaxtlarında təsadüfdən-təsadüfə görüşərdilər. Yavər evləndiyinin ikinci ili Mədinəni götürüb opera teatrına getmişdi. Orada Kərəmə rast gəldilər. Qəzadan yerləri də yan-yana düşmüşdü. Köhnə qaradinməz Kərəm, Mədinəni görəndə bülbül kimi dil açdı. Üç gündən sonra isə Yavərə zəng vurdu:

– Ay dost, evdəsən, bir qapını bizə tanıtsan nə olar? Bir stəkan çaya da layiq olmadıq?

Kərəm min bir bəhanə ilə bir neçə dəfə gəlib-getdi. Yavər onun Mədinəyə dikilmiş gözlərini, şit hərəkətlərini görüb, bayağı, haqq-say itirən adam olduğunu duydu və acıqlandı, o gedəndən sonra:

– Mədinə, bu Kərəm heç mənim xoşuma gəlmir axı, sən necə bilirsən? – deyib ehmalca soruşdu.

Mədinə bic-bic gülümsədi:

– Pis adama oxşamır, necə məgər?

Arvadının belə sadəliyi və ciddi məsələyə yüngül baxması Yavərə toxundu, acığını zorla boğaraq dedi:

– Sən heç adam tanıyan deyilsən. Mədinə, hamıya inanırsan, elə bilirsən ki, dünyada pis adam yoxdur. Hamı imamdır, peyğəmbərdir!

Kərəmdən zəhləsi gedən, yalnız Yavərin xətrinə onun üzünə qapı açan Mədinəyə ərinin bu sözləri gülünc göründü. Kərəm kimi kötüyə qarşı ürəyində oyanan qısqanclıq duyğuları ilə əylənmək, onu bir az incitmək istədi:

– Yox, ay Yavər, mənim nəzərimdə Kərəm nə imamdır, nə peyğəmbər. İmam, peyğəmbər olsaydı – heç yaxına qoymazdım. Axı mən də onlara inanmıram. Mən onu adam bilmişəm, adama da gərək inanasan.

Yavərin lap səbri tükəndi. "Bu arvad nə danışır? Heç zarafatın yeridir? Mən deyirəm elə üz göstər ki, bir də qapını açmasın, bu deyir ki, gərək adama inanasan. Görmür ki, Kərəm adam deyil?" Belə düşən Yavər az qaldı Mədinəyə ağır söz desin, lakin özünü bir təhər saxladı, ələ ala bildi. İçərisi isə od tutub yandığından udqundu. Sanki ürəyini bulandıran bir şey yemişdi, nə həzm edə bilir, nə də geri qaytara bilirdi. İllərlə bəslədiyi inamı bir anda itirmiş kimi başını buladı:

– Hər adama inansan, heç bilmirəm axırımız necə olacaq?!

Ərinin sözlərində ümidsizlik və kədər duyan Mədinə, özünəməxsus ürək açıqlığı, təmizlik və məlahətlə onun boynunu qucaqladı, ciddi səslə:

– Arxayın ol, əzizim, – dedi, – ürəyini sıxıb eləmə, əvvəlimiz necə olub, axırımız da elə olacaq. Birinci gün Mədinəni necə görmüsən, axıra qədər də elə qalacaq, onu öz əllərinlə aparıb qəbirə ləkəsiz qoyacaqsan.

Mədinənin bircə sözü, bircə təbəssümü, bircə hərəkəti kifayət idi ki, Yavərin şübhələri yaz buludu kimi dağılıb getsin. Yavər üzdə heç bir şey olmamış kimi arvadına gülümsədiyi halda, ürəyində özünü danlayıb utandırdı: "Gör mənim də başıma necə qara fikirlər gəlir. Gərək pisdən pis olasan ki, ürəyində Mədinə kimi bir qadına şübhə oyansın!".

Bu danışıqdan sonra Mədinə Kərəmə elə üz göstərdi ki, onun ayağı bir daha onların evinə dəymədi.

3

Yavər fizika müəllimi idi, hələ institutun üçüncü kursunda oxuduğu zaman dərs deməyə başlamışdı. Buna da səbəb atasının Vətən müharibəsindən ağır halda qayıtması, ailənin bir çox maddi və mənəvi çətinliklərə düçar olması idi. Yavərin atası Soltan cəbhəyə zabit olaraq getmişdi. Dörd il müvəffəqiyyətlə vuruşmuşdu, müharibənin odu-alovu, güllələr və bombalar yanından ötüb keçmişdi, yoldaşlarını dönə-dönə şikəst etdiyi, öldürdüyü halda, ona dəyməmişdi. Ordularımız alman torpağına daxil olanda da o sağ-salamat idi. Artıq tezliklə evinə qayıdacağına qəti inanmışdı. Elə bu zaman tale Soltanı yaxaladı, pusquda durub addım-addım izləyərək fürsət gözləyən oğru kimi birdən üstünə atıldı. Berlinin ağzındakı son döyüşlərdən birində qərargahın yanında bomba partladı, binanı uçurub yerlə-yeksan etdi, üç zabit məhv oldu, partlayışın zərbi iki döyüşçü ilə Soltanı göyə qaldırıb yerə çırpdı, uçan binanın daş-torpağı altında basdırdı. Ayılanda Soltan özünü hospitalda gördü. Sağ qolu yaralanmış və sınmışdı. Kontuziyadan iki gözü də kor olmuşdu. Uzun müalicədən sonra o, evinə gəldi. Hov eləməyə başlayan qolunu kəsmişdilər. Atanın dərdini yüngülləşdirmək, ailəyə qaytarmaq üçün Yavərgil dəridən çıxdı. Xəstəxanalar, həkimlər, kurortlar, dava-dərman qalmadı ki, eləməsinlər. Yavərin anası Badam xala kölgə kimi kişinin dalınca gəzdi, heç yerdə yastığının dibindən ayrılmadı. Yavər məktəb yaşlı dörd bacı-qardaşa həm atalıq, həm də analıq etməli oldu.

Həyatın ağırlıqları və iztirablar hərəyə bir cür təsir edir. Kiminin ürəyini daşa döndərir, kimini yumşaldır, insanlara qarşı mərhəmət duyğuları

ilə doludurur. Yavər ikincilərdən idi. Atasının ölümü, saçları vaxtsız ağarmış anasının sağalmaz, ovunmaz dərdi, bacı və qardaşlarının gözündə əbədi kədər şəklində donub qalmış ata həsrəti onun xasiyyətində silinməz izlər buraxmışdı, insanlara və həyatın gözəlliklərinə qarşı həssas etmişdi. Məktəbdə uşaqlarla əbədi ünsiyyət isə ürəyinin mülayim duyğularını daha da artırmışdı. Həyatın bəzi gözəl görünməz guşələri, insan xasiyyətində min illər boyu, nəsildən-nəslə keçib gələrək qartmaq bağlamış bəzi amansız və çirk cəhətlər ona məlum deyildi. Mədinəni sadəlikdə və tez inanmaqda ittiham edən bu adam özü bir uşaq qədər sadə və inanan idi. Beləsi Mədinə kimi saf və təmiz ürəkli arvadın yox, hərcayinin, bədxasiyyətin əlinə düşsə, kim bilir nə oyun açar.

Mədinəyə olan məhəbbəti də ona görə bu qədər qızğın idi ki, o ümumiyyətlə insanları sevirdi, onlara inanırdı. Kərəm əhvalatından sonra isə bu məhəbbət daha da güclənmişdi. Mədinədən beş gün ayrı duranda, bir illik hicran çəkmiş kimi darıxırdı. Məktəbdən qayıdaraq Bakının dağ hissəsindəki təzə evlərdən birində ikiotaqlı mənzilinin zəngini basıb Mədinənin məlahətli səsini eşidərkən, qapı açıldıqda onunla üz-üzə durarkən Yavərə baxmaq lazım idi. Üzü sözsüz bir səadətlə işıqlanardı. Özündən razı, işindən razı, insanlardan və bütün dünyadan razı halda dəhlizə daxil olar, arvadını salamlar, sonra da üç yaşlı kiçik Leylasını qucağına alıb oxşar "Atasını maç elə" deyə üzünü ona uzadardı. Üzü təmiz olanda uşaq boynunu qucaqlayıb öpərdi, tüklü olanda dodaqlarını yumub başını yana çəkər, balaca, yumşaq əlilə atasının çənəsini dala basardı:

– Cücülər...

Bu gün də zəng olanda Mədinə məlahətli, yumşaq səslə "gəldim" deyib qapıya yaxınlaşdı. Yavərin tək olmadığını hiss etdi. Qapını açdıqda gözlərinə inanmadı. – Yavərin yanında uzun boylu, geniş sinəli, iri ala gözlü bir gənc durmuşdu. Gəncin başı açıq olduğundan, yumşaq gur qara saçları burularaq sağ tərəfdən alnına tökülmüşdü. Qara buğdayı üzündə taleyindən razı adamlara məxsus xoş bir təbəssüm vardı. Əynindəki ağ ipək köynəyin gen ətəkləri boz rəngli nazik yun parçadan tikilmiş şalvarın üstünə düşmüşdü. Köynəyin uzun qolları düyməsiz və enli olduğundan gəncin hərəkətlərinə xüsusi bir sərbəstlik verirdi. Mədinə onu dərhal tanıdı. Bu, yeddinci sinifdən məktəbi qurtarana qədər bir yerdə oxuduqları Rasim idi. Ah, o nə qədər dəyişmişdi! Boybuxunda Fərhad kimi bir pəhləvana oxşayırdı. Yavər onun yanında

necə balaca, necə solğun və zəif görünürdü. Sanki şamla işıqlanan bir otaqda birdən-birə elektrik lampası yandırdılar. Əlbəttə gənc də Mədinəni tanıdı və deyəsən heyrətdən diksinən kimi oldu, iri ala gözləri ani olaraq işıqlandı. Məktəbdəki qarayanız və arıq Mədinə nə qədər gözəlləşib, açılmış qızılgül kimi rayihədar olmuşdu.

Rasim hələ şagird ikən gözəl şəkillər çəkərdi. Məktəbin divar qəzetini o tərtib edərdi. Məktəb uşaqları, xüsusən doqquzuncu və onuncu sinfin qızları Rasimdən əl çəkməz, albomlarına yadigar olaraq gah dənizin, gah Qız qalasının, gah da özlərinin və məktəblərinin şəklini çəkdirərdilər. Son üç-dörd ildə Mədinə qəzetlərdə tez-tez “Rəssam Rasim” adına rast gəlir, o radioda onun “İstedadlı gənc sənətkar” kimi tərifini eşidirdi. Lakin Mədinə ərinin Rasimlə necə tanış olduğundan xəbərsiz idi. O bilmirdi ki, bu yaxında əri Moskvadan qayıdarkən, onunla yol yoldaşı olmuşdu. Üç gün bir kupedə oturub-durmuş, bir yerdə yeyib-içmiş, şirin söhbətlər edərək bir-birini bəyənmişdilər. İndi də təsadüfən küçədə rast gəldikdə əl çəkməmiş, götürüb evlərinə gətirmişdi.

Gözlənilməz görüşdən pörtüb qızarmış Mədinə, tanışlıq verməyə macal tapmamış, Yavər onları bir-birinə təqdim etdi. Mətbəxdən çıxmış Mədinə dama-dama önlüyü aça bilməmişdi. Əlini bu önlüyə sürtüb Rasimə tərəf uzatdı. Rasim köhnə ziyalılara məxsus nəcabət və nəzakətlə Mədinənin əlini sıxdı. Yavərə döndü:

– Mədinə xanımla biz çoxdan tanışıq, bir yerdə oxumuşuq.

Mədinə qızardı. Ona elə gəldi ki, gərək bu xəbəri ərinə özü bildirəydi, nahaq yerə tərəddüd edib Rasimdən əvvəl demədi, birdən Yavərin ürəyinə xal düşər. Lakin Yavər buna əhəmiyyət vermədi:

– Eləmi? Daha yaxşı! – deyib özünəməxsus gur səslə danışdı. İçərisində yeni bir balıq olan balaca bankanı Mədinəyə uzatdı, – Çin balığıdır, tapılan şey deyil.

Mədinə gülümsəyib balığı aldı. Yavər rəssamı içəri apardı, – gəlin otağa, Mədinə bizim üçün yemək düzəldənə qədər mən də onun çiçəkləri ilə sizi tanış edim.

Mədinə gözlərini süzdürüb tənə ilə ərinə baxdı və dəhlizə çəkib pıçıldadı:

– Yaxşı xörəyimiz yoxdur, həmişə belə edirsən. Bilmirəm səndə nə adətdir, soraqsız, xəbərsiz adamın başının üstünü alırsan. Heç olmasa səhər xəbər verəydin. Mən də bir şey hazırlayaydım.

Mədinənin pıçıltı ilə dediklərinə Yavər ucadan cavab verib:

– Eyib etməz, əzizim, məni danlama, nəyin var, gətir, deyirlər ki, dərvişin olanından. Özüm də Rasimə təsadüfən rast gəlmişəm.

Rasim söhbətin nə barədə olduğunu başa düşüb sözə qarışdı:

– Yavər dedi gedək, mən də etiraz etmədim. Görürsünüz necə üzlü qonağam?

Mədinə gözünü onun iri, sirayətedici gözlərindən qaçıraraq çiyninin üstündən hara isə yana baxdı.

– Xoş gəlmişsiniz, dövlətindən hər gün süfrəmizdə bir şey olur. Bu gün dovğa və yarpaq dolması bişirmişəm.

– Lap ağayana xörəkdir, deyib Rasim razılığını bildirdi və fikri özündə olmayan adamlar kimi xəyala getdi. Lakin deyəsən Yavər rəssamın dalğınlığını görmədi: “Yaxşıdır ki, kişinin kefi sazdır, həmişəki kimi, ayıq deyil” Mədinə düşündü və dərhal öz fikrindən utandı. “Burada nə var ki, guya mən ondan bir şey gizlədə bilərəm?”

– Ata, salam, – deyib balaca hörüklərinə qırmızı lent bağlanmış Leyla, o biri otaqdan çıxdı, özünü Yavərin üstünə atanda Mədinə mətbəxə keçdi. Yavər qızını havada qapıb qucağına aldı. Bildiyimiz mehriban görüşdən sonra onu da Rasimlə tanış etdi.

– Əmi ilə dost ol ha, yaxşı şəkillər çəkir, sənin üçün cırtdanın da, xoruzun da şəklini çəkəcək.

Leyla ürkək-ürkək Rasimə baxdı və elə birinci çağırışdaca qollarını açıb onun qucağına getdi. Qızın bu hərəkəti atanı nəhayətsiz dərəcədə sevindirdi. Qəribə olsa da Leyla adamlara münasibətdə bu evin mizanı idi. İlk görüşdə kiminlə dostlaşsa o yaxşı adam, kimdən aralı və namehriban dolansa o pis adam sayılardı.

– Mədinə, bir bura bax, – deyib Yavər mətbəxə tərəf səsləndi, – gör Leyla Rasimi necə bəyənib?

Mədinə mətbəxdən “yaxşı, yaxşı” deyib səs versə də dəhlizə çıxmadı, Leyla isə balaca əlilə Rasimin burnundan tutdu:

– Yaxşı əmi! – deyib kəkələdi.

Bu dəqiqədən Rasimin adı “Yaxşı əmi” qaldı.

## 4

Mədinə nə üçün Rasimi görəndə qızardı və özünü bir cür hiss etdi? Bu suala cavab vermək o qədər də asan deyil. Bəlkə məktəbdə oxuduqları zaman Mədinə ilə Rasimin arasında bir macəra baş vermiş,

yaxud Mədinə, Rasimi sevmişdi, Rasim isə çoxlarına olduğu kimi Mədinəyə də əhəmiyyət verməmişdir? Axı Rasim elə o zaman da gözəl idi. Həm boy-buxunu, həm də istedadı ilə tay-tuşundan seçilirdi. Qızlar vardı ki, üzünə baxanda yağ kimi əriyirdilər. Yox, belə şey olmamışdı. Mədinə məktəbdə oxuyanda Rasimə gözucu da olsa, başqa nəzərlə baxmamışdı. Onun yanında halını bir zərrə də pozmamışdı. Bəlkə Rasim Mədinəyə meyl etmiş və soyuq qarşılanmışıdır? Yox, bu da həqiqət deyil. O zaman daha gözəl, daha şirindilli və xoşsifət qızları qoyub Mədinənin dalınca düşmək heç Rasimin ağlına da gəlmirdi. Rasim onu bilirdi ki, Mədinə ən yaxşı şagirddir, hətta riyaziyyatdan belə daim beş alır, hamıya məlumdur ki, fizika və riyaziyyatdan beş aldığı üçün hələ heç bir qıza vurulan olmayıb.

Bəs Mədinənin ürəyi niyə belə döyünür? Nə üçün o mətbəxdən çıxmaq, o biri otağa keçmək istəmir, Rasimlə bir yerdə oturmaqdan qorxur, bəli, bəli, qorxur? Bu suallar Mədinəni narahat etdi. Hətta ürəyinin qeyri-adi döyüntüsündən özü də heyrətə gəldi. "Mənə nə olub?" deyə mətbəxdə özünü danladı.

Görürsünüz ki, bu əcaib hadisənin səbəbini Mədinə də bilmir. Axı, insan ürəyinin qəribə halları var. Hətta bütün ömrünü ürəyi öyrənməyə həsr etmiş, minlərlə ürəklərin döyüntüsünə qulaq asmış, ağrısını sağaltmış ağsaçlı alimlər belə çox zaman aciz qalırlar. Mən ürəyinin ağrısından şikayət edən xəstələr görmüşəm ki, bir həkim dəstəyi sinəsindən çəkmiş, o biri həkim yapışdırıb qulaq asmışdır. Bir ağızdan "heç şey yoxdur, yaxşı ürəkdir" demişlər. Xəstə isə ürəyinin bərk sıxıldığını və ağrıdığını söyləyib dururdu. Onda ağsaçlı alimlər qulaqlarına, əllərinə, bilik və hissiyyatlarına inanmayaraq ürəyi maşına saldılar, elektrokardioqrama çıxardılar, diqqətlə baxıb yenə birağızdan dedilər: – "Bir şey yoxdur". Xəstənin isə ürəyi ağrıyırdı. Sinəsində daş kimi asılmışdı, ağırlıq edirdi. Bəli, ürəyin anlaşılmaz sirləri çoxdur.

İndi Mədinənin bircə arzusu vardı – nahar tez qurtarsın, çay tez içilsin, Rasim tez çıxıb getsin. O, öz sevimli əri ilə, gözəl qızı ilə tək qalsın. Munis, mehriban ailə səadəti içində yavaş-yavaş, sakit-sakit axıb keçən xoş dəqiqələri və saatları bu gün də kimsə pozmasın. Mədinənin bu istəyinə baxmayaraq nə Rasim tələsir, nə də Yavər onu buraxmaq istəyirdi. Süfrə başında başlanan söhbət, çay zamanı davam edib, getdikcə maraqlı şəkil aldı, gah dağ selləri kimi birdən coşaraq Yavərlə Rasim arasında canlı mübahisəyə çevrildi, gah da çəmənlik-

dəki bulaq kimi həzin, mülayim axdı. Hətta axşam qaranlığı qovuşaraq böyük şəhərin gur işıqları yandığı və Yavər ikinci dəfə çay dəmləməyi xahiş etdiyi zaman Mədinə özü də bu söhbətə cəlb olundu.

Söhbət isə musiqidən düşmüşdü. Bu məsələ o dövrün ailələrində, teatrların foyelərində, qonaqlıq məclislərində də canlı münaqişələr doğururdu. Mətbuatda əks olunduğundan qat-qat qızğın mübahisə oyadırdı. Süfrəyə oturduğu zaman, Bakı radiosu, musiqi verilişlərinə başlandığını elan etdi.

– Görək nə verəcək, – deyə Yavər radionun səsini artırdı, – musiqini sevirsinizmi?

– Sevirəm, ancaq hər musiqini yox, – deyib Rasim cavab verdi, – doğrusu çox şey var ki, heç qulaq asa bilmirəm.

Yavər, özünə həmfikir tapmış kimi sevindi və Mədinəyə baxdı. Bu baxışlar deyirdi: "Görürsənmi, narazı olan təkcə mən deyiləm. Sənəti yaxşıca anlayanlar, hətta yaradanların özü də narazıdır".

Yavərin belə baxması səbəbsiz deyildi. Bir neçə dəfə Mədinə ilə ikilikdə oturub musiqi verilişlərini dinlədikləri zaman o, radionun səsini kəsmiş, çalınan əsər barədə ağır sözlər söyləmişdi. O dövrdə musiqi ətrafındakı mübahisələrin bəzən siyasi ittihamlara çevrildiyini görən Mədinə, ərinin başqa yerdə də qızıb danışacağından ehtiyat edərək "A Yavər, bəlkə belə lazımdır, sən başa düşmürsən"– deyə onu soyutmağa çalışmışdı.

İndi özünə Rasim kimi mötəbər tərəfdar tapması Yavəri ruhlandırdı:

– Lap ürəyimdən deyirsiniz, bəzən elə şeylər çalırlar ki, az qalır qulağı deşsin. Adını də qoyurlar nə bilim yeni məzmun, bugünkü mövzu, özü isə taxta kimi adamın sinəsinə dəyib taq eləyir, qayıdır, ha əlləşirsən bir şey qanasan mümkün olmur, başın-beynin qaralır, yorulursan, əsəbiləşib durursan ayağa. Axı, mənim qandığıma görə, gərək musiqi qarmaqarışıq, anlaşılmaz səs yığını olmasın, gərək adamın ürəyini titrətsin, fikrini rövşən etsin. Düz demirəm?

Mədinə Rasimə fikir verdi: onun hərəkətləri də, danışığı da, səsi də, simasındakı daimi xoş təbəssüm kimi yumşaq və aydın idi, hamısında bir müvazinət vardı, ixtiyarsız adama xoş gəlirdi. Dediklərinə də inanırdın. Nə yalandan güzəştə gedir, nə də özünü göstərmək üçün mübahisə açırdı. Yavərin sualına verdiyi cavab da Mədinəyə səmimi və inandırıcı göründü.

– Yavər yoldaş, deyəsən biz ikimiz də musiqini bir cür başa düşürük. O şey ki, siz tələb edirsiniz, biz sənətkarların dilində, ona emosional, yəni coşqun hissi sənət deyilir. Etiraf etməliyəm ki, mən də bu cür sənətin pərəstişkarıyam. Ürəkləri soyuq olan sənətkarlar isə öz soyuqluğunu gizlətmək üçün siz deyən kimi məzmunun dalında yatırlar. Bu vasitə ilə də bəziləri istedadsızlığını gizlədir, bəziləri də ucuz şöhrət yoluna düşürlər.

Yavər rəssamın hər sözünü su kimi içirdi. Az qalırdı durub onu qucaqlasın və öpsün.

– Ay qardaş, ay başına dönüm, nədən yazırsan, yaz, sözümüz yox, ancaq ürəkdən yaz ki, bizim də ürəyimizdən olsun.

– Bu sözünüz də düzdür, müəllim yoldaş. Səmimiyyət olmayan yerdə sənət yoxdur. Bu gündən yazmaq, daha artıq səmimi olmağı tələb edir. Mövzunun dalında yatanlar, ağıllarına da gətirmirlər ki, həqiqi müasirlik, hər zaman əsil coşqun əsərlərin yaranmasına kömək etmişdir, həqiqi müasirlikdə həmişə bir əzəmət var, əsil yenilik həmişə gözəldir. Necə ola bilər ki, xırda və sönük əsərə müasir və yeni deyəsən? Bu ki, mümkün deyil.

Yavər və Rasim xəyalpərvər məktəb şagirdləri kimi bir-birini o qədər ürəkdən təqdir edirdi ki, Mədinə də istər-istəməz həvəsə gəldi, sözə qarışıb yarı zarafatla Rasimə dedi:

– Bu sözləri bəs sizə niyə deyən yoxdur? Elə şəkillər görmüşəm ki, heç şəklə oxşamır. Elə bil ki, rəssam çəkməyib, rəngsaz işidir. Əl-qolunu çirməyib lopa-lopa, bomboz rəngləri yapışdırıb divara, çıxıb gedib, bir bundan da desəniz dünya dağılmaz ki...

Rasim iri ala gözlərini Mədinəyə tərəf çevirdi. Mədinənin sözlərində nə gizli bir eyham, nə bir işarə axtarmadan, dərin hörmətlə cavab verdi:

– Siz də haqlısınız, Mədinə xanım. Deyir haqq sözün qabağında boynum tükdən nazikdir. Rəngsazı xatırladan əsərlərimiz də var, ancaq hamısı yox. Elələri də var ki, adamı sevindirir, onu da nəzərə alın ki, biz də axtarırıq, əsrin ruhunu əks edən boyaları, onların ahəngini tapmağa çalışırıq. Həm də səmimi surətdə çalışırıq. Heç kəsi təqlid etmədən yaratmaq istəyirik. Bunu qiymətləndirmək gərəkdir.

Bu zaman radioda rast çalındı. Yavər radiotutanın düyməsini bir az sağa burub, səsini artırdı və ağız dolusu:

– Musiqi belə olar ey, adamın iliyinə işləyir! – dedi.

Mizrab tarın simlərində dolandıqca rastın həyat eşqi aşılayan və mərdliyə çağıran səsləri yağ kimi Yavərin canına yayılırdı. “Bəh, bəh. Belə şeydən doymaq olmaz!”– deyib ürəkdən vəcdə gəlirdi. Rastın dalınca pianoda xalq havalarından birini çaldılar. Buna da Yavər təbəssüm və sevinclə qulaq asdı. Lakin bunun dalınca simfonik orkestr orta səviyyəli bir süita çalanda başını buladı, radionu tamamilə söndürdü.

– Nə olsun ey, səs-küydən qulaq batır. Necə bilirsən, Rasim, deyəsən bizim bəzi kompozitorlar xalq musiqimizə xor baxırlar, düz yolu qoyub özlərini dağ-dərəyə salırlar? Qorxuram o qədər uzağa gedərlər ki, səsimiz də qulaqlarına çatmaya. Biədəb də olsa yaxşı bir məsəl var, deyir, naxırdan aralı düşən dananı qurd yeyər, hə?

Rasim xeyli düşündü. Görünür Yavərin bu mülahizəsi haqqında birdən-birə fikir demək istəmirdi. Yavər isə bu sözlərinin də təsdiq olunmasını gözlədiyindən onun ağzına baxıb dururdu:

– Elələri də var, – deyib Rasim yavaş-yavaş sözə başladı, – ancaq əksəriyyəti nə axtarırsa, burada axtarır. Siz razılaşın ki, hər şey kimi musiqi də təkamülə möhtacdır. Razılaşın ki, dörd divarın arasında qapılıb qalmaq, adamı inkişafdan qoyar. Uşaqlıqda atamdan eşitdiyim bir əhvalat yadıma düşür. İyirmi beşinci ildə o Kəlbəcərə getmişdi. O zaman indiki yollar yox idi. Üç ay qış dağı, dərəni qar qurtardı, Kəlbəcərin dünya ilə əlaqəsi kəsilərdi. Atam lap dağların keçilməz yerində Murovdağın ətəyində düşmüş Yanşak kəndinə gedib çıxır. Deyirdi ki, orada saz çalıb söz deyən doxsan yaşlı bir aşığa rast gəldim. Aşıq şəhər nədir, bilmirdi. Kəlbəcərdən də böyük şəhər tanımırdı. Kəlbəcər isə o zaman kiçik bir qəsəbə idi. Atam aşığın zövqünə, istedadına, hafizəsinə heyran olmuşdu. Ancaq dünya haqqında uşaq qədər sadə təsəvvürlərinə təəssüf edib deyirdi: vaxtında gəzib görsəydi, başqalarından öyrənə bilsəydi, dahi olardı. Yanşak dərəsi sıxıb yazığın suyunu çıxardıb, eləyib əyribel, donqar. Zəmanəmizdə ölkələrin üfüqləri genişlənmişdir. Hamı boylanıb kənara baxır ki, görsün başqasından nə öyrənə bilər.

Rasim danışdıqca Yavər fikrə gedir, tutulurdu. Bir az qabaq onların arasında mənəvi birlik yaradan fikirlər aradan çıxırdı. Hətta Yavərə elə gəldi ki, Rasimin dəlilləri çox sərtdir. Mədinə onun qaşlarının çatılmasından bildi ki, kişi qızışacaqdır. Doğrudan da belə oldu.

– Əlbəttə, Yanşak dərəsində donqar olmaq yaxşı iş deyil. Bəs cəlayi-vətən olmağa nə deyirsən? Hər dərədən bir su içmək necə?

Bunun bir faydası varmı? Yoxdur? Məncə hər quş öz havasını çalsa yaxşıdır, yoxsa çığ-bığdan qulaq tutular.

Deyəsən Rasim Yavərlə tərsləşmək istəmirdi. Buna görə də tez razılaşdı.

– Bu təbiidir.

Yavər isə eyni ahənglə davam etdi:

– İndiki bəzi kompozitorların simfoniyası, nə bilim konsertinası, süitası xoşuma gəlmir, qardaş gəlmir də, neyləyim. Nə üçün? Çünki bunlar bizim musiqi ilə tutmur!

Ümumi razılıq və ahəngin hökm sürdüyü ailə şəraitində ərinin bu cür fikirlərini yumşaqlıqla soyutmağa çalışan Mədinəyə indi bu sözlər qəribə göründü. Aydın idi ki, Yavər səhv edir, necə də, belə aşkar bir şeyi başa düşmür, – məgər məsələni bu qədər sadələşdirmək olar? Simfoniya bizim musiqi ilə tutmursa, bəs "Koroğlu" niyə bizi valeh edir? Axı bir zaman bizdə opera da yox idi! Lakin Mədinə qəsdən öz etirazını bildirmədi. Onu maraqlandıran, Rasimin necə cavab verməsi idi.

– Çalınan süitanın müvəffəqiyyətsiz olduğuna söz yox, – deyə Rasim gülümsəyərək danışdı, – bu barədə sizinlə şərikəm. Ancaq fikrinizin ikinci hissəsi ilə razılaşa bilmirəm. Burada simfoniya, konsertina, süita dediyiniz formalar günahkar deyil. Bu formalarda ölməz əsərlər yazılmışdır. Bizim də musiqi həmin formalarda şah əsərlər yaradacaqdır. Bu yeni formaları inkişaf etdirməklə biz musiqimizin hələ açılmamış mənalarını və gözəlliyini açmış olarıq.

Mübahisə uzandı, Yavər fikrində israr etdi. Rasim də etiraz edib durdu. Yavərin qızışdığını gördükdə isə əlindən tutub sıxdı və ayağa qalxdı.

– Atalar yaxşı deyib, gecənin xeyrindən gündüzün şəri yaxşıdır. Hələlik sağlıqla qalın.

Nəhayət, gecədən xeyli keçmiş Rasimin çıxıb getməsinə Mədinə sevindi və arzu etdi ki, bir daha gəlməsin.

## 5

İki gün sonra isə axşamçağı qapının zəngi çalındı. Bu dəfə Rasim tək gəlmişdi. Qoltuğunda bir bükülü vardı. Bu uzun çalınan vallar qoyulmuş karton qutu idi. Rasimin oradan çıxarıb çaldırdığı ilk əsər "Koroğlu" operasının "Çənlibel" səhnəsinin müqəddiməsi oldu. Azərbaycan musiqisi simfonik orkestrdə dərya kimi coşaraq qanadlanır, bitməz-tükənməz qüdrətlə insanı ruhlandırırdı. "Koroğlu"dan sonra

Listin "Məhəbbət arzuları" adlı kiçik əsəri çalındı. Necə olmuşdusa Yavərgil təmiz məhəbbəti tərənnüm edən bu gözəl əsərə indiyə qədər qulaq asa bilməmişdilər. Birinci dəfə dinlədikləri bu yüksək sənət nümunəsi doğrudan da onları heyran etdi. Məhəbbətin insan sinəsində oyatdığı uca və pak duyğular, şirin xəyal və arzular, həsrət və iztirablar burada necə təbii, necə təsirli əks olunmuşdu!

Vallar çalındıqdan sonra yenə sənət haqqında danışdılar. Yavər artıq keçən dəfəki mövzuya toxunmadı, Mədinə onun ehtiyatlı tərpəndiyini hiss etdi. Onu da hiss etdi ki, Rasim söhbəti ora qaytarmaq və Yavərin zəif yerinə toxunmaq fikrindən uzaqdır. Ümumiyyətlə, rəssam üstünlük göstərməyi sevən adama oxşamırdı. Həmişə diqqət və hörmətlə müsahibinə qulaq asır, adamın yaxşı cəhətlərini görür və sevinir, özü isə nəzakətlə danışır, yumşaq rəftar edirdi. Mədinəyə elə gəldi ki, Rasimlə müsahibə və təmasdan sonra adam öz gözündə böyüyür, geyimdə də, danışıqda da, əməldə də səliqəli və gözəl olmaq istəyir.

Beləliklə rəssam, Yavərin evində hörmətlə qarşılanan xoşsifət və xoşrəftar bir müsahibə çevrildi. İki gündən, üç gündən bir gəldi, oturub şirin söhbət etdilər.

Bir dəfə yenə sözləri sənətdən düşdü və ən çox rəssamlıqdan danışdılar. O, Mədinənin divardan asdığı rəngli şəkillərə baxdı. Bunlardan biri üzümyığan qızı, o biri qarlı dağları təsvir edirdi. Hər ikisi bədii fondun nəşri idi. Pul üçün buraxılan bu şəkillərin altında rəssamın imzası da yazılmamışdı.

– Mədinə xanım, deyəsən axı, sizi də tənqid etməli olacağıq. Bu nədir, bir zaman rəngsaz rəssamlara hücum çəkirdiniz, indi də onların əsərləri ilə otağınızı bəzəyirsiniz, – deyib Rasim birinci dəfə olaraq Mədinəyə sataşdı.

– Nə edək, varını verən utanmaz deyərlər. Əlimizə nə keçib, onu da asmışıq.

– Bir nəfər, Bəhruz Kəngərlinin "Yaşxana yolu" adlı tablosunun gözəl bir surətini satır. Məsləhət görürəm, alın və bunun yerinə asın, deyib Rasim üzümyığan qız şəklini göstərdi, – otuz il əvvəl çəkilmiş o şəkildəki gözəlliyə baxın, mənzərənin zənginliyinə baxın, buradakı cansızlıqdan canınız qurtarsın. Bu şəklin yerinə isə, – Rasim lopa-lopa rəngdən ibarət olan qarlı dağlar şəklinə işarə etdi. Lakin Yavər ona sözünü qurtarmağa macal vermədi:

– Onun yerinə, bunun şəklini asacağam! – deyib geniş təbəssümlə Mədinəyə baxdı.

İki kişinin baxışları altında qızaran Mədinə etiraz etdi:

– Aa, sən də söz dedin, heç ora foto yeridir? Tapsam, canlı rəsm əsəri asacağam.

Rasimin başına qəribə bir fikir gəldi. Gözləri sevincdən açılmış halda gah Mədinəyə, gah Yavərə baxaraq:

– İcazə versəniz, hər ikinizin arzusunu yerinə yetirərəm. Həm Mədinə xanımın şəkli olar, həm də canlı rəsm!

Bu gözlənilməz təklifi eşitdikdə ər-arvad ani olaraq baxışdılar. Mədinə bir qərara gəlməmiş Yavər dilləndi:

– Yaxşı sözdür. Mədinənin canlı rəsmini görmək mənim çoxdankı arzumdur.

Rasim artıq xəyala getmişdi. O, gözəl, təmiz və nəcib ürəkli qadının portretini yaratmaq haqqında düşünürdü. Mədinə isə hələ də tərəddüd içində idi. Saatlarla Rasimin qarşısında oturub şəklini çəkdirmək ona əcaib gəlirdi. Rədd etmək də yaxşı olmazdı. Çünki əri razılıq vermişdi, Rasim də ürəkdən istəyirdi. Bir-birinə zidd duyğular qəlbini qırsa da, artıq Mədinə axşamın tez qurtarmasını, Rasimin tez çıxıb getməsini istəmirdi. Sanki evin divarları da onun nəfəsilə isinir, onun geniş işıqlı alnına, geniş sinəsinə, qüvvətli qollarına baxıb dincəlirdi, yumşaq səsini dinləmək istəyirdi.

– Yaxşı, nə vaxtdan başlayırıq! – deyə Rasim Mədinəyə müraciət etdi.

Mədinə əvvəl ərinə, sonra Rasimə baxdı. Onların baxışları tutuşdu. Mədinəyə elə gəldi ki, rəssamın gözləri ikitağlı pəncərə kimi açılmışdır və indiyə qədər bilib tanımadığı sirli, cazibədar bir dünyanı ona göstərir, oraya çağırır. Bu, odlu, alovlu, xülyalı bir çağırışdı, nəhayətsiz sevinc, füsunkar gözəllik, dadlı zövq vəd edirdi. Lakin o xülyalı dünyanın, o şirin vədlərin aqibəti nədir? Mədinə cavab verməmiş, anlaşılmaz qayibanə bir səs eşitdi:

– Bir şey ki, hamının ürəyindən oldu, tez yerinə yetirmək gərəkdir.

Mədinəyə ilk dəfə yabançı gələn və çox uzaqdan eşidilən bu səs ərinin səsi idi. Sanki Yavər özü də onun qolundan tutub cəsarətləndirir, rəssamın çağırdığı həm şirin, həm qorxulu dünyaya itələyərək "get!" deyirdi.

– Sizə əziyyət olmaz ki? – deyib Mədinə köhnə məktəb yoldaşının üzünə gülümsədi, xəfif, isti, həyəcanlı təbəssümlə gülümsədi və qızardı. Bu təbəssümdən rəssamın da halı dəyişən kimi oldu.

– Mənim üçün çox xoşdur, – dedi və zahirən heç şey bildirməyən, əslində isə gizlin vədlərlə dolu olan iri, təmkinli gözlərini yenə Mədinəyə dikdi. Mədinə bu gözlərdə insanı hakimiyyəti altına alacaq bir qüvvət gördü, başını aşağı saldı.

– Yaxşı! – deyib ürkək səslə razılıq verdi.

6

Sabahısı Mədinə axşama doğru özünü səliqəyə saldı, kiçik Leylası və əri ilə nahar edib qab-qacağı yığışdırdıqdan sonra, Rasimi gözləməyə başladılar. Lakin saat yeddi oldu Rasim gəlmədi, səkkiz oldu gəlmədi. Mədinə narahat oldu.

– Yazığın başına bir iş gələr a, – deyib ərinə baxdı.

– Nə olacaq, yəqin iclasda-zadda başı qarışdı. Yoxsa zəng edərdi, bilirsən necə sözündə düz adamdır, bir şeyi ki, boyun oldu, mütləq yerinə yetirəcək. Özünü də çox istedadlı rəssam deyirlər. Qanan adamların fikrinə görə böyük ümid verir.

– Elə məktəbdə də fərasətli uşaqlardan idi, – Mədinə ərinin sözünü təsdiq etdi, – hansı dərsə bir dəfə qulaq assaydı yadında qalardı.

– Xoşuma gələn odur ki, çox təvazökardır. Heç özündən danışmır. Elələri də var ki, fikri-zikri özündədir. Hey özünə müftə məddahlar axtarır. Sözbaşı mən, mən adamın zəhləsini tökür.

Ərinin Rasim haqqında müsbət danışması Mədinənin ürəyinə yatdı. Nə yaxşı ki, onlar bir-birini bəyənib. Ailənin bu cür dostları olanda günlər nə qədər xoş keçir. Mədinə "niyə gəlib çıxmadı"– deyə bir də soruşmaq istədi, lakin nə isə düşünüb dayandı, sözü dilinin ucundan qaytardı. Bu zaman telefon zəng çaldı. Mədinə dəstəyi götürdü. Danışan Rasim idi. O, Mədinəni dərhal tanıdı:

– Salam, Mədinə xanım, – dedi və ani fasilədən sonra kədərli bir səslə davam etdi, – vədimə əməl edə bilmədiyim üçün üzr istəyirəm. Bilirsinizmi, ittifaqda təxirəsalınmaz bir yığıncağımız vardı.

– Nə olar ki, sabah gələrsiniz, – deyən Mədinə öz səsindəki titrəyişdən qorxdu.

– İş belədir ki, sabah da gələ bilməyəcəyəm, – deyib Rasim tutuldu və özünü zorlayaraq sözünün dalını gətirdi, – on-on beş günlüyə, Nuxa, Qax və Zaqatala rayonlarına getməliyəm. Sağlıq olsun qayıdanda görüşərik.

Rasim daha nə isə dedi, lakin artıq Mədinə onun sözlərinin mənasını ayırd edə bilmədi. İndi onun fikri ərində idi. Əvvəldəncə dəstəyi ona vermədiyinin peşmanlığını çəkir və günahkar gözlərlə Yavərə baxırdı. Yavərin də gözləri arvadında idi. Lakin bu gözlərdə tənə yox, dalğın bir sükut vardı. Deyəsən o, arvadının cavablarından Rasimin nə dediyini anlamağa çalışırdı.

Mədinə Rasimin gözlənilmədən rayona çıxmasına bir yandan təəssüf etsə də, o biri yandan sevindi. Çünki müqəvva kimi rəssamın qabağında əyləşib şəklini çəkdirmək hələ də ona qəribə görünürdü. Rasimin rayona getməsilə bəlkə bu məsələ də unudulacaqdı. Hər halda düşünüb-daşınmaq və fikrən bu işə hazır olmaq üçün kifayət qədər vaxt vardı. Ancaq elə oldu ki, Mədinə düşünməyə, hətta Rasimin səfəri barədə ərinin fikrini bilməyə macal tapmadı. Dəstəyi yerə təzəcə qoymuşdu ki, qapının zəngi basıldı. Mədinə qonşusu Məryəmin hönkürüb, saçını yolub ağladığını eşitdikdə qapıya qaçdı.

– Sənə nə olub, Məryəm bacı?

Məryəm daha da kövrəldi:

– Evim yıxılıb, ay Mədinə, uşağı tutublar! Ühü! Ühü!

Mədinə qulaqlarına inanmadı. Hansı uşağı, kimi? Axı, Nazimi bütün qonşular ağıllı və sakit uşaq kimi tanıyırdılar. Məktəbdə də ondan şikayət yox idi. Heç kəsin ağlına pis şey gəlmirdi. Dərsdən qayıdıb həyətdə oynamasını təbii sayırdılar. Birdən-birə sorağının milisdən çıxması Mədinəni sarsıtdı.

Məryəmi içəri apardı:

– Axı, nə üstə tutublar?!

– Bilmirəm, başına dönüm, bilmirəm! Uşağı ordan qurtarın, yoxsa partlaram! – deyib Məryəm daha çılğın halda ağladı.

Mədinə ərinə baxdı. Yavər hər iki arvadın kömək gözlədiyini anladı. Ora-bura zəng etdi, milis rəisini tapdı, öyrəndi ki, Nazim son aylar pis bir dəstənin içinə düşüb. Günün günortaçağı bulvarda xəlvət bir xiyabanda dalaşmışlar, kimi isə bıçaqla vurub yaralamışlar, qaçan yerdə tutulmuşlar.

Məryəm üçün bu, gözlənilməz, ağır, dərin faciə idi. Fikirdən, qüssədən az qalırdı ürəyi partlasın. Mədinəgil onu sakit etmək üçün çox səy göstərdilər. Nəhayət, gecə yarısı evinə yola saldılar. Yavər "səhər açılar, bir çarə taparıq"– deyib söz verdi. Əlbəttə sabahısı Nazimi damdan çıxara bilmədilər. Yalnız necə hərəkət etmək, hansı vasitələrə əl atmaq mümkün olduğunu aydınlaşdıra bildilər.

Mədinə min bəhanə ilə gah Məryəmi evlərinə çağırır, gah özü onlara gedir, dərdinə şərik olurdu. Uşağı xilas etmək yollarını axtarırdı. Evə qayıtdıqda isə:

– Heç belə də iş olar, Yavər! Gül kimi uşaq idi. Gözümüzün qabağında cinayətkar elədilər! – deyib heyfsilənirdi.

Uzun düşünəndən sonra Mədinə Yavəri razı saldı, iki-üç qonşu ilə danışdı, kağız yazdılar, milisə, prokurora müraciət etdilər. Uşağı bir də pis yola qoymayacaqları haqqında zəmanət verib şərti cəza ilə anasına qaytara bildilər.

Bu hadisə Yavəri ayıltdı, o həyətə diqqət yetirməyə başladı. İşə gedib qayıdanda cürbəcür səbəblər tapıb ayaq saxlayır, gözaltı uşaqları nəzərdən keçirirdi. Hətta otağında olanda da bu müşahidəni davam etdirirdi. Çörəkdən sonra üçüncü mərtəbədən həyətə açılan pəncərənin dalında durub uşaqlara, onların oyununa, bir-birilə rəftarına göz qoyurdu, gördü ki, həyətə başqa uşaqlar da gəlir. On-on iki yaşına çatmamış uşaqların əksəriyyəti özünü yaxşı aparırdı, sakit oynayır, bir-birilə yaxşı rəftar edirdi. Həyətdən kənara çıxmırdı. On iki-on üç yaşından yuxarı olanlar isə, xüsusən oğlan uşaqları, qaynayıb daşırdı, bu həyət onlara darlıq edirdi, başqa həyətə keçir, küçəyə qaçırdılar. Yavər bilirdi ki, bu xatalı işdir. Çünki Bakı kimi böyük şəhərdə onları tanıyan, fikir verən olmur, nəzarətsizlikdən nə istəsələr edirlər. Deməli, yeni-yeni uşaqlar bədbəxt ola bilər, lap sabah Yavərin öz uşağını aldada bilərlər. Nə etməli? Uşağa demək olarmı ki, qaxıl otur evdə, yaşıdlarınla görüşmə, oynama? Məktəb, ev, vəssalam! Yavər müəllim idi, bilirdi ki, heç bir uşağa bunu demək olmaz.

– Mədinə, bütün bədbəxtlik ondadır ki, həyətdə uşaqlar başsız qalır. Sabah Nazimi başqa bir dəstə ələ ala bilər. Nazim olmasa da özgə bir xam taparlar, girə keçirə bilərlər. Gəl qonşularla danışaq, həyət komitəsi düzəldək, bütün böyüklər növbə ilə uşaqlarla məşğul olsun, oyununu, istirahətini, əyləncəsini təşkil etsin. Necədir?

Ərinin təklifi Mədinənin ürəyindən oldu. Hətta təəssüf ketdi ki, niyə bu fikir öz başına gəlməmişdir. Bir də, Yavərin dediyi olsa Mədinə də ictimai bir iş görəcəkdi. Axı, evdar qadın olaraq tez-tez daxili bir sıxıntı çəkirdi. Evlərinin dörd divarından kənarda qaynayan böyük həyatdan ayrılmış kimi idi, darılırdı. Mədinə pedaqoji texnikum qurtarmış, üç il uşaq bağçasında işləmişdi. Sonra necə oldusa, işdən çıxdı və evdə oturdu. Əvvəlcə dincəlirdi, kitablar oxuyurdu, sonralar isə darılmağa başlayanda ancaq özünü günahlandırırdı.

Ərinin təklifi barədə Mədinə bir-bir qonşulara danışdı, evlər idarəsinə getdi, yığışdılar, evdar qadınlardan beş nəfərini həyət komitəsi və Mədinəni də komitənin sədri seçdilər. İndi Yavər evə gələndə arvadının cürbəcür yeni fikirlərlə qaynadığını görür, ona məsləhətlər verir, kitablar göstərirdi. Getdikcə həyətdəki uşaqlar müxtəlif əyləncələrə cəlb olunurdu. Çox maraqlı tədbirlər meydana çıxır və Mədinəni məşğul edirdi. Bir gün Yavər zarafatla ona dedi:

– Rəsmi olaraq işləsəydin, heç bu qədər vaxtın getməzdi, Mədinə, bərk qızışmısan!

Mədinə ürəyini ərinə açdı:

– Doğrusu, ay Yavər, birinci onu düşünürəm ki, dilimizdən iltizam vermişik, gərək sözümüzün üstündə duraq. İkinci də – Mədinə dayandı, ərinə baxıb gülümsədi: – ikinci də ki, mənim də adımı qəzetlərə yazsınlar.

– Sən kitablara da layiqsən! – deyib Yavər arvadını oxşadı.

Mədinə ərinin tərifindən xoşlanaraq davam etdi:

– Yaman maraqlı işdir, ay Yavər. Heç yorulmuram. Sağ ol ki, məni həvəsləndirdin. Bilsən ki, bu uşaq dünyası necə qəribədir. Necə açılmamış sirləri var! Özləri də o qədər mehribandır, o qədər yatımlıdır ki, adam ayrılmaq istəmir. Lap pis uşağın da dilini tapanda mum kimi yumşalır, olur üzüyola, sözə baxır, fikri, gözü açılır. İndi mən inanıram ki, dünyada pis uşaq yoxdur, pis tərbiyəçi var.

– Elədir, elədir, – deyib Yavər təsdiq etdi. Özündən razı halda gülümsədi və ürəyində belə düşündü ki, Mədinə gözəl uşaqlar tərbiyə edəcək, övlad cəhətdən də ərini yarıdacaqdır. Dünyada dərdlərin ən böyüyü olan pis övlad dərdi çəkməyəcəklər.

Bütün bu qızğın fəaliyyət zamanı Yavər də, Mədinə də rəssamı unutmuş kimi idilər. Yalnız bircə dəfə Mədinə ona oxşar bir adamı yuxuda görmüşdü. Bu qəribə bir yuxu idi. Mədinə Nazimin işi üçün ora-bura qaçdığından və nəhayət, uşağı azad edib evə gətirməklə son dərəcə sevindiyindən, günün necə gəlib keçdiyini bilməmiş, gecə saat birdə yorğun-arğın halda başını yastığa qoyanda daş kimi yatmışdı. Birdən özünü keçilməz-çıxılmaz qalın meşədə gördü. Üz-gözünü tük basmış bir adamı, min illik bir palıd ağacına sərimişdilər. Zəncirini qıra bilməyən bu adam dərdli-dərdli oxuyur, kimləri isə köməyə çağırırdı. Yalnız iri ala gözlərindən, o rəssama oxşayırdı. Mədinə ona

kömək etmək üçün palıda tərəf qaçanda meşədə, dağlarda, dərələrdə qeyb oldu.

Zaqatalanın gözəl bağlarında ilişib qalmış kimi görünən rəssam, birdən getdiyi kimi, birdən də gəlib çıxdı. Yavər və Mədinə adətləri üzrə axşam çaya oturmuşdular. Söhbət edir, radioya qulaq asır, balaca Leyla ilə oynayır, qəzet və jurnal oxuyurdular. Zəng çalındı. Qapıya Yavər getdi:

– Ah, əziz dost, "yaxşı əmi"– deyib gur səslə ucadan danışdı, – harda qaldın, ay canım?

Mədinə dəhlizə çıxmaq istədi. Lakin ürəyinin xoş bir sevinclə döyündüyünü hiss edib ayaq saxladı. Rəssam gəlib nəzakətlə ona salam verdi. Mədinə rəssamın gözlərində yaz səhərinin üfüqlərindəki dumana oxşar bir xəyal gördü.

– Səfəriniz uzun sürdü, əyləşin, – deyib Yavər söhbətə başladı. Bir qədər sınıxmış kimi görünən rəssam öz kreslosunda oturdu, həsrətli adam kimi oturdu. Yavərin suallarına cavab verərək, kənddə gördüklərindən, o yerlərin zəngin və səfalı təbiətindən danışdı, arada yeni yaradacağı əsərlərin də adını çəkdi. Bütün gecəni söhbət kənddən getdi. Yalnız qapıdan çıxarkən Rasim sabahdan mütləq gəlib Mədinənin şəklini çəkəcəyini xatırlatdı:

– Artıq hazıram, hər şey burada bişib yetişmişdir, – dedi və əlini sinəsi, ürəyinin üstünə qoydu, – yaxşımı?

– Qorxuram yenə bir şey çıxa. Bu dəfə Altaya gedəsiniz, –deyib, Mədinə gülümsədi.

– Yox, daha heç yerə gedən deyiləm. Sabahdan başlayırıq!

## 7

Mədinə hər gün axşam saat yeddiyə doğru qarşısıalınmaz bir həvəslə yataq otağına çəkilirdi. Gah ona çox yaraşan narın sarı güllü ipək paltarını, gah da yun şal kostyumunu geyirdi, corablarını dəyişirdi, yaraşıqlı xurmayı saçlarını düzəldirdi, ayna qabağında ani olaraq özünə baxırdı.O bəzək-düzək vuran qadınlardan deyildi, ömründə dodaqlarına rəng çəkməmişdi. Lakin xəfifcə pudralanmağı və ətirlənməyi sevərdi. Bunu da ayda iki-üç dəfə ərilə birlikdə kinoya, teatra və ya dostlarından birinə qonaq getdikləri zaman edərdi. İndi isə hər gün

özünü beləcə düzəldirdi. İlk zaman bu Yavərin ürəyinə yatdı. Çünki o həmişə arvadını gözəl və cazibədar görmək istəyir, mətbəxdə əriyib solmasına qətiyyən razı ola bilmirdi. Lakin arvadın son zamanlar dəqiq surətdə hər gün özünə sığal verməsi Yavəri şübhəyə saldı. Əvvəllər arvadı sarı güllü paltarını nadir hallarda geydiyini, hətta bir-iki dəfə ərinin xahişini yerə saldığını da xatırladı:

– Bu nədir, mətbəx paltarını əynindən çıxarmırsan, dur təzə paltarını gey.

– Evdə oturmuşuq, niyə geyim əzim-töküm, elə belə də yaxşıdır.

İndi isə üç-dörd gündən bir sarı güllü paltar ütülənir və Mədinənin incə belinə, girdə çiyinlərinə ayrı bir yaraşıq verirdi. Bununla belə Yavər arvadı barədə pis fikrə düşmək istəmirdi. Mədinəyə inanmışdı, yaramaz bir arzu onun xəyalından belə keçsəydi, özünü bədbəxt sanardı. Buna görə də Mədinənin son günlər geyim-keciminə diqqət etməsindən doğan şübhələri boğmağa çalışdı, bu haqda bir söz deməyib sussa da qeyri-ixtiyari arvadının hərəkətlərinə göz qoymağa başladı.

Mədinə isə bunları təbii bir şey sayırdı. Özünü inandırmağa çalışırdı ki, burada fəna bir şey yoxdur. Axı, evə başqa adam gəlir, ərinin dostu kimi saatlarla oturub söhbət edir, çay içir, musiqiyə qulaq asır, ara-sıra nərd də oynayırlar. Yaxşı olmaz ki, onun qabağına qızardılmış kartof-soğan iyi verən mətbəx paltarında çıxasan. Mədinə öz aləmində özünü bu cür doğruldurdu. Heç ağlına da gətirmirdi ki, onda Rasimə xoş gəlmək həvəsi oyanmışdır, sarı güllü paltarı da Rasim üçün geyir, xəfif qoxulu ətri də onun üçün vurur. O bilmirdi ki, hərəkətlərində, danışığında, gözlərində qeyri-adi bir canlanma var. İndi o, dumanlı-buludlu qış axşamlarında sakit xəyallara dalıb mürgüləyən bir adamı xatırladır ki, birdən-birə gözlənilməz bir bahar gəlmişdi, buludlar dağılmış, çaylar daşmış, sular-sellər axıb bu adamı mürgüdən qaldırmışdı. Daxilində bilinməz bir həvəs oyatmışdı. Bəli, Rasimin ikitağlı pəncərə kimi açılmış iri ala gözlərindən baxan tanımaz dünya getdikcə daha qüvvətlə Mədinəni səsləməkdə idi...

Rasim onun şəklini çəkdikcə bu cazibə artırdı. Əvvəllər rəssam həftədə iki gün gəlirdi. Sonralar günaşırı gəlməyə başladı. Mədinə çayı hazırlayıb stolun üstünə qənd, mürəbbə, özü bişirdiyi şirin qoğallar və sair qoyduqdan sonra otururdu. Elə bu zaman ordan-burdan şirin söhbət etdikləri yerdə Rasim fırçanı götürüb yavaş-yavaş çəkməyə başlayırdı. Rəssam danışarkən çox zaman Yavərə müraciət edir,

Yavəri dinləyir, fikri Yavərdə olan kimi görünürdü. Mədinə isə bilirdi ki, bunlar hamısı müasir, mədəni insanın gəlib çatdığı çox incə, çox zərif bir rəftar üsuludur, əslində rəssamın yalnız Mədinə ilə məşğul olduğunu gizlədən ipək bir pərdədir. Kişi qısqanclığından açılmış gözlərin qığılcımı belə, bu pərdəni yırta bilmir, onun dalını görmürdü. Rasim özünü elə aparırdı ki, Yavərdə bir zərrə də şübhə oyatmırdı, əksinə onu arxayın salırdı, Mədinəni isə ara vermədən o füsunkar dünyaya çağırırdı.

Beləliklə həftələr gəlib keçdi. Şəklin ümumi cizgiləri hazır olmaqda idi. Kətanın üzərindəki qarışıq boyalar getdikcə pozulmaz bir ahəngə tabe olaraq dərin məna və ehtirasla dolu bir gözəlliyi ifadə etməyə başlayırdı. Sanki heçlikdən, dumanlar arasından bir işıq doğmaqda, hərəkət edərək ilahi bir surətin şəklini yaratmaqda idi. Bir dəfə Mədinə şəklə baxdıqda özü də heyran qaldı. Rəssam onun gözlərindən ürəyinin anlaşılmaz həvəsini, hamıdan gizlin saxladığı iztirablarını əks etmişdi. Mədinənin ay kimi işıqlı üzü, xurmayı tellərin yaladığı boynu bu həvəslə yanırdı. Eyni zamanda şəkildə başqa bir çağırış, təşnə, bir həsrət də vardı. Bu, rəssamın duyğuları idi.

Yavər şəklə baxanda vəcdə gəldi:

– Çox gözəldir, Rembrant Saskiyanı bu həvəslə çəkməmişdir! – dedi və özü öz sözünə tutuldu, ildırım vurmuş kimi tutuldu, çünki bu şəkildə o, Mədinənin və Rasimin gözlərindəki, hərəkətlərindəki cazibənin gizli mənasını oxudu. Sanki bu canlı rəsm deyil, bir məhəbbət dastanı idi. Öz gözəlliyi, öz şirinliyi ilə Yavəri təhqir edirdi, onun Mədinəyə olan məhəbbətinə meydan oxuyurdu. Bu dastan, indiyə qədər rəqib görməyib, Yavərin sinəsində arxayın yatan duyğuları təlatümə gətirdi. Ürəyini gözlənilməz bir alov içinə atıb yandırdı. İndi o sinəsini açıb yalnız gözlərində deyil, bütün vücudunda, bütün hərəkətlərində yaşayan öz odlu-alovlu məhəbbətini rəssamın məhəbbətinə qarşı qoymaq, “Mədinə, əzizim, bax, gör ürəyimin sənsiz yaşayan bir teli varmı?.. Yüz rəssam səni mənim qədər sevə bilərmi?”– deyib soruşmaq istəyirdi. Lakin artıq gecdir. İndi bu sözlər Mədinəyə gülünc görünə bilərdi. Rəssam onu qabaqlamışdı! Bu fikirlərin təsirilə sinəsindəki sevgi və iztirab aciz, ümidsiz bir kədərə çevrilib gözlərinə kölgə salanda, o yüz ilin yorğunu kimi divana düşdü.

Mədinə də, rəssam da Yavərin bu halını duydu və hər ikisi kədərləndi. Hətta rəssamın gözlərində yanıqlı təəssüf ifadələri göründü.

Sanki Yavərin halına acıyıb yanırdı. İxtiyarsız olaraq onu da, özünü də iztirablar girdabına atmışdı və bu girdabdan çıxış yolu tapmayıb çırpınırdı.

Mədinə də çaşqın halda idi. Birinci dəfə olaraq əri ona əzgin və zavallı göründü. Sanki o müşkül, həllolunmaz bir məsələ qarşısında qalmışdı. Sanki belinə ağır bir yük sərimişdilər. Bu yükü nə ata bilir, nə də çəkib apara bilirdi. Rəqiblərin istehzalı nəzərləri altında yanıb qovrulurdu. Mədinənin ağlına gələn ilk fikir bu oldu ki, "Görəsən Yavər nə edəcək? Qısqanclıq səhnələrimi düzəldəcək, yoxsa evini-eşiyini atıb gedəcəkdir?" Lakin Yavərin gözlərində buna bənzər heç şey yoxdu. Onlar Mədinəyə çevriləndə əvvəlkindən də mehriban məhəbbətlə dolurdu. Ancaq indi orada anlaşılmaz bir sual və həsrət əmələ gəlmişdi. Yavərin hərəkətlərində isə qeyri-adi bir qürur və təmkin gözə dəyirdi.

Mədinə ilə rəssamın intizar dolu baxışları altında Yavər düşündü – nə etsin? Mədinəyə acıqlansın, Rasimi evdən qovsun? Bununla məgər arvadın ürəyini yerindən oynatmağa başlayan, gözlərini dumanlandıran cazibəni söndürmək olar? Necə təhlükəli bir oyuna girişdiyini Rasimə qandırmaq mümkündür? Yox, Yavər bunu bacarmayacaq! Öz əlilə öz təmiz eşqinin sarayını vurub uçurmayacaqdır. Bir də ki, bu ancaq faciəni tezləşdirər, kim bilir, bəlkə onların özü üçün də dumanlı olan bir yola düşmələrini asanlaşdırar. Bəlkə də arada heç bir şey yoxdur? Bütün bunlar qara şübhələrdir? Bəlkə də! Yavər məhz indi doğma dayısı oğlunun ailə faciəsini xatırladı. Onun arvadı bir məclisdə köhnə tanışlardan birilə mehriban rəftar etmişdi. Bunun üçün qısqanclıqdan kişinin gözləri qızıb kəlləsinə çıxmışdı. Bu halda sevimli arvadına əl qaldırmış, köhnə tanışı söyüb təhqir etmişdi. Sabahısı evə gələndə stolun üstündə belə bir kağız tapmışdı: "Mən o adamı sevdiyimi bilmirdim. Özümü inandırırdım ki, səni sevirəm. Sənin bugünkü şillən məni ayıltdı, bu vaxta qədər səhv etdiyimi anladım. Sağ ol, sənin evini birdəfəlik tərk edirəm".

Yox, Yavər o cür vəhşi rəftarı özünə rəva görə bilməzdi! Bir də ki, ilk ciddi imtahana davam gətirməyən bir məhəbbət kimə gərəkdir? Bir qadın ki, ərindən gözəl, ərindən yüksək, ərindən adlı-sanlı və ləyaqətli adama rast gələndə hər şeyi unudacaq, onun evdə qalmasının nə faydası! Belə qadın qoy nə istəyir eləsin, hara gedir, çıxıb getsin!

Yavər artıq Rasimə baxmadan arvadına dedi:

– Bilirsənmi, Mədinə, tamam unutmuşam, məktəbdə iclasımız var. Mənim iştirakım vacibdir. Siz oturun, mən də qayıdaram.

Mədinənin cavabını gözləmədən, çox davamlı, sevdalı və kədərli baxışlarla onu süzüb otaqdan çıxdı. Bir zaman bütün evi qızdıran, Mədinənin sinəsini isidən bu baxışlar indi közü sönməkdə olan bir ocağı xatırladırdı. Yox, deyəsən orada alova çevriləcək yeni bir od közərirdi! Mədinə Yavərin bu hərəkətini anlaya bilmədi. Acıqlanıbmı? Qısqanclıqdırmı? Yoxsa xırda duyğulardan yüksəkdə durduğunu, hələ də arvadına nəhayətsiz dərəcədə inandığını göstərmək istəyir! Hər halda Yavər Mədinənin düşündüyü kimi hərəkət etmədi və onu daha artıq çaşdıraraq, heyrətə salaraq evdən çıxdı. Mədinə: "Ürəyi mənim bilmədiyim ehtiraslarla doludur – deyib düşündü. – Birdən-birə gözləri necə də alovlanıb yanmağa başladı!".

Yavər təmkinli addımlarla aşağı enirdi. Mədinə çaşqın halda, təzadlı fikirlər əlində astanada durub onun dalınca xeyli baxdı, pillələrdən enib həyətə çıxana qədər ayaq səslərini dinlədi və düşündü ki, qayıdıb rəssamdan xahiş etsin – du get, bur evi tərk et. Axı, nəyə gərəkdir bu iztirablar? Məgər o əri ilə xoşbəxt deyildi?.. Doğrudur, bu günə qədər Mədinəyə elə gəlmişdi ki, onların səadəti sakit, həzin axan balaca bir çaya bənzəyir. O, dalğalanıb daşmırdı, sahillərini yuyub ətrafı basmırdı. "Nə olar ki, hərənin bir həyatı var, hərə səadəti bir cür başa düşür və nəhayət, hərəyə bir cür səadət qismət olur. Mənimki də budur!".

Qəribədir! Yavər uzaqlaşdıqca Mədinənin ürəyinin nisgili artırdı. Sanki təsadüfən əlinə keçmiş qiymətli büllur bir aynanı şıltaq bir uşaq kimi qədrini-qiymətini bilmədən daşa çırpıb sındırmışdı və indi peşmançılığını çəkirdi. "Bəli Rasimlə vidalaşmaq lazımdır!" – deyib qət etdi.

Geri döndükdə rəssamla üz-üzə gəldi. Gözləri gözlərinə sataşanda qətiyyəti duman kimi əridi, nitqi qurumuş halda dayandı, bir söz deyə bilməyib divara söykəndi. Rasimin ala gözlərində, geniş alnında və üzündə nəhayətsiz bir kədər vardı. Mədinə və rəssam əzablı, şirin sükut içində baxışdılar. Mədinəyə və rəssam əzablı, şirin sükut içində baxışdılar. Mədinəyə elə gəldi ki, bu an bütün ixtiyarı, həyatı, taleyi rəssamın əlindədir, rəssam nə istəsə edə bilər. Bunu anlamış kimi rəssam onun əlindən tutdu, gətirib divana oturtdu:

– Mən bilirəm ki, – dedi, – yaxşı hərəkət etmirəm. Lakin ixtiyar məndə deyil.

Mədinə qızdırmadan ayılan xəstə kimi üşüdü, yana çəkildi, əlini havada yellətdi:

– Rica edirəm danışmayın. Görürsünüz ki, mən evliyəm, ərim var, uşağım var. Siz səadətinizi başqa yerdə tapa bilərsiniz. Hansı qızı istəsəniz sizə gələr.

Rəssam gözlərini Mədinədən çəkmirdi, Mədinə də bu gözlərə baxırdı... Yalvaran, rica edən baxışlarla gözünü ona dikmişdi. Rəssamın üzündə, gözlərində ani həvəslərdən deyil, ürəyin dərin titrəyişindən doğan bir aydınlıq və qətiyyət vardı.

– Mən sizi hələ məktəbdə ikən sevdiyimi deməyəcəyəm. Belə bir yalana ehtiyac yoxdur. Bir-birimizdən xəbərsiz yaşadığımız illərdə həyatımı yalnız sənətə verdiyimi desəm, o da yalan olar. Gəzdiyim, görüşdüyüm, hətta ciddi fikirlə görüşdüyüm qadınlar olub, lakin heç birisi sizin qədər məni valeh etməyib, mənə belə böyük bir səadət vəd etməyib!

Rəssam danışdıqca Mədinənin ürəyi həm yumşalır, həm də bərkiyirdi. Onda bir arxayınlıq hasil olurdu. Çünki təhlükəli an keçmişdi. O an ki, onda insan heç bir şey düşünmədən, gözübağlı kimi özünü uçuruma atmağa hazır olur, artıq o bir an uzaqlaşırdı!

– Sözlərinizin, duyğularınızın səmimiliyinə inanıram. Lakin mənim kimi qadınlar həmişə ağlı ehtirasdan üstün tutmalıdır. Bəlkə mən sizinlə doğrudan da daha böyük səadətə çataram. Lakin nəyin bahasına? Ürəyini səmimi olaraq sənə vermiş bir adamın ömürlük zəhərlənməsi bahasına, həyata bu qədər sevinclə baxan körpə və məsum bir uşağın gələcəyini zəhərləmək bahasına. Yox, Rasim, nə sənə, nə də mənə belə səadət lazım deyil!

– Mən sizin balanıza doğma atasından artıq baxaram. İnanın ki, mən yüngülağıl deyiləm, hər şeyi düşünmüşəm. İki ayda on ilin iztirablarını çəkmişəm. O zaman çıxıb kəndə getdiyim də nahaq deyildi. Özümdən, sizdən qaçmaq, uzaqlaşmaq istəyirdim. Mümkün olmadı. Nə etməli, Yavər də bizi başa düşər, axı, o sizin soyuduğunuzu, evinin, ailəsinin əvvəlki hərarətlə qızmadığını gördükdə məgər xoşbəxt olacaq?

– Bu sözlər hamısı bəlkə də doğrudur. Lakin mənim üçün yox, başqa cür qadınlar üçün! Mən bilirəm ki, təzə birini sevdiyi zaman heç şeyə baxmayan qadınlar var, onlar evini, uşaqlarını atıb gedir, mən onları qınamıram. Bəlkə bu onların haqqıdır. Mən isə haqqımı başqa şeydə görürəm. Sizinlə görüşümüz də bir röya idi, bir həvəs idi, gəldi, keçdi. Mənim kimi qadınlar səadəti vicdanın, namusun beşiyində

tapırlar. Onlar bir dəfə büdrəyib yıxılsalar, bütün ömürləri boyu şikəst olur, ayağa qalxa bilmirlər, onu da bilirəm ki, mənim kimilərinə aciz deyən, qorxaq deyən, hissiyyatı kasıb deyən adamlar olacaq, qoy desinlər, bu ittihamlar məni qorxutmur!..

Rasim yaşarmış gözlərini yana çəkdi:

– Siz mənim istədiyimdən də böyük məhəbbətə layiqsiniz, Mədinə! – deyib pıçıldadı, şəkli göstərdi. – İki gün də gəlib bunu qurtara bilərəmmi?

Mədinə həyəcandan zorla özünü saxlayaraq, titrək və qüssəli səslə:

– Elə burda kəssək yaxşıdır, qurtarmağa nə ehtiyac var?! – dedi və qapıya tərəf yönəldi.

Rasim paltosunu geydi.

– Son dəfə əlinizi sıxmağa icazə verin. Söz verin ki, mənim haqqımda pis fikirdə olmayacaqsınız. Bir də yadınızda saxlayın ki, iraq-iraq lap pis dəqiqələrinizdə qabağınızda qul kimi duracaq bir dostunuz var. Yaxşımı?

Mədinə onun gözünə baxmaqdan qorxaraq tez başıyla təsdiq etdi və tələsik qapını örtüb özünü divanın üstünə atdı. İndi hönkürüb ağlamaq, içərisinə dolmuş ağır, dumanlı hissləri göz yaşları ilə silib təmizləmək onun yeganə arzusu idi. Lakin ağlaya bilmirdi. Nə isə, boğulurdu. Elə bu zaman zəng çalındı. Gələn Yavər idi. Mədinə onun hirsli, əsəbi, acıqlı olacağını düşünürdü. Lakin deyəsən o, yenə əvvəlki kimi gülər üzlü, sakit, mülayim idi. Ya da, bu cür görünməyə çalışırdı. Yalnız gözlərinin altındakı kədərli qara kölgəni gizlədə bilmirdi. Mədinəyə elə gəldi ki, bu kölgəni heç vaxt Yavərin üzündən silmək olmayacaq. Onu dəhlizə buraxan kimi boynunu qucaqladı, başını çiyninə qoyanda özünü saxlaya bilməyib ağladı.

Yavər arvadının göz yaşlarını sildi, saçlarından öpüb oxşadı:

– Mənim dəlim, sənə nə olub belə?! Ağlama, uşağı oyadarsan!..

*1960*

# DUZ-ÇÖRƏK

1

Sahildə iki ev var. İkisinin də mavi həşyə içinə alınmış yaraşıqlı pəncərələri dənizə açılır. Bütün dənizlər kimi, bizim Xəzər də sakit və buludsuz havalarda füsunkar mavi gözəlliklə adamın üzünə gülür, o qədər mehriban və munis olur ki, elə bilirsən təzə gəlindir, oturub yanında, öz nəfəsi və gözləri ilə canını qızdırır. Lakin hava pis olanda, göy üzünü duman və bulud örtəndə Xəzər tamamilə dəyişir, gözəlliyini itirir, bulanıq gölə oxşayır. Fırtına qopanda isə quduz pələngə dönür, dağ boyda qəzəbli və amansız dalğalarla sahillərə hücum çəkir.

Sahildə yaşayan iki adamın heç biri dənizin orta vəziyyətini sevmir. İkisi də bu əqidədədir ki, dəniz gecələr ulduzların işığını, gündüzlər günəşin şüalarını əks edən nəhayətsiz büllur ayna kimi parıldamalıdır, ya da coşub-daşaraq sahilləri döyəcləməlidir. Bulanlıq göl kimi cansıxıcı dəniz nəyə gərəkdir?! Bu cür olanda dəniz, sahildə yaşayan adamların gözündən düşür, aciz, mənasız, zavallı bir şeyə çevrilir. İlin hansı fəslində olursa olsun belə günlərdə onlar pəncərə qabağına gəlməz, dənizə baxmazlar. Hətta payızda və qışda pərdələri də salarlar, – qoy üzünü görməyək! Axı, niyə də görəsən? Bir qəhrəman ki, sən onun qollarında nəhəng qüvvəsi olduğunu, dizlərinin bükülməzliyini güman etmisən, birdən-birə arxası üstə torpağa düşə, hər gələn ona istehza edib gülə, onun nəyinə baxasan? Yəqin ki, bu, tamaşa etmək üçün o qədər də yaxşı mənzərə deyil. Bəli, dəniz gözəlliyini itirəndə və gücünü göstərə bilməyəndə sahildə yaşayanlar onu unutmağa çalışırlar. Yaxşısı budur, dur ayağa, pərdələri sal. Qoy müasir işıqlı və böyük şüşələrin qabağını pərdələr örtsün! Qışda soyuq havanı buraxmayan qalın pərdələr, yayda isti günəş işıqlarını udan nazik pərdələr...

Pərdələr barədə sahildə yaşayanlar müxtəlif fikirdədirlər. Sağ evdəki Xəlil Çaydaşlı bu fikirdədir ki, pərdələr evin içini, kənar gözlərdən gizlətdiyi kimi, evin içindəkiləri də xoşagəlməz üzlərdən, pis hadisələrdən, bəd nəfəslərdən qoruyur. Buna görə də çöldə xatalı bir şey hiss edən kimi pərdələri örtür, gərək sadəlövh bir uşaq və ya yaşlı bir axmaq olasan ki, küçənin təsadüflərinə imkan verəsən hər dəqiqə içəri dolsunlar və sənin həyatını zəhərləsinlər... Çaydaşlı belə düşü-

nür. Bu cür aydın və qəti fikirlərdən xoşu gəlir. Məhz buna görə də bütün sənədlərdə familiyasını Çaydaşlı yazdırır: "Mənim dumanlı-mumanlı işlərlə aram yoxdur, familiyam necə, özüm də elə!" Bu sözlər köhnələr demişkən, onun dilində "təkyəyi kəlamdır", harada və nə barədə söhbət düşsə, Çaydaşlı sözü hərləyəcək, fırlayacaq, gətirib qətiyyət məsələsinə çıxardacaq. Deyir ki, ikibaşlı söz danışan, ikibaşlı, haça fikirli adamlardan xoşu gəlmir, belələrinə qarşı ürəyinin gizli bir guşəsində özündən asılı olmayaraq nifrət yaşayır. Soruşa bilərsiniz ki, bəs bu xasiyyəti ilə familiyası arasında nə əlaqə var? Ümumiyyətlə, insanın familiyasının xasiyyətinə nə dəxli?! Mən də elə düşünürdüm. Lakin görünür, bəzi hallarda dəxli olur.

Çaydaşlı müharibə illərində kənddən şəhərə gəlib, pis vəziyyətdə, ağır vəziyyətdə gəlib. Onların kəndi aranın ağzında, dağa oxşar böyük təpələrin ətəyindədir. Dədə-babadan Daşlıçay adlanır. Bu da çox təbiidir, coğrafi xüsusiyyətlərinə görə kəndlərə və şəhərlərə ad qoymaq təkcə Azərbaycanda yox, bütün dünyada qədimdən qalma adətdir. Onların kəndinin böyründən balaca bir çay axır. Əslinə baxanda adı çaydır, özü isə kənd əhalisi üçün min illər ərzində bədbəxtlik mənbəyi idi, qonşu kəndlərin yerli-yersiz istehzasına səbəb olardı. Bu çayın keçmişlərdə kəndlilərə gətirdiyi bədbəxtlikdən bir az sonra danışacağıq. İndi isə istehza və məsğərələr barədə deyək. Təsəvvür edin ki, Daşlıçaydan bir adam rayon mərkəzinə, ya başqa bir yerə gedərdi, bazar-dükanda alıb-satacağı vardı, dost-aşnanın xeyrində-şərində iştirak edəcəkdi, bir idarəyə vacib işi düşmüşdü və sairə. İki kəlmə salamməlik eləməmiş soruşardılar.

– Hardansan, xalaoğlu?

Daşlıçaydan gələn o saat təhlükəni hiss edər, qaşlarını çatıb qəsdən ucadan söylərdi:

– Daşlıçay kəndindənəm...

Müsahib şirin-şirin gülərdi:

– Çayı bir az da bərkdən desənə!.. Axı, doğrudan da kəndinizdən çay axır. Yay, qış suyunuz aşıb-daşır!..

– Bu, on beş – iyirmi il bundan əvvəlin sözüdür, indi köhnəlib və təsirini itirib. Çünki kəndə Mingəçevir gölündən arx çəkib, su gətiriblər. Keçmişdə, yəni Xəlilin uşaqlıq illərində Daşlıçay kəndlilərinin qulağı istehza və məsğərələrə o qədər öyrənmişdi ki, çox zaman özləri də öz vəziyyətlərinə gülərdilər. Nə etməli, əllərindən nə gələrdi!

Dərd insandan güclü olanda nə edəsən? Özünü öldürməyəcəksən ki?! Dalıçay kəndliləri də dədə-babadan qalma bu müdrik silaha əl atardılar. Vəziyyətin çıxılmazlığına gülər, istehza edərdilər. Axı, başqa əlacları yox idi. Bilirdilər ki, ilin on bir ayını qupquru quruyan, ancaq yazda və yazqabağı hərəkətə gələn, bəndləri yuyub dörd tərəfi basaraq kəndlilərə minbir bədbəxtlik gətirən belə səfeh bir çayın qabağını kəsməyə, bəndlər tikməyə imkanları yoxdur, gücləri çatmayacaq. Əlac ona qalır ki, başqalarına qoşulub, bu səfeh çaya doyunca güləsən. Lakin onlar bu müdrik qaydaya həmişəlik əməl edə bilmirdilər. Üç ildə-beş ildə bir bu səfeh çay başlarına elə bir bəla açırdı ki, böyüklü-kiçikli hamısı mat qalırdı, gülmək nədir, qəzəbdən ağlamalı olurdular. Belə hallarda, əvvəlcə bulanıq, köpüklü su gətirən Daşlıçay, bir də görürdün ki, doldu, qıjhaqıjla elə sel gəldi ki, bütün kəndliklə qabağını almaq mümkün olmadı. Dörd tərəfi su basdı, yolları vurub dağıtdı, yuyub uçurtmadığı bənd-bərə qoymadı, yaxındakı taxıl zəmilərini, yoncalıqları kökündən silib apardı. Belə hallarda gülmək nədir? İstehza kimin yadına düşürdü? Məməyeyəndən pəpəyeyənə qədər, uşaqlı-böyüklü bütün kənd beldən-külüngdən götürüb çölə-bayıra tökülür, Daşlıçayı bir təhər cilovlamağa, yatağına salmağa, heç olmasa az zərərlə bəlasını başlarından eləməyə çalışırdılar. Az qala əldən-ayaqdan olduqları yerdə bulanıq, lehməli sel yavaşımağa başlayır, bir az sonra tamamilə kəsilirdi. Sel kəsilən kimi Daşlıçay da quruyurdu. Axıb-daşdığı yerlərdə isə dağlardan, qayalardan qoparıb gətirdiyi irili-xırdalı boz daşlar qalırdı. İndi bildiniz ki, bu kəndə niyə Daşlıçay kəndi deyilir? Lakin bu sözdən familiya düzəltmək çətindir (Daşlıçaylı addı ki, familiya olmaz!). Ona görə də sifətlə ismi dal-qabaq eləmək lazım gəldi və Çaydaşlı familiyası meydana çıxdı. Elə o zaman təzə ədəbiyyat həvəskarlarından biri əlini Çaydaşlının kürəyinə vurub dedi:

– Afərin! Həmişə cəsarətli olmaq lazımdır! Həmişə qəti və aydın!

Ancaq Çaydaşlının bilmədiyi, başqalarından eşitdikdə isə razılaşdığı kiçik bir həqiqət var; hamıdan qətiyyət və aydınlıq tələb edən, ziddiyyətlərdən zəhləsi gedən Çaydaşlının özü tərəddüd etmək, dumanlı fikirlərə dalmaq kimi qüsurlardan azad deyil. Məsələn, elə pərdə məsələsini götürək. Hər dəfə dənizi bulanıq görüb pərdələri salanda bir gözü o biri evin pəncərəsinə baxdığı halda, mənalı və nümayişkaranə bir səslə ucadan söylənir:

– Yaşasın pərdələr!..

Bu sözləri deyir və tez pərdənin dalına çəkilir. Ona görə çəkilir ki, atmaca söz deyib, gizlənir görsün sözlər hədəfə dəydi ya yox, o biri evdəkinə necə təsir etdi. O biri evdəki Kamal Rəhimli isə heç bir zaman özünü eşitməməzliyə vurmaz, əksinə, pəncərədən çölə boylanar, qonşusunu salamlamaq üçün geniş alnı və açıq siması təbəssümlə işıqlandığı halda o tərəfə baxar, Çaydaşlının artıq pərdə dalında gizləndiyini görüb başını bulayar:

– Zavallı filosof! Hələ də bilmir ki, bütün pərdələri yırtmaq olmaz...

Kamal Rəhimli əvvəllər elə bilirdi ki, Çaydaşlı zarafat edir, dilxoşluq üçün bu sözləri deyir, qonşusunu sancmaq kimi atmaca fikirlərdən uzaqdır. Lakin onun müntəzəm olaraq bu sözü deyərkən oğrun nəzərlərlə bu tərəfə baxdığını və tezcə çəkildiyini gördükdə daşın bu yana atıldığını bildi: "Görəsən, nəyə işarə edir?! Pərdə dalında mən hansı sirri gizlətmişəm ki, "yaşasın pərdələr!" deyib mənə eşitdirir?!". Ha fikirləşdi, öz hərəkətlərində sirli bir şey tapa bilmədi. Bu vaxta qədər elə bir fikri və əməli olmamışdı ki, onu qonşusundan, həmyerlisindən gizlətmiş olaydı. Bəli, həmyerlisindən! Kamal müəllim və Çaydaşlı bir rayondan və bir kənddən idilər. Hətta, bir ildə, bir ayda anadan olmuşdular. Uşaq vaxtı onları çox zaman Xəlil və Kamal yox, yaşıdlar çağırardılar. "Yaşıdlar yaxşı uşaqdır, yaşıdlar gəldi, yaşıdlar getdi!" Axı, onlar kənddə də qapıbir qonşu idilər, bir gündə məktəbə getmiş, bir gündə kəlin boynuna oturaraq meşədən odun daşımış, bir gündə yeddilliyi bitirmişdilər. Lakin əziz oxucu, bu "bir gündələr" sizi çaşdırmasın. Elə güman etməyin ki, yaşıdların xasiyyəti və qabiliyyəti də bir idi. Qətiyyən yox! Kamal uşaqlıqdan çalışqan, sözə baxan idi. Xəlil dəcəl, davakar, pis oxuyan! Heç kəs də bilmirdi ki, bir gündə anadan olmuş, bir gündə məktəbə getmiş, bir gündə kəlin boynuna oturmuş və bir-birindən ayrılmayan yaşıdların biri niyə belədir, o biri elə?! Kimi deyirdi ki, iş toxumdadır, bu anadan belə gəlib, o elə. Kimi deyirdi ki, xeyr, iş tərbiyədədir, ata-ana tərbiyəsində! Qərəz hərə bir söz deyirdi. Yaşıdlar isə böyüməkdə idi. Böyüdükcə də bunun yaxşı sifətləri, onun pis sifətləri böyüyürdü. Ancaq həmişə bir yerdə idilər, həmişə də ki, Kamal Xəlilə kömək edər, onun görmədiyi işi görər, məktəbdə evə verilən dərsləri (xüsusən hesabdan məsələ və misalları) hazırlar, onu başa salar və verərdi dəftərinə köçürsün. Yeddinci sinfə qədər belə oldu. Yeddidən sonra Xəlil məktəbi buraxdı, dedi ki, işlə-

yəcəyəm, oxumaq istəmirəm. Bir müddət poçtda işlədi, sonra aşxanaya keçdi, daha sonra rayonda böyük bir mağazada işə düzəldi. Kamal isə həm işlədi, həm oxudu, yəni başqa səmtə getdi, yolları ayrıldı. Lakin əlaqələri kəsilmədi. Uzaqdan da olsa Kamal bacardığını edir, köhnə yoldaşına yox demirdi. Kamalın ağlına da gəlmirdi ki, Xəlil onun köməyini həmişə daxili bir qibtə və paxıllıq hissi ilə qəbul edir. Çox sonralar şəhərdə bir yerdə yaşamalı olmuşdular (Kamal kömək etmişdi). "Yaşasın pərdələr!" şüarı da bu zaman meydana çıxdı. Əlbəttə, Xəlil ürəyində buna başqa məna verirdi. Kamala isə bu barədə açıq bir söz demirdi, üz-gözünün hər hansı dumanlı bir ifadəsi ilə də olsa, bir şey bildirmirdi. Əksinə, hər dəfə rastlaşanda onu uzaqdan və hərarətlə salamlayır, şirin-şirin hal-əhval tutur, gülümsəyir, hörmət izhar edirdi.

"Qəribə adamdır bu Çaydaşlı!"– deyib Kamal Rəhimli düşünürdü, – ziyalı olasan, oxumuş olasan və bu qədər bulanıq?! Heyif, sənə bəslədiyim ümidlərə... heyif, sənə çəkdiyim zəhmətlərə! Sənin əlindən tutub nəşriyyata gətirəndə düşünmüşdüm ki, iri, qara gözlərindən mərdlik, cəsarət yağır. Fikrimdə sənin də səhv edə biləcəyinə yol verirdim... Qan daman qırmızı yanaqlarına, palıd kimi sağlam və şümşad boyuna baxırdım, deyirdim ki, bunu şəhərin içkisindən, kef məclislərindən, yüngül qadınlarından qorumaq lazımdır. Vətən barədə odlu, hərarətli sözlərini, cəmiyyətdə gördüyün bu və ya digər qüsura qarşı çox zaman düşünülməmiş, çiy fikirlərlə dolu coşqun etirazlarını eşidəndə qərara alırdım ki, bacardıqca bunu qızğınlığın törədəcəyi səhv addımlardan saxlamalıyam. Bu mənim borcumdur. Yaxşı mübariz olacaq, mərd və cəsur olacaq... Ancaq ağıllı və müdrik olmağa, hadisələrin gözə görünməyən dərinliklərinə enməyə öyrədə bilsəm, dilindən düşməyən vətənə nə qədər faydası dəyəcək... O zaman heç ağlıma da gəlməmişdi ki, xırda işlərdə min cür zəhmət çəkmiş uşaqlıq yoldaşım əli maaşa çatan kimi xüsusi "Volqa" fikrinə düşəcək, çiy-çiy yazıları dalbadal kitablar halında çap etdirəcək. Bütün bunlar üçün asılı olduqlarının qabağında yumşaq muma dönəcək, özündən asılı olanlar üçünsə iti kəsərli qılınc olacaq!.. "Gələcəyimizi sizə tapşırırıq!" – deyənlər məgər bizi belə tərbiyə ediblər?! Yox! Min dəfə yox! Bəlkə mən də günahkaram, elə uşaqlıqdan mən bunun əlindən tutub dartıram. Qoymuram bir dəfə özü zora düşsün, əlləşsin, öz gücü ilə dartınıb palçıqdan çıxsın?!

Bu acı və əzablı fikirlər uzun sürmürdü. Bunların dalınca şübhələr, tərəddüdlər başlayırdı. Uzun həyat təcrübəsi Kamal Rəhimliyə öyrətmişdi ki, insanlar barədə tez hökm çıxarmaq lazım deyil. Otuz beş yaşı olsa da, iki uşaq atası olsa da, Çaydaşlı hələ ümidsiz deyil, yeriyəcək, büdrəyəcək, yıxılıb qalxacaq və əvvəl-axır qüsurlardan, səhvlərdən, bulanıq həvəslərin çirkabından təmizlənəcək... Belə düşündükcə onun yaxşı işlərini, yaxşı sifətlərini xəyalımda canlandırırdım. "Nə qədər fəaldır! Nəşriyyatın bütün işlərində onun əli, onun təşəbbüsü görünür. Planlar, yazılar müzakirə olunan zaman onun çıxışlarına qulaq asasınız! Bu canlı ensiklopediyadır?"

Bugünkü Qərbin elə yazıçılarından, elə rəssamlarından danışır, misallar gətirir ki, onlar hələ-hələ kitab və mütaliə aşiqlərinə məlum deyil. Amerikada, İngiltərədə, Fransada çap olunan jurnallardakı sensasiya ruhlu nadir yazıları əzbərdən bilir. Kamal Rəhimli hələ orta məktəbdə oxuyandan kitab aşiqi idi, iyirmi ilin ərzində ömrünün mütaliəsiz keçən bir günü olmamışdı. Buna baxmayaraq Çaydaşlı misal gətirdiyi ədəbiyyat, rəssamlıq, musiqi əsərlərinin çoxundan xəbərsizdi. Onların əksərini oxumamışdı, vaxt tapmırdı oxusun. Kamal öz-özünə deyirdi: "Yəqin gec ayılanlar belə olur! Yatmaq, dincəlmək bilmirlər. Gecə-gündüz oxuyur, əlləşir və boş-boşuna itmiş günlərin əvəzini çıxırlar!.." Bəzən bu mülahizələrə də nə isə şübhəli bir fikir qarışırdı: "Hər şeydən bir az bilmək də yaxşı deyil. Delitantizm heç kəsə fayda verəmyib... Gərək nə qədər qüvvən, həvəsin, enerjin, şüurun ola ki, bütün bunları oxuya biləsən, həzm edəsən, oxumağa vaxt tapasan!.." Çaydaşlı vaxt tapırdı. Eyni zamanda özü də yazırdı. Hamıdan, bütün nəşriyyat işçilərindən məhsuldar idi. "Yox, onun barəsində belə sadə hökm çıxarmaq olmaz!" – deyib Kamal Rəhimli düşüncələrinə yekun vurdu, çox mürəkkəb adam olub!..

2

Kamal Rəhimli müəllimdir. Yaşı otuz beş olduğuna baxmayaraq xeyirxah, mərd, qoçaq adamlardan tutmuş nanəciblərə, satqınlara, kəmfürsətlərə qədər nə çeşid insanlar desəniz, hamısı ilə oturub-durmalı olub, özü isə tərtəmiz qalıb, üstünə bir tikə də ləkə qonmayıb. Əksinə, sanki təbiət bal arısının xüsusiyyətini ona vermişdir, harda kimə rast gəlibsə onun yaxşı cəhətini götürüb, hətta nanəciblərin,

namərdlərin də ürəyinin çürüməmiş bir hissəsində qalan ətirli, gözəl duyğular gəlib dolub Kamalın ürəyinə. Var, belə adamlar var!.. Onlar almaz parçası kimidir – at çamurluğun içinə, çıxardıb siləndə görəcəksən ki, par-par parıldayır!..

Kamal lap ilk gəncliyindən müəllimliyə, sonra da Ağsu rayonuna getməyə razı oldu. Ona elə gəlirdi ki, əlində gur işıqlı bir məşəl var. Yüzlərlə, minlərlə adamların yolunu işıqlandırmağa, gözlərinə işıq verməyə gedir. Xalqı savadlandırmaq, bilik adlanan kəsərli silahı onun əlinə verib varlı və mədəni həyat uğrunda mübarizəyə qaldırmaq o zamankı gəncliyin bütün ürəyinə hakim olmuş, varlığına qüvvət verən bir arzu, bir həvəs, bir ehtiras idi. Kamal da bu gənclərdən biri olaraq onların hamısı kimi, bu ideal yolunda hər bir fədakarlığa, hər bir çətinliyə dözməyə hazır idi. Kamal həmin kənddə çox yaxşı işlədi, maarif şöbəsinin, kənd rəhbərlərinin gözlədiyindən qat-qat bacarıqlı, fərasətli çıxdı.

İkinci il onu dərs hissə müdiri təyin etdilər. Kamal axşam kursları açdı. Yaşlı adamların hərfləri necə höccələyib, necə həvəslə oxumağa çalışdığını, uşaqların səylərini, müvəffəqiyyətlərini gördükcə ürəyi sevinclə dolur, müəllimliyi daha artıq sevirdi. Bir müddət sonra onu maarif idarəsinə apardılar. Əvvəlcə bir neçə kəndin məktəb və maarif işinə baxırdı, sonra bütün rayonu ona tapşırdılar. Bir neçə il sonra, yəni əllinci illərin axırına doğru özünü pedaqoji instituta oxumağa göndərdilər. “Ali təhsil al!” Kamal bu zaman evli idi. Sadə və yetim bir kəndli qızı almışdı. Arvadı kənddə qaldı, özü Bakıda oxudu. Həm də taleyindən razı, həyatından xoşbəxt, yüksək ruhla oxudu. Arvadı da kənddə eyni ruhla nikbin və xoşbəxt çalışıb onun yolunu gözləyir, onunla fəxr edirdi. İllər keçdi, ali məktəbi bitirdi. İndi də onu başqa rayona göndərdilər. Əlbəttə, heç bir söz demədən getdi. Nə deyəcəkdi? Başqa bir təklif irəli sürmək onun heç ağlına da gəlmirdi. Xalq məni oxudub. Mənim də borcum hara lazım görürlər, ora getməkdir. Getdi, arvadını da apardı. Orada uşaqları oldu. Birinci qız, ikinci oğlan, üçüncü qız. Müəllim yoldaşları və kəndlilər ona sataşıb deyirdilər:

– Kamal müəllim, gör nə yaxşı nizam ilə gəlir: biri qız, biri oğlan, biri qız, biri...

Altmışıncı illərə doğru uşaqların sayı beşə qalxdı. İkisi oğlan, üçü qız. Kamal müəllim “dövlətdir!” deyib, onlarla fəxr edirdi. Bu dövrdə onu Bakıya gətirdilər. – Maarif nazirliyində məsul bir işi Kamal müəllim həmişə olduğu kimi həvəslə qəbul etdi. Lakin nə xasiyyəti

dəyişdi, nə yerişi, nə də insanlarla rəftarı. Sahildən uzaqlaşdıqca dəryada gah batıb, gah çıxan üzücü kimi bəzən Kamal müəllimə yaxınlaşıb, bəzən səssiz-səmirsiz itən Xəlil Çaydaşlı bu zaman öz varlığını bildirdi. Xüsusi məktubla uşaqlıq dostundan xahiş edirdi ki, ali təhsil almaqda ona kömək etsin: "Görürəm ki, indi elmsiz keçinmək mümkün deyil!" – yazırdı. Əlbəttə, Kamal müəllim ona kömək etdi. Xəlil Darülfünunun axşam şöbəsinə daxil oldu. İşləyib oxuyurdu. Tez-tez mehmanxanada yaşayan Kamalgilə gəlib-gedirdi. Onun məsləhət gördüyü kitabları qapıb mütaliə edir, sözlərinə qulaq asıb səy göstərirdi. Darülfünunu yaxşı qurtardı. Şəhərdə qaldı. Bu zaman Kamal müəllim nazirlikdə böyük hörmət qazanmışdı. Artıq nazir müavini işləyirdi. Bakıda köhnə bir evdə, heç bir şəraiti olmayan iki balaca otaqda yaşadığını bilib yeni tikilən evlərdən birində ona təzə mənzil vəd etmişdilər. Arvadı ilə üç uşağı rayonda yaşayan Xəlil bunu eşidib dedi:

– Nə yaxşı olar, mənə də orada mənzil verələr, qapı-qonşu yaşayaq!

Elə bu işarə kifayətdi. Xüsusi xahiş etməyə ehtiyac yox idi. Kamal əlli adama ağız açdı, hətta onu tanıyanlar gülüb dedilər:

– Neçə ildir özün elə yerdə yaşayırsan, bir kəlmə danışmamısan, bu Xəlildən ötəri nə yaman çalışırsan?

– Yoldaşdır, uşaqlıq yoldaşı, özü də bir başqa cür adamdır, yolunu gec tapıb, gərək kömək edək, naümid olmasın!..

Beləliklə, bir yerdə qapı-qonşu yaşamalı oldular. Şəhərdən azca aralı da olsa, dənizə baxan bir mülkdə!.. Kamal Xəlilə həm bir yoldaş, həm də bir müəllim kimi kömək edir və bundan ləzzət alırdı. Ona elə gəlirdi ki, yüzlərlə, minlərlə şagirdlərindən biri də həmin bu Xəlildir və onun yolunda çəkdiyi zəhmət müəllimlərin çoxunun öz şagirdləri üçün çəkdiyi adi zəhmətdir. "Adi" sözü burada nə qədər yersiz və soyuq görünür! İstedadlı, bacarıqlı bir uşağa, müəllim ürəyinin dərinliklərindən qopan hərarətli duyğulara, böyük ümidlərə və bu ümidlər yolundakı əməyə adi demək olarmı? Bu qeyri-adi bir işdir. İlhamla dolu bir iş! Kamal müəllim də ömrü boyu işdən ləzzət almışdı. Xəlilin yolunda çəkdiyi zəhmət ona ləzzət verirdi. Kamal müəllimi qocalmağa qoymayan, bədənini və ruhunu cavan saxlayan da bu ilhamlı əmək idi! Onun o qədər şagirdi vardı ki, indi adları gələndə cəmiyyətdə hamı "əhsən!"– deyirdi. Məgər müəllim üçün bundan böyük fərəh var!..

Lakin Çaydaşlı bir az başqa cür çıxmışdı. Yuxarıda gördünüz ki, Kamal müəllim onun da istedadı, bacarığı barədə yaxşı fikirdədir,

lakin hərdən xasiyyətində elə şeylər hiss edirdi ki, onlar bu istedad, bu bacarıqla heç cür həmahəng ola bilməzdi, musiqi dili ilə desək, dissonans təşkil edirdi. Doğrudur, indinin özündə də Kamal müəllim öz aləmində Çaydaşlı barədə "pis adamdır!" – deyib qəti hökm verməkdən çəkinir, onunla öz arasında əmələ gəlmiş gizli və lal narazılığı əsasən xasiyyət ayrılığı, zövq ayrılığı ilə izah edir...

Doğrudan da, indi uzun həyat yolu keçərək yenidən qapı-qonşu yaşadıqları illərdə Kamal müəllimə aydın oldu ki, onların xasiyyətləri tamamilə başqa-başqadır. Kamal müəllim həyat və məişətdə aza qane olmaq düsturu ilə hərəkət etdiyi halda, Çaydaşlı hər şeydə özü demişkən "geniş miqyaslar" tərəfdarı idi. Kamal müəllim bunu da ona qüsur saya bilmirdi. Əksinə, düşünürdü ki, "aza qane olmaq" prinsipi çox köhnə zamanlardan gəlir. Bəlkə də kasıblığın, cəsarətsizliyin, inamsızlığın doğurduğu bir fəlsəfədir, kasıb, yoxsul ata-analardan yadigar qalıb. İnsanların xasiyyətinə əxlaqına girib yaşayır. Xəlil isə başqa cür böyüyüb, heç zaman ehtiyac, çatmazlıq nə olduğunu bilməyib. Onun başqa cür düşünməyə ixtiyarı var.

Maraqlı burasıdır ki, bir çox şeylərdə hər iki qonşunun zövqü müstəsna dərəcədə bir-birinə uyğun gəlirdi. Əvvəldə dediyimiz kimi, hər ikisi dənizi ya fırtınalı görmək istəyirdi, ya da tamamilə sakit, dənizin orta vəziyyətini heç biri sevmirdi. Maraqlıdır, xasiyyət ayrı, anlayışlar ayrı, sevgi bir! Bəlkə ona görə belədir ki, insan təbiətən bütövlük aşiqidir. Parlaq olan hər şey insanı cəzb edir. Hətta, özü yarımçıq, naqis və qorxaq olan adamların da qəlbində bütöv, kamil olan hər şeyə soyumaz bir həvəs yaşayır, onlar da qəhrəmanlıq qarşısında sarsılır, vəcdə gəlirlər. Ancaq onlar qəhrəmanlığı başqalarından gözləyirlər. Özləri heç bir zaman az da olsa cəsarət tələb edən bir iş görməzlər, çünki daim özlərini düşünür, canlarının hayında olurlar. Buna görə də çətinliyə düşən kimi riyakarlıq edirlər, heç bir məsələdə bir zərrə də olsa risk deyilən şeyə yol vermirlər. Çaydaşlı ilə Kamal müəllimi də bir-birinə yaxınlaşdıran bu idi, hərəsinin özünə görə xasiyyəti bütöv idi...

Bu gün yenə hava xoş, dəniz sakit idi. Harada isə uzaqlarda mavi sularla buludsuz aydın göylər birləşmişdi, sanki bütün kainat mavi tül pərdəyə bürünmüşdü. Uzaq üfüqlərdən, əvvəli-axırı olmayan uzaq ənginliklərdən sehrkar bir mahnı qopub gəlirdi, hər iki evin pəncərələri taybatay açılmışdı. Hər iki qonşu pəncərə qabağında durub bu

nəhayətsiz ənginliklərə baxır, bu sehrkar mahnını dinləyirdi. Lakin bu mahnı Kamalın qulağına bir şey pıçıldayırdı. Çaydaşlının qulağına başqa şey: birinə deyirdi sıldırım qranit dağlar altında, mavi dənizlərin dibində, nə əvvəli, nə də axırı olan bu nəhayətsiz boşluqların dərinlə-rində, hər an nəfəs aldığımız bu havanın özündə xilqətin hələ gizli qalan nə qədər sirri var və insan bu sirləri açacaq! Ancaq ona görə ki, təbiətin ən ecazkar qüvvəsi, ən böyük sirri insan özüdür, onun idrakı-dır. Bütün bunlar nə qədər gözəldir. Tamaşasından doymaq olmur! Əl-bəttə, zamanın nəhayətsizliyi, aləmi – kainatın əzəməti və sonsuzluğu qarşısında insan ömrü heç nədir. Bir an qədər, anın mindən biri qədər azdır. Göz qırpımında gəlib keçir!.. Bizə qədər milyon-milyon insanlar, insan nəsilləri torpağın üstündə yaşayıb və həsrətlə onu tərk ediblər, bizim də aqibətimiz belə olacaq. Mən də öləcəyəm, sən də, o sinəsinə döyən üçüncü də! Lakin insan idrakı ölməyəcək! Bir nəsildən o birinə keçdikcə o güclənəcək, işığını artıracaq, bu mavi boşluqların dərin-lərində, dənizlərin dibində, torpağın qaynar qatlarında nəfəs aldığımız havada gizlənmiş sirləri açacaq, insanı həm xarici təbiətdəki, həm də öz içindəki dağıdıcı qüvvələrin əsarətindən bir dəfəlik azad edəcəkdir. O zaman gəl insan həyatına tamaşa elə, bizim bu torpağa bax!

Kamal müəllim təəssüf hissi ilə düşünürdü ki, bu gələcəyi yaxın-laşdırmaq üçün o çox az iş görüb, ömrün boş keçən günlərini geri qay-tarmaq qeyri-mümkündür. Dünyada elə adam varmı ki, dönüb dala baxanda "daha çox şey etmək, daha yaxşı işləmək olardı!" – deyib təəssüflənməsin?

Sakit dənizin, əbədiyyətə uzanıb gedən mavi boşluqların mənzə-rəsi Çaydaşlını da cəlb etmişdi. Lakin bu nəhayətsizlik ona ilham ver-məkdən artıq sarsıdıcı təsir edirdi. O da, özünü bu gözəllik, bu əzəmət qarşısında kiçik və gücsüz bir zərrə kimi hiss edirdi. Lakin bu hiss onda aclığa bənzər həris bir duyğu oyadırdı. Kainatın əzəmətini, nəhayətsizliyini qavramaq, dərk etmək barədə isə o heç düşünmürdü də. Bunun üçün Xəlilin başı çox balaca idi. Əslinə baxsan o, məəttəl qalırdı ki, bu böyük dünyanın əhvalatları, bu nəhayətsiz kainatın sirləri insanın balaca başına necə yerləşir. Təbiət, canlıların sinəsini təhlükələrdən qorumaq hissiyyatı ilə doldurub dünyaya gətirir. Bu hissiyyatın hökmü qətidir və biz onun varlığını hər an, hər dəqiqə saysız-hesabsız təzahürlərdə görüb müşahidə edə bilərik. Məhz bu hissiyyata görədir ki, hər kəs bu dünyada çiynini ancaq gücü çatan

yükün altına verir... Çaydaşlının sinəsində bu hissiyyat çox güclü idi (ancaq böyük həvəslər, böyük ideallar insanı məcbur edir ki, bu hissiyyatın səsinə qulaq asmasın, onu sinəsindəcə boğub "ağılsız" işlər görsün) və dönə-dönə təcrübədə sınamışdı ki, bu hissiyyat heç vaxt onu aldatmır... bir işin ardınca, bir tapşırığı yerinə yetirmək üçün yoldaşları ilə birlikdə getməyə hazırlaşdığı yerdə gözlənilmədən birdənbirə sinəsində əzici bir təlaş duymuş, hissiyyatı onu xəbərdar etmişdi ki, "getmə!" O da min bəhanə tapıb getməmişdi. Nəticədə də ya maşın qəzasından, ya xoşagəlməz bir dava-dalaşdan, yaxud da şübhə oyadan bir fikir ixtilafından kənarda qalmışdı... Hətta, daha böyük bədbəxtliklərdən qorunmuşdu. Elə qırx üçüncü ili götür... o zaman çoxlu duz yeyib üz-gözünü şişirtməsəydi, aparacaqdılar müharibəyə və kim bilir, bəlkə də indi çürümüşdü, ya da tayqıç çolaq kimi ayağını çəkib dururdu. Bəli, özünümüdafiə adlanan təbii hissiyyat Çaydaşlının ürəyinin ən güclü hisslərindən idi. Bu hissiyyat onu çox şeydən qoruyurdu, çox şeydən uzaq saxlayırdı, həyatın adi cərəyanlarından kənara çıxmağa, bir az ucalmağa qoymurdu. Buna görə də o, dənizin və dumduru fəzaların gözəlliyini seyr etdiyi zaman fikri tez-tez bu gözəlliklərdən uzaqlaşırdı. Dəniz gözündə dumanlanırdı. Məişətin gündəlik xırda əhvalatları beynində dolanmağa başlayırdı. Düşünürdü ki, "görəsən mənim bu qonşumun, mənim bu köhnə yaşıdımın niyə bəxti gətirir, hər odun içindən sağ-salamat çıxır? Bilmirəm özü də həqiqətən göründüyü kimi sadədir, yoxsa camaatı axmaq ələ salıb?!"

Məlum bir fikir Çaydaşlıya rahatlıq vermirdi, ona elə gəlirdi ki, daha doğrusu, o, əmin idi ki, Kamal müəllimin zahiri sadəliyi və nəcabəti yaxşı düşünülmüş bir pərdədir, nəyi isə hamıdan gizlədir, camaatı aldadır, rahat və yaxşı yaşamasına kömək edir. Çaydaşlı, Kamal müəllimi hər görəndə – "Yaşasın pərdələr!" deməklə bunu nəzərdə tuturdu... O, bilmirdi ki, yarıgerçək, yarıhənəng deyilən bu sözdə necə bir zəhər var və bu zəhər onun özünün ürəyini yeyir. Bilmirdi ki, bu paxıllıq adlanan ağacın zəhəridir. Yavaş-yavaş, lakin mütəmadiyən, gecə-gündüz öz ürəyinin başına dammaqdadır. Ona deyən olsaydı ki, bu ağacı özü becərib, öz günahı ucundan həyatda rast gəldiyi müvəffəqiyyətsizliklər bu ağacı qidalandırıb, o qəti etiraz edərdi. Bir dəfə yenə paxıllıq hissləri güc gəldiyi zaman Kamal müəllimin dalınca danışırdı. Belə sözləri həmişə qaşqabağını çataraq lal-dinməz qarşılayan arvadı bu dəfə özünü saxlaya bilməyib dedi:

– Ay Xəlil, niyə elə danışırsan? Kamal nəcib adamdır. Bizə də az yaxşılığı dəyməyib... Eşidən...

Xəlil arvadın sözünü ağzında kəsdi:

– Sən belə şeyləri başa düşməzsən. Nə eləyib öz xeyrinə eləyib, eləyib ki, sənin kimi avamlar desinlər filankəs yaxşı adamdır!

– Hardan bilirsən, bəlkə heç elə fikri olmayıb, ürəyinin içində deyilsən ki?! Sənin dediyindən belə çıxır ki, dünyada bir nəfər də yaxşı adam yoxdur!

Xəlil, həyatda ayağı möhkəmləndikcə, artıq heç bir zaman Kamal müəllimin köməyinə möhtac olmayacağını düşündükcə onun haqqında yalnız evdə, arvadının yanında deyil, kənarda da danışmağa başlayırdı. Bəzən bu sözlərin yersiz olduğunu da hiss edir və "bir də danışanın atasına lənət!" deyib özünə töhmət də verirdi. Lakin andına əməl edə bilmirdi. Çox qəribədir! Xəlil nəinki başqa həmyaşıdlarına, hətta özündən kiçiklərə də daha böyük müvəffəqiyyətləri, daha böyük səadəti bağışlaya bilirdi, amma Kamala yox! Sanki bir kənddə, bir qonşuluqda, bir gündə doğulduqları, bir yerdə dərsə gedib böyüdükləri üçün Kamal ondan üstün olmaqda, ondan çox-çox irəli getməkdə günahkar idi. Sanki onun uşaqlıqdakı dəcəlliklərinin, intizamsızlığının, tənbəlliyinin, sonra da dolanbac həyat yoluna düşməsinin və sairənin günahı Kamalda idi. Məhz buna görə də onun yaxşılıqlarını unudur, onlara başqa məna verməkdən çəkinmirdi, dalınca danışmaqdan, bəd niyyətini bildirməkdən özünü ala bilmirdi.

Bütün bunları hiss edən Kamal müəllim xeyli düşündükdən sonra arvadına dedi:

– Arvad, üzümüzə gələn bazar axşamı yaxşı bir plov bişir, dovğa tədarük elə, bir sözlə yaxşı bir süfrə aç, Xəlili bütün ailəsi ilə qonaq çağıracağam.

Arvadı heyrət etdi:

– Nə münasibətlə?!

– Münasibətsiz-filansız! Qonşudur, dostdur, çağırıram!

– Yaxşı dost tapmısan?! – deyib arvadı onu danladı. – Çox sadə ürəklisən, ay kişi, tez inanansan...

Kamal arvadının sözünü kəsdi:

– Bu bizim xalqın sifətidir, əzizim, çox da gözəl sifətdir...

– O vaxt gözəl olar ki, ətrafındakılar da sənin kimi düz ola, ürəyi təmiz ola, sənin sadəliyindən istifadə edib başını piyləməyələr...

– İnsanlara inanmaq lazımdır, əzizim! Birindən bir şeydə şübhələnirsənsə, ürəyə salmaqdansa, şübhə içində dığdığaya qapılaraq şirin yuxuna haram qatmaqdansa, şübhələrini açıq-açığına o adama bildirməyin yaxşıdır.

– Bildirərsən – olar səninlə düşmən... Mən demirəm ki, hamıdan şübhələn, deyirəm bir az ayıq ol, gör kim doğrudan dostdur, kim dost cildinə girib, içəridə isə sənin paxıllığını çəkir, az qalır çatlasın. Bizim bu qonşu kimi!..

Arvad sağ əlini geniş açıb Xəlilgilin evinə tərəf tuşladı və ərinin bərk etirazını gözləyərək əlini havada saxlayıb ona baxdı. Lakin Kamal müəllim nə acıqlandı, nə etiraz etdi, arvadının buruq, xurmayı tellərini oxşadı:

– Rica edirəm, bu dəfə sözümü yerə salma...

Bazar günü gəlib çatdı... Bakıda, dumanlı-küləkli və yağışlı bazar günlərindən biri idi. Belə gündə oturduğun yerdən durmaq istəmirsən, xüsusən ki, gözəl, dadlı Azərbaycan xörəkləri ilə bəzənmiş təmiz və halal süfrə başında! Kamal müəllimin arvadı məhz süfrə açmşdı – təmiz və səliqəli. Hər şey yerində, yarpaq dolmasının, zəfəranlı cücəplovun, zoğlu ispanaq və başqa göy-göyərti dovğasının ətrindən, tamından doymaq olmurdu...

Xəlil Çaydaşlı bütün ailəsi ilə birlikdə bu süfrənin başında oturmuşdu. Kamal ondan başqa bir neçə müəllim yoldaşını da çağırmışdı, öz uşaqları da burada idi. Evin xanımı tez-tez mətbəxə getsə də, süfrə başında da otururdu. Hətta xörək yeyir, qonaqlarla şirin-şirin söhbət də edirdi. Bu zaman onun göstərişi ilə böyük qızı və oğlu lazım olan şeyləri aparıb-gətirir, qonaqlara xidmət edirdilər. Bu, Xəlil Çaydaşlının nəzərindən qaçmadı.

– Səlimə bacı, – dedi, – maşallah nə yaxşı təşkil etmisiniz, mənə ləzzət verir, çox evlərdə isə yazıq ev sahibəsi mətbəxdə batıb qalır, bir dəfə də olsa süfrə başında görünmür.

Xəlilin arvadı:

– Mənə atır ey, Səlimə bacı! – dedi və ərinə döndü. – Axı, hamı bunu bacarmaz. Səlimə bacının səliqəsi başqadır.

– Mədəniyyəti də! – deyib kimsə əlavə etdi. – Ev sahibəsi süfrə başında olanda yemək də adama ləzzət verir, cana sinir...

Bu cür şirin söhbətlərlə yeyib-içdilər, heç bir acılığa, tikanlı sözlərə, giley-güzara yol vermədən ömrün bir neçə saatını xoş keçirdilər.

Doğrudur, ara-sıra Çaydaşlı gözlərini qıyıb qibtə ilə evin sadə səliqəsinə, Kamal müəllimin gözəl süfrəsinə, xoş üzünə baxırdı. Bu zaman dodaqları titrəyən kimi olurdu. Kamal müəllimə elə gəlirdi ki, indicə bu dodaqlar açılacaq və "yaşasın pərdələr!" deyəcəkdir. Lakin dodaqlara hardansa xəfif bir kölgə qonub dərhal çəkilirdi. O, yenidən şirin söhbətlərə qoşulurdu... Hətta axşamüstü gözəl Azərbaycan buketindən dəmlənmiş samovar çayı ortalığa gəldikdə o özünü saxlaya bilmədi.

– Sağ ol yaşıdım, bu gün ömrümü xeyli uzatdın! – dedi və Kamal müəllimə baxdı. İki yoldaşın baxışları çarpazlaşdı. Xəlil otaqdakı şad vəziyyətə yabançı olan soyuq təbəssümlə gülümsəyib qeyri-ixtiyari olaraq əlavə etdi:

– Yaşasın pərdələr!

Kamal müəllim qədəhi götürüb ayağa durdu:

– Yox dostum! – dedi, – atalar məsəli var – örtülü bazar, dostluğu pozar. İnsanlar arasında etibar, hörmət, ismət pərdələri yaşamalıdır. Qalan pərdələr yox! Bu süfrəni görürsənmi, bu yemək üçün açılmayıb, insaniyyət üçün açılıb! Bizim atalar Allahdan, Qurandan sonra buna buna and içiblər. Bütün xalqlarda duz-çörək müqəddəsdir. Bir adamla ki, duz-çörək kəsdin, gərək onunla açıq ürəklə, açıq alınla danışasan... Axı, biz elə bir cəmiyyət qururuq ki, orada nəinki qohumların, yaxınların, hətta heç bir-birini görüb tanımayanların da damarlarında qardaşlıq qanı dolanmalıdır. Övladları qranit parçası kimi birləşə bilməyən xalq bədbəxtdir. Paxıllıq, gözügötürməməzlik qranit daşları ovub parçalayan zəhərli turşular kimi insan ürəyini yeyir. Yadında saxla, dostum!

Xəlil başını aşağı salmışdı. Boynundan, alnından puçur-puçur tər süzülürdü... Başını yuxarı qaldırıb Kamal müəllimə baxanda isə hansı bir hissin təsirindənsə özünü saxlaya bilmədi, durub onun boynunu qucaqladı və bərk-bərk üzündən öpdü, titrək səslə:

– Məni bağışla! – dedi, – və başını yana çevirdi ki, gözlərində girdələnən mirvari dənələrini görən olmasın...

## METAMORFOZA

1

Atalar min cür yaxşı-yaxşı məsəllər qoyub gediblər. Qanan adamların nəzərində onların qiyməti yoxdur. Evlər, saraylar uçulur, kitablar saralıb gedir, onlar isə ağızdan-ağıza gəzib yaşayır, çoxları üçün həyat məktəbi olurlar.

Məsəllər cürbəcürdür. Eləsi var ki, bircə mənası olur. Hər sözü istədiyi şəkildə yazmağı bacaran adamlar belə onlara ikinci məna verə bilmirlər. Eləsi də var ki, kim necə istəsə elə də yoza bilir. Necə ki zəmanəmizdə bəzi siyasət adamları "humanizm", "ədalət", "istiqlaliyyət" kimi sözlərə bəşəriyyəti təmsil edən ali kürsülərdə tamamilə əks məna verir və əsla utanıb qızarmırlar!

Mum kimi hərənin əlində bir şəklə düşən məsəllərdən birində deyilir ki, igidin adı çıxınca canı çıxsa yaxşıdır. Bu məsəl ona görə yadımıza düşdü ki, hekayəmizin qəhrəmanı onu çox sevir, çox işlədir və ona cürbəcür mənalar verirdi, – harada, hansı şəkildə daha faydalı bilsə o şəkildə də şərh edirdi. Lakin əsla vecinə almırdı ki, bir sözü o biri ilə düz gəlmir, bu gün dediyi, dünən dediyinin tərsinə olur. Əslinə baxanda bunun fərqinə də varmırdı. Çünki dünənki sözünü bu gün, bugünkünü sabah unudurdu. Başqa bir məsələdə nahaq deyilməyib ki, yalançının yaddaşı olmaz! Müxtəsər ki, qəhrəmanımız bu barədə düşünmür, bir tikə də narahat olmurdu. Çünki bir dəfə də olsa ona mirad tutan olmamış, deyən olmamışdır ki, ay balam, axı sən filan vaxt bu cür məsələsi filan cür şərh etmişdin. Bunu deyən olmadığı üçün də o, baş alıb gedirdi. Bununla belə bir sual, bir şübhə onu incidirdi, ona rahatlıq vermirdi. O da budur ki, bilmirdi həmin məsəl məsxərə üçün, istehza ilə deyilib, yoxsa ciddi. Ha düşünür, ha fikirləşir, axırını bir yerə çıxara bilmirdi. Çıxara bilmədiyi üçün də o məsəli bir yerdə ciddi mənada, o biri yerdə istehza ilə işlədirdi. Yəqin ki, siz bu qəhrəmanın adını, familiyasını, atasının adını bilmək istəyəcəksiniz. Bilmək istəyəcəksiniz ki, necə adamdır? Boy-buxunu necədir, üzü gülərdir, yoxsa acıqlı, hikkəlidir, yoxsa başı aşağıdır. Sözün doğrusu ki, bunu heç kəs bilmir. Onu lap çoxdan tanıyanlar da bilmir ki, üzü nə rəngdədir – qaradır, ya ağ, gözləri iridir, ya balaca! Bu barədə heç kəs qəti söz deyə bilməz. Çünki onun üz-gözü o qədər qeyri-müəyyən-

dir, o qədər tez dəyişir ki, necəliyini bilmək olmur. Bir dəqiqənin ərzində o ağarır, qaralır, bozarır, saralır, nə rəngə desəniz düşür. Bircə anda gözləri açılıb piyalə kimi iriləşir və dərhal yığışıb qıyıq gözü kimi kiçilir. Hətta kişinin boyu da qeyri-müəyyəndir. O bəzən iki yüz adamın içindən seçilir, iriləşir, bəzən də elə xırdalaşır, balacalaşır ki, on adamın içində itir, görünməz olur... Bu kişinin adı Kəlbi, familiyası Kəlbiyevdir. Özü də Kəlbi oğludur.

Bəs Kəlbinin xasiyyəti necədir, təbiəti nə təhərdir? Nəcibdir, ya nanəcib? Xeyirxahdır, ya bədxah? Çalışqandır, ya tənbəl? İşgüzardır, ya xəyalpərvər? Bu barədə də heç kəs qəti söz deyə bilməz. Ona görə yox ki, təbiəti də siması kimi, boy-buxunu kimi, gözləri kimi qeyri-müəyyəndir, dəyişkəndir. Xeyr! Ona görə ki, Kəlbi qapalı sandıq kimidir. Hələ onun açarı tapılmayıb. Açılmayıb ki, görsünlər içində nə var.

Lakin Kəlbinin bir keyfiyyəti var ki, ondan söz düşəndə, hamı bircə kəlmə ilə, bir ağızdan və qəti şəkildə onu təsdiq edir: təvazökar! Bunu inkar edən yoxdur, buna kimsə şübhə etmir və bircə bu kəlmə ilə onun bütün varlığını ifadə edərək susurlar. O özü də bu tərifdən razı qalır, razı qalır ki, belə yüksək bir sifəti ona şamil edirlər. Razı qalır ki, bu bir kəlmə söz gələcək üçün, onun irəli sıçraması üçün yaxşı bir körpü, bir pilləkən ola bilər... razı qalır və gözləyir...

Doğrudur, bəzən gözləməkdən təngə gəlir, yorulurdu və belə hallarda "təvazökar" sözü əsəblərinə toxunur, onu acıqlandırırdı. Bu zaman istehza ilə deyirdi: "Kişinin adı çıxınca, canı çıxsa yaxşıdır! Yəni yaxşı yapışdırıblar təvazökar sözünü mənə. Başlarına dəysin!"

Əlbəttə, bu sözləri heç kəs eşitmirdi. Kəlbiyev onları öz-özünə, içərisində deyirdi. Üzdə isə gülümsəyir, gözünü yumur, qaşqabağını sallayır, simasını elə gizlədirdi ki, heç kəs bir şey görüb duya bilmirdi. Bir sözlə Kəlbiyevin ürəyinin içi yanırdı. O, hərarətlə yanırdı ki, onun barəsində xalq deyib: "İçim özümü yandırır, çölüm özgəni". Kəlbiyevin içi yanırdı, ona görə ki, bircə kəlmə "təvazökar" sözü ilə onu buxovlayıb yerində oturtmuşdular. Nə vəzifə bölgüsündə, nə də nişan paylananda yada salırdılar. Çölü də özgələrini yandırırdı ona görə ki, deyirdilər: "Nə xoşbəxt adamdır, dünyada bilmir şöhrət nədir, mənsəb nədir..."

Bəli, "İgidin adı çıxınca canı çıxsa yaxşıdır" məsəlini Kəlbiyev buna görə tez-tez deməli olurdu. Hər deyəndən sonra da bu qərara gəlirdi ki, çalışıb özünə başqa bir sifət qazansın. Məsələn "təvazökar"

yerinə ona – zirək desinlər. Yaxud “bacarıqlı”, “işgüzar” sözlərini də adına əlavə etsinlər: “Kəlbiyev işgüzardır! Kəlbiyev bacarıqlıdır!..”

İndi deyin görək, siz bu məsələ necə baxırsınız? Həmin o məsəli necə başa düşürsünüz və ondan nə nəticə çıxarırsınız? Bəlkə belə başa düşürsünüz ki, şöhrət ağır yükdür və şöhrətpərəstlik yaxşı şey deyil, yəni pis azardır. Kim ki, bu azara tutuldu, həm özünün rahatlığı qaçır, həm də başqalarına rahatlıq vermir. Yata bilmir, üzü gülmür, eyni açılmır, fikirli və qaşqabaqlı olur. Adamlara şübhə ilə baxır, həmin məsələdən özünüz üçün əxlaqi bir nəticə çıxarırsınız: nəyimə lazımdır şöhrət, başımı aşağı salıb bacardığım qədər işimi görəcəyəm, vəssalam.

Hekayəmizin qəhrəmanı da bu vaxta qədər özünü məhz bu cür qələmə vermişdi: yəni şöhrətin, şöhrətpərəstliyin düşməni kimi tanıtmışdı. İndi isə belə düşünürdü ki, məsəl kökündən düz deyil, bu məsəli düzəldənin özünün igidliyi çatmayıb, ad çıxara bilməyib, buna görə də deyib “İgidin adı çıxınca canı çıxsa yaxşıdır”, yəni o pişiyin günündə olub ki, onun əli ətə çatmadığı üçün deyir murdardır.

Belə düşündüyü gündən Kəlbiyev başqa cür hərəkət etməyə başladı. Əvvəllər başı aşağı dolanıb özünü sakit, təvazökar apardığı halda, indi gözə girməyə çalışırdı. Tez-tez söz alıb danışır, özünü göstərirdi. Bütün danışıqlarının da müqəddiməsi təqribən belə olurdu: Yoldaşlar! Mənim nə fəxri adım var, nə vəzifəm, nə də döşümü qırmızı nişanlar bəzəyir. Dünya mənə bir şey verməyib, əlimdən də bir şey ala bilməyəcək. Ona görə də nə düşünürəm, onu da deyəcəyəm, həqiqəti deyəcəyəm və deyirdi. Lakin düşündüyünü yox, həqiqəti yox, adamların bir para dərinlərdə yatmış dumanlı hisslərini oxşayan, ya da yalançı tələbkarlıqdan doğan sözlər deyirdi, hərarətlə, özüundən çıxaraq deyirdi. Onun bu cür dəyişməsindən, gözlənilmədən belə fəaliyyətə başlamasından heyrətə gəlmiş iş yoldaşları əl çalır və üzünə də, dalınca da onu tərifləyirdilər: “Afərin Kəlbiyev! Yaman fəallaşıb ha! Özü də şöhrətpərəstlərə necə nifrət edir! Heç şeydə gözü yoxdur!” Bu sözlər getdikcə yayılırdı və bu vaxta qədər təvazökar kimi tanınmış Kəlbiyev bundan vəcdə gələrək daha da fəallaşırdı. Adamlarda belə bir fikir oyadırdı ki, sadəcə olaraq təvazökar deyil, həm də mübarizdir, mənsəbpərəstlərlə ölüm-dirim mübarizəsinə girməyə hazırdı. Bu yolda canfəşanlıq etdikcə görürdü ki, aha, niyyətinə çatır, onu tərifləyənlərin sayı artır. Daha da ruhlanırdı. Lakin bircə onu hiss etmirdi ki, içərisi

çürüməyə başlayıb. Bilmirdi ki, hər bir adamın mənəvi pozğunluğu, xasiyyətinin dəyişməsi şöhrətpərəstlik duyğusundan, layiq olmadığı təriflərdən başlayır. Ağlına gəlmirdi ki, hər cür saxtakarlara, cansız bürokratlara, qabiliyyətsiz stolbazlara və ürəksiz formalistlərə qarşı mübarizənin alovlu əvvəl-axır məddahları da yandıracaq. Vəzifə sahiblərini üzük qaşı kimi dövrəyə alan məddahların, yaltaqların və onların yağlı dilinə uyub borcunu unudanların axırı yoxdur. Kəlbiyev onu da unutmuşdu ki, insanı axmaqlaşdıran, böyüklük, allahlıq iddiasına salan şeylərdən birincisi şöhrət həvəsidir, yersiz təriflərə uymaqdır. Ağıllı-başlı bir adamı tərifləyə-tərifləyə axmağa çevirənlər, axmaqları tərifləyə-tərifləyə havalandırıb, yerə-göyə sığmağa qoymayanları və buna baxaraq ləzzət alan kələkbazları bu dünya az görməyib. Bəli, bu tərif zəhərli şərbətdir. Adamı elə yatırdır ki, zurna səsinə də ayıltmaq olmur. Bir az da o yana gedib demək olar ki, tərif adamın içini yeyib çürüdən canlı mikrobdur. Buna görə də məşhur bir filosofun məşhur bir kəlamını bir az dəyişib "Məddahların bağırsağı ilə şöhrətpərəstlikləri boğmaq lazımdır" demək çox yerində olar. Əlbəttə, bu cür sözlər Kəlbiyevin xoşuna gəlmirdi, qıyıq kimi ürəyinə batırdı. Ancaq özünü o yerə qoymurdu. Əvvəlki kimi təvazökar olduğunu göstərməyə də çalışırdı. Bununla belə hər hansı bir tərifin qeyri-ixtiyari olaraq canına yayıldığı, onu şövqləndirdiyi hallar da olurdu. Üz-gözü işıqlanır, geniş açılmış minnətdarlıq dolu gözlərlə ani olaraq tərifləyəni süzüb gülümsəyir və qeyri-iradi olaraq ağzından qaçırırdı: "Biz beləyik də!"

Nə təhər oldusa bu gün yenə işçilərdən biri Kəlbiyevi təriflədi, dedi ki, həm mübarizdir, həm də ipək kimi yumşaq adamdır. Heç kəsin pisliyini istəməz, təvazökardır. Haqq yolunda canından keçəndir... Bu sözləri eşidən kimi özü də istəmədən rəngi açıldı. Amma etiraz etməyi də unutmadı: "Mən ölüm saxla, bilirsən ki, belə şeylərdən xoşum gəlmir". İdarədə məzəli xasiyyəti ilə məşhur olan köhnə mühəndis Hökümə xala ona çəpəki nəzər salıb dedi:

– Yanasan ay, Kəlbi! Camaatın başına yaxşı yaylıq bağlayırsan... Sözdə deyirsən tərifdən xoşum gəlmir, amma ürəkdə tərif üçün ölürsən. Ondan görürəm ki, tərif eşidəndə qalaylanmış cam kimi açılırsan! Tərifin əleyhinə çıxmağın da ona görədir ki, səni tərifləsinlər.

Əlbəttə, Kəlbiyev pərt olmadı, noxudu gülərək Hökümə xalaya belə cavab verdi:

– Ay Hökümə xala, mən nəyəm ki, məni təürifləsinlər də? Vəzifəm yox, ordenim yox, adım-sanım yox. Sənin kimi sadəcə bir işçiyəm. O ki qaldı üzümün açılmağına, onu düz deyirsən, dana bilmərəm, açılır, necə deyərlər, burda sənin qabağında boynum qıldan nazikdir. Niyə açılır? Özüm də bilmirəm.

Bu səmimi etiraf hamıya, hətta Hökümə xalaya da xoş təsir bağışladı. Mehriban nəzərlə Kəlbiyevi süzüb üzünə gülümsədilər. O isə bir az da ruhlandı, həvəslənib dedi:

– Görünür tərif şirin şeydir, şərbət kimidir! Kimə versən çəkəcək başına!

– Hə, hə, yaxşı tutmuşam səni! – deyərək Hökümə xala zarafata salıb onu hədələdi, – bəs bu günəcən deyirdin ki, xoşun gəlmir, nə oldu?!

– Ay Hökümə bacı, sən də hədələməyə adam tapdın. Hünərin var get odur ey, onu (Kəlbiyev əlini qaldırıb başının üstündən o tərəfə, müdirin otağına işarə etdi) hədələ ki, neçə ildir tərif dəryasında üzür. O tərifləyir, bu tərifləyir.

– Bıy, bıy bunda bir sözə bax! – Hökümə xala sakit olmadı – a balam, tərifləyənlərdən biri elə sən deyildin?! Nə oldu belə üzün döndü?!

– Mənciyəz qələt eləmişəm! Niyə sənin də gözün məni görür? Hey qoltuğuna verib kişinin evini yıxanları görmür?! – deyə Kəlbiyev kimə isə işarə etdi. – Bilirsən ki, nə qədər iş başında deyildi, adamlığı vardı. Elə ki keçdi stolun dalına, onu da itirdi. Niyə? Çünki bu yana döndü – tərif, o yana döndü – tərif... Axırı da belə...

– Yaxşı, yaxşı, ay Kəlbi! Bura iclas deyil. İclasda kişini bir boçka suya salıb çıxartdın, kifayətdir, gələn iclasa qədər qoy bir az qurusun. Orada təzədən salarsan suya, o ki var çimdirərsən...

– Onu görməyəcəksiniz! – deyib Kəlbiyev etiraz etdi, – tənqid eləmək elə mənə qalıb?!

– İnanan kor olsun! Sən olasan, iclas ola, müdirdən deməyəsən?! Mən ki, inanmıram... Bir də, ay Kəlbi, son vaxtlar sənin bu adətinə elə öyrənmişik ki, tərgitsən darıxarıq, iclasda otura bilmərik... Çoxları məhz sənə görə axıra qədər oturur ki, görsün – müdirimiz barədə təzə nə deyəcəksən. Öz aramızdır, kişini yaman gözaltı eləmisən ha!

– Gözaltı eləməyim neyləyim?! Bu nədir? Soruşuram sizdən, bu nədir?! – Kəlbiyev əlini üç-dörd dəfə su kranına çırpdı. Adamlar hamısı bir-birinə baxıb başlarını tərpədərək onun sözünü təsdiq etdilər.

Haqlı olduğunu bildirdilər. Bircə müdirə yaxın və tərəfdar hesab olunan mühasib Təhməz nə başını tərpətdi, nə dilini.

Əlini krana vurmaqla Kəbiyev nə dedi, adamlar nəyi təsdiq etdilər: Təhməz nə ilə razılaşmadı? Əziz oxucu bu barədə aydın təsəvvür yaratmaq üçün bir balaca haşiyə çıxmağa ehtiyac var.

Kəlbiyev işləyən idarə o zaman Bakının elə bir guşəsində yerləşirdi ki, yay aylarında, xüsusən iyulun və avqustun şıdırğı istilərində o rayondakı evlərin suyu kəsilirdi. O cümlədən Kəlbiyevgilin idarəsi də susuz qalırdı. Günün istisində o iş, bu iş dalınca ora-bura qaçan işçilərdən biri – qan-tər içində geri qayıtdıqda əlini yumağa, üzünə çırpmağa bir stəkan su tapsa, elə bil dünyanı ona vermiş olurdular. Su isə tapılmırdı. Tərli adam açıq kranı o tərəfə bururdu, bu tərəfə bururdu, su gəlmirdi. Qupquru quruyaraq günahkar halda susub duran krandan səs çıxmadıqda deyinib geri çəkilirdi. Belə vaxtlarda ancaq süpürgəçi Fatmada su tapmaq olardı. O isə hamıya vermirdi. Yox, pisliyindən şümür kimi Fəratın qabağını kəsməmişdi. Səhər erkən doldurduğu bircə vedrə suyu dərman kimi qorumağa məcbur idi. Bu suyu o ancaq içməyə və çaya sərf edirdi. Bir dəfə belə bir hadisə Kəlbiyevin öz başına gəldi. Avqust günəşi Bakının üstündə, göyün tən ortasında duraraq şüalarını sel kimi şəhərə səpələyir, adamların başını deşir, göydən yerə od-alov yağdırırdı. Belə bir gündə Kəlbiyev əldən düşmüş halda, qan-tər içində qayıtdı, kranı burdu, su gəlmədi!

– Fatma xala, qadan alım, o vedrədən bircə stəkan su, üzümə çırpım, tərim soyusun!..

Fatma xala mühəndisin islanmış köynəyinə, puçur-puçur tər axan üzünə, alnına baxanda yazığı gəldi. Ürəyi yumşaldı. Onu mətbəxə aparıb stolun altındakı vedrəni bəri çəkdi, əlinə iki stəkan su tökdü.

– Oxqay! – Sağ ol, Fatma xala. Bir gün gələr, bu yaxşılığın xəcalətindən çıxaram. Sənin bu vedrəni Zəmzəm quyusuna dəyişmərəm ki, Məhəmməd peyğəmbər biz müsəlmanlara vəd eləyib...

– Zəmzəm quyusu odur, bax, o həyətdə! – deyib Fatma xala köhnədən qalma su quyusunu açıq pəncərədən Kəlbiyevə göstərdi. – Yoxlamışam, elə suyu var, şollardan da yaxşı. Bir az işlənsə heç misli olmaz. Şirin, buz kimi!

– Bəs niyə gətirmirsən, ay Fatma xala?! – deyib Kəlbiyev soruşdu və dərhal Fatma xalanın üzündə yaranmış qəzəbli ifadədən vahiməyə düşdü.

– Sağ ol! – deyib arvad istehza ilə ona baxdı, – məndə o ürək hanı əlli metr quyudan su çəkib altıncı mərtəbəyə daşıyım? Motor qoyun, çən qoyun, vursun yuxarı, işlədin!..

– Bu müdir ki, bizdə var, baş tutan iş deyil! – deyib Kəlbiyev fikrə getdi, sonra əlavə etdi: – hər halda mən bu barədə məsələ qaldıracağam!

Kəlbiyev avqustun qora bişirən çağında trubaların quruduğu və su ceyran dağına çıxdığı zaman əlini krana vurmaqla idarə müdiri Əhmədin bacarıqsızlığını, iclasdan iclasa onu tənqid atəşinə tutmaqda haqlı olduğunu demək istəyirdi. Kəlbiyev hiss etdi ki, hamı onunla razıdır, bircə Təhməzdən başqa.

– Deyəsən ürəyindən deyil, döşünə düşmür, hə?! – Kəlbiyev əlini Təhməzə tərəf tuşladı. – Əlbəttə, döşünə düşməz! Axı, sən də mənim siyahımdasan, şöhrətpərəst müdirlərdən əvvəl cəzalanmalı olan yaltaqların siyahısında! Yadında saxla!

– Bura bax, ey, ay Kəlbioğlu, məni qorxutma! – Təhməz onun üstünə xoruzlandı.

Kəlbiyev istehza dolu iti baxışlarla Təhməzin vücudunu aşağıdan-yuxarı süzdü. İndi bu vücud ona daha da eybəcər göründü: kökbədən, balacaboy, kobud, irisifət, əyri, iriburun! Kəlbiyev ona təəccüb etdi ki, bu eybəcər vücud hansı sehrlə bir baxışdaca bəzi adamları təsiri altına alır, onları özünə tabe edir?! Doğrudan da Təhməzin, xüsusən iri qara gözləri, davamlı, iti baxışları çox təsirli idi. Bu gözlər kimə tuşlandı, qeyri-ixtiyari olaraq o adamın canından bir gizilti keçirdi. Nəinki qadınlar, hətta kişilər də bu baxışların altında özlərini pis hiss edib gözlərini yana çəkməyə məcbur olurdular. Əlbəttə, Kəlbiyev Təhməzə baxanda bu iri gözləri yox, ancaq onu eybəcər edən iri burunu, kobud sifəti və sair qüsurları görürdü. Xüsusən onun eybəcər boynunu. Doğrudan da sanki Təhməzin boynu yox idi, sanki kürə altında sıxıb boynun bədəninin içinə keçirmişdilər. Bu təbii qüsuru bir az da artıran o idi ki, Təhməz hirsləndiyi zaman ağzını açıb danışmamış, başını yuxarı dartıb çiyinlərini çəkər, sonra sözünü deyərdi, buna adət etmişdi. İndi də Kəlbiyevin istehza dolu baxışlarına cavab olaraq, başını yuxarı dartıb çiyinlərini çəkdi.

– Bəli, Kəlbi yoldaş, məni qoxutma, mən sən deyənlərdən deyiləm. Sənin kimilərini çox görmüşəm! Ağzını boşuna qoyub hər şeyi hazır istəməyə nə var ki. O olaydı, bu olaydı, krandan su gələydi, nə bilim

quyunun üstünə motor qoyulaydı. Nə bilim daha nə... Boş-boş arzulamağa nə var, deməyə nə var, nənəm də bacarar, amma eləmək çətindir. Söz deməklə krandan su gəlmir. Bir də ki, susuz qalan bir biz deyilik ha...

Kəlbiyev dərhal Təhməzin zəif damarından yapışdı:

– Yaxşı, bizim hörmətli Əhməd Rəhimoviç, – müdirin adını və atasının adını qəsdən ibarə ilə söylədi. Hamı bilirdi ki, Təhməz müdirə həmişə bu cür müraciət edir, – sənin hörmətli rəhbərin krandan su gətirə bilmir, gətirməsin, burda onun hökmü işləmir. Bəs bu xalanın quyusuna nə deyirsən, odur bax, o həyətdəkini deyirəm ey, onun üstünə bir motor qoymaq da çətindir?!

Nahar fasiləsində baş verən bu söhbət zamanı arıq, uzunboylu bir kişi kənarda oturub gözlərini danışanların ağzına dikərək qulaq asır, bir söz demirdi. Amma tez-tez dikəlib o yan-bu yana boylanır, yenə otururdu. Bu, idarənin təlimatçısı Kərəm yoldaş idi. Onun əlindən nə desən gələrdi – xarratlıq, saatsazlıq, texniklik, çilingərlik, xüsusən nasoslarla, su kranları ilə, motorlarla qurdalanmağı sevərdi. Görünür buna görədir ki, “motor” sözü Kəlbiyevin ağzından çıxan kimi Kərəm dedi:

– Təhməz müəllim, bax, buna etiraz eləmək olmaz. Bir motor və nasos tapmağa nə var, bir çəllək, bir də əlli-altmış metr turba nə çətin şeydir?! Siz tapın, qurub düzəltmək məndən. Ömürlük idarəni su ilə təmin edərik.

Təhməz yenə başını yuxarı dartıb çiyinlərini çəkdi.

– Smetamızda yoxdur... Pul vermirlər... Başa düşürsən?!! Vermirlər! Hörmətli Əhməd Rəhimoviç neyləsin?!

– Necə neyləsin, ada?! – deyib Kəlbiyev lap ucadan dilləndi. – Canına azar eləsin! Getsin məsələni yuxarılarda qoysun, keçirtsin! Müdirlə sən mühasib bu idarədə vermisiniz baş-başa, bütün işləri batırmısınız. O nə deyir sən deyirsən – doğrudur, sən nə deyirsən – o deyir – doğrudur. Düzələn işi də düzəltmirsiniz. Bir putyovka tapıb bu yazıq arvadı, – Kəlbiyev əlini Fatma xalaya tərəf tuşladı, – Mərdəkana göndərmək olmazdı? Onu da qoymurlar? Xəstə arvaddır, gedib mədə-bağırsaq sanatoriyasında...

– Smetada putyovka pulu nəzərə alınmır, bunun üçün yerli komitə var! – deyib Təhməz onun sözünü kəsdi.

– Yaxşı, ay kişi, balaca daxmasının döşəməsinə nə deyirsən, onu ki, təmir etmək olardı?! Rütubət az qalıb yazıq arvadı şikəst eləsin. Hələ siçanları...

Bu dəfə də Fatma xala özü Kəlbiyevin sözünü yarımçıq qoydu:

– Bura bax, ay Kəlbi yoldaş, əvvəla mən tələb edirəm, o yazıq sözünü ki, iki dəfə mənim barəmdə dilinə gətirdin, geri götürəsən. Mən yazıq-zad deyiləm. Özümü heç kəsdən əskik bilmirəm! İkinci də, eləsələr də sağ olsunlar, eləməsələr də... hələ ki, ayaqüstə dura bilirəm.

– Məsələ səndə deyil, Fatma xala, məsələ ondadır ki, axı, bu işlər niyə görülmür, adama niyə qayğısızlıq göstərirlər?! Sabah hamımızın başına gələ bilər. Hamımız naxoşlaya bilərik. Deməli, baxan olmayacaq?!

Təhməz "smetada yoxdur!" – deyib saatına baxdı və fasilənin qurtardığını bildirən nümayişkaranə hərəkətlə otağına çəkildi.

Kəlbiyev istehza dolu nəzərlə onun dalınca baxıb başını buladı:

– Adam deyil ha, smetadır!..

2

Ağıllı bir adam deyib ki, təsadüflər, olmasaydı tarix cansıxıcı olardı. Lakin o deməyib ki, bütün təsadüflər xoşagələn və ürəkaçıcı olur. Kəlbiyevlə məlum mübahisədən bir neçə ay sonra idarədə qəribə bir təsadüf baş verdi. Heç kəsin gözləmədiyi bir təsadüf.

Xoşa gəlməzliyinə baxmayaraq tezliklə hamı bu təsadüflə barışdı. Belə düşündülər ki, nə edəsən, dünya başdan-binadan bu cür qurulub. Gəərk hər gün ya burada, ya orada əcaib bir əhvalat baş versin. İnsanlar ağıllarına da gəlməyən bir hadisənin şahidi olsunlar... Təzə bir söz eşitsinlər, qəribə bir şey görsünlər... Nahaq deməyiblər ki, qulaq hər gün qəribə söz eşitməsə, kar olar, göz qəribə şey görməsə, kor olar... Elə bir adam təsəvvür etmək olmaz ki, həyatın və taleyin bu qəribə təsadüflərinə rast gəlməsin. Buna görədir ki, dünyada elə bir yer tapmaq olmaz ki, orada hər dəqiqə bir adam ağlasığmaz əcaib işlərdən şikayətlənməsin, gördüklərinə və eşitdiklərinə təəccüb etməsin, heyrət içində donub qalmasın. Doğrudur, bu heyrət və təəccüb şərti şeydir, filosoflar demişkən, onu mütləq həqiqət hesab etmək olmaz. Çünki bir adama qeyri-təbii və ağılsız görünən bu hadisələr, o biri adama tamamilə qanuni və təbii görünür. Görürsən ki, biri bu hadisədən kədərləndi, ümidsizliyə qapıldı. O biri isə sevinir, xoş ümidlərə düşür. Nə etməli, insanlar bütün hadisələri bir cür qəbul etməyəcəklər. Bunlar hamısı təbii və adi şeylərdir.

Lakin qeyri-adi olan odur ki, baş vermiş hadisə o adama qəribə görünə, o adamı heyrətə sala ki, onun ürəyindəndir, çoxdankı arzusudur, xeyrinədir. Hekayəmizin qəhrəmanı Kəlbiyev belə vəziyyətdə idi. Doğrudan da yatsa, yuxusuna girməyən bir hadisə baş vermişdi. Birdən-birə gözlənilmədən Təhməz demişkən, Əhməd Rəhimoviç, ərizə verib işdən azad olunmağı xahiş etmişdi. Bəhanəsi də bu idi ki, elmi işə keçir. Buna da etiraz etmək olmazdı. Çünki altı ay əvvəl mötəbər bir elmi idarədə dissertasiya müdafiə edib elmlər namizədi adını almışdı.

Lakin Kəlbiyevi heyrətə salan Əhmədin alim olması və işdən getməsi deyildi. Alimliyi barədə, əlbəttə, Kəlbiyev o qədər də yaxşı düşünmürdü və ürəyinin dərinlərində Əhmədə qarşı nifrəti on qat artırmışdı. Ancaq müdirlikdən getməsi ürəyindən idi. Daha yaxşı olardı ki, onu bədnam edib qovaydılar. Lakin elə bu cür çıxarılması da pis deyil. Kəlbiyev bunu çoxdan gözləyirdi, belə hesab edirdi ki, nəhayət, ədalət qələbə çaldı. Onsuz da bu qələbə gecikmişdi. Kəlbiyev mübarizəyə başladığı gündən çox keçmişdi. İllər uzunu yerli-yersiz tribunalardan müdiri məhz bu məqsədlə tənqid etmişdi, arası kəsilmədən atəşə tutmuşdu ki, vəzifəsindən azad etdirsin. Bəlkə də Kəlbiyev qədim Roma senatında nə barədə danışıq gedir-getsin çıxışını mütləq “Karfagen dağılmalıdır!” – sözləri ilə qurtaran senator barədə eşitməmişdi. Bəlkə də tarixdə belə bir adamın olduğunu bilmirdi. Lakin eynilə onun kimi hərəkət edərək, nə iclas olur olsun, nə barədə danışıq gedir getsin, mütləq söz alacaq və axırda müdiri tənqid edəcəkdi. Məqsədi də bu idi ki, onu yerindən tərpədib kənara itələsin. Kəlbiyevə desəydilər ki, başqa niyyəti var, müdirin yerini tutmaq istəyir, qəzəblənərdi, özünü elə göstərərdi ki, guya müdir olmaq heç yatsa yuxusuna da girmir. Adamlar da buna inanırdılar. Ən çox şübhə eləyənləri isə deyirdi ki, guya bu fikir dumanlı bir duyğu kimi onun özündən də xəbərsiz ürəyində yaşayır. Guya müdiri tənqid atəşinə turarkən Kəlbiyev heç bir zaman onun yerinə keçmək qəsdində olmayıb. Hər halda zahirdə belə görünürdü. Bircə Hökümə xala buna inanmırdı. O dediyini deyib dururdu: “Müdirlik üçün burnunun ucu göynəyir”. Kəlbiyevin hərarətli tənqidlərini işə canıyananlıq hesab edənlər də vardı. Bəziləri də deyirdi ki, ağlı yerində deyil, adam da bu qədər tənqid edər, lap sözün çürüyünü çıxardıb. Həqiqətən də belə idi. Kəlbiyev fasiləsiz və çox zaman yersiz tənqidi

çıxışları ilə özünü gülünc vəziyyətə qoyurdu. Beləliklə də müdir stolu ilə öz arasındakı məsafəni qısaltmaqdansa bir az da uzadırdı.

İndi Kəlbiyevin heyrətinə səbəb olan da bu idi ki, on illik yolu bir anda keçmişdi! Öz aləmində "Fələyin oyunlarından baş açmaq olmaz!" – deyib düşünürdü, – bir təsadüfə bax haa. Deyəsən, bəxtim açılıb!" – Kəlbiyev birdən-birə bu cür qalxmasını başqa cür izah edə bilmirdi. Yox, onun heç yerdə bir adamı yox idi. Bu vaxta qədər yuxarılarda özünə söykənəcək tapmamışdı. Adamın insafı var, gərək olmayan şeyi deməyəsən. Bəs bu yüksəlişin sirri hardadır? Axı, necə oldu, kimin yadına düşdü ki, "mən varam?!" deyib düşünür və heç bir fərli cavab tapa bilmirdi. Axır bu fikrə gəldi ki, müdirləri seçənlər də canlı adamlardır, yorulurlar, başları ağrıyır, əldən düşürlər və bəzən kim gəldi "hə" deməli olurlar... Bəli, "görünür kiminsə yorğun vaxtına düşüb, məndən başqa adam tapmayıb" deyə ilk günlər dost-aşna yanında zarafata salıb gülürdü. Necə deyərlər, zarafat zarafatlığında, iş də işliyində. "İndi ki, təyin ediblər, sən də razılıq vermisən, işləmək lazımdır". Kəlbiyev də işə girişdi.

Öz aləmində götür-qoy eləyib bu qərara gəldi ki, gərək birinci addımı Əhmədin müdirliyi zamanı tənqid etdiyi qüsurları aradan qaldırmaqdan başlaya, görülməmiş işləri görə. Bunun üçün elə əvvəlcədən idarəni yaltaqlardan və kağız-kuğuz içində paslanmış, ürəyi sinəsində qaysaq bağlamış bürokratlardan təmizləmək lazımdır. Bu barədə düşünəndə təbiidir ki, ilk əvvəl Təhməz gəlib durdu gözünün qabağında, o Təhməz ki, başı çiyinlərinin arasında itmişdi, vahiməli sir-sifətindən zəhrimar yağırdı. Üzündə yazılmışdı: "Pul yoxdur!" Bəli, bu Təhməz gəlib durmuşdu Kəlbiyevin gözünün qabağında, tikan kimi batırdı gözünə! Elə buradan başlamalıyam. Yoxsa qoymayacaq iş görəm. Nə təşəbbüs irəli sürsəm, ortalığa bir maneə çıxaracaq. Necə olsa quyruqdur, Əhməd Rəhimoviçin quyruğu! – Bu yerdə Kəlbiyev birdən-birə qəhqəhə çəkib güldü... ha-ha-ha!.. Əhməd Rəhimoviç!..

Qəhqəhəsi kəsilməmiş zəngi basdı. Katibə içəri girdi.

– Təhməz mühasibi yanıma çağır!

– Baş üstə! – Katibə getmədi, – Əhməd Rəhimoviç sizi görmək istəyir.

Kəlbiyevi maraq bürüdü, bir anda başında qəribə bir fikir oyandı: "Görək Əhməd Rəhimoviç necədir? Görkəmi-zadı dəyişməyib ki, özünü necə aparır?!"

– Burax gəlsin!

Katibənin çıxması ilə Əhmədin içəri girməsi bir oldu. Əhməd əvvəlki kimi təmiz və səliqə ilə geyinmişdi. Ağ köynəyinin yaxasında qırmızı qalstuk parlayırdı. Üzü tərtəmiz idi. Gözləri və bütün siması əvvəlki kimi, bəlkə bir az da xoş təbəssümlə işıqlanmışdı. Kəlbiyev düşündü: "Deyəsən yeri yaxşıdır. – İş az, maaş çox!". Bunun ardınca dərhal başına başqa bir fikir gəldi. "Gərək mən də bir mövzu götürəm, yavaş-yavaş başlayam yazmağa, kimdən əskiyəm?" Bütün bu fikirlər stolun dalından çıxıb kabinetin ortasında Əhmədi qarşılayana kimi beynində cərəyan etmişdi.

– Buyurun, əyləşin! – deyib Əhmədə yer göstərdi. Əhməd oturmadı, elə ayaq üstündə sadə bir əda ilə dedi:

– Məzuniyyət pulum qalır. Təhməzə deyin versin.

– Elə bu?! Niyə vermir ki?

Əhməd suala cavab vermədi. Mənalı təbəssümlə kifayətləndi.

– Hər halda sizin göstərişiniz lazımdır...

– Baş üstə, göstəriş verərəm...

Əhməd getdi. Kəlbiyev fikirləşdi ki, Təhməzi çağırmamış onunla çəpləşməyə bir bəhanə tapsın və çəpləşmədən sonra isti-isti onu başından eləsin. Həyətdəki quyu, Fatma xalanın putyovkası və otağının döşəməsi yadına düşdü. "Elə bu iki məsələ kifayətdir ki, onunla birdəfəlik üzülüşək!" Əhməd çıxan kimi Təhməz qoltuğunda böyük bir qovluq içəri girib intizamı hər şeydən üstün tutan qulluqçulara məxsus bir dəblə qapı ağzında durdu:

– İcazə var, Kəlbi Kəlbiyeviç?

Kəlbiyev acıqlı-acıqlı ona baxdı və gözlərinə inanmadı. O gözləyirdi ki, Təhməz acıqlı, qaşqabaqlı, kinli olacaq. Üz-gözündən zəhrimar bir az da artacaq. Lakin bunların tərsinə Təhməz gözlərinə şəkər səpmişdi. Kəlbiyevin üstünə səpələyirdi. Buna baxmayaraq, Kəlbiyev özünü yığışdırıb qırğı kimi Təhməzin üstünə şığıdı:

– Bura bax görüm, o kişinin məzuniyyət pulunu niyə vermirsən?! – Təhməzin başını yuxarı dartdığını gördü, lakin cavabını gözləmədən əlavə etdi, – Əhməd Rəhimoviçi deyirəm ey...

Axırıncı sözləri Kəlbiyev açıq istehza ilə, hətta tənə ilə dedi. Sanki deyirdi: – Ada, o dünənki naçalnikini deyirəm ey, qabağında quyruq buladığın Əhməd Rəhimoviçi... Kəlbiyev gözləyirdi ki, sözləri və rəf-

tarı Təhməzi haldan çıxaracaq, ona pis təsir edəcək... Lakin Təhməz bu istehzadan, bu qədər hökmlü sözlərdən, etinasız hərəkətlərdən əsla incimədi, adi qaydasını pozmadan yumşaq və müti cavab verdi:

– Sizsiz nə ixtiyarım var, Kəlbi Kəlbiyeviç? İstədim biləsiniz, sonra...

Kəlbiyev onun səsində və hərəkətlərində təcrübəli bir idarə qulluqçusunun ləyaqəti ilə yanaşı canayatan xoş bir şirinlik hiss etdi. Ömründə birinci dəfə Kəlbiyev yox, Kəlbi Kəlbiyeviç çağrılmağı da xoşuna gəldi. Eyni zamanda fikirləşdi ki, bu köhnə tülkü mənə qaşov çəkir, məni yuxuya vermək istəyir. Hər halda özünü xataya salan deyil, yəqin qeyri-qanuni bir şey var ki, özü verməyib, mənim icazəmi istəyir.

– Nə üçün mən bilməliyəm, qanunsuz bir şey var?

Təhməz dərhal müdirin vahiməsini hiss etdi. Lakin özünü elə göstərdi ki, guya heç bir şey hiss etməyib:

– Qeyri-qanuni heç bir şey yoxdur. Lakin maliyyə məsələləri, özünüz bilirsiniz ki, məsuliyyətli məsələdir, aydınlıq sevir, gərək sizin hər şeydən xəbəriniz ola. Mən ki belə öyrənmişəm. Yaxşısı budur bu başdan hər şeyi biləsiniz. Sabah yüz yerdən yoxlaya bilərlər, nə üçün başınız ağrısın...

Qəribədir! Təhməz danışdıqca Kəlbiyevə elə gəlirdi ki, sanki hardansa bir isti gəlir, sinəsinə dolub oradakı soyuq buz parçasını əridir, bir az əvvəlki kin və qəzəb yox olub gedir, indi daxilində kimsə baş qaldırıb yavaşca-yavaşca qulağına pıçıldayırdı: “Kimsə pis söz demir ha, hamısı sənin xeyrinədir”.

– Otur, görüm! – Kəlbiyev ona yer göstərdi. Özü də keçib yerində əyləşdi.

Təhməz ruhlandı. Müdirin qəlbinin həssas telinə toxunduğunu hiss etdi. Lakin yenə bunu hiss etdirmədən qeydkeşliklə dedi.

– Bilirsiniz, Kəlbi Kəlbiyeviç, bizim işimiz bir az ilişəcəkli işdir. Hamısı sənədlərlə bağlıdır. Bir yerdə bir balaca pozğunluq oldu – akt eləyib yazacaqlar ora-bura, sonra gəl o yana qaç, bu yana qaç, əldən-ayaqdan ol, aktdan yaxanı qurtara bilməyəcəksən, kəndir kimi keçəcək boğazına.

Təhməz iri qara əlini qaldırdı, kobud qara barmaqlarını açdı, boğazından yapışıb sıxdı.

– Elə sıxarlar ki, adamın nəfəsi kəsilər...

Bir anlığa Kəlbiyevin canına üşütmə düşdü. Ona elə gəldi ki, boğazı keçib Təhməzin qara iri caynağına, sıxır, nəfəs almağa qoymur... Qeyri-iradi olaraq dartınıb udqunaraq dedi:

– Pozğunluğa yol vermək lazım deyil!

– Elə mən də onu deyirəm. Əsla yol vermək olmaz! Buna görə də gərək ehtiyatlı olasan. Hər xahiş edənə "hə!" deməyəsən. Camaata nə var, qanuni, ya qeyri-qanuni, çalışır səndən bir şey qopartsın, necə deyərlər, dədəsinin malı deyil ha! Aldı, yedi, getdi işinə. Sənin yaxan ələ keçəndə, səni yüz yerdən çək-çevirə salanda, yeyib gedənlərin bir də hayına hay verməyəcək. Hələ eləlləri olacaq ki, gendən sənə baxıb güləcək də!..

Mühasib bir neçə misal gətirdi. Maliyyə intizamını pozduğu üçün hansı idarədə, hansı müdirin işdən götürüldüyünü, kimin hələ də işinin məhkəmədə olduğunu sadaladı. O danşıdıqca Kəlbiyev artan daxili bir maraqla qulaq asır və düşünürdü. Düşünürdü ki, xoş bir təsadüf nəticəsində qazandığı stolu çox tez də itirə bilər. Üstəlik yaxşı adı da gedər. Təhməz doğru deyir... O deyən kimi eləmək lazımdır. Artıq Kəlbiyev, ona kinli baxmırdı. Arabir suallar verir, özü də onun bəzi fikirlərini təsdiq edən misallar gətirirdi. Söhbətin axırında Kəlbiyev hiss etmədən, əvvəlki niyyətinin tərsinə olaraq, mühasiblə nəinki çəpləşmədi, əksinə, qəribə bir anlaşmaya gəldi.

– Yaxşı, de görüm su məsələsini neyləyək? Hər halda, həyətdəki quyunun üstünə bir motor və nasos qoysaq, suyu mətbəxə qaldırsaq pis olmaz... Necə bilirsən?..

Təhməz fikrə getdi. Birdən-birə cavab vermədi. Bilirdi ki, bu məsələ Kəlbiyev üçün nüfuz, prestij, avtoritet məsələsidir. Həm də bir növ Təhməzin özünü də yoxlamaqdır. Vaxt ilə bərk etiraz etdiyi halda, indi birdən-birə razılıq versə, yaxşı düşməz. Təzə müdirin yanında özünü hörmətdən sala bilər.

Təhməzi belə fikirlər aparmış ikən Kəlbiyev başqa şey düşündü, ona elə gəldi ki, mühasib onu kinli, xırda adam hesab edir və öz aləmində deyir: "Kor tutduğunu buraxmaz". Kəlbiyev öz haqqında heç kəsin belə düşünməsini istəməzdi. Buna görə də Təhməzi çaşdıran bir sual verdi:

– Səadət nədir, Təhməz?

Təhməz heyrətlə gözlərini döydü. Bilmədi nə desin.

– Soruşuram ki, səadət nədir? İnsan nə vaxt xoşbəxt olur?!

– Vallah, nə deyim, məncə səadət odur ki, dünyada az-çox yaxşı güzəranın ola. Yaxşı arvadın ola, uşaqların ola... Dost-düşmənə möhtac olmayasan.

– Yox, Təhməz. Bunlar hamısı vacib şeydir, ancaq səadət deyil. Bütün bunlar ola-ola adam xoşbəxt olmaya bilər. Və tərsinə! Səadət odur ki, sən hiss edəsən ki, başqalarına lazımsan... Başqa bir adama köməyin dəyir. Mən ki səadəti belə başa düşürəm. Al, bu jurnalda səadət barədə yazını oxu! – Qalın bir jurnalı ona uzatdı. – Siz maliyyə işçilərinə də hərdənbir fəlsəfi məqalələr oxumaq lazımdır!..

– Əlbəttə, əlbəttə! – Təhməz jurnalı götürdü, axşam evdə oxuyaram, – dedi.

– İndi de görüm, istəyirsənmi mən azca özümü xoşbəxt hiss edim?! Onda de görüm o su işini neyləyək? Gör nə qədər adam atamıza rəhmət deyəcək...

Nəhayət, Təhməz müsbət cavab verməyin vaxtı çatdığını hiss etdi:

– Mənim heç bir etirazım yoxdur, Kəlbi Kəlbiyeviç, göstəriş verərsiniz, balaca bir smeta hazırlayarıq, nazirliyə yazıb icazə alarıq, salarıq plana çıxar gedər...

Təhməzin cavabı Kəlbiyevi çox razı saldı, tamamilə yumşaltdı:

– Xahiş edirəm, özün bu işlə məşğul ol. Heç kəsə tapşırma. Sənədlər hazır olan kimi mənə göstər...

– Baş üstə, özüm məşğul olaram... Başqa bir tapşırığınız yoxdur ki?

Kəlbiyev ani tərəddüd keçirtdi: Fatma xala barədə göstəriş versin, ya yox? Tərəddüdünə də səbəb bu idi ki, arvad o qədər də xoşuna gəlmirdi: “Yaxşılıq bilən deyil, istəyirsən beş barmağının beşini də bal elə sal ağzına, sağ ol deməyəcək!”. Buna baxmayaraq ona kömək etməyi qərara aldı: “Kimə yaxşılıq eləsən itməz!” – deyib düşündü və ayaq üstə durub göstəriş gözləyən, əslində isə müdirin nə barədə fikrə getdiyini bilməyə çalışan Təhməzə baxdı.

– O Fatma arvada necə kömək etmək olar? Fikriniz nədir?

Təhməz cavabı əvvəlcədən hazırlanmış kimi heç bir çətinlik çəkmədən dedi:

– Necə olacaq, yerli komitəyə deyin, putyovka tapsın, o ki qaldı otağının döşəməsini düzəltməyə, bu barədə təmir kontoruna tapşırın, qurtarsın getsin. İstəyirsiniz, sizin adınızdan mən deyim? – Təhməz

azca dayanıb mənalı-mənalı əlavə etdi, – ancaq heç bu qədər zəhmətə dəyməz ki o arvad üçün çəkirsiniz... Vaxtınız, əməyiniz heyifdir, qədrini bilməyəcək!..

Kəlbiyev özü də bilmədi nə vaxt Təhməzlə razılaşdı.

– Elə mən də o barədə düşünürdüm. Ancaq necə deyərlər, sən balığı at dəryaya, balıq da bilməsə, xalıq bilər, – Kəlbiyev Təhməzin gözündə istehzalı bir qığılcım gördü, – düzdür, köhnə məsəldir, ancaq mənası yaxşıdır, gərək insana kömək edəsən. Bir də ki, Fatma arvad barədə çoxdan demişəm. Bir sözdür, bir zaman ağzımdan çıxıb gərək yerinə yetirək!

– Əlbəttə, kişi tüpürdüyünü yalamaz! – Təhməz onun fikrinə qüvvət verdi. – Başqa nə tapşırığınız var?

– Sizin sağlığınız, gedə bilərsiniz! – deyib Kəlbiyev onu buraxdı.

Kəlbiyev Təhməzə gah "sən", gah "siz" deyirdi. Bu da təsadüfi deyildi. Təhməz nəzərində gah böyüyür, gah balacalanırdı. Gah ona nifrət edir, gah munislik duyurdu. Bu təsirlə də ona gah "sən", gah da "siz" deməkdən özünü ala bilmirdi. Ən maraqlısı bu idi ki, onu çağırmışdı acılasın, töhmətləndirsin və işdən qovsun. Söhbətdən əvvəlki bu qəsdi ilə, söhbətdən sonrakı qərarını, yəni Təhməzi idarədə saxlamaq qərarını müqayisə etdikdə Kəlbiyevi gülmək tutdu. Bu hal ona o qədər gülməli görünürdü ki, durduğu yerdə qəhqəhə çəkdi, sonra da öz hərəkətinə bəraət qazandırmağa başladı. "Axı, işini sevən, vəzifəsinə sədaqətli olan adamla niyə də çəpləşək?! Nə qədər ki, müdirsən, əlində ixtiyar var, sədaqətlə sənə qulluq edəcək, üzdə də, dalda da sənin tərəfini saxlayacaq... Mənə bundan artıq nə lazımdır?! Vəzifədən çıxandan sonrakı dönüklüyünə gələndə isə... mahiyyətinə baxanda, bu elə mənasız və incə məsələdir ki, heç bu barədə fikirləşməyə dəyməz".

Kəlbiyev müdirliyə keçdiyi ilk günlərdə onun haqqında idarədə müxtəlif sözlər danışırdılar. Biri bu təyinatdan razı idi, biri dodaq büzürdü. Biri deyirdi işlər yaxşı gedəcək, o biri çiyinlərin çəkirdi. Elə ki, həyətdəki quyudan yuxarı su çıxarılacağı barədə bir sıra başqa yeni tədbirlər haqqında eşitdilər, ona tərəfdar çıxanların sayı artdı, ümidləri çoxaldı. Süpürgəçi Fatma xalanın dərdinə qaldığını bildikdə isə bir ağızdan dedilər: kişi qeydə qalandır, ürəyi nazik adamdır. Ürəyinin nazikliyi və nəcabətli adam olması barədə danışıqların artmasına bir

səbəb də Təhməzlə yaxşı rəftar etməsi oldu. Çünki aralarının soyuq olmasını, sözləşdiklərini hamı bilirdi, odur ki, deyirdilər: "Kəlbiyev Təhməzi idarədə sazlamaz!". Bir ay, iki ay, beş ay, sonra da ona dəymədiyini, hətta əvvəlki müdirdən də artıq onu özünə yaxınlaşdırıb, ondan məsləhətsiz-məşvərətsiz bir iş tutmadığını gördükdə dedilər: "Canım, kişi nəcib adamdır, şəxsi intiqam duyğularından uzaqdır..."

Bu cür söhbətlər artdıqca Kəlbiyevə xahişə gələnlərin də sayı artırdı. Yalnız evlərini təmir etmək üçün bir ayda on nəfərə qədər ona müraciət etmişdi. Biri pul, o biri taxta, üçüncüsü rəng istəyirdi.

– Bu ərizəçilərin də əlindən cana gəlmişəm! – deyib bir dəfə Təhməzə şikayətləndi və bir ərizəni onun qabağına atdı. – Taxta istəyir, neyliyək?!

Təhməz çiyinlərini çəkib, məəttəl qaldığını söylədi: "Qəribə adamlardır! Bilmirlər ki, olmaz, ixtiyarımız yoxdur? Yaxşı bilirlər! Ancaq üzünüzü yumşaq görüblər. Bir dəfə məndən soruşmuşdunuz ki, səadət nədir? Demişdiniz ki, səadət odur ki, hiss edəsən, başqalarına lazımsan, köməyin dəyə. Bəs başqaları niyə səni düşünmür, heç fikir də eləmir ki, axı, onun istədiyini eləsən, atalar demişkən, özün dizi açıq qalarsan... Üstünə yazın "yox!", vəssalam!".

Kəlbiyev Təhməzin məsləhətinə qulaq asdı, ancaq özünəməxsus üsullarla bu məsləhəti yerinə yetirməyə başladı. Yəni xahişlər müəyyən əsaslarla rədd olundu. Biri yerli komitəyə, o biri başqa bir idarəyə göndərildi. Üçüncünü yoxlamaq üçün komissiya yaradılırdı və sairə... Beləliklə, yerinəyetməz, haqsız ərizələrlə haqlı şikayətlər bir-birinə qarışdı, ayırd olunmadan hamı kağızlar bu və ya digər bir ünvana göndərildi. Alınan cavablar və təkliflər müsbət olanda yeni komissiya yaradılır, yeni adamlar işə cəlb olunurdu o qədər ki, xahişini yerinə yetməz olduğu barədə təklif irəli çıxır və məktub işə tikilirdi.

Bir müddət sonra, Kəlbiyev haqqında yaxşı danışanların səsi batmağa, əvvəlcə dodaq büzüb çiynini çəkənlərin səsi ucalmağa başladı. "Filan kağız Kəlbiyevin quyusuna düşdü, filan təklifi o quyudan heç bir usta çıxarda bilməz!" kimi sözlər eşidildi. Yavaş-yavaş Kəlbiyev bu sözlərə alışdı: "Başqası məni düşünmür, mən başqasını niyə düşünüm?" – deyib rahatlığını təmsin edən bir fəlsəfə uydurdu. Camaata vəd etdiyi sözlərin heç birini yerinə yetirmədi. Hətta elə bir qayda yaranmağa başladı ki, bu idarədən adi bir xasiyyətnamə və ya arayış

almaq üçün günlərlə vaxt itirmək lazım gəlirdi... Kəlbiyevin özünün də əvvəllər böyük hərarətlə girişdiyi su məsələsi isə ancaq smetaya qədər yaxşı getdi və oradaca ilişib qaldı. Bir neçə ay sonra Təhməz smetanı və balaca layihəni onun qabağına qoyub dedi.

– Təsdiq edin. Ancaq onu deyim ki, idarənin ümumi smetasında bu iş üçün pul nəzərdə tutulmayıb. Başqa maddədən götürmək lazım gələcək.

– İxtiyarımız var, ya yox?

– İxtiyarımız var deyəndə ki, maliyyə intizamı pozulur, kim yoxlasa ayağımıza yazacaq!..

Kəlbiyev qələmi götürdü, istədi qol çəksin, lakin kağızların aşağı-yuxarısına xeyli baxıb, fikrə getdi, nəzərdə tutulan məxarici bir neçə dəfə ucadan öz-özünə təkrar edib dayandı, qələmi təzədən yerə qoydu.

– Apar, saxla görək...

Təhməz bu sözlərin mənasını çox gözəl başa düşürdü. Bilirdi bu nə deməkdir. Yəni apar bu kağızları, bir də mənə göstərmə!

Təhməzin istədiyi də bu idi. Smetada nəzərdə tutulan nə qədər az xərclənsə mühasibə o qədər çox xoş gələrdi. Nəzərdə tutulmayan, əlavə zəhmət tələb edən, xüsusi icazə almaq üçün təşəbbüs istəyən tədbirlər isə neştər kimi onun sinəsini deşirdi və bu barədə eşitmək belə istəmirdi. Buna görə də "apar, saxla görək" sözləri ürəyindən idi.

Bu sözlər müdirin ağzından çıxan kimi Təhməz durub getdi. Qorxdu ki, təzədən fikrini dəyişər. – "Adamdan nə desən çıxar".

Suyun kağızları o gedən getdi. Ancaq Təhməz də az aşın duzu deyildi. Hərdənbir o da müdirin əsəbləri ilə oynayırdı. Onun zəif, yaralı yerinə əl atır və ləzzət duyurdu. Məhz bunun üçün Təhməz qəsdən bir neçə dəfə su barədə söz saldı, kağızları müdirə uzatdı. Hər dəfə Kəlbiyev "sonra, sonra" deyib başından elədi. Hətta bir dəfə Təhməzə bərk acılandı da... "Nə yapışmısan ey, bu quyudan, hər saat soxursan gözümə?! Başqa işin yoxdur?!" Bundan sonra, Təhməz bildi ki, su məsələsi birdəfəlik batdı. Kəlbiyevin otağından çıxan kimi suyun sənədlərini lazımsız kağızlar olan şkafın bir küncünə tulladı. Bununla da rahat olub oturdu...

Lakin işçilər rahat olmadılar. Hamıdan da əvvəl Kərəm, Hökümə xanım və Fatma xala Kəlbiyevin yanına gəldilər.

– Bu nə işdir, balam?! – deyib soruşdular. – Quyudan əl çəkmisən, hə?!

Kəlbiyev ciddi gözlərlə onları süzdü:

– Bir şey çıxmaz! – dedi. – Filan qədər pul istəyir, material istəyir, heç bir smetada, kağızda nəzərə alınmayıb və alınması da qeyri-mümkündür.

Hökümə xanım özündən çıxdı.

– Necə yəni qeyri-mümkündür, balam?! Bunun üçün birinci canfəşanlıq eləyən sən deyildin? Nə oldu, nə qədər ki, heç şeyin məsuliyyətini çəkmirdin, eləməkdən, düzəltməkdən, qurmaqdan danışanda, ağzına çullu dovşan yerləşmirdi. İndi ki, görürsən bir balaca boynuna məsuliyyət düşür, geri çəkilirsən, əlinin dalını qoyursan yerə ki, düzələsi iş deyil, hə?!

Kərəm və Fatma xala da bu ruhda bir xeyli söz dedi. Lakin Kəlbiyev yumşalmadı ki, yumşalmadı. İdarədə quyu ətrafındakı danışıq insanın insanlığı, verdiyi sözə əməl etməməsi, cəsarət və qorxaqlıq kimi mənəvi söhbətlərə çevrilirdi. Dalda deyilən bu sözlərin hamısı Kəlbiyevin qulağına çatır və onu xeyli əsəbiləşdirirdi. Bir gün Təhməzi yanına çağırdı, qapını bağladı və katibəyə dedi ki, "heç kəsi içəri buraxma!" Sonra üzünü Təhməzə tutdu:

– Bu quyu barədəki boş danışıqlar məni cana gətirib. Neyləyək?!

Təhməz çiyinlərini çəkdi. Bilmədi nə desin. Bunu görən Kəlbiyev gizli məqsədini açdı.

– Quyunu itirmək lazımdır!

Təhməz iri vahiməli gözlərini döydü:

– Başa düşmədim?!

– Elə eləmək lazımdır ki, quyu yox olsun, qurusun, birdəfəlik yer altında basdırılsın. Başa düşdün?

– Düşdüm... Ancaq necə?!

– Elə o barədə səni məsləhətə çağırmışam.

Uzun götür-qoydan sonra çıxış yolu tapdılar.

Keçən ilki təmir zamanı köhnə divarlardan tökülmüş və bərkiyib daşa dönmüş çoxlu əhəng, sement, kərpic parçaları və sair bu kimi lazımsız zir-zibil həyətin yarısını tutmuşdu. Kəlbiyev və Təhməz bu zir-zibili quyuya tökməyi qərara aldılar. Zibilin yerində qaraj düzəldib idarənin "Volqa" maşınını saxlamaq məqsədəuyğun göründü...

Cəmi on beş-iyirmi manat verib iki adam tutmaq, quyunu doldurmaq olardı. Bu işi şənbə günü axşam başlayıb, bazar günü qurtarmaq məsləhət oldu.

Elə belə də etdilər. Martın axırlarında bazar axşamı işdən sonra evlərinə gedib, bazar ertəsi səhər erkən işə gələn qulluqçular həyətdə dəyişiklik görüb dayandılar. Diqqətlə baxıb işin nə yerdə olduğunu bildikdə hay-küy qaldırdılar. Hamıdan da artıq vəlvələ qoparan Hökümə xanım, Fatma xala və Kərəm oldu. Onlar başılovlu Kəlbiyevin kabinetinə təpişdilər, Hökümə xanım həyəcandan və qəzəbdən boğula-boğula soruşdu:

– Xəbərin var?!

Kəlbi Kəlbiyeviç özünü o yerə qoymadı:

– Nədən?!

– Necə əlin gəldi? – deyib Fatma xala yavaşdan, lakin az qala ağlaya-ağlaya soruşdu.

– Bu cinayətdir! – deyib Kərəm zilə qalxdıqda Kəlbiyev ayağa durdu:

– Qoyun işimizi görək, avara sözlərlə vaxtımızı almayın!..

Soruşa bilərsiniz ki, bəs Fatma xalanın putyovkası və otağının döşəməsi nə oldu? O barədə soruşmayın, çünki idarədə elə vəziyyət yarandı ki, Fatma xala heç bir şey istəmədi, Hökümə xanım da, Kərəm də iş yerlərini dəyişməli oldular. Kəlbiyev isə onların əmrini verən günü Təhməzi yanına çağırıb dedi:

– Bəsdir, sadəcə mühasib işlədin, bu gündən səni özümə müavin təyin edirəm. İşgüzar və sədaqətli adamların qədrini bilmək lazımdır!.. Xalq yaxşı deyib – çörəyi ver çörəkçiyə birini də artıq!

Kəlbiyev bu gözəl xalq məsəlini öz aləmində o cür mənalandırırdı, nə cür ki, bəzi siyasət adamları bəşərin ali kürsülərində "humanizm", "ədalət", "istiqlaliyyət" sözlərini mənalandırırlar.

Lakin Kəlbiyev də onlar kimi unudurdu ki, xalqın başqa bir məsəli də var – sən saydığını say, gör fələk nə sayır. Bir dəfə Fatma arvad bu məsəli xatırlatdıqda Kəlbiyev "fələk" sözündən yapışıb onu mövhumatçı, köhnənpərəst adlandırmışdı. Ağlına da gəlməmişdi ki, bizim zəmanədə "fələk" insanın iradəsindən yuxarı olan bir qüvvə deyil. İnsan özüdür – ağıllı, namuslu mübariz insan! Bir idarədə bir neçə belə insan əl-ələ verəndə elə edirlər ki, Kəlbiyevi stol başına gətirmiş təsadüf onu uçuran bir zərutə çevrilir. Elə belə də oldu. İdarədən getmiş Hökümə xanımı bir gün yuxarı çağırdılar. Əmr verib, Kəlbiyevin yerinə göndərdilər. Qızarıb-bozarmış Kəlbiyevin "Niyə?!" sualına yarızarafatla cavab verdilər.

– Get sənətinə, mühəndisliyini elə. Yaxşı ad çıxartmamısan...

Kəlbiyev istədi məşhur məsəli söyləsin. Lakin dilinin ucundan qaytarıb susdu. Balacalaşmış, büzüşmüş, gözə görünməz halda idarəyə yox, evinə getdi... Canında üşütmə hiss edib yatdı. O yatan bir ay durmadı... Bir ay sonra adi mühəndis kimi işə çıxanda yenə əvvəlki, nuh əyyamından qalma sakit, rəngsiz, simasız Kəlbiyev idi.

*1969*

## ÇANDRANIN ÜSYANI

*Qızım Sevdaya*

1

Çandra haqqındakı xatirələr nəinki həyatımın yollarına, həm də dar və qaranlıq zindanımın rütubətli divarlarına işıq salır. Mən indi Çandraya aid olan hər fikri, hər bir duyğunu dünyada ən qiymətli şey kimi qoruyuram; çünki iztirab dolu həyatdan, mavi göylərdən, əlvan üfüqlərdən bu böyük dünyadan mənə qalan yalnız Çandraya olan məhəbbət və xatirələr oldu.

Mənə elə gəlir ki, Çandranın dərdlərini mənim qədər duyan bir adam gərək olmasın. Onun səadət üçün yaranmış nəcib ürəyinin gördüyü əzabları, çəkdiyi iztirabları heç kəs mənim qədər dərindən hiss edə bilməz. Mənim belə düşünməyə haqqım vardır; çünki mən onu sevirdim. Çoxdan məlumdur ki, sevgi insanın ürəyini həssas, gözlərini işıqlı edir. Çandranın elə bir hərəkəti yox idi ki, mənim gözümdən qaçsın, elə bir fikri yox idi ki, mən onu bilməyim.

Məhəbbət mənim gözlərimdə Çandranı xilqətin tacına çevirmişdi. Mən həmişə belə düşünmüşəm ki, dünyada ondan gözəl bir məxluq yoxdur. Çiçəklər ətir verir, çünki Çandra var, ulduzlar işıqlıdır, ona görə ki, hər gün Çandranın gözlərinə baxırlar. Buludsuz mavi göylər bu qədər təmiz və ürəkaçıcıdır, o səbəbə ki, hər gün Çandranın təbəssümünü görürlər. Mənim etiqadım, əqidələrim, fəlsəfəm, həyatım Çandranın varlığına bağlıdır. İndi Kəlküttə şəhər zindanında oturub, dardan asılacağım saatı gözləyirkən belə, məni yaşadan Çandradır.

Mənim zindanım heç bir zaman günəş işığı görməmiş və görməyəcəkdir. Onun divarlarından kərtənkələ, əqrəb və təsəvvür olunmaz cürbəcür həşərat çıxır, gəlib mənim çılpaq dərimin üstündə oynayırlar. Sönməmiş həyat istisini duyan kimi qaçırlar. Axı, onlar daimi nəm iyi verən divarlara alışdığından canlı istilikdən qorxurlar. Onlar yerin qurdlarıdır. Məni diri-diri bu qurdların ağzına atmışlar. Bu həşərat

gözləyir ki, mən nə vaxt öləcəyəm, nə vaxt bədənim iylənməyə və onlara qida olmağa başlayacaqdır. Deyəsən onlar da bədənimin bu qədər davamlı olmağına təəccüb edir və əsəbiləşirlər. Onlar qorxur ki, hələ mən ölməmiş sümüklərimin üstünü örtən qara nazik dəri də əriyib getsin. Yer qurdlarının tələsməyinə baxmayaraq, mən yaşayıram, hətta düşünür və sevirəm də.

Çandranın məhəbbəti! Dünyada səndən böyük bir şey varmı?

Çandra tək yaranmışdı. Bizim kənddə, gəzib dolandığım yüzlərlə başqa hind kəndlilərində mən hələ belə bir qıza təsadüf etməmişdim. Bu dünyaya qara və arıq gəlib, əzablarla dolu qısa həyat yolunda kömürə və sümüyə çevrilərək, əbədiyyətə qovuşan bizim qızlar içində o, nadir bir şey idi. İsti Hindistan günəşi bizim qızları ana bətnində yandırıb qaraldır. Çandra isə Hindiquş dağının qarlı zirvəsi kimi ağ idi. Aclıq və ehtiyac qızlarımızı doğulmamış üzüb çöpə döndərir, Çandra isə ətli-canlı idi. Onun girdə və balaca çiyinləri, yaraşıqlı gərdəni, nazik beli vardı. Mən ona baxanda həmişə öz-özümə deyirdim: – Şükür sənə, ey böyük Rama[1], Çandranı yaratmasaydın, bəs mənim bədbəxt gözlərim nəyə baxardı? Çandra sənin qüdrətini nümayiş etdirir.

Bəli, sevən bir adamın belə düşünməsi gərək sizə qəribə görünməsin. Mən, doğrudan da, bu fikirdəyəm ki, Rama öz qüdrətini göstərmək üçün Çandranı yaratmışdır. Onu yaratmaqla sanki məğrur və yaltaq, nəcib və kinli, böyük və alçaq insanlara demək istəyir ki, baxın, mən buna da qabiləm. Belə əcaib bir gözəlliklə də sizi heyran buraxa bilərəm!

Mən Ramaya inanırdım. Hindistanın qədim dini və fəlsəfəsinin pərəstişkarı idim. Bilirəm ki, Çandra həyatın əbədi pozulmaz ahəngidir. Bir-birinə və öz-özünə əzab verməkdən ürəkləri daşa dönmüş, lakin yorulmamış insanlara bir təsəlli olsun deyə Rama Çandraya can vermişdir. Arasıkəsilməz qanlı müharibələrdən, Kali[2] allahın riyakar işlərindən sinəsi cadar-cadar olmuş bizim torpağın üstündə Çandra olmasaydı, bizi illər uzunu yaşadan bir dəqiqəlik, bir anlıq sevinc və səadət də olmazdı. Mən bilirəm ki, Çandra ömründə gülməmiş adamların üzünə təbəssüm gətirdi, gözlərinə işıq verdi, ürəklərini oxşadı.

---

[1] *Rama* – Hind mifologiyasında üç allahdan biri həyatın yaradıcı əsasını təmsil edir (*Müəllifin qeydi*).

[2] *Kali* – hind mifologiyasında qanlı müharibələr allahı.

Siz mənə inanın ki, Çandra hara getsə, oraya bir yüngüllük gətirərdi. O heç bir zaman sönməyən gülüşləri ilə qamış və palçıq daxmalarımıza işıq salardı. Acıqlı və dərdli zamanlarında belə, onun üzündən, gözlərinin içindən işıq çəkilməzdi. Sanki o, bulanmaz bir bulaq idi. Ruzigar ara vermədən tozları, torpaqları onun başına sovururdu. O bunların hamısını udur, yenə mavi saflığını, büllur təmizliyini itirmədən, sərin nəfəsi ilə təşnə insanların sinəsini oxşayırdı. Heç yadımdan çıxmaz, o, on beş yaşına çatanda, öz canına qəsd etmək istəyən bir adamı “ölüm həmişə var, tələsmək nəyə gərək” – deyə gülümsəyib, həyata qaytardığı zaman, mən sehrlənmiş kimi qarşısında heyran olub atası Raxula dedim:

– Çandra Kamanın[1] sinəsindən çıxmışdır, baharın nəfəsidir. O, insanlara həyat verir.

Bizim dini ayinlərimizə az inanan və daha az əməl edən atası, gözləri yaşarmış halda belə cavab verdi:

– Mən də o fikirdəyəm ki, Çandra baharın nəfəsidir. O, anadan olanda mən kənddə yox idim. Bir həftə sonra gəldim. Daxmamızda ağ bir işıq gördüm. Astadan içəri girəndə anası cındır qundağa bükdüyü uşağı mənə verdi. İki qolumun üstündə sinəmə sıxdım. O, gözlərini açdı. Mənə baxıb gülümsədi və yenə yumdu. Mən bildim ki, evimizin işığı ondadır.

...Çandranı mən bu cür sevirdim, mənim gücüm də bu sevgidədir. Həyatda mənim varım, dövlətim bu sevgidir. Mən yoxsulam, lüt və çılpağam, hər şeydən məhrumam, hətta həyatın ən böyük neməti olan günəş işığını belə mənim əlimdən almışlar. Lakin bu yoxsulluğumla mən hakimlərimizdən, ağalar və kübarlardan varlıyam: mən səadətin nə olduğunu bilirəm, onlar isə bilmir. Mənim ürəyim daima Çandranın eşqi ilə çırpınır. Onların ürəyini döyündürən isə kindir, qəzəbdir, qorxudur. Gecə və gündüzdə bir dəqiqə yoxdur ki, onlar var-dövlətini, mövqelərini, yaxşı yaşayışlarını itirməkdən qorxub titrəməsinlər. Çünki onlar da duyur ki, bütün bunları insanın əlindən almaq olar. Bəs mən? Mən qorxmuram: mənim səadətim əbədidir. Bu səadət nə alınmaz, nə də satılmaz bir məhəbbətdədir – Çandranın məhəbbətində!..

---

[1] *Kama* – hind mifologiyasında məhəbbət ilahəsi (*Müəllifin qeydi*).

## 2

Çandranın atası yoxsul idi. Gözünü açan gündən quru torpaq və aclıqdan başqa həyatda heç şey görməmişdi. Müalicəsi mümkün olmayan pis xəstəliyə alışan kimi, o, yoxsulluğa alışmışdı. İyirmi beş il bundan qabaq Raxulun on yaşı olanda aclıqdan bütün ailəsi qırılmışdı. O zaman kənd əhalisinin yarısından çoxu məhv oldu. Çox evlərin qapısı birdəfəlik bağlandı, işığı əbədilik söndü. Bu, sizə təəccüblü görünməsin. Axı, bizim Hindistanda hər il 80 milyon adamın aclıq çəkməsi adi bir şeydir.

O zaman mən də atamı, iki qardaş və bir bacımı itirdim. Mən Raxuldan səkkiz yaş böyük idim. Onda mən, heç bir zaman evlənməyəcəyimə və ömrümü ibadətdə keçirməyə and içdim; məni belə düşünürdüm ki, dünya zövqləri bizə haram buyurulmuşdur. Tək yaşayırsan bir dərdin var, kimi alsan yəqin o da dərdsiz deyil. Evlənmək – sənin də, onun da bir dərdini iki edəcəkdir. Bəs uşaqlar? Dünyaya gətirəcəyin o yazıqlara sən nə verəcəksən? Çörək yox, ev yox, paltar yox. Hələ ana bətninə düşməmiş fəlakətə məhkum olanların doğulmasından nə fayda?

O zaman mən belə düşünürdüm və buna görə də and içdim. Lakin Raxul məndən kiçik idi və hələ ürəyində çox duyğular oyanmamışdı. Buna görə də o and içmədi. Bir də ki, o lap uşaqlıqdan başqa cür düşünərdi. Elə bil ki, onun gözləri də dünyaya başqa cür baxırdı: o, şeyləri yalnız şey kimi görürdü, daha dalında başqa bir məna, bir Allahın və ya bir insanın ruhunu axtarmırdı. Müqəddəs meymunlar və inəklər mənim fikrimdə anlaşılmaz sirli bir titrəmə oyatdığı halda, Raxulun halına təsir etməzdilər. Hətta meymun balaları və buzovlarla, o, bir oyuncaq kimi oynar, quyruqlarından tutub dartar, qulaqlarını dişləyib qışqırdardı. Mən belə düşünərdim ki, şeytan Raxulun ürəyinə girmişdir. Bununla belə mən ondan ayrıla bilməzdim: Raxul yaxşı yoldaş idi, qoçaq və vəfalı idi.

Raxulun bu xasiyyətləri Çandraya keçmişdi. O, həyatı, yaşamağı nə qədər sevərdi! Ürəyiaçıq, xasiyyəti oynaq və şad idi. Hərdən mənə elə gəlirdi ki, bizim dini əqidələr, qranit daşların üzərində atılıb-düşən bir top kimi onun ürəyinə dəyir və heç bir iz buraxmadan geri qayıdır.

Mən zindana düşməmişdən bir həftə əvvəl Raxulgilə getmişdim. Onların qamış daxması kəndin ortasında yerləşirdi. Mən içəri girəndə Raxul həsirlərin üstündə oturaraq üç kəndli ilə qızğın söhbət edirdi. Çandra qapının ağzında ayaq üstə durmuşdu. Onun əynində ağ bezdən

sarı[1] vardı. Belindən və qollarının altından sarıyıb gətirdiyi sarının ucunu çiyninin üstündən dala atmışdı. Sanki büründüyü adi bir bez parçası deyil, dünyanın ən qiymətli ipəyi idi. Doğrudan da Çandranın əynində pis mal da yaxşılaşır, gözəl və yaraşıqlı olurdu. Çandra məğrur görkəmini pozmadan əllərini döşündə çarpazlayıb xəfifcə baş əyməklə, məni salamladı və azca yana çəkildi. Raxul və kəndlilər ayağa durdular. Lakin söhbəti kəsmədilər. Raxul çox ehtiyatlı olan kəndliləri mənə inandığını bildirən mənalı baxışlarla rahat edib dedi:

– Buna yol vermək olmaz. Yanki kənddən qovulmalıdır. O, istədiyini etsə, biz kəndi tərk etməli olacağıq. Arvad-uşaqlarımız, qoca və xəstələrimiz isti yollarda, tozlu küçələrdə qırılıb gedəcək.

Kəndlilərdən biri Bombeyə gedib toxucu fabrikinə işə girəcəyini dedikdə Raxul daha da qızışdı.

– Bu fərarilikdir, – dedi, – şəhərin yolunu mən səndən yaxşı tanıyıram. Lakin getmirəm və getməyəcəyəm. Kəndimizə gələn adam canavardan pisdir. Yazıq, dilsiz-ağızsız adamları qoyub qaçmaq bizə yaraşmaz.

Sonra Raxul Bombeydən, Kəlküttədən danışdı.

– Məgər şəhərdə durub səni gözləyirlər? Gələn kimi deyəcəklər, buyur, bu iş, bu da çörək, işlə və yaşa. Xeyr! Şəhərlərin küçələrində mənim, sənin kimi on min, yüz min adam var: iş və çörək axtarırlar. Onları it kimi qapılardan qovurlar.

Raxul Bombeydə öz baxışı ilə ağaları və kahinləri murdarlayan “Toxunulmazlar”ın[2] dəhşətli həyatından danışdıqca, kəndliləri bilinməz və anlaşılmaz bir gələcəyin vahiməsi basırdı. Axı, Raxul hər yerdə olmuşdu: Bombeydə toxucu fabriklərində işləmiş, Kəlküttədə tramvay parkında çalışmışdı və yenə də həyatının yeganə təsəllisi olan öz Çandrası ilə kəndimizə qayıtmışdı.

Raxul, söhbətin nə barədə olduğu ilə maraqlandığımı hiss edərək məni başa saldı:

– Raxuli, zamındar[3] özü ilə bir amerikalı mister gətirmişdir – mister Smit! Çay əkmək üçün torpaqlarının bir hissəsini ona icarəyə

---

[1] *Sarı* – hind qadınlarının paltarı (*Müəllifin qeydi*).

[2] *Toxunulmazlar* – Hindistanda ən aşağı zümrə hesab olunan kəndlilər, fəhlələr, nökərlər və sairə. Guya onların baxışı belə ağaları murdarlayır.

[3] *Zamındar* – Hindistanda iri feodal, mülkədar (*Müəllifin qeydi*).

verir. Lakin yer azlıq edir. Mister Smit torpağı olan kəndlilərə təklif edib ki, torpağınızı mənə satın.

Bir dəri bir sümükdən ibarət olan balaca boylu, kömür kimi qara kəndli dedi:

– Torpağı becərməyi də özümüzə tapşırır.

– Böyük iltifatdır, – deyə Raxul istehza ilə güldü və sonra qəzəblə davam etdi, – mister smitləri mən tanıyıram, onların allahı puldur. Ayağını kəndə qoydumu, hamımızı yavaş-yavaş yeyib udacaq, tədrici ölümə məhkum edəcəkdir.

Kirpiksiz və omba sümüyü kimi çıxıq qaşlarının altında iri qara gözləri işıldayan kəndli çılpaq qapını qaşıyaraq soruşdu:

– Bəs nə edək! Çarə nədir?

– Bircə çarə var, – deyə Raxul yavaş-yavaş danışdı. Zamındar torpaqlarını amerikalıya yox, bizə versin, qiymət eləsin, kəndilərə satsın. Beş-üç ilə pulunu verərik.

Ovurdları batıq, qabarıq yanaqlarının sümüyü çıxmış, çılpaq qolları və qıçları nazik uzun taxtaya oxşayan üçüncü kəndli:

– Birdən zamındar razı olmadı, bəs onda nə edək? – deyə soruşdu.

– Razı olmasa, zorla torpağı almalıyıq. Mister Smiti bura buraxmaq olmaz. Bərk ayaqda ümidimiz ancaq qolumuzadır.

Raxul yumruğunu havada yellətdi və sualedici nəzərlərlə mənə baxdı. Çandra da, kəndlilər də gözlərini mənə dikmişdilər və kömək gözləyirdilər.

– Yox, övladlarım, – dedim, – güc və zorla yaxşı iş görmək olmaz. Sözünüz haqdır. İstədiyiniz xeyirdir. Lakin bu yaxşı işi pis yollarla yerinə yetirməkdən çəkinin. Zora əl atmayın, dünyanı xarab edən, bəşəriyyəti çıxılmaz dərdlərə salan güc oldu. Ondan qaçın, zalımları başa salın ki, zülm pis şeydir.

Mən Raxulun qulaq asmadığını, başımın üstündən hara isə uzaqlara baxdığını, kəndlilərin tərəddüd içində olduğunu, Çandranın həm əsəbiləşdiyini, həm də bir uşağa rəhm edər kimi mehriban gözlərlə mənə baxdığını görürdüm və onları ədalət yoluna çağırmaq üçün daha artıq səy göstərirdim.

– Çandra, sən bir ay əvvəl siyahı tutunda, birinci mən qol çəkdim; çünki sən insanları sülhə çağırırdın. İnsanlar arasında mehribanlıq və qardaşlıq toxumları səpin. Hamının səadət və qurtuluşu ondadır. Haqq

yolunda səbirli və dözümlü olun. Gücə əl atmayın. Sizə güc göstərənləri belə, başa salın, xoşluq və xeyirxahlıqla haqq yoluna çıxardın.

Raxul daha məni dinləməyərək durub həyətə çıxdı. Onun bu hərəkətini də mən ona bağışladım. Axı, haqq sözü deyənlər hər cür təhqirə dözməlidir.

Çandranın mehriban və xeyirxah nəzərləri altında mən çıxıb getdim. Sabahısı kənd meydanında Raxulun başına böyük bir dəstə toplandığını görərək yaxınlaşdım.

Raxul eyni üsyankar sözlərlə kəndlilərin fikrini oynadır, ürəklərini qızışdırırdı. Mən yenə onları haqq yoluna çağırdım. Qardaş və insan qanı tökəcək hərəkətlərin hind dini – təsəvvürləri və əxlaqına zidd olduğunu anlatdım. Yenə də onlar sükut dolu ağır baxışlarla məni yola saldılar. Lakin bu dəfə Raxulun gözlərində mən nə isə başqa bir şeyi də görürdüm: o mənə yolunu kəsən bir kötüyə baxar kimi baxırdı. Kəndin o biri başında mən Çandraya rast gəldim. Qara və yalın ayaqlarının dərisi bərkimiş və kobudlaşmış on-onbeş qadınla söhbət edirdi. Atası kimi qızğın və odlu danışırdı:

– Səsimizi ər və atalarımızın səsinə qatmalıyıq – deyirdi, – bu dünyada zəifləri diri-diri yeyirlər. Güclü olmalıyıq!

Mən sözə qarışdım:

– Səadət gücdə deyil, səbirdədir. Səbirli olun, qızlarım. İnsanları qanlı işlərdən saxlayın. Ürəklərini mərhəmətlə doldurun...

Çandra atası kimi mənə acıqlı baxmadı. Yox o çox sevdiyi bir uşağın səhv hərəkətlərini düzəldər kimi dedi:

– Siz ki həyatımızın pis qurulduğunu inkar etmirsiniz. Qoyun onu yaxşılaşdırmaq üçün düz və yaxın bir yol tapaq...

Bu sözü elə dedi ki, mən ona etiraz edə bilmədim. Bir anlığa mənə elə gəldi ki, Çandra da mən deyəni deyir. İkimiz də eyni arzularla yaşayırıq. Mən daha bir söz danışmayıb getdim.

Elə həmin günün axşamı məni zamındarın evinə çağırdılar. Zamındar öz camadarını, yəni mübaşirini mənim dalımca göndərmişdi. Həsirlərdən tikilmiş çadırımda uzanıb Handinin həyatını oxuyurdum ki, uzaqdan camadarın həmişə acıqlı və bülöv kimi hamar üzünü, qan və od tökülən gözlərini gördüm. Yanıma yollandığını görüb təəccüb etdim. Ürəyimdə anlaşılmaz bir əndişə baş qaldırdı: bu dünyanı puç hesab edən, hər an minnətdarlıqla ölümünü gözləyən mənim kimi bir

adam belə, camadarı görəndə qorxursa, onun necə adam olduğunu özünüz təsəvvür edin! Kəndlilər deyirdilər ki, camadar üçün dünyada adam başı kəsməkdən, tində birinin böyrünə bıçaq soxub öldürməkdən və ya lapdan tutub boğmaqdan asan bir şey yox idi. Bir sözlə, camadar quldur idi, cani və cəllad idi. O, nə insaf, nə din, nə vicdan bilirdi. Hamı inanırdı ki, Kali allahın ruhu camadarın bədəninə girmişdir və öləndən sonra camadarın ruhu ancaq quduz canavarın bədənində özünə məskən tapacaqdır.

Belə bir adamla sorğu-suala girməyi lazımsız bilərək, mən müti bir halda zamındarın evinə tərəf yollandım. Zamındarın evi kəndin qırağında, böyük və hamar küçənin başındadır. Ev hündür və qalın yarpaqlı ağaclarla əhatə olunmuşdur. Hələ balaca taxta qapıya yaxınlaşarkən evin dörd tərəfindəki güllüklərdən qalxan ətir iyi məni oxşadı. Qapını açıb içəri girdim və çay qumu döşənmiş düz səki ilə birmərtəbəli, eyvanlı evə tərəf yollandım. Mən həyət qapısından evə qədər olan yolun üstündə enliyarpaq sarmaşıqların yaratdığı işıqkeçməz talvara tamaşa edə-edə tələsmədən yeriyirdim. Hələ ev qapısına çatmamış başında ağ ispan papağı, əynində ağ bezdən köynək və qıçlarına yapışacaq qədər dar balaqlı şalvar, ayaqlarında üzü açıq səndəl olan orta boylu zamındar qarşıma çıxdı və gözləmədiyim bir hörmətlə məni salamlayıb içəri apardı. Zamındarın qeyri-adi hörmət və ehtiramı məni o qədər çaşdırmışdı və buraya nə üçün çağırıldığım haqqında o qədər əcaib fikirlərə salmışdı ki, haradan və necə keçib, nə vaxt böyük bir zala çıxdığımızı yaxşı görə bilmədim. Bu zaldakı böyük divar boyu döşəmədən tavana qədər uzanan kitablarla doluləmələr vurulmuşdu. Bizim zamındar cavan idi. Bombeydə təhsil almışdı və həmişə oxumuş, maarifpərvər olması ilə fəxr edərdi. Qarşıda nazik ipək örtük salınmış çox enli bir taxt vardı. Ortada açıq qırmızı rəngli balaca stollar qoyulmuşdu. Bunlardan birinin başında, zamındardan iki dəfə uzun olan bir adam oturmuşdu. Zamındarın yanında onun üzü ağ görünürdü. Əslində isə sarımtıl idi. Gözlərinin bozmu, sarımı rəngə çaldığını müəyyən edə bilmədim. Laübali və laqeyd təbəssüm olmasaydı, onun üzü və gözləri pis görünərdi. Yabançı bir şey kimi tənasübsüz bir halda qaşlarının üstündə asılmış enli alnının da eybəcərliyini örtən bu təbəssüm idi. Tam bir arxayınçılıq içində yavaş-yavaş tüstüləyən trubkası dərhal nəzərimi cəlb etdi. Üzünə baxan kimi bilinirdi ki, bu adam taleyindən razıdır və dünyada hər şeyin lazım olduğu kimi

cərəyan etdiyinə arxayındır. Hər halda məlum idi ki, daxili rahatlığını pozacaq bir fikir və əndişəsi yoxdur. Zamındar məni bu adama təqdim etdi və haqqımda xoş sözlər dedi:

– Hindistanın heç bir guşəsi filosofsuz yaşaya bilməz, mister Smit. Bizim kəndin və əyalətin də filosofu mister Ramulidir. O, mərhum Handinin bütün Hindistanda ən ləyaqətli şagirdlərindəndir.

Mister Smit:

– Ol rayt[1] – deyib ağır-ağır ayağa durdu, tam bir xeyirxahlıqla sol əlində tüstüləyən trubkasını tutduğu halda sağ əlini mənə uzatdı və yenə də iki kəlmə ilə kifayətləndi.

– Ol rayt...

Mister Smit eyni ağır və təmkinli hərəkətlə yerində oturdu. Zamındar mənə də yer göstərdi:

– Əyləşin, mister Ramuli. İnanın ki, mister Smit sizinlə tanış olduğuna çox şaddır. Mister Smit deyir ki, Handinin fəlsəfəsi və təlqin etdiyi fikirlər həmişə onun ürəyində xoş duyğular oyatmış və marağını cəlb etmişdir. O həmişə belə əqidədə olmuşdur ki, Yer üzündə hamı Handinin dediyi kimi yaşasaydı, bir nəfər də bədbəxt tapılmazdı.

Zamındar danışdıqca mən gah ona, gah da trubkasını əlindən qoymayıb kirpik çalmadan gözlərini üzümə zilləmiş mister Smitə baxırdım. Zamındar elə danışırdı ki, sanki mister Smit və mən bir-birini anlamayan iki çöl adamı idik. Halbuki mən ingiliscə yaxşı bilirdim. Bu əcaib hərəkəti mən mister Smitin çox danışmağı sevməyən bir adam olması ilə izah edib daha diqqətlə zamındara qulaq asmağa çalışdım. Lakin tez-tez gözaltı da olsa, mister Smitə baxmaqdan özümü saxlaya bilmirdim. Buna da səbəb mister Smitin gözlərini mənim üzümdən çəkməməsi idi. “Ol rayt” deyib qaralmaqda olan trubkasını sümürdükcə, mənə elə gəlirdi ki, müntəzəm surətdə sağa-sola hərəkət edən saat kəfkirinə qulaq asıram. Özü də hey sağ əli ilə ağ ipək köynəyinə yapışmış yaşıl qalstukunu oynadırdı. Mən heç cür anlaya bilmirdim ki, onun “ol raytları” zamındarın sözlərini təsdiq edir və ya mənim üzümün cizgilərini diqqətlə öyrənərək, çıxartdığı qərarları bildirir.

Zamındar isə danışırdı. Sanki mənim də, mister Smitin də bu saat nələr düşündüyünün onun üçün heç bir əhəmiyyəti yox idi.

---

[1] *Ol rayt* – ingiliscə yaxşı, xoşdur, eyib etməz deməkdir.

– Mister Ramuli, bilməlisiniz ki, bu evin astanasından içəri girmişsinizsə, buna səbəb mister Smitdir. Siz indi mənim yox, onun qonağısınız.

Mən xəfifcə mister Smitə baş əydim.

– Təşəkkür edirəm, mister Smit. Mən belə bir şərəfə layiq deyiləm.

– Ol rayt.

Mister Smit bu dəfə "ol raytı" elə bərkdən dedi ki, mən otaqda dördüncü bir adamın səsini eşidər kimi dönüb yan-yörəmə baxdım. Zamındar da sevincək ayağa durdu və tez qapını açıb dəhlizə nə isə dedi. Azca keçməmiş camadar podnosda bizə üç stəkan ananas şirəsi gətirdi, zamındar bir stəkan götürüb mister Smitin, birini mənim, birini də öz qabağına qoydu.

– Mister Smit bu fikirdədir ki, siz daha artıq şərəfə layiqsiniz. Bir adam ki, vətəndaşların ruhunu sakit edir, onları taleyin nəsibi ilə razılaşmağa çağırır, bütün fəlakətlərin səbəbi olan üsyankar fikirləri onların sinəsində boğur, onları zor və gücün şərindən qoruyur, o adam ölməzdir, mister Ramuli.

Yenə trubka tüstülədi, yenə mister Smit uşaq sadəliyi ilə mənə baxan gözlərini tərpətmədi:

– Ol rayt, – dedi və ananas şirəsi olan stəkanı götürüb içməyə başladı. Zamındar da tez stəkanının götürdü və gecikməməyi bildirən bir nəzərlə mənə baxdı. Mən də öz stəkanımı götürdüm.

– Bəli, mister Ramuli, mister Smit deyir ki, mənəvi həqiqəti dərk etmədən yaşayan insanların həyatı heyvan həyatıdır. Mister Smitə görə insanlar ancaq açıq mənəvi gözlərlə həyata baxdıqları zaman, yüksək mədəniyyəti anlayar və onun nümunələrini yarada bilərlər. Mister Smitin qəti etiqadı belədir ki, bu cür bir mədəniyyəti yaratmaqda Asiya xalqlarına kömək etmək amerikalıların tarixi vəzifəsidir və elə bunun üçün mister Smit öz gözəl məmləkətini buraxaraq, təbiət və ab-havası ağır olan bizim Hindistana gəlmişdir.

– Ol rayt...

Artıq mən "ol raytların" hər dəfə bir məna ifadə etdiyini anlamışdım. Odur ki, əziz qonağı incitməmək üçün onun istədiyini etmək məqsədilə tez zamındara baxdım. Zamındar gözləri ilə məni sakit etdi. Bu gözlər deyirdi: heç şey etmək lazım deyil. Zamındar yeni mətləb başladıqda bildim ki, bu dəfəki "ol rayt" onun danışığına aid imiş.

– Möhtərəm mister Ramuli, insanlara səadət vermək və həqiqəti onlara anlatmaq meylləri öz-özünə yerinə yetmir. Dinsizlər və cinayətsiz yaşaya bilməyən adamlar bu meyllərə müqavimət göstərirlər. Lakin mister Smitin fikri budur ki, elə adamlara qarşı da zor və güc lazım deyil. İstər Amerikada, istərsə buradakı hökumətin bugünkü siyasəti bu cəhətdən mister Smiti razı salmır. O, bu siyasətin təsirli olmadığını iddia edir, məhbəslər, qaranlıq zindanlar nəyə gərəkdir. Bir halda ki, daha təsirli vasitələrə əl atmaq olar.

Mister Smit, bozmu, sarımı rəngdə olduğunu hələ də müəyyən edə bilmədiyim gözlərini mənə dikdiyi halda, sönmüş trubkasının külünü təmizləmiş və indi də tütün doldururdu. Qəribə orasıdır ki, heç trubkaya baxmadan bu işi görürdü. Sanki barmaqlarının ucunda da bir cüt göz vardı. Mən: "Yəqin mister Smit öz trubkasından gecələr də ayrılmır, adət edib", – deyə düşündüm. Yalnız zamındar son cümləsini deyəndə mister Smitin tütünü trubkaya basan barmaqları dayandı və azca sərtliklə deyilən həmən sözlər eşidildi:

– Ol rayt.

Zamındar tələşla sözünə davam etdi:

– Mister Smit bu fikirdədir ki, bəşəriyyətin iztirablarına səbəb onun yanlış yollara düşməsidir. Ancaq həqiqət insanlığı xilas edə bilər. Mister Smit bilir ki, həqiqət öz kürsüsünü sizin dodaqlarınızda tapmışdır. Siz iki gün əvvəl Raxulun evində, dünən kənd meydanında bu həqiqəti deməkdən qorxmamışsınız. Mister Smitə görə belə bir qəhrəmanlığa ancaq göylər layiqli mükafat verə bilər. İnsan buna acizdir.

Mister Smit spiçkanı çəkərək qalın dodaqlarına aldığı trubkanı yandırdı. Yandıra-yandıra uşaq kimi kibritin gah boğulan, gah saçaqlanan alovu ilə oynayırdı. Alov kibritin nazik çöpünü yeyərək, mister Smitin barmağını yalayanda, o, külə dönmüş çöpü ağ mərmərdən qayrılmış balaca ağızlı fincana oxşar qaba saldı. Trubkanı sümürüb tüstünü havaya buraxdı və gözlədiyimin tərsinə olaraq, gözlərini üzümə dikmədi, burula-burula yuxarılara qalxıb yox olan tüstüyə baxdı. Artıq mənim üzümdə mister Smiti maraqlandıran bir şey qalmamışdır, – deyə düşündüm və fürsətdən istifadə edib onun üz-gözünü ətraflı öyrənməyə çalışdım. Lakin nə qədər baxdımsa, orada yeni bir cizgi və ifadə tapa bilmədim. İlk təəssüratda olan kimi, mənə elə gəldi ki, mister Smit çox sakit və xeyirxah bir adamdır. Hətta dünyada toyuğun da qanının tökülməsinə razı olmaz. Mister Smit mülayim və yumşaq səslə:

– Ol rayt, – dedi və zamındar da sözü dəyişdi.

– Bir mükafatdan çox bir təşəkkür olaraq bunu qəbul etmənizi mister Smit xahiş edir, – deyə ayağa durdu və stollardan birinin dalından bir şey götürdü. Bu, canlı güllərdən hörülmüş böyük bir boyunbağı idi. Onu öz əlləri ilə mənim boynuma saldı. Mən gözlərim yaşarmış halda təşəkkür edərək dedim:

– Sağ olun, mister Smit, mən haqq yolundan heç vaxt dönməyəcəyəm.

– Ol rayt...

Mən sözümü kəsib gözlədim. Çünki bu "ol raytların" mənasını ancaq zamındar yaxşı başa düşürdü və ona aid idi. Zamındar tez balaca qırmızı bir qutu gətirdi və əlində tutub gözümün içinə baxaraq dedi:

– Mister Smit deyir ki, güllər nə qədər qiymətli olsalar da, solub gedəcəklər. O isə istəyir ki, sizə elə bir xatirə qoyub getsin, nə zaman, nə də ruzigar onu soldura bilməsin. Həmişə ona baxanda mister Smiti xatırlayasınız.

Zamındar qutunu açdı. Oradan iri firuzəyi qaşlı bir üzük çıxardıb mənim orta barmağıma taxdı.

– Mister Smit deyir ki, bu bəxt üzüyüdür. Onu ancaq öləndə barmaqdan çıxarmaq olar.

Zamındar yerində oturdu və:

– Oturun, mister Ramuli, – dedi, – mister Smit and içib ki, həyatının olan-qalan günlərini bəşəriyyətə xidmətdə keçirsin. Yaxşılıq etsin, geridə qalanların gözünü açsın. Aclara çörək versin.

Zamındarın bu sözü məni ruhlandırdı. Fikir elədim ki, lap yeridir, neçə ildən bəri ona vergi borcu olan və heç cür bu borcu ödəyə bilməyən kəndlilərin tərəfinə ağız açım.

– Möhtərəm zamındar, – dedim, – bu gün Bişnə[1] özü sizin dilinizlə danışır. Doğrudan da insanı aclıqdan qurtarmaq böyük xidmətdir. Bizim kəndlilərin arasında...

– Ol rayt.

Bu "ol rayt" elə bərkdən çıxdı ki, mən heyrətlə mister Smitə və tez zamındara baxdım. Onların üzündə nə isə kölgəli bir şey gördüm. Lakin onlar bir an içində bu kölgəni qovdular. Adi təmkini, mehriban ifadə və təbəssümü bərpa etdilər. Zamındar sözünə davam etdi:

---

[1] *Bişnə* – üç hind allahından biri. Həyatı davam etdirən əsas (*Müəllifin qeydi*).

– Elə bu məqsədlə mister Smit burada çay plantasiyaları salmaq istəyir. Bizim kəndlinin illik gəlirin hesablasan, ayına səkkiz rupi[1] düşməz. Mister Smit bizim gücsüz, məhsul verməyən torpaqları götürüb, kəndlilərə də iş verməyi vəd edir. Hər işçiyə də ayda 15 rupi verəcəkdir. Beş il, on il, sonra elə ki, torpağı düzəltdi, münbitləşdirdi, kəndlilərimizi işləməyə öyrətdi, yerlərini özlərinə bağışlayıb birbaş Beytülmüqəddəsə gedəcəkdir. Mister Smitə görə bu dünyada Hind kəndlisinə kömək etmək, o dünyada cənnəti satın almaq deməkdir.

– Ol rayt.

Mən mister Smitin üzünə baxdım ki, görüm bu dəfəki “ol raytın” mənası nədir. Daha doğrusu, mən mister Smitin dünyaya və dünya malına etinasızlıqla dolu olan üzünə doyunca tamaşa etmək, o biri dünyada yüksək ilahi zövqlərin gözlədiyi ruhunun qəlinə baxmaq istəyirdim. Lakin onun üzündə pozğunluq əlaməti görüb narahat oldum. Zamındar da bir anlığa fikrin ucunu itirən və nə deyəcəyini bilməyən adam kimi çaş qalıb mister Smitə baxırdı. Mister Smit heç də ayağa durmaq lazım olduğunu andırmayan bir səslə bir də dedi:

– Ol rayt.

Zamındar deyəsən fikrin itmiş ucunu yenidən əlinə keçirmişdi:

– Bəli, möhtərəm Ramuli, mister Smit möhkəm əmindir ki, siz kəndliləri başa salarsınız. Haqq yoluna çağırarsınız. Üsyankar və qanmaz adamların ürəyini sakit edər, gözlərini açarsınız. Əlbəttə, Raxul kimi səhv yola düşənlər bir gün peşman olacaqlar. Mister Smit həqiqətin gücünə inanır. O inanır ki, raxulları sakit etmək üçün həqiqətin imkanları tükənməzdir. Həqiqət çox güclüdür. Onun dağları əzəcək, dizlərini qurudacaq, çayları dayandıracaq qüvvə və vasitələri var. Raxulu və onun kimi bədbəxtləri başa salın. Handinin ruhu sizə yar olsun.

Mister Smit yavaş-yavaş sönmüş trubkasını mərmər qaba döyərək külünü boşaldırdı. Yenə də gözlərini mənim üzümə dikdiyindən, mən ona ancaq ara-sıra baxırdım. Onun davamlı baxışlarına dözmək çətin idi.

– Ol rayt.

Mən bu dəfəki “ol raytın” ahəngindən anladım ki, mister Smit lap yorulmuşdur və söhbəti qurtarmaq lazımdır. Ayağa durdum. Onlara təşəkkür edib evdən çıxdım. Mister Smit zalın qapısına qədər baxışları ilə, zamındar isə sarmaşıqlı talvara qədər şəxsən məni yola saldı.

---

[1] *Rupi* – hind pulu.

Mən xeyirxah sözün qüvvəsinə, insan səadətinin zor və güc işlətmədən əldə ediləcəyinə daha artıq inamla zamındarın evini tərk edib sabah kəndlilərlə danışmağı qərara aldım.

3

Kəndlilərlə danışmaq üçün xüsusi səy göstərmək və ya fürsət gözləmək lazım gəlmədi. Kənddə hadisələr elə sürətlə inkişaf edirdi ki, belə bir imkan özü mənim qabağıma çıxdı.

Kəndin adi sakit həyatı pozulmuşdu. Küçələrdən tutmuş evlərə qədər hər yerdə iki kəndli bir-birinə rast gəldimi, dərhal mister Smitdən və onun təklifindən danışmağa başlayırdı. Heç kəs öz bir tikə torpağından əl çəkmək istəmirdi. Torpaqsızlar isə mister Smitin zamındardan daha amansız və pis olacağından qorxaraq, vəziyyətin olduğu kimi qalması tərəfdarı idi. Cürbəcür danışıqlar, narazılıq və söyüşlər kəsilmək bilmirdi. Ümumi rəy belə idi ki, mister Smit kənddən qovulsun. Bu rəyə kömək edən, onu möhkəmlədən və yaşadan, əlbəttə, Raxul və onun ətrafına toplanmış bir neçə nəfər idi. Söz yox ki, Çandra da onların içində idi. Görünür mister Smit də çox gözləmək istəmirdi. Mənim görüb anlaya bilmədiyim əllər kəndlilərə təzyiq edirdi. Bu təzyiq artdıqca narazılıq da artırdı. Hətta mister Smiti zorla kənddən çıxarmaq haqqında söhbət gedirdi.

Ertəsi günü səhər mən zamındarın göndərdiyi bir fincan keçi südünü, üç peçenye və bir bananı yedikdən sonra kəndə çıxdım. Divarları sökülmüş məbədin qabağında böyük bir izdihama rast gəldim. Camadar məbədin qapısı ağzındakı iri qara daşın üstünə çıxaraq deyirdi:

– Mister Smit amerikalıdır. O, sizin gördüyünüz əcnəbilərdən deyildir. O, bizim vətənimiz Hindistanın azad və abad olmasını istəyir. O nə desə bizim xeyrimizədir, o bizə çörək verəcəkdir.

Camadarı danışmağa qoymadılar.

– İstəmirik! İstəmirik o verən çörəyi!

– Amerikalıdır, Amerikaya getsin!

– Azadlığı, abadlığı bu qədər sevir öz xarabasında eləsin!

Camadar məni görcək daşın üstündən yerə düşdü və kömək istəyici nəzərlərlə üzümə baxdı. Mən cəsarətlə gedib daşın üstünə çıxdım:

– Qardaşlar, – dedim, – sizin ürəyinizdəki həsrətlər mənə aşnadır. Mən sizin dərdlərinizi bilirəm, yaralarınıza tanışam, budur, on beş

ildir, mən sizin balalarınıza atalıq edirəm, onlara dərs verirəm və həmişə də sizin yaxşılığınızı istəmişəm.

Kəndlilər susaraq, intizar içində məni dinləyirdilər. Mən danışdıqca bir-bir onların gözünə baxırdım. Bu gözlərdəki məhəbbəti də, sözümün axırını gözləyən intizarı da görürdüm. Özüm də həyəcanlanaraq sözümü qurtarmağa çalışdım:

– Lakin indi mən sizin səsinizdə qəzəb eşidirəm. Ürəyinizi döyündürən kin və qərəzdirsə, onu bir kənara atın. Gəlin düşmənimizə də səbirlə qulaq asaq. Bəlkə o bizə yaxşı söz deyəcək. Hirs və qəzəb aqillərin yolu deyil. Rama qardaşlıq və xeyirxahlığı bizə layiq görmüşdür.

Kəndlilər arasında bir pıçıltı, getdikcə ucalan bir dalğa keçdi. Mən soyuq gözlər və daş kimi sərt baxışlar altında gücümü itirərək yerə düşdüm. Raxul daşın üstünə sıçradı.

– Yoldaşlar, – dedi, – toxun acdan xəbəri olmaz. Bizim qursağımız qabırğamıza yapışmışdır, belimiz ikiqat olmuşdur, dözmüşük; bizə deyirlər bir az da dözün, belinizi bir az da əyin. Biz deyirik – Yox! – Daha bəsdir, aclığa dözməyəcəyik! İldə üç dəfə məhsul verəcək Hindistan torpaqlarında aclıq məhv edilməlidir. Daha belimizi əyməyəcəyik, biz də insanıq və insan kimi yaşamaq istəyirik.

Raxul bütün Asiyadan danışdı, Asiya xalqlarının azadlığından söylədi. Sonra Çini xatırlatdı. Nə isə amerikalı bir müstəmləkəçinin qolundan tutub evindən bayıra atan çinlinin nağılını danışdı və dedi:

– Biz də çinlilər kimi mister smitlərə deyirik: – Çıxın bizim evimizdən! Qoyun evimizin içində istədiyimiz kimi yaşayaq!

Kəndlilərin gurultusu köhnə məbədin divarlarını sarsıtdı:

– Rədd olsun əcnəbilər!

– Rədd olsun zalımlar!

Bu zaman ağılkəsməz və dəhşətli bir hadisə baş verdi. Uzaqdan toz qaldıraraq məbədə doğru gələn və günəş işığı altında işıldayan gözəl, yaraşıqlı bir maşın göründü. Hamı üzünü o tərəfə tutub durdu. Bu mister Smitin maşını idi. Görünür, zamındar və mister Smit özü kəndlilərlə danışmaq üçün gəlirdi. Raxul qışqırdı:

– Onlarla danışmayacağıq! Onları maşından çıxmağa qoymayın.

Bir yerə toplanmış həyəcanlı kəndli kütləsi qızğın seldən pis olur. Suyun ağzı hara düşdü, hansı səmtə yol aldı, dalı da oraya gedir. Kəndlilər:

– Qoymayacağıq! Qoymayacağıq!– deyib qışqırdılar.

Hərə yerdən bir daş aldı. Maşın gəlib kənarda durmaq istəyəndə onu daşa basdılar:

– Rədd olsun müstəmləkəçilər!

Rədd olsun zalımlar!

Daşların bir neçəsi maşının yanlarına dəyib əzdi. İşıldayan dəmir əyilib dərhal eybəcərləşdi. Maşın döndü və gəldiyi yolla sürətlə geri qayıtdı.

Mən bütün günü həyəcan içində keçirdim. Bu hadisənin dalını gözlədim: mister Smit və zamındarın şəhərdən polis dəstəsi çağıracağını güman etdim. Yenə qan töküləcək. Yenə Kali qan istəyir!

Lakin gün batıb qaranlıq bir axşam düşdü – polis gəlmədi; kənddə silahlı bir adam görünmədi. Ümumən zamındarın həyətinə gedib-gələn nökərlərdən başqa heç kəs oradan çölə çıxmadı. Öz-özümə dedim: – bəli, mister Smit kimi insanpərvər və müqəddəs bir adam gərək elə belə də hərəkət edə idi. O, silaha və polisə müraciət etməyəcəkdir. O, ədalətlə və səbirlə iş görəcəkdir.

Bu cür düşündüyümə baxmayaraq, mən gecə uzun müddət yuxuya gedə bilmədim. Fikrim çox narahat idi. Raxulu yola gətirə bilsəydim, kəndimizin üstünü almış fəlakəti aradan qaldırmış olardım. Kəndlilər Raxulun sözündən çıxmazdılar. Bu fikirlə durub çölə çıxdım. Hindistanın açıq və geniş göyləri ulduzlarla dolu idi. Bu ulduzlar da bizi xeyirxahlığa, qardaşlığa çağırırdı. İndi mən hər şeydə, bütün kainatda pozulmaz bir ahəng duyurdum. Ah, insanlar qızğın ehtiraslarını boğsalar, bir-birini bağışlasalar, kin və qərəzdən əl çəksələr, nə qədər xoşbəxt olarlar!

Bu fikirlərlə mən Raxulun daxmasına yaxınlaşırkən, qaranlıq içərisində Çandranın dəhşətli naləsini eşitdim. Ürəyim parça-parça oldu. Çandra nə üçün ağlayır, nə üçün belə fəryad edir? Özümü tez daxmaya yetirdim və yerimdə donub qaldım. Çandra astanadaca yıxılıb ölmüş Raxulu qucaqlayaraq ağlayırdı. Gah əllərini, gah üzünü üzünə sürtür, saçlarını oxşayırdı. Mən Çandranın qolundan tutub qaldırdım:

– Çandra, ona nə oldu? Bəlkə özündən getmişdir?

Çandra qəzəb və kin dolu gözləri ilə üzümə baxdı və qolumdan tutub Raxulun cənazəsinə tərəf çəkdi, ox kimi onun sinəsində sancılıb qalmış bıçağı göstərdi:

– Bax, Ramuli, gör atamı necə öldürmüşlər! Bu zülmə daşlar da dözməz. Dilə gəlib intiqam, intiqam deyə nalə çəkərlər!

Çandra danışırdı.

Lakin bu dəqiqə mən nə onun səsini eşidir, nə də özünü görürdüm. Qanlı hərb meydanlarında, insan cənazələrinin arasında çalınan dəhşətli bir musiqi qulağımdan çəkilmir, rəqs edən, atılıb-düşən ölülər gözümdən uzaqlaşmırdı.

Kali təntənə çalırdı. Yetmiş min başlı, yetmiş min ayaqlı, yetmiş min caynaqlı hərb allahı torpağı dörd tərəfdən qucaqlayaraq, didib dağıdırdı.

4

Bu dəfə mən dəvət gözləmədən zamındarın evinə getdim. Camadar qapıda məni qarşıladı. Qanlı gözləri ilə üzümə nifrətamiz bir nəzər saldı və zamındara xəbər apardı. İki dəqiqə keçməmiş zamındar özü qapıda göründü.

– Ah, mister Ramuli! Buyur içəri, – deyib məni məlum zala apardı. Mən içəri girən kimi eyni yerdə oturmuş və trubkası dodaqlarında tüstüləyən mister Smitin səsini eşitdim:

– Ol rayt!

Mən oturmadan həyəcanla dedim:

– Raxulu çox amansız öldürmüşlər. Canini tapmaq və qanunun əlinə vermək lazımdır.

Mister Smit və zamındar baxışdılar. Məni yormaqda olan sözləri yenə də eşitdim.

– Ol rayt.

Zamındar məni təskin etdi:

– Nə etməli, Ramuli, hələ dünyanın düzəlməsinə çox qalıb. Raxul özü günahkardır. Hey gücdən danışırdı, xəncərdən dəm vururdu, xəncərlə də öldürdülər. Mister Smit bu ölümə çox təəssüf edir. Ürəyi o qədər xarab olub ki, bu gün nahar da etməyib. Baxın, mister Smit görün nə qədər ağarmışdır.

Doğrudan da mənə elə gəldi ki, iztirab mister Smitin rəngini qaçırmışdır. Mister Smit yenə hərəkətsiz gözlərini mənə tutub durmuşdu, mənim həyəcanlarıma şərik olar kimi görünürdü.

– Ol rayt!

Zamındar meşələrə qaçmış Çandranın pozğun işlərindən danışdı.

– Mister Ramuli, mən çox xəcalət çəkirəm. Mister Smit bir hind qızının silah götürüb quldurlara başçılıq etməsini insan əxlaqının nəhayətsiz düşkünlüyü hesab edir. Mister Smit haqlıdır. Lakin mister Smit rəhmdil adamdır. O Çandraya da yaxşılıq arzu edir. Onun da sakit

olmasını istəyir. O qız dünən gecə bizim nökərlərdən birini tutaraq öldürmüş, o biri nökərlə də belə bir kağız göndərmişdir.

– Ol rayt!

Artıq mən bu səsə alışdığımdan gözümü zamındarın üzündən çəkmədim və onun uzatdığı kağızı oxudum. Bu kağızı Çandra, mənim yazmaq öyrətdiyim Çandra öz uşaqlıqdan tanış olan xətti ilə yazmışdı. Kağızda o, zamındarı hədələyir, mister Smitin iki günə kənddən çıxmasını tələb edirdi. Əks halda zamındarın evinə od vuracağını yazırdı.

– Görürsənmi, mister Ramuli, dünya nə qədər xarab olmuşdur. İnsan əxlaqı gör nə qədər pozulmuşdur. Mister Smit deyir ki, bu elə bir dərddir ki, dərmanı ancaq xalqın ruhani atalarındadır. İnsanın ruhu tərbiyə olmayınca, əməlləri düzəlməz. Ramuli, mister Smit, Çandranın da xilasını sizdə görür.

– Məndəmi? Mən Çandraya nə edə bilərəm?

– Siz onun yanına gedin, evinizə dəvət edin. Başa salın, mister Ramuli. Biz sizə inanırıq. Mister Smit də, mən də inanırıq ki, sizin vicdanınız təmizdir. Niyyətləriniz xoşdur. O zavallını haqq yoluna çəkin. Deyin ki, biz hər şeyi ona bağışlayırıq. Torpaq da özünün olsun, pul da verərik, həyatını yoluna salsın. Qoy meşələrdən çıxıb atasının evinə qayıtsın.

Mən təzadlı duyğularla, hələ məndən nə istənildiyini və nə edəcəyimi aydın bilmədən qulaq asırdım. Mister Smit öz rəhmdil və uşaq baxışlarını mənə dikmişdi. Dünyanın dərdinə yana-yana trubkasını tüstülədirdi.

– O rayt!

Zamındar mister Smitə baxdı və cibindən kağız çıxardıb yazdı.

– Alın, mister Ramuli, bu da bizim sözümüz. Çandraya yetirin. And içir və yazılı olaraq ona söz veririk. Həyatı amandadır.

– Ol rayt!

Mən tələsik durub çıxmaq istədim. Axı, Çandranın həyatı və gələcəyi mənim əlimdə idi. Ona mən əbədi sülh və səadət aparırdım. Lakin mister Smitin son "ol raytından" sonra zamındar məni saxladı.

– Mister Ramuli, həqiqətin təntənə yolları tükənməzdir. O, Çandranı da sakit edə bilər... Ona deyin ki, tutduğu səhv yoldan nə qədər tez dönsə o qədər yaxşıdır.

Mən həm mister Smitə, həm də zamındara ürəkdən təşəkkür edib çıxdım və Çandra ilə görüşmək üçün vasitələr axtarmağa başladım.

Nəhayət, onun atasına yaxın olan kəndlilərdən birinə iki sətirlik bir məktub verib meşəyə göndərdim. Məktubda yazırdım ki, mütləq, çox vacib məsələ üçün mənimlə görüşməlisən. Beşcə dəqiqəliyə də olsa görüşməlisən. Sabahısı Çandradan cavab aldım. O, mənimlə görüşəcəyini vəd edirdi. Mən artıq bütün rahatlığımı itirərək, gecə-gündüz Çandranı gözləyirdim. Birinci axşam olanda ondan bir xəbər çıxmadı. İkinci gün də o gəlmədi. Bu müddətdə kənddə müxtəlif şayiələr yayıldı. Həyəcanlar soyumaq bilmirdi. Deyirdilər ki, Çandranın dəstəsi hər saat, hər dəqiqə artır. Yaxın kəndlərdən də narazılar onun başına toplanırlar. Hətta şəhərlərdən də onun dəstəsinə gələnlər varmış. Onların zalım və müstəbidlərdən amansız intiqam aldığı, yoxsul və məzlumların dadına çatdığı haqqında dastanlarda deyilən hekayətlər danışılırdı.

Budur, nəhayət, Çandra özü də gəldi. Gecədən xeyli keçmiş, yerin qaranlığı qatılaşıb ulduzları göy tabağının dibsiz dərinlərinə qovduğu zaman qamış daxmanın dalından məni səslədilər. Mən tez bayıra sıçradım.

– Gələn, kimsən?

– Ramuli, məni çağırmışdın, gəlmişəm, – deyə Çandra qaranlıqda öz mehriban və yumşaq əli ilə mənim əlimi sıxdı, – tez söylə, nə xəbər var?

– Əziz Çandra, – dedim, – sənin taleyin işıqlıdır. Səadətin qapıları üzünə açılmışdır.

– Nə səadət, Ramuli? – deyə o, titrək səslə soruşdu.

– Bax, bu səadət, – deyib mən zamındarın verdiyi kağızı qaranlıqda onun ovcuna sıxdım, – sənə azadlıq verirlər. Sənə toxunmayacaqlar.

– Bəs mənimlə meşələrə dolmuş zavallılar, Ramuli? Bəs onların yara-yara olmuş ürəklərinin sızıltısını kim kəsəcəkdir? Bəs atamın intiqamı? Bəs yüz minlərlə atam kimilərin cənazəsini saxlaya bilməyib fəryad qoparan vətənin yaralarını kim sağaldacaqdır, Ramuli?

Mən Çandranın üzünü seçə bilməsəm də orada sərt və dönməz bir iradənin ifadəsini görürdüm. Onun səsi ağır və vahiməli idi. Mən onun ayaqlarına yıxılmaq, yalvarıb fəlakətli yoldan döndərmək istədim.

– Çandra! Ürəyini daşa döndərən bu fikirləri bir kənara at. Taleyinlə barış. Bu böyük və əzablı dünya ilə barış. Ancaq barışanların ürəyi sakit döyünür.

– Ohh, Ramuli, mən elə bilirdim ki, bu fəlakətlər sənə təsir edər, səni xalqın tərəfinə, bizim tərəfimizə çəkər.

Mən ona sözünün dalını deməyə imkan vermədim:

– Mən həmişə sizinlə olmuşam, Çandra. Vicdanım şahiddir ki, xalqımın əleyhinə bir addım atmamışam. Fikrim insanları qardaş və dost görmək olub. Hamını xoşbəxt görmək istəmişəm.

Qeyri-ixtiyari olaraq gözlərim yaşardı və səsim titrəyib qırıldı. Çandranın ürəyi yumşaldı:

– Ehh, Ramuli, hamı sənin kimi olsaydı, bəlkə də xeyirxah söz dünyanı düzəldərdi. Lakin hamı sənin kimi deyil. Bu kağızı sənə verənlər, bıçağı atamın sinəsinə batırmışlar. İndi onlar sənin əlinlə məni dar ağacına çəkmək istəyirlər. Yox, Ramuli, biz çox yuxuladıq. Artıq ayılmışıq və gözlərimiz açıqdır.

– Sən səhv edirsən, Çandra. Atanı onlar öldürməmişlər, onlar mənim öz yanımda bu faciəyə təəssüf etdilər, gözləri yaşardı.

Çandra acı-acı güldü:

– Gözləri yaşardı, eləmi? Bax belə şeylərə inandığın üçün Ramuli, onlar səni axmaq hesab edirlər. Hələlik, Ramuli, mənə zamındar və mister smitlərin verdiyi səadət lazım deyil.

O, zamındarın kağızını parça-parça edib havaya sovurdu və əlimi sıxdı:

– Hələlik, Ramuli. Ayılanda və bizim tərəfimizə keçəndə mən xəbər çatdırarsan, səni yanımıza apararıq.

Bir anda Çandra yox oldu. Mən ətrafdakı daş və kəsəklərin dibində hənirti duydum. Çətinliklə seçə bildiyimə görə bu Çandranın iki silah yoldaşı idi. Mən gözlərimi qaranlığa zilləyib onlar gedən səmtə baxır və gözləyirdim ki, kənddən çıxsınlar. Bir neçə dəqiqə bu qayda ilə durdum. Qarışıq fikirlər, anlaşılmaz şübhə və təzadlar içində Çandranın gələcəyini düşünürdüm ki, uzaqdan uca səslər eşitdim. Deyəsən bir neçə adam kimi isə qucaqlayıb tutmaq istədilər.

Kim isə kürəyinə bıçaq soxulmuş kimi qışqırıb susdu. Yenə adamlar bir-birinə sərindilər. Dalbadal üç güllə açıldı.

Sonra bütün kənd, bütün ətraf əvvəlkindən daha ağır sükut və qaranlığa qərq oldu.

5

Mən bir qərara gələ bilmirdim. Bu nə hadisədir? Çandragili pusub tutmaqmı istəmişlər? Yoxsa təsadüfən baş verən bir toqquşmadır? Görəsən Çandra nə oldu? Tutdular, yoxsa kənddən salamat çıxıb getdi? Bütün bu suallara cavab vermək mümkün deyildi. Mən belə qərara gəldim ki, dərhal zamındarın yanına gedim. Çandra tutulmuşsa, ver-

dikləri sözə əsasən onu azad etdirim. Lakin bu fikrimdən döndüm. Səhərin açılmasını gözləməyi qərara aldım. Səhər hər şey aydın olar və nə edəcəyimi bilərəm.

Səhər kənddə müxtəlif şayiələr gəzirdi. Kimi deyirdi ki, gecə Çandranın dəstəsi zamındarın evinə hücum etmişdir. Evi yandırmaq istəmişlər. Vuruşmada Çandranın adamları ölmüş, özü isə yaralanıb qaçmışdır. Başqa bir şayiəyə görə o, tutulub zindana salınmışdır. Mən bildim ki, indi kəndlilər arasında şayiələr getdikcə artacaq və həqiqəti bilmək olmayacaq. Ancaq zamındardan səhih bir məlumat almaq olardı. Bu məqsədlə də mən zamındarın evinə yollandım. Lakin zamındar evdə yox idi. Qarşıma çıxan camadar bildirdi ki, zamındar mister Smitlə birlikdə hara isə getmişlər və bütün günü evə gəlməyəcəklər. Camadar gözlərimə qəribə dəyirdi. O, danışarkən ağız-burnunu qəribə bir şəkildə əyir və ayaq üstdə zorla dururdu. Mən dönüb getmək istədikdə, o birdən qorumdan tutub məni həyət qapısına yaxın balaca daxmaya çəkdi.

– Gəl, gəl, bir az da mənimlə otur, ay alim...

Mən onun bu hərzəliyinə qarşı etiraz edənə qədər o məni içəri saldı. Həsir döşənmiş otağın bir küncündə bir boşqab ətli, sarıköklü düyü xörəyi, iki boşalmış və bir yarımçıq şüşə gördükdə məsələni anladım. Camadar çiynimdən basıb məni yerə oturtdu və şüşədən fincana şərab tökdü:

– Al iç, al filosof, indi de görüm kimi güdaza verməyə gəlmisən?

Hirs məni boğsa da camadarın bütün təhqirlərini udur, onun qızğınlığının soyumasını gözləyirdim. O isə hey danışırdı:

– Özünü məndən uca tutma. Biz ikimiz də bir yuvanın quşuyuq. Sən də adam öldürürsən, mən də. Sən sözlə, mən bıçaq ilə. Sənin bıçağın sənin dilindir. Aldadırsan, tora salırsan, gətirib verirsən bu misterlərə... ha... ha...

O, mənim üçün tökdüyü şərabı başına çəkdi və yenə dolduraraq gətirib qabağımda tutdu:

– De görüm. Hər adam öldürməyə sənə nə qədər verirlər? Ancaq düzünü de, nə qədər alırsan? Mənə az verirlər. Cəmi on rupi. Başlarına dəysin. On rupi üçün tər tökməyə dəyərmi? Eybi yoxdur, acından ölməkdən bu yaxşıdır.

Mən yavaş-yavaş onun çirkin və rəzil təbiətinə alışırdım, artıq əvvəlki hirs və qəzəbimi boğmuşdum.

– Camadar, – dedim, – axı, hindlilər meyvə suyundan başqa heç nə içməzlər. Bu nədir, sən buna hardan öyrənmisən?

O, ucadan güldü və yumruğunu mənim açıq sinəmə vurdu:

– Özünü avam göstərmə, ay filosof. Mən sizin hamınızı yaxşı tanıyıram, məni aldada bilməzsiniz. Mən xeyirxah və dəbdəbəli sözlərdən tikilmiş donunuzun altındakı cır-cındırdan xəbərdaram. Məni aldada bilməzsən. Al, iç, zamındar hələ sənə çox pul verəcək. Özünü bərk saxla. Bu gecə Çandranın tuta bilmədilər. İki polis öldürüb qaçdı. Amma yoldaşlarından biri öldü. Zamındar səni qızıla tutacaq ki, onu bir də tələyə tərəf gətirəsən.

Mən ömrümdə birinci dəfə olaraq şəraba qarşı ürəyimdəki ikrah hissini boğdum. O, kilidli dilləri açırsa, alınmaz sirləri aşkar edirsə, gör onda nə qüvvə var! Camadar isə danışırdı:

– Mənim zəhmətimə qiymət vermirlər, Ramuli, mənim bir qarışqa qədər qiymətim yoxdur. Raxulu öldürmək üçün mənə nə qədər versələr yaxşıdır? Cəmi on beş rupi.

Məni heyrət, dəhşət və qorxu basmışdı. Deməк, Raxulun qatili qabağımdadır, onu öldürən budur.

– Hə, Raxulu yaxşımı vurmuşdum? Çox ustalıqla oldu. Daldan çatdıq ona. Uşaqlar qollarını tutub dala burdular. Mən də bıçağı düz ürəyinin başından sancıb bir dəfə burdum və bıçağı sinəsində qoyub qaçdım.

Artıq mən camadarın sözlərinə heyrət etmirdim. Qorxu və dəhşət hissi də keçmişdi. İndi bütün varlığım nifrətlə dolu idi. Bu nifrəti yeyə-yeyə mən bəzi şeylər öyrənməli idim.

– Onun öləcəyindən zamındar xəbərdar idimi?

– Necə xəbərdar deyildi! Mister Smit bu fikri onun başına saldı. Axı, bu amerikalı yaman bicdir. Zəhəri şərbət yerinə verər, xəbərin olmaz. Al, iç. Məni avam yerinə qoyma, al, iç, ay filosof...

Camadar yenə danışır, söyürdü, söyür, danışırdı. Mister Smitin maşını gözlənilmədən səslənməsəydi, mən onun əlindən necə qurtaracağımı bilmirdim. Maşın səsini eşidən kimi camadar həsiri şüşələrin və çirkli qabın üstünə qatladı.

– Gördün? Bunlara inanmaqmı olar? Hər işləri belədir. Şeytan da əllərində acizdir. Deyirdilər ki, nahara da gəlməyəcəyik, iki saat keçməmiş qayıtdılar.

Camadar əlinin dalı ilə ağzını silərək, özünü yığışdırıb həyətə çıxdı. Mən də onun dalınca özümü çölə atdım. Sarmaşıqlı talvarın altında yavaş-yavaş yeriyən və trubkasını tüstülədən mister Smit soyuq şüşə gözləri ilə camadarı da, məni də süzdü.

– Ol rayt!..

Zamındarın da şübhə dolu nəzərləri bizə dikilmişdi. Onların baxışları da, təmiz və nəzakətli zahiri görkəmləri də məni təhqir edir, əsəbiləşdirir, içimdəki qəzəb və kini coşdururdu. Zamındar hələ uzaqdan:

– Ahh, mister Ramuli, – dedi, – mister Smit və mən təəssüf edirik ki, sizin sözləriniz Çandranı haqq yoluna qaytara bilmədi. Biz inanırıq ki, siz təslim olmazsınız. Həqiqi dindarlar və haqpərəstlər kimi yenə onu fəlakətdən qurtarmağa cəhd edərsiniz.

Görünür, mənim gözlərim, üzüm və bütün vücudum alov saçırdı. Çünki zamındar birdən sözünü kəsib soruşdu:

– Mister Ramuli, naxoş deyilsiniz ki?

– Zamındar, bu oyunları qurtarmaq lazımdır! Mən sizə inanırdım. Lakin bu qədər alçaq olduğunuzu təsəvvür etmirdim. Siz mister Smit, bundan da alçaqsınız!

Mister Smit yavaşca trubkasını dodağından çəkdi. Mən indicə onun "ol rayt" deyəcəyini gözlədim. Lakin bu dəfə o, susub iki addım qabağa atdı və mənə yaxınlaşdı. Tanımadığım boğuq və sərt bir səslə:

– Axmaq! – dedi, – özünü düşün və boş-boş danışma.

– Yox, mister Smit, mən boş danışmıram. Mən sizə deyirəm: alçaq, alçaq, alçaq! İndi mən həqiqəti bilirəm və onu hamıya deyəcəyəm!

Dönüb getmək istədim. Lakin odlu bir şey bir anda üzümü yandırdı. Mən Mister Smitin yanına enən trubkalı əlindən yapışıb silkələdim və öz əlini öz üzünə çırpdım.

* * *

Sonrası yəqin ki, sizə də məlumdur: məni tutdular, quldurlarla əlaqə saxlamaqda, ikiüzlülük edərək zamındarı və mötəbər bir ağanı aldatmaqda, onların etibarını qazanıb xəyanət etməkdə təqsirləndirdilər və mühakimə etdilər. Bütün xainlərə dərs olsun deyə, mənə ölüm cəsazı kəsdilər.

İndi mən ölümü yox, Çandranı və həyatı düşünürəm.

Məni dar ağacının altına aparıb "axırıncı sözün nədir?" deyə soruşurlar, mən sözlərimin ona çatacağına sarsılmaz bir inamla cavab verirəm:

– Çandra, möhkəm dur, səadət mübarizədədir!

*1953*

## FIRTINA QUŞU

Sənədli povest

*Dünyanı ancaq namusla idarə etmək olar. Dövlət və bayraq ancaq namusla ucalır.*

***Nizami***

*Sən ey məğrur qartal! Sən düşmənlərlə döyüşlərdə həlak oldunsa da, mərd və qorxmaz adamların mahnısında əbədi yaşayacaqsan. Sən insanları azadlığa və işığa çağıran – yıxılmaz heykəl olaraq qalacaqsan!*

***Maksim Qorki***

*Sənə dedim: Saqın, dəryaya çıxma, indi ki, çıxmısan ürəyini tufanlara tapşır!*

***Sədi***

Eşq olsun zəka sahiblərinə! Eşq olsun qüdrətli və cəsur insanlara! Onlar olmasaydı, həyat nə qədər yeknəsəq olardı!

Mən bir adam tanıyıram. O bizim dağların qoynunda dünyaya gəlib, orada böyüyüb, durna gözlü bulaqların suyu ilə pərvəriş tapıb. Uşaqlıqdan eşitdiyi Koroğlunun nağılları, Qaçaq Nəbinin mahnıları olub. Cuşa gəlib oxuyanda dağlar səsinə səs verib. O, bizim Kiçik Qafqaz sıra dağlarının yüksək zirvəsində əsatiri gözəlliyə malik olan Murovdağın ətəyində yaşayır. Mən onunla ömrümün əfsanəvi günlərindən birində görüşməli oldum. O mənə yoldaşlıq elədi. Sıldırım qayalarda, keçilməz keçidlərdə, uçurum dərələrdə bələdçim oldu. Bir səhər biz Yanşaq kəndindən atlara mindik. Gədikləri aşdıq, zirvələrə qalxıb-endik. Çaylardan adladıq. “İt yolu” adlanan dar, ensiz, daşlı-qayalı və çox ağır bir cığırla Murovun zirvəsinə qalxdıq. Oradan aşağı enib Kəpəzin cənub üfüqlərindən adlayaraq, gah ağışa, gah doluya düşdüyümüzə baxmayaraq, gözəlliyindən doymadığımız yerlərdən keçib yamyaşıl otlaqlardakı qoyun sürülərinə baxa-baxa, çobanlarla ayaqüstü söhbət edərək, gəlib bizim misilsiz incə və zərif gözəlliyi ilə hamını heyran buraxan Göy gölə çatdıq.

Bir dəstə idik. Hamımıza başçılıq edən İlyas kişi idi. Çünki bu yerləri heç kəs onun kimi tanımırdı. O hər daşa, hər qayaya, hər cığıra, hər dərəyə bələd idi. Bilirdi harda nə təhlükə var, hansı cığır hara

gedib çıxır. Onun həyatının ən xoş xatirələri bu sıldırım qayalarla bağlıdır. Neçə-neçə qarlı qış gecələrində o, sinəsini bu qayalara sıxıb ovun bərəsinə gəlməsini gözləmiş, hətta vəhşi heyvanlarla da vuruşmalı olmuşdur.

Bəli, vəhşi heyvanlarla! Axı, belə insanlar var – qorxunun nə olduğunu bilməyən insanlar! Adi zamanlarda quzu kimi sakit və mülayim olan, təhlükə vaxtı isə pələngə dönən adamlar əfsanə deyil, nağıl deyil, həqiqətdir. Var və yaşayırlar. İlyas kişi belələrindəndir. Neçə il əvvəl altmış-altmış beş yaşı olanda o, soyuq bir qış günündə dağ meşəsinin keçilməz yerində ac pələnglə gözlənilmədən üz-üzə gəlmişdi. Qorxu? Dəhşət?! Yox, mübarizə! Ölüm-dirim çarpışması! Bu döyüşdə İlyas kişi pələngin boğazını iki pəncəsi arasına keçirə bilmiş, kilidlənmiş pəncələrini gücü gəldiyi qədər sıxmış, pələng boğulub həlak olana qədər sıxmış, sıxmışdı...

Biz Murovun zirvələrinə qalxan ili İlyas kişinin yaşı səksənə yaxın idi. O, atın üstündə qırğı kimi otururdu. Mən onun dağ bulağı qədər təmiz, qartal gözlərinə, yəhərdə sıldırım qaya kimi təmiz, qartal gözlərinə, yəhərdə sıldırım qaya kimi dikələn şax gövdəsinə baxıb düşünürdüm ki, insan necə də təbiətin ayrılmaz bir hissəsinə çevrilə bilər?! Onu bu sərt qayalardan, daşlı-çınqıllı yamaclardan, dibində bulaqlar şırıldayan dibsiz dərələrdən, keçilməz qalın meşələrdən ayırmaq mümkün deyildi. Mənə elə gəlirdi ki, o bizim əzəmətli dağların bir parçasıdır: o, dağlarsız, meşələrsiz yaşaya bilməyəcəyi kimi meşələr və dağlar da onsuz yaşaya bilməzlər. Bəlkə pələngə qalib gəlməsinin sirri elə bundadır ki, arxasını dağlara söykəmişdir. Burada hər qaya, hər qarış torpaq, hər ağac, hər daş onun köməyidir, havadarıdır. Bəlkə... Bəlkə... Bunun başqa sirri var? Axı, İlyas kişidən də gənc və qüvvətli adamlar olub ki, cəld, zirək və amansız pələngə, hətta ondan çox-çox ağır və tənbəl hərəkət edən ayıya rast gələndə özlərini itiriblər, çaşıblar. Qorxudan dilləri söz tutmayıb, qışqırmağa səsləri gəlməyib, qıçları titrəyib əsdiyindən qaça da bilməyiblər.

Yox, həqiqi qəhrəmanlıq qüvvətli qollarda, qüdrətli gövdədə deyil, möhkəm ruhdadır. Cəsur və işıqlı ürəkdədir. Ürəyə işıq salan nədir? Cəsarət hardandır? Eşq olsun insanın özündə yanan günəşə ki, onun adı zəkadır, ağıl və idrakdır! Bu günəş olmasaydı insanın qəhrəmanlığı ilə pələngin yırtıcılığı arasında heç bir təfavüt olmazdı. Bu günəş hamının ürəyində yanır, hərədə bir cür işıq verir.

İlyas kişi ilə Murovun ətəklərindəki ilk görüşümüz uzun illərin dostluğuna çevrildi. O, səs-küyünə alışa bilmədiyi Bakıya gəlib mənim evimdə qaldığı günlərin xoş, məhrəmanə söhbətləri zamanı mən anladım ki, bu kişinin pələngə qələbə çalmasının ən azı daha iki sirri var. Bu sirlər onun canındadır, təbiətinin xüsusiyyətidir. Otağın içində dəri papağını başından çıxarmayan bu qocada mən böyük bir müdriklik və daxili mədəniyyət gördüm. Bu mədəniyyət onun ədəb-ərkanla dolu sözlərində, hərəkətlərində hiss olunurdu. İkinci xüsusiyyət bu idi ki, İlyas kişi əsil adamdır və adamlara məxsus gözəlliklərdən ləzzət alır. Söhbət yaxşı məqsədlər naminə özünü oda-alova atan kişilərdən, qış gecələrində kəndə soxulan yalquzaqlarla vuruşan igidlərdən, qorxulu keçidlərdə tək-tənha pusquda duraraq ac yırtıcılara atəş açan qoçaqlardan düşəndə biləsiniz, İlyas kişinin gözləri necə alovlanır, necə hərarətlə adamı qızdırırdı!

Bilmirəm nə üçün məhz indi mən bu kişini xatırlayıram. Halbuki mənim fikrim tamamilə başqa bir qəhrəmanla məşğuldur. Bəlkə ona görə ki, amansız tale bu qəhrəmanı qəzəbli pələnglə, ac canavarla vuruşmaqdan da artıq mərdlik, dözüm, qəhrəmanlıq və zəka tələb edən bir vuruş meydanına atmışdır və o da öz taleyinin bu qismətini mərdmərdanə qəbul etməklə taleyin özünə də meydan oxumuşdur! Bəli, əziz dostlarım, mən sizə elə bir adam barədə danışmaq, elə bir adamın yazılmamış böyük dastan, çalınmamış qəhrəmanlıq simfoniyası olan həyatından söhbət açmaq istəyirəm ki, ancaq fərhadlara və prometeylərə nəsib olan bir səadət ona nəsib olmuşdur. Yox, bu səadət yalnız mərdlik deyil, yalnız cəsarət deyil. Yalnız o deyil ki, bu adam amalını taleyindən üstün tuta bilmiş, yaralı halda qanı axa-axa düşmənlərin əlinə keçdiyi halda diz çökməmiş, tabe olmamış, məğrur bir qartal kimi son nəfəsə qədər vuruşmuş və şərəflə həlak olmuşdur. Yox, onun səadəti təkcə bunda deyil. Yeni əsrin müqəddəs azadlıq fədailərinin sırasında ona şərəfli yer qazandıran keyfiyyət başqadır. Bu adamın daxilində yanan günəş əbədiyyət günəşi idi. Ölüm adlanan qaranlıq zülmət onun gözlərinə əbədi olaraq pərdə çəkəndə də o, işığa, səadətə, insana inamını itirməmişdi. Yer üzündə haqqın və azadlığın qələbə çalacağına inanaraq gözlərini yummuşdu. Mən qəti inanıram ki, bəşərin azadlıq və namus fədailərindən olan Cordano Bruno əsrləri yaran gözləri ilə gələcəyə baxarkən dediyi bu müqəddəs və böyük sözləri bizim də qəhrəmana çatdırmaq istəmişdir: “Ləyaqət və qəhrəmanlıqla ölmək, alçaq yollarla qələbə çalmaqdan yaxşıdır”.

1

Tehranın Şücaülsəltənə xiyabanında baği-şahın mücəssəmə meydanı yaxınlığındakı evlərdən birində bircə otaqdan ibarət olan kirayə bir mənzildə üz-üzə iki adam oturmuşdu. İkisi də fikirli idi, ikisinin də ürəyi ziddiyyətli fikirlərlə döyünürdü: məhəbbət və nifrət! Halbuki bircə saat əvvəl onlar qucaqlaşıb öpüşdükləri zaman nə qədər xoşbəxt idilər, heç ağıllarına da gəlməzdi ki, söhbət belə uğursuz bir istiqamətdə davam edəcək və indiki ağır nöqtəyə gəlib çıxacaqdır.

Kirayə mənzilinin sahibi Xosrov Ruzbeh neçə il idi ki, doğma vətənində gizlin yaşayırdı: onun ölüsü və ya dirisi barədə xəbər gətirənlərə Əmniyyəti sazman[1] böyük xələtlər vəd etmişdi. O, casuslardan yayınmağa, dostlarla gizli görüşməyə, zəif və qorxaqların yanından tanışlıq vermədən etinasızlıqla ötüb keçməyə, vəfasızları, satqınları nifrətlə, istehza dolu gözlərlə yola salmağa öyrənmişdi. Hərarət və sədaqət gördüyü insanlara isə o, elə bir məhəbbət göstərirdi ki, ürəyini çıxart ver desəydilər əsirgəməzdi.

Bircə saat əvvəl günəş bataraq Tehranda qaranlıq bir payız axşamı düşəndə gizli iş və partiya yoldaşı Əzim Əsgəri ilə birlikdə Nurməhəmməd Aynasazın gəldiyini gördükdə o, heyrət etdi, istədi özünü tanımamazlığa vursun. Lakin az danışan, hər sözü eyhamla və işarələrlə mənalandıran Əzim Əsgəri dedi:

– On il əvvəl necə görmüşdün, elədir. Ürəyi təmiz, fikri rövşən. Ölsə də xəyanət bacarmaz...

Nurməhəmməd Aynasaz isə uzun ayrılıqdan sonra əziz atası ilə görüşən sədaqətli bir oğul hərarəti və məhəbbəti ilə qollarını açıb irəli yeriyəndə Xosrovun sinəsindəki insanlıq hissləri gizli işləməyə və gizli yaşamağa məcbur olan adamın ehtiyatkarlığına qalib gəldi. O da qollarını açıb neçə ildən bəri görmədiyi əziz tələbəsini qucaqladı. Onlar adətə müvafiq üç dəfə öpüşüb döş-döşə söykənərək durdular, sonra ayrılıb hər ikisi dəsmal çıxartdı, yaşarmış gözlərini sildi.

Nurməhəmməd Tehranın kübar ailələrindən idi. Xosrov naib-əvvəl dərəcəsi alaraq zabitlər məktəbində dərs dediyi zaman ona rast gəlmişdi. Bu gənc mənsub olduğu mühitdəki tay-tuşlarından öz sadəliyi, hüsn-əxlaqi, səykarlığı ilə seçilirdi. Mənsəb və var-dövlət cəhətcə ondan aşağı olan sinif yoldaşlarından nəinki öz üstünlüyünü şişirdib gözə soxmur, hətta bundan utanır, bunu gizlətməyə çalışırdı. Onlarla

dostluq edib, özünü onlardan aşağı və sadə tuturdu. Bütün bunlar və dərslərdə göstərdiyi müvəffəqiyyətlər bir müəllim olaraq Xosrovun diqqətini cəlb etmişdi, yeri düşdükcə onu tərifləmiş, ona mehribanlıq göstərmişdi. Gənc Nurməhəmməd də müəllimi sevmişdi; əsaslı bilik vermək meylinə, müstəsna ciddiyyətinə və tələbkarlığına görə sevmişdi. Onların arasında yaranan yaxınlıq yavaş-yavaş əsil dostluğa və mənəvi ünsiyyətə çevrilmişdi. Əlbəttə, elə o zamanda Xosrov, Nurməhəmmədin gəncliyini, cəmiyyətdəki vəziyyətini, ata-anasının yüksək mövqeyini nəzərə alaraq öz siyasi əqidələrini ona açmamış, onu gizlin inqilabi işə çəkmək təşəbbüsündə olmamışdı. Lakin İranın tərəqqisi, xalqın irəliləməsi və yaşayışının yaxşılaşması kimi ictimai məsələlərdə və əxlaqi anlayışlardakı fikir birliyi müəllimlə tələbə arasında möhkəm daxili rabitə yaratmışdı. Sonra isə iş elə gətirdi ki, orduda mütərəqqi zabitlər dəstəsi bir sıra müvəffəqiyyətsizliklərə uğrayıb təqib olunmağa başladı. Xosrov tutuldu. Zindandan qaçdı, yenə tutuldu. Yenə qaçdı və nəhayət, tamamilə gizli yaşamağa, gizli işləməyə məcbur oldu. Beləliklə də Nurməhəmməd Aynasazla onun arasında dostluq əlaqələri tamamilə kəsildi.

Lakin ta qədim zamandan dünyanın hər yerində insan həyatı, insan taleyi gözlənilməz dönüşlərlə dolu olmuş və doludur. Bir də görürsən ki, gərdiş səni elə hadisələrlə üz-üzə gətirdi ki, yatsan yuxuna da girməz. Bu gün Nurməhəmmədin Əzim Əsgəri ilə gəlişi də Ruzbeh üçün belə gözlənilməz hadisələrdən idi və hələ indiyə kimi Ruzbeh bunun səbəbini dürüst aydınlaşdıra bilmirdi: Nurməhəmməd öz təşəbbüsü ilə bura gəlib, yoxsa onu bu işə təhrik edən var? Əlbəttə, Ruzbeh bu barədə nə Nurməhəmməddən, nə də Əzim Əsgəridən bir söz soruşmadı. Əvvəla ona görə ki, astanadan içəri girmiş qonağı sorğu-suala çəkməzlər. Gəlib, xoş gəlib, göz üstdə yeri var. İkinci də sorğu-sual onları yanlış fikirlərə sala bilərdi, elə başa düşərdilər ki, Ruzbeh öz həyatı üçün qorxur, daimi səksəkə içində yaşayır.

– Əyləş! – deyib Ruzbeh püxtələşmiş, yaşa dolub daha da gözəlləşmiş gəncə otağın ortasındakı balaca mizin başında yer göstərdi. Yaxşı cilalanmış, son dərəcə yaraşıqlı bu cür mizlər İranda çox dəbdədir və onların arxasında oturub çay içərək dostanə söhbətlərə dalmağı İranın ziyalı dairələrində çox sevirlər. Nurməhəmməd ədəb gözləyib göstərilən yerdə oturmadı, özündən yaşca xeyli böyük olan köhnə müəllim və dostunun oturmasını gözlədi. Ruzbeh mizin bu

tərəfindəki səndəliyə əyləşdikdə Nurməhəmməd də öz yerinə çökdü. Kənarda, şah nökərləri kimi əl-əl üstdə durub Ruzbehlə Nurməhəmmədi diqqətlə seyr edən Əzim Əsgəri birdən Ruzbehin iti nəzərlərini öz üzərində hiss etdi. Sanki Ruzbehin iri, qara gözlərindən od çıxıb onu qarsıdı. Bu da səbəbsiz deyildi: Əsgərinin zahiri hərəkətləri, mütiliyi, əl-əl üstdə qulluğa hazır durması Ruzbehə həmişə pis təsir bağışlardı. Ruzbehə görə gizli inqilabi təşkilatın üzvü olan bir adama yaraşmazdı ki, öz əqidə və məslək yoldaşlarının yanında da özünü kiçik bir xidmətçi kimi aparsın, tundnəvis (stenoqraf) olduğu İran məclisinin əyan və əşrəfdən ibarət senatlarları və məclis üzvləri qabağında belə durmaq bəlkə də məqbul idi. Lakin inqilabçı yoldaşların qabağında əl-əl üstdə qulluğa hazır dayanmaq mənəvi naqislik idi. Xosrov belə düşünmüşdü, nə etməli? İllər ərzində hər gün, hər saat vərdiş etdiyi bu hərəkətdən əl çəkmək görünür, Əzim üçün çox çətindi. “Tərk-adət və mövcibi mərəzəst” – deyən məşhur fars məsəli ilə ona bir növ bəraət qazandırmış, Ruzbehə ikrah duyğusunu susdurmağa çalışmışdı. Buna baxmayaraq, hər dəfə onun baxışları odlu iynə kimi Əzim Əsgərinin gözlərini dəlib içinə keçirdi. Bu baxışların təsiri ilə o, dərhal soruşurdu:

– Nə buyurursunuz, ağayi Ruzbeh?

İndi bu sualı eşitdikdə Ruzbeh səsini yumşaltmağa çalışaraq dedi:

– Buyur, sən də əyləş.

Əzim Əsgəri təlaş dolu gözlərini Ruzbehin gözündən qaçırdı.

– Siz söhbətdə olun, mən də çay tədarükündü – deyib otağın küncünə çəkildi. Balaca elektrik samovarını götürüb çay hazırlamağa başladı.

Hər hərəkəti qətiyyət və iradə ilə dolu olan Ruzbeh iri gözlərini ondan çəkib Nurməhəmmədə tərəf döndü. “Doğrudan da Nurməhəmmədin üz-gözündən gənclik təravəti ilə yanaşı cazibədar bir təmizlik və doğruluq yağırdı. Bu təmiz və işıqlı üzdəki təbəssüm, bu qara gözlərdəki aydın və mehriban baxışlar heç bir zaman maska, pərdə, örtuk olub pis niyyətləri, çürük daxili aləmi gizlədə bilməzdi. On ildən artıq təqiblərə, gizli fəaliyyətə baxmayaraq, dönə-dönə satqın və iradəsiz adamlara rast gəldiyinə baxmayaraq, Xosrov özü daxilən bir uşaq qədər saf və təmiz idi. İnsana inamı itirməmişdi. Buna görə də Nurmə-

---

[1] Dövlət təhlükəsizlik idarəsi.

həmmədin gəncliyinə, gözəl və cazibədar görkəminə, gözlərindən, alnından, simasından daşıb tökülən işığa – ürək işığına inanaraq bütün şübhələri rədd edib, eyni işıqlı və mehriban gözlərlə ona baxdı. Nurməhəmməd dərhal bu gözlərdə "nə əcəb, xeyir ola?" sualını oxudu və yavaş-yavaş təmkinlə sözə başladı:

– Əziz müəllim! – dedi, məni bura gətirən hisslərin və fikirlərin ucalığından danışmağı artıq bilirəm. Bizim aramızda etibara layiq bir dostluq və inam olmasaydı belə, o fikirlər yenə məni bu addımı atmağa vadar edərdi. Hər ölkədə elə adamlar var ki, onlar yalnız dostlar və qohumlar üçün qiymətli deyil, bütün vətən üçün qiymətlidir və hər bir vətən övladının borcudur onları qorusun, çalışsın ki, onlar mümkün qədər vətənə çox xeyir versinlər.

Nurməhəmmədin söhbəti hara gətirəcəyini dumanlı şəkildə təxmin edən Ruzbeh ona sıxılmadan fikirlərini bütün aydınlığı ilə ifadə etmək imkanı vermək üçün: – Həqiqətən uca fikirlərdir! – dedi. – Kaş vətənin bütün övladları belə bir şüura malik olaydı!

Nurməhəmməd doğrudan da ruhlanıb vəcdə gəldi və daha da açılışaraq davam etdi:

– Mən bu əqidədəyəm ki, hər bir istedadlı insan və xüsusən istedadla bərabər bilik, təcrübə və çalışqanlıq bir sərvətdir ki, onun mislibərabəri yoxdur. Qızıl, gövhər, cavahirat hamısı onunla müqayisədə heç nədir. Onu ancaq əla poladdan qayırılmış kotana qayırılmış kotana oxşatmaq olar ki, işləndikcə özü açılıb parıldayacaq, vətən torpağını isə laləzara çevirəcəkdir. Bəs belə bir kotanı küncdə-bucaqda qoyub paslatmaq və axırda korşaldıb xarab etmək insafsızlıq olduğu qədər də axmaqlıq deyilmi?

Xosrov təsdiq etdi:

– Əlbəttə. İdeal cəmiyyət odur ki, insan üçün elə həyat şəraiti yaratsın ki, hər bir vətəndaş verə biləcəyini bütünlüklə və cani-dildən, heç bir sıxıntı çəkmədən cəmiyyətə versin. Belə cəmiyyətdə hər kəs, istedad və bacarığına görə yer tutur və hər kəs də tutduğu yerdən razı qalır.

– Çox şadam ki, fikirlərimiz bir-birinə uyğun gəlir, – deyib gənc Nurməhəmməd bir az da həvəsləndi. – Gözəl söz dediniz. Hərə öz istedad və bacarığına görə! Mən bunu belə anlayıram ki, hər istedad sahibi öz təhsilinə, biliyinə, təcrübəsinə görə hansı sahədə daha çox xeyir verə bilərsə, o sahədə də çalışmalıdır. Məsələn, insaf deyil ki, on

illərlə elm oxuyub mühəndislik sənətini tamamlamış bir adamı göndərəsən yer qazsın və ya yük daşısın.

Ruzbehin qalın topa bığları qaçdı.

– Bizdə həyata real nəzərlə baxan gəncliyin yetişməsi məni çox sevindirir.

– Belə xəstə halları görəndə ciyəri od tutub yanan təkcə mən deyiləm, inanın ki, bugünkü İran gənclərinin yüzdə doxsan doqquzu bu cür düşünür. Lakin nə etsinlər, əllərindən nə gələr?!

– Necə yəni əllərindən nə gələr?! – deyib Ruzbeh heyrətlə soruşdu. – Yüzdə doxsan doqquzu bu sözü deyə bilər. O bu gün öz qüvvəsini dərk etməyibsə, sabah dərk edəcək. Lakin sizin kimi qabaqcıl adamlar ümumi bədbinliyə qapılıb o "əlimizdən nə gələr?" – deyəndə mən buna təəssüf etməyə bilmərəm.

– Mən "qabaqcıl" kimi, məsul vəzifəni üstümə götürmürəm. Olsa-olsa mən yüzdə doxsan doqquzdan biriyəm. Çünki cəmiyyət işlərində başçı olmağın ağırlığını təsəvvür edirəm. Şair yaxşı deyib:

Aqil məbaş ta ki, qəmi digəran xori,
Divanəbaş ta qəmi to digəran xorəd.[1]

– Çox gözəl beytdir, şairanə deyildiyinə söz ola bilməz. Lakin cəmiyyət işlərinə laqeydliyi, biganəliyi ifadə etdiyi üçün mənim əqidə və anlayışlarıma ziddir. Siz doğrudanmı xalqınıza və cəmiyyətinizə biganəlik təbliğ edən fəlsəfəni qəbul edə bilərsiniz?

Bayaqdan bəri söhbətin başqa səmtə düşəcəyindən qorxan Nurməhəmməd Xosrovun bu sualından istifadə edərək istədiyi mətləbə keçdi.

– Biganə olsaydım, bura gəlməzdim, əziz müəllim, – dedi, – Məni bura gətirən yalnız sizə olan hədsiz məhəbbətim və sədaqətim deyil, həm də vətən məhəbbətidir, xəyalən hər gün qarşısında yüz dəfə diz çökdüyüm xalqıma olan məhəbbətimdir!..

Bu sözləri deyərkən Xosrov, Nurməhəmməd Aynasaza diqqət etdi. Ruzbeh, xalq və vətən məhəbbətindən danışarkən ağzı köpüklənən yüzlərlə, minlərlə boşboğazlar görmüşdü ki, bunların içində ən

---

[1] Ağıllı olma ki, başqalarının dərdini çəkəsən, divanə ol başqaları sənin dərdini çəksin.

adi baqqallardan tutmuş məclis vəkillərinə və vəzirlərə qədər hər cür adamlar tanıyırdı. "Vətən" və "xalq" sözləri onların əlində İran bazarlarını doldurmuş ən adi sikkə idi, gah bu, gah başqa dövlətin valyutası idi, faydalı alış-veriş zamanı işə yarayırdı. Əməldə isə onlar xalq və vətən yolunda bir gecələrini də yuxusuz keçirməzdilər. Zahirdə belələri daha qızğın və hərarətli görünsələr də, əslində içiboş və hiyləgər satqınlar idi. Yox, Nurməhəmməd sakit danışırdı. Ağzı köpüklənmirdi. Dodaqları titrəyib əsmirdi. Yalnız gözlərində kədərli xəyallar oynayırdı və bu da Ruzbehi onun səmimiyyətinə inanmağa vadar edirdi.

– Yaxşı, de görüm, sənin sinən belə müqəddəs duyğularla dolu ikən, mənim sənə nə köməyim dəyə bilər? Axı, heç bir insanın dünyada vətən məhəbbəti ilə döyünən ürəkdən doğru yol göstərəni ola bilməz.

– Elə məni bura gətirən də o ürəkdir, əziz müəllim! – deyib Nurməhəmməd qeyri-adi bir hərarətlə, gözlənilməz bir vəcdə qapılaraq davam etdi:– Yalvarıram, dönün o yoldan, qayıdın o uçurumun ağzından... Axı, siz bu torpağa, bu vətənə lazımsınız. Sizin kimi istedadlarımız yüz deyil, min deyil, tək-təkdir... O yol ki, siz indi tutmusunuz, o yolla sizdən başqa minlər, on minlər gedə bilər. Amma başqa bir yol ki, siz gedə bilərsiniz, onların heç birisi onu gedə bilməzlər. Siz gözəl müəllim, misilsiz ixtiraçı, dərin mühakimələri ilə hamıdan seçilən bir filosof...

Nurməhəmməd sözünü nədənsə yüksək ahənglə davam etdirə bilmədi, sanki özü də səsindəki qeyri-adiliyi hiss edib birdən-birə dayandı, fikrə getdi. Uzun və ağır yol gəlmiş müsafir kimi yorğun halda və yavaş-yavaş dedi:

– Əlbəttə, özünüz bilən yaxşıdır. Siz məni bağışlayın. Belə bir cəsarəti ədəbsizlik hesab etməyin. Mən bura gəlməli idim, bu sözləri sizə deməli idim. Bu mənim vicdani borcum idi. Qalanı öz işinizdir.

Əziz Əsgəri hər iki müsahibin sükut içində dərin fikrə getməsindən istifadə edib çoxdan süzdüyü və soyumuş çayları təzələdi. Keçib yanını pəncərə sürahisinə söykəyərək laqeyd bir seyrçi kimi kənardan onlara tamaşa etməyə başladı.

Elə bu zaman yenə onun baxışları Xosrovun baxışları ilə çarpazlaşdı. Nədənsə bu dəfə Xosrovun gözləri açıldı və qəribə bir şeyə baxır kimi Əsgərinin gözlərinə dikilib qaldı. Əsgəri isə daxilində oyanan qorxuya və nifrətə bənzər bir duyğunun təsiri ilə gözlərini ondan qaçırmırdı. Lakin deyəsən bu, Xosrovu şübhəyə saldı:

– Sən necə bilirsən, Əsgəri? – deyib ona müraciət etdi. – Nurməhəmmədin sözlərindən ağlın bir şey kəsirmi?

Əsgəri çox tez cavab verdi, bir saniyə də gözləməyə qoymadı.

– Səhərdən fikir verirəm, çox dərin sözlər danışır. Ancaq hələ ki, başa düşmürəm, axır mətləbi nədir.

Xosrov, Əsgəridən qəti bir söz, aydın bir fikir gözləmirdi. Partiya daxilindəki mübahisələrdə də, o heç vaxt müəyyən bir cəbhə tutmazdı. Hətta beş yoldaş mübahisə edəndə də Əsgərinin mövqeyini bilmək olmazdı. Eyni zamanda mübahisələrin, mübarizələrin axırında o, həmişə qalib gələn fikrin tərəfində olardı, özü də lap əvvəldən bu fikrin mücahidi olan adam kimi! Ruzbehin ürəyində ona qarşı soyuqluq oyadan da bu idi. Lakin "Əməli işdə, gündəlik fəaliyyətdə bunlarsız da keçinmək olmaz" fikri bu soyuqluğu bir növ neytrallaşdırırdı. Ruzbeh gözlərini Əsgəridən çəkib hələ də öz hissiyyatı ilə məşğul olan gənc Nurməhəmmədə dikdi:

– Deməli, tutduğum yoldan dönüm, qayıdım geri?!

– O çox xətərnək yoldur! – deyib gənc təkid etdi.

– Xətərnək olmağı hələ lazımsız və faydasız olduğuna dəlil deyil. Ancaq qorxaqlar və miskinlər qorxulu olduğuna görə tutduqları yoldan dönərlər.

– Əziz müəllim, mənim bildiyimə görə sizin əqidələriniz dini və mövhumi təsəvvürlərə ziddir, hər bir insan əməlini ağlın hökmü ilə məqbul və ya qeyri-məqbul hesab edir. Belə isə cəsarət edib soruşuram: bir yolun ki, indiki şəraitdə heç bir yerə çıxmadığı məlumdur, o yol ilə getməyin xeyri nədir? İrəli atılan hər bir addım bizi uçuruma yaxınlaşdırırsa, nahaq qurbanların sayını artırmaq faydasız deyilmi? Dünyanın indiki şəraitində bu torpaqda sizin nəqşələriniz baş tutan deyil, çünki vətənimizin taleyini daxili qüvvələrin tənasübü həll etmir, bu tale – bütün tarixə meydan oxuyan daha böyük dövlətlərin münasibətindən və iradəsindən asılıdır.

Ruzbeh də yavaş-yavaş qızışmağa başlayırdı.

– Mən isə sarsılmaz bir inamla deyirəm ki, bütün vətəndaşlarının ürəyi vətənpərvərlik duyğuları ilə birləşmiş mütəşəkkil bir xalq heç şeyə baxmaz və öz azadlığı yolunda hər cür maneələri aradan qaldırar. Hətta üç-beş milyonluq balaca bir xalq belə, istədiyinə nail ola bilər. Biz isə iyirmi milyondan çoxuq.

– Lakin dediyiniz şərtlərə diqqət edin: vətənpərvərlik duyğuları ilə birləşmiş bir xalq! Biz havaxt bu dərəcəyə gələcəyik, Allah bilir. İndi isə tacir bir yana çəkir, ərbab bir yana. İşsizlik, ehtiyac, cəhalət də ki, öz işini görməkdədir. Kənardan uzanan düşmən əli bizim içimizdə daha çox müttəfiq tapır, nəinki ürəkdən xalqın halına yananlar...

Ruzbeh gülüb əllərini açdı:

– Siz sözünüzə zidd gedirsiniz. Bu vəziyyət ürəkdən yananları geri çəkilməyə, iflas etməyə yox, daha dönməz, daha inadla mübarizə aparmağa məcbur etməlidir. O vaxta qədər mübarizə aparmalıyıq ki, vətənin bütün namuslu adamları, bütün xalq bunu dərk edəcək, heç kəs öz beş quruşluq xeyri üçün kənardan uzanan düşmən əlini sıxmayacaq, əksinə, o əli nifrətlə rədd edəcəkdir. O zaman görərsən Firdovsi yurdu nəyə qabildir, "Şuru", "Çahargahı" yaradan xalq daha nələr yarada bilər!

Nurməhəmməd, Xosrovun məntiqini bəyənsə də, onun inamındakı səadət və ucalığa daxili bir hörmət duysa da dediklərini əməldən uzaq bir şey kimi qəbul etməkdə idi. Onun bir gözündə Xosrovun arzu etdiyi dünya və xalq canlanırdısa, o biri gözündə qüdrətli ərbablar, tacirlər, vəzirlər, dövlət dəsgahı açan, əmniyyə, sərhənglər, sərtiblər, xəfiyyələr, zindanlar, neft konsersyumu, göylərdə ildırım sürəti ilə uçan qırıcı və bombardmançı təyyarələr canlanırdı.

– Nə deyirsiniz, deyin, o gözəl arzular xəyalətdir. Biz real şəraitlə hesablaşmağa məcburuq. O, isə bizi istədiyimiz kimi yox, zərurətə görə tərpənməyə məcbur edəcək, yol palçıq olanda harın atlar belə dördnala çapa bilmirlər. Qapı alçaq olanda pəhləvanlar da bellərini əyib keçirlər...

Bu vaxta qədər təmkin və səbrini birtəhər saxlayan Ruzbeh bu sözləri qeyri-adi bir qəzəb və əsəbiliklə rədd etdi:

– Bu, əsil ümidsizlik və acizlik fəlsəfəsidir, miskin fikirlərdir! Nə deyirsiniz, qapı balacadır, belimizi əyək, hə?! Yol ağırdır, qabaq uçurumdur, qaranlıqdır deyə biz bataqlıqda, üfunət içində çapalayıb ölək?! Bir kişi tapılmasın ki, qollarını işığa, təmiz üfüqlərə doğru açsın, eləmi? Məgər keçən əsrdə təhkimçilik Rusiyasında azadlıq yolunda vuruşanlar bizdən yaxşı şəraitdə idilər? Məgər orta əsrlərdə inkvizisiya bütün Avropanı qaranlıq bir zindana çevirdiyi zaman azadlıq təşnələrinin yolu bizdən aydın və geniş idi? Yox, səhv edirsən! Bu acizlikdir, nökərçilik və qulluq ruhudur ki, bizi belə miskin hala salıb, içərimizdə uçmağa, qanadlanmağa, ucalara qalxmağa qabil olan hər şeyi məhv edib. Bizi bir

soxulcana çevirib ki, yemək-içmək və sürünməkdən başqa bir amalımız qalmayıb. Ar olsun o millətə ki, onun içində yüksək əməllər naminə ölümə hazır olan oğullar və qızlar tapılmayacaq!

Xosrovun sözləri bir ox kimi Nurməhəmmədin sinəsini deşib gənc ürəyinə batsa da, onun üzündə qırmızı ləkələr yaratsa da, o tabe olmaq istəmədi. Hələ də o, öz əqidəsində möhkəm idi və öz fikirlərini müəllimlə ciddi mübahisə yolu ilə də olsa müdafiə etməyə hazır idi.

– Mən sizi realist təfəkkürə malik bir adam kimi tanıyıram. Yenə təkrar edirəm, gərək ki, inandığınız fəlsəfə də xəyalata uymağı yox, həyatın real şəraiti ilə hesablaşmağı üstün tutur. Belə isə yaşadığınız məmləkətin daxili və xarici vəziyyətini nəzərə almadan hazırda yerinəyetməz xəyallara qapılmağın xalqa və millətə nə kimi xeyri ola bilər?!

– Deməli, bizim torpaqda azadlıq, tərəqqi, səadət qeyri-mümkündür?!

– Əstəğfürullah! Mən elə söz deyə bilmərəm. O əqidədə olsaydım, nə bura gələrdim, nə də bundan sonra yaşamaqda bir məna tapardım. Mən ancaq onu deyirəm ki, düz yol seçənlər mənzilə daha tez çatırlar.

– Xob, iltifat edib buyurun görək hansıdır o düz yol?

– Hər halda mən sizin kimi vətənə, millətə sədaqətli, bacarıqlı, istedadlı adamları keçilməz bir divara gətirib çıxarmış yolu düz yol hesab edə bilmərəm.

Söhbət gah açıq şəkil alır, dalğalanıb coşurdu, gah da üstüörtülü şəklə düşür, eyhamlar və işarələrlə davam edirdi. Əlbəttə, hər iki müsahib bu işarələrin, eyhamların dalındakı mənanı dərhal və bəlkə də bizim təsəvvür etdiyimizdən çox geniş və çox dərin şəkildə başa düşürdü. Ruzbehin bayaqdan bəri bu söhbəti genişləndirməkdən məqsədi Nurməhəmmədin görüş və anlayışları barədə daha ətraflı təsəvvür almaq idi. Artıq indi bu barədə dumanlı bir şey qalmadığını kəsdirib əsil mətləbə keçdi:

– Bilmək istərdim ki, bir dost kimi, məni istəyən bir adam kimi təklifiniz nədir?

Məsələnin belə aydın qoyuluşu Nurməhəmmədə də xoş gəldi. Çünki o birdən-birə arzusunu bildirməyə çətinlik çəkir, Ruzbehin mənliyinə toxunmaqdan qorxurdu.

– Əlbəttə, mənim fikrim çox naqis ola bilər. Ancaq məhəbbətdən doğduğu üçün bağışlarsınız. Mən istəyirəm ki, siz vətənimizə və xalqımıza verə biləcəyiniz xeyri verəsiniz. İstəyirəm sizi üzə çıxaraq...

Xosrov bu təklifi gözləmirdi. Buna görə də dərhal qaşları çatıldı:

– Yoldaşlarının bir hissəsi dar ağacından asılmış, bir hissəsi vətəndən uzaq salınmış, əqidə və amalı dövlət tərəfindən təqib olunan, özü dönə-dönə zindandan qaçmış bir adamı necə üzə çıxarmaq olar?

– O adamın istedadını, qabiliyyətini, biliyini və vətənə etdiyi müsbət xidmətləri, nəhayət, tamamilə başqa bir sahədə, xalqın tərəqqi və inkişafı sahəsində verə biləcəyi misilsiz faydaları nəzərə almaq yolu ilə.

– Siz güman edirsiniz ki, əmniyyənin keşiyində duranlar, dövlətin qüdrətini qoruyanlar bunları nəzərə alarlar?!

– Onlara təsir etmək üçün də müəyyən dairələr var. Elə adamlar var ki, siyasətə qarışmasalar da dövlət yanında özlərinin vəzni ağırdır, sözlərini yerə salmazlar.

– Əvəzində də mən çalışmalıyam ki, onların üzünü ağ eləyim. Elə bir əmələ yol verməyim ki, utanmalı olsunlar. Özüm utansam da, qızarsam da eyib etməz, eləmi?!

– Başqa bir yol ilə siz indiki zamanda xalqın, vətənin tərəqqisinə daha çox xidmət göstərə bilərsinizsə, burada məncə, utanmalı bir şey yoxdur.

– Var. Həm də çox şey var. Bədnamlıq var. Nakişilik var.

– Mən isə o yolda qələbə görürəm. Xosrovun qələbəsini, düşmənlərə və rəqiblərə qələbə çalacağını görürəm!

– Neçə yüz il əvvəl İtaliyada alicənab bir adam yaşayıb. Əlbəttə, sən oxumuş adamsan, sözlərini eşidən kimi onu tanıyacaqsan. O deyib: "Ləyaqət və qəhrəmanlıqla ölmək, alçaq yollarla qələbə çalmaqdan yaxşıdır!".

Nurməhəmməd pərt oldu və ancaq:

– Cordano Bruno!– deyə bildi.

Araya dərin sükut çökdü. Söz gəlib daşa dirəndi. Əvvəldə dediyimiz kimi dostların arasında uçurum açıldı.

Balaca, cilalanmış mizin üstündəki armudu stəkanlarda məxməri çay buğlanırdı. Çox qədimdən qalmış və taleyin anlaşılmaz yolları ilə gəlib bura düşmüş çini qəndqabı, iri doğranmış parça qəndlə dolu idi. Azərbaycanda olan kimi, İranda da məhz bu cür qəndlə çay içməyi sevərlər. Xüsusən kirayə mənzilin sahibi Xosrov bunun aşiqi idi. Gərgin işlədiyi və yorğun olduğu zaman bir stəkan təzədəm, məxməri çayı və bir parça qəndi sədri düyüsünün plovuna da dəyişməzdi. İndi isə nə o, nə də onun gözlənilməz qonağı çaya məhəl qoyurdu. Stəkanlardakı çay üç dəfə soyumuş və atılaraq yenidən doldurulmuşdu. Gördüyümüz

kimi balaca mizin başındakı adamlar buna fikir də verməmişdilər. Onlar gah bir-birini süzüb fikrə gedir, gah da hərarətlə söhbət edirdilər. Onlar nəinki çayı, hətta bütün dünyanı unutmuş kimi idilər.

Əzim Əsgəri isə öz işində idi. Kənarda sakit oturmuşdu. Bütün fikri bunda idi ki, görsün Xosrov və onun gözlənilmədən gəlmiş qonağının nəyə ehtiyacı var. Onlardan biri siqaret qutusuna əl atan kimi, o kibrit yandırırdı, çay soyuyan kimi təzə çay töküb gətirirdi. Özü isə mizin yanında üçüncü səndəl olmasına baxmayaraq, yanını pəncərə sürahisinə qoyub oturur, gözlərini söhbət edənlərə zilləyib lal-dinməz dayanırdı. O, dördüncü dəfə çayları təzələyib kölgə kimi pəncərə qabağına çəkildikdə, Xosrovla üzbəüz oturmuş gənc əlini qara yumşaq saçlarına (deyəsən onlara azca yağ vurmuşdu) çəkərək təəssüf dolu gözəl qara gözlərini hara isə naməlum bir nöqtəyə dikib dedi:

– Söz yox ki, uca fikirdir, gözəl sözdür:– Ləyaqət və qəhrəmanlıqla ölmək, alçaq yollarla qalib gəlməkdən yaxşıdır! Çox yaxşı sözdür! Ancaq mən heç vaxt istəməzdim ki, mənim dostlarımdan və tanışlarımdan kimə isə bu cür ölüm qismət olsun. Axı, sözdə demək asandır. Lakin ona əməl eləmək çətindir, çox çətindir, mən heç vaxt elə vəziyyətə düşməmişəm ki, "ləyaqətli ölüm və ya alçaq qələbədən" birini seçməli olam. Lakin bunun nə qədər ağır vəziyyət olduğunu təsəvvür edirəm və bu fikirdəyəm ki, yüz adamdan biri də tapılmaz ki, iş, əməl məqamına gələndə "Ləyaqət və qəhrəmanlıqla ölməyi" yaşamaqdan üstün tutsun.

Xosrov qeyri-ixtiyari olaraq yerindəcə qımıldandı. Qarabuğdayı siması, piyalə kimi iri gözləri, geniş alnı ani bir təbəssümlə işıqlandı. Gənc hiss etdi ki, bu təbəssüm deyil, istehzadır. Həm də acı bir istehza. Lakin gənc inciyib pərt olmadan təmiz ürəklə dedi:

– Ümumiyyətlə, heç kəsə arzu eləməzdim.

Bu sözü deyən kimi gənc, Xosrova baxdı. Baxdı və sarsıldı. Onu indicə görür kimi, onda nə isə yeni bir keyfiyyət kəşf etmiş kimi gözləri açıla qaldı. Xosrovun iri əlləri, oxumuş adamdan artıq səhərdən axşama qədər qızmar kürə qabağında işləyən dəmirçinin əllərini xatırladırdı. Geniş və işıqlı alnı isə onu qədim zamanların filosoflarına oxşadırdı.

– Mən ancaq buna təəssüf edə bilərəm! – deyib Xosrov ürəyə işləyən sözlərin dalındakı fikirləri oxuyan iti gözləri ilə qabağındakı gənci süzdü, onun şəvə kimi qara və yumşaq saçlarına, qız alnı qədər gözəl

və təravətli alnına, qara, məhəbbətli gözlərinə, incə cizgiləri ilə ürəyə xoş gələn üzünə baxdı. Bu baxışlardanmı, yoxsa sözlərdənmi qızardığına əhəmiyyət vermədən davam etdi: – Təəssüf edirəm ki, sizin kimi rövşənfikir, ziyalı bir gənc bu cür düşünür və həyatın ən yüksək zövqündən məhrumdur.

Gənc də öz növbəsində istehza ilə soruşdu:

– Ləyaqət və qəhrəmanlıqla ölməkdən, eləmi?!

– Əziz dostum, budur, bizi bir-birimizdən ayıran divar buradan başlanır. Siz həyatın yüksək zövqünü rahatlıqda, yaxşı yeməkdə, yaxşı geyməkdə, ehtiyacdan azad xoş güzəranda görürsünüz və mənə təklif edirsiniz ki, bu güzəran naminə etiqad və ideallarımdan əl çəkim. Sədi deyir ki:

Təne adəmi şərifəst becane adəmiyyət,
Nə həmin libase zibast becane adəmiyyət...[1]

Nurməhəmməd hiss edirdi ki, getdikcə ürəyinin dərinlərindən Xosrov Ruzbehə qarşı anlaşılmaz soyuq bir fırtına qalxmaqdadır. Bu fırtınanı boğmağa, zahiri təmkini və üzündəki xoş ifadələri saxlamağa cəhd edirdi. Özünü zorlamağa çalışırdı. Lakin buna tamamən müvəffəq ola bilmirdi. Buna görə də Sədinin məşhur şerini eşidəndə özünü saxlaya bilməyib Ruzbehin sözünü kəsdi və şerin o biri beytini ucadan söylədi:

Əgər adəmi beçəşməsto dəhano guşo bini
Çe miyan nəqş divar və miyane adəmiyyət.[2]

Xosrov da açıq hiss edirdi ki, aralarındakı zahiri mehribanlıq, şəxsi hörmət və ehtiram sovuşmaqda, yerini dərinlərdən qalxan barışmaz fikirlərin və görüşlərin mübarizəsinə verməkdədir. Burada zahiri ədəb gözləmək – mahiyyəti gizlətmək, Xosrovun fikrincə, əxlaqın qanunlarını pozmaq idi.

---

[1] İnsanın bədəni insanlıq ruhu ilə şərəflidir,
Gözəl paltar hələ insanlıq nişanəsi deyildir.

[2] Əgər göz, ağız, qulaq və burun adamı adam eləsəydi, onda naxışlı divarla adamın arasında nə fərq ola bilərdi?

– Tutaq ki, mən yaxşı yaşayış naminə siz deyən kimi etdim, bu mənə nə verə bilər? Bəli, iki-üç ilə gördüyünüz bu kasıb kirayə otaqdan qurtararam. Tehranda özümə görə mənim də evim, həyatim, güzəranım olar. Hətta, Şimran yaylağında da yaxşı bir istirahət evi düzəldə bilərəm. Lakin nəyin bahasına? O şeyləri itirmək bahasına ki, mən insanlığı onlarda görürəm. Belə olanda da vicdanım mənə bir saat rahatlıq verməyəcək.

– Marksistlərin bu qədər idealist olduğunu mən bilmirdim! – deyib gənc Nurməhəmməd zarafatla vəziyyəti yüngülləşdirmək istədi. Lakin öz fikirləri ilə məşğul olan Ruzbeh bu zarafata əhəmiyyət vermədən davam etdi:

– Tutaq ki, mən sabahkı xoş güzəran naminə, sizin təsəvvür etdiyiniz gələcək cəlbedici mənzərə naminə bütün varlığımla nifrət etdiyim və nifrətlərini duyduğum adamlarla sazişə gəldim, bəs keçmiş həyatımın məşəqqətlərini, gördüyüm yersiz, amansız təhqirləri, təhinləri unuda bilərəmmi?

– O adamlara ki, nifrətiniz var və onlar da sizə nifrət edirlər, elələri ilə görüşməzsiniz! – deyib Nurməhəmməd bağışlanmaz səthi bir mülahizəyə yol verdi.

– Siz elə güman edirsiniz ki, mənim kiminləsə şəxsi ədavətim var?! Mən həyatımda belə xırda duyğulardan həmişə uca olmuşam. Hətta o qədər məharətli və yumşaq bir adamam ki, mənim şəxsi hüquqlarımı və ixtiyaratımı məhdudlaşdırıb öz xeyrinə istifadə edənlərə belə ürəyimdə kin bəsləyə bilməmişəm. Lakin mən o ictimai vəziyyətin düşməniyəm ki, o, cəmiyyətin yüzdə doxsan beşini səfalət içərisinə atır, həyat adlanan böyük nemət və ləzzəti onlar üçün əbədi işgəncəyə çevirir. Yüzdə beşini isə o qədər harınlaşdırır və qudurdur ki, onlar öz həmcinslərinə və həmvətənlərinə vəhşidən pis baxırlar. Unudurlar ki: Bəni adəm özəyi yekdigərənd...[1]

– Heç kəs var-dövlətinə görə günahkar deyil! – deyib Nurməhəmməd etiraz etdi.

– Kasıbı isə kasıb olduğuna görə hər addımbaşı söyür, təhqir edirlər, ona alçaq nəzərlə baxırlar. Siz mənim Məlik Mədənilər ailəsi ilə yaxınlığımı və sonra bu yaxınlığın düşmənçiliyə çevrildiyini eşitməmiş olmazsınız. Səbəb?! Arada heç bir şəxsi məsələ yoxdur. Onlar əla fərşlər, ipək

---

[1] Sədinin məşhur şerinin bir misrasıdır. Mənası: insanlar bir-birinin üzvüdürlər.

pərdələr, parlaq mebellər və sərvətlə dolu mülklərindən çıxıb bircə dəfə mənim bu kasıb otağıma ayaq basdıqda mənə əbədi düşmən oldular. O dəqiqə mən onların üzündə, gözlərində elə təhqiredici ifadələr gördüm ki, ona dözmək çətin idi. Halbuki nə qədər mənim yaşayış şəraitimdən xəbərsiz idilər, nə qədər ki, məni bir Xosrov Ruzbeh kimi, bir müəllim və ziyalı kimi tanıyırdılar, əynimdəki paltara, fikir və biliyimə görə mənə qiymət verirdilər, gözlərindən məhəbbət yağırdı. Mənimlə oturub-durmağı özlərinə iftixar bilirdilər, dönə-dönə xahiş edirdilər ki, məclislərində olum! Elə ki, yaşayışımı və vəziyyətimi gördülər, gördülər ki, mən yoxsullar zümrəsindənəm, ürəklərində oyanan nifrəti gizlətməyə belə iradələri çatmadı. Hələ mən bu hərəkətin əxlaqi qiymətini vermirəm. Yox, yalnız yoxsul olduğuma görə əşrəfzadələrin mənə təhqir dolu baxışlarını, ürəyimə neştər tək sancılmış həqiranə nəzərlərini bundan sonra sizin dediyiniz yollarla qazana biləcəyim həyat nemətləri belə, ürəyimdən silib ata bilməz. Hətta mən çalışıb şəxsən ağrılarımı unutsam da, sakit qalıb danışmamağı xoş yaşayışın muzdu kimi qəbul etməyə və başqa Xosrov Ruzbehlərlə bu cür təhqiredici rəftar olunmasına yol verməyə mənim haqqım yoxdur. Bəli, mənim belə bir haqqım, belə bir icazəm yoxdur, ola da bilməz!

Nurməhəmməd artıq istədiyinə nail olacağına ümidini çoxdan itirmişdi. O, görürdü ki, Xosrovu tutduğu yoldan döndərmək qeyri-mümkündür və qəlbən buna təəssüf edirdi. Çünki Nurməhəmməd o cür adamlardandır ki, şəxsən çox mülayim və xeyirxah olsalar da, öz zümrə və tərbiyələrinin dairəsindən kənara çıxa bilmirlər. Onlar həyatda zülmü, ədalətsizliyi, acları, dilənçiləri, avamları görür və buna təəssüf edirlər. Lakin həyatı dəyişmək üçün mübarizə fikrindən uzaqdırlar və bu mübarizənin aqibətinə inanmırlar. Xosrovun isə məhz belə bir inamla yaşadığını görür, qəlbən ona yazığı da gəlirdi. Elə yazığı gəlirdi, necə ki, nahaq qurbana adamın ürəyi yanar. Bununla belə Ruzbehin fikirləri gəncə çox maraqlı və cazibədar görünürdü, söhbəti kəsərək durub getmək istəmirdi.

– Mən bilən, siz təhsil və yüksəlişinizlə heç kəsə borclu deyilsiniz, öz səyiniz və əməyinizlə bu dərəcəyə çatmısınız və istədiyiniz şəkildə də yaşamağa haqqınız var. Heç kəsdən, heç şeyə icazə almağa ehtiyacınız yoxdur.

– Mənim həyata baxışım şəxsi mənafeyin dar hüdudlarından çox genişdir. Məsələnin həqiqəti də burdadır. Əgər mən təkcə özümü

düşünsəydim, məsələ çox asanlıqla həll olunardı. Mən istəyirəm ki, nəfəsim gəldiyi qədər millətin, xalqın mənə tapşırdığı səngərdə möhkəm dayanım. Siz deyirsiniz ki, mən bir mühəndis, bir ziyalı kimi xalqa xidmət etməliyəm. Halbuki mənim anlayışlarım və təcrübəm məni vadar edir bir vətəndaş kimi, xalqın namuslu bir oğlu kimi ona xidmət edim. Bilirəm, bu mübarizədə həyatım təhlükəyə məruz qalacaq, necə ki, indi təhlükə içindədir. Lakin məgər məslək sahibi olan bir kişi canının qorxusundan səngəri tərk edə bilər? Sədi yaxşı deyib: "Sədaqətli aşiq bəladan qaçmaz, ümidi və imanı süst olanlar məlamətdən qorxub qaçarlar...".

Nurməhəmməd artıq söhbəti qurtarmağın vaxtı çatdığını hiss etdi. O, bura həvəslə, möhkəm fikirlə gəlmişdi. Əmin idi ki, Ruzbehi üzə çıxmağa razı salacaq. Həyat və yaşamaq eşqi hər şeyə üstün gələcək. Lakin indi özü sarsılmış halda, daxilində ziddiyyətli fikirlər və hisslər oyandığı halda buranı tərk etməli idi. İndi bir sual onun beynini gəmirirdi. Bundan sonra necə yaşamaq lazımdır? Kim daha doğru yaşayır biz, ya Xosrov kimi "dəlilər", özünü oda atanlar?

Birdən Nurməhəmmədə elə gəldi ki, bu görüş Xosrovla son görüşdür, bir daha onun üzünü görməyəcək, səsini eşitməyəcəkdir. Bu qəribə hiss gəncin ürəyini yenidən riqqətə gətirdi, məhəbbətlə doldurdu. "Həyat, sevgidən və sonra əbədi ayrılıqdanmı ibarətdir?"– deyib düşündü. Bu hissin təsiri ilə gözləri yaşardı. Lakin o, bunu bildirmədi. Cibindən təmiz, gözəl dəsmal çıxardaraq üz-gözünü sildi. Xəfif ətir qoxusu otağa yayıldı. O, Xosrovdan gülər üzlə ayrılmaq istədi, istədi ki, son dəfə onun hafizəsində işıqlı təbəssümü ilə qalsın.

– Əziz müəllim, rica edirəm məni bağışlayın, – deyib ayağa durdu. – Bəlkə naqabil sözlər danışdım. Onunla təsəlli tapıram ki, alicənab adamlar sədaqətlə deyilən sözü ləyaqətsizlik hesab etmirlər. Bilmirəm, bir də sizinlə nə vaxt görüşəcəyəm. Əlbəttə, mənim tərəfimdən heç bir təşəbbüs olmayacaq. Sizin vəziyyətiniz buna yol vermir. Ancaq siz nə zaman işarə etsəniz qulluğunuza hazıram, kiçik bir qardaş kimi. Heç bir divar, heç bir sərhəd qabağımı kəsə bilməz.

Ayaq üstündə onunla üz-üzə durub bu sözlərə qulaq asan Xosrovun da ürəyində yenidən dostluq duyğuları baş qaldırdı: "Nə yaxşı ki, həyatda belə adamlar da var!" – deyib düşündü və qeyri-ixtiyari bir hərəkətlə Nurməhəmmədin əlindən tutub sıxdı.

– Təşəkkür edirəm, gənc dost! – dedi. – Bu gəlişinlə məni çox xoşnud etdin. Sanki azad günlərimi yenidən mənə qaytardın. Sağ ol! Sən də bil ki, hər zaman sənə bacardığı xidməti etməyə hazır olan bir dostun var.

Nurməhəmməd bu sözləri eşitmədi, çünki onun fikri bundan qabaq danışılmış məsələlərdə idi. Xosrovun möhkəm iradəsi, dönməz və işıqlı əqidələri haqqında düşünürdü.

– İndi bildim ki, azadxahların ürəyində niyə belə möhkəm yeriniz var! – deyib Xosrovun əlini bərk-bərk sıxdı və dönüb qapıya yönəldi. Astanada nə isə xatırlayıb ayaq saxladı. – Atəşpərəstlər ona görə xatirimi əziz tuturlar ki, heç zaman sönməyəcək o od, mənim ürəyimdədir! Əziz müəllim, bu söz sizə yaraşan qədər heç kəsə yaraşmayır.

Xosrov gülümsədi, nə isə demək istədi. Lakin artıq Nurməhəmməd otaqdan çıxmışdı. Xosrov nədənsə sapsarı saralmış və təlaşlı görünən Əzim Əsgəriyə döndü:

– Romantik gəncdir!– dedi,– beləlķəri azadlıq hərəkatına qoşulsalar, sədaqətli mücahid olarlar!

– Ağlım kəsmir, əlləri çox ağdır,– deyib Əzim Əsgəri pəncərədən küçəyə baxdı.

– Sənin isə rəngin zəfəran rəngindədir. Naxoş deyilsən ki? – Xosrov soruşdu və cavab gözləmədən əlavə etdi.– Bəlkə evdə bir narahatlığın var?

Əzim Əsgəri birdən bu tərəfə çevrildi və istehzalı səslə dedi:

– Bir evdə ki, ehtiyac əbədi qonaq ola, orda nə narahatlıq?!

– Səndən pis vəziyyətdə olan yaldaşlarımız az deyil, Əzim, amma şikayətlənmirlər. Halbuki sənin daimi işin və maaşın var. Onlar isə aylarla işsiz gəzirlər. Pul iblis təbiətlidir, tamahkarları özünə qul edir, yenə də əl çəkmir. Yadında saxla!

– Yadımdan çıxmaz, icazə verin gedim!– deyib Əzim Əsgəri fikri dağınıq və tələsik otaqdan çıxdı.

2

Xosrov fikrə getdi: "Əzim Əsgəri və Nurməhəmməd! Hər ikisi adamdır, hər ikisi bu vətənin oğludur. Biri naz-nemət içində yaşayır, ömründə ehtiyac nə olduğunu bilməyib, o biri isə ehtiyacdan göz açmır. Xosrovun əqidə və məslək yoldaşıdır, gizli təşkilatın üzvüdür.

Amma adamlığı bir şey deyil. Acgözdür, hərisdir, başqalarından pay umandır. İçərisindəki yaranı açıb hamıya göstərəndir. Onu bu hala salan nədir, kimdədir bunun günahı? Onunla görüşürsən və istəyirsən ki, tezcə ayrılasan. Lakin Nurməhəmməddən ayrılmaq istəmirsən. Anlaşılmaz bir cazibə səni ona tərəf çəkir, istəyirsən bir az da söhbət edəsən. Fikirlərinə qulaq asasan...". Xosrov bir anlığa ağır taleyindən razılıq etdi ki, belə sədaqətli bir gənci ona rast gətirib.

İndi Xosrov onun bütün sözlərini yenidən xatırlayırdı. O, necə də hərarətlə danışırdı, necə də ürəkdən çalışırdı ki, haqlı olduğunu sübut etsin. Məntiqi və idrakı əsasları zəif olan bir fikri bu qədər hərarətlə müdafiə edən adam daha böyük və daha dərin fəlsəfi həqiqətlərə inansa, necə də gözəl mübariz olar! Əlbəttə, həyat təcrübəsi və ehtiyatkarlıq Xosrovu hissə qapılmağa, Nurməhəmmədin zəif cəhətlərinə göz yummağa qoymazdı. Həyatda başına gələn bəlalar, müsibətlər, insanlardan gördüyü sərtlik, vəfasızlıq, dönüklük onu hər şeyə açıq gözlə baxmağa, hər şeyin əsil qiymətini verməyə öyrətmişdi. O, Nurməhəmmədə də bu cür yanaşırdı. Ona inandığı, niyyətlərinin xoş və təmiz olduğunu yəqin etdiyi kimi, onun fikir və düşüncəsinin qeyri-kamil və naqis cəhətlərinə də göz yumurdu. Siyasi həyat və mübarizələr barədəki təsəvvürlərinin bəsitliyinə, sadəlövhlüyünə təəssüf edirdi, təəssüf edirdi ki, bu cür gənclər az deyil və onlar öz sadəliyi, təmizliyi ilə çox zaman biclərin və hiyləgərlərin əlində oyuncağa çevrilirlər.

"Yox, sadəlik və təmizlik yaşamalıdır! – deyib Ruzbeh özü-özünə etiraz etdi. – Gəncliyin ən gözəl keyfiyyəti kimi yaşamalıdır! Bu, çox gözəl və münbit bir zəmindir. Yalnız bu zəmində o amalın toxumları cücərə bilər ki, onun yolunda biz həyatımızı tufanlara atmışıq. Biz nə istəyirik? İnsanlıq, insanlığın qələbəsini! Məgər bu nəcib və ali məqsəd pozğun, hiyləgər, xudbin, yaramaz, xain ürəklərdə rüşeym ata bilərmi? Yox, yox! Ata bilməz. Onun yarı təmiz ürəklərdir! Qoy bu ürək sahibinin təsəvvürləri məhdud olsun, təcrübəsi az olsun. Siyasi həyatın qanunlarından və azadlıq mübarizələrinin tarixindən xəbərsiz olsun, eyib etməz. Bütün bunlar düzələsi şeylərdir, təmiz ürək və təmiz niyyət insanı həmişə irəli aparıb, geri yox! Bəli, ürəyi insanlıq eşqi ilə döyünən adamlar inqilabın ehtiyat qüvvəsidir!"

Nurməhəmmədin kübarlar zümrəsinin içindən çıxması, – Xosrovun nifrət etdiyi bir sinfin övladı olması da onun haqqında yaxşı rəyini, ona olan inamını sarsıda bilməzdi. Xosrov bu cür dar təsəvvürlərdən

uzaq idi və belə hadisələrə başqa gözlə baxırdı. Bir qütbdə Əzim əsgəriləri ehtiyacın pəncəsinə verib hərisliyə, acgözlüyə sövq edən cəmiyyət, o biri qütbdə ya insan iztirablarına qarşı kar və kor olan qansızlar yetirir, ya da orada namuslu nə varsa bu biri qütbə keçməyə məcbur edirdi: "Qəribə təzaddır! – deyib Ruzbeh düşünürdü, – bütün cəmiyyətin ixtiyarını əlində saxlayan bir təbəqə öz içindən öz müxaliflərini yetirir!".

Xosrov sərmayədarlıq quruluşunun barışmaz və son dərəcə şüurlu düşmənlərindən idi. Bu quruluşu və onun həyat tərzini insanlıq üçün rəzalət, bədbəxtlik hesab edirdi. Belə əqidədə idi ki, heç bir məmləkətdə, o cümlədən İranda da bu quruluş fəlakət və pozğunluqdan başqa artıq heç bir şey yaratmağa qabil deyil. Əlbəttə, bu hisslər onun ürəyində anadangəlmə deyildi. Birdən-birə yox, yavaş-yavaş, tədriclə oyanıb böyümüş, artmışdı. Onları oyadan da həyat özü olmuşdu.

Xosrov ortabab bir ailədə doğulmuşdu, atası Ruzbeh arif təbiətli, namuslu və düz bir adam idi. Hafizin, Sədinin şerlərindən nəhayətsiz ləzzət alan bu adam bütün əxlaqı və düşüncəsi etibarı ilə elm və ədəbiyyat üçün doğulmuşdu. Tale isə onu tamamilə təbiətinə zidd olan yollara salmışdı. O, qoşunda xidmət etmiş, dövlət qulluğunda olmuşdu. Bu vəzifələrin verdiyi imkanatdan nəinki istifadə edib varlana bilməmiş, hətta, atadanqalma az-çox varidatını da itirmişdi. Halbuki onun tutduğu vəzifələrdə olanlar topla dağılmayacaq sərvət toplaya bilmişdilər. Hərbi qulluqda olarkən o, ləşkər tədarükatı rəisi kimi gəlirli bir vəzifədə işləyib "Ziyai ləşkər" ləqəbi qazanmışdı Bütün qazancı da bu quru addan ibarət idi. Başqaları kimi altını doldurmağa, dar günə dağarcıq düzəltməyə çalışmamışdı. Rüşvət almaq, min cür yollarla varlanmaq onun məcazına zidd idi. Ordudan sonra onu İranın cənubunda Mülayir əyalətində üç nahiyənin jandarm idarəsinin rəisi təyin etdilər. Jandarm rəisi! Zahirən elə görünür ki, bu vəzifədə çalışan adamın maddi çətinliklərdən şikayətlənməyə heç bir haqqı yoxdur. Bu vəzifəni tutaraq şikayətlənən adam ya gərək son dərəcə aciz ola, ya da maymaq. Onun işgüzarlığını, vicdanlı və ədalətli işlərini görənlər ona aciz yox, ancaq "qoçaq adamsan!" deyirdilər. Lakin ailəsinin maddi çətinlik içində yaşadığına baxanda üzünə yox, dalınca "çox yazıq adamdır, ağzı çörək ağacındadır, özü isə acından ölür!" deyib danışırdılar. Nə özü yeyən, nə də başqalarına yedirən, bütün işlərdə insaf və vicdanı rəhbər tutan bir adam jandarm idarəsində

ömrünü başa vura bilməzdi. Ruzbeh kişini maliyyə nazirliyinə keçirdilər. Burada 4-cü dərəcəli rütbə ilə işləyirdi. Əlbəttə, bu elə böyük bir qulluq deyildi ki, aldığı maaşla böyük bir külfəti saxlaya bilsin. Buna görə də ömrünün axırına doğru var-yoxdan çıxdı, hətta Mülayir kəndlərindən birində kiçik evini və bağçasını girov qoymalı oldu. Girovu isə vaxtında qaytara bilmədiyi üçün ev və bağça birdəfəlik əlindən çıxıb pul sahibinin mülkiyyətinə keçdi.

Atasının bu cür qalxıb enməsini, daha doğrusu, tutduğu vəzifələrə baxmayaraq, yalnız maaşla dolandığı üçün həmişə maddi çətinliklərlə əlbəyaxa vuruşmasını, Xosrov demək olar ki, bütün əzabları ilə xatırlayırdı. Bu hadisələr onun 7–8 yaşı olanda başlamışdı. Nə qədər ki, uşaq ibtidai məktəbdə oxuyurdu, onun təlim-təhsil xərcləri o qədər də çox deyildi. Lakin ibtidai məktəbi qurtarıb orta məktəbin birinci dövrəsində oxuyanda bu xərclər xeyli artdı. İranda yaşayan ailələrin əksəriyyətində uşaqlar on iki-on üç yaşında zəhmətə alışırlar, ailənin köməkçisi olurlar. Xosrov da məktəbdə oxumaqla bərabər ev işlərini görür, ailəyə kömək edirdi. Lakin ata bunun zehinli və fərasətli olduğunu görüb öz aləmində gələcəyinə ümid bəslədiyi üçün uşağın mümkün qədər bu cür işlərlə yüklənməsinə yol vermir, onun fikrini elmə, kitablara yönəldirdi. Uşaq da verilən kitabı tez oxuyur, mühakimələri ilə atanın ürəyindəki dəruni arzuları bir az da qanadlandırırdı. Lakin orta məktəbdə təlim-təhsil xərcləri xeyli pul istəyirdi. Bu zaman atası Mülayir vilayətindən maliyyə nazirliyinə keçmişdi və onun maaşı cəmi 220 riyal idi. Bu puldan zor-güc ancaq 30 riyal oğlunun təhsili və yaşayışı üçün ayıra bilirdi. Son dərəcə qənaətlə yaşamağa öyrənmiş kiçik Xosrov bu pulla dolanıb heç bir şikayət etmədən təhsilini davam etdirirdi. Yeddinci sinfi qurtarandan sonra orta məktəbin son siniflərində oxumaq üçün o Həmədana getməli oldu. Burada xərclər bir qədər də artdı. Atası "qayışı bir az da bərk dartıb, ailənin boğazından kəsib" oğluna ayrılan aylıq pulu 50 riyala qaldıra bildi. Bu kiçik məbləğlə ev kirayəsini, yemək pulunu, təhsil və cari xərcləri ödəmək olduqca çətin idi və Xosrov bir öynə yeyəndə, o birini ac qalırdı ki, birtəhər ayı başa vursun. Lakin bu barədə heç kəsə bir söz demir, özünü tox saxlayır, bütün ağırlığı tək çəkir, hər şeyə dözüb məktəbdə birinci oxuyanlar cərgəsində gedirdi.

Maddi çətinlik və ehtiyaclar insanlara iki cür təsir edir: bir qismini əzib ruhdan salır, mənliksiz, miskin və müti tərbiyə edir. Bunlar

təbiətən küt və zəif adamlardır. Onlar çətinlik qarşısında tez sınır və tabe olurlar. Lakin açıq gözlü və fərasətli adamlar da var ki, onlar çətinliyin də səbəblərini görür və ona qarşı durmaq, müqavimət göstərmək üçün iradələrini toplaya bilirlər. Yeniyetmələr içərisində Xosrov bu cür möhkəm xasiyyəti, iradəsi və şüuru ilə nəzəri cəlb etmişdi. Artıq müəllimlər də bu uşaqdan bir şey çıxacağına böyük ümid bəsləyir və öz məhəbbətləri ilə onu daha da ruhlandırırdılar. O isə atasının ağır vəziyyətini, hər gün bir az da qocalıb əldən düşən kişinin ailəni saxlamaq üçün dəridən-dırnaqdan olmasını görüb ancaq dərslərində səy göstərmək və yaxşı oxumaqla ona sevinc gətirəcəyini anlayır və çalışırdı. Gələcəkdə onu ölümə məhkum edən məhkəmə qarşısında dediyi sözlər həqiqət idi. “Mən atamın maddi vəziyyətini və onun nə dərəcədə fədakarlıq göstərdiyini bildiyim üçün təhsil müddətini qısaltmaqla və atamın üzərinə bundan artıq ağırlıq düşməyə qoymamağa çalışırdım. Buna görə də gecə-gündüz dərs oxuyub orta məktəbin 6 illik dövrəsini 4 il ərzində başa çatdırmağa müvəffəq oldum. Həmişə birinci şagird olurdum. Və orta məktəbin elmi şöbəsinin son imtahanını da 18,55 mədəl ilə qurtarıb elmi diplom almağa nail oldum”.

Gənc Xosrov, xüsusən riyaziyyat dərslərində müvəffəq olar və bu dərəcələrə böyük maraq göstərərdi. Hətta bəzən müəllimin çətinlik çəkdiyi müadilələri o asanlıqla həll edərdi. Neçə dəfə müəllim istedadlı şagirdlərinin dəftərinə yüksək tərif olan ərəbcə “sədəqqə” sözünü yazmışdı ki, bunun da mənası “təsdiq edirik, doğrudur” deməkdir. Riyaziyyat dərslərində göstərdiyi müvəffəqiyyət və həvəs onu hələ orta məktəbdə ikən ali müadilələri həll etməyə dair kiçik bir kitabça yazmağa sövq etdi. Xosrovun parlamağa başlayan qeyri-adi istedadı, dərslərdə göstərdiyi səylər, sərbəst mühakimə qabiliyyəti və fikri kəşflərə olan meyli müəllimlərinin ona olan məhəbbətini birə-on artırmışdı və bu vəziyyətin verdiyi mənəvi zövq o qədər yüksək idi ki, o maddi çətinliklərin ağırlığını və əzabını tamamilə unutmuş kimi idi. Atası isə ümidlərinin doğrulmağa başladığını görüb heç bir gərginlikdən çəkinmir və çalışırdı ki, oğlu mütləq ali təhsil alsın.

Qoca Ruzbeh:

– İşıqlı fikir hər kəsə qismət olmur, oğlum, – deyirdi. – Bu da qadir-qüdrətin bir hikmətidir, istədiyi yerdə zahir edir. Oxu, bu işığı artır, Allaha da xoş gələr, xalqa da. Səndən bir fayda görərlər.

Bu fikirlər orta məktəbi yüksək qiymətlə qurtaran Xosrovu Tehran darülfünunun fənn fakültəsində elektronik-mexanik ixtisası üzrə oxumağa gətirib çıxartdı. Universitet! Ali məktəb! Bu, Xosrovun gənc ürəyində illər uzunu yuva salan müqəddəs bir arzu idi və indi bu arzusuna çatdığı üçün özünü dünyanın ən xoşbəxt adamı sayırdı. Universitetdə oxuyarkən, o yenidən ilk elmi əsərinə qayıtdı. Ali dərəcəli müadilələrin qrafik vasitələrlə həll yollarını bura əlavə edib xüsusi cədvəllər hazırlayaraq bu kitabı xeyli təkmilləşdirdi.

Deyirlər ki, sən saydığını say, gör fələk nə sayır. Fələk Xosrov deyəni demirdi. Tale ona qarşı işləməkdə idi. Həyatın ağır və dayanmaz gedişi öz işini görməkdə idi. Gəncin öz arzularına çatdığı, böyük bir yola çıxdığı güman olunan yerdə başının üstünü bədbəxtlik aldı, yollar bağlandı: atası ağır xəstəliyə düçar oldu. Ailənin maddi vəziyyəti dözülməz dərəcədə pisləşdi. Yarı iflic halda yatağa düşmüş atası artıq canının hayında idi. Gözlərinə qocalıq və xəstəlik, ümidsizlik pərdəsi çəkməkdə idi. Bu pərdənin dalından o, imdad diləyən gözlərlə oğluna baxırdı. Yastığı yanında oturduğu ağır bir dəqiqədə Xosrov atasının bu halını duydu və qət etdi ki, ona kömək göstərə bilməsə də, əlavə bir yük kimi çiynindən asılmasın. Bu qərar qəti idi. Xosrov universiteti buraxıb hərbi qulluğa getməyə vadar oldu. Həyatının yeni dövrü başlandı. Təbii istedad və qabiliyyət tezliklə bu sahədə də özünü göstərdi. Xosrov bütün tay-tuşlarından seçilirdi. Şüuru, işıqlı fikirləri, iradəsi və ciddiyyəti yüksək dərəcəli zabitlərin nəzərini ona çəkirdi. O, hər gün irəliləyirdi. Artırdı. Burada o, hərbi texnika sahəsində bir sıra səmərələşdirici təklifləri, ixtiraları ilə yüksək istedad sahibi və böyük gələcəyi olan adam kimi ad qazanmağa başladı. Tezliklə özü kiçik zabit rütbəsi alıb irəli çıxdı. Əlbəttə, hərbi paltarda o, böyük zəka sahibi olaraq qalırdı. Yaşa dolub püxtələşdikcə, o, sağlam və gənc vücudunun bütün qüvvəsini elmə, biliyə verirdi. Ondan yaşca gənc zabitlər gözəl hərbi libasda və işıldayan poqonlarda küçələri dolanıb müxtəlif məclislərdə firavan gün keçirdikləri halda, onu bu məclislərdə görən olmazdı. Zəhmət, əmək, iş – onun əyləncə məclisi bunlar idi.

Taleyin ona qismət etdiyi ağır və əzablı ömür yükünü qüdrətli və dönməz bir qatır gücü ilə həyatın yoxuşlarına doğru çəkərkən, o hey düşünürdü. Hey ətrafa baxır, keçdiyi həyat yollarını bütün təfərrüatı ilə hafizəsində canlandırır, başqalarının güzəranına fikir verir və düşünürdü. Düşünürdü ki, həyat niyə bu qədər mürəkkəb və dolaşıqdır.

Niyə zəhmət çəkənlər və istedad sahibləri ehtiyac içindədir, tənbəllər və qabiliyyətsizlər isə süd gölündə üzürlər?.. Niyə?! Bəli, ömrünün ən gözəl illərini yaşadığı zaman, iyirmi beş-iyirmi altı yaşlarında bu cür ağır fikirlər ondan əl çəkmirdi. Həyatın yeganə ləzzətini bu fikirlərdə tapırdı. Onun fikri son dərəcə geniş meydana meyl edirdi. Bir neçə il keçməmiş o, "İxtisas topçuluq sahəsinin ali riyaziyyat dövrəsi" kimi iki cildlik hərbi texniki kitablarla yanaşı riyaziyyata aid bir sıra əsərlər yaratdı. Ədəbiyyata, fəlsəfəyə, uşaqların və gənclərin tərbiyə məsələsinə qeyri-adi maraq göstərdi. "Fəlsəfənin əsasları", "Uşaq evdə və məktəbdə" adlı kitablar yazıb çap etdirdi. Fransızcadan "Rus dilini təkbaşına öyrənmək üçün dərslik" kitabını fars dilinin xüsusiyyətlərinə uyğunlaşdıraraq tərcümə etdi.

Bəli, yorulmadan oxumaq, çalışmaq, həyatın ağır gərdişləri barədə düşünmək, oxuduqları ilə həyatda gördüklərini tutuşdurmaq, onun saatlarının və günlərinin deyil, aylarının və illərinin mündəricəsini təşkil edirdi. Bu düşüncələr, həyat və yaşayıq tərzi onu sosializm ideyalarına gətirib çıxartdı. Hətta o, "Elmi sosializm və xəyali sosializm" adlı kitab da yazdı. Bütün bunları orduda olduğu zaman etmişdi. Orduda o, elə gözəl ad çıxartmış, elə hörmət qazanmışdı ki, böyük gələcəyinə kimsə şübhə etmirdi. Artıq o, ali zabitlik məktəbində dərs verirdi.

Lakin heç bir sənət insanı əxlaqın təhrikindən və əqidələrin təsirindən qurtara bilməz. Xosrov nə qədər ağır həyat yolu keçmiş olsa da, maddi cəhətdən çətinlik çəksə də, əyri yollara getməmişdi. Bu cür adamlara nifrət edirdi. Təmiz əxlaqı və cəmiyyəti içəridən yeyən yaraları görməsi onun ürəyində daim coşub-daşmağa hazır olan bir qəzəb yaratmışdı. O, həyatdan orduya da sirayət etmiş fəsadları, rüşvətxorluğu gördükdə susa bilməyib mübarizəyə girişdi. Mübarizə isə ağır oldu. Hər mənsəbpərəstin və rüşvətxorun dalında daha qüvvətli mənsəbpərəst və rüşvətxor gizləndiyini, onların əl-ələ verib silsilə təşkil etdiyini unutmuş və dalını ədalət kimi bir dağa söykədiyinə güvənən Xosrov bu mübarizədə məğlubiyyətə uğradı. Doğrudur, onu şərə salmadılar, ordudan qovmadılar, onunla nəzakətlə rəftar edib İranın iqlimcə sərt olan cənubuna, yəni Əhvaz şəhərinə köçürtdülər. Xosrov bunun üsyankarlığa, ədalət fədailiyinə cəza olaraq "nəzakət sürgünü" olduğunu yaxşı anlayırdı. Lakin bu da onun həyatında əsaslı dönüş yaranmasına səbəb olmadı. Hələlik o, hərbi qulluqda davam edirdi və böyük ümidlər oyadırdı. Hətta kübar ailələr belə onunla

ünsiyyətə, yoldaşlığa və dostluğa meyl edirdilər. Elə bilirdilər ki, o istedadına, zəkasına görə də kübardır, var-dövlət sahibi olan bir ailədən çıxmışdır. Ağıllarına da gəlmirdi ki, həmişə təmiz və səliqəli geyinən, zəkası, istedadı və ağır təmkini ilə hamını heyran buraxan bu adamın yaşamağa fərli bir otağı da yoxdur, doğma atası güclə dolanır; bir qarın ac, bir qarın tox yaşayır. Məhz bu əsasda da onun həyat yolunun üstündə elə bir tufan qopdu ki, bütün həyatını və taleyini başqa bir istiqamətə saldı.

Mülayirin məşhur kübarzadələrindən olan Məlik Mədənilər ailəsi Xosrovla hərbi qulluğa keçərək bir zabit kimi parladığı dövrdə yaxınlıq etməyə başlamışdı. Onunla dönə-dönə gənc zabiti evlərinə aparmış, məclislərində oturdaraq ona nəhayətsiz bir nəvaziş və hörmət göstərmişdilər. Onlar söhbətdən doymaq bilməyən bu ailənin kişiləri də, qadınları da xoşnud idi. Belə bir nəcib və mədəni adamla dostlaşmağa sevinir, fərəh duyurdular, onunla oturub-durmağa can atırdılar. Lakin Xosrov mümkün qədər bu görüşlərdən qaçır, onların təklifini rədd etmək mümkün olmayanda, evlərinə getsə də özü onları dəvət edə bilmirdi. Çünki yaşadığı kasıb otaq qətiyyən bu cür qonaqları qəbul etməyə layiq deyildi. Elə o dövrdə də Xosrovun kirayə mənzili bir otaqdan ibarət idi. Bir gün bu otaqda oturub mütaliə ilə məşğul olduğu zaman gözlənilmədən qapının zəngi basıldı. Xosrov qapını açdıqda heyrət və təəccübdən ani olaraq özünü itirdi: doktor Mahmud Məlik Mədəni və onun qardaşı uşaqları astanada durmuşdu. Məlik Mədəni İran əyan-əşrafına məxsus incə bir nəzakət və təbəssümlə salam verdi və gülərək dedi:

– Ağayi mən, məgər siz qonaq qəbul etməzsiniz?

– Buyurun, rica edirəm, ağalar! – deyib Xosrov yarı çaşmış olsa da, mehribanlıqla onları otağa dəvət etdi.

Astanadan içəri girən kimi onların halı dəyişdi: dörd tərəfdən otağı süzdülər. Döşəməyə salınmış iki-üç rəngbərəng xırda ayaq altına, bir parça iplik palaza, küncdəki sadə çarpayıya nəzər saldılar. Dönüb qeyri-iradi olaraq təəssüf və peşmanlıq dumanı ilə örtülmüş gözlərini süzdürərək baxışdılar. Xosrov onların rənginin qaçdığını, ciddi bir heyrət içərisində tutulduğunu görüb, iki barışmaz vəziyyətin üz-üzə gəldiyini anladı. Onlar ləmələri dolduran kitablara da gözucu baxıb istər-istəməz oturmalı oldular: üçü çarpayının üstündə, üçü də küçəyə açılan pəncərə sürahisində əyləşdi. Otağa ağır, əzici bir sükut çökdü.

Xosrov indi özünə qarşı nə isə təhqiredici bir şey duydu: onlar ona elə baxırdılar, necə tox aca baxar. Halına acıyır və rəhmləri gəlirdi. Xosrovu təhqir edən də bu idi. Zəka və istedadca qat-qat onlardan üstün olduğu halda, onların nə haqqı vardı ona, zavallıya baxar kimi baxsınlar?! Bu haqqı onlara verən nə idi? Onlar bir varlının bir yoxsul qarşısında ala biləcəyi lovğalıq qiyafəsi alsaydılar, Xosrovun ürəyinə toxunmazdı, lakin ona zavallıya baxar kimi baxmaları dözülməz idi. Dünən onların nəzərində dağ başında duran qartalı sanki gözəgörünməz bir qüvvə birdən-birə götürüb aşağı, dərənin dibinə atmışdı və indi bu dağ başındakı qarğaların ona yazığı gəlirdi. Nə qədər alçaq bir vəziyyət!

Bu hisslər Xosrovun ürəyində nifrət oyatmaya bilməzdi. Lakin qonaqpərvərlik rüsumunu gözləyərək və əzici sükutu pozmaq üçün dedi:

– Ağalar icazə buyursalar, çay gətirtdirərəm.

– Çox mütəşəkkirik! – deyib doktor Mahmud Məlik Mədəni ayağa durdu. Soyuq istehza ilə əlavə etdi. – İcazə buyursanız qulluğunuzdan mürəxxəs olarıq...

Vəssalam. Bununla da söhbət qurtardı və onlar çıxıb getdilər. Xosrov isə coşqun bir qəzəb içərisində oturub düşündü: “Mən qoşun naibi əvvəliyəm. Ali əfsərlik məktəbinin müəllimiyəm. On cilddən artıq kitab yazmışam və tərcümə etmişəm. Qoşunun gələcək fərmandehləri (komandirləri) mənim dərslərimə diqqətlə qulaq açırlar. Ağıl və zəka məsələlərindən, elm və fənlərdən bəhs edirəm. Yaşayış vəziyyətim isə elədir ki, cibi dolu odun parçalarının mənə yazığı gəlir. Nə üçün?!”.

Bu əzablı fikirlər, bu ağır təəssürat soyumamış, Xosrovun atası Tehrana gəldi. Amansız qocalıq kişini, artıq altına almaqda idi. Xeyli düşkünləşmişdi. Cənubun istilərinə və çətin iqliminə dözəcək halda deyildi. Xosrov min yerə qaçdı, min adama ağız açdı və nəhayət, onun cənubdan Həmədana keçirilməsi barədə hökm ala bildi. Söhbətləri zamanı hiss etdi ki, atasının cibi tamamilə boşdur, gündə üç öynə yeməyə belə pulu yoxdur. Xosrov azca pul düzəldib ona verdi. Sabahısı isə xəbər tutdu ki, kişi həmən puldan 50 riyal arvadı və azyaşlı uşaqları üçün cənuba göndərmişdir. 50 riyal! Deməli, ailə elə bir ehtiyac içindədir ki, bu dilənçi payı da ona kömək ola bilər! Atasının bu vəziyyəti onun ürəyini titrətsə də bir şey etməkdən aciz idi. Xoşbəxtlikdən atası səbirli kişi idi, heç zaman vəziyyətindən şikayət etməyi sevməzdi.

Tale zərbəsini endirəndə heç kəsə aman vermir. Atası Həmədana gedən günün səhəri xəbər gəldi ki, beyninə qan damıb. Xosrov oğulluq borcunu müqəddəs tutan bir adam idi. O, dərhal atasının köməyinə qoşdu. Min əziyyətlə dəridən-dırnaqdan olaraq onu Tehrana gətirdi və ən yaxşı həkimlərin köməyinə müraciət etdi. Əlbəttə, bütün bunlar pulsuz mümkün deyildi. Xosrov borca-xərcə düşməyə bilməzdi. Tehranda bir az özünə gələn və bunu hiss edən qoca, bir gün Xosrovdan gizlin sifariş edib, Məlik Mədənini yanına çağırtdırdı. Qoca, Məlik Mədənilər ailəsində Xosrovun hörməti olduğunu bilirdi. Ancaq sonralar onların arasında açılmış soyuq uçurumdan xəbərsizdi. İnsafən demək lazımdır ki, elə o günü Məlik Mədəni oğlu Həsənağa ilə qocanın görüşünə gəldi. Bir qədər söhbətdən sonra qoca böyük sıxıntı və kədər içində dili dolaşa-dolaşa Məlik Mədənidən bir qədər borc istədi. Məlik Mədəni əlli tümən verib getdi.

Xosrov bundan xəbər tutanda qocanın halı çox kədərli idi. O, oğluna baxanda özünü saxlaya bilmədi. Lal və ağır kədər bir damcı iri göz yaşına çevrilib gilələnərək yanağı aşağı süzüldükdə elə bil ki, dünyanı dolandırıb Xosrovun başına çırpdılar. Bu hadisənin acı təsirini ancaq məzar daşı onun ürəyindən çıxara bilərdi!

Lakin onun nifrəti Məlik Mədəni ailəsinə deyildi. Artıq aylar və illər ərində keçirdiyi iztirablar və "niyə?!"lər, "nə üçün?!"lər, arasıkəsilməz gərgin fikirlər onun xəyalında bir sıra həqiqətlərin aşkar olması ilə nəticələnmişdi. Bu həqiqətlər isə ona deyirdi ki, günah bir ailədə deyil. Xosrov kimilərin nifrət və hücumunun hədəfi bir ailə ola bilməz, o daha geniş dairəni əhatə edir və etməlidir. Məlik Mədəninin qoca ataya dilənçi payı verib getdiyi o ağır dəqiqədə Xosrov artıq hər şeyi aydın dərk edən bir filosof kimi düşünməyə başlamışdı. O, dünyada ən cəfadar dostu və etibarlı silahı olan qələmi əlinə alıb yazmışdı:

"Məlik Mədəninin şəxsiyyətinə, ailəsinə nisbətən mənim xüsusi bir nifrətim yoxdur. Bizi üz-üzə gətirən, aramızda mənəvi nifaq yaradan amil başqadır. Məndə nifaq oyadan sərmayədarlıq quruluşudur. Bəşər cəmiyyətinin və eləcə də İran cəmiyyətinin bütün bədbəxtliklərinin əsas mənşəyi olan üsuldur. Mən İran millətinin 18 milyon nəfərinin bədbəxtlik və yoxsulluğu, aclıq və məhrumiyyəti hesabına bütün yaşayış nemətlərini 1000 imtiyazlı ailə üçün təmin edən rejimə nisbət dərin nifrət və barışmaz düşmənçilik hissi ilə yaşayıram".

“Nə qədər nəfəsim var bu üsula qarşı vuruşacağam. And olsun atamın gözündən axan o müqəddəs göz yaşına ki, mən bu yoldan dönən deyiləm!”.

Xosrovun həyatında baş verən fırtınanın tarixi belədir. O fırtınanın ki, o, Xosrovun hərbi və ya elmi pillələrlə yüksəlmək yolunu birdəfəlik bağlamış, onu gözlənilməz tufanları və uçurumları olan bir yola atmışdı.

Əlbəttə, Nurməhəmməd kimi bir gənc Xosrovu bu yoldan döndərmək fikrinə düşməklə çox xam xəyala qapılırdı. Nurməhəmməd özü də bunu dərk etdikdə həyatın sehrli bir cəhəti ilə qarşılaşmış kimi dərin fikirlərə daldı və Xosrovu əsatiri bir qəhrəman kimi sevməyə başladı...

3

Gecədən xeyli keçmişdi. Böyük bir şəhərin gündüzkü səs-küyü kəsilmiş, insanın hisslərinə rahatlıq gətirən fikir və düşüncələrin bir məcra ilə axmasına kömək edən xoş sükut hər tərəfi bürümüşdü. Tehran yatırdı. Yuxu çox şirin və dadlı idi. Şimrandan axıb gələn sərin payız havası yalnız hündür evlərə, geniş küçələrə deyil, zirzəmilərə, dar və xəfə dalanlara, bir-birinin böyrünə qısılmış darısqal palçıq evlərə də dolur və yüngüllük gətirirdi. Səhərin gözü çırtlayandan gün batana kimi bütün günü qatır kimi işləmiş, min bir təlaşla həyat adlanan burulğanda çalışıb-çapalamış yoxsullar, ehtiyac əsirləri belə gecələrdə də rahat yata bilmirlər. Yuxuları min təlaşla dolu olur.

Stolüstü fənərin işığında nə isə oxuyan, bəzən də ağ vərəqləri qaralayan Xosrov Ruzbeh yatmayıb bu adamlar haqqında və onların ağır taleyini düşünürdü. Onların həyatı, ümidi, ehtiyacları, gələcəyi Xosrovun fikrinə rahatlıq vermirdi. Həyatlarının ağır mənzərələri xəyalında gah hekayələr, romanlar şəklinə düşür, gah da bəşərin böyük faciələrini əks edən fəlsəfi fikirlər oyadırdı. Necə də ağır faciədir! Bu görünməmiş təkamül əsrində təbiətin ən dəhşətli qüvvələrinə qalib gələn insan öz ziddiyyətlərini həll edə bilmir. İbtidai vəhşinin həyatını idarə edən qanunlardan yaxasını qurtara bilmir. Güclünün gücsüzə ağalıq etmək həvəsi fərdlərdən tutmuş siniflərə və millətlər qədər hamının iliyinə işləmişdir. Siyasətin də, əxlaqın da, fəlsəfənin də hökmünü verən budur. Bu qədim və dəhşətli azardan qurtarmaq üçün ancaq bircə yol var: – bu sərin payız gecəsində də

rahat yata bilməyən, yuxusu təlaşla dolu olanlar dünyanı idarə etməlidirlər. “Rədd olsun alçaqlar, ağ biləkli, iblis düşüncəli riyakarlar, xudbinlər, mənsəbpərəstlər!”.

Xosrov pəncərə qabağına gəldi. Küçəyə baxdı. Evdən xeyli aralı, küçənin ortasında sarımtıl bir fənər yanırdı. Buralar şəhərin laləzar kimi mərkəzi küçələrinə bənzəmirdi. O küçələr çıraqban olduğu halda, buralarda ancaq seyrək lampaların sarımtıl işığı görünürdü. Küçə sakit idi. Bir it, bir pişik belə gözə dəymirdi. Hər şey yatmışdı. Birdən küçənin o biri başına ağ gur işıqlar səpələndi. İşıqlar hərəkət edirdi. Sürətlə bir yana gəlirdi. Xosrov böyük şəhərlərdə gecə yarısı küçələrin sakitliyini pozan maşınların adi bir şey olduğunu bilirdi. Bununla belə pəncərə qabağından çəkilmədi. Gözlədi. Maşın yaxınlaşdıqca sürətini azaltdıqda Xosrov şübhəyə düşdü. Dilinə bircə söz gəldi: “Polis!”. Ancaq bu söz onu qorxutmadı. Gizlin inqilabçı üçün bu adi bir hal idi. Azca yana çəkildi. Maşının işığı pəncərədən içəri dolub otağı işıqlandıra bilərdi. Maşın gəlib keçdi. Gözəl bir minik maşını idi. İki ev o tərəfdə dayandı. Küçədəki lap sarımtıl fənərin altında maşından əvvəlcə rulda oturan adam düşdü. Başı açıq idi. Gur qara saçlarından cavan olduğu bilinirdi. Yaxşı geyinmişdi. Şıq, gözəl! O, tələsmədən maşının dal qapısını açdı. Oradan bir xanım çıxdı. Oğlan onun əlindən tutdu. Maşından uzaqlaşdılar. Evin yanına, qaranlığa çəkildilər. Uzun zaman oğlan qayıtmadı. Sarı işıqlı fənərin altında gözəl, qara maşın sahibsiz qaldı. Xosrov: “Demək sevişirlər! – deyib düşündü, – xoşbəxtlər!”.

Sevgi, məhəbbət! Nədənsə bu sözlər indi Xosrovun ürəyini daha dərindən, həsrət dolu duyğularla titrətdi. Sevginin cazibəsi qarşısında duran bir adam varmı? Ola bilər. Sevgini ancaq ötəri bir hiss kimi anlayanlar yox deyil. Belələri insandan daha artıq heyvanat aləminə yaxındır. Sevginin cazibəsini müqəddəs bir duyğu kimi bihuşluq dərəcəsinə gələrək yaşayanlar əsil insanlardır. Onlar üçün bu cazibə əbədi və pozulmazdır. Xosrov düşündü ki, həyat onu bu səadətdən də məhrum etmişdir. Düşündü və dəruni bir kədər duydu: axı, o da sevir! Necə böyük bir hərarətlə sevir! Lakin o, sevgidən səadət ummağa özünü haqsız bilir. Çünki ona səadət verən mütləq bədbəxt olmalı idi. Xosrov isə bunu istəməzdi. Məhz buna görə də Afaqdan qaçırdı.

Xosrov pəncərə qabağına çəkildi. Kresloya oturdu, tənha maşın və onun qaranlıqda itmiş sərnişinlərini unudaraq öz xəyallarına daldı. Afaqla ilk tanışlığını xatırladı. Bu, qəribə bir təsadüf idi.

Xosrov Tehranın yaxınlığındakı məşhur Zərgəndə yaylağında ziyafətə çağırılmışdı. Bu ziyafəti Fransadan gəlmiş bir dəstə jurnalistin şərəfinə düzəltmişdilər. Burada Tehranın görkəmli qəzet və jurnallarının redaktorları, mühərrirləri, məsul əməkdaşları, xarici işlər nazirliyinin işçiləri və başqaları vardı. Yayın ortaları idi. Tehranın adama tər tökdürən istilərindən sonra Zərgəndənin sərin dağ havasını, gözəl şəlalələri, sıx meşəliyi andıran parkları, günəşin odlu şüalarını aşağıya buraxmayan qalın yarpaqları, hündür gövdəli ağacları adamın gözünü, qəlbini, ruhunu oxşayırdı. Ələfurşə, yəni ayaqüstü ziyafət böyük bir parkda açıq havada təşkil olunmuşdu. Gözlərinə qara eynək taxaraq başqa bir adla bura dəvət olunmuş Xosrov, tudənin gizli xadimlərindən məşhur bir jurnalistlə və siyasət məsələlərində mötədil mövqe tutmağa çalışan üç nəfər orta yaşlı mühərrirlə parkın qırmızı kərpic ovuntuları döşənmiş bir xiyabanında gəzir, gah ciddi söhbət edir, gah şirin zarafatlara yol verib gülürdülər. Ara-sıra söhbəti İran şerində çox zəngin olan poetik aforizmlərlə, mənalı və ədibanə boyalarla zənginləşdirib həqiqi ruhu ləzzət duyurdular. Xosrov bu ziyafətə çağırıldığı üçün tudəçi dostundan qəlbən çox razı idi. Çünki insanlarla belə ünsiyyət, mənalı söhbətlər, əlbəttə, onun təbiətinə uyğun gəlir və az da olsa, ağır fikirlərdən uzaqlaşıb dincəlməsinə kömək edirdi.

Xiyabanın başında olan başqa bir dəstə ilə üz-üzə gəldilər. Bu dəstənin içində dörd gənc qız vardı. Xosrovun jurnalist dostu hələ onlara yaxınlaşmamış özünəməxsus şad bir əda ilə əllərini havaya qaldırıb:

– Oho, xoş görmüşük, qardaş! – deyərək qaraqaş, qaragöz, nazik qarabığ gənci salamladı. Yaxınlaşıb görüşdü və xanımlardan son dərəcə sadə və görkəmli qızı gördükdə əlavə etdi. – Oho, bu gün nə xoş gündür, Afaq xanımı da görmək olarmış!

Qız gülümsədi. Üzü qəribə bir cazibə ilə işıqlandı. Xosrovun dostu qızın yumşaq və balaca əlindən tutduğu halda Xosrova döndü:

– Təbəssüm barədə sizdən hansı rus yazıçısınınsa yaxşı bir sözünü eşitmişəm...

Xosrov qara eynəyin altından maraq dolu gözlərini Afaqın üzünə dikdiyi halda:

– Lev Tolstoyun sözüdür. Ancaq dəqiq xatırlamıram. Təqribən mənası belədir ki, o adamın ki, üzünə təbəssüm yaraşır, onun gərək gözəl ürəyi olsun, – dedi və Afaqa müracist etdi. – Mənə elə gəlir ki, məxsusən sizin haqqınızda deyilmiş sözdür.

Afaq daha cazibədar və pak bir təbəssümlə gülümsədi:

– İltifatınız artıq olsun, ağa, mersi!

Hər iki tərəfdən köhnə tanışlar o birilərini də bir-biri ilə tanış etdilər. Jurnalist Xosrovu onlara mülayir əyalətinin mötəbər bir taciri və jurnalisti kimi təqdim etdi.

Belə hallarda gözə dəyməkdən çəkinən, xüsusən tanımadığı adamlarla adi nəzakətlə görüşüb dərhal kənara çəkilən Xosrov bu dəfə adətinin xilafına hərəkət etdi. Yeni tanışlardan biri isə onun əlini bərk-bərk sıxaraq əlində saxladı:

– Adam sərrafısınız. Afaq xanımın doğrudan da başqa ürəyi var. Hamı bu qədər məsum və xeyirxah olsaydı, Yer üzündə çoxdan cənnət yaranmışdı.

Afaq qızlardan şəvə kimi qara telli və son dərəcə gözəl olan birinin qolundan tutdu.

– Gülsüm, – dedi, – heç olmasa sən məni bunların hücumundan qoru.

Bayaq Afaqı tərifləmiş gənc tez bu sözdən istifadə etdi:

– Aşiqlərin oxu hələ heç bir gözəli yaralamamışdır.

Gülsüm buna cavab olaraq fars qızlarına məxsus nəzakət və şirinliklə Sədinin şerindən bir beyt oxudu:

Ki, ey müddədi eşq kare to nist
Ki nə səbr dari, nə yaraye ist[1].

Hamı gülüşdü. Sonra da iki dəstə bir-birinə qoşulub xiyaban boyu gəzməyə başladılar. Ziyafətin rəsmi hissəsi başlananda isə necə oldusa Xosrov nimçəyə xörək qoyduğu zaman Afaq da stola yaxınlaşdı. Xosrov dərhal ona da xörək götürdü və onlar bir kənara çəkilib gah rəsmi tostlara qulaq asır, gah özləri ordan-burdan söhbət edirdilər. Axşamdan bir az keçmiş vidalaşaraq ayrılanda isə Xosrov onu bir daha görəcəyini ağlına gətirməzdi. Halbuki taleyin hökmü başqa cür idi.

Bircə həftə sonra Xosrov yoldaşları ilə növbəti görüşdən fikirli halda mərkəzi küçələrdən biri ilə evinə döndüyü yerdə birdən ağ rəngli bir maşın gəlib yanında dayandı. Gülsüm pəncərədən başını çıxarıb onu salamladı. Afaq da orda idi. Onlar Xosrovu maşına dəvət etdilər.

---

[1] Ey müddəi eşq sənin işin deyil, çünki nə səbrin var, nə də dözməyə mətanətin.

– Təşəkkür edirəm, xanımlar, axşam sərinində bir az gəzmək istəyirəm.

– Gözəl fikirdir! – deyib Gülsüm Afaqa baxdı, – buradan biz də piyada gedə bilərik.

Onlar maşından endilər, çox mehriban rəftarla Xosrovu danışdırır, onunla yan-yanaşı addımlayırdılar. Bir neçə belə təsadüf onların bir az da yaxınlaşmasına səbəb oldu. Qızlar Xosrovun qeyri-adi bir zəka sahibi olduğunu hiss etdilər; bir gün Afaq söhbətarası gülərək dedi:

– Siz tacirdən artıq bir filosofa oxşayırsınız. Ya da şairə...

– Sizə elə gəlir... Aldanırsınız, – deyib Xosrov onun zehnini çaşdırmağa çalışdı.

Bir axşam isə onlar tək gəzməli oldular. Bu, qəribə bir axşam idi. Xosrova elə gəlirdi ki, yanında addımlayan adi insan deyil, məhəbbət və səadət ilahəsidir. O axşam Afaq nə qədər gözəldi, gül ağacı kimi ətir saçırdı. Bəli, onların arasında dilsiz məhəbbət başlamışdı. Məhəbbət isə uzun zaman lal və gizlin qala bilməz. O bir gün aşkara çıxdı və aşkara çıxanda Xosrov necə ağır yola qədəm qoyduğunu, Afaqı necə amansız bir girdaba sürüklədiyini hiss edib onu bu yoldan qaytarmağa çalışdı. Bu məhəbbətin uğursuz olduğunu, Afaqın daha uğurlu bir səadətə layiq olduğunu söylədi. Əlbəttə, Afaq bu sözləri eşitmək belə istəmir və "hər kəs özü öz səadətinin ağasıdır" deyirdi:

– Mən sevdiyimdən artıq dünyada heç şeyi görmək və axtarmaq istəmirəm.

Xosrov artıq həqiqəti ona açmağın vaxtı çatdığını görüb mərdmərdanə etiraf etdi.

– Siz bir taciri sevmisiniz, halbuki mən adi yaşayış şəraiti olmayan bir zəhmətkeşəm! – dedikdə Afaq onun sözünü kəsdi:

– Mən taciri yox, adamı sevmişəm. Nə olursunuz olun, mən görürəm ki, siz şərəfli və ləyaqətli adamsınız.

– Sizin kimi bir qızın məhəbbətini mən dünyaya dəyişmərəm. Ancaq mənim boynumda elə vəzifələr var ki, onlar hamıya məqbul görünən nemətləri mənə haram etmişdir. Bu sözlər, əlbəttə, sizi qane edə bilməz. Lakin mən cəhənnəm əzabları çəkməyə razı olaram, sizi əbədi iztirablar və məhrumiyyətlərlə dolu olan bir həyata çəkmərəm. Gedin, bir daha düşünün. Bəlkə hissiyyat sizi aldadır... Bəlkə...

Bu "bəlkə" ilə onlar son dəfə görüşüb ayrılmışdılar: lakin Xosrov hiss edirdi ki, Afaqı özündən uzaqlaşdırmağa çalışdıqca, qız bütün

varlığına hakim olur... Ağır işlərdən, gizli həyatın və gizli inqilabi işin daimi həyəcanlarla dolu olan qeydlərindən azad olan kimi, Afaq, işıqlı bir səadət heykəli kimi gəlib dururdu gözlərinin qabağında...

Qara, şıq maşın siqnal vermədən hərəkət edib getdi. Xosrov onun səsinə xəyaldan ayrılıb yenə pəncərə qabağına gəldi və küçəyə baxdı. İndi əks tərəfdən bir maşın göründü. Maşın gəlib bayaqkı evin qabağında dayandı. Bu, taksi idi. Kim isə tələsik düşüb əcələ ilə özünü divarın dibinə, qaranlığa verdi. Maşın dərhal yerindən tərpənib gözdən itdi. “Bu gecə sirlərlə doludur!” – deyib Xosrov düşündü.

Pəncərədən ayrılıb böyük ləmədəki kitabların qabağına gəldi. Bu ləməyə o, ictimai fikir və inqilabi mübarizələr tarixinə aid kitablar yığmışdı. Burada farsca ilə yanaşı fransız, ingilis, ərəb və rus dillərində də kitab vardı. Qolunu uzadıb əlinə gələn ilk kitabı götürdü. Bu, Tağı Əraninin “Difaiyyəsi” idi. Qəribədir! İlk olaraq bu kitabın əlinə gəlməsi ona mənalı göründü. Kitabı vərəqləməyə başladı. Böyük inqilabçı mütəfəkkirin fikirləri onu ən gözəl bir romandan daha artıq maraqla cəzb edirdi. Nə vaxt isə oxuyub altından xətt çəkdiyi cümlələri yenidən gözdən keçirdi. Gözləri bu cümlədə ilişib qaldı: “Öz həyatını cəmiyyətin inkişafı yolunda mübarizədə qurban verməkdən böyük iftixar ola bilməz!”.

Bu cümlənin üstündə fikrə getdi. “Bir inama bax! Əqidənin gücünə bax, eşq olsun! Xalqın mənəvi qüdrəti və şərəfi belə adamlardır!” – deyib düşündü. Elə bu zaman kim isə əli ilə ahəstəcə qapını iki dəfə tıqqıldatdı. Xosrov hər ehtimala qarşı dərhal pəncərəni açdı və dönüb qapıya tərəf getdi:

– Kimdir?

Qapı dalında Nurməhəmmədin ahəstə və həyəcanlı səsi eşidildi:

– Mənəm, müəllim, açınız. Təkəm.

Xosrov tez qapını açdı, Nurməhəmmədi içəri buraxıb təpədən dırnağa qədər süzdü, gözlərini ağarmış üzündə saxlayıb soruşdu:

– Xeyir ola, Nurməhəmməd?! Olmaya bir bədbəxtlik üz verib? Əyləş.

Nurməhəmməd əyləşmədi, sorğu-suala yol verməyən təlaş dolu səslə dedi:

– Xəyanət bədbəxtliksə, böyük bədbəxtlik üz verib, müəllim. Yığışın, elə bu gecə bu otağı tərk edin.

– Nə danışırsan, Nurməhəmməd, nə xəyanət?!

– Əzim Əsgəri sizi satıb. Bütün təşkilatınızı satıb. O xaindir. Sazman əmniyyətə satılıb. Mən bunu səhih bilirəm. Lap mötəbər mənbədən bilirəm. Elə bu gecə köçün burdan. Mən sizə yer də hazırlamışam. Etibarlı bir dostumun evində.

Xosrov, Nurməhəmmədin təlaş və həyəcanlarına baxmayaraq, onun verdiyi xəbəri olduqca soyuqqanlı qarşıladı. Tələsmədən, səbirlə ona bir neçə sual verdi. Harda, nə vaxt, kimdən eşitdiyini soruşdu. Cavablarına diqqətlə qulaq asdı, nəhayət, onun təklif etdiyi yerə köçməkdən imtina edib dedi:

– Əzim Əsgəri satılmışsa, deməli, mənim yerimi bilirlər və dalımca güdücülər salıblar. Sənin gecə-gözü bura gəlməyin də xətərnakdır. Eyib etməz, al bu kitabı, sonralar səni sorğu-suala çəksələr de ki, köhnə müəlliminəm, təcili lazım olduğu üçün bu kitabın dalınca gəlmişdin. Etibarlı dostunun evinə isə mən getmərəm. Çünki, beləliklə, səni bağışlanmaz bir günaha salmış olaram. Get və məndən nigaran olma. Belə vacib bir xəbər üçün təşəkkür edirəm. Artıq durma, get.

Nurməhəmməd gedə bilmədi. Ayaqları yerə mıxlanmış kimi heyrət və məhəbbət dolu gözlərlə özünü soyuqqanlı və təmkinli aparan Xosrova baxıb durdu. Bu baxışlar qarşısında ürəyinə sıcaq duyğular dolmuş Xosrov onu bağrına basıb öpdü:

– Qorxma, dedi. Get. Mənə heç şey olmaz! – deyib onu yola saldı.

Özü isə elə o gecə məlum otağı tərk etdi.

4

Xosrov jurnalist dostu ilə məhz burada, üç küçənin ayrıcında görüşməyi əvvəlcədən şərtləşmişdi. Əzim Əsgərinin xəyanəti aşkar olduqdan sonra təşkilatın bəzi üzvlərinin təhlükəsizliyini təmin etmək lazım gəlirdi. Yerlərdə ruh düşkünlüyünə yol verməmək, mübarizə ruhunu gücləndirmək, yaranmış şəraitə görə vəzifələri və iş üsullarını müəyyən etmək üçün rəhbər heyətin yığışmasına ehtiyac vardı. Lakin bütün bunlar son dərəcə ehtiyatkarlıq tələb etdiyindən hər nöqtəni ölçüb-biçmək, müqabil cəbhənin planlarından və tədbirlərindən xəbərdar olmaq, cəmiyyətin müxtəlif təbəqələrinin əhvali-ruhiyyəsini bilmək lazım gəlirdi. Bu işdə isə jurnalist çox fayda verə bilərdi. O, demək olar ki, şəhərdəki bütün söhbətlərdən xəbərdar idi. Özü də təcili görüş istəmişdi. Deməli, nə isə vacib bir xəbər var.

Xosrov sözləşdikləri vaxtda vədə yerində olmaq üçün lazımi ehtiyat tədbirləri görərək evindən çıxmışdı. O, yaxşı bilirdi ki, hansı küçələrdən və nə sürətlə getməlidir ki, vaxtında görüş yerində olsun. Nə bir dəqiqə tez, nə bir dəqiqə gec.

Axşam idi. 1336-cı şəms ili, tir ayının on beşi, yəni 1957-ci il iyul ayının altısı idi. Bütün cənub ölkələrində olduğu kimi Tehranda da günəş batandan azca sonra qatı qaranlıq hər tərəfi bürümüşdü. Açıq mavi göylər dərhal ulduzlarla dolmuşdu. Əlbəttə, ola bilər ki, şəhər əhalisinin çoxu bütün bunları hiss etməmişdi. Onlar çoxdan elektrik fənərlərinin işığına alışmışlar. Göylərə baxmaq, batan günəşi seyr etmək kimi ləzzətləri çoxdan unudublar. Lakin Xosrov nə qədər qayğılı olsa da, təbiət mənzərələrini seyr etməyi unutmaz, Tehranın səhərlər açılıb, axşamlar daralan üfüqlərinə baxmaqdan doymazdı. İndi də yay günəşinin tez-tələsik məğrib üfüqlərinə yatmasına, qaranlıq pərdənin birdən-birə göyləri örtməsinə diqqət etmiş və anlaşılmaz bir kədər duyğusu ilə durub evdən çıxmışdı.

Küçələrdə adamlar seyrəkləşmişdi. Xüsusən, Xosrovun hərəkət etdiyi ucqar küçələrdə gündüzlər şəhərin mərkəzinə axan adamlar indi mərkəzdən kənarlara çəkilir; yorğun-arğın evlərinə dönürdülər. Lakin kiçik dükanların bir hissəsi hələ də açıq idi. Arabir xırda alverçilərin, su, siqar və sair xırda şeylər satan uşaqların müştəri çağıran səsləri eşidilirdi. “Bu ticarət gölü millətin nə qədər sağlam qüvvələrini çürüdüb məhv edir!” – deyərək düşünən Xosrov bir su dükanına girdi, bir stəkan sərin portağal şirəsi içib çıxdı və yoluna davam etdi.

Havalar çox isti keçirdi. Bürkü idi. Bürkü, xüsusən Tehranda ağır olur: səkilərdən, evlərin divarlarından od çıxır və adamı qarsır, buxarlanmış, isti havada nəfəs almaq çətin olur. Bütün bunlara baxmayaraq, Xosrov Tehranı dəruni bir məhəbbətlə sevirdi – həqiqi oğul məhəbbəti ilə! Bu şəhər onun nəzərində millətin bütün oğul və qızlarının ürəklərini bir-birinə yaxınlaşdıran böyük bir ana idi. İranın keçmişində, bugünkü həyatında və gələcəyində yaxşı nə varsa, sanki, hamısı bu ananın sinəsinə toplanmış, ora rişə ataraq bir-birinə qovuşmuş, kökləri və budaqları ilə bir-birinə dayaq olmuşdu...

Bu hisslər Xosrovun üzündə şairanə bir ifadə yaratmışdı. Onun geniş alnında və qara eynəyin altındakı gözlərində yaz səhərinin işığı vardı. Lakin zahirən o, elə laqeyd, elə təmkinlə yeriyirdi ki, kənardan baxan belə hesab edə bilərdi ki, o da yüzlərdən və minlərdən biridir ki,

axşamdan küçəyə çıxmış, qayəsiz-məqsədsiz olaraq insan axınına qoşulmuş, gəzmiş, yorulmuş və indi də laqeyd halda qaranlıq bir gecənin düşməsi ilə evinə qayıtmaqdadır. Heç kəsin fikrinə gələ bilməzdi ki, zahirən laqeyd görünən bu adamın sinəsi alovlu kürə kimi yanır. Bir-birindən ağır bir fikir, həyəcan, iztirab yerini rübabi hisslərə verir və yenə təzədən baş qaldıraraq onun sinəsini döyəcləyir.

Qara eynək onun gözlərindəki işığı da, kədəri də gizlədirdi. Bu kədəri görən naşı adamlar deyərdi ki, nakam məhəbbətinin kədəridir, bir gözələ qovuşmaq həsrətidir. Yox! Bu dünyada o, məhəbbətdən payını almışdır. Ona qarşı daima amansız olan tale məhəbbət məsələsində çox səxavətli idi. Afaq kimi fədakar bir qızın məhəbbətini ona vermişdi. İndi bu səadət taleyin ona bəxş etdiyi yeganə sevincdir. Bəs üfüqvarı o iri gözlərdəki kədər nədir? Bu, nakam arzuların, yerinə yetməmiş böyük istəklərin həsrətidir. Elə bir ehtirasdır ki, daima ürəyinin içində közərir, onu burulqanların, fırtınaların, tufanların qoynuna atılmağa məcbur edir. Yox, bu kədər deyil, bir işıqdır, bir qılınc parıltısıdır. Həmişə döyüşün qorxulu yerində olan, düşmənin içində kəşfiyyat aparan döyüşçü ehtirasıdır ki, sönmək, soyumaq bilmir!..

Saatın əqrəbləri doqquz yerində duranda Xosrov üç küçə ayrıcına gəlib çıxdı. Gözlədiyi adam yox idi. Onu fikir aparırdı: bir xata üz verməyib ki? Hər halda burada durmaq olmazdı. Gizli işin möhkəm qanunlarından biri də dəqiqlikdir. Vədə vermiş adam vaxtında gəlmədikdə dərhal vəd yerini tərk etmək lazım idi. Xosrov üç küçə ayrıcından uzaqlaşmaq istəyəndə, bir anlığa Əzim Əsgərinin sarı üzünü gördü. O, əcələ ilə gəlib Xosrovun sağ tərəfindən ötdü. Yanında bir adam vardı. Əsgəri son dərəcə özünü itirmiş və həyəcanlı görünürdü. Tez-tez Xosrova baxır və yanındakı adama nə isə deyirdi: Xosrov bu xainin üstünə atılmaq, boğazından tutub tülkü kimi sıxıb boğmaq istədi. Bunu hiss etmiş kimi Əsgəri ondan bir neçə addım uzaqlaşan kimi qaçmağa üz qoydu. Bu rəzil, bu çirkin adam necə də qorxaq idi! Xosrov ona təəccüb etdi ki, daxilən nifrət bəslədikləri bu adama necə də təşkilatın sənədlərini etibar etmişlər! Bu əbədi bir sirr olaraq qalacaq. Pələnglərin, şirlərin dövrəsində tülkülər necə də özlərinə rahat məskən sala bilir və etibar qazanırlar?! Xosrov bu fikirlərdən ayrılmamışdı ki, Əsgərinin yanındakı naməlum adam Xosrova bir güllə atdı. Xosrov dərhal tapançasını çıxardıb həmin adamı çaşdırmaq məqsədilə ona tərəf, lakin havaya bir güllə atıb geri döndü və şimala tərəf qaçaraq aradan çıxmağa cəhd etdi.

Bu zaman ara vermədən neçə yerdən onu atəşə tutdular: demə Əsgəri tək deyilmiş, yalnız yanındakı adama deyil, başqa xəfiyyələrə də bələdçilik edirmiş. Güllə səslərinə adamlar toplandı. Xosrov daldan atəş açan adamları susdura bilərdi. Çünki onun gülləsinin boşa çıxdığını görən olmamışdı. Lakin küçəyə o qədər kənar adamlar yığışmışdı və onu təqib edənlər elə bir başıpozuqluqla atəş açırdılar ki, onun müqavimət göstərməsi mütləq günahsız adamların həlak olması ilə nəticələnə bilərdi. Bunu isə o, vicdanına, partiyasına, ideallarına sığışdıra bilmirdi. Buna görə də fikri bu oldu ki, birtəhər qaçıb aradan çıxsın.

Onu təqib edənlər isə amansız idilər. Onlar pələng dalına düşmüş it ilxusı kimi bir-birinin həvəsinə daha qızğın halda onu gülləyə basmışdılar. Biridən Xosrov güllələrdən birinin lap qulağının dibində vıyıldadığını hiss etdi. Sol qolunun dirsəyini sanki odlu dəmirlə yandırdılar. Qolu yanına düşdü və dərhal köynəyini qan bürüdü. Macal tapıb sol qolunu bağlamış ikinci güllə sol budunu deşdi. Üçüncü güllə isə ürəyinin altından dəyib çıxdı. Bu zaman Xosrov özünü dar küçələrdən birinə yetirərək yana buruldu və diri-diri ələ düşməməyi qət etdiyindən bu küçə ilə qaçmağa başladı. Qan axıb zəiflədiyindən və gözlərinə qaranlıq pərdə çökdüyündən buranın kiçik bir dalan olduğunu görə bilməmişdi. Bunu yalnız o zaman hiss etdi ki, sinəsi divara söykəndi. O tez dönüb arxasını divara verərək nəfəsini dərmək istədi. Alnından tər damcıları su kimi axdığından onsuz da dumanlanmış gözlərini tuturdu. Cibindən dəsmal çıxarıb gözlərini, alnını, üzünü sildi. Gözləri azca işıqlandıqda öküzə oxşar qara bədheybət bir kişinin əlində kərpic üstünə hücum etdiyini gördü. Xosrov yaralı pələng kimi nərildədi:

– Ay namərd, alçaq! Geri çəkil, canına alaram!

Qara həyula bu nəriltidən qorxub geri çəkildi. Lakin Xosrovun taqətdən düşdüyünü görüb ikinci dəfə hücum etmək istədi. Xosrov bir də gücünü toplayıb onun üstünə qışqırdı:

– Alçaq, cəllad! Bu saat beynini deşəcəyəm!

Qara həyula ikinci dəfə geri çəkildi. Lakin yenə Xosrovun gözlərinin yumulduğunu görüb üç kərpici üst-üstə qoyaraq qaldırıb zərbə ilə onun başına çırpmaq istədi. Xosrov gözlərini açanda bunu gördü və ancaq onu edə bildi ki, başını sol tərəfə əydi, kərpiclər sağ çiyninə dəyib bütün bədənində dəhşətli bir ağrı yaratdı. Onlar Xosrovun çiyin sümüyünü sındırdı. Qara həyula isə "öldürdüm, öldürdüm" – qışqıraraq küçəyə tərəf qaçdı.

Xosrov böyük küçədəki səs-küyü eşidirdi və bu halında da ələ keçmək istəmir, qaçıb qurtarmaq ümidi ilə yaşayırdı. Sol əli və sol qıçı tamamilə işdən düşmüşdü. Divara dırmaşmalı halı yox idi. O tərəf-bu tərəfə baxanda divarın dibində atılıb qalmış köhnə bir nərdivan gördü. Min əziyyətlə onu qaldırdı, divara söykədi və olmazın çətinliklə dama çıxıb ayağı ilə nərdivanı yerə itələdi, damın üstündə oturdu. Bütün bədəni od içində yanırdı. Taqətsizlik gözlərinə əbədi pərdə çəkməkdə idi. Artıq o, sağ qurtaracağına və ya hər hansı bir həkimin müalicəsi ilə həyata qayıdacağına ümidini itirmişdi. Bu ağrılara, bu yaralara və iztirablara heç bir bədən davam gətirməz, çoxdan məhv olardı. Onun daşdan, qayadan bərk olan bədəni və ruhu isə davam gətirmişdi.

Xosrov ani olaraq başına gələnləri düşünməyə və son nəfəsdə nə edəcəyini kəsdirməyə çalışdı. Bütün bu qarma qarışıq hadisələr və simalar içində Əzim Əsgərinin sarı tiryəki üzünü, batmış ovurdlarını xatırladı. Hansı bir hissin təsiriləsə tez cibindən bloknot və qələm çıxartdı, sürünərək özünü damın qırağına verdi. Həyətdəki lampanın bura səpələnən sönük işıqlarında bu sözləri yaza bildi: “Mənim qatilim birinci növbədə milli şura məclisinin stenoqrafı Əzim Əsgəridir!”.

İndi Xosrovu ən çox narahat edən bu idi ki, Əzim Əsgərinin alçaq xəyanəti və cinayəti yoldaşlarından və xalqdan gizli qala bilər. Onu təqib edən, arxadan ona güllə atan inzibati məmurlara və xəfiyyələrə o qədər nifrəti yox idi ki, nə qədər Əzim Əsgəriyə vardı. Çünki onlar sərbaz paltarı geyib məvacib alır və buna görə də öz vəzifələrini yerinə yetirirdilər. Onların işi hizb-tudə ilə mübarizə aparmaqdır, rəsmi borcları bunu onlardan tələb edirdi. Əzim Əsgəri isə alçaq bir xain idi, satılmışdı. Erkək canavarla əlbir olub sürünü bir-bir ona verən qancıq it kimi murdar idi. Belə itləri dardan asmağın ən adil bir cəza olduğunu böyük Nizami də söyləmişdir. Bu qəzəbli fikirlərin təhriki ilə Xosrov, Əzim Əsgərinin xəyanəti haqqındakı sözləri on ayrı-ayrı vərəqə yazaraq həyətə, küçəyə səpələdi. Bu ümiddə idi ki, onlardan biri namuslu bir adamın əlinə keçər, onu ittiham sənədi kimi və gələcək nəsillərə ibrət olaraq saxlarlar. Son vərəqə havada yellənərək yavaş-yavaş həyətə düşdü. Bu zaman otaqdan çıxan gözəl bir gəlin:

– A, bu nədir, bu nə kağızdır? – deyib vərəqəni götürdü.

Sonra Xosrovun qulağına bu səslər gəldi:

– Ay qız, bunu ki, Ruzbeh yazıb... Saxla... Saxla... Nurməhəmmədə verərsən.

Xosrova sanki dünyanı və əbədiyyəti bağışladılar. Kürə kimi yanmaqda olan ürəyinin başına buz qoydular, yaralarına məlhəm sürtdülər. Ona elə gəldi ki, gözəl bir yatağa uzanmışdır, atası, anası, qardaşları başının üstündə qulluğa hazır durublar... Bəs Afaq? Bəs o, niyə elə kənarda dayanıb, niyə elə kədərlidir? Yox, Afaq kənarda durmayıb, öz şəfa verən əllərilə onun başına yaş dəsmal qoyur, başının ortasında seyrəlməyə başlayan saçlarını sığallayır...

Tehranın ulduzlar sayrışan göylərinin altındakı balaca bir damın üstündə Xosrovu şirin yuxu apardı...

5

Xosrov gözünü açanda özünü bir zərrə də işıq girməyən bir yerdə gördü. Bura əfsanələrdə deyilən yeraltı zindanları andırırdı. Divarlar rütubət qoxusu verir, yazın son ayı olduğuna baxmayaraq, xoşagəlməz, əzici bir soyuq canına üşütmə salırdı. Bəli, bura zindan idi. Onu bu vaxta qədər düşdüyü məhbəs otaqlarından ən dəhşətlisinə – tək kameraya salmışdılar. Xosrov ölmədiyinə, hələ də salamat qaldığına özü də heyrət etdi. İnsanın bədəni nə qədər möhkəm ola bilər, nələrə dözə bilərmiş! "Yaxşı, indiki əzrailin əlindən salamat çıxmışam, yaşamalıyam. Bundan sonra, nə olsa dözməliyəm", – deyib düşündü və sövqtəbii bir hərəkətlə sağ çiynini, sol sinəsinin altını yoxladı: bədəni sarıqlar içində idi. "Deməli, yarmışlar, bağlamışlar, heç xəbərim də olmayıb. Axırda da gətirib bura atıblar. Danışdıracaqlar, ruhi əzablar verəcəklər, çaşdırmağa, əzməyə, sındırmağa, səcdə etdiyim ideallarin əleyhinə getməyimə çalışacaqlar. Deməli, mübarizə davam edir. Vuruş meydanı bu zirzəmiyə keçmişdir. Görək kim kimi?!"

Gözlərini ovdu, başını qaldırıb dörd tərəfə nəzər saldı. Heç şey görmək mümkün deyildi. İməklədi, yerlə süründü, nəhayət, divara söykənib qalxdı və əlini divara, ayağını yerə sürtə-sürtə kameranın enini, uzununu, hündürlüyünü yoxladı. Bura ən qədim hamamların hücrəsinə oxşayırdı. Divarlar yaş idi, hətta əlinə dəyən yumşaq şeylərdən bildi ki, divarlarda göbələk bitib, deməli, illər, on illərdir ki, bura günəş işığı görmür, havası təmizlənmir... Kim bilir bu divarların arasında nə qədər insan ürəyi partlayıb, neçə adam dəli olub, neçəsi başını divara çırpıb parçalayıb?!

Yox, Xosrov dəli olmayacaq, intihar etməyəcək, insana bu zülmü rəva görənlərlə mübarizə aparacaq. Onun bədənini bu dörd divarın içinə salmaq, günəşdən, havadan, mavi göylərə baxmaqdan, çiçəklərin ətirindən məhrum etmək olar. Fikrini, şüurunu, xəyallarını buxovlamaq, dama basmaq, zindana salmaq isə mümkün deyil. Bu qaranlıq zindanda o, yaxşı şeylər düşünəcək, xəyalında daima dünyanın gözəlliklərini canlandıracaq, Nurməhəmmədi, Afaqı yanına çağıracaq, onlarla söhbət edəcək, gələcəyə, sabahkı günə baxacaq. Bəli, insanın başı bir günəş kimi zülmətlərə də işıq saça bilər, ürəyi, rütubətli və soyuq zirzəmiləri də qızdıra bilər! Ağlamaq, inləmək, şikayət etmək aciz və miskinlərin işidir. Sədini, Hafizi, Xəyyamı öz qaranlıq zindanına müsahib çağırmışdı. Onlar ona deyirdilər: "Pərvanə kimi işıq aşiqisənsə, səni oda atsalar da nalə və fəryad eləmə!".

Zindanın divarları o qədər qalın, dəmir qapısı o qədər ağır idi ki, kənardan heç bir səs eşidilmirdi. Xosrov gecə və ya gündüz olduğunu müəyyən edə bilmirdi. Aha, deyəsən dəhlizdə hənirti duyulurdu. Budur, onun qapısına açar saldılar. Qapı ağır-ağır açıldı və işığa oxşar bir şey kameraya süzüldü: gündüzdür, çünki içəri girən zindan gözətçisinin arxasındakı pəncərəsiz otağa da işıq balaca, dar dəhlizdən düşürdü.

– Xosrov Ruzbeh, gəl! – deyə zindan gözətçisi ona əmr etdi.

Xosrov qeyri-iradi bir cəldliklə onun dalınca getdi. Yox, onun dalınca yox, zəif, sönük işığa doğru getdi. Dəhlizdən yüngül hava ciyərlərinə dolanda, qüdrətli həyat duyğuları sinəsini titrətdi. Gözətçi onu balaca, lakin işıqlı bir otağa gətirdi, müstəntiqə təhvil verdi.

Yüksək hərbi rütbəli müstəntiq ilk baxışda Xosrova özündən, taleyindən, quruluşundan razı bir adam təsiri bağışladı. O, Xosrova sual və istehza dolu gözlərlə baxırdı. Sanki soruşurdu: "Nə istəyirsiniz, niyə qoymursunuz bu cənnət kimi İranımızda rahat yaşayaq?!" Lakin o, Xosrovdan bunu soruşmadı, əyləşmək üçün yer təklif etdi. Sonra qabağındakı şişman qovluqların birini götürüb o birini qoydu. Hansını isə açaraq vərəqlədi və nəhayət, başını qaldırıb soyuq nəzərlərlə Xosrovu süzdü. Adını, sicillisini, yaşını, sənətini müəyyən edən bir sıra rəsmi suallar verdi. Gözləmədən səsini dəyişərək sərt bir əda ilə:

– Tudənin üzvüsünüzmü? – deyib soruşdu və elə bir vəziyyət aldı ki, guya Xosrovun bunu inkar edəcəyinə heç bir şübhəsi yox idi. Xosrov isə təmkinlə cavab verdi:

– Nəinki üzvüyəm, hazırda onun təşkilatçılarından və bütün fəaliyyətinə cavabdeh olan şəxslərdən biriyəm!

– Mersi, mersi! – deyib müstəntiq gözləmədiyi bu cavabdan vəcdə gələrək əllərini ovuşdurdu. – Bütün suallara belə cavab versəniz, ağayi Ruzbeh, nə siz əziyyət çəkərsiniz, nə biz. Hər şey çox tez həll olunar. Ədalət ilahəsi də sizdən razı qalar.

– Yəni məni edam edərsiniz! – deyib Ruzbeh istehza ilə əlavə etdi.

Müstəntiq yenə əllərini ovuşdurdu (Xosrov hiss etdi ki, bu müstəntiqin adətidir: gözləmədiyi sözlər eşidəndə əllərini ovuşdurdu).

– Ölümdən qorxursunuz, hə? – deyib müstəntiq elə etinasızlıqla soruşdu ki, guya ölüm futbol oyunu kimi bir şeydir. Xosrovun cavabını gözləmədən əlavə etdi: – əlbəttə, ölüm o qədər də xoşagələn şey deyil. Mən sizi qınamıram. Ancaq istəsəniz, bu dəfə də ölümdən qurtara bilərsiniz...

– Bu dəfə məni çox pis yerə salmısınız, özüm də yaralıyam. Heç cür qaçmaq imkanı yoxdur. Qorxuya gələndə isə deməliyəm ki, mən doğrudan da qorxuram, ancaq ölümdən yox, ondan qorxuram ki, siz mənə bəraət qazandırasınız və bu da xalqın nəzərində mənə şərəfsizlik gətirə. Elə güman edərlər ki, bəziləri kimi mən də azadlığı və yaşamağı firqəmə, etiqadlarıma xəyanət bahasına qazanmışam. Mən bundan qorxuram.

– Siz əntiqə adamsınız, anlaşılmaz adamsınız! – deyib müstəntiq adətinə əməl etdi. – Belə çıxır ki, sizin bizdən birinci xahişiniz budur ki, sizi edam edək!

– Xeyr, mən sizinlə mübarizə aparacağam. Sübut edəcəyəm ki, mən heç bir cinayətə mürtəkib olmamışam. Mən insanlıq və şərafət yolunda bir fədaiyəm. Əgər bunu bacarmasam, siz məni dumanlı və anlaşılmaz bir şəraitdə azad etsəniz, mən siz müstəntiqdən, qoşun müddəiümumisindən və sonra da məhkəmə qazilərindən ciddi surətdə tələb edəcəyəm ki, məni edam etməkdə ən kiçik tərəddüdə belə yol verməyəsiniz. Çünki Muxtarı kimi cavanları ölümə məhkum edən məhkəmə mənim kimi bir şəxs barədə edam hökmü çıxarmasa, hər bir avam və savadsız qoca kişi və ya ağbirçək qadın şərəfimə şübhə etməyə haqlı olacaqdır.

Müstəntiq ayağa durdu, əllərini ovuşdura-ovuşdura pəncərə qabağına getdi, hara isə baxdı, qayıdıb sol əlini stolun kənarına qoyub Xosrova tərəf əyildi.

– Çox şərəf-şərəf deyirsiniz. Şərəfi olan adam bu sözləri deyərmi?

O, əsəbi hərəkətlə döndü və qovluqdan bir kağız çıxardıb Xosrovun qabağına itələdi. Xosrov kağızı götürüb oxudu. Orada yazılmışdı:

“Bəli, həmin bu Xosrov Ruzbeh şərəfsizlik, vicdansızlıq və hər cür insanlıq simasını itirməkdən doğan bir həyasızlıqla deyir: “Mənim məram və rəviyəmə zidd olmuş və olan hər bir kəsin öldürülməsini vacib bilmiş və bilirəm”.

Xosrov dərin fikrə getdi. Bir az sonra acı-acı gülüb dedi:

– Sizin dəlil kimi istifadə etdiyiniz bu kağız sizə qarşı, sizin quruluşa qarşı böyük ittihamdır. O, Əziz Əsgəri kimi bir casusun uydurmasıdır. Bütün fəaliyyəti xalqdan gizli, qapalı divarlar arasında gedən bir təşkilat bundan artıq nə yarada bilər? Əfsanəvi bir əjdaha kimi qırx min əli-ayağı olan və hamısı da gizlində çalışan bu əcaib təşkilat.

– Olmuya siz məni də öz yolunuza çəkmək fikrindəsiniz?!– deyib müstəntiq onun sözünü kəsdi, – yaxşısı budur ki, əsil mətləbə keçin. Orada yazılanlar barədə danışın...

– Əvvəla, istehza dolu sualınıza cavab vermək istərdim; həqiqəti müqəddəs tutan və mənən pozulmamış hər bir adamı biz öz yolumuza çəkməyə çalışmışıq və çalışırıq. Tutduğu vəzifənin və ictimai mövqeyin heç bir əhəmiyyəti yoxdur. Əgər həqiqəti və şərəfi uca tutursa, bizim dəlillər və məramımıza dərindən bələd olsa, tərəfimizə keçəcəyinə inanırıq.

– Məndən sərf-nəzər edin, sizin bütün vücudunuz yalandır. Mətləbə keçin. Yuxarıdakı cümləyə nə deyirsiniz, sizin sözlərinizdirmi?

– Xeyr, mən elə nadan və alçaq fikirlə yaşamamışam. Yuxarıdakı cümlə mənim məfkurəmə əsla uyğun deyil.

– Deyil?!

– Birinci dəlil budur ki, “rəfatən” – sözündən düzəlmiş “rəvət” sözü olduğu halda mən heç vaxt “rəviyyə” kəlməsini işlətmərəm. Çünki o fars dilinin qaydalarını pozur və fikri düzgün ifadə etmir. İkinci dəlil də budur ki, mən dönə-dönə qeyd etmişəm, yenə deyirəm: siyasi terror marksizm nəzəriyyəsinə ziddir. Mən isə marksist olmağımla fəxr edirəm!

...Müstəntiqlə bu cür görüşlər doqquz ay davam etdi. Əlbəttə, Xosrovdan məşrutəyə, xalqa, vətənə zidd fəaliyyətlər haqqında heç bir etiraf almaq mümkün olmadı. Bütün görüşlər və istintaq iki bir-birinə zidd dünyagörüşünün, ictimai-siyasi və fəlsəfi-əxlaqi anlayışların mübarizəsinə, toqquşmasına çevrildi. Hər dəfə müstəntiq müttəhimin fikri və məntiqi üstünlüyünə rast gələndə sorğu-sualı kəsir, sabaha

keçirirdi. Sabah isə pul üçün işləyən xainlərin və casusların kəşfiyyat idarələrinə verdiyi uydurmalara, açıq yalanlara və təhriflərə əsaslanan ittihamlarla müttəhimi divara sıxmağa çalışırdı. Onun ruhunu əzmək, bezikdirmək, cana gətirmək və istənilən kağızlara qol çəkdirmək fikri ilə müstəntiq çox vasitələrə əl atdı, heç biri də istənilən nəticəni vermədi. Bütün bu müddətdə Xosrov təkadamlıq, rütubətli kamerada saxlanılır, heç kəslə, hətta doğma qardaşı ilə də görüşə icazə ala bilmirdi. Ayaq yoluna getmək, gündə beşcə dəqiqə də olsa açıq havaya çıxmaq kimi adi ixtiyaratdan da o, məhrum edilmişdi. Müstəntiqlə birinci görüşündən sonra isə onun bütün əyin paltarlarını əlindən alıb, 28 nömrəli kamerada anadangəlmə lüt saxladılar. İkinci görüş zamanı bu vəhşi hərəkətə qarşı protest etdikdə isə dedilər: "Səndə çox sirlər var. Özünü öldürər və onları qəbrə apara bilərsən".

Xosrov bütün bunları ağır taleyinin nəsibi kimi qəbul edir, xalqın azadlığı və səadəti yolunda əzablara dözməyi özünə şərəf bilirdi.

Nəhayət, doqquz aydan sonra istintaq qurtardı və məhkəmə başlandı.

Əlbəttə, onun ruhi sarsıntılar keçirdiyi dəqiqələr az olmurdu. Təmiz hava, açıq göylər, parlaq ulduzlar, dostların üzü və söhbəti üçün bəzən o qədər darıxırdı ki, vaxt eləyirdi bağrı çatlasın. Hələ Afaq!..

Afaq üçün onun sinəsi min bir həsrətlə, şirin arzularla qalxıb-enir, başını qaranlıq zindanın rütubətli divarlarına söykəyərək bir saat-iki saat yuxuya getdiyi zaman onu qarışıq və ağır röyalarında görürdü. Həmişə də xoş təbəssümlə, həyatın, dünyanın hər cür əzablarına əvvəlcədən dözməyə hazır olan nəhayətsiz bir nəcabət və təmkin yağan gözlərlə o, Xosrova baxır, onu dözümlü olmağa çağırırdı. Ayılanda Xosrov uzun zaman rahat ola bilmir. Min cür təzadlı fikirlərə dalırdı. Onun həyatını bu fırtınalı yollara salmaqla günah etməmişmi? Başqa bir səs deyirdi, yox, axı, bu fırtınalar, bu ağır iztirablar, bu məhrumiyyətlər haqqında biz ona demişdik. Namuslu bir adam kimi qabağa çıxa biləcək bütün təhlükələr haqqında xəbərdar etmişdik.

Yenə dəmir qapı ağır-ağır açıldı və hissiz, duyğusuz bir maşın kimi danışan zindan gözətçisinin kobud səsi eşidildi:

– Hə, ağayi Xosrov, gəl görək!

Yenə kimdir çağıran, müstəntiqdir, müddəiümumidir, ya kimdir?.. Bəs deyilmi?! Qurtarsınlar, məsələni acı bağırsaq kimi uzatmaqdan bunlar ləzzət alırlar? – deyib Xosrov deyindi.

Zindan gözətçisi yenə eyni laqeyd və insani iztirablara qarşı biganə bir səslə cavab verdi:

– Ləzzət almırlar, maaş alırlar. Pul, pul! Necə bilmisən, üzü qara pulu? Elə bilirsən ki, mənim çox xoşuma gəlir sizin qapılarda keşik çəkmək?.. Ancaq nə edəsən, işdən çıxsam, bir bölük külfəti nə ilə dolandırım? Gərək itə-qurda möhtac olam. İndi aylıq maaşım öz yerində, sənin kimi ağalara gələn şey-şüydən də bir az pay düşür. Bəziləri lap pul da verirlər. Birtəhər başımızı girləyirik.

Xosrov gözətçinin son sözündən tutub düşündü: "Başımızı girləyirik!". Necə də zavallı bir etiraf! Axı, insan yaşamalıdır. Böyük, ali bir həyatla, yaşayışın ləzzətini bütün ürəyi və qanı ilə duyaraq yaşamalıdır. Bu yazıqlar isə ona da qanedirlər ki, başlarını girləyirlər... Zülm üstündə qurulan həyat belədir. Hər addımbaşı öz puçluğunu sübut edən yüz dəlil ortalığa atır.

– Hə, yenə nə fikrə getdin, gəl görək, – deyib keşikçi qapının o tərəfində durub ona yol göstərdi. – Bu dəfə yanına bir xanım gəlib, görüşməyə icazə veriblər. Deyəsən yumşalmısan, istədiklərinə qol qoyursan, hə? Əcəb eləyirsən, dünyanın işi belədir, ağa dedi sür dərəyə, sür dərəyə. Canına yazığın gəlsin. Nə deyirlər, de ki, düz buyurursuz, ağalar, söz siz deyəndir, vəssalam. Başını birtəhər salamat saxla. Bu zəmanədə başı salamat saxlamaq özü də bir hünərdir!

Xosrov bilmirdi gözətçinin böyük bir səmimiyyətlə dediyi və onun həyat fəlsəfəsinin puçluğunu bu qədər utanmazcasına ifadə edən sözlərinə qulaq assın, yoxsa gələnin kim olduğunu soruşsun, hətta fikrindən keçdi ki, bəlkə gözətçi mənimlə oynayır, məni ələ salır? Axı, zindanlarda belə hallar çox olur. Elə qulluqçular və məmurlar tapılır ki, zavallı məhbuslarla siçan-pişik oyunu oynamaqdan ləzzət alırlar. Onları istəkli arvad-uşaqları, ata-anaları ilə görüşdürməyə apardıqlarını vəd edib kameradan çıxarır, sonra da cəza otaqlarına aparırlar.

Lakin gözətçi Xosrovla zarafat etmirdi, onun gülüb, ələ salmaq və oynatmaq fikri yox idi. Onu zindanın görüş otağına gətirdi. Xosrov içəri girdikdə gözləmədiyi bir hədiyyə üçün insanın nəinki iztirablarına, sevincinə də biganə olan gözətçiyə ürəyində min təşəkkür dedi. Xosrovdan iki-üç addım qabaqda həyəcandan ağappaq ağarmış Afaq oturmuşdu. Sol çənəsini sol ovcuna qoyub skamyaya dirsəkləndiyi halda dərin fikrə getmişdi. Xosrovun içəri girdiyini hiss edən kimi tez ağaya durub qabağa gəlmək istədi, lakin taqətsiz kimi yerində sən-

dirlədi. Xosrov onun kağız kimi ağardığını gördü və özünü irəli atdı, Afaqı bağrına basdı.

Zindanın bir əbədiyyət qədər nəhayətsiz görünən doqquz aylıq əzabları, ürəkdəki ağrılar, bədəndəki yaraların sızıltısı, ruhi işgəncələr hamısı bir anda yox olub getdi. Dünyanın misilsiz gözəlliyi yenidən xəyalında canlandı. Həyat min bir füsunkar nəğmələrlə onu səsləməyə başladı.

Yan-yana, üz-üzə oturdular.

– Əzizim, necəsən? Mənsiz səni incitmirlər ki? Dost-aşna səndən üz döndərməyib ki? Axı, bizim kimi adamlarla bağlı olanlara qohumlar yad olur, yadlar düşmən.

Artıq özünü ələ almış, artıq Xosrovla zindanda görüşdüyünü unutmuş, onunla birlikdə nəfəs aldığı, üz-üzə oturub danışdığı üçün əbədi səadətə qovuşduğunu güman edən Afaq:

– Elələri ilə bizim nə işimiz var! – dedi. – Allah ömürlərini uzun eləsin, özləri üçün yaşasınlar... De görüm sən necəsən?

Bu sual ağzından çıxan kimi qeyri-iradi olaraq bir də Xosrovu süzdü. Onun iri qara gözləri nə qədər dərinə düşmüşdü. Ovurdları batmış; üzünün, geniş alnının dövrələrində sarıya çalan ləkələr əmələ gəlmişdi. Baxışlarından isə əvvəlki kimi od tökülürdü. Bu halında o, çiynində dağları saxlayan bir bahadırı xatırladırdı.

– Allaha şükür ki, sağ-salamatsan. Yaraların sağalıb, – dedi və dönüb yana qoyduğu kiçik çamadanı götürdü. – Sənə dəyişək gətirmişəm. Bir cüt ağ üst köynəyi də almışam. Axı, ağ köynəyi sevirsən.

Ruzbeh onun əllərini öpdü, duz kimi yaladı:

– Sənə min təşəkkür, mənim əzizim! Yer üzündə sənin kimi mələklər olmasaydı, mənim kimi fəlakətzadələr bu dünyadan nə qədər binəsib gedərdilər. Taleyim, əzablarıma mükafat olaraq səni mənə rast gətirib.

Gözətçi gəldi. Laqeyd, kobud səslə onlara müraciət etdi:

– Hə, daha bəsdir əyləndiniz... Hər şeyi qaydasınca eləmək yaxşıdır. Aclıq çəkmiş adama birdən-birə çox yemək verməzlər... Durun, xanım!

Bu rəftara, bu danışıq tərzinə öyrənməmiş Afaq sövq-təbii bir hərəkətlə ayağa qalxdı. Bunu görən gözətçi ucadan güldü. Üzünü Xosrova tutdu:

– Lap xam göyərçindir! – dedi. – Hardan düşüb sənin kimi çalağanın əlinə? – Xosrov etiraz edən gözlərlə gözətçiyə baxanda o, yenə güldü. – Görürəm, nəcabətli xanımdır, arvadındır?

Bu sual Afaqı da, Xosrovu da sarsıtdı. Necə də bu vaxta qədər Xosrov bu barədə düşünməmişdi. Tez dedi:

– Bəli, yoldaşımdır. Ömür, həyat yoldaşımdır.

– Onda bir beş dəqiqə də danışın, qurtarın! – Gözətçi çıxan kimi Afaq əlini Xosrovun çiyninə qoydu:

– Gəlmişəm, səndən bir xahiş edəm. İcazə ver kəbinimizi kəsdirək.

Bir anda Xosrovun beynində fırtına qopdu. Min bir fikir dalğa-dalğa qalxıb-yatdı. Qadın nə qədər vəfalı, nə qədər fədakar və qəhrəman ruhlu olmalıdır ki, ölüm başının üstünü almış bir adama bu təklifi etsin!

– Deyirlər ki, ürəkləri məhəbbətlə birləşən adamların kəbini göylərdə kəsilir. Bizim kəbinimiz çoxdan kəsilib, əzizim... Bir də ki, mənim vəziyyətimdə olan adamlardan çox zaman kəbinli arvadları üz döndərir, sən sabahkı günü düşünürsənmi? Məni ölüm...

– Heç elə sözü dilinə gətirmə! – deyib Afaq onun sözünü kəsdi. – Sabah izdivac ayini icra olunacaq. Qoy bizim də toyumuz zindanda olsun.

Afaqın gözlərindən inci dənələri yanağına düzüldü. Xosrov onu bir daha bağrına basdı.

Xosrov kamerasına qayıdanda axşam düşürdü. O, Afaq haqqında, onun sədaqəti və fədakarlığı haqqında düşündükcə kameranın soyuq divarlarını qucaqlayıb Nizaminin "İnsan yer üzünün əşrəfidir" deyən sözlərini xatırlayırdı. Bəli, Afaq kimilərdir həyatın şirinliyi, dünyanın gözəlliyi!.. Heyif, min heyif ki, bu gözəlliyi pozan, bu şirinliyə acı zəhrimar qatan da insan özüdür...

Gecədən xeyli keçənə qədər Xosrovun gözünə yuxu gəlmədi. Onun sinəsinə meydan açmış xəyallar, fikirlər, həyəcanlar bir-birini əvəz edirdi. Ancaq gecə yarıdan keçəndə fikirlər bir az sakitləşib yatdı, yorulmuş bədən dincəlmək istədi. Gözlərinə təzə yuxu getmişdi ki, qonşu kameradan çığırtı səsi eşitdi və dik atıldı, dinləməyə başladı. Kimi isə döyürlər.

Xosrov hər gecə təkrar olunan bu vəhşiliyə dözə bilməyib, yumruqlarını düyərək kameranın qapısını döyəcləməyə başladı. Xeyli sonra gözətçi gəldi:

– Hə, nə hay-küy salmısan? – deyib yuxulu gözlərini ovaraq soruşdu.

– Bu vəhşiliyə son qoyun, – deyib Xosrov dəmir qapının dalından qışqırdı.

– Qoy işini görsün, ağa dərəcə alır! – deyib gözətçi laqeydcəsinə cavab verib çəkildi.

“Dərəcə alır!”. Bu da zülm və ədalətsizliyə əsaslanan cəmiyyətin çürük mahiyyətinin bir təzahürü idi. Xosrov xatırladı: üç gün əvvəl vəzifəsi şallaq vurmaq olan girəhbanlardan biri onun və gözətçinin yanında öz taleyindən şikayətlənib deyirdi:

– Dörd ildir gecə-gündüz adam döyürəm, şallaq vururam, hələ də mənə dərəcə verməyiblər. Deyirlər hələ tezdir, çalış, səy göstər. Adam nə qədər səy göstərər?.. Məgər məni onlar üçün...

Girəhban elə biədəb bir söz işlətdi ki, Xosrov qulaqlarını tutdu, gözətçi isə qəhqəhə çəkib güldü.

Xosrov düşündü: “Bunlar necə də məşrutədən, ədalətdən, xalqdan dəm vururlar?! Hər addımbaşı qanunsuzluq, özbaşınalıq hökm sürdüyü halda qanunlar yazır, kitablar çap edir, məclislər düzəldir, məhkəmə qururlar. Komediyadır... Bəşərin komediyası qurtaran deyil”.

Məhkəmənin gedişində bu komediya necə də rəngarəng şəkillərdə meydana çıxırdı. Məhkəmə sədri, qazilər, prokuror Xosrovun ən adi müdafiə üsullarından məhrum edildiyini, ən adi vətəndaşlıq hüquqlarının tapdalandığını bildikləri halda yenə də ədalətdən, insan hüquqlarına hörmətdən danışırdılar. Məmləkətin qanunlarında məhkəməyə hazırlaşmaq və özünü müdafiə etmək üçün ittihamnamənin 5-10 gün qabaqcadan müttəhimlərə verilməsi, məhkəmə gününə qədər onlara “kifayət qədər vaxt verilməsi” yazıldığı halda Xosrov Ruzbeh rəsmi ittihamnaməni ancaq məhkəmə başlanan günü ala bilmişdi. O, əvvəlcədən məhkəmə sədrinə müraciət edib, ittihamnaməni istədikdə sədr məzhəkələrə yarayan bir cavab verib dedi:

– Siz öz pərvəndənizi əzbərdən bilirsiniz və mütaliə etməyə ehtiyacınız yoxdur...

Qanunlarda müttəhimin özünə vəkil seçməkdə azad olduğu göstərildiyi halda, bu ixtiyar da Xosrov Ruzbehin əlindən alındı. Min bəhanə ilə onun istədiyi vəkillərdən heç birini məhkəməyə çağırmadılar, istədikləri adamı ona vəkil təyin etdilər. Məhkəmədəki müdafiə nitqində də dediyi kimi Xosrova məzəli görünən bu idi ki, həmin adam vəkil olmaq barədə Xosrovun xahişini rədd etmişdi. Yəni onu müdafiə etməyə hazır deyildi. Buna cəsarəti çatmamışdı. Lakin rəsmi dairələrin təklifindən sonra bu işə qövl vermişdi. Buna görə də məhkəmənin gedişində ədalət işığı görməyən Xosrov bildi ki, tarix onun boy-

nuna böyük vəzifə qoymuşdur. O, özünü və ideallarını müdafiə etməli, zülmün, zorakılığın, ədalətsizliyin ittihamçısı kimi çıxış etməlidir.

Belə də oldu.

Onun məhkəmədəki nitqi, Sokratın, Tağı Əraninin, doktor Sukarnonun, Dmitrovun məşhur nitqləri kimi misilsiz əbədi abidə olaraq qalacaqdır. Prokuror azadlıq mübarizələrini vətənə xəyanətdə ittiham edib, onlara şiddətli cəza verilməsini tələb etdikdə, Xosrov dedi:

– Bir gün gələcək bu insafsız təklifləri irəli sürənlərə İran xalqı özü şiddətli cəza verəcəkdir.

– Siz İran xalqı adından danışmayın! – deyib prokuror qışqırdı. – Siz bizim məşrutə qanunlarının düşmənisiniz!

– Qanunlar! Məşrutə qanunları, hanı onlar?! Siz məşrutə qanunlarını tapdalamısınız. Siz elə qanunlar düzəltmisiniz ki, onlar qan tökməyin, yoxsulluğun, pozğunluğun və fahişəliyin qarşısını almaqdan danışan əqidələri on illik həbs cəzası ilə təqib edir... Budurmu məşrutə?!

Məhkəmə sədri onun sözünü kəsdi:

– Yaxşısı budur, cinayətlərinizdən danışın. Burada kommunist təbliğatı aparmayın.

Xosrov böyük bir təmkin və mətanətlə bu hücumları rəf edib öz fikrinə qayıtdı:

– Xeyr, bunlar təbliğat deyil, həqiqətdir. Zəhmətkeşlərin tərəfdarı olmaq və onların hüququnu qorumaq üstündə bu qədər şiddətli cəza verilməsi cəmiyyət üçün olduqca böyük rüsvayçılıqdır. Sizdən soruşuram: nə üçün zəhmətkeşlərdən bu qədər qorxursunuz? Cin bismillahdan Tehranın polis idarəsinin zəhmətkeşlərdən qorxduğu qədər qorxmur. Məgər sizin həyatınızın bütün ehtiyaclarını zəhmətkeşlər təmin etmir? Məgər İran millətinin onda doqquzu zəhmətkeş deyil? Millətin yüzdə doxsanına düşmənlik etdiyiniz halda millət adından danışmağa sizin nə haqqınız var?!

Yenə məhkəmə sədri toxmağını döydü, yenə Xosrovun sözünü kəsdilər. Prokuror qəzəblə soruşdu:

– Sizin şərafətsiz millət xaini olduğunuz gün kimi aşkardır. Məgər bədnam Azərbaycan nehzətini siz müdafiə etməmisiniz?!

Qəribədir, Xosrov günlərin, ayların yorğunluğunu unutmuşdu. Damarlarında qan qeyri-adi bir şiddətlə hərəkət edib ona qüvvət verirdi.

– Bəli, mən Azərbaycan və kürd millətlərinin hərəkatını müdafiə etmişəm və edirəm. Bu nehzətlər bizim, yəni bütün İranın milli azadlıq

və istiqlalının saxlanmasına, qorunmasına, möhkəmlənməsinə səbəb olmuşdur. Bu millətlər xüsusi dilə və özlərinə xas olan milli xüsusiyyətlərə malikdirlər. Onlar bizim qanun əsasının 29-cu maddəsinə əsasən özlərinə milli muxtariyyət istəməkdə haqlıdırlar.

Yenə səs-küy qalxdı. Yenə onun sözünü kəsdilər. Ara sakit olduqda isə o, davam etdi:

– Şübhəsiz ki, bu gün vətənimizi bürümüş ziddiyyətlər bir gün yox olacaq, bu tufanlar yatacaq, aydın həqiqətlər aşkara çıxacaqdır. İran cəmiyyəti bu kimi məsələlər barədə azad şəkildə bəhs edərək öz fikirlərini bildirəcəyi günü də görəcəkdir. O gün o qədər də uzaqda deyildir. O gün gələcəkdir!

– Gözünün kökü saralanda, o günü görərsən! – deyib prokuror yenə onun sözünü kəsdi. – Başıpozuqlar, ölkəmizə hərc-mərclik salan canilər!..

Xosrov ona istehza dolu bir nəzər salıb davam etdi:

– Hakim təbəqə, sərmayədarlıq üsulu zəhmətkeşləri soyur, onlara zülm edir, onların mənafeyinin müdafiəsinə qalxmış bizim hizbimiz kimi mütərəqqi təşkilatları təqib edir, özü isə az bir etiraza, müqavimətə rast gələndə qışqırır ki, ölkədə hərc-mərclik salmaq istəyirlər, qanunları pozurlar. Burada Sədinin məşhur kəlamını necə də yada salmayasan!..

Be bəri mal müsəlmano ço malet be bərənd,
Bango fəryad bərarike, müsəlmani nist.[1]

Məhkəmə sədri fasilə elan etdi. Hər dəfə mübahisə qızışanda, Xosrov rəddolunmaz dəlillərlə hücuma keçəndə məhkəmə sədri belə edirdi. Kim bilir, bəlkə Tolstoyun yazdığı məhkəmə sədri kimi onun da gizlin bir ağrısı vardı və ara-sıra fasilələrə zəruri ehtiyac duyurdu?! Deyirlər ki, dünyanın çox yerində məhkəmə sədrlərində belə xəstəliklər olur.

Fasilədən sonra Xosrov bir sıra başqa ittihamlar barədə danışdı. Cümhuriyyət və şahlıq üsulunu müqayisə etdi, dinə və dini əqidələrə münasibətini bildirdi. Dünyanın bugünkü mənzərəsinə nəzər saldı,

[1] Müsəlmanının malını aparırsan, sənin malını aparanda hay-küy salırsan ki, bu müsəlmanlıq olmadı.

tarixin hara hərəkət etdiyini xatırlatdı. Nuh əyyamından qalma köhnə qaydaları yaşatmaq, köhnə ictimai üsulun ömrünü uzatmaq kimi gülünc təşəbbüslərə toxunub dedi:

– Bunlar hamısı təkamül qatarının yükünü ağırlaşdıra bilən və onun yalnız hərəkət sürətini azalda bilən, lakin bir an belə dayandıra bilməyən və onu bir addım da olsun dala qaytara bilməyən ağırlıq hökmündədir.

O, hiss edirdi ki, məhkəmə sədri də, qazılar da həqiqəti tapdalamaqdan yorulmuşlar, əzab çəkirlər. Hətta onun istibdad və zülm əleyhinə, fikir və vicdan azadlığı barədə dediyi sözlər onların bəzisinin ürəyindəndir. Bəzisi də xəcalətdən başını aşağı salır və nəinki onun, hətta bir-birinin də gözünə baxmaqdan utanırlar.

Xosrov dedi:

– Mən inanıram ki, siz də batində, öz ürəyinizdə mənim şərafətimə ehtiram gözüylə baxır və inanırsınız ki, Xosrov Ruzbeh vətən satqını deyildir. Mən öz vicdani borcumu yerinə yetirdim. Mən sizdən mərhəmət istəmirəm, siz mənim barəmdə edam hökmü çıxartmaqdan qorxmayan. Ondan qorxun ki, öz vicdani borcunuzu pis yerinə yetirəsiniz. Bunun isə cəzasını xalq verir. Bəli, o xalq ki, siz elə bilirsiniz, o kar və kordur, amma o hər şeyi görür və eşidir, tükü-tükdən seçir, yatmayıb fürsət gələndə hərəkət edəcək. Onun məhkəməsindən qorxun!..

Əlbəttə, Xosrovun edam hökmü çoxdan çıxarılmışdı, əvvəlcədən hazırlanmışdı, o, dönə-dönə dediyi kimi bu hökmü mərd-mərdanə qarşıladı.

Buna görə də son söz deyərkən o, olduqca təmkin və əzəmətlə danışaraq hamını heyran buraxdı. O, dedi:

– Mən sizdən edam hökmü çıxarmanızı xahiş etdim. Bu heç də o demək deyil ki, mən həyatdan doymuşam və ölümü məmnuniyyətlə qarşılayıram. Yox! Əqidə sahibi olan və ürəkləri gələcəyə, parlaq və işıqlı gələcəyə ümidlə dolu olan adamlar üçün ölüm, arzu olunan şey deyil. Lakin hər qiymətə və hər şərtlə diri qalıb yaşamaq da insana yaramaz. Heysiyyəti əldən vermək, alçalmaq, abırdan keçmək, siyasi və ictimai əqidə və arzuları ayaq altına atmaq şərti ilə yaşamaqdansa, ölmək yaxşıdır.

Xosrov yaşamaq naminə xəyanət edən, əqidə, fikir və arzularını köynək-tuman kimi həftədə iki dəfə dəyişən mənliksiz və alçaq

təbiətli adamlardan danışdı. İki cür ölüm olduğunu söylədi. İnsan hər işi iki cürə görə bilər: pis və yaxşı. Paltarı yaxşı tikən dərzi, yaxşı nəccar hörmətə layiqdir. Bütə və öküzə sitayiş edən adam, ürəkdən inanaraq sitayiş edirsə, ona eşq olsun. Ölüm də belədir. İnsan bir şeyə inanaraq ölümü, etiqadlarını və şərafətini ucaltmaq yolu kimi qəbul edirsə, şərafətlə ölür. O, hakimləri sarsıdan bir soyuqqanlılıqla əlavə etdi:

– Vətənin müdafiə xatiri üçün ölən sərbaz, təhlükəli bir xəstəliyin müalicə yolunu tapmaq xatiri üçün canını fəda edən həkim, öz siyasi və ictimai məqsədləri xatirinə ölüm şərbətini içən insan yaxşı ölmək yolunu bilir...

Edam qabağı saxlandığı kamerada ölümün addım səslərini eşidən, hər an onun qara üzünü görən Xosrov yenə sarsılmadı. Təmkin və mətanətini saxladı. Artıq o, sona çatmaqda olan həyat yoluna fikrən nəzər salır və ancaq ona təəssüf edir ki, məram və arzuları hələ yerinə yetməmişdir. Əgər o, bir də təzədən dünyaya gəlsəydi, yenə bu yolu seçərdi...

– Hə, gəl görək, niyə mənim sözümə baxmadın?! – deyib gözətçi qapını açdı, – ay kişi, mən səni ağıllı bir adam bilirdim, sən niyə belə etdin?! Niyə özünü verdin bu qəssabların bıçağı altına?! Nə deyirdilər deyəydin, hə, qurtarıb gedəydi də.

Xosrov, əslində o qədər də pis olmayan bu adama ilk dəfə məhəbbətlə baxdı.

– Deyə bilmədim. Mənim yolum başqadır. Məhz bəhramilər, qüreyşilər, yəzdilər gedən yolu gedə bilməzdim. Mən tutduğum yolu iftixarla başa çatdırmışam, öhdəmə düşən vəzifəni sədaqətlə yerinə yetirmişəm. Şair yaxşı deyib: Döyüş meydanında can vermək, namərdcəsinə qaçmaqdan yaxşıdır!..

– Onda məni halal elə. Əgər yanında artıq-əskik bir söz danışmışamsa, xətrinə dəymişəmsə, məni halal elə! – deyib gözətçi ilk dəfə kövrəldi.

– Halal edirəm! – deyib Xosrov onu arxayın saldı.

– Gəl dalımca, görüşünə gəliblər.

Xosrov getdi. Bu dəfə daha böyük və işıqlı otaqda beş-altı adam oturmuşdu. Hamısı sükut edirdi. Xosrov gələn kimi ayağa durdular... Qardaşı, Afaq, dəmir yolunda işləyən bir dostu, iki müəllim və bir də... Bir də kim olsa yaxşıdır? Nurməhəmməd!

Xosrov onların hamısı ilə qucaqlaşıb öpüşdü. Yanlarında oturdu.

– Danışın görüm, şəhərdə nə var, nə yox? Niyə belə bikefsiniz? Heç belə etməyin... O zaman kədərlənməyə haqlı olardınız ki, Xosrov qorxaydı, titrəyəydi, şərafətsizlik edib xəyanətə yol vermiş olaydı.

Afaqın gözlərindən yaş süzülürdü. Xosrovun qardaşı və dostları tez-tez dəsmalla gözlərini silirdilər. Nurməhəmməd daima üzünü yana tutub hıçqırırdı.

– Nurməhəmməd, səndəmi ağlayırsan?! Zabitə yaraşarmı?

– Mən özüm üçün ağlayıram! – deyib Nurməhəmməd həzindən danışdı. – Öz acizliyimə ağlayıram, çox çalışdım sizi burdan qurtaram, bacarmadım.

– Mənim əzizlərim, – deyib Xosrov onların hamısına müraciət etdi. Afaqın isə iki əlini də ovcuna aldı. – Siz fəxr edin, bilin ki, Ruzbeh borcunu kişi kimi yerinə yetirdi. Mən və mənim məslək yoldaşlarım öz əziz vətənimizin xadimləriyik, onun yolunda qurban gedirik. Bilin ki, İranın ədalətli və nəcib milləti bu hökmlərin hamısını ədalətsiz hesab edir və öz fədakar oğullarını iftixarla yola salır. O, bilir ki, Xosrov Ruzbehləri öldürmək olar, şücaəti və igidliyi, vətənpərvərliyi və namusu, insanpərvərliyi və fədakarlığı isə heç vaxt İran xalqının ürəyindən silib çıxarmaq olmaz! Mənə yas saxlamayın, mənim əzizlərim. Məndən arxayın olun, edam dəqiqəsində də Xosrov Ruzbeh qorxu nə olduğunu bilməyəcək. Canan eşqi ilə yaşayan sədaqətli aşiqdirsə, edam günündə gözünü qırpmamalıdır...

*1966*

# GÜLƏBƏTİN

## HƏSRƏT...

Təbrizin bağlı-bağatlı və az-çox abad hissələrindən birində hündür kərpic hasarın içində əndərunlu-birunlu[1] birmərtəbəli bir ev gizlənir. Bu ev çox böyük deyil, ancaq yaraşıqlı və gözəldir, yaşamaq üçün olduqca əlverişlidir. İçində hər cür şəraiti var. Birun üç otaqdan, əndərun iki otaqdan və bir qapılı dəhlizdən ibarətdir. İkinci dəhliz əndərunla birunu birləşdirir. Evin bağçalı, balaca həyəti var. Bu ev, həyət adətən sakit olur. Lakin bəzi günlərdə səhər çayı içilənə yaxın, ya da axşamlar şam zamanları bir də görürsən ki, eyni zamanda dörd tərəfdən "Güləbətin!" sədaları göyə ucaldı.

– Güləbətin, ay Güləbətin! Tez bura gəl!

– Güləbətin, ay Güləbətin! Samovar yandı, su tök!

– Güləbətin, ay Güləbətin! Tez ol köynəyi mənə ver!

Bu gün sakitlik idi. "Güləbətin", deyə qışqıran yox idi. Səhər çayı rahatca içilib qurtarandan sonra xanım dəhlizin küncünə atılmış bir yığın paltarı Güləbətinə göstərib dedi:

– Güləbətin, bu gün bazar-dükana getməyəcəksən, həyət-baca təmizləməyəcəksən, başqa bir işimiz də yoxdur, qolunu çirmə, su qızdır paltarları yu!

– Baş üstə, xanım! – deyib Güləbətin dərhal əmri yerinə yetirməyə başladı.

Əlbəttə, qolunu çirməməyə ehtiyac yox idi, çünki onsuz da qolu dirsəyə qədər açıq idi: xanım bir həftə əvvəl kiçik qızının qolu cırıq köhnə köynəyini ona verərək demişdi:

– Cırığını kəs at, gey əyninə, qolsuz daha yaxşı olar.

Güləbətin xanım deyən kimi etmiş, köynəyin qolunun cırıq hissəsini kəsib atmış, gödək qolun uclarını səliqə ilə büküb qatlamış və tikmişdi. Əyninə geydikdə dirsəyə qədər açıq köynək nəinki qızların, hətta xanımın özünün də xoşuna gəlmişdi:

– Gör necə də yaraşıqlı çıxıb... Dedim axı, yaxşı olar.

---

[1] Cənubi Azərbaycanda və İranda həyətli-bağçalı evlər çox zaman iki hissədən ibarət olur. Birun – evin kişilər yaşayan qabaq hissəsi və əndərun – evin qadınlar yaşayan içəri hissəsi.

– Sağ ol, xanım! Allah sizi xoşbəxt eləsin! – deyib Güləbətin anasının belə hallarda həmişə xanıma dua etmək barədəki tapşırığını xatırlayıb dil-ağız etmişdi.

İndi xanım da görürdü ki, Güləbətinin qolu dirsəyə qədər açıqdır. Buna baxmayaraq "qolunu çirmə" deməkdən özünü ala bilmədi. Çünki adət etmişdi. Xanım üçün də, Güləbətin üçün də bu sözlər sətri mənasından daha artıq bir şey ifadə edirdi. Güləbətin yaxşı bilirdi ki, xanım ancaq o zaman "qolunu çirmə" deyir ki, onda ağır bir iş görmək lazımdır. Məsələn, bütün evi döşəmədən tavana kimi silib-təmizləmək, tozunu almaq, xalçaları bir-bir həyətə çıxardıb çırpmaq, günə vermək və sairə... Yoxsa hər xırda-xuruş tapşırıq zamanı xanım bu sözləri deməzdi. Yəni bunlar bir növ, sehrli sözlər idi. Güləbətini də, xanımın özünü də hərəkətə gətirirdi, zirək tərpənməyə məcbur edirdi. Hərgah indi əynində qollu köynək olsaydı, şübhəsiz ki, Güləbətin o saat elə xanımın gözü qabağındaca balaca, nazik, buğdayı rəngə çalan qollarını çirməyəcək və işə başlayacaqdı. Lakin qolları açıq olduğu üçün birbaş paltarın üstünə yeridi.

Güləbətin başıaşağı, üzüyola qız idi. Onun bu xasiyyəti xanıma çox xoş gəlirdi. Xanım elə birinci günlərdə hiss etmişdi ki, Güləbətin zirək qızdır, gözüaçıqdır, deyilən sözü yerinə yetirməyə səy göstərir. Xanım çalışmışdı ki, qızın bu xasiyyətini daha da möhkəmlətsin. Hədə-qorxu ilə yox, həvəsləndirmək, ruhlandırmaq yolu ilə; xanım rəhmdil və ağıllı arvad idi.

– Bərəkallah, qızım, ayıq ol, söz qulağında qalsın, nə dedilər o saat yerinə yetir...

Əlbəttə, Güləbətinə bu xasiyyəti ilk aşılayan anası olmuşdu. Bütün kasıb analar kimi, o da qızını səykar və diqqətli olmağa öyrətmişdi.

Xanım isə çalışırdı ki, qızın "canında olan" bu keyfiyyət daha da artsın, möhkəmlənsin. Yerli-yersiz yox, ancaq yeri düşəndə fürsəti əldən vermədən qeyd edərdi ki, əsil insan olmağın və yaxşı əxlaqın birinci şərti elə budur ki, başıaşağı, üzüyola olasan, söz ağızdan çıxan kimi yerinə yetirəsən. Xanım hər dəfə sözünü "yüyürən at qamçı yeməz" məsəli ilə qurtarardı.

Böyüklərdən və xüsusən öz xanımından eşitdiyi bu təriflər balaca Güləbətinin səy və zəhmətinin mükafatı olmaqla bərabər ona xoş da gəlirdi. Axı, hər halda bu tərif acı danlaq və tənədən daha yaxşı idi. Buna görə də Güləbətin heç özü də hiss etmədən günü-gündən daha

artıq səy göstərir, söz ağızdan çıxan kimi yerinə yetirməyə, həm də deyildiyi kimi yerinə yetirməyə tələsirdi. Xanım və bütün evdəkilər qəti inanmışdılar ki, Güləbətinə nə tapşırırsan tapşır, get arxayın yat, bir dəqiqə gecikdirmədən, bir iynə deşiyi qədər o yan-bu yana əymədən yerinə yetirəcək. Hətta xanım Güləbətini yoxlamaq üçün bir neçə dəfə qəsdən bəzi tapşırıqlarla bazara və bir qədər uzaqda yaşayan qohumlarının evinə göndərmişdi. "Filan küçə ilə get, filan küçə ilə qayıt, kənara çıxma ha!" – demişdi. Sonra da dalınca adam salmışdı. Güləbətinin deyilən küçədən bir addım da o yana ayaq basmadan tapşırığı yerinə yetirdiyi məlum olmuşdu.

İndi də söz xanımın ağzından çıxan kimi, Güləbətin bir-birinə qarışmış yastıq və yorğan-döşək üzlərini, əl-üz və cib dəsmallarını, alt və üst köynəklərini toplayıb qucağına aldı və qapıya tərəf yollandı. Xanım razı gözlərlə arxadan ona baxdı: balaca boyunun az qala qucağındakı böyük şələnin altında itdiyini görüb gülümsədi və öz-özünə: "Xarab olmasa yaxşı uşaqdır, ölüncə əldən buraxan deyiləm", – deyib düşündü.

Güləbətin isə qarşısıalınmaz bir həvəsin təsiri ilə qapının ağzında ayaq saxladı və geri çevrilib qorxaq, zəif uşaq səsilə soruşdu:

– Xanım, icazə ver, həyətdə yuyum, hovuzun qırağında, olar?

Xanım pəncərədən bağçanı nura qərq eləmiş mülayim payız günəşinə baxıb bu xahişin səbəbini dərhal anladı və ani fikirdən sonra öz-özünə: "Hə etməli, uşaq uşaqdır!" – deyib düşündü. Mərhəmətlə icalə verdi:

– Yaxşı, olar! – dedi, – apar yığ ora, su qızdır, qab-qacağı gətir, ancaq ehtiyatla tərpən ha, çirkli suyu yerə tökmə, güllərin dibinə sabunlu su töküldüyünü görəndə ağanın acığı tutur...

– Baş üstə! – deyib Güləbətin razı halda həyətə çıxdı. Paltarları hovuzun yanına gətirdi. Bir kənara qoydu. Su qızdırmaq, tas, dolça və sairə gətirmək üçün geri dönmək istədi. Lakin dönə bilmədi. Çünki elə bu an bir cüt göyərçin uçaraq gəlib hovuzda çimməyə başladı. Güləbətin onlara doyunca baxmamış damın üstündən yeni bir dəstə uçub gəldi və bu birilərə qarışdı, qar-qur səsi hər yeri tutdu, qəribə bir xor əmələ gəldi. Təbrizin bəzəkli, rəngarəng göyərçinlərini Güləbətin çox sevirdi. Elə buna görə də xanımdan paltarları camaşırxanada yox, burada, hovuzun qırağında yumağa icazə almışdı ki, göyərçinlərə doyunca tamaşa etsin, onların anlaşılmaz, cazibədar, ürəyə yatan qar-

quruna qulaq assın. Göyərçinlər o qədər gözəl idi, lələkləri elə qəribə rənglərə çalırdı ki, Güləbətin baxmaqdan doymurdu. Xüsusən döşlərini xəfifcə suya toxundurub, hovuzun qırağında oturaraq qanadlarını açıb özlərini günə verdikləri zaman nə qədər gözəl olurdular! Günün işığında daraq-daraq açılmış lələkləri yüz rəngə çalırdı. Başları ağappaq idi. Boyunlarına isə sanki yaşıl həmayil keçirmişdilər. Ayaqları dizə qədər xınayı rəngdə idi. Elə bil ki, qırmızı çəkmə geyinmişdilər. Bellərinin ortasında isə sarımtıl gözəl bir zolaq uzanırdı.

Göyərçinlər bir an aram olmurdu. Gah çimir, gah yerə atılıb nəyi isə dimdikləyir, gah bir-birini oxşayır, gah da uçub həyətin üstündə dolanaraq yerə, hovuzun qırağına enirdilər. Güləbətin çox zaman cibində bir ovuc yarma, darı, ya da bir parça çörək saxlar, göyərçinlərin qabağına atar, onların həvəslə dənləməsinə tamaşa edərdi.

Qızcığazı göyərçinlərə çəkən yalnız onların zahiri gözəlliyi, gözoxşayan rəngləri deyildi. Güləbətin onlara baxdıqca içərisində qəribə hisslər oyanırdı. Xəyal onu aparırdı. Sanki sehrli bir əl uzanıb ehtiyacla dolu həyatının divarlarını parçalayır, oradan bizim soyuq dünyaya oxşamayan bir aləmə yol açırdı. Bu gözəl aləmdən at və mavi işıqlarla süzülüb gələn ılıq bir şey qızın sinəsini doldurur, bihuşedici bir şərbət kimi bütün bədəninə yayılırdı.

Ah, xoşbəxt göyərçinlər:

Nə olaydı, mən də sizin kimi uça biləydim! Əlbəttə, Güləbətin də bilirdi ki, bizim zəmanədə insan quşdan da, küləkdən də iti uçan maşınlar düzəltmişdir. Hətta bir dəfə xanımın həmişə acıqlı oğlu Şahpələng ona bu maşının şəklini göstərib demişdi: “Təyyarə!”. Bu maşınlarda təkcə kişilərin və oğlanların deyil, qızların da uçduğunu ona bildirdikdə Güləbətin qorxa-qorxa və uşaq sevincilə pıçıldadı:

– Ölməzdim, bir gün mən də göydə uçsaydım!..

Bu sözü eşidəndə Şahpələng uğunub getdi, iki əli ilə qarnını tutuncaya qədər güldü, sonra da tərli köynəyini Güləbətinin başına atdı:

– Bir göydə uçana bax! Yerdə yeriyə bilmir, göyə çıxmaq fikrindədir! Apar, yu, qurut, ütülə. Sabaha hazır olsun!..

Ah, xoşbəxt göyərçinlər! Siz istədiyiniz vaxt istədiyiniz yerə uçub gedirsiniz. Şahpələng nədir – siz bilmirsiniz! Mən isə onun çirkli köynəyini də yumalıyam.

Göyərçinlər onu anlamış kimi qəribə bir yumşaqlıqla qar-qur etdikdə, sanki Güləbətin xoş bir mahnıya qulaq asırdı.

Kənardan baxana elə gələ bilərdi ki, göyərçinlər, doğrudan da, Güləbətini tanıyır və sevirlər. Ürəyinin hisslərindən xəbərləri var, bilirlər ki, nəinki ondan heç bir zərər görməyəcəklər, hətta onun simasında fədakar müdafiəçiləri var. Qızı hovuzun yanında görən kimi qırmızı kirəmitli taxtapuşun altındakı yuvalarından uçub aşağı enirdilər.

– Güləbətin, başın quşlara qarışmasın, vaxt keçir, – deyib eyvandan xanım onu səslədi.

– Baş üstə, xanım, bu saat! – deyib, Güləbətin göyərçinlərlə xəyali söhbətdən ayrılıb camaşırxanaya qaçdı...

## SEVİNDİK

Güləbətinin on dörd yaşı var. Təbrizin yayda tozu, qışda palçığı dizə çıxan küçələrindən birində, boz palçıq divarları sökülüb dağılmış bir evdə anadan olmuşdur. Onlar yaşayan evdən bir az günçıxanda "Noşəhr" zindanı yerləşir. Günbatan tərəfdə, şəhərin qurtaracağında isə qəbiristanlıqdır. Üç-dörd yaşından başlayaraq eşitdiyi və gördüyü bu olub ki, küçələrdən ya ölü aparırlar, ya da dustaq. Yox, burada gəlin köçürüldüyü günləri, toy mərasimini də xatırlayır. Ölü və məhbus aparanda da, toy zamanı da həyətin uşaqları küçəyə qaçar, bir-birinə qısılıb maraqla tabutun üstündəki təpədən dırnağa qədər qara kəfənə bükülmüş meyitə, yaxud silahlı əmniyyə və ajanların araya alaraq apardığı məhbuslara baxardılar. Gəlin aparanda isə "mübarək olsun" deyib qışqırar, oynayardılar. Əlbəttə, tabutun üstündəki qara kəfənli meyit onlara çor sirli və dəhşətli görünərdi. Elə bilərdilər ki, meyit indicə kəfəni yırtıb çıxacaq, taxta kimi uzun, arıq və çılpaq qollarını uzadıb uşaqlardan əlinə keçəni qapıb özü ilə aparacaqdır. Buna görə də bərk-bərk bir-birinə qısılıb, bir-birinin əlindən tutaraq qapının ağtzından o yana bir addım da atmazdılar. Ən çox xoşlarına gələn toy mərasimi idi. Çünki toy zamanı böyüklər də deyib gülürdülər. Hətta uşaqlara şirni paylayanlar da olurdu.

Dustaq aparanda isə vəziyyət tamamilə dəyişərdi. Uşaqlar ucadan danışar, dustağın kim olduğu, nə etdiyi barədə öz mülahizələrini bildirər, mübahisə edərdilər. Bir az yaşlıları isə dustaq aparan ajanın və ya əmniyyənin dalınca düşüb o biri küçələrdən gələn uşaqlara qoşularaq, böyük bir dəstə təşkil edər, ucadan danışa-danışa "Noşəhr"in qapılarına qədər dustağı müşayiət edərdilər. Xüsusən "siyasi" adlanan

dustaqları daha böyük maraqla yola salardılar. Böyüklərdən eşitdiklərinə əsasən oğrulara, dükan yaranlara, cibgirlərə, adam öldürənlərə açıq nifrətlə baxardılar. Hətta öz hisslərini bildirməkdən də çəkinməzdilər.

– Bir boyuna bax, yekə kişidir oğurluq edir!

– Yediyi haram olsun!

"Siyasiləri" isə təntənəli bir sükutla, danışanda pıçı-pıçı ilə ötürərdilər. Gözləri, üzləri onlara qarşı qəribə bir marağın, hətta sevgiyə oxşar bir duyğunun işıqları ilə yanardı. Sanki onlar qeyri-adi adamlar idi, ətrafdakı adamlardan tamamilə seçilirdilər, həyatları qəribə sirlərlə dolu idi, nağıllardakı qəhrəmanlar kimi qorxmaz və cəsur idilər. Güləbətinin altı yaşı olanda özündən yeddi yaş böyük qardaşı Həmzə bir siyasinin dalınca baxarkən:

– Böyüyəndə mən də siyasi olacağam! – deyib yavaşca pıçıldadı. Dərhal Həmzə Güləbətinin gözünə başqa cür göründü – qəhrəman, cəsur, qoçaq... Əlbəttə, o zaman nə onun, nə də Həmzənin ağlına gəlmirdi ki, siyasi olmaq nə qədər ağır işdir, bütün ailə üçün, qohumlar, dost-aşnalar üçün necə əzablar və məhrumiyyətlərlə bağlıdır...

O zaman Güləbətinin atası Namaz kişi də, böyük qardaşı Sevindik də Təbriz gön karxanasında işləyirdi. İkisi də adi fəhlə idi və aldıqları maaşla ailəni birtəhər dolandırırdılar. Hər halda Namaz kişi də, arvadı Narınc da gecə-gündüz əllərini Allah dərgahına qaldırıb bir tikə çörəkləri olduğu üçün dua-səna etməkdən yorulmurdular. Bircə Sevindik əlini göyə qaldırmırdı. O, həyatdan, karxanadakı iş şəraitindən və fəhlələrin maaşının azlığından şikayətlənəndə, atası da, anası da onu danlayırdı.

– Adam naşükür olmaz, bala, bir gör Təbrizdə nə qədər işsiz var, bir tikə çörəyə möhtac var, onlara bax, öz halına şükür elə!

– Nəyə şükür eləyim, dədə?! Bizim yer, bizim torpaq kimdə olsa bütün adamları böyükdən kiçiyə yağ içində üzər, evinin döşəməsi də qızıldan olar, dərdimiz böyükdür, dədə, nəyə şükür eləyim?! – deyib Sevindik odlu-odlu danışardı. Onun çox sözlərini Güləbətin başa düşməzdi. Amma ona qulaq asdıqca ara-sıra qapılarının ağzından aparılan dustaqlar gözündə canlanardı və elə bilərdi ki, Sevindik onların hamısından qoçaq, hamısından qorxmazdır, əsil qəhrəmandır!

Bu hisslərin təsirilə o yavaşca anasının dizləri arasından sürüşüb çıxar, qardaşının qoltuğuna qısılıb başını sinəsinə qoyar, qara qıvrım

saçları ilə onun boynunu, boğazını oxşardı. Qardaşı isə atası ilə mübahisə edə-edə Güləbətinin başını sığallar, balaca əlini öz iri və qabarlı əlində saxlar, ovxalayıb qızdırardı, atası ilə mübahisənin nahaq olduğunu, heç kəsin öz fikrindən dönməyəcəyini hiss edəndə Güləbətinin başından öpər, isti nəfəsilə boynunu qızdırıb deyərdi:

– Biz heç, dədə, bizim həyatımız bir tikə çörək qayğısı ilə başa çatacaq, bunları düşünmək gərək, heç olmasa bunlar xoş bir gün görsünlər... Canım sağ olsa Güləbətini oxudacağam, gözlərindən fərasət yağır, oxudacağam. Danişgaha qədər aparacağam. Qurtarsın həkim olsun, xəstələri sağaltsın!

Lakin taleyin amansız hökmü elə oldu ki, Sevindik öz arzusuna çata bilmədi. O, Güləbətini ancaq altıncı sinfə qədər oxuda bildi. Qızın on üç yaşı tamam olanda və yeddinci sinfə getməyə hazırlaşanda bir axşam gün batana azca qalmış silahlı adamlar "siyasi" deyə Sevindiyi aparmağa gəldilər. Anası özünü itirmiş halda ağlayırdı. Əvvəlcə ucadan qışqırmaq, üz-gözünü cırmaq istədi. Sevindik: "Nənə, xahiş edirəm, sakit ol" – deyib ona necə mənalı gözlərlə baxdısa, arvad susub dayandı. Ancaq yaş gözlərindən gilə-gilə üzüaşağı süzülürdü. Atasının üzünə meyit rəngi qonmuşdu. Ovurdları batmış, gözləri çuxura düşmüşdü, qızdırmalı adamın gözləri kimi yanırdı. Bu gözlərdə narahat, üsyankar fikirlər oynayırdı. Lakin kişi heç bir söz demirdi. Çaş halda durub baxırdı. Bircə Həmzə əsmirdi, titrəmirdi, saralmamışdı. Gözləri qəzəblə dolu idi. Bu zaman artıq onun on doqquz yaşı vardı, özü də xalça karxanasında işləyirdi. O kənarda durub silahlı adamların evi tələsik axtarmasına, yükü alt-üst edib nimdaş kasıb yorğan-döşəyini o tərəf-bu tərəfə çevirməsinə baxdıqca yanaqlarına anlaşılmaz bir qızartı çökür, yumruqları düyünlənirdi. Güləbətin Sevindiyə qısılmışdı. Altdan yuxarı baxan gözlərini onun üzündən çəkə bilmirdi. O çox sakit görünürdü. Qara, çəkmə qaşları çatılmışdı, iri gözləri çox fikirli olsa da, təmkinini saxlayırdı. Sanki zindana yox, başqa bir yerə gedirdi və iki-üç saat sonra qayıdacaq idi. İndi o, Güləbətinin nəzərində, doğrudan da, bir qəhrəman idi və qız öz qardaşı ilə fəxr edirdi!

Lakin bu duyğu çox çəkmədən keçdi. Ananın aramsız olaraq axan göz yaşları, dünyadan ümidini üzmüş atanın meyit kimi donub qalması göstərirdi ki, çox böyük bir bədbəxtlik ailənin üstünü alıb, elə bir bədbəxtlik ki, onun qabağını kəsmək, vurduğu yaraları sağaltmaq qeyri-mümkündür. Birdən Güləbətinin fikrinə gəldi ki, gecə Sevindik evdə

olmayacaq, kim bilir harda, hansı quru və yaş yerdə yatacaqdır. Zindan barədə eşitdikləri ildırım sürətilə xəyalından keçdi və onu vahimə basdı. Sanki Sevindikdən birdəfəlik ayrılırdı, onu əlini bərk-bərk sıxdı, sinəsinə qoydu, bunu hiss etmiş Sevindik yuxarıdan aşağı bacısına baxıb gülümsədi, ağır, qabarlı əlilə onun başını sığalladı. Sanki gözləri ilə deyirdi: "Nə olub Güləbətin? Qorxma, mən qayıdıb sizin yanınıza gələcəyəm, səni oxudub həkim edəcəyəm. Arxayın ol...".

Qardaşının təmkinini itirməyən, qorxmaz, mərd və isti baxışları Güləbətini bir anlığa sakit etsə də, evdəki ümumi kədərin dözülməz əzici ağırlığından qurtara bilmədi. Bir anda qızın başında xain bir fikir, çox qorxduğu yaramaz bir düşüncə oyandı: "İstəmirəm, qəhrəman olma, elə hamı kimi ol, amma evimizdə qal!..".

Bu fikrin təsirilə bir az da bərk Sevindiyə qısıldı. Onun əlini təkrar sıxdı. Sevindik bunu bacı məhəbbətinin ifadəsi kimi başa düşdü. Elə anladı ki, guya Güləbətin deyir: "Möhkəm ol ha, qorxma!" – O, bacısını arxayın salmaq üçün yuxarıdan aşağı ona baxıb bir də gülümsədi və "məndən nigaran olma, möhkəm olacağam!" – deyən gözlərini yumub açdı.

Sonra Sevindiyi apardılar.

İlk zamanlar Güləbətin onun evdə olmadığına heç cür inana bilmirdi. Bəzən səsini eşidir, bəzən üzünü görürdü. Elə gün olmurdu ki, onun dedikləri gəlib xəyalında canlanmasın, xüsusən tutulduğundan bir həftə qabaqkı söhbətlərini unuda bilmirdi. Evdə heç kəs yox idi, Sevindik və Güləbətin tək idilər. Onda söhbət gələcəkdən düşdü. Qardaşı necə gözəl, necə füsunkar bir adam təsvir etdi:

– Həyat kökündən dəyişəcək, bacım, belə qalmayacaq. Yemək, geymək dərdi çəkən olmayacaq. Bizim bu Təbrizi görürsən, onu biz cənnətə döndərəcəyik. Bir dənə də torpaq ev qalmayacaq. Tozlu küçələrin, palçıq evlərin hamısını söküb təzə evlər tikəcəyik. Böyüklərin hamısına iş verəcəyik, uşaqların hamısını oxudacağıq!..

Lakin həyatın gündəlik ehtiyacları, güzəranın ağırlığı yanında bunlar bir xəyal olurdu, Güləbətinə yuxu kimi gəlirdi.

Sevindiyi aparandan bir həftə keçməmiş gön karxanasında fəhlələrin ixtisarı başladı. Deyirdilər ki, sahibkar zərər çəkir, bazarda dərinin qiyməti o qədər düşüb ki, heç zəhmətinin dəyərini ödəmir, handakı fəhlələrin maaşı ola. Əlbəttə, birinci ixtisar olunanların içində Namaz kişi də vardı. İndi ailə Həmzənin xalça karxanasından aldığı bir

az maaşla dolanmalı idi. Maaş isə ev kirayəsinin xərci deyildi. Namaz kişi həftələrlə özünü ora-bura çırpdı, bir iş tapa bilməyərək evdə oturub ümidini bircə Allaha bağladı: usta Zeynal kimi düşünüb dedi:

– Heç kəs yazılandan artıq görməyəcək, alnımıza nə yazılıb, payımız odur!..

Elə bu zaman anası evarası arvadlardan öyrəndi ki, yaxşı bir xanım xırda ev işlərini görmək, xırda-xuruş şey-şüydən ötəri dükan-bazara qaçmaq üçün zirək, əli-ayağı təmiz bir qız uşağı axtarır. Bu fürsətdən istifadə etməmək axmaqlıq olardı. Onlar Güləbətini tez həmin xanımın evinə düzəltdilər. Xanım vəd etdi ki, ilk zamanlar ayda on tümən verəcək, əgər görsə ki, qız səy göstərir, əli əyri deyil, bir az sonra maaşını artırar, on beş tümən elər. Bu şərtlə ata da, ana da sözsüz-danışıqsız razılaşdılar. Onlara elə gəldi ki, xanım adi xanım deyil, mələkdir, göydən Allah göndərib ki, dadlarına çatsın.

– Allah kərimdir, bir yerdən bağlayanda, o biri yerdən açar! – deyib Namaz kişi yenə şükür əlini göylərə qaldırdı...

Əlbəttə, iki ilin ərzində xanım Güləbətini yaxşıca tanımışdı və ondan çox razı idi. Maaşını da vəd etdiyindən çox artırdı. İndi yeməyindən, geyməyindən başqa ayda ona iyirmi tümən verirdi. Daha doğrusu "qız uşağını pul xarab edər" – deyib özünə yox, anasına verirdi. Hər ayın axırında Narınc gəlib dil-ağız və min bir dua edə-edə iyirmi tüməni alıb aparır və Həmzənin gətirdiyinin üstünə qoyub birtəhər ayı başa vurmağa çalışırdı.

## YAXŞI XANIM

Güləbətin səhərin gözü çırtlayanda ayılmağa adət etmişdi. Başqa cür mümkün də deyildi. Əlbəttə, səhər yuxusu onun üçün də şirin idi. Lakin yatmaq olmazdı. Xanım və ailənin başqa üzvləri durmamış bazara gedib gəlmək, həyəti süpürmək, samovara od salmaq lazım idi. Hər gün günəş şüalarının Eynal-Zeynal dağlarından bu tərəfə aşıb töküldüyünü hiss edən kimi o gözlərini açıb ayılırdı, sanki kim isə qolundan tutub silkələyir və hökmlə deyirdi: "Dur!". Evdə sabah kimin bir işi olsa, kim tez durmaq istəsə:

– Güləbətin, səhər saat yeddidə məni oyat!

– Güləbətin, sabah düz altıya bir rüb qalmış məni çağırarsan! –

deyib tapşırar və arxayın yatardı. Güləbətin deyilən vaxtda mütləq balaca barmaqları ilə ahəstəcə tapşırıq verənin qapısını tıqqıldadıb deyəcəkdi:

– Ağa, saat altıya bir rüb qalıb, durun!

Çay və ya yemək zamanı ailə üzvləri bir yerə toplanıb ordan-burdan danışarkən, söhbət bu məsələyə gəlib çıxanda hamısı bir ağızdan heyrət edib soruşurdular:

– Ay Güləbətin, nə sirr var ki, nə vaxt istəyirsən, onda ayılırsan?

Güləbətin qızarıb başını aşağı salır və heç bir cavab vermirdi. Ürəkdən sevinirdi ki, onun bu xasiyyəti xanımın və evdəkilərin hamısının xoşuna gəlir. Tezdən durmağının isə sirrini ancaq özü bilirdi və onun nəzərində burada o qədər də böyük bir sirr yoxdu. O günəşə görə yatıb-durmağa adət etmişdi. Güləbətini vaxtlı-vaxtında yuxudan oyadan günəş idi. Qızcığaz dəhlizdə günəş işığının azlığına-çoxluğuna görə qəribə bir dəqiqliklə bilirdi ki, saat neçədir. Bilirdi ki, hər ay və hər gün hansı saatda günəşin işıqları divarın harasına düşür və adətən qızın yataq yeri olan dəhliz nə dərəcədə işıqlanır. Yazın əvvəlindən payızın ortalarına qədər günəş aramsız olaraq işığını Təbrizin üstünə, onun gözəl və səfalı bağ-bağatına səpələdiyi üçün Güləbətin istədiyi zaman tezdən ayılır, milyon illər əvvəl yaşamış dədə-babalarımızdan gələn təbii bir duyğu ilə vaxtı dəqiq surətdə müəyyən edir, yanılmadan vaxtında yuxudan dururdu.

Əlbəttə, bu heç də o demək deyil ki, Güləbətin qurulmuş saat idi və hər gün eyni saniyədə zəngin çalırdı. Heç də yox! Onun da yatağında xumarlandığı, balaca, çılpaq qollarını başının altına qoyub gözlərini pəncərənin lap yuxarısından mavi boşluqlara dikib xəyala getdiyi, hətta bəzən yatıb qaldığı günlər olurdu. Lakin bu heç də xanımın Güləbətin barədə yaxşı rəyini sarsıda bilmirdi. Çünki bu çox nadir hallarda baş verirdi. O günlərdə baş verirdi ki, səhər tezdən görüləsi heç bir vacib iş olmadığı əvvəlcədən Güləbətinə məlum idi. Bu halda qızcığaz axşamdan arxayın yatır, səhər arxayın gözünü açır və yerinin içində fikrə gedirdi. Nə düşünürdü? Belə hallarda ən çox düşündüyü qardaşı Sevindik olurdu. İndi Sevindiyi Təbriz zindanından Tehrana keçirmişdilər. Nə qədər ki, Təbrizdə idi, heç olmasa həftədə bir-iki dəfə zindanın qaranlıq dəmir barmaqlıqlarının dalından üzünü görmək olurdu. Güləbətinə elə gəlirdi ki, zindana düşəndən qardaşının gözləri daha da iriləşmişdir, adama baxanda elə bil ki, lap ürəyinin içini görür,

gözlərindən çıxan qığılcımlar adamın sinəsini dəlib içəri keçir. Lakin gizli qəzəblə yanan bu alovlu gözlər zindanın da dəmir barmaqlıqları arasından Güləbətinə baxanda yumşalır, mülayimləşir, xoş bir təbəssümlə işıqlanırdı, anlaşılmaz qəzəbin yerini həsrət tuturdu. İndi Güləbətin həftədə bir dəfə də olsa bu gözlərə baxmaq səadətindən məhrum idi. Düzdür, Sevindiyin gözləri həmişə Güləbətinin ürəyində idi. Dan ulduzu kimi ürəyinin dərinliklərində yanırdı və heç bir qüvvə onu oradan çıxarda bilməyəcəkdi. Lap on il, iyirmi il, otuz il keçsə də o ulduz bacının ürəyinə işıq verəcəkdi. Ancaq qəribədir! Zaman keçdikcə Güləbətinə elə gəlirdi ki, naməlum bir qüvvə hər gün onu Sevindikdən uzaqlaşdırır, ya da Sevindiyi çəkib çox uzaqlara aparır, onun gözləri getdikcə göylərin dərinliklərinə çəkilən ulduz kimi xəyali, bir az da soyuq bir parıltı ilə yanır. Sevindik barədə Güləbətin ancaq ya səhər tezdən, ya da gecələr tək-tənha yatağının içində fikrə gedirdi. Sevindik, balaca qızcığazın həyatının hamıdan gizlin saxladığı sirrinə çevrilmişdi. Bu sirr ilə qızın ürəyinin min bir arzuları, xəyalları, istəkləri, anlaya bilmədiyi əhvalatlar, cəmiyyətin, insan həyatının hörümçək toru kimi dolaşıq hadisələri, ziddiyyətləri bağlı idi. Hər halda Güləbətin Sevindik barədə hamının yanında düşünməkdən belə ehtiyat edirdi. Sanki gözünün içinə baxan kimi biləcəkdilər ki, o zindanda yatan "siyasi" qardaşının haqqında düşünür. O, heç bir yad gözün ürəyinə enməsini, oradakı ən müqəddəs, ən əziz duyğulara toxunmasını istəmirdi. Bəli, Sevindik barədə fikrə getdiyi səhərlərdə Güləbətin vaxtı unudar, bəzən xanımdan daha gec qalxıb həyətə çıxardı. Bir də heç yerə getməyəcəyini biləndə gecikərdi, yerinin içində arxayınlıqla uzanıb qalar, yataqda azca nazlanmağı özünə rəva görər, "bir az da yatım gözümün acısı çıxsın, duraram" – deyə cazibədar, lakin aldadıcı fikrə uyardı. Gözünü açanda isə görərdi ki, yarımca saat yatıb qalıb, – nə az, nə çox! Qulağını həyətə zillədi, hənirtidən hiss edərdi ki, xanım durub, əl-üzünü yuyub, məhrəbanı həyətin ortasındakı ipdən asır. Tez köynəyini əyninə salar, ayaqüstü saçlarını darayıb düzəldər, çölə çıxardı, titrək səslə:

– Salam, xanım, sabahınız xeyir! – deyərdi.

Onun səsindəki günahkar ahəngi hiss edən xanım mehribanca gülümsərdi:

– Salam, Güləbətin, yatıb yuxuya qalmısan, hə? – deyər və dərhal əlavə edərdi, – eybi yoxdur, səhər yuxusu şirin olur, bu gün nədənsə mən tez durmuşam...

Güləbətin ürəyində xanıma min bir təşəkkür duyğusu ilə tez əl-üzünü yuyar, samovara od salar, həyəti süpürməyə başlardı.

Güləbətinin bəxtindən xanım, ümumiyyətlə, nəcib təbiətli arvad idi. Bəzən görürsən ki, otun-alağın içindən elə bir gül qalxıb pardaxlanır ki, ətri və tamaşası baxanı heyran edir. Var-dövlət və sərvətin ancaq harınlar, havayı yeyənlər, əməyə və əmək adamlarına nifrətlə baxan üzübəzək, içitəzək parazitlər yetirdiyi pozucu mühitdə xanım nadir istisnalardan idi. Heç bir bolluq, naz-nemət və anadangəlmə səadət onun insan təbiətini poza bilməmiş, munis, mehriban insan ürəyini qabar-qabar edib daşa döndərə bilməmişdi. Buna görə də o, balaca, on dörd yaşlı Güləbətinin insan iradəsindən kənar səylərini, əmək qabiliyyətini, çalışqanlığını, ata-anasına sövq-təbii və hədsiz-hüdudsuz məhəbbətini görəndə, bütün bunları öz kiçik qızının yersiz şıltaqlığı, hər gün saat ona qədər yatıb qalması, yeməkdə və geyməkdə göstərdiyi zəhlə aparan ədaları il, oğlunun ipə-örkənə gəlməz harınlığı, heç bir nemətin qədrini bilməməsi, pozucu, dağıdıcı təbiəti ilə müqayisə edəndə, Güləbətini ürəkdən sevmiş, ona qarşı ürəyində səmimi bir məhəbbət oyandığını hiss etmişdi. Bir də ki, xanım Güləbətindən gördüyü hörməti, bircə böyük qızından görürdü. Ailənin yerdə qalan üzvləri isə ancaq əziyyət idi, qanını qaraldır, həyatını zəhərləyir, ürəyini dərdlə doldururdu. Övladdan arzuladığını, ummağa haqlı olduğunu yad qızında tapması ananın ürəyində nə qədər acı təəssüf hissləri oyatsa da, Güləbətini layiqincə qiymətləndirməsinə mane olmurdu. Güləbətin bütün bunları hiss etdiyi üçün xanımı sevirdi və əlindən gələni edirdi ki, onu razı salsın.

Güləbətin onu da çoxdan hiss etmişdi ki, xanımın əri Hacı Səlman tamamilə arvadının tərsinə olan bir adamdır: acıqlıdır, insafsızdır, sərtdir, özündən çıxandır və özündən çıxanda bir xanımdan başqa heç kəsə baxan deyil, ağzına gələni deyəcək, acı sözlərlə adamı ürəyinin içinə qədər yaralayacaq. Xanıma acı söz deməməyinin, acıqlı vaxtlarında da onunla ehtiyatla danışmağının səbəbi isə məhəbbət və ya hörmət deyil, qorxu idi. Bəli, Hacı Səlman arvadı Xanımdan çəkinirdi və bunu Güləbətin də yaxşıca hiss etmişdi. Buna baxmayaraq, Hacı Səlman bəzən xanımı da zəhərləyirdi. Xüsusən xanımın Güləbətinlə yumşaq rəftarı, Güləbətin yatıb yuxuya qalanda acıqlanmaması, cəzalandırmaması, əksinə xoş rəftarı Hacının nəzərində əxlaq qaydalarının pozulmasına bərabər idi. Bu münasibətlə Güləbətin Hacının deyindiyini, xanıma tənəli söz dediyini bir neçə dəfə öz qulağı ilə eşitmişdi:

– Xarab eləyəcəksən bu qızı. Qulluqçudur, qulluqçu yerində oturt, başına mindirmə!

– Başıma mindirmərəm, xarab eləmərəm, qorxma! – deyib xanım özünəməxsus sakit və yumşaq səslə ona cavab verirdi. – Bir də ki, arxayın ol, Güləbətin yerini bilən uşaqdır, başa minən deyil!..

Bu gün Güləbətin yenə yatıb yuxuya qalmışdı. İşin tərsliyindən bu dəfə Hacı xanımdan tez qalxmışdı, hara isə tələsirdi. Samovarın hazır olmadığını görə-görə Güləbətini çağırıb ətli ağ əlilə çənəsindəki bir dəstə uzun seyrək tükləri oynatdığı halda dedi:

– Çay gətir, tez gedəcəyəm!

– Bu saat, ağa! – deyib Güləbətin tələsik samovarı doldurdu, kömür salıb alışdırdı. Bütün bunları gördüyü halda özünü görməməzliyə vuran Hacı pəncərələri bağçaya açılan böyük yemək otağından qışqırdı:

– Güləbətin, çay nə oldu?

– Ağa, indicə qaynar, dəmlərəm! – deyib Güləbətin qorxa-qorxa cavab verdi.

Hacı acıqlanmadı, qışqırmadı, amma zəhərli-zəhərli “xi, xi”, – edib güldü və kosa saqqalını oynatdı.

– Vaxtında durmaq lazımdır, xanım qız, vaxtında!

“Xanım qız” sözünü elə bir istehza ilə dedi ki, sanki Güləbətinin sinəsinə ox sancdılar. Belə yumşaq deyilmiş zəhərli, acı sözlərdənsə, Hacı qışqırsaydı, acıqlansaydı daha yaxşı olardı.

Xoşbəxtlikdən bu zaman xanım gəldi və Hacıya yaxınlaşdı. Onlar nə isə astadan danışmağa başladılar. Güləbətin tüstüləyən, lakin heç cür alışmayan samovara yaxınlaşdı, dudkeşi götürüb bərk-bərk üflədi, alov çıxanda, yenə dudkeşi üstünə qoydu. Xanımla Hacı hələ də pıç-pıçda idilər. Lakin getdikcə səsləri ucalmağa başlayırdı. Artıq ikisinin də səbri tükənmiş olmalıdır ki, mübahisəni öz aralarında gizli saxlamaq kimi vacib əxlaqi prinsipi unudub hər ikisi səsini xeyli qaldırmışdı. Belə ki, Güləbətin istər-istəməz onların danışığını aydın eşidirdi.

– Ay kişi, sən allah bəsdir, bir stəkan çay üstündə səhər-səhər qanımızı qaraltma! – deyib xanım hələ də təmkinlə danışmağa çalışırdı.

– Mən heç kəsin qanını qaraltmıram, canım, mənim qanımı qaraldırlar! – deyib Hacı eyni yumşaq, lakin daha zəhərli səslə ona cavab verdi: – Bilmirəm mən bu evdə kiməm? Bir qulluqçu uşağa da söz deyə bilmərəm?!

Xanım bu acı və istehza ilə dolu sözlərə Güləbətinin bu vaxta qədər görmədiyi bir sərtlik və qətiyyətlə son qoydu:

– Səndən xahiş edirəm, Hacı, get dükanda nə qayırırsan qayır, ev işinə, qulluqçu işinə qarışma, mən özüm bilirəm qulluqçu ilə necə rəftar eləmək lazımdır, gözümü açandan qabağımda qulluqçu görmüşəm.

Güləbətin bilirdi ki, xanımın bu axırıncı cümləni deməkdən qəsdi Hacıya tikan batırmaqdır. Xanım mötəbər bir adamın qızı idi. Atası bütün Təbrizdə məşhur idi. Avropa ölkələri ilə əlaqəsi olan bir adam idi. Əslində kəndçi-bağban nəslindən olan bu adam yaxşı təhsil görmüşdü. Avropa dillərinə aşina idi, ingilis dilini isə gözəl bilirdi və hətta mükəmməl fars-ingilis lüğətlərindən birinin müəllifi idi. Var-dövlət cəhətdən də Təbriz kübarlarının adlı-sanlılarından idi. Ancaq onlardan öz maarifçi görüşləri ilə fərqlənirdi. O qızına yaxşı tərbiyə vermişdi. Hacı isə dədə-babadan orta vəziyyətli bir baqqal olmuşdu. Yalnız xanıma evləndikdən sonra onun atasının köməyilə baqqal dükanını bağlamış, böyük fərş mağazası açmışdı. Söz əsil-nəcabətə gəlib çatanda Hacı susdu, çayını içib qurtarana qədər nə xanıma, nə də Güləbətinə bir söz demədi, heç onların üzünə də baxmadan lal-dinməz evdən çıxıb getdi. Ancaq bütün gün Güləbətini fikir apardı. Xanımla ağa arasındakı deyişməyə səbəb olması onun xoşuna gəlmirdi. Öz aləmində and içdi ki, bundan sonra bir daha yatıb qalmayacaq. Həmişə hamıdan tez duracaq, vəssalam! Görünür, taleyin hökmü belədir!..

## ANA DİLİ

Axşam yatmamış xanım Güləbətini özü ilə üzbəüz oturdub nazik sarı rəngli karandaşı və bir vərəq kağızı qabağına qoydu:

– Yaz görək, sabah nə bazarlığımız olacaq.

Bu iş xanımın bütün tapşırıqlarından artıq Güləbətinin xoşuna gəlirdi. Karandaşı barmaqları arasına alıb bərk-bərk sıxaraq kağızı qabağına çəkib altdan-yuxarı xanıma baxdıqca elə bilirdi ki, sinifdə oturub müəllimə baxır, xanım isə lap sinifdəki müəllim kimi ayaq üstdəcə duraraq diktə etməyə başladı. İndi də Güləbətinin yazmağa hazır olduğunu görüb dedi:

– Kərə yağ – üç kilo. Qara kişmiş – iki kilo. Yazdın?

Güləbətin heç bir şey yazmayıb təəccüblü və sualedici gözlərlə xanıma baxdı. Axı, belə şeyləri həmişə Hacı özü alıb göndərərdi, həm də xanımın dediyi kimi üç kilo, iki kilo yox, on dəfə, on beş dəfə çox. Evin ay yarım, iki aylıq ehtiyacını ödəyəcək qədər. Xanım qızın baxışlarındakı sualı anlayıb dedi:

– Hacı tapşırıb, gətirəcəklər. Qorxuram gec ola, xörək vaxtında hazır olmaya, yaz. Kərə yağ, nə qədər dedim?

– Üç kilo, dediniz xanım!

– Hə, kərə yağ – üç kilo, qara kişmiş – iki kilo, xurma – bir kilo, şabalıd – bir kilo, ərik qurusu – bir kilo. Yazdın?

Xanım, Güləbətinin birinci sinifdə gördüyü və həmişəlik olaraq xeyirxahlıq mücəssəməsi kimi hafizəsində ilişib qalmış qoca müəllim kimi səbirlə, tələsmədən diktə edirdi.

– Yazdım, xanım! – deyib Güləbətin yenə altdan-yuxarı xanıma baxdı və fikrindən keçdi ki, bu xasiyyət ki, xanımda var, ondan çox yaxşı müəllim olardı! Hətta bu fikri xanımın özünə də demək istədi. Lakin tərəddüd etdi, nədənsə çəkindi. Xanım ayıq idi. Güləbətinin gözlərinin hərəkətindən nə isə demək istədiyini hiss etdi:

– De görüm, nə deyəcəksən?

Güləbətin artıq susmaq mümkün olmadığını gördü. Xanım soruşduğu halda fikrini ondan gizlətməyi günah bildi. Amma yenə də deyə bilmədi.

– Heç, xanım.

Xanım əvvəlcə elə bilmişdi ki, Güləbətin bugünkü bazarlıq barədə bir söz deyəcək. İndi isə qızardığını görüb belə hesab etdi ki, qız sözlüdür.

– Yenə olsun, Güləbətin.

– Deyirəm ki, xanım, sizdən elə yaxşı müəllim olar! Siz dərs deyən uşaqlar hamısı yaxşı oxuyar...

Güləbətin özü də hiss etmədən və qəsdsiz-qərəzsiz xanımın ürəyində elə telə toxunmuşdu ki, o, bütün insanların sinəsində ən həssas tellərdəndir, kiçik bir söz belə onu titrədir. Xırda qız uşağının, adi bir qulluqçu qızcığazın ağzından nəyə isə qabil olduğunu eşitmək xanımın xoşuna gəldi, nəcib və incə ruhlu insanların sinəsində heç zaman yatmayan və heç zaman da şişib xəstəliyə çevrilməyən, onları fəaliyyətə sövq edən sağlam mənlik duyğusunu oxşadı, xanım əlini Güləbətinin başına çəkdi:

– Hardan bilirsən?

Güləbətin ruhlandı, bu gözəl xanımın ruhunu tərpədən bir söz dediyi üçün sevinərək bu sualına da, uşaqlara məxsus adamı valeh edən bir sadəlik və səmimiyyətlə cavab verdi:

– Səbirlisiniz, adama acıqlanmırsınız! – dedi,– uşaqları çox sevənləri uşaqlar incitməzlər.

Xanımın simasında böyük bir kədər və təəssüf hissləri göründü:

– Bəs Şahpələng, bəs kiçik xanım niyə incidir, məgər mən onları az sevirəm?!

Güləbətin bu suala cavab tapa bilmədi, dumanlı şəkildə hiss etdi ki, doğrudan da insanların həyatı onun düşündüyü kimi sadə deyil, lap hörümçək toru kimi qarışıq sirlərlə doludur. Xanım isə pis övladın adı gələndə ana ürəyini bürüyən ağır, kədərli fikirlərdən ayrılmağa çalışaraq:

– Yaxşı, yaz görüm, sədri düyüsü – beş kilo, – dedi və alnına süzülüb tökülmüş xurmayı buruq saçını geri qatlayıb sığallayaraq davam etdi: – Göy-göyərti – hərəsindən iki-üç dəstə. Ancaq turşəng yadından çıxmasın, olsa bir dənə də baş kələm al.

Xanım siyahıya daha bir sıra şeylər yazdırıb qurtarandan sonra otaqdan çıxmamış Güləbətinə dedi:

– Ağır olsa, baqqalın şagirdinə de, sənə kömək eləsin. İki qıran verərsən...

Xanım gedəndən sonra Güləbətin səhər alınacaq şeylərin siyahısını pəncərə qabağına qoydu ki, duran kimi gözünə dəysin. Sonra yastığının altındakı göy cildli kitabı götürüb pəncərənin qabağında oturdu və oxumağa başladı. Bu kitab 1946-cı ildə Təbrizdə beşinci sinif şagirdləri üçün buraxılmış “Ana dili” kitabı idi. Güləbətin axşamları işdən baş açan kimi oradakı balaca hekayələri, ədəbi parçaları, xalq məsəllərini, tapmacaları böyük maraq və səylə oxuyardı.

Həm duzlu, sadə yazılarına görə, həm də qardaşı Sevindikdən yeganə yadigar olduğu üçün bu kitab Güləbətin üçün dünyanın bütün əziz və qiymətli şeylərindən əziz idi, hələ Sevindik azad gəzərək gön karxanasında işlədiyi zaman, Güləbətin üçüncü sinfə keçəndə bu kitabı yükün dalındakı balaca sandıqçadan çıxardıb bacısına vermiş və demişdi:

– Öz dilimizdə yazılıb, yaxşı saxla, elə ki, sən öz dilimizdə bundan da çətin kitabları başa düşdün və farscanı da yaxşı-yaxşı öyrəndin,

daha bu kitab sənə lazım olmadı, onda da atmazsan, saxlarsan, başqalarına lazım olar. Ancaq heç kəs bilməsin, ha...

Güləbətin kitabı alıb vərəqlədi, o yan-bu yana baxdı. Şəkillərinə tamaşa etdi:

– Niyə heç kəs bilməsin? Siyasidir? – deyib soruşdu, – harda çap eləyiblər?

– Siyasi deyil, öz dilimizdədir, ona görə də siyasidən pisdir.

– Boyy, axı niyə elə olur?!

– Mən də bilmirəm! – deyib Sevindik nədənsə əsəbi cavab verdi, məlum idi ki, bu söhbəti uzatmaq istəmir, Güləbətin isə daha da maraqlandı:

– Qağa, sən allah, de görüm niyə?!

– Yekələnəndə, bilərsən!

– Bəs bunu harda çap eləyiblər, kim çap eləyib, hökumət bilmir? – deyib Güləbətin dalbadal bir neçə sual verdi.

Sevindik kitabın başqa adamlar tərəfindən buraxıldığını söylədi və o adamlar barədə Güləbətinin bütün suallarına bircə cavab verdi:

– Yadında saxla, yaxşı adamlar idi, istəyirdilər hər yerdə azadlıq olsun, hamı işləsin, hamının çörəyi olsun, paltarı olsun, heç kəs heç kəsə zülm eləməsin:

Sevindik danışdıqca Güləbətinin marağı artırdı. Uşaq inadı ilə soruşdu:

– Bəs elə adamlara nə oldu?

– Nə olacaq, didərgin saldılar...

– Boyy... kim didərgin saldı?! Heç yaxşı adamları da didərgin salarlar?!

– Yekələnəndə, bilərsən! – deyib Sevindik bacısının üzündən öpdü, – bu balaca başında yaxşı beyin var. Ancaq kitabı cırma ha, təmiz saxla, heç vaxt itirmə...

Çox zaman kitabı qabağına qoyub oxuyanda Güləbətinin gözləri səhifədə sətrin üstündə ilişib qalardı. Çünki Sevindik kitabın arasından boylanıb ona baxardı, Güləbətin qardaşının səsini eşidərdi. Onunla təzədən söhbətə başlardı... Evdə xanımdan başqa heç kəsin "Ana dili" kitabından xəbəri yox idi. Güləbətin diqqətlə, böyük ehtiyatla onu hamıdan, xüsusən Hacıdan, onun oğlu Şahpələngdən qoruyurdu, qorxurdu ki, hansı xəbər tutsa alıb cırsın. Xanıma isə Güləbətin özü demişdi. Həm də onun yaxşı, rəhmdil adam olduğuna tamamilə arxayınlıq hasil edəndən sonra demişdi.

Bu hadisə xanımgildə işlədiyinin ikinci ili baş vermişdi. Birinci il Güləbətin məktəbə getdiyini, az-çox yazıb oxumaq bacardığını hamıdan gizlədirdi. Nə üçün? Qəribə bir duyğu ona deyirdi ki, birdən şübhəyə düşərlər, deyərlər ki, qarnına çörək tapmayan bir kargər uşağı hara, məktəb hara, oxumaq hara?! Bir az da dərinə gedib Sevindik barədə xəbər tutarlar. Siyasi dustağın bacısını belə evdə saxlarlarmı? Əlbəttə, yox!, Ətrafda gördükləri və eşitdikləri Güləbətini qəti olaraq bu qənaətə gətirmişdi. Buna görə də o məktəbdə oxuduğunu da gizlətməyə məcbur olmuşdu.

Lakin bir il sonra xanımın heç kəsə bədxahlıq edən adam olmadığını gördükdə və onun hər cəhətdən etibarını qazanmış olduğunu hiss etdikdə Güləbətin az-çox yazı-pozu bildiyini ondan gizlətməməyi qərara aldı. Əvvəllər xanımın bazar sifarişlərini hafizəsini gərginləşdirərək, yadda saxlar və olduğu kimi yerinə yetirərdi. Xərclədiyi pulların da hesabını dinarına qədər əzbər hesablardı. Lakin elə ki, xanımı tanıdı və yazı-pozu bildiyini ondan gizlətməməyi qərara aldı, onda, xanım növbəti sifarişlər verdiyi zaman qələm-kağız götürüb əli titrəyə-titrəyə səhvlərlə olsa da yazmağa başladı. Xanım heyrətlə soruşdu:

– Ay qız, sən yazıb-oxumaq da bilirsən?! – cavab gözləmədən əlavə etdi:– Vallah, Güləbətin, sən bir qızıl parçasısan, sahibin yoxdur. Hacını razı salıb səni oxudacağam!..

O gündən Güləbətin bazardan alınacaq şeylərin siyahısını tutar, qabağında miqdarını yazardı. Bazardan qayıdanda isə hərəsinə nə qədər verdiyini yazar, axırda cəmləyib bütün xərclərin hesabını vuraraq, son dinarına qədər xanıma təqdim edərdi. Bəzən xanım sifarişləri öz otağında, öz əlilə yazıb gətirərdi. İlk zamanlar Güləbətin xanımın xəttinə bələd olmadığından, yazdıqlarını çox da dürüst ayırd edə bilmirdi. Lakin tezliklə buna da öyrəndi. O qədər öyrəndi ki, xanımın tələsik yazaraq sonra oxuya bilmədiyini də Güləbətin dərhal oxuyurdu. Bu cür yaxınlıqdan sonra bir gün Güləbətin xanımın kefinin saz vaxtında anasını görmək üçün icazə alıb evlərinə getdi. Qayıdanda "Ana dili"ni kağıza büküb gətirdi və xanıma göstərdi:

– Xanım, icazə ver, axşamlar bu kitabı oxuyum.

Xanım alıb kitabı vərəqlədi, bir parçanı oxuyub Güləbətinə qaytardı.

– Burada nə var ki, icazə də istəyirsən? Nə qədər kefindir oxu.

Güləbətin istədi xanıma desin ki, bu başqa hökumət zamanı çap olunub, indi icazə vermirlər. Lakin demədi. Kasıb uşaqlarına məxsus

həyati hisslərdən doğan əməli bir duyğu buna yol vermədi. Belə hallarda atasının sevə-sevə işlətdiyi məsəl yadına düşdü: “Nəyə lazımdır, oğrunun yadına daş salasan!”.

İndi də Güləbətin dəhlizdə pəncərənin qabağında oturaraq Təbriz elektrikinin zəif sarı işığı altında “Ana dili”ni oxuyurdu. Güləbətinin yaşadığı dəhliz evin dal tərəfində idi, qapalı dəhliz idi. Xanım buranı bir növ artıq pal-paltar, az-az açılan sandıq və xalçalar saxlanılan xəlvət yerə çevirmişdi. Buradan bir qapı ümumi dəhlizə, biri də xanımın yataq otağına açıldığından heç bir get-gəl olmurdu. Xanım isə gecə-gündüz istədiyi vaxt Güləbətini səsləyə bilirdi. Bu mülahizə ilə də onun üçün burada bir künc ayırmışdı. Hər halda Güləbətin çox razı idi ki, onun yataq yeri ayaq altı deyil, gözdən kənardır və burada o oturub öz fikirləri, xəyalları ilə tək-tənha qala bilir.

Güləbətin hiss edirdi diqqətini bir yerə toplaya bilmir, hey fikri yayınır, nə isə onu narahat edir, rahatlıq vermir. Bir az sonra bu “nə isə” tamamilə aydın bir fikrə çevrildi. Daxilində bir səs onu ittiham etməyə başladı. Bu səs deyirdi ki, “heç ayıb deyilmi, Güləbətin, xanım sənə bu qədər inanır, sən isə biclik edirsən, onu aldadırsan, demirsən ki, xanım bu kitab harda tapılsa, oranı “siyasi” sayacaqlar, günahkar hesab edəcəklər”.

Bu fikirlərlə bir cinayətkar kimi öz-özünü dardan asa-asa yuxuya getdi və ona elə gəldi ki, daş kimi yatıb, bir də səhər açılanda gözünü açdı. Lakin bazara gedib qayıdaraq xanıma salam verib, sabahın xeyir edəndə məlum oldu ki, gecəni o qədər də rahat yatmayıb:

– Güləbətin, yəqin sənin o kitabında qorxulu nağıllar var, yatanda oxuma, gecə səsin gəlirdi, yuxuda da danışırdın, hərdən qışqırırdın da...

Güləbətin xanımın qabağında günahını yumaq üçün yaxşı fürsət düşdüyünü görüb dedi:

– Xanım, elə o kitab barədə sizə deyəcəkdim. Sonra sizə söz gəlməz ki. Axı, o başqa hökumət zamanında yazılıb.

– Nə başqa hökumət, ay qız? Sən nə danışırsan? – deyib xanım kitabı aldı, bir də o yan-bu yanına baxdı və Güləbətinə qaytardı – hansı hökumətdə yazılıb-yazılsın, uşaq nağıllarıdır!

– Xanım, bu çox qiymətli kitabdır, amma heyif ki, siyasidir!

“Siyasi” sözünü deyəndə böyük bir sirr açır kimi Güləbətinin gözləri böyüdü.

Xanım etinasızlıqla:

– Ay Güləbətin, mənim siyasidən-miyasidən başım çıxmaz, – dedi və ani fikirdən sonra əlavə etdi: – Ver Hacıya göstərim, siyasətdə ona çatan olmaz.

Güləbətin kitabı ikiəlli bağrına basdı:

– Sənə qurban olum xanım, bu kitabı ağaya göstərmə!

– Niyə, ay qız?

– Ağa hirslidir, acığı tutar, cırar, qalaram kitabsız...

– Yaxşı, göstərmərəm, di get işinə! – deyib xanım bütün bu danışıqdan bir şey başa düşmədi və öz aləmində Güləbətinin vahiməsini dünya işlərindən xəbərsiz uşaq mühakimələrinin sadəliyi ilə izah edib arxayınlaşdı. Güləbətin isə tez dəhlizə qaçıb kitabı yastığının altında gizlətdi.

## ŞAHPƏLƏNG

Payızın orta ayı yarıdan keçmişdi. Artıq Təbrizin açıq üfüqlərində boz buludlar tez-tez görünməyə başlayırdı. Günlər qısalır, gecələr uzanırdı. Yavaş-yavaş yarpaqlar saralıb tökülür, ağaclar getdikcə qızılı rəngə boyanırdı. Güləbətin həyəti, evin astanasından həyət qapısına, bağçanın dalda yerində kərpic divarın sağ küncündə gizlənmiş ayaqyoluna və bağçanın ortasındakı hovuza gedən qırmızı kərpic səkiləri süpürərkən xəzəlin gündən-günə artdığını görürdü. Süpürgənin ağzında və ayağının altında xışıldayan xəzəl bir yandan ona xoş gəlirdi, bir yandan da ürəyinə qüssə gətirirdi. Bu dünyada saralıb-solan, ölüb gedən hər faydalı şey kədərli bir iz buraxmırmı?

Buna baxmayaraq Güləbətin Təbrizin payızını sevirdi. Payız özü ilə hər tərəfə bir bolluq və sərinlik gətirirdi. Küçədə, bazarda adamlar daha gümrah görünür, gəlib gedənə əl açanların sayı sanki azalırdı. Ah, Güləbətin necə istərdi ki, onların gözəl, səfalı Təbrizində bir nəfər də əl açan, dilənçi olmasın, xüsusən uşaqlardan!

Dilənçi uşaq görəndə, xüsusən qız uşağı, az qalırdı Güləbətinin ürəyi qopub düşsün yerə. Bunun da səbəbi vardı. Əvvəllər qətiyyən belə şeylərə fikir verməzdi. Bazara gedib gələrkən Şahpur xiyabanından Gülüstan bağının ağzına qədər dükanları və mağazaları gəzib xanımın tapşırdığı şeyləri alarkən ayaqyalın başıaçıq, yaxası cırıq yoxsul və dilənçi uşaqlarını sanki görməzdi. Lakin neçə aydan bəridir ki, amansız bir əl uzanıb onun gözündəki pərdəni yırtmış, gözəl şəhə-

rin bir qara yarasını ona göstərməyə başlamışdı. Bir gün, bir saat olmur ki, bu yara gözünün qabağında durmasın, onun ürəyini anlaşılmaz, sanki gözlənilmədən hardansa çıxıb gələrək başının üstünü alacaq bir kabusun vahiməsi ilə qorxutmasın!.. Əlbəttə, bu da səbəbsiz deyil. Bu vaxta qədər ürəkbulandırıcı yaranı gizlədən pərdə öz-özünə yırtılmamışdır, amansız qorxu nahaq yerə ürəyinə dolmamışdır. Bütün bunların səbəbi var: Şahpələng!

Güləbətini bu evə düzəldərkən anası tapşırmışdı ki: "Qızım, ayıq ol, həmişə gözüaçıq ol, qulluğa hazır dur, yad evdir, elə elə ki, üzünə söz gəlməsin. Sən ağıllı balasan, elə əvvəldən gözüaçıqsan, zirəksən, orda evimizdəkindən də ayıq ol, yaxşını yamandan seç!". Xanımgilə gəldiyi gündən anasının bu sözlərini bir an da unutmamışdı, açıq, narahat gözlərlə hər şeyə və hər kəsə fikir verir, həm evin səliqəsinə, həm də burda yaşayan adamların xasiyyətinə bələd olurdu. Elə ilk müşahidələrindən o evin böyük qızı Böyükxanımın anasına çəkdiyini, anası kimi sadə ürəkli, iddiasız olduğunu görmüşdü. Böyükxanım hər gün müəyyən vaxtda gedib yatar, müəyyən vaxtda durardı, öz yerini özü yığışdırar, otağın səliqəsinə baxar, paltarlarını yerinə asardı. Ona: "Dərs hazırla, təmizkar, səliqəli ol!" – deyən olmazdı. Bütün bunların hamısını özü edərdi. Hətta son zaman xörəkdən sonra öz qab-qacağını özü yığışdırar və özü yuyub təmizləyərək yerinə qoyardı. Onun ağ, girdə üzü, püstə dodaqları, qara iri gözləri, çatma qaşları, geniş alnı həmişə işıqlı olardı, üzündən yüngül, xoş bir təbəssüm əskik olmazdı. Güləbətin ürəkdən onu sevir və ara-sıra vaxt tapıb Böyükxanım özü demədiyi halda onun otağını növbədən kənar silib-süpürür, bağçada təzə açılan güllərdən dərib güzgülü stolunun üstündəki güldana qoyurdu. Əlbəttə, bütün bunlar Böyükxanımın gözündən qaçmırdı və hər dəfə Güləbətinə təşəkkürünü bildirirdi.

– Yaxşı qızsan, Güləbətin! – deyirdi. – Qoy bir az başım ayılsın, danişgahda imtahanlarımı verim, sənə oxumaq-yazmaq öyrədəcəyəm...

– Oxumaq-yazmaq bilirəm! – deyib bir dəfə Güləbətin sirrini ona da açdı.

Böyükxanım dərhal Güləbətinə bir kitab verdi:

– Oxu görüm.

Kitab farsca idi. Üstündə "Siyahətnameyi İbrahim bəy" yazılmışdı. Güləbətin bu sözləri oxudu və hətta mənasını da dedi. Böyük-

xanım vəd etdi ki, ana dilimizdə yaxşı oxumalı kitablar tapıb ona verəcək.

Evin kiçik qızı olan Kiçikxanım isə başqa təbiətdə idi, o, ərköyün və şıltaq idi. Heç bir şeydə nizam-intizam bilməzdi. Kefi istəyəndə – məsələn səhər çayından sonra gedib yatar, gecə Allah bilir havaxta qədər radiotutanın qabağında oturub qəribə havalara, anlaşılmaz danışıqlara qulaq asar, səhər saat ona qədər yatar, yerini yığışdırmaz, paltarlarının hərəsini bir yana atar, sonra da axtara-axtara qalardı. Dərslərinə də həvəs göstərməzdi. Bacısı məktəbi əla qurtarıb həkimlik dərsi oxuduğu və yaxşı oxuduğu halda onun fikri-zikri ayna qabağında durub saçına, üz-gözünə rövnəq vermək idi, paltarın, tuflinin modda olanını hamıdan yaxşı ayırd edir və bütün bunlarla anasını əldən salardı. Kiçikxanımı bu cür ərköyün və nazlı edən, əlbəttə, anası deyildi. Xanım özü ondan narazı idi və çox vaxt narazılığını gizlədə bilməyib deyirdi:

– Neyləyim, var-dövlətin də bu bəlası var. Uşağı zəhmətə öyrədə bilmirsən, sən gözünü açınca görürsən ki, oturub-durduğu adamlardan elə şeylər götürüb ki, elə xarab olub ki, özünü öldür düzəldə bilməzsən. Nə yediyi çörəyin qədrini bilir, nə varın-dövlətin. Elə bilir ki, hamısı göydən tökülür və həmişə də belə olacaq. Daha demir ki, bu dünyada heç şeyə etibar yoxdur, adamın öz qabiliyyətindən, öz bacarığından savay!..

Bu sözlərin heç birisi Kiçikxanıma təsir etmirdi. Hətta Güləbətinə elə gəlirdi ki, o, heç anasını başa düşmür, onun sözlərini eşitmir, heç qanmır ki, ana nə deyir, fikri tamamilə başqa şeylərdədir. Güləbətin mümkün qədər özünü ondan uzaq saxlayırdı, bir şey istəyəndə, ya bir söz deyəndə dərhal yerinə yetirib kənara çəkilirdi.

Lakin Şahpələngə baxanda Kiçikxanım toy-bayram idi. Qızların ikisindən də böyük olan Şahpələngin yaşı iyirmi ikini adlamışdı. Lakin onun qeyri-sabit hərəkətlərinə, danışığına, ailə üzvləri ilə rəftarına, ağılsız işlərinə baxan deyərdi ki, on üç, on dörd yaşı var, hələ gözü açılmayıb, heç şey anlamır. Ümumən o çox dəlisov idi. Dumanlı heyvani həvəslər hara çəkdi, ora gedirdi. Hərdən elə şeylər edirdi ki, ağlı başında olan, az-çox bir şey qanan uşaq belə o cür hərəkətlərə yol verməzdi.

Elə ilk tanışlıqdan Güləbətin onunla ehtiyatla dolanmaq, mümkün qədər onun gözünə görünməmək lazım gəldiyini qət etmişdi. Bəla

burasında idi ki, ilk rastlaşdıqları andan Şahpələngin də ürəyində Güləbətinə nifrət duyğusu oyanmışdı. Güləbətin onlara gəldiyinin ikinci ayı idi. Keçən bir ay ərzində Güləbətin Şahpələngin üzünü o qədər görməmişdi, nə qədər ki, haqqında eşitmişdi. Şahpələng adətən, hər gün yerindən duraraq nahar edib evdən çıxar, bir də gecə hamı yatandan sonra qayıtdığı üçün Güləbətin onu çox az-az görərdi və o da ancaq yuxudan oyanıb nahar yediyi zaman; yuxudan isə o çox gec durardı. O zaman durardı ki, dükan-bazar çoxdan açılmış olardı, məktəblərdə dərslər yarıdan ötərdi, karxanalarda fəhlələr günorta yeməyinə çıxmağa hazırlaşardı. Bir sözlə, gün gəlib günorta yerində duranda Şahpələng yuxudan oyanıb tüklü döşü açıq halda həyət çıxar, əsnəyə-əsnəyə, gərnəşə-gərnəşə, heç kəsə salam vermədən, "sabahın xeyir" demədən o tərəf-bu tərəfə baxar, üzünü atüstü yuyub, daha doğrusu yalandan isladıb məhrəba istər, silərək məhrəbanı hara gəldi atar, çörək yeməyə oturardı. Aman Allah, bu necə çörək yemək idi! Çörəyi dartıb parçalar, üstünə lopa yağ yapışdıraraq ağzına basardı. Ovurdları şişərdi. Onu çeynəyib udmamış qayğanağı qabağına çəkərdi. Eyni iri parçalarla orasından-burasından iki-üç tikə götürüb, yenə ovurdlarını şişdirərdi. Güləbətin birinci dəfə gördüyü bu mənzərəni heç vaxt unutmaz. Yenə dediyimiz kimi çörəyi, yağı, yumurtanı micillədikdən sonra Şahpələng üzü kənara duraraq qüssəli gözlərlə onu süzən anasına tutdu, acıqlı, qanlı baxışlarla anasını süzdü, sanki anasına yox, düşməninə baxırdı.

– Yeməyə bir şey olacaq, ya yox?!

Xanım kağız kimi ağardığı halda:

– Nə istəyirsən, bala, süfrədə hər şey var! – dedi.

Bu sözü eşidəndə Şahpələng top kimi açıldı:

– Zəhrimar da yoxdur! Aləmə yedirdirsiniz, mənə gələndə əliniz əsir. Atamın da, sənin də hanı toyuq çığırtması? Bilmirsən ki, səhərlər çığırtma xoşuma gəlir. Bilirsən, qəsdən gətirmirsən ki, yediyimi zəhər eləyəsən!

Xanım da geri çəkilmədi, içəridən ürəyini dəlib deşən, lap boğazına yığılmış acı kədəri və qəzəbi çölə hayqırdı:

– Utan sözündən! – dedi: – bu nə rəftardır sən bizimlə edirsən? Sənin nə haqqın var, bizim üstümüzə qışqırırsan?! Yekə kişisən, əlindən bir şahılıq iş gəlmir, nə evin işinə qarışırsan, nə çölün! Gəlirsən, yeyirsən, içirsən, dağıdırsan, cibini doldurub gedirsən! Harda xərc-

ləyirsən, kiminlə xərcləyirsən, nəyə xərcləyirsən, başına harda daş salırsan, bilmirik! Qurtaranda yenə qaçırsan üstümüzə!

Şahpələng anasına elə cavab verdi ki, Güləbətin onun sözlərindən dəhşətə gəldi. Ancaq ağlı olmayan, nə danışdığını bilməyən dəli, anasına bu cür cavab verərdi:

– Sənin çörəyini yemirəm, havaxt sən qazansan, verməzsən!

Bu sözdən sonra o, boşqabı mizə çırpıb çayını da, çörəyi də yarımçıq qoyaraq ayağa qalxdı, zırrama dəlilərə məxsus iti, acıqlı hərəkətlə öz otağına getdi. Zavallı xanım də əsə-əsə rəngi torpaq rənginə çaldığı halda yemək otağından çıxdı. Öz otağına çəkildi. Güləbətin süfrəni yığışdırmağa, qab-qacağı yumağa başladı. Azca keçməmiş otağında qərar tuta bilməyən ana həyətə çıxaraq açıq havada sovruqları çırpmağa məşğul oldu. Halbuki, sovruqlar səhər çırpılmışdı. Məlum idi ki, bir yerdə qərar tuta bilmir, az qala onu dəli edəcək fikirlərini dağıtmaq üçün bir iş axtarır ki, başı qarışsın. Bu zaman Güləbətin hənirti duyub döndü. Şahpələng öz gözəl şah boyu ilə (bəli, zahirən o çox gözəl idi) yemək otağının qapısında durmuşdu. Qəribədir, onun qara gözləri gülürdü. Üzü açılmışdı. Sanki bir az əvvəl qışqırıb qaralaraq canavara oxşayan o deyildi. O, nazik qara bığları ilə o qədər yaraşıqlı görünürdü ki, Güləbətin ürəyində təəssüf etdi: belə boy-buxunu, sir-sifəti olan oğlan evin dayağı, ata-ananın iftixarı ola biləcəyi halda qara bir daş kimi onların boynundan asılmışdır və hey aşağı çəkib az qalır nəfəslərini kəssin!..

Şahpələng gülümsədiyi halda şəhadət barmağı ilə Güləbətini çağırdı. Güləbətin irəli getdi. Şahpələng qapıdan böyük dəhlizə çəkildi və dönüb ürkək, ehtiyatlı vəziyyətdə mücəssəmə kimi durmuş Güləbətinə "gəl" işarəsi verdi. Güləbətin, əjdaha nəfəsilə cəzb olunan sığırçın kimi qorxa-çəkilə onun izilə dəhlizə çıxdı. Şahpələng dəhlizin qaranlıq küncündən böyük bir bükülünü götürüb qıza verdi və yavaşca dedi:

– Apar, qoy həyət qapısının dalına. Gəlib götürəcəyəm. Nənəm bilməsin.

Güləbətin donub qaldı. Sanki onun ayaqları yerə mıxlanmışdı. Nə tərpənə bilir, nə danışa bilirdi. Nə əməl edib bükülünü ala bilir, nə də qorxusundan "yox!" deyə bilirdi. Qızın tərəddüd etdiyini görən Şahpələng bir az qabaqkı canavara döndü:

– Maymaq-maymaq gözünü döymə! Al deyirəm!

Ürkək, qorxaq qız uşağı yırtıcının qabağında dura bilmədi: əlləri əsə-əsə ağır bükülünü aldı, ikiəlli qucaqlayıb həyətə çıxdı və dümdüz kərpic səki ilə qapıya tərəf irəlilədi. Bükülü o qədər ağır idi ki, Gülə-bətin zorla yeriyir, ayağının birini götürüb, o birini qoyaraq yıxılma-mağa çalışırdı. Səkinin ortasına çatar-çatmaz ayağı büdrədi. Yıxıl-mamaq üçün səkinin qırağındakı şümşad qələmə ağaca söykəndi. Səs eşidərək bu tərəfə baxan xanım soruşdu:

– Güləbətin, nə qayırırsan?

Güləbətin deməyə söz tapmayıb susdu. "İlahi, nə işə düşdüm!" – deyib düşündü. Xanım bu tərəfə addımlayanda artıq tamamilə quduz vəhşini xatırladan, gözləri qəzəb alovu ilə yanan Şahpələng də evdən çıxıb bura gəldi. Xanım sualını təkrar etdi:

– Bu nədir, Güləbətin, hara aparırsan?!

Xanımın başının üstündən boylanan Şahpələng əllərini "Məni demə, demə! – işarəsi verdi. Lakin necə gizlətmək olardı?! Güləbətin bu canavarla əbədilik düşmən olduğunu və onun qabağından qaçmağın mənasızlığını hiss etdi. Xanımın sualına cavab verən gözlərilə Şahpələngi göstərdi:

– Ağa verdi, xanım. Qapıya apar, dedi.

Xanım əyilib bükülünü açdı, içərisindəki səliqə ilə bağlanmış gözəl sarı qutunu görəndə Şahpələngə baxdı:

– Ölüb yerə girəsən, sən də adını kişi qoymusan, sən də deyirsən ki, qardaşam! Axı, bu bacının cehizidir! Elə bu qalmışdı ki, aparıb başını əzəsən?

Şahpələng qanlı gözlərini anasının üzündə süzdürərək bir anlığa Güləbətinin gözünün içinə tuşladı, onu hədələyərək anasına baxdı.

– Sən verməzsən, bundan da pis eləyərəm! – dedi və əlini qabağa uzadıb şəhadət barmağını açaraq hədələdi, – özün də yadında saxla, bundan sonra yalvarmayacağam, istəməyəcəyəm, həmişə cibimdə pul oldu olub, olmadı özünüzdən küsün!

O, yel kimi həyətdən çıxanda xanım əlini göyə qaldırdı:

– İlahi, mən nə günah eləmişəm ki, mənə belə cəza verirsən?! – dedi, Güləbətinə isə tapşırdı ki, bundan sonra xanımdan icazəsiz evdən bir çöp də çıxarmasın...

O gün Güləbətin belə qət etdi ki, bir daha Şahpələngin gözünə görünməməyə çalışsın. Ancaq bu mümkün deyildi. Axı, evdən ki çıxıb qaça bilməzdi. Bu ağ olardı. Şahpələng evdə olanda xəlvəti dəhlizdə

qapılıb qalmaq da mümkün deyildi. Buna görə də Güləbətin hiss edirdi ki, hadisələrin gedişinə tabe olmaqdan başqa əlacı yoxdur. Bəxti ilə üz-üzə gəlməyə məcburdur. Bəlkə bəxti elə gətirdi ki, Şahpələng düşünüb anladı, ürəyində Güləbətinə bəraət qazandırdı və günahından keçdi: "Axı, doğrudan da, bunu anlamağa nə var! – deyib Güləbətin öz-özünü mühakimə edirdi. – Mən bu evdə qulluqçuyam, nə ixtiyarım var, xanımdan gizli iş görəm?! Məni belə işə çəkmək insafsızlıq deyilmi? Sabah çölə atsalar, Həmzə yazıq, Şəhpələngin yarısıca yoxdur, üç adamı necə saxlasın?!".

Bu fikirlərlə o ehtiyatlı, çəkingən də olsa Şahpələng evdə olan zamanlarda da özünü elə aparırdı ki, guya heç bir şey baş verməyib və heç bir pis hərəkətin şahidi olmayıb. Güləbətin az yaşında və az həyat təcrübəsinə baxmayaraq, çox erkən yaşlarından özlərinə yol açmalı olan yoxsul uşaqlarına məxsus bir ayıqlıqla bu həqiqəti dərk etmişdi ki, adamların dünyada o şəxslərdən zəhləsi gedir və onların pisliyini istəyirlər ki, yanlarında yaramaz bir işləri və ya sirləri ola. Bir adamın pis əməlinə istəyərək və ya istəməyərək şahid olmağın isə heç bir əhəmiyyəti yoxdur. Madam ki, onun pis işini bilirsən, pis əməlinin şahidi olmusan, yaramaz bir sirri sənə məlumdur, o adamdan yaxşılıq umma. Ancaq axmaqlar belələrindən yaxşılıq gözləyə bilər!

Bu cür düşünəndə Güləbətini vahimə basırdı. Sanki dünya gözlərində qaranlıqlaşırdı. Təbrizin açıq mavi göyləri, ayna kimi təmiz üfüqləri daralmağa, onu boğmağa başlayırdı. Deməli, bundan sonra vahimə içində yaşamalı, nagahani bir zərbənin qorxusu ilə əsib titrəməli, qara yuxular görməli! Yox, yox! Axı, bu dünyada hər şeyi bağışlayan, hər günahdan keçən, kin saxlamağı bacarmayan insanlar da var. Elə biri Sevindik! Nə qədər ona dönüklük eləyən, vəfasızlıq göstərən, pis gündə dal çevirən adamlara dara düşdükləri zaman bacardığı yaxşılığı eləyib?! Bu fikir Güləbətini bir az sakit etdiyindən daha artıq xoşuna gəldi və elə bildi ki, bu ən doğru fikirdir. "Axı, necə olsa Şahpələng də adamdır. Onun da ürəyi var. Başa düşər ki, mən başqa cür edə bilmərəm. Əgər başqa cür olsam, onların özünə zərərdir, evlərində də əli-ayağı düz adam olsa yaxşıdır, yoxsa əyri, yalançı, adam aldadan?! Başqasını sənə satan adam, axı, bir gün səni də başqasına satar, bunu anlamağa nə var ki!.."

Doğrudan da, ilk günlər Şahpələng Güləbətinə heç bir söz demir, həmişə olduğu kimi məhrəbadan, çaydan istəyib rahat olurdu. Hətta

baxışları da bir az yumşalmış kimi idi. Bəzən də özünü elə göstərirdi ki, guya Güləbətinin bu evdə varlığını da hiss etmir. Güləbətin bundan da incimirdi, çünki hissləri ona deyirdi ki, Şahpələngin diqqətini cəlb etməkdə zərərdən başqa bir xeyir yoxdur.

Həmin hadisə baş verən gündən xeyli keçmişdi. Bu müddətdə Şahpələng dönə-dönə anası ilə, bir neçə dəfə atası ilə, ara-sıra bacıları ilə, xüsusən böyük bacısı ilə sözə gəlmiş, didişmiş, onları acılayıb zəhərləmişdi. Lakin Güləbətinlə bir dəfə də pisləşməmişdi.

Bir gün yenə gecə gec gələrək gündüz çox gec durmuşdu. Yenə üz-gözündən zəhrimar yağırdı. Gözlərinin altında suluğa bənzər qara ləkələr görünürdü. Yenə həyətdə yaxası açıq, tüklü sinəsi göründüyü halda fasiləsiz olaraq əsnəyib gərnəşirdi. Güləbətin hiss etmişdi ki, Şahpələng çox yorulduğu, əldən düşdüyü zaman lap adamlıqdan çıxır. Üz-gözünə baxmaq mümkün olmadığı kimi, dili də zəhər saçır, kobud və dözülməz olur. Kiminlə danışırsa, sanki onu acılamaqdan ləzzət alır. O həyətin ortasında durmuşdu. Bir saat sonra, bir gün, bir ay, bir il sonra, bütün ömrü boyu nə edəcəyini bilməyən adamlar kimi qayəsiz-məqsədsiz gözlərlə o tərəf-bu tərəfə baxırdı. Güləbətin yenə hovuzun qırağında paltar yuyur, öz xoşbəxt göyərçinlərinin qar-quruna qulaq asırdı. Bu zaman qapı döyüldü. Güləbətin sabunlu əlini yuyub istədi qaçıb qapını açsın. Şahpələng etinasız hərəkətlə əlini tər-pədib onu saxladı:

– Mən açaram! – deyib qapıya tərəf getdi. Qapını açanda əvvəlcə duruxub durdu. Sağ əlilə açıq döşünün qara tüklərini oynadaraq ani fikrə getdi. Bu zaman Güləbətin qapının dalından zəif bir qız səsi eşitdi:

– Ağa, Allah yolunda, kömək elə!..

Şahpələng nə düşündüsə dilənçi qızı içəri çağırdı, bu qaraçı uşa-ğına oxşar, balacaboylu, cılız, qarayanız bir qız uşağı idi. Əynində cırıq-cırıq olmuş bir köynək vardı ki, o da döşünü, ayıb yerlərini güclə örtürdü. Şahpələng onu içəri buraxıb hovuza tərəf döndü və səslədi:

– Güləbətin, bura gəl.

Güləbətin fikir elədi ki, yəqin Şahpələng onu çağırıb tapşıracaq ki, apar bu uşağı yedirt, anama de əyninə bir şey geydirsin salsın yola. Bu fikirlə o tez qapıya gəldi. Şahpələng məzlum-məzlum altdan-yuxarı ona baxan dilənçi qızı göstərib:

– Güləbətin, sənin əkiz tayın yoxdur ki? Bax necə sənə oxşayır! – deyib ucadan və şit-şit gülməyə başladı. Bu qəhqəhələr iti tikan kimi

Güləbətinin ürəyinə sancılmaqla bərabər bir anda gözlərindən hansı bir pərdəni isə cırıb atdı. O bir də baxanda dilənçi qızı bütün dəhşətli, dözülməz, fəlakətzadə görkəmilə görüb sarsıldı. Vahimə içərisində və təhqir olunmuş mənlik duyğusu ilə qəhərlənib hönkürdü və dönüb kərpic səki ilə birbaş xəlvət dəhlizə qaçdı...

## GÜLƏBƏTİN, AY GÜLƏBƏTİN!

Təbrizdə gözəl bir səhər açılmışdı. Göy üzündə üfüqdən-üfüqə bir tikə də qara ləkə, bir parça da bulud yox idi. Hansı üfüqə dönürdün, göyün hansı tərəfinə baxırdın, daş ayna kimi par-par parıldayırdı. Güləbətin gözünü açanda dəhlizdəki işığın bolluğundan və parıltısından bildi ki, hava gözəldir, tez geyinib həyətə çıxdı. Ağ-qırmızı çiçək açmış qərənfillərin yanından keçib hovuzun qırağına gəldi. Hava elə sakit idi ki, ağacların bir yarpağı da tərpənmirdi. Hətta həmişə xəfifcə xışıltısı eşidilən qələmələrin də səsi çıxmırdı. Hovuzun suyu dumduru idi və suyun xoş mavi rəngi Güləbətinin ürəyinə qəribə bir sevinc gətirdi. Əlbəttə, Güləbətin bilirdi ki, hovuza bu maviliyi verən göylərin təmizliyidir. Axı, hava buludlu-dumanlı olanda balaca hovuz da tutqun, bulanlıq görünürdü. Güləbətin başını qaldırıb göylərə baxdı. Fikrinin, xəyalının qavraya bilmədiyi, lakin böyük maraqla cəlb olunduğu nəhayətsizlik və əzəmət qarşısında donub qaldı!

Güləbətin göylərə baxmağı sevərdi. Uşaqlıqdan sakit gecələrdə həyətdə yatdıqları zaman onun fikrini, xəyalını göylərə çəkən anası olub:

– Bax, gör ulduzlar necə səpələniblər göy üzünə! – deyib o bildiyi bir-iki nağılı danışaraq qurtardıqdan sonra: “Birini də danış, nənə”, – deyə təkid edən Güləbətinin fikrini yayındırmaq, başını qatıb yuxuya vermək üçün göyləri göstərərdi. Sonra da ulduzlar barədə min illərlə bundan əvvəlki babalarımızın yaratdığı əfsanələri nəql edərdi. Guya hər adamın göydə bir ulduzu var, hər axıb gedən ulduz o deməkdir ki, yer üzündə bir adam öldü, anadan yeni bir uşaq doğulanda, yeni adam dünyaya gələndə göydə yeni ulduz yaranır. Beləliklə, ulduzlar da insanlar kimidir, ara vermədən bir ölür, o biri törəyir...

– Ulduz nədəndir, nənə?! – deyib heç cür yuxulamaq istəməyən Güləbətin soruşardı.

– İşıqdandır, görmürsən, necə işıldayırlar! – deyib anası qəti cavab verərdi.

– Bəs niyə birinin işığı azdır, o birininki çox?

– O asılıdır adamından. Kimi ki bəxti var – ulduzu işıqlıdır, kimin ki bəxti yoxdur, ulduzu növüt lampası kimi sönükdür.

– Bəs niyə hamının bəxti bir deyil, nənə?

– Mən nə bilim, ay bala, o Allahın işidir.

– Allah niyə hamının ulduzunu işıqlı yaratmır, nənə? Niyə hamını bir gözdə görmür? – deyib Güləbətin əl çəkməyəndə və dərinə gedəndə anası acıqlanardı.

– Allahın sirlərindən baş açan olmayıb, bala, yat, bəsdir!

Əlbəttə, bizim zəmanədə insanların aya, ulduza uçmaq cəhdləri barədəki xəbərlər Təbrizə də, Güləbətin və onun anası kimi adamların da qulağına gəlib çatmış və nəhayətsiz göylər haqqındakı dumanlı t-əsəvvürlərini bir az da dumanlandırmışdı. Gecə-gündüz Təbrizin məscidlərində moizə oxuyanlar, din xadimləri, əsrlə, zəmanə ilə insan fikri, insan şüuru arasında ehkamlardan keçilməz hasar yaratmağa çalışanlar, avamları, zavallıları, məzlumları, geridə qalanları, əzginləri öz toruna salaraq cəhaləti və bədbəxtliyi əbədiləşdirmək istəyənlər əsrin bu təkamülünə qarşı bircə dəlil irəli sürürdülər:

– Havayı şardır, buraxırlar göyə, havaxt ulduza gedib qayıtsalar, onda döşlərinə döysünlər!

Buna baxmayaraq elm və qabaqcıl fikir də öz işini görür, ehkamların qalın divarını, yağış damcıları qayanı ovan kimi yavaş-yavaş, lakin əsaslı surətdə ovub dağıdır. Təbrizdə danişgahlar, ibtidai məktəblər, müəllimlər, oxumuşlar, ziyalılar, gözüaçıq adamlar, nəhayət, danişgah var. Onlar indiki kosmik uçuşların necə böyük bir qələbə olduğunu yaxşıca anlayır, adamlara şərh edir və yeni böyük nəticələri gözləyirlər. Onların dedikləri günəş işığı olub qaranlıq guşələrdən çıxan boğucu buğu-buxarı az da olsa əridib dağıdır. Güləbətinin Allaha inanan anasının da, atasının da əqidəsini, fikrini sarsıdır. Güləbətinlərdə isə anlaşılmaz qəribə həvəslər, qəribə maraq oyadır ki, bu da anbaan ürəklərinin çırpıntısını artırır, damarlarında ilk əlverişli şəraitdəcə əməli fəaliyyətə keçə biləcək hərarətə, enerjiyə çevrilir. Bəli, güləbətinlərin və ondan daha qüvvətli olanların, – sevindiklərinin simasında cəmiyyət adlanan böyük, mürəkkəb, canlı orqanizmin dərinlərində, lap ürəyinin içində, beynində fırtınaya, tufana çevrilərək həyatın köhnəlmiş, çürük formalarını məhv edəcək əzəmətli, qarşısıalınmaz bir qüvvə yetişməkdədir. Bu qüvvə göylərə dikilmiş, yerdəki

pərdələrin arxasına zillənmiş, pərdələrin dalını görmək istəyən gözlərdə işıqlanır, həyatın kədərini də, sevincini də əvvəlkilərdən nazik və həssas duyan ürəklərin narahat çırpıntısında yaşayaraq hər gün, hər saat artır, böyüyür...

Güləbətin hovuzun yanında durub Təbrizin açıq mavi göylərinə baxarkən, sinəsində mürəkkəb duyğular baş qaldırırdı. O, müasir mədəniyyətlə sadəlövh təsəvvürlərin, insaniyyətlə hərisliyin, çox sadə və təbii insani səadət arzuları ilə, ailə məhəbbəti, ata-oğul mehribanlığı haqqındakı həsrətlərlə, pozğun və coşqun ehtirasların, harınlığın, özbaşınalığın, insafsızlığın gah açıq, gah gizli, gah yavaş, gah şiddətli toqquşduğu bu ailədə gördüklərini və eşitdiklərini tənha gecələrdə sakit dəhlizdə saatlarla fikrində dolandırmış, küt və ərköyün Kiçikxanımın taleyi ilə öz taleyini, yaramaz, ağılsız və dünyaya dağıtmaq üçün gəlmiş Şahpələnglə insanlara səadət vermək istəyən Sevindiyin taleyini tutuşdurmuş və dünya işlərinin ulduzlardan da qarışıq və dumanlı sirləri olduğunu yəqin etmişdi. Əlbəttə, bu dumanları dağıtmaq Güləbətinin işi deyildi və bu barədə də o düşünmürdü. Lakin bütün bu həyatda, bütün qurğuda anlaşılmaz, ağlasığmaz, hamı insanlar üçün dəhşətli olan bir ədalətsizlik görürdü ki, bu ədalətsizliyə qarşı onun yenicə girdələnməyə başlayan balaca sinəsinin altındakı yumruq boyda ürəyi elə həyəcanla, elə hərarətlə döyünürdü ki, bu hərarət çölə çıxsaydı, Güləbətinə elə gəlirdi ki, buzları əridərdi...

Bu gün göyərçinlər uçub hovuzun üstünə gəlmirdilər. Payız səhər günəşinin nəfəsi o qədər ilıq və xoş idi ki, göyərçinlər hamısı havaya qalxaraq çox hündürlərdə uçur və Güləbətinin gözünə hərəkət edən qara nöqtələr kimi görünürdülər. Birdən bu qara nöqtələr hamısı bir istiqamətdə hara isə çəkilib getdilər. Göyün dərinlərində arxayınlıqla süzərək üfüqə doğru gedən dəmir qanadlı nəhəng bir qartal göründü. Əlbəttə, Güləbətin bilirdi ki, bu nəhəng quşun adı təyyarədir və o yüz adamı birdən göyə qaldırıb dünyanın bu başından o biri başına apara bilir... “Ah, nə olaydı, Sevindik gələydi, məni təyyarəyə mindirib uzaq ölkələrə aparaydı!” – deyib düşündü. Elə bu zaman otaqlardan birinin qapısı açıldı və qalın kişi səsi onu çağırdı:

– Güləbətin, ay Güləbətin! Bura gəl! Tez!

Güləbətin Şahpələngin səsini dərhal tanısa da qulaqlarına inana bilmədi: “Bundan nə əcəb belə tezdən durub?! – deyə düşündü. Şahpələng isə Təbrizin üstündən xeyli uzaqlaşmış təyyarəni görəndə

Güləbətinin nə üçün gözlərini göyə zillədiyini anladı və elə səhər-səhər onu ələ salmaqdan çəkinə bilmədi:

– Göylərdə uçdun bəsdir, en yerə, bura gəl! – deyib “xi-xi” edərək güldü və yalnız indi Güləbətin onun eynən atası kimi güldüyünün fərqinə varıb düşündü ki, “şükür Allaha, bunda da ata-anasına oxşayan bir şey varmış”. Lakin elə o saat öz-özünə etiraz etdi: “Yox, anasına oxşar heç şey yoxdur. Amma baqqal atasından deyəsən çox şey keçib buna!..”.

Güləbətin bunları düşünə-düşünə hovuzun yanından evin qapısına gəldi. Şahpələng adı eşidəndə qeyri-ixtiyari olaraq gərginləşən, ehtiyatlı olan gözlərilə bircə anlığa nifrət duyduğu oğlana baxdı və tez gözlərini yana çəkdi (Anası tapşırmışdı ki, əjdahanın gözündə ovsun var, bircə dəfə baxanı ovsunlayıb çəkir kamına. Bəzi adamlar da belədir. Yaxşısı budur, gözünü onların gözündən qaçırdasan!).

– Al, bu şalvarı ütülə. Tez! – deyib Şahpələng bahalı şal parçadan mil-mil qara şalvarı onun üstünə atdı.

Güləbətin heç bir söz deməyib tez Şahpələngdən uzaqlaşdı. Gedib elektrik ütüsünü qızmağa qoydu. Ütü qızana qədər qaçıb samovarı doldurdu və od saldı. Tez-tələsik süpürgəni götürüb səkiləri süpürməyə başladı. Hacı durana qədər heç olmasa səkilər süpürülməsəydi, deyinməyə bəhanə tapıb qanlarını qaraldacağını bildiyindən cəld tərpənib evin qapısından ayaqyoluna və küçəyə gedən səkiləri təmizlədi. Fikri isə ütüdə və Şahpələngdə idi. Bir az gecikərsə, onun qışqıracağından, kobud söz deyəcəyindən çəkinir və Allaha yalvarırdı ki, tez durduğu kimi tez də evdən rədd olub getsin, rahat nəfəs alaq. Doğrudan da, Şahpələng evdə olanda hamı narahatlıq hiss edirdi. Hamı indicə evdə qeyri-adi bir şey olacağını gözləyib dururdu. Ya otaqlardan birində pal-paltar, qab-qacaq alt-üst ediləcək, kiminsə bir şeyi itəcək, ya pəncərə şüşələrindən biri sınacaq, ya bağçanın ortasında tonqal qalanacaq, ya da qiymətli parçadan örtük çəkilmiş, gözəl cilalanmış stulların parçası kəsik-kəsik olacaq, cilalı taxtalar yonulub qaşınacaqdı. Bunların heç biri də olmayanda ikicə-üççə dəfə geydiyi öz qiymətli köynəyinin qollarını qayçılayacaq ki, nə var, qolu uzundur, ya da şalvarının balağını bir qarış kəsəcək ki, gödək yaxşıdır. Sonra da bunları ilan vurmuş kimi yerində yanıb-qızaran ananın üstünə ataraq:

– Pul ver, təzəsini alım! – deyə tələb edəcəkdi.

– Ey, Güləbətin, nə həyətdə veyllənirsən, tələsirəm ey! – deyib damağında siqaret olan Şahpələng onu fikrindən ayırdı. Güləbətin başını qaldırıb ona baxmadan:

– Ütü qızsın, çəkərəm! – dedi.

– On saatdır ütü qızmadı?! Min dəfə demişəm ki, ütü həmişə isti olsun. Deyiləni eləsəniz canınız çıxar! – deyib Şahpələng ağzını açdı. Havaxt yumacağı məlum deyildi. Telefon zəng çalmasaydı, qurtarmaq fikri yox idi. Güləbətin onun necə tələsik özünü telefonun üstünə atdığını, dəstəyi götürüb yavaşca, oğrun-oğrun danışdığını gördükdə "kül sənin başına! – deyib düşündü, – bilmirəm Allah sənin kimilərini niyə yaradır?! Torpağın üstünü murdarlamaqdan başqa nə xeyriniz var?! Hələ kişilənməyinə bax! Neyləyim, fələyin üzü qara olsun, Sevindik burda olaydı, bükəydi qoyaydı dizinin altına, görəydin qışqırmaq necə olar?!".

Səkiləri süpürüb təmizləyərək Güləbətin otağa getdi. Ütü qızmışdı. Ürəyində nifrət qaynadığı, iyrənərək çiyrəndiyi halda əlacsız olaraq şalvarı düzəldib stolun üstünə sərdi və ütü çəkməyə başladı. Güləbətin payız günəşinin artıq həyətin divarlarına işıq saldığını görüb təəccüb etdi ki, niyə xanım bu vaxta qədər durmayıb. Axı, o tez durmağa adət etmişdi. Görünür, insan uşaqlıqda öyrəndiyini həm gec unudur, həm də gec tərgidir. Bəzi şeylər də var ki, ölənə qədər nə unudursan, nə tərgidirsən. Səhərlər tez durmaq, bir gün də əliboş oturmamaq görünür atasından xanıma qalan irs və yadigar idi ki, onu bu evdə də tərgidə bilmirdi. Bəs bu gün niyə yatıb qalıb?!

Güləbətinin narahatlığını duymuş kimi xanım yataq otağından səsləndi:

– Güləbətin, bura gəl!

Elə bu zaman evin dörd tərəfindən səslər eşidildi.

– Güləbətin! Ay Güləbətin! – deyib eyni zamanda Şahpələng, Hacı, Böyükxanım və Kiçikxanım onu səslədilər. Güləbətin ani olaraq düşündü ki, hansı tərəfə getsin. Əlbəttə, ayaqları onu xanımın otağına çəkirdi. O biri otaqlarda isə səslər kəsilmir, daha artıq səbirsizliklə qışqırırdılar:

– Güləbətin, ay Güləbətin!

– Gəldim, indicə gəlirəm! – deyib Güləbətin o biri otaqlara səs verib xanımın otağına girdi.

Xanım öz təmiz yatağında uzanmışdı. Siması solğun və tutqun idi, gözlərinin altında torbacıq əmələ gəlmişdi, gecəni pis yatdığı bilinirdi.

– Orda nə edirdin, Güləbətin? – deyib xanım yavaş və zəif səslə soruşdu:

– Şahpələngin şalvarını ütüləyirəm, xanım! – deyib Güləbətin xanıma baxdı.

Oğlunun adını eşidəndə xanım diksinən kimi oldu. Üzünü qırışlar bürüdü, kölgələr örtdü. İçərisindəki hansı bir ağrını isə güclə boğub özünü ələ almağa, az qala boğazına yığılmış hıçqırıqları saxlamağa çalışdı, öz-özüylə danışırmış kimi:

– Dünyada pis övladdan böyük dərd yoxdur! Allah heç kəsi bu dərdə salmasın! – dedi və yatağa dirsəklənib əlavə etdi: – Baş ağrısından gözümü aça bilmirəm, Böyükxanımı yanıma çağır.

Elə bu zaman yenə dörd tərəfdən səslər gəldi:

– Güləbətin, ay Güləbətin!

Birinci qapıdan qışqıran isə əlavə etdi:

– Harda ölmüsən, ay it qızı! Ayaqlarını qıracağam ha...

Xanım, Güləbətinin qızarıb allanan yanaqlarına baxıb dedi:

– Vecinə alma, bala! Get şalvarını at üstünə, geysin, cəhənnəm olsun, sonra Böyükxanımı çağırarsan.

Güləbətin böyük dəhlizə çıxıb Şahpələngin otağına yollananda Hacı bir yandan, Kiçikxanım o biri yandan səbri tükənmiş halda qışqırırdı:

– Güləbətin, ay Güləbətin! Gəl, gör bu zəhrimar hara dığırlandı?

– Güləbətin, ay Güləbətin, gəl bu köynəyin düyməsini tik!

Güləbətin artıq bu səslərin heç birinə əhəmiyyət verməyərək Şahpələngin qapısına yaxınlaşdı. O, dizdən yuxarı gödək tumanda qarşısına çıxdı.

– Hay da verə bilmirsən? Öləsən elə! – deyib şalvarı aldı, elə oradaca qıçına keçirdi, üz-gözünü büzüşdürərək Güləbətinə “xox!” elədi, ucadan gülüb uzaqlaşdı, həyətə çıxmamış dönüb dedi:

– Nənəmə deyərsən getdik Şah gölünə, gecə gəlməsəm nigaran olmasın.

Güləbətin hansı yaramaz, nalayiq hərəkətləsə gecə anasının ürəyini yaralamış, fikir-xəyal ilə doldurub, yuxusunu qaçırmış, az qala onu dığladıb öldürəcək bəd əməllərə yol verən Şahpələngin birdənbirə belə dəyişməsini, səhər bu qədər tezdən durmasının səbəbini indi başa düşdü: “Deməli, yenə özü kimi avaralara qoşulub şəhərdən çıxacaqlar, yeyəcək, içəcək, Allah bilir daha nə kimi hərzə işlər görüb, var-yoxlarını xərcləyərək cibləri tamamilə boşaldandan sonra hamının həsəd apardığı, lakin əslində bədbəxt olan analarının üstünə qayıdacaqlar: “Ver, pul ver!”.

Xanım yatağa düşən gündən Güləbətinin işi birə-on artdı. Kiçik qız əvvəlki kimi ayna qabağında tellərini tumarlayaraq sonra qız yoldaşlarına qoşulub şəhərin küçələrini ölçməklə məşğul idi, vaxtını hər gün bir qızın evində, kinolarda keçirirdi. Şahpələng hələ ki, Şah gölündən qayıtmamışdı və Güləbətin gecə-gündüz Allaha yalvarırdı ki, qayıtmasın. Heç olmasa onsuz evdə sakitlik idi. Hər küncdə adamı bir vahimə gözləyirdi. Hacı evə ancaq yeyib-içməyə və dincəlməyə gəlirdi. Günün qalan hissəsini xalça mağazasında, axşamları da müxtəlif tacirlərlə görüşdə keçirirdi, nə alıb satmağın faydalı, nəyin zərərli olduğu barədə söhbətlərə qulaq asırdı. Oğlu sakit Şah gölündə üzdüyü halda, özü bazarın daima təlatümdə olan bulanıq və xatalı gölündə o tərəf-bu tərəfə əl-qol atır, iflas etməmək, kapitalı bir az da artırmaq yollarını axtarırdı. Böyük qız gündüzlər danişgahda olur, axşamlar da bir yığın dəftər-kitabı qabağına tökərək gecədən xeyli keçənə qədər dərs hazırlayırdı. Anasının naxoşladığını bilərək ona dava-dərman hazırlayan kimi, o, Güləbətini çağırıb dedi:

– Qadan alım, Güləbətin, anam bərk naxoşdur. Elə elə ki, evdən nigaran olmasın, bir neçə gün dincəlib özünə gəlsin. Mənim də ki, başım qarışıqdır, özün görürsən.

Beləliklə, evin bütün işləri Güləbətinin üstünə tökülmüşdü. Xanım yataqda da olsa ona bazar-dükandan alınacaq şeylər, evdə görüləcək işlər barədə göstəriş verirdi. Güləbətin də onun dediklərinə diqqətlə qulaq asır, yazır, yazılmalı olmayanı yadında saxlayıb yerinə yetirirdi. Xanımın hər gün və ya günaşırı Güləbətinə bazar haqq-hesabını yazdırması qızcığazda kağız-qələmə olan həvəsi o qədər artırmışdı ki, axşamlar sakit dəhlizə çəkiləndə “Ana dili” kitabını yastığının altından çıxarıb, xüsusi hazırladığı dəftəri açır, qələm götürüb kitabdakı yazıların xoşuna gələnini də, gəlməyənini də bir-bir dəftərə köçürürdü. Yazmaq Güləbətinə o qədər ləzzət verir, onu öz gözündə o qədər böyüdürdü ki, kənardan baxan olsaydı, bu dəqiqələrdə onun üz-gözündə qeyri-adi bir səadətin işığını görərdi. Bir gün ağlına gəldi ki, Sevindiyə kağız yazsın. Əlbəttə, Güləbətin bilirdi ki, bu kağızı Sevindiyə çatdırmaq olmayacaq. Əvvəla eşitmişdi ki, siyasilərə yazılan kağızlar gedib çatmır, ikinci də əgər çatsaydı, yenə göndərə bilməyəcəkdi, çünki Sevindiyin harda, hansı zindanda olduğunu nə anası bi-

lirdi, nə atası. Kimi deyirdi Tehrandadır, kimi deyirdi yox, göndəriblər Tehrandan da o yana, lap isti yerlərə. Yazıq qardaşım! Sən insanlara nə pislik istəyirdin ki, səni anamız qədər sevdiyin Təbrizdən ayırıb atdılar əl çatmaz, dil yetməz yerlərə!..

Buna baxmayaraq Güləbətinin başına düşmüşdü ki, Sevindiyə məktub yazsın. Özü də bir yox, iki yox, lap çox yazsın, hər gün yazsın. Bu məktubları göndərməsə də yığıb saxlayacaq, bir gün Sevindik gələndə verəcəkdi hamısını birdən oxusun. Axı, necə olsa o bir gün gələcək! Həmişəlik ki, adamı zindanda saxlamazlar! (Zavallı, munis Güləbətin, sən nə qədər sadəsən, dünyadan xəbərsizsən! İnsanları son nəfəsinə qədər ömürlük olaraq azadlıqdan, günəş işığından, təmiz, buludsuz göylərə baxmaq səadətindən məhrum edən qanunlardan sənin xəbərin yoxdur!) Qardaşının bir gün azad olub gələcəyinə Güləbətinin şübhəsi yox idi. Qız başqasının qapısında işləmək əzabına ona görə tab gətirirdi ki, gələcəyə ümidi vardı. İnanırdı ki, indiki həyatı pis bir yuxudur, qaranlıq gecədir və bu gecə qurtaracaq, pis yuxu keçəcək, səhər açılacaqdır, gün çıxacaqdır, Sevindik gələcəkdir və özüylə də dediyi xoş, gözəl həyatı gətirəcəkdir. Onda bu məktubları oxuyacaq, görəcəkdir ki, bacısı nələr çəkib, nələr düşünüb, ürəyində necə əziz duyğular, yaxşı fikirlər doğub və ölüm. Amma qardaşının məhəbbəti heç vaxt ölməyib. Günü-gündən artıb, böyüyüb, şirin olub...

Bu kədərli və şirin, işıqlı və həsrətli duyğuları yazmaq istədi. Lakin nə qədər çalışdısa bir şey yaza bilmədi. Qələmi, kağızı kənara qoyanda qardaşına deyiləcək fikirlər beynində bir-birini sıxışdırırdı, bu deyirdi məndən başla, o deyirdi məndən... Ağlına o qədər söz gəlirdi ki, bir dəftərə sığmazdı. Lakin qələmi əlinə alıb kağızı qabağına çəkən kimi iki-üç kəlmədən artıq söz tapa bilmirdi. "Əziz qardaşım Sevindik... Biz sağ-salamatıq. Nigarançılığımız bircə səndəndir...".

Bundan sonra nə qələm işləyir, nə də bir şey yaza bilirdi. Kitabdan surət çıxartdığı dəftərin ağ vərəqləri gündən-günə azaldığı, yazılı vərəqləri artdığı halda Sevindiyə başlanmış məktub yazılıb qurtarmır, ağ vərəq kağız sanki tənə ilə Güləbətinə baxıb deyirdi: qardaşını istəyən belə eləməz. Niyə yazıb qurtarmırsan?..

Elə bu halda da Güləbətini yuxu apardı. Bu çox ağır, çox şirin, çox gözlənilməz yuxu idi. Əvvəlcə gözləri yumulmağa başladı. Kim isə sanki ona bir stəkan şərbət verdi. Qıza elə gəldi ki, bu şirin, bu dadlı şərbət yavaş-yavaş bütün bədəninə yayıldıqca, bütün damarlarını

dolandıqca ona qeyri-adi bir yüngüllük və rahatlıq gətirir. Bir az sonra isə o tamamilə ağırlığını itirərək, qov kimi yüngülləşərək uçmağa başladı. Dəhlizin pəncərəsindən çıxıb göyərçinlərə qoşuldu və mavi boşluqlarda qanad açdı. Eynən göyərsinlər kimi! O gah üfüqlərə doğru süzür, gah birdən-birə dönərək yuxarılara, ulduzlara tərəf qalxır, gah da sürətlə üzüaşağı gəlirdi. Ucu-bucağı görünməyən mavi boşluqlar qucağını açaraq onu səsləyir, lap uzaqlarda parıldayan ulduzlar ona əl edib çağırırdılar. Qəribə burasıdır ki, gecə ilə gündüz arasındakı fərq aradan çıxmışdı. Ulduzlar qaranlıq gecələrdə olan kimi par-par parıldadığı halda, mavi fəzalar dumduru idi. Üfüqdə parlayan günəşin işıqlarını udaraq nura qərq olmuşdular.

Güləbətin birdən hiss etdi ki, nəhəng qanadlı bir təyyarə üstünə gəlir. Qaçıb qurtarmaq üçün qız bir az yuxarı qalxmağa səy etdi.

Lakin təyyarə əl çəkmədi, daha sürətlə yuxarı qalxaraq birbaş üstünə cumdu. Elə iti, elə qüvvətlə cumdu ki, Güləbətin özünü itirdi. Sanki nəhəng bir dağ yerindən qopub gəlirdi və istəyirdi onu altına alıb əzsin. Güləbətin səsi gəldiyi qədər qışqırıb dəmir qanadlı quşun qabağından qaçmağa, çoxdan hovuzun qırağına enmiş göyərçinlərin yanına enməyə çalışdı. Lakin fürsət tapa bilmədi. Dəmir qanadlı quş sürətlə aşağı yuvarlanıb qabağını kəsdi. Güləbətin Şahpələngin istehzalı, zəhərli, acıqlı səsini eşitdi.

– Yaxşı düşməsən əlimə, indi uçmağın dadını sənə göstərərəm. Səninki həyət süpürmək, şalvar ütüləmək, qab yumaqdır. Sən hara, uçmaq hara?!

Dəmir paltar geymiş, dəmir əlcəkləri olan Şahpələng, uzun, qüvvətli qolunu təyyarənin pəncərəsindən uzadaraq Güləbətini havadaca qamarlayıb içəri çəkdi. Az qaldı qızın ürəyi sinəsindən çıxsın. O son gücünü toplayıb qışqırdı:

– Mənə əl vurma, elə bilmə ki, sahibsizəm, havadarım yoxdur. Sevindik mənim intiqamımı səndən alar!

Elə bu an Sevindik hardansa çıxdı. Güləbətin sevincdən qışqırdı. Onu qucaqladı...

– Güləbətin, ay Güləbətin! Yastığını düzəlt, nə yuxudur görürsən elə?! Gah qışqırırsan, gah gülürsən! – deyib xanım otağından dəhlizə çıxan qapını döyüb Güləbətini yuxudan ayıltdı. Qız gözlərini yumub açdı. Dörd tərəfinə baxdı. Hər yan sakitlik idi. Gecədən xeyli keçmişdi. Təəssüf etdi ki, xanım onu yuxunun lap şirin, lap dadlı yerində

oyatdı. Elə yerində ki, Sevindik onu süd kimi ağ bir maşına mindirərək öz istədiyi kimi təzədən tikib düzəltdiyi Təbrizdə gəzdirirdi.

Artıq Güləbətinin yuxusu qaçmışdı. Elə oturduğu yerdəcə bütün yuxuda gördüklərini xatırlamağa başladı. Sanki indicə baxdığı bir kino idi və hələ bütün rənglərinə qədər gözünün qabağında canlanırdı... "Qoy bu yuxumu Sevindiyə yazım! – deyib düşündü – qalar yadımdan çıxar...". Elə gecəyarısı, yerin içindəcə yazmağa başladı... Maraqlıdır, indi sözlər öz-özünə gəlirdi. Qələm kağızın üstündə elə rahat hərəkət edirdi, elə bil ağ maşın yeni Təbrizin ayna kimi düz və təmiz küçələrində süzüb gedirdi.

Həyəcanla, ürəyi döyünə-döyünə yazdığı üçün bəzən çaşır, xətdən kənara çıxırdı. Lakin ara vermədən yazırdı. Bu nə xatirəyə, nə nağıla, nə də gündəliyə oxşayırdı. Bu bir qız uşağının öz qardaşı ilə söhbəti idi. Güləbətinin necə uçduğunu, Şahpələngin onu necə hədələyərək təyyarəyə çəkdiyini bilirsiniz, bu hissədə həsrət, arzu, kədər, sevinc, qorxu bir-birinə qarışmışdı, bir-birini əvəz edirdi. Yuxunun sonrakı hissələrində isə birdən-birə istədiyinə nail olmuş bir uşaq sevinci hakim idi. Həmin hissələri Güləbətin qardaşına bildirirdi "Şahpələng məni içəri çəkəndə qorxumdan gözlərimi yumdum, dedim ki, daha mənimki qurtardı. Elə o dəqiqə təzəcə qanad çıxarmış, amma uzaqlara uça bilməyən göyərçin balası yadıma düşdü. Bilirsənmi, Sevindik, bizdə iri bir pişik var, lap pələngə oxşayır. Sapsarı olduğundan xanım adını Sarıca qoyub. Bir dəfə göyərçinlər hovuzun qırağına enmişdi. Təzə uçmağa başlayan bala göyərçin də anasının yanında qarqur edə-edə özünü günə verirdi: birdən-birə hardansa Sarıca özünü onların üstünə atdı. Hamısı pırr eləyib uçdu. Mən onda döndüm ki, bala göyərçin Sarıcanın dişləri arasında çırpınır. Mən özümü yetirənə qədər Sarıca ağacların arasına qaçıb onu parçaladı... Mən də gözümü yumub parçalanmağımı gözləyirdim. Lakin Şahpələng məni təyyarəyə çəkən kimi sənin səsini eşitdim və tez gözlərimi açdım. Aman Allah, bu necə yuxu idi? Sən iri, qüvvətli əllərinlə Şahpələngin yaxasından yapışıb elə silkələdin ki, o palçıq divar kimi az qaldı uçulub tökülsün. Mənim biləyimi buraxdı və sənə yalvarmağa başladı:

– Məni bağışla, ağayi-kapitan, keç günahımdan, qələt eləmişəm!..

O sənə yalvarıb hey "ağayi-kapitan!" – deyirdi. Özü də qabağında diz çökmüşdü. Elə də balacalanmışdı ki, lap cırtdan boyda görünürdü. Sən ona dedin:

– Az mənə ağa de, ağa sizsiniz, mən deyiləm! İndən belə yerində rahat otur, bir adamı incitsən sənə aman yoxdur!..

Sonra sən qüvvətli qollarınla məni qucaqlayıb qaldırdın. Üzümdən, gözümdən öpdün. Mən sənin boynuna sarıldım. Səni o qədər öpmüşəm ki, lap duz kimi yalamışam. Mən səndən çox şey soruşmaq istəyirdim. Amma macal tapmadım. Qara kostyumlu, ağ köynəkli, çiyinlərində qızıl nişan olan bir oğlan sənə yaxınlaşıb soruşdu:

– Hara sürək, yoldaş kapitan?

Sən məni bir uşaq kimi qucağında saxlamışdın, mən sevincdən özümü o qədər itirmişdim ki, sənin qucağından yerə düşməyi də unutmuşdum, lap uşaq vaxtında olan kimi qollarımı boynuna sarıyıb bərk-bərk sinənə qısılmışdım. O cavana dedin:

– Təbrizə, əlbəttə, Təbrizə sürün!

– Bəs bunları neyləyək? – deyib cavan kimləri isə göstərdi. Sən dönüb baxanda mən də onları gördüm. Bilirsənmi kimlər idi? Səni “sifasi” deyə zindana aparan, anamın yükünü, sandıqçasını, bizim köhnə pal-paltarı eşələyib-axtaran o qırmızı sifət zabit və iki silahlı adam! Onlar suya düşmüş cücə kimi sənin qabağında büzüşüb durmuşdular. Sən onlara baxanda zabit yalvardı:

– Bizə rəhm elə, yoldaş kapitan! Bizi yerə atma.

Sən yavaşca gülüb:

– Biz siz deyilik, rəhmsizlik edək!– dedin və gəncə döndün: – bunları da Təbrizə aparın. Bizə çoxlu işləyən lazımdır. Şəhəri söküb təzədən tikəcəyik, işlərlər – yaxşı işləməzlər – özlərindən küssünlər...

Təyyarə havaxt yerə endi, biz havaxt düşdük, bilmirəm. Onu gördüm ki, bələdiyyə qabağındakı meydançadayıq. Meydança, Şahpur xiyabanı, örtülü bazara gedən küçələr adamla dolu idi. Təbrizlilər hamısı küçəyə çıxmışdı, arvad, kişi, qız, oğlan bir-birinə qarışmışdı, hay-küydən qulaq tutulurdu, deyib-danışan kim, çalıb-oynayan kim! Bələdiyyənin qapısında ağ taxtalardan uca bir kürsü qurulmuşdu. Onun üstündə çoxlu adam vardı. Biz də onların arasındaydıq. Mən sənin əlini buraxmırdım. Sən isə ağ köynək geymişdin (bilmirəm niyə səni həmişə ağ köynəkdə görürəm? Görünür ona görə ki, ağ köynək sənə çox yaraşır!). Ağsaçlı, balacaboylu, nurani bir kişi qabağa çıxdı, əlini havaya qaldırıb adamları sakit etdi və yavaş-yavaş danışıb dedi ki, bu gündən Təbrizin, bizim vətənimiz Azərbaycanın yeni tarixi başlanır... Bundan belə bizi bir-birimizdən ayıran divarlar uçulacaq. Ruhlarımızı, ürəklərimizi

birləşməyə qoymayın, ədavət, düşmənçilik, nifaq yaradan sədlər dağılacaq. Aclıq və ehtiyac ortadan götürüləcək. Özündən zəiflərə zülm edənlər və tənbəllər qalmayacaq. Zəhmət o qədər gözəlləşəcək, o qədər cazibədar olacaq ki, bir adam onsuz yaşaya bilməyəcək. Hər adam bir gül ağacı kimi dörd tərəfə ətir saçacaq... Ancaq bunların hamısı necə əmələ gələcək? Biz cənnətdən də gözəl olan yeni Təbrizi necə yaradacağıq? Bu barədə danışmaq üçün sözü verirəm bizim əziz yoldaşımız Sevindiyə...

Ah, qardaşım, göyərdin, camaat səni necə qarşıladı. Hər yandan sənin başına gül-çiçək atmağa başladılar. Min ağızdan "Yaşasın, var olsun, ura!" – qışqırırdılar. Mənə elə gəlirdi ki, bələdiyyə meydanından qopan bu səslər bütün şəhərin küçələrinə yayıldı. Daş döşəməli küçələrdə də tozlu-torpaqlı döngələrdə də hamı: "Sevindik! Sevindik!" – deyib qışqırdı. Sən isə elə kədərli, elə qüssəli gözlərlə irəli çıxıb bu izdihama baxdın ki, mənim nəfəsim tutuldu. Dedim ki, yəqin ya köhnə qara günlərimiz, ya da qaranlıq zindanlar Sevindiyin yadına düşdü. Sənin kirpiklərində mən mirvari kimi iki gilə yaş girdələndiyini görəndə qəhərləndim. Deməli, sən də ağlaya bilərmişsən?! Sən qırmızı haşiyəli ağ dəsmalı çıxardıb üzünü, gözünü, alnını sildin və danışmağa başladın. Ancaq onda mən bildim ki, səhv etmişəm. Sən kədərli keçmişə yox, uzaq, xoş gələcəyə baxırmışsan. Bilirsənmi sən nə dedin? Bilmirsən. Qoy mən sənin yadına salım. Sən dedin:

– Əziz qardaşlar, mənim sevimli həmvətənlərim! İnqilabımızın bayraqdarlarından biri, bizim qoca müəllimimiz bizim qayələrimizdən danışdı. Mən sizə ancaq onu deyəcəyəm ki, o gözəl həyatı qurmaq həm çox çətindir, həm də çox asan. Çətindir o adamlara ki, natəmiz ürəklə bu işdən yapışacaqlar, asandır o adamlara ki, işin müqəddəsliyinə inanırlar və ürəklərində heç bir çirkin fikir yoxdur. Çətindir o adamlara ki, danışmağı bacarırlar – işləməyi yox, dildə pəhləvandırlar, əməldə cırtdan! Xalqımız isə yaxşı deyib: "Halva-halva deməklə ağız şirin olmaz", gərək qolunu çirməyəsən, un hazırlayasan, yağ tapasan, şəkər tədarükündə olasan, odun qırıb gətirəsən, ocaq qalayasan. Bəs gəlin hamımız sidq ürəklə, təmiz niyyətlə qolumuzu çirməyək, bir-birimizin dalında duraq. Belləri, külügcləri götürək, maşınlar tapaq, müəllimimizin dediyi Təbrizi yaradaq... Köhnə, çürük, iylənmiş nə varsa sökək, ataq, yaxşıların, gözəllərin yanında yenilərini qaldıraq...

Sevindik, mənim iftixarım! Sən bu sözü deyən kimi nələr oldu!.. Yüz min, on yüz min əl birləşdi. Külünglər, bellər havada oynadı,

ömrümdə görmədiyim nəhəng maşınlar hərəkətə gəldi... Təbrizin köhnə, uçuq, tozlu-torpaqlı evləri, küçələri yerlə-yeksan edildi... Gözəl bağların, evlərin, küçələrin qabağı açıldı. Maralan, Ərs qalası, Göy məscid uzaqdan görünməyə başladı. Bizim yaşadığımız ev də sö-küldü, o ev ki bir zaman oradan "siyasi" deyə səni tutub aparmışdılar. "Noşəhr" zindanının qabağı açıldı. Axı, buralarda o, uca, ən təzə tikil-miş binadır. Səndən soruşdular:

– Bunu da uçuraqmı?

Sən cavab verməmiş kim isə dedi:

– Uçurun, bundan sonra bizə zindan lazım olmayacaq.

Bu sözü deyən təyyarədəki gözəl oğlan idi. O da sənin kimi qolunu çirməmişdi. Bir dəstə işçiyə başçılıq edirdi. Sən "Noşəhr"i uçurmağa icazə vermədin:

– Düzdür, bundan belə bizə zindan lazım olmayacaq. Amma bu binanı biz təzədən düzəldərik. Dəmir barmaqlıqları çıxarıb götürərik, qaranlıq, rütubətli otaqlara pəncərə açarıq. Burada yetim uşaqları sə-nətə öyrədərik... Axı, yeni Təbrizdə iş bacarmayan avara bir adam olmamalıdır!..".

Məktubun bu yerində qələm sürüşüb əlindən düşdü. Güləbətini yenidən yuxu apardı... yenidən röyalar görməyə başladı.

## HƏYAT

Səhərisi yuxudan duranda, Güləbətin harada olduğunu birdən-birə müəyyən edə bilmədi. Gözünə dəyən şeylər adi şeylər idimi? Dəhlizin sarı rəngli pəncərə şüşələri hər gün gördüyü şüşələrdimi? Hələ həyatın ağır yükü altında yorulmamış, təmiz uşaq hafizəsi gecə gör-düyü sehrli, cazibədar yuxunu bütün təfərrüatı ilə saf bir güzgü kimi əks edib saxlamışdı və indi Güləbətinin şüuruna bir həqiqət, bir ger-çəklik kimi təqdim edirdi. Buna görə də çaşıb qalmışdı, birmirdi, yuxuda gördüyü və hafizəsinə həkk olunmuş füsunkar, o cazibədar aləm həqiqətdir, yoxsa indi gözünə dəyən bu dumanlı, bu yarıişıq, yarıqaranlıq dəhliz, dəhlizin soyuq küncünə salıb üstünə uzandığı nimdaş yataq, yarısı ağ, yazısı sarı pəncərə şüşələri, şüşələrin dalın-dakı çənə-dumana bürünmüş cansıxıcı boz divarlar?

Birdən-birə üç tərəfdən eşidilən:

– Güləbətin, ay Güləbətin! – sədaları onu qəti olaraq xəyalından, yuxuda gördüyü aləmin mirajından ayırdı. O hiss etdi ki, çox gecdir, artıq ağa da, Böyükxanım da, xanım özü də ayaq üstədir. Bunu hiss etdi və o şirin dünyanın ancaq yuxu, ancaq xəyal olduğuna dəruni təəssüf duyğuları ilə köynəyi əyninə taxıb həyətə çıxdı.

Bu gün hava heç də dünənkinə oxşamırdı. Təbrizin göylərini bu üfüqdən o üfüqə sal buz buludları örtmüşdü. Narın yağış çiləməyə başlayırdı. Havalar soyumağa üz qoymuşdu. Hər gün bir az da artıq çılpaqlaşan ağaclar da deyəsən havaların sərinləşdiyini hiss edirdilər. Göyərçinlərin bunu yaxşıca hiss etdikləri aydın idi. Onlar hovuza yaxın durmurdular. Havaya qalxmırdılar. Yuvalarının ağzında büzüşərək oturmuşdular.

Dünənə görə hava dəyişmişdi, ağaclar dəyişmişdi, quşlar dəyişmişdi. Lakin onların hamısından artıq Güləbətin özü dəyişmişdi. İndi o, dünyaya tamamilə başqa gözlə baxırdı. Ona elə gəlirdi ki, bir gecədə o qədər böyümüş, o qədər yaşa dolmuşdur ki, indi heç kəsin ona uşaq deməyə haqqı yoxdu. İndi o, çox böyüklərin bilmədiyini bilir, görmədiyini görür. O bilir həyat necə pisdir, nə gecə yaxşı ola bilər! O bilir insanlar nə qədər əzab çəkir və necə xoşbəxt ola bilərlər. O bilir gözəl Təbriz işsizlərlə, gecə-gündüz ehtiyacın əlində çapalayanlarla doludur, halbuki o milyonları doyura bilər, geydirə bilər. O bilir necə qüdrətli əllər işsizlikdən keyiyib qalıblar, halbuki o əllər Təbrizi cənnətə çevirə bilərlər. O bilir...

Yenə üç tərəfdən sədalar eşidildi:

– Güləbətin, ay Güləbətin! Gəl gör bu cücü nədir, girib yorğanıma?

– Güləbətin, ay Güləbətin! Bircə dəqiqə bu düyməni tik, danışgaha gecikirəm!

– Güləbətin, ay Güləbətin! Tez özünü bura yetir.

Belə hallarda, adətən, Güləbətin maşın kimi cəld tərpənər, fikrən ayaq üstəcə birinci növbədə hara qaçmaq lazım gəldiyini müəyyən edər və tez ora cumardı. Bu adətə əsasən ani fikirdən sonra Hacının otağına yollandı. Belə düşündü ki, yatağına cücü girdiyi üçün tez ayılmış Kiçikxanım gözləyə də bilər. İlan olmayacaq, əqrəb olmayacaq, çalıb öldürsün. Görəsən pərvanədir, nədir, gecə işığa uçub gəlib – heç şey eləməz. Böyükxanım da danışgaha tələsirsə, başqa köynək geysin, nə çox yaxalı ağ köynəyi. Elə hökm deyil ki, bu sarı düyməlini geyə. Bir də ki, onun yanına gec də getsən eybi yoxdur, nə qədər tələsik işi

olsa acıqlanan deyil, bir az gileyli gözlə üzünə baxacaq, vəssalam. Amma Hacı başqa şeydir, xüsusən bu son günlər!.. Bircə dəqiqə gec getdin, bir kitablıq söhbət açacaq. “Bu evdə mən kiməm? Bu evdə mənə qiymət verən yoxdur, hərə öz kefindədir, böyük-kiçik bilinmir!”. Nə bilim daha nələr deyəcək. Xanımın gözü qabağında dilinə kobud söz gətirməyəcək, xanım olmayanda isə...

Güləbətin fikrini tamamlamamış Hacının qabağında durmuşdu. Onun üzünə baxan kimi bildi ki, fikirlidir. Hacı fikirli olanda hara isə baxıb gözlərini qıyardı. Dodaqları tərpənərdi, ancaq qabağında duran adamı görməzdi. “Elə bir kordur, üzümə baxır, amma özümü görmür!”– deyə Güləbətin düşündü və yavaşca soruşdu:

– Ata, nə buyururduz?

Hacını elə bil ki, yuxudan ayıltdılar, diksindi. Gözlərini ovuşdurub, təzədən Güləbətinə baxdı:

– Heç bilirəm ki, nə buyuracaqdım! – deyib öz-özünə danışdı. – Gədə məni elə çaşdırıb ki, huşum da başımdan çıxıb. Heç şey yadımda qalmır, gərək özümü bir həkimə göstərim.

Hacı yenə gözlərini qıyıb haralara isə dikdi və fikrə getdi. Yenə Güləbətini görmürdü. Hətta onu çağırdığını da unutmuşdu. Hacının öz-özünə danışmasından Güləbətin belə anladı ki, havaxt isə ya gecəyarısı, ya da səhər sübhdən Şahpələng gəlib evə, Hacı ilə sözləşib; nə üstdə ola bilər? Nə üstə olacaq – ancaq pul üstdə! Özü də yəqin çox istəyib. Əlli tümənə qədər olanda anasından istərdi. Əllidən aşanda Hacıya müraciət etməli idi. Hacıdan da pul istəyəndə elə bil ətini kəsirsən!..

Güləbətin bir də dedi:

– Ağa, mənnən işin yoxsa, gedim işimə.

Hacı dik atıldı, elə bil ki, yuxuya getmiş tiryəkçi qəfil səs eşitdi.

– Necə yəni işim yoxdur?! Al bu zərfi, apar ver badamçıoğluna, dur yanında, cavabını yazsın, gətir.

Güləbətin balaca ağ zərfi aldı və istədi icazə alıb çaydan sonra getsin. Lakin Hacının acığı tutacağından qorxub tərəddüdlə ona baxdı:

– Durma, tərpən! – deyib Hacı tələsdirəndə başına təzə fikir gəldi: “Gedərəm, yolüstü anamgilə də dəyərəm. Evimiz yolun ağzındadır. Çayı da orda içərəm”.

Dönüb getmək istəyəndə bir də gözü Hacıya sataşdı. Hacı yumşaq kresloda yayılıb oturmuşdu. Ayaqlarını geniş açmış, iki əlini də

sinəsində çarpazlamışdı. Sağ ayağındakı qara ayaqqabının dabanını yerə qoyub pəncəsini qaldıraraq oynadırdı. Gözünü ayaqqabının burnuna zilləyib özündən razı halda fikrə getmişdi. Simasındakı bir an əvvəlki narazılıq və şikayəti kobud, cahil bir təkəbbür əvəz etmişdi. Bu halında o Güləbətinə o qədər xoşagəlməz və iyrənc göründü ki, onu sancmaq, əsəbiləşdirmək istədi, anadan olandan bir saniyə də aclıq nə olduğunu bilməyən toxlara məxsus heyvani təkəbbürünü dağıtmaq həvəsi oyandı.

– Bağışlayın, ağa, – dedi, – bilmədim zərfi kimə verim?

– Kor deyilsən ki, üstündə yazılıb! – deyə Hacı at kimi fınxırdı.

– Xəttinizi oxuya bilmirəm, ağa, – deyib Güləbətin artıq evdə oxumaq bildiyinin hamıya məlum olduğunu xatırlayaraq tez cavab verdi.

– Xanımın xəttini oxuya bilirsən, mənimkini yox?! Yaxşı bax, oxuyarsan...

Güləbətin özünü itirmədi. Qəsdən höccələməyə başladı. "Bb baba, aa bada.. bada".

– Zəhrimar bbb baba! – deyib Hacı onu yamsıladı və əlavə etdi:– Apar ver badamçıoğluna, bildin? Badamçıoğluna...

– Ağa, birdən badamçıoğlu dükanda olmasa neyləyim?

– Dur gözlə.

Güləbətin tam ciddiyyətlə yenə soruşdu:

– Ağa birdən gec gəldi, onda neyləyim?!

Hacı kresloda qurcalandı, gözünü ayaqqabının burnundan çəkib Güləbətinə baxdı. Onu birinci dəfə görür kimi dikəldi, özünü qabağa verdi, qızı təpədən dırnağa kimi süzdü:

– Başın işləməyə başlayıb, Güləbətin xanım! – dedi və yenə gözləri yaşarana qədər öskürüb dəsmalla ağzını-burnunu silərək əlavə etdi: – Lap axşamacan gəlməsə, dur gözlə.

Güləbətin tamamilə açılışdı, qəribə bir duyğu ilə insan cəmiyyətinin düşünən bir üzvü olaraq özünün Hacıdan üstünlüyünü hiss etdi, əvvəlkindən də artıq bir sadəliklə soruşdu:

– Ağa, birdən heç gəlmədi, onda neyləyim?

– Yıxıl öl! – deyib Hacı bezar olmuş kimi acıqlandı. – Get evlərinə, soruş gör hardadır, yerin altında olsa axtar, tap, zərfi ver, cavabını al gətir, başa düşdün?!

– Düşdüm, ağa! – deyib Güləbətin həyətə çıxdı və qərara aldı ki, getməmiş xanıma bildirsin. Xanım samovarın yanında idi. Balaca güllü

çayniki yaxalayıb qaşıqla içinə çay ataraq samovardan dağ su doldurub dəmləməklə məşğul idi. Güləbətin uzaqdan xanımın bütün bu işi tələsmədən, özünəməxsus səliqə ilə yerinə yetirdiyini görüb ona yaxınlaşdı. Xanım qızın əlindəki zərfi gördü.

– O nədir, Güləbətin? – deyib soruşdu.

Güləbətin hara getdiyini söylədi və hiss etdi ki, xanım qəzəbini zorla boğaraq razılıq verdi. Xanım qəzəblənirdi. Ona görə ki, bu gün ev-eşiyi təmizləmək fikrində idi. Xəstələnib yatandan xalçalar, çırpılmamışdı, qapı-pəncərənin tozu alınmamışdı, havaların soyuması ilə əlaqədar olaraq, yay şeyləri yığışdırılıb, qış şeyləri çıxarılmamış qalırdı və sairə. Görünür, Hacı ilə pisləşmək istəmədiyindən çar-naçar etiraz etmədi.

– Get, nə qədər bacarsan tez qayıt...

Güləbətin həyətdən çıxdı, özü də hiss etdi ki, pörtmüş, narazı halda çıxdı, həm də Hacıdan artıq xanımdan narazı idi. Hacıdan heç bir yaxşı şey ummurdu. Amma xanımın belə rəftarı onun ürəyinə dəydi: “Səhər-səhər acqarına deyirlər get şəhərin o başına, qayıt, heç birinin də yadına düşmür ki, desin, balam, bir stəkan çay iç, ağzına bir tikə çörək al, sonra get!..”. Güləbətin belə düşündüyünə heyrət etdi. Bu fikirlər onun başına hardan gəlir?! Axı, bu günəcən o xanımdan heç vaxt inciməyəcəyini güman edərdi. Məgər dünənəcən belə bir xanımı olduğuna gündə yüz dəfə şükür eləyən o deyildi? Məgər, bu evdə nədənsə narazı olan kimi Şahpələngin həyət qapısından içəri buraxıb “Güləbətin, sənin əkiz tayın yoxdur ki?” – deyə göstərdiyi zavallı dilənçi qız gəlib durmurdu gözünün qabağında və onu hər şeyə dözməyə, taleyi ilə barışmağa vadar etmirdi?! Məgər, elə indi bu saat bu qorxu ortadan çıxıb? Məgər, Təbrizdə ayda onca tümən maaş üçün onun kimi yüzlərlə, minlərlə qızlar bundan da yüzqat artıq zəhmətə, ağırlığa, əziyyətə dözməyə hazır deyillər? Bu fikirlər nə qədər ağır olsa da Güləbətinə əvvəlki kimi vahiməli görünmürdü. Daha artıq bu fikirlərin məhz dilənçi ruhundan doğduğunu hiss edirdi. Axı, o zavallı qızın günahı nədir ki, bir tikə çörək üçün Şahpələng kimilərin qapısını döyməyə məcburdur? Sabah onu daha pis vəziyyətə salmaq olar, elə eləmək olar ki, heç insana oxşamasın, ot-ələf yesin. Bəs onu başqalarına göstərib “bax, gör necə yaşayanlar var!” – demək insafdırmı, insanın ağlı belə ədalətsizliyi, belə zülmü qəbul edərmi? İnsanı ac saxlamaq və ona təsəlli vermək ki, səndən də pis aclar var, nə qədər axmaq və çirkin əməldir!

“Yox, görünür, toxların gözünə dünya başqa cür görünür. Onlar elə bilir ki, toxluq anadangəlmə hüquqları və ləyaqətləridir, başqalarına hökm etmək ixtiyarını onlara verir. Daha bilmirlər ki, toxluq beyinlərini o qədər kütləşdirir ki, bir uşağın da hiss etdiyini hiss etmirlər. Məgər, xanım çox istədiyi böyük qızını demirəm, lap elə o fərsiz kiçik qızını səhər-səhər acqarına evdən çıxıb belə bir işə getməyə qoyardı? O saat saxlayıb deyərdi: “Otur, çörək ye, çay iç, sonra get! Bəs mən, axı, mən də onun kimi adamam. Mənim də onun kimi qarnım var, yemək istəyir, verməyəndə quruldayıb hay salır, ürəyim elə ovulur ki, gözümün qabağında qara kölgələr, xırdaca ulduzlar oynayır...”.

Güləbətin hiss edirdi ki, bütün bu fikirləri nəinki Hacıya, heç xanımın özünə də demək olmaz. Onlar heç birisi onu anlamazlar. Bu fikirlər onları vahiməyə salar və dərhal Güləbətini evdən qovarlar, o bədbəxtlərin içinə atarlar ki, onları göstərib deyərlər: “Bax, özünü yaxşı apar, yoxsa bu kökə düşərsən!”.

Bəs nə etməli? İndiyə kimi yaşadığı kimi pis taleyə boyun əyməli, bədbəxtliyi Allahın xoş bir neməti kimi qəbul edib yaşamalımı? Yox, Güləbətin istəsə də bundan sonra belə yaşaya bilməyəcəkdi. Bircə yol vardı, bu kor mütiliyin daşını atmalı. Bilməlisən ki, bir tikə çörək üçün bu ağır yükü çəkirsən, səni belə yükləyənlərə etiraz edə bilmirsən, amma özünü də aldatma, qoyma nökərçilik hissləri ürəyində yuva salsın. Qoy ruhun məğrur olsun, heç kəsin qabağında əyilməsin, dilənçi payını, nökərə edilən səxavəti yaşayışın qayəsi saymasın!.. Bundan belə Hacı ilə bugünkü kimi rəftar etmək gərək, özünü sadəliyə vurub onu oynatmaq, ələ salmaq, gülmək gərək...

Bu fikirlərlə Güləbətin Şahpur xiyabanından, Şir Xurşid teatrının qabağından və Ərk qalasının yanından keçib yoluna davam edirdi. Səhər tezdən çiləyən yağış çoxdan kəsmişdi. Buludlar dağılmış, yenə Təbrizdə mülayim, xoş işıqlı günəş çıxmışdı. Bir dəstə yurdsuz uşaq Ərk qalasının qalın divarları yanında özlərini günəşə verir, yarıçılpaq bədənlərini qızdırırdılar. Xiyabandan yaxşı geyimli bir adam keçdiyini görəndə onlar yerlərindən qopub adamın qabağına qaçır, əl açıb “ağa, Allah yolunda bir pay ver!” – deyərək yalvarırdılar. Bu uşaqların içində qızlar da vardı. Onlar bəzən əl açdıqları adamın dalına düşüb gedir, bir şey almayınca əl çəkmirdilər. Bəzən də bir-iki dəfə sızıldayıb geri dönür və divarın dibində quru torpağın üstündə oturaraq oynayırdılar. Qəribədir! Güləbətin fikrən, xəyalən həyatlarından bu qədər vahimə-

ləndiyi, yaşayışlarına bu qədər dəhşətlə baxdığı bu uşaqlar bir-birilə oynayır, deyib gülürdülər də. Sanki dilənçilik onlar üçün əyləncə idi. Bu özü də Güləbətinə dəhşətli göründü. "Yazıqlar, heç bilmirlər ki, başqalarına əl açıb dilənmək hara enməkdir, həyatın hansı bataqlığına düşməkdir!" – deyib tez onların yanından ötüb keçdi və daş mağazalardan adlayaraq badamçıoğlunun dükanına gəldi. Badamçı yerində idi. Hacının kağızını aldı, zərfi açıb oxudu və nə isə yazıb bükdü. Başqa bir zərfə qoyub Güləbətinə qaytardı.

Güləbətin evlərinə getməyi qəti qərara aldı. Çoxdandı Həmzəni, anasını, atasını görmürdü. Hiss etdi ki, onlar üçün ürəyi bərk darıxıb. Söhbət edər, üzlərinə doyunca baxar, anasının xırda-xuruş işlərini görüb qayıdar. Bir az geciksə də eyib etməz. Çox olsa deyər ki, badamçıoğlu dükanda yox idi, dayanıb gözləməli oldu. İndi Hacı kimi adamlara yalan deməyə də öz aləmində bəraət qazandırırdı.

## NAMƏLUM ADAM

Güləbətin bir zaman uşaqlara qoşulub siyasilərin, toy mərasiminin və çiynində tabut aparan kədərli, tutqun adamların dalına düşüb getdiyi, uşaqlığını keçirdiyi tozlu-torpaqlı, əyri-üyrü küçəyə çatanda ürəyi qeyri-adi həyəcanla döyünməyə başladı. Ona elə gəldi ki, o zamandan əlli il, yüz il keçib və o günlər o qədər uzaqlarda qalıb ki, adama kədərli, qüssəli bir nağıl kimi gəlir.

Küçənin hər iki əli birmərtəbəli evlər idi. Ara-sıra ikimərtəbəlilərə də rast gəlmək olurdu. Evlərin çoxu çiy kərpicdən və ya saman qarışıq boz palçıqdan tikilmişdi. Əksəriyyətinin dal tərəfi küçəyə çıxırdı və bir dənə də pəncərəsi yox idi. Buna görə də küçə uzunu baxanda adama elə gəlirdi ki, hər iki əl boz palçıq divardan ibarətdir. Balaca, dar həyətlərə açılan taxta qapılar və darvazaların bəzisi açıq, bəzisi də kül kimi qara rəngli ilə divardan seçilirdi. Ayrı-ayrı evlərin pəncərələri isə bu boz divarlarda yaraşıqlı naxış kimi görünürdü... Güləbətinin həyəcanları yatmamış, ətrafa nəzər saldıqca oyanan dağınıq fikirlərini bir yerə yığmamış öz evlərinə yaxınlaşdığını hiss etdi. "Nə tez?!" – deyərək dönüb dala baxdı. Heyrət etməlidir! Sanki küçə sıxılmış, gödəlmiş, daralaraq balacalanmışdı. Hafizəsində isə böyük, enli bir küçə kimi yaşayırdı. Uşaqlıqda Güləbətin çox zaman

təkbaşına bu küçəni başacan getməyə cəsarət etməzdi... İndi küçə əvvəlki yaraşığını da itirmiş kimi idi. Divarlar çox yerdən sökülmüşdü, evlərin əhəngi qopub düşmüşdü. Bəzilərinin isə ora-burasındakı ağ ləkələr Nuh əyyamında əhəng gördüklərini deyirdi... Əlbəttə, bu küçə hara, bu evlər hara, Hacıgilin düz uzanıb gedən, yan-yana iki maşın sığışacaq daş döşəməli, asfalt səkili və o əl-bu əl qələmə ağaclar sıralanan küçəsi hara! Oradakı qırmızı kərpicdən, ya daşdan tikilmiş qoşa pəncərəli, əksəriyyəti ikimərtəbəli, bağlı-bağatlı evlər hara, bu boz, pəncərəsiz daxmalar hara?! Buna baxmayaraq burada Güləbətin qəribə bir doğmalıq hiss edir, ürəyi dəruni bir sevinclə döyünürdü. Bu sevincdə gizli bir kədər, həsrət və təəssüf olsa da, çox xoş idi.

Qabaqda küçə əyilərək sola burulan yerdə Güləbətinin gözünə bir dəstə uşaq dəydi. İçlərində həm qız, həm də oğlan vardı. Ayağı dolaşa-dolaşa yeriyən iki-üç yaşlılar da, on üç-on dörd yaşına qədər olanlar da. Bəzisi ayaqyalın, başıaçıq idi. Bəzisinin əynində pisdən-yaxşıdan köynək-tuman və hətta ayağında çust da vardı. Yenə nəyinsə dalına düşüb gedirdilər. Mərasim döngəni burulmuş olduğundan, ancaq axıra qalanları göründüyündən Güləbətin bilmədi ki, siyasi aparırlar, yoxsa meyit. Əlbəttə, toy mərasimi deyildi. Çünki nə çalğı səsi gəlirdi, nə də deyib-gülən vardı. Bir də ki, şirni içməkdən tutmuş, gəlin köçürməyə qədər bütün toy mərasimi ilkindidən sonra – axşamçağı olardı.

Güləbətin balaca taxta qapıya yaxınlaşıb dayandı. Yarıaçıq qapıdan qulağını həyətə zillədi. Heç bir hənirti eşidilmirdi. Uşaq səsi də gəlmirdi. Deməli, bütün qonşu uşaqları mərasimin dalınca gediblər. Qapı yarıaçıq idi. Güləbətin onun taxtalarından birinin qopub ortadan yuxarı hissəsinin sındığına diqqət etdi. “Sevindik olsaydı, çoxdan qayırmışdı!” – deyib düşündü və içəri girdi. Dördkünc balaca həyətin sol əlindəki mənzilin qapısı bağlı idi. Balaca girdə qıfıl vurulmuşdu. Birgözlü bu mənzildə öz oğlan nəvəsi ilə Gülsüm adlı bir qarı olurdu. Nəvəsi şofer idi və ömrünün çoxunu Təbrizlə başqa şəhərlər arasında yük, yaxud adam daşımaqla keçirirdi. Gülsüm xala da yəqin bazara getmişdi. O biri ikigözlü mənzildə yeddi baş külfəti olan Fərhad əmi yaşayırdı. O, gön karxanasında işləyirdi. Arvadı isə uşaqlarını Güləbətinlə həmyaşıd olan qızının ixtiyarına buraxıb bütün günü xalça karxanasında keçirirdi. Yaxşı əli vardı, özü də gözəl mahnılar oxuyardı. Güləbətingil onlarla qapı və divarbir qonşu idilər. Güləbətin öz evlərinin qapısını açıq görüb sevindi. “Deməli, ya dədəm, ya nənəm evdədir. İkisindən birini görə-

cəyəm, bəlkə ikisini də!” Əvvəlcə istədi səssizcə içəri girsin. Lakin hansı bir duyğu isə qoymadı. Əvvəla xanım öyrətmişdi ki, heç vaxt qapını döyməmiş girməzlər, lap doğma anan da olsa, Güləbətin artıq buna adət etmişdi. İkinci də düşündü ki, lapdan girərəm nənəmgil qorxar, elə bilərlər ki, iraq candan, bir bədbəxtlik üz verib.

– Nənə! – deyib həzindən çağırdı.

Anası Narıncı dərhal onu tanıdı və başını çölə çıxartdı:

– Can nənə! Nənən sənə qurban!– deyib tələsik çirməkli yaş qollarını bir parça əsgi ilə silərək özünü Güləbətinin üstünə atdı, qucaqlayıb bağrına basdı, üz-gözündən öpdü. Bir anda Güləbətinə elə gəldi ki, ana qucağının hərarətinə, istiliyinə möhtac olan körpə uşaqdır. Bu istilik üçün necə də ürəyi darıxıb! Buğ və sabun iyi verən anasının boynuna sarıldı və elə o dəqiqə düşündü ki, yəqin nənəm paltar yuyur, özüm yuyaram, sonra çıxıb gedərəm. Ana isə onu hələ də qoynuna sıxaraq deyirdi:

– Qədəmlərinə qurban olum, Gülü, nə yaxşı gəlmisən! Gecə elə qarmaqarışıq yuxular görmüşəm ki! – Birdən qızın çiyinlərindən tutub özündən uzaqlaşdırdı və narahat gözlərlə üzünə baxdı, – bir şey yoxdur ki?!

Güləbətin onun səsindəki qorxu və təşvişi duyub dərhal sakit etməyə çalışdı:

– Heç şey yoxdur, nənə. Yolum bu yana düşmüşdü, dedim sizə baş çəkim, gedərəm.

– Lap yaxşı eləmisən, mənim gül balam, keç, keç içəri, atanın da gözünə görün, bir az kefsizləyib...

İndi də Güləbətinin gözlərində narahat kölgələr oynadı. Tez dönüb içəri girmək istəyəndə astanada arıq, uzunboylu atası ilə qarşılaşdı və “salam, dədə” deyib onun qucağına qısıldı. Namaz kimi taxta kimi quru əlləri ilə qızının başını qucaqlayıb alnından öpdü və diqqətlə üzünə baxdı.

– Maşallah, yekə qız olmusan! – dedi, – şükür Allaha, gözümə də yaxşı dəyirsən. Allah səni xoşbəxt eləsin!

Güləbətin atasının səsini tanıya bilmədi. Bu səs nə qədər zəifləmişdi, dünya ilə haqq-hesabını qurtarmış və birdəfəlik ondan ayrılmağa hazır olan adamın səsini andırırdı. Bu ağır hissin təsirilə Güləbətin artıq budağında şirələnib yetişən gilənar kimi qara gözləri ilə atasını süzdü: kişi sanki təkcə sümükdən yonulmuş bir heykəl idi.

Güləbətin gözünü kənara çəkdi, lakin heykəl çəkilmədi. O, qızın gözlərində donub qalmışdı.

– Dədə, nəyindir? – deyib soruşdu.

– Bekara şeydir, qızım! – dedi, – mən lap gümraham. Nənənin dediyinə baxma, əlli ildir onun gözünə naxoş görünürəm. Siz yaxşı olun, mən keçinərəm... Sən lap yaxşısanmı?

– Lap yaxşıyam, dədə. Məndən heç nigaran olmayın!..

– Bəsdir, ayaq üstə durdun. Keç uzan yerində, – deyib anası Namaz kişinin qoluna toxundu, – qoy mən də işimi görüm.

Güləbətin ancaq indi otaqla həyətin arasındakı balaca qaranlıq artırmadakı taxta kürsünü, üstündəki sabunlanmış paltarla dolu tası, yanındakı isti su buğlanan iri qazanı, yerdəki yuyulmamış paltarları gördü:

– Nənə, qoy mən yuyum, sən dədəmi rahatla! – dedi.

– Yox, sənə qurban olum, qoymaram. Sən gəl otur, özüm yuyaram! – deyib Narınc arvad Güləbətinə küncdəki köhnə kilimin qırağında, atasının yatağı yanında yer göstərdi. – Otur, qadan ürəyimə...

Lakin Güləbətin oturmadı. Uzunsov balaca otağa göz gəzdirdi. Bilmək istəyirdi, anasına nə kömək edə bilər, görməli nə iş var. Bunu hiss edən anası:

– Əliboş otura bilmirsən, hə, sənə qurban olum? Onda götür dədənin o alt köynəyinin qolunu təpçi...

Güləbətin yastığın altındakı ağ bez köynəyi, anasının sarı taxta qutusundan iynə, sap və üskük götürdü. Bardaş qurub yerdə atasının ayağı tərəfdə oturdu və köhnə köynəyi təpçiməyə başladı. Ancaq indi bərk acdığını, ürəyinin ovulduğunu hiss etdi. Lakin aclığını bildirmədi. Əgər evdə bir şey olsaydı, anası özü yemək təklif edərdi.

– Həmzə necədir, nənə, işləri yaxşıdırmı? – deyib soruşdu.

– Allaha şükür, qızım. Yaxşıdır! – deyib anası cavab verdi. Güləbətin isə gözünü ona dikib verilməmiş suala cavab gözləyirdi. Ana onun gözlərindəki sualı oxudu, başını bulayıb dedi ki, heç bir xəbər yoxdur. Onlar atanın yanında Sevindik barədə ancaq beləcə dilsiz-sözsüz danışırdılar... Çünki onun adı gələndə kişinin yarasının közü qopurdu. Əl-ayağı əsməyə başlayır, rəngi kağız rənginə dönürdü. "Nər kimi oğul, işləyən vaxtı, ata-ananın hayına çatan vaxtı dustaqxana küncündə yatıb qalıb. O vaxt buraxacaqlar ki, özünün hayına yetən gərək, iti xəncəri torpağa basdır, bir il sonra çıxart, nə olar? Dönüb

olar kəsərsiz dəmir parçası... Yüz dəfə dedim, getmə bu yola... Xeyir görən olmayıb, baxmadı sözümə...” – deyib hey öz-özünə heyifsilənər, deyinər, yanıb-tökülərdi... Güləbətinin Həmzə barədə sualına ananın cavabını kifayət hesab etməyən ata dedi:

– Çox yaxşıdır, qızım. Bundan da yaxşı olacaq. Lap mən deyən oğlandır. Bərk yapışıb sənətindən, əlindən nə desən gəlir...

Həmzə barədə danışdıqca kişinin gözləri işıqlanırdı. Güləbətin bunun səbəbini bilirdi: Sevindik dustaqxanaya düşəndən sonra Həmzə bir müddət qaynayıb coşdu, kimlərinsə dalınca danışdı, hədələdi, söydü, sanki gözəgörünməz yüzbaşlı bir əjdaha haqqında danışırdı ki, bütün bədbəxliklərin səbəbi odur. Lakin bu açıq qəzəb bir qızdırma kimi keçdi. Qızdırma zamanı sayıqlayan adam qızdırması kəsəndə necə yorğun, əzgin, lal-dinməz düşərsə, Həmzə də bir müddət sonra susdu, saatlarla danışmadı, key kimi olub qaldı. İşlədiyi xalça karxanasında isə ondan razılıq eləməyə başladılar. – “Belə səykar, belə fərasətli adam olmaz, fikri-zikri işdədir, sənətindədir. Çox keçməz Təbrizdə birinci fərş toxuyan olar!” – deyib üzünə də, dalınca da eyni hərarətlə tərifləyirdilər. Həmzə isə bu tariflərə də biganə kimi idi. Fikrini ancaq işə vermişdi. Atası bundan çox razı idi. Arxayın idi ki, heç olmazsa elə iş görməyəcək ki, Sevindiyin gününə düşsün... Karxanada söz vermişdilər ki, yaxın zamanda maaşını da artıracaqlar... Daha nə istəyirsən, əlinin sənəti, yaxşı maaşın... nə qədər nəfəsin var işlə, yaşa... Bir adam da sənə güldən ağır söz deyə bilməsin! Namaz kişi üçün ideal həyat bu idi...

Əlbəttə, Güləbətin çox razı idi ki, kiçik qardaşı karxanada yaxşı ad çıxarıb. Sənətində irəli gedir. Heç olmasa öz atasına bu qoca vaxtında sevinc və təsəlli gətirir. Güləbətinin ürəyində ona qarşı sıcaq bir məhəbbət yaşayırdı, onu elə sevirdi, necə ki, mehriban bacı öz yaxşı qardaşını sevə bilər. Amma Sevindik Güləbətinin nəzərində başqa şey idi. Əlçatmaz bir qəhrəman idi, elə qəhrəman idi ki, onun fikirləri, düşüncəsi bir tül pərdə ilə örtülmüşdü. Güləbətinin nəzərində qəribə, ecazkar sirlərlə dolu idi.

Güləbətin köynəyi təpçiyib yerinə qoyaraq anasına kömək edirdi: yuyulmuş paltarları suya çəkib həyətin ortasından asılmış ipə sərirdi. Paltarı yuyub qurtaranda ananın ürəyinə birdən qəribə bir həvəs gəldi, Güləbətinə, xüsusi hörmət və məhəbbət göstərmək istəyərək onu samovar çayına qonaq etməyi qərara aldı:

– Ay Namaz, – dedi, – istəyirəm çay hazırlayam, Güləbətin balaya samovar çayı verəm. Sən də səhərdən çay içməmisən, yığışaq samovarın başına.

– Savab iş görərsən! – deyib Namaz güclə eşidilən səslə yerindən cavab verdi, – kömürün varmı?

– Taparam! – deyib Narınc balaca, ağ samovarı, yükün yanındakı küncdən gətirib həvəslə tozunu siləndə Güləbətin ata evindəki məhəbbətdən ürəyi riqqətə gəlmiş halda anasına baxdı. Baxdı və ürəyinə elə bil iynə batırdılar: aman Allah, anası nə qədər qocalmışdı. Saçları dümağ idi. Beli xeyli əyilmişdi, sümüyü çıxmış əllərinin dərisi qırış-qırış olmuşdu.

– Nənə, sən bir az dincəl, mən özüm samovara od salaram! – deyib işə başladı.

...Balaca güllü çaynikə çay atıb dağ su ilə dolduraraq dəm almaq üçün samovarın üstünə təzəcə qoymuşdu, lap qapılarının ağzında hökmlü bir qadın səsi eşitdi:

– Narınc, ay Narınc! Evdəsən?

Arvad səsindən artıq davakar, hərzə kişi səsinə oxşayan bu səs Güləbətinə çox pis təsir etdi, dönüb baxanda gözlərinə inanmadı. Qarşısında xırdavatçı qızı Səlmi xanım durmuşdu.

Güləbətin hələ evlərində olanda Səlmi xanımın bacarıqlı bir dəllala ərə getdiyini eşitmişdi. Bir az sonra bu dəllal özü mülk saxlamağa başlamışdı. Əvvəl – bir, sonra – iki, sonra – üç... onların kirayə xərci ilə bollu pul qazandığını deyirdilər. Bir il əvvəl Güləbətingil olan evi də sahibindən satın alaraq öz əlinə keçirmişdi. İndi Səlmi xanım şəhərdə dəllallar cərgəsindən adlı-sanlı varlılar cərgəsinə keçməkdə olan bir adamın xanımı idi. Güləbətin onu son dörd ildə bir dəfə də görməmişdi. Əvvəllər o yaraşıqlı bir qadındı. İndi isə ətlik qısır inəklər kimi şişib kökəlmişdi. Eni ilə uzunu bir olmuşdu. Buxağından iki barmaq ət sallanırdı. Bədəninə münasib xasiyyəti də, səsi də dəyişmişdi. İri qara gözləri adama elə baxırdı, elə bil deyirdi: "Parçalayıb yeyərəm ha!..". Bu pis təəssürata baxmayaraq Güləbətin hörmətlə salam verdi. Səlmi xanım ona gözucu baxdı, salamı isə sanki eşitmədi.

– Nənən hanı, ay qız?! – Maşallah nə böyümüsən, lap ərə getməli olmusan ha! – deyib Güləbətinə yox, heyrət dolu gözlərlə pıqqıldayan samovara baxdı. Üz-gözündən Səlminin gəlişinin heç də xoş olmadığını bilən Narınc onun qabağına çıxdı.

– Buyur içəri, Səlmi xanım, çay iç!

– Bəxtəvər, samovar qoymusan ki! – deyib Səlmi təşəkkür əvəzinə istehza və paxıllığın qarışdığı acı bir duyğu ilə cavab verdi və ayaq üstəcə əlavə etdi: – Ev kirayəsi üçün gəlmişəm. Bu gün üç ay tamam olur. Kişi deyir ki, axı, bizim də min xərcimiz-borcumuz var...

Güləbətinə elə gəldi ki, qabağında duraraq, az qala, həyətin yarısını tutan Səlmi xanım adam deyil, acı zəhərli sözlər püskürən bir vulkandır. Nə dediyini, ağzından çıxan sözlərin ox kimi adamın sinəsini deşdiyini nə duyur, nə düşünür. Elə hey danışır, danışır, içərisindəki tükənməz söz lavasını çölə atır. Əgər danışmasa bu söz lavası onu çatladar... Vulkan bircə anlığa nəfəs alıb, yenə püskürdü:

– Balam, göydən gəlməmisiniz ki, Allaha şükür, Təbrizdə yaşayırsınız, bilirsiniz ki, ev tapmaq çörək tapmaqdan çətindir. Kirayəsini verə bilmirsiniz, çıxın gedin, cibinizə layiq yer tapın. Nə çox növbədə durub gözləyən!..

Güləbətin baxdı ki, anası fürsət gözləyir, gözləyir ki, Səlmi arvad macal versin, o da sözünü desin. Güləbətingilin ailəsində danışanın sözünü kəsmək ədəbsizlik hesab olunardı. Lakin Səlmi arvad ucunu alıb ucuzluğa getmişdi və qurtarmaq fikri yox idi. Buna görə də dilindəki cümləni qurtarıb nəfəs alan kimi Narınc fürsətdən istifadə etdi:

– Səlmi xanım, niyə elə deyirsiniz, iyirmi ildir biz bu evdə yaşayırıq, hara çıxıb gedəcəyik? İndi əlimiz bir az aşağıdır, belə olmaz, tezliklə düzəldib verərik.

Anası danışarkən Güləbətin Səlmi xanımın qeyri-adi dərəcədə böyümüş və pis bir fikirlə oynayan gözlərini öz simasında hiss etdi. Hiss etdi ki, onun baxışları üzü aşağı süzülüb bütün bədənini pis bir alovla qarsır:

– Sən niyə pulsuzluqdan şikayət edirsən! – deyə vulkanın ağzı açıldı. Hər şeyi yandıran, saqqız kimi qatı qaynar palçıq buğlana-buğlana axıb gəlməyə başladı. – Belə qızı olan da pulsuzluqdan şikayətlənər!? Odur ey Fəhmi xanım birillik maaşını əvvəlcədən sayar ovcuna...

Fəhmi xanım adını eşidəndə həyətdə nə isə qeyri-adi bir hadisə baş verdi: elə bil ki, Narınc arvadın başına bir verdə qaynar su töküb pöşlədilər. O əlini atıb qapının ağzındakı xəkəndazı götürdü və qaldırıb Səlmi xanımın təpəsinə endirdi. Səlmi yana çəkilməsəydi, yəqin ki, başında qoz boyda şiş əmələ gələcəkdi.

– Fəhmi xanım, dəllal qızlarının müştərisidir, mənim yox! – deyib nəfəsi darıxmış halda əlavə etdi.

Bütün bu mənzərəni Güləbətin key halda lal-dinməz duraraq seyr edirdi. Çünki Səlmi xanımın gözlənilmədən ağlagəlməz bir həyasızlıqla Təbrizdəki əxlaqsızlıq evlərindən birinin sahibi Fəhmi xanımın adını çəkməsi qızı tamamilə sarsıtmışdı. Lakin zərbənin gözlənilməzliyindən doğan bu ani sarsıntı keçən kimi Güləbətinin sinəsində anasınınkından da dəhşətli bir qəzəb coşub qaynadı!

– O cür evlər sizin yerinizdir, çıxın! – deyib əlini qaldıraraq qapını göstərdi.

Səlmi xanım qıpqırmızı qızarıb bir az da şişmişdi:

– Yaxşı, qalsın qoca qulluğunda, Narınc xanım! – deyib döndü və getmək istədi.

– Dayanın, getməyin Səlmi xanım! – deyib orta yaşlarında, olduqca avropasayağı geyinmiş, əlində əsa, qolunda sarı payız paltosu, başında silindr olan bir ağa onun qabağını kəsdi. Bu naməlum adamın qiymətli qara şaldan kostyumu, qara lak tufliləri, son dərəcə incə, mədəni hərəkətləri və rəftarı ilə bu kasıb həyət, buradakı şərait və adamlar arasındakı ziddiyyəti bəlkə də çətin təsəvvür etmək olar. Səlmi xanım da, Güləbətin və anası da onun qarşısında çaşıb qalmışdılar. Güləbətin və anası boğuq, tutqun halda dayanaraq bir az əvvəlki qəzəbli qürurlarını saxladıqları halda Səlmi xanım ağanın bircə görkəmi qarşısında dərhal dəyişərək yağ kimi əriməyə başlamışdı.

Naməlum adam ağayana hərəkətlə, tələsmədən qoltuq cibindən böyük bir portmanat çıxartdı. Oradakı qatı açılmamış təptəzə on tümənliklərdən iyirmi dörd dənə sayıb ayırdı və Səlmi xanıma uzatdı.

– Buyurun Səlmi xanım, birillik ev kirayəsini əvvəlcədən alın! – deyib pulu gözləri kəlləsinə çıxmış, bir an əvvəlki təhqirləri dərhal unutmuş Səlmi xanımın ovcuna basaraq Güləbətinin anasına dönüb əlavə etdi. – Mən Tehrandan gəlmişəm, xanım, siz məni tanımırsınız. Ancaq mən sizi yaxşı tanıyıram. Siz rəhmətlik Haşım kişinin qızısınız. Mənim atam tacirdir, bir zaman əli aşağı olanda sizin atanız Haşım kişi öz Kaşan xalısını ona verib, o da satıb və özünə maya düzəldib. Bizim indiki varidazımız həmin o xalının pulundan yaranıb. Atam öləndə vəsiyyət elədi ki, harda olsa sizi tapam, borcunuzdan çıxam və halallıq istəyəm. Oturmağa icazə verirsinizmi?

– Buyurun! – deyib bütün bu söhbəti də əhvalatları hələ də nağıl bilən, yuxu bilən Narınc onu içəri dəvət etdi. Naməlum adam daxil olmamış Səlmi xanıma döndü:

– Dünyada belə şeylər çox olur, xanım, təəccüb etməyin. İndi isə ya buyurun bizimlə bir stəkan çay için, ya da bizə icazə verin.

– Nuş olsun, siz çayınızı için, məni bağışlayın, gedim! – deyib Səlmi xanım elə danışırdı, elə bil söz tapa bilmirdi, vulkan soyuyub kəsilmişdi.

O, həyətdən çıxan kimi naməlum adam Güləbətinə həyət qapısını bağlamaq işarəsi verdi və yavaşcadan son dərəcə işgüzar bir səslə dedi:

– Narınc xala, mən, doğrudan da, Tehrandan gəlmişəm. Ancaq nə tacirəm, nə də tacir oğlu. Mən Sevindiyin yoldaşıyam. Heç narahat olmayın. Sağ-salamatdır. Təbrizdə işim var, gəlmişəm. Sizə baş çəkməyi özümə borc bildim.

Artıq bu zaman Namaz kişi də durub yorğanı çiyninə salaraq həyətə çıxmışdı, naməlum adama baxırdı. Sevindikdən xəbər gətirən bu adamı işıqlanmış gözləri ilə yeyən Narınc hələ də çaş halda:

– Çox sağ ol, bala, – dedi – keç içəri bir stəkan çay iç. Güləbətin, qızım, samovara kömür at, yəqin soyuyub.

Güləbətin yerindən qopmaq istəyəndə naməlum adam böyük bir məhəbbətlə onun qolundan tutub saxladı:

– Güləbətin budur, hə? Sevindiyin sənə ayrıca salamı var. Deyir yadından çıxmasın, hər gün kitab oxusun, – deyib yenə anaya döndü – artıq mən getməliyəm, Narınc xala, Namaz əmi, gecikə bilmərəm. Səlmi xanım indi aləmə car çəkəcək. Bir az sonra əri də, qonum-qonşu da bura töküləcək, nə soruşsalar deyin ki, bilmirik, Haşım kişinin borcunu verib getdi. – O, bir neçə on tümənliyi qaranlıq artırmada kətilin üstünə qoydu. – Hələlik... salamat qalın!..

Güləbətin ancaq indi, Sevindikdən xəbər gətirmiş, Sevindiyin dostu və yoldaşı olan bu adamın çıxıb getmək istədiyi dəqiqədə yuxudan ayılan kimi oldu:

– Bəs Sevindik mənə kağız yazmayıb?

– Hələlik çətindir, bacım, – deyib naməlum adam gülümsədi, – gələn dəfə kağız da yazar, hələlik...

O həyət qapısına tərəf dönəndə ana qabağa yeridi:

– Ay oğul, heç olmasa adını, yerini-yurdunu biləydik.

– Nə mənası var, Narınc xala. Sizə onun bir xeyri olmaz. Bizə isə zərər gətirə bilər. O da kifayətdir ki, mən sizi tapdım. Yenə gələcəyəm, birdəfəlik ki, ayrılmırıq.

Naməlum adam qəflətən gəldiyi kimi qəflətən də yox oldu. Güləbətinin və anasının gözlərində böyük bir sevinc və ümidin qığılcımları oynadığı halda, Namaz kişi qorxu, vahimə və şübhə içində başını bulayıb içəri çəkildi.

Günlər hiss olunmadan gəlib keçirdi. Əvvəllər Güləbətinə elə gələrdi ki, onlar hamısı bir-birinə oxşayır, biri o birindən bir az şad gəlir, ya da bir az kədərli. İndi isə onun nəzərində günlər başqa məna kəsb etmişdi. Əlbəttə, Hacının evində, doğrudan da, onun üçün günlər hamısı bir-birinə bənzəyirdi, bir-birinin eyni idi: səhər tezdən durmaq, həyət-bacanı süpürmək, samovar qoymaq, bazara getmək, paltar yumaq, xanımın müxtəlif göstərişlərini yerinə yetirmək, axşam da yorğun-arğın dəhlizə çəkilərək bir az yazmaq, bir az oxumaq, bir az xəyallara qapılmaq, nəhayət, yatmaq – hər gün də belə... Lakin zamanın çarxı hərləndikcə, Güləbətin yaşa dolduqca, bütün bunlar ancaq onun əllərinin, qollarının, ayaqlarının, əzələlərinin işinə çevrilirdi. Fikri, şüuru isə bunlarla kifayətlənmirdi, həyətin dörd divarı arasından kənarlara boylanırdı. Göylərə baxırdı, qonum-qonşuya diqqət edirdi, güclü küləklərin haralardansa qovub gətirdiyi tamamilə başqa ölkələrin havasını udurdu. Zamanın bu havasında gözəgörünməz nələr vardı!

Onlar Güləbətinin fikrinə qida verirdi, hər gün təkrar olunan işini zahirən sakitcə və səliqə ilə yerinə yetirsə də, daxilən narahat duyğularla yaşayırdı. Beləliklə də günlər yeknəsəq ahəngini itirir, başqa məna ilə dolurdu. Xüsusən bizə məlum olan əcaib yuxusundan və ondan da əcaib naməlum adamla görüşündən sonra fikirli olmuşdu. Gözləri insanlara və dünyaya qarşı sönməz bir maraqla qaynayırdı.

Günlərin dayanmaz axını içində payız çıxmış, qış gələrək Təbrizin bağlarına, dağlarına bollu qar-yağış töküb getmişdi. Axırıncı çərşənbə idi. Şəhər ənənəvi təntənə və dəbdəbə ilə Novruz bayramını qarşılamağa hazırlaşırdı. Xanım da kasalarda, boşqablarda səməni cücərdib şirniyyat alıb bayram süfrəsi açmışdı.

Bu günlər Hacı evdə tez-tez görünürdü. Xüsusən axşamçağıları heç yerə çıxmırdı. Güləbətin nə isə son günlər Hacının yanına gəlib gedənlərin artdığını görürdü. Həm də bunların çoxu birinci dəfə idi gəlirdi, əvvəllər qapılarını açmayan adamlar idi, hamısı da görkəmindən tacirə, ərbaba oxşayırdı, hamısı da elə ciddi görünürdü ki, Güləbətin üzlərinə baxmağa da qorxurdu.

– Xanım samovara od salım, yenə ağanın yanına bir dəstə adam gəldi – deyib otağında oturaraq fikrə getmiş xanımdan soruşdu.

– Salamat gəlməsinlər! – deyib xanım suala cavab verdi.

– Xanım, yəqin ağanın ticarəti artıb ki, bu qədər adam gəlib-gedir – deyərək Güləbətin adi bir şeylə maraqlanır kimi soruşdu. Xanım da eyni sadəliklə, lakin Hacıya qarşı istehza dolu səslə dedi:

– Yox, indi ağa başqa sövdaya düşüb... Siyasi olmaq istəyir. Hizb düzəldir. Get, çay hazırla... İndi çağıracaq...

Doğrudan da, azca keçməmiş Hacı başını qapıdan dəhlizə çıxardıb boşluğa qışqırdı:

– Xanım, çay.

Bu iki kəlməni də tələsik deyib otağa çəkildi və oradakı söhbətə qoşuldu. Orada isə bir-birinə macal verməyən qarışıq səslər getdikcə güclənirdi. Xanım bu səslərə işarə edərək:

– Qızışırlar! Kül başınıza, Təbrizi abad edəcəklər! – deyib boğmaladı və bizlərdə bircə kəlmə "çay" sözünün nə qədər geniş mənada işləndiyini yaxşıca bildiyindən kişmiş, xurma, noğul, badam içi, qoz ləpəsi və sair bu kimi bayram şirniyyatı yığdığı xüsusi vazları və boşqabları bir-bir Güləbətinə verib içəri göndərdi. Güləbətin otağa girəndə söhbət lap qızışmışdı. Adamlar hərəsi bir vəziyyətdə oturaraq siqar və çubuq çəkə-çəkə danışdıqlarından otağı tüstü-tütün iyi basmışdı. Onlar bir boşluğa baxar kimi Güləbətinə gözucu nəzər salıb elə dərhal onun varlığını unudaraq söhbətləriən məşğul oldular. Güləbətin tələsmədən səliqə ilə boşqabları balaca dəyirmi stolların üstünə düzməyə başladı. Qulağı isə onlarda idi. Onların danışığından bunu anlaya bildi ki, kimləri isə tutublar və tutulanların şuriş salmaqdan, aranı qarışdırmaqdan, hərc-mərclik törətmək, dünyanı alt-üst etməkdən başqa bir niyyəti yoxdur. Hamısı lat-lütün biridir, dinsiz-imansızdır, Allahsızdır, anasının əmcəyini kəsəndir, buna görə də hamısı boğazdan asılmağa, diri-diri odda yandırılmağa layiqdir!

Güləbətin otaqdan çıxanda qıpqırmızı qızarmışdı. Fikrində bircə şey dolanırdı: ilahi, o adam tutulanların içində olmasın! (Güləbətin naməlum adamı öz aləmində "o adam" adlandırırdı). Hacının adamları axşamdan bir az keçəndə dağılışdılar. Güləbətin qab-qacağı yığışdırıb bir bəhanə ilə Böyükxanımın otağına getməyi qərara aldı. Fikir vermişdi. Böyükxanım şəhərdəki hadisələrdən daha yaxşı xəbərdar olurdu. Onun dedikləri həmişə düz çıxırdı. O, yəqin tutulanların kim olduğunu bilir. "Oxumağa bir kitab istərəm, özü vəd eləyib", – deyə düşündü və yavaşca onun qapısını tıqqıldatdı. Böyükxanım dərhal Güləbətin olduğunu bildi.

– Gəl, Güləbətin! – deyib səslədi.

Güləbətin içəri girəndə o divana dirsəklənərək, nə isə bir kitab oxuyurdu. Görünür, çoxdan bu cür oturub gərgin diqqətlə oxuduğundan gözləri şişən kimi olmuşdu. O başını qaldırıb, dikəldi, gözlərini ovdu.

– Gəl, əyləş görüm nə var, nə yox, Güləbətin, – deyib onu yanına çağırdı. Hal-əhval tutdu, anasını, atasını soruşdu. Güləbətin təşəkkür etdi.

– Dükan-bazarda nə var?

Güləbətin Böyükxanımın nə soruşduğunu yaxşı başa düşürdü. O çox zaman küçədə, bazarda baş verən hadisələr haqqında Güləbətindən soruşardı. Güləbətin də gördüklərini və eşitdiklərini ona nəql edərdi. Lakin indi Güləbətin onun sualına öz düşündüyü mənada cavab verdi:

– Xanım, şəhərdə yaman xəbərlər gəzir. Deyirlər ki, bir dəstə siyasi tutublar. Şuriş salmaq istəyirlərmiş. Sən bir şey eşitməmisən, xanım?

– Sən də belə şeyləri başa düşürsən, Güləbətin? Xatalı şeylərdir ha...

– Mən heç şey qanmıram, xanım, bazarda eşitmişəm, bayaq ağanın yanındakı adamlar da danışırdı. Deyirdilər hamısı dinsizin-imansızın biridir, hamısını dardan asmaq lazımdır...

– Qaragüruhlar!– deyib Böyükxanım kiminsə dalınca söyləndi.

– Onlar pis adamlardır, hə, xanım, siz də siyasiləri deyirsiniz, hə, xanım? – deyib Güləbətin soruşdu.

Xanım Güləbətinin alnına sürüşüb tökülmüş saçını geri qatladı.

– Yox, Güləbətin, mən onları demirəm. Onlar vətənlərini istəyən adamlardır. Fədakar adamlardır. Sən bilirsənmi onlar nə istəyirlər? Eh, Güləbətin, Güləbətin, mən səni necə başa salım. Onlar istəyir ki, biz də qabağa gedək, mədəni xalqlar cərgəsinə çıxaq. Hər yerdə haqq və ədalət olsun. Bax necə deyim, bax, sən o hovuzu görürsən, iki ay, üç ay təmizləməyəndə, təzə su buraxmayanda iylənir, dibində cürbəcür qurdlar əmələ gəlir... Bizim camiə də elədir. Sular dəyişməlidir, təzə hava gəlməlidir. Onlar istəyən olsaydı sən də oxuyardın, sənin kimi minləri də... Hə, Güləbətin, yaxşı yadıma düşdü. Sənə təzə kitab gətirmişəm, özü də ana dilimizdə...

Xanım kitablarının altından balaca, sarı bir kitab çıxartdı, Güləbətinə verdi. Qız kitabı alıb üstünü oxudu. “Heydər babaya salam” yazılmışdı. Çevirib o biri səhifəyə baxdı. Orada qaraqaş, qaragöz, iti baxışlı, ağıllı bir kişinin şəkli vardı. Güləbətinin ona diqqətlə baxdığını görən Böyükxanım dedi:

– Öz şairimizdir, Şəhriyardır. Oxu, çox sadə və gözəl yazıb, oxuyarsan, nə başa düşməsən, soruşarsan, elə ki, qurtardın, söhbət edərik.

Güləbətin bu dəqiqə taleyindən o qədər razı idi ki, sanki dünyanı ona bağışlamışdılar. O, fikrində axırıncı çərşənbə axşamının belə xoş gəlməsini daha böyük sevinclərin müjdəsi hesab edərək Böyükxanıma ürəkdən gələn bir minnətdarlıqla təşəkkür etdi:

– Çox sağ olun, xanım. Allah sizi həmişə xoşbəxt eləsin! – deyib qapıya tərəf yönəldi və astanada geri dönüb: – Gecəniz xeyrə qalsın, xanım! – deyərək otaqdan çıxdı. Lakin bu balaca yaraşıqlı otağı da, onun içində yaşayan gözəl xanımı da ürəyində apardı. Ona elə gəldi ki, otaq büllur aynadan qayırılmışdır, kərpic mülkə havaxt baxsan, hardan baxsan, ilk öncə bu işıqlı otağı görəcəksən. Böyükxanım isə bu büllur otaqda yanan bir çıraq, bir ulduz idi ki, işığı uzaqlara yayılırdı.

Güləbətinin yadına düşdü ki, bir zaman Sevindik də xəyalına ulduz kimi daxil olmuşdu. Yox, o elə indi də xəyalının təmiz göylərində parıldamaqdadır. Lakin getdikcə uzaqlara çəkilir, daha parlaq işıq verir. İndi bu ulduz qoşalanmışdı... Bu müqayisə bacı ürəyində mümkün olmayan və buna görə də daha şirin görünən bir arzu doğurdu: “Sevindik və Böyükxanım necə də bir-birlərinə yaraşırlar... Kaş ulduzları barışsın!” – deyib düşündü. Sonra da düşündü ki, niyə mümkün olmasın, deyirlər bizim zəmanədə elə şeylər olur ki, əvvəllər lap böyük adamların da xəyalına gəlməzmiş...

## XAİN

Güləbətini dəhşət almışdı. Gözünün qabağında Sevindiyə tələ qururdular. Üzünə gülə-gülə min bir hiylə və kələk işlədərək xəlvətə çəkib məhv etmək istəyirdilər. Güləbətin isə bunları görə-görə heç bir kömək edə bilmirdi. Kənarda dayanıb baxırdı: “Heç olmasa bu çirkin xəyanət barədə, bu qanlı tələ haqqında qardaşını xəbərdar edə biləydi!”.

Yox, Güləbətinin buna da imkanı yox idi. Axı, o Sevindiyi ancaq xəyalında, ancaq yuxularında görə bilirdi. Yuxuda da ki, adama söz demək olmaz.

Bəs nə etməli? Bu tələni nə cür vurub dağıtmalı? Güləbətin xəyanət haqqında öz yoldaşını, dostunu satan xainlər haqqında az eşitmə-

mişdi. İndi belə bir xain gəlib Sevindiyi tapıb, gözlənilmədən, xilaskar mələk kimi onların qapısını açıb, həyasız, abırsız Səlmi xanımdan onlara nicat vermiş o adam indi Hacının evində, təzə hizbi düzəldənlərin, Sevindik kimilərin şurişçi, dələduz, Allahsız adlandıraraq dərhal dar ağacından asılmalarını tələb edənlərin içində görünürdü... Dəhşətə baxırsınızmı! İnsan necə də ikiüzlü, xain ola bilər...

Dumanlı da olsa Güləbətin təsəvvür edirdi ki, bu xəyanətə təkcə Sevindik qurban olmayacaq, kim bilir neçə Sevindiklər sorğusuz-sualsız gedəcək... Bəs nə etməli? Qaçıb anasına desin? Nə faydası! Yazıq arvadın ürəyi elə orda partlar, oğlunun hardasa sağ-salamat olduğu, zindanda yaşadığı və bir gün qurtarıb gələcəyi fikri ana ürəyinə təsəlli idi. İndi bu ümidi, bu təsəllini də qırmağın nə faydası vardı? Yox, bu sirri anaya deməyin mənası yoxdur. Ancaq bu xəyanəti elə-belə də qoymaq olmaz. Bəs nə etməli?

Güləbətin qızğın, həyəcanlı fikirlərin əlində qalmışdı. Biri batırdı, biri çıxırdı. Əlini cibinə atmış, varlı bir adam görən bazar dilənçiləri kimi bu fikirlər bir-birini basıb kənara itələyir, özünü irəli verirdi, lakin dərhal üçüncü onu sıxışdırırdı.

Nəhayət, Güləbətin çıxış yolu tapdı: indi ki xəyanətin qabağını almağa qüvvəsi yoxdur, indi ki xəyanət qurbanlarına kömək edə bilməyəcək, heç olmasa xainin ürəyini yaralamaq lazımdır, şərbət kimi içdiyi xəyanət badəsinə zəhər qatmaq lazımdır, bir ayna olub ona bütün murdar üzünü, iyrənc sir-sifətini göstərmək lazımdır ki, baxsın, öz-özündən iyrənsin...

Lakin xaini necə görməli, nə təhər fürsət tapıb xəncəri onun ürəyinə soxmalı? Xain oturub yuxarı başda, Hacının bayram süfrəsinin başında, yeyir, içir, danışır, gülür, qəzəblənir... Güləbətin isə gah həyətə qaçır, gah dəhlizə yüyürür, gah çirkin, bulaşıq boşqabları yığışdırmalı olur. O boşqabları ki, onlara xainin əli dəyib, xainin pis, murdar nəfəsi toxunub, xurma çərdəkləri ilə, qoz-fındıq tör-töküntüsü, yarısı yeyilmiş, yarısı qalmış paxlavalar ilə doludur... Güləbətini gah ağa səsləyir, gah xanım, gah kiçik qızın çığırtısına qaçmalıdır, gah Şahpələngin... Dörd yandan hay qalxır:

– Güləbətin, ay Güləbətin!.. Çay gətir...

– Güləbətin, ay Güləbətin! Gəl ayaqqabılarımı təmizlə.

– Güləbətin, ay Güləbətin, ütü hardadır?..

Bayramdan bir həftə keçir, amma bayram süfrəsi yığılmayıb, get-gəl kəsilməyib. Hacı siyasi olandan evin qapısı karvansara qapısına dönüb. Təzə hizbin adamlarının biri gedir, o biri gəlir. Deyirlər ki, başçıları Hacıdır. Kül başınıza! Adam qəhət olmuşdu, özünüzə böyük seçməyə! Bu yandan da gündən-günə Kiçikxanımın həvəsi artır, hər gün bir əda ilə ananın da, Güləbətinin də zəhləsini aparırdı. Hələ Şahpələng! Yenə düşüb qalıb Təbrizdə... Evdə gecə davadır, gündüz dava. Yüz tümənlik kostyumu iki həftə geyir, ləkə-ləkə eləyib gətirir atır dəhlizə...

– Güləbətin, təmizlə...

Şah gölünə, Tehrana gəzməyə, Qaradağa ova gedəndə beş-altı gün canları dincəlir, üzünü görmürlər. Bu gün o da evdədir, adam azmış kimi yanınca da özü kimi beş-altı havayıyeyən gətirib. Özlərinin də gözlərindən od çıxır.

Cəhənnəmə çıxsın! Güləbətin özünü elə aparır, guya onları heç görmür də... Ancaq onu, o xaini görməyə bilməz. Ondan intiqam almaya bilməz!.. Lakin nə cür?! Fikir elədi ki, bu dəfə çay aparanda qəsdən elə eləsin ki, çayını dağıtsın üstünə qıçınısa pöşləsin, o ütülənmiş, hamarlanmış ingilis şalından şalvarına ləkə salsın... Sonra düşündü ki, bununla xainə böyük bir zərbə dəyməyəcək, Güləbətinin də ürəyi soyumayacaq. Bu nə intiqamdır, özü də xaindən! Uşaq oyunudur. Gərək xəlvətə salıb üzünə çırpam ki, sən xainsən, adam satansan, alçaqsan! Lakin nə cür?!

Hansı plan tuturdusa, nə düşünürdüsə axırı gəlib bu sualda dayanırdı. Bu suala isə cavab tapa bilmirdi.

– Güləbətin, ay Güləbətin! Nargiləni gətir – deyib yenə başını qapıdan dəhlizə çıxararaq çağıran və dərhal içəri çəkilən Hacının səsi Güləbətini bu ağır, əzablı fikirlərdən ayırdı. Gedib şüşəsi göy və narıncı naxışlarla bəzənmiş Nargilə adlanan gözəl qəlyanı hazırladı və Hacının otağına apardı. Yenə orada ucadan danışır, bir-birinin sözünü kəsir, arada gülüşür, bəzən hamısı birdən susub fikrə gedirdilər. Bu zaman ancaq sarı kəhrəba və ya qara muncuq təsbehlərin şaqqıltısı eşidilirdi. Güləbətin qapıya yaxınlaşanda hiss etdi ki, o xainin üzünü görəcəyini fikrinə gətirəndə qıçları əsir, əlində qəlyan titrəyir. “Mən nə qayırıram, – deyib düşündü, – doğrudan da uşağam!.. Belə olmaz! Özünü ələ al. Güləbətin!” Birtəhər özünü ələ aldı, içəri girdi. Qət etdi ki, ona baxmasın. Heç o oturan tərəfə də çevrilməsin... Birbaş Hacının

üstünə getdi. Bu zaman Hacı danışırdı. Güləbətin çox söz eşitdi, Hacı bu dəfə də keçən dəfəki fikirləri deyirdi. Sanki tutuquşu idi. Əzbərlədiyindən kənara çıxmırdı:

– Axmaqlıq eləmişik ki, bu vaxtacan siyasətə qarışmamışıq, meydanı vermişik lat-lütə...

Güləbətin qəlyanı Hacının qabağına qoymaq istəyəndə, Hacı əli ilə göstərdi ki, ora qoy... Güləbətin onun əlinin səmtilə dönəndə Hacının onu, o xaini göstərdiyini gördü. O indi də birinci dəfə gördüyü kimi sakit və təmkinli idi. Ondakı kimi ciddi görünürdü. Danışıqlara diqqətlə qulaq asırdı. Güləbətin düşündü ki, heç olmasa utanıb qızara. Gör, necə də arxayın oturub!.. Qəlyanı qabağına qoyanda bir anlığa onların gözləri rastlaşdı. Güləbətinin əli əsdi, az qaldı qəlyan yerə düşsün. O isə artıq qıza baxmadan qəlyanı elə tutdu ki, heç kəs bunun fərqinə varmadı. Güləbətin tez çəkilib getdi... Dayanarsa ağlayacağını, ya da üzünü Hacıya tutub: "Bu adama inanmayın, bu xaindir!" – deyəcəyini hiss etdiyindən boş stəkanları, çirkli boşqabları da yığmayıb otaqdan çıxdı.

Bir az sonra dağılışmağa başladılar... Gün təzəcə batmışdı. Hardansa azan səsi gəlirdi. Müəzzin müsəlmanları axşam namazına çağırırdı. Hacının özü kimi onun evinə gələnlər də vaxtlı-vaxtında namaz qılanlardan deyildilər. Namazlarını çox zaman qəzaya qoyar, ya da başqalarına qıldırardılar. Onlar əmin idilər ki, Allah-taala işlərinin çox, başlarının qarışıq olduğunu nəzərə alacaq... Güləbətin dəhlizin rəngli pəncərələri dalında durub onlara baxırdı. Görünür, Hacı onları həyət qapısına qədər ötürməyi qərara almışdı. Yavaş-yavaş, söhbət edə-edə, təsbehləri şaqqıldada-şaqqıldada, bir-birinə yol verə-verə kərpic səkidə irəliləyirdilər. O, ortadan bir az dalda idi. Təmkinlə, arxayınlıqla yeriyirdi. Otaqda olduğu kimi yenə danışmır, qulaq asırdı. Lap qapıya çatanda o ayaq saxladı, hamı çıxandan sonra Hacıya nə isə dedi. Hacı dönüb səslədi:

– Güləbətin, ay Güləbətin!

Güləbətin qaçaraq gəldi. Hacı küçəyə baxan naməlum adamı göstərdi:

– Ağa ilə get əmanət var, versin gətir.

Güləbətinə elə gəldi ki, bu fürsət təsadüfi deyil, göylərin hökmüdür, onun əlinə düşüb ki, xaini damğalasın, neştərlə ürəyini deşsin!..

O, Güləbətinə heç bir əhəmiyyət vermədən, guya heç tanımırmış kimi qabaqda gedirdi. Qız bir an düşündü ki, bəlkə, doğrudan da, məni

tanımayıb, ya da mən səhv edirəm, bu başqa adamdır və dərhal öz-özünü inandırdı ki, səhv etmir, odur ki, var...

O, təbrizlilərin dürüşgə dediyi, köhnə zamanda Bakıda qazalaq adlanan təkatlı balaca bir fayton saxladı. Özü oturdu və işarə edib qıza da yanında yer göstərdi. Onlar Firdosvi mehmanxanasının yanından sağa buruldular. Bir qədər gedib dar küçələrdən birində dürüşgədən düşüb balaca həyətə girdilər və ikinci mərtəbədə bir neçə pəncərəsi olan böyük bir otağa çıxdılar. O, əsasını bir küncə qoydu. Silindrini asılqana keçirdib, nəhayətsiz dərəcədə mehriban, gülər gözlərlə qızı süzdü:

– Bəs belə, Güləbətin xanım! – dedi: – niyə mənə deməmisən ki, Hacının evində işləyirsən?

Onun mehriban səsi də, gülər gözləri də Güləbətinə nifrətamiz görünürdü, qız ona əlində bıçaq adam öldürmək istəyən bir cəllada baxar kimi baxırdı.

– Mən sizə nifrət edirəm. Siz xainsiniz, alçaqsınız! – deyib Güləbətin ağır sözləri dolu kimi onun başına, üzünə çırpdı... O isə bütün bunlara sakitcə qulaq asdı, üzündəki təbəssümü ciddi ifadələr əvəz etsə də, acıqlanmadı. Nəhayət:

– Mənim xain olduğumu hardan bilirsən? – deyib sakitcə soruşdu.

– Ordan bilirəm ki, Hacı kimi adamlarla oturub-durursan... Onun hizbinə girirsən. Onlar isə Sevindik kimiləri şurişçi, Allahsız adlandırırlar. Deyirlər hamısını dardan asmaq lazımdır!..

Qız danışdıqca hiss edirdi ki, onun gözləri böyüyür, qeyri-adi bir diqqətlə dolur.

Güləbətin sözünü qurtaranda, o, otaqda gəzindi, nə isə xeyli düşündü. Gəlib Güləbətini bir də diqqətlə süzərək əvvəlki kimi işıqlı təbəssümlə gülümsədi:

– Sən məni yaman sevindirdin, ay qız! Sən Qürrətüleyn Tahirə[1] olacaqsan! Sizləri oxudan olsa, hərəniz bir qəhrəman olarsınız!..

– Mən Tarirə-zad tanımıram! – deyib Güləbətin hələ də acıqlı danışdı, – insafınız olsun, verməyin Sevindikgili ölümə!.. Yalvarıram sizə!..

Yalnız bu sözü eşidəndə o tamamilə dəyişdi. Kədərli, qüssəli gözlərlə Güləbətinə baxıb əlindən tutdu:

– Mənim ağıllı qızım, mənim bacım! – dedi, – mən özüm dar ağacına gedərəm, onların başından bir tük əskik olmağa qoymaram. Nəyə deyirsən and içim, inandınmı?

– Bəs onda sənin Hacıgildə nə işin var?! Ya oyanda ol, ya buyanda. Həyatda ikiüzlü adamlardan mənim zəhləm gedir.

O yenə fikrə getdi. Pəncərədən küçəyə baxdı. Sonra Güləbətinə döndü:

– Hərgah o yanın xeyri tələb edirsə ki, mən bu yanda olum, onda necə?

– Elə şey olmaz. Həyat belədir, ya bu yanda, ya o yanda! – deyib Güləbətin qəti təkid etdi və elə düşündü ki, onu divara sıxmışdır, buna qarşı bir söz deyə bilməyəcək.

O isə sakitcə cavab verdi:

– Həyat haqqında sənin təsəvvürlərin nə qədər bəsitdir, Güləbətin! – dedi, onun səsi təəssüflə dolu idi. Sanki çox yaxşı bildiyi bir həqiqəti heç cür Güləbətinə başa salmaq mümkün olmadığı üçün təəssüf edirdi...

– Səni sox saxlaya bilmərəm, – deyib şübhəyə yol verməyən bir səslə danışdı, – mən Hacıya çatacaq şeyi hazırlayınca, sən də bu kağızı oxu.

Güləbətin əldən-ələ keçdiyi üçün əzik-əzik olmuş balaca ağ zərfi açdı. Bir neçə sətirdən ibarət olan məktubun altındakı imzaya baxdı. “Qardaşın Sevindik” sözləri gözünə dəyəndə sevincdən əlləri titrədi. Ürəyindən isti, hərarətli bir dalğa qalxıb bütün bədəninə yayıldı, hərarətin dalınca canına üşütmə gəldi, qıçlarının əsdiyini, ayaq üstə dura bilmədiyini hiss edib yavaşca pəncərə qabağındakı səndəliyə oturdu, məktubu oxumağa başladı. Məktub bir vərəq ağ kağızda yazılmışdı. Hərflərin aydın və gözəl yazılışından Güləbətin qardaşının xəttini tanıdı. Lakin Sevindiyə yaraşmayan o idi ki, bir-iki xətt yuxarıdan aşağı əyilmişdi. Məlumdur ki, tələsik yazılıb. Bu məktub deyildi, əlinə keçən bir anlıq fürsəti qaçırmamaq üçün tələsən, həyəcanlı, təlaşlı bir ürəyin çırpıntısı idi. Sevindik yazırdı: “Əziz bacım Güləbətin! Mənim gözümün işığı, canım, ciyərim! Məktub vasitəsilə də olsa səninlə, mənim əziz anam, atam, qardaşımla danışmaq, bilsəniz mənim üçün necə səadətdir. Bu saat elə bilirəm ki, hamınız gözümün qabağındasınız, üzünüzü görürəm. Səsinizi eşidirəm. Sizdən xahiş edirəm, mənim əzizlərim, mənə elə qəmgin baxmayın, heç fikir eləməyin. Pis günün ömrü az olar. Tezliklə sizi görəcəyəm. Hamımız xoşbəxt yaşayacağıq. İnanın mənim sözlərimə, gələcək barədə naümid olmayın. Ağıllı bacım! Mən necə xoşbəxtəm ki, sən oxuya bilirsən. Fikrimə gətirəndə ki, mənim bu məktubumu oxuyacaqsan, atam-anam, qardaşım Həmzə

qulaq asacaq, elə bilirəm dünyanı mənə bağışlayırlar. Sağ olun mənim əzizlərim, bir-birinizdən muğayat olun...”

Güləbətin oturduğu yerdəcə məktubu neçə dəfə oxuduğunu bilmədi. Ürəyində coşub-qaynayan duyğuların, oyanan həyəcanların nəticəsində zərif, incə qız ürəyi tab gətirmədi. Qeri-iradi olaraq göz yaşları gözündə gilələndi.

– Olmadı ki, – deyib naməlum adam kiçik bir əl çamadanını qapının ağzına qoydu, – ağlamaq nədir, Güləbətin! Sənə yaraşmır. Mən səni mübariz, möhkəm ürəkli bir qız bilirəm.

Güləbətin əlinin dalı ilə yanaqlarını sildi. İndi onun ürəyində bu naməlum adama qarşı elə bir məhəbbət oyanmışdı ki, sanki o Sevindiyin əkiz tayı idi, Güləbətinin böyük qardaşı idi.

– Yox, ağlamıram! – deyib o məktubu bükərək qoynunda gizlətdi.

Naməlum adam isə otaqda gəzinərək öz-özünə danışırmış kimi dedi:

– Sənin barəndə düşünmək gərək, Güləbətin. Səni o evdən çıxarmaq gərək. Məktəblərin birində, ya maarifdə səni kiçik bir işə düzəldəcəyəm. Necə bilirsən? Axı, evdə qulluqçu olmaq başqa, idarədə, karxanada işləmək başqa şeydir. Orda görəcəksən ki, tək deyilsən, həmkarların var. Elə işdə olsan, bəlkə oxuya da bildin.

– Siz bilən yaxşıdır! – deyib Güləbətin etiraz etməsə də, tərəddüdlə cavab verdi. Naməlum adam isə yenə də öz-özüylə danışırmış kimi davam etdi:

– Hacının oğlu xoşuma gəlmədi. Elə axmaqdır ki, əlindən xata çıxa bilər.

– Amma xanım çox yaxşı arvaddır! – deyib Güləbətin tərəddüdünün səbəblərini açdı. – Hə, sizə onu da deyim, böyük qız atasıgilin tamam tərsinədir. Mən elə bilirəm ki, ürəkdə o da sizlərdəndir...

– Eh, Güləbətin, elələri çoxdu. Baxma ki, varlıdırlar, naz-nemət içində yaşayırlar, amma hər evdə şüuru oyanmış, zəmanənin ab-havası ilə nəfəs alan bir eləsi var. Təzə yellər əsən kimi, onlar açıq-açığına bizə kömək edəcəklər... Get, artıq gecdir! – deyib qapının ağ-

---

[1] *Qürrətüleyn Tahirə* – keçən əsrin birinci yarısında Cənubi Azərbaycanın Zəncan şəhərində doğulmuşdur. İranda şahlıq istibdadına və ortodoksal islam dininə qarşı ictimai-siyasi müxalifəti ifadə edən bəhayi hərəkatının fəal iştirakçılarından olmuşdur. Öz qorxmazlığı, cəsarəti və əqidə möhkəmliyi ilə müasirlərini heyrətə salmış, mürtəceləri dəhşətə gətirmişdir. Nəsrəddin şahın hakimiyyətinin ilk illərində həbs edilmiş, min bir işgəncədən sonra Tehran zindanında 35 yaşında öldürülmüşdür.

zındakı balaca əl çamadanını götürməyi işarə etdi, – dürüşgəyə oturarsan, al bu da pulu. Yadında olsun ha, məni Hacıgildə görmüsən, vəssalam. Bundan sonra nə gözlərin dolmasın, nə qəlyan əlində titrəməsin...

Güləbətin qızardı. Naməlum adam haqqındakı pis fikirləri yadına düşdü və öz-özündən utandı. Günahkar kimi yavaşdan dedi:

– Bilsəniz, sizin barənizdə necə pis sözlər demişəm. Sizə necə qarğımışam.

Naməlum adam bütün günahları bağışlayan bir təbəssümlə gülümsədi:

– Sən xainə qarğımısan, mənə yox. O adama qarğımısan ki, o insaniyyətə, dostluğa, səadətə xəyanət etmiş olur. Mən ki bunlar üçün çalışıram!

Güləbətin öz-özünə düşündü: “Hər şeyi bilir...”.

– Heç kəsin barəsində pis düşünməyəcəyəm! – deyib çamadanı götürərək otaqdan çıxdı.

## QIZIL SAAT

Təbriz bahar içində idi. Şəhərin yalnız bağları, bağçaları deyil, xiyabanları da, bazar-dükanı da bahar ətrilə nəfəs alırdı. Bahar günəşinin hər şeyə həyat və can verən işıqları bütün günü həyətlərə, bağlara-bağçalara tökülür, gül-çiçəyin pardaqlanmasına, ağacların qol-budaq atmasına, yarpaqların qalınlaşıb sıxlaşmasına, meyvələrin iriləşməsinə kömək edirdi. Səhərdən axşama qədər günəşin qızıl tellərini içən, şirəsini və rəngini günəşdən alan al-əlvan qızılgüllərin yanından keçəndə ətir qoxusundan doymaq olmurdu. Min üç yüz metr hündürlüyündə olan bu gözəl şəhərdə dağ havası ilə aran günəşi birləşmişdi. Təmiz dağ havası və səhərdən axşama qədər hər yeri qızdıran parlaq aran günəşi bağ-bağatın inkişafı üçün, dadlı meyvələrin yetişməsi üçün müstəsna şərait yaradır. Güləbətinin göyərçinləri də Təbrizin bahar havasından doymur kimi göylərdə uçur və hovuzun ətrafına toplanırdılar. Onlar yenə fasiləsiz olaraq bir-birini oxşayır, qar-qur edib havaya qalxırdılar.

Güləbətin onlara tamaşa edib baharın xoş nəfəsini udduqca sinəsinin indiyə qədər bilmədiyi, anlaşılmaz, dumanlı və həm də şirin hiss-

lərlə döyündüyünü duyurdu. Bahar çiçəkləri, gülləri pardaqlandırdığı kimi qızın da böyüməsinə, yanaqlarının allanmasına kömək edirdi. Güləbətin duyurdu ki, indiyə qədər əhəmiyyət vermədiyi güzgü həyatına daxil olmaqda, onu cəlb etməkdədir. Lap işinin tələsik vaxtında da güzgünün qabağından keçəndə qeyri-ixtiyari olaraq ayaq saxlayır, ötəri özünə nəzər salır. Tez tələsik saçlarını düzəldib keçirdi...

Bahar sanki özüylə onlara az-çox xoş günlərin də müjdəsini gətirmişdi. Karxanada Həmzənin dərəcəsini və maaşını artırmaq barədə çoxdan bəslədikləri ümid gerçəkləşmişdi. Hər halda amansız ehtiyacın boğazlarına uzanan qara əlini deyəsən özlərindən uzaqlaşdırmışdılar.

Əvvəlki kimi ailənin gizlincə çəkdiyi, içərisinə saldığı bircə dərdi vardı: Sevindik!.. Bu dərd bir gün də Güləbətinin ürəyindən çıxmırdı, xüsusən məktub gələn gündən sanki o daha ağırlaşmışdı, daha artıq hiss olunmağa başlamışdı. Axı, nə qədər ki, Sevindikdən heç bir xəbər yox idi, onun barəsində ancaq dildən-dilə bir şey eşidirdilər, vücudunun varlığını duymurdular, elə bil ki, o çox uzaqlarda idi. Yalnız xatirələrdən, bir növ xəyalatdan ibarət idi. İndi isə o, hardasa yaşadığını, nəfəs aldığı, canlı və hərarətli vücud olduğunu bildirmişdi. Ata-ananın da, Həmzənin də, xüsusən Güləbətinin ürəyində bu vücudu görmək, onunla üz-üzə oturmaq, onun hərarətini duymaq həsrətini qat-qat artırmışdı.

Yəni yaranın közü qopmuşdu və sızıltısına davam gətirmək çətin idi. Şübhələri, narahat fikirləri artıran o idi ki, məktub aldığı gündən naməlum adam da yoxa çıxmışdı. O, Hacıgilə də gəlmirdi. Güləbətin bazar-dükana gedəndə dördgöz olur, yaxşı geyimli, silindrli, əli əsalı bir adam görəndə uzaqdan izləməyə başlayırdı. Lakin yaxınlaşanda o olmadığını bilən kimi təəssüf duyğusu ilə uzaqlaşıb gedirdi.

Güləbətin onu görməyə, onunla danışmağa, məsləhətləşməyə daxili bir ehtiyac hiss edirdi. Eh, ürəyinə, fikrinə o qədər şeylər dolub ki, heç bilmir necə həll etsin, gündə başında min bir sual oyanır, birinə də doğru cavab tapa bilmir... Güləbətinə elə gəlirdi ki, bu cür narahat olmağının, daxili rahatlığını itirməyinin günahı ondadır: insafsızlıq deyilmi bir adamda qətiyyən bilmədiyi, təsəvvür etmədiyi həvəsləri oyadasan, ağlına da gəlməyən fikirlərə salasan, sonra da çəkilib durasan kənarda?!

Güləbətin o zaman, o dar küçədəki ikimərtəbəli evdə geniş və işıqlı otaqda, onun sözlərinin mənasını birdən-birə başa düşməmişdi. Lakin o sözlərin hamısını bir-bir yadında saxlamışdı. Dəvə yediyini

sonradan gövşəyib həzm eləyən kimi o da sonralar, saatlarla fikrə gedərək onun sözlərinin əsil mənasını anlamağa başlamışdı. Xüsusən iş barədə dedikləri hey Güləbətinin fikrində hərlənir, hərlənirdi, “Axı evdə qulluqçu olmaq başqa, idarədə, karxanada işləmək başqa şeydir. Orda görəcəksən ki, tək deyilsən, həmkarların var”. Bu sözlər fikrində hərləndikcə, qızın daxili narahatlığını artırırdı. Əvvəllər bu qədər razı olduğu, Allaha min şükür etdiyi bu evdəki işi gözündən düşməyə, hətta ona bir növ əskiklik kimi görünməyə başlayırdı. Bir dəfə bu fikirlərini həmişə sakit və dinməz Həmzəyə danışdı. Həmzə nə deyə bilərdi? Susub qulaq asdı, dırnaqlarını çeynəyib durdu. Lakin Güləbətin hiss etdi ki, o çox darıxır, əzab çəkir, öz acizliyini, bacısına kömək iqtidarından məhrum olduğunu hiss etdikcə az qalır ürəyi partlasın!.. Həmzənin iztirabları üçün də Güləbətin özünü günahkar hiss etdi. “Axı, niyə qardaşıma əziyyət verirəm?!” Naməlum adam haqqında düşünəndə də özünü danladı. “Niyə elə o zaman indiki kimi qanmamışam, onun sözlərinin mənasını doğru anlamamışam, əlim-ayağım əsib, gözlərim yaşarıb, dilim elə sözlər deyib ki, heç yeri deyilmiş...”.

Ah, əziz Güləbətin, Sevindik sənin bu təzadlı fikirlərini, özünə bu qədər əzab verdiyini görsəydi, dodaqlarından öpərdi, deyərdi: “Bacım, sən elə şeylər düşünürsən ki, böyük filosofların idrakına layiqdir. Sən bir az da yaşasan, bir az da insan əməlləri ilə tanış olsan, oxusan, düşünsən, bu əməlləri təhlil etsən görəcəksən ki, insanlar əllərini, ayaqlarını, dillərini tərpətməmiş, düşüncələrini, ağıl və fikirlərini işlətsəydilər, əzələlərin hərəkətini idrakın hökmünə tabe edə bilsəydilər, bəşəriyyət nə qədər xoşbəxt olardı!.. O zaman xalqların taleyi təsadüflərin hökmü altına düşməzdi. Əsl-nəsəbinə, məsləksizliyinə, siyasi hiylələrdə bacarıq göstərdiyinə görə dövlət başına gəlmiş eqoist, kütbeyin və qansız hakimlər xalqları bir-birinə yaxınlaşdıran insaniyyət duyğularını çirkin, heyvani ağalıq və üstünlük duyğularına qurban verə bilməzdilər. Bəli, hamı, yer üzündəki bütün fərdlər öz insani mahiyyətlərini dərk etsəydi, kor-koranə hərəkətləri ağlın məhkəməsinə versəydi, bir çox bəlaların, iztirabların, faciələrin qabağı öz-özünə alınmış olardı...”.

Əlbəttə, Güləbətin bunların heç birini bilmirdi. O, təbii olaraq, bütün qəlbilə səadətə meyl edirdi. Necə ki, güllər-çiçəklər günəşə doğru meyl edir, necə ki, günəbaxan günəşin əsiri kimi, günəşin işıqlarına bağlanmış kimi onun dalınca çevrilir, üzünü bir an günəşdən

yana tutmur. Bəli, saədət – təbii bir ehtiyac idi, gənc qızın ürəyində oyanmışdı. Qız böyüdükcə, əzələləri gücləndikcə, yanaqları allandıqca bu ehtiyac da böyüyürdü, artırdı, güclənirdi. Kasıb, yoxsul uşaqları ona görə Şahpələnglərdən düşüncəli, ayıq və qabiliyyətli olur ki, kiçik yaşlarından başlayaraq həyat özü onlara müəllimlik edir.

Hər halda Güləbətin gözləməyi, naməlum adam haqqında heç kəsə, hətta böyük qıza da bir söz deməməyi qət etdi. Pis fikirlərə, ümidsizliyə basılmamaq, təslim olmamaq üçünsə onun yaxşı dərmanı vardı: kitab! Ağır fikirlər üstünə qoşun çəkdiyi gecələrdə "Heydər babaya salam" ən möhkəm və ümidli dayağı olmuşdu.

Bu kitabı oxuduqca ona elə gəlirdi ki, anasının nağıllarına qulaq asır. Ya da şirin xəyalların qanadında haralara isə uçub gedir. Kitabın bir çox yerlərini isə o qədər oxumuşdu ki, süd əzbər bilirdi. Hətta işlədiyi zaman, paltar yuduğu, ev təmizlədiyi yorğun dəqiqələrində onları yavaş-yavaş dodaqaltı özü üçün oxuyur, nəinki ruhən, hətta cismən də yüngülləşdiyini hiss edirdi...

– Güləbətin, yaman öz-özünə danışırsan, nə olub? – deyə xanım soruşdu və cavab gözləmədən əlavə etdi. – Get ağanın otağını təmizlə. Bir azdan yığışacaqlar. Bağçanı sonra süpürərsən.

Güləbətin həyət süpürgəsini yerinə qoyub, ev süpürgəsini, xəkəndazı götürdü, Hacının otağına tərəf yollandı. Həyətdə özünü yaz günəşinə verən xanım dedi:

– Al, bu saatı da qoy Hacının mücrüsünün üstünə, yadından çıxıb, qalıb mənim otağımda!..

– Güləbətin zəncirli qapaqlı qədimi qızıl saatı alıb otağa yollandı və düşündü ki, siyasi olandan lap Hacının huşu başından çıxıb. Bu saatı heç yerdə qoymazdı, bir adama etibar etməzdi, həmişə cibində gəzdirərdi, adam arasında çıxardıb düyməçəsini basar, birdən yuxarı qatlanaraq açılan qapağına ləzzət dolu gözlərlə baxar, vaxtı yoxlar və dərhal büküb jiletinin cibinə qoyardı. Güləbətinə elə gələrdi ki, Hacı jileti məhz bu saata görə geyir... İndi gör başı necə qarışıb ki, bu qədər sevdiyi saatı yadından çıxardıb...

Güləbətin Hacının otağını süpürəndə həyətdə Şahpələngin qalın bas səsini eşitdi. Pəncərədən boylandı. O hara isə getməyə hazırlaşırdı. Pencəyi qolunun üstündə, siqar damağında anasının qabağında durmuşdu. Güləbətin "ver, dur ayağa, yüz tümən ver!" sözünü eşidən

kimi bildi ki, o yenə xanımdan pul istəyir. Lakin xanım yerindən tərpənmirdi. Onlar xeyli danışdılar:

– Atan indicə gələcək, özündən istə! – deyib xanım qəti səslə və təngə gəlmiş halda ucadan danışdı. Şahpələng acıqlı addımlarla yenidən otağına çəkildi.

Güləbətin Hacının otağını təmizləyib qurtaran kimi xanım ona yeni tapşırıq verdi:

– Qaç qızım, o tindəki baqqaldan bir az darçın al, qayıt, darçınımız qurtarıb, Hacı darçınlı çay sevir, birdən istər, olmasa itə dönəcək, qaç ha...

Güləbətin tez əlini yuyub küçəyə qaçdı. On dəqiqə keçməmiş darçın alıb qayıdaraq həyətə girəndə Hacı dalınca girdi.

– Hardan belə, Güləbətin xanım! – deyə yarı istehza ilə soruşdu.

Güləbətin ona müfəssəl məlumat verməyi artıq bildi.

– Xanımın tapşırığı vardı...

Ayrı vaxt olsaydı, mütləq Hacı soruşardı: “Nə tapşırıq, necə tapşırıq?!”. Lakin indi kefi saz idi, fikri başqa şeylə məşğul idi, soruşmadı. Elə həyətin ortasından xanımı görüb səsləndi:

– Xanım, o oturduğun yerdə hovuzun başındaca mənə bir stəkan çay düzəlt, səndəlləri geyib gəlirəm.

Hacı otağına girib ayaqqabılarını çıxarmamış Şahpələng onun başının üstünü aldı. Güləbətin darçını qaba töküb həyəti süpürürdü və bir qulağı onlarda idi. Lakin danışıqları o qədər də aydın eşidilmirdi. Çox danışdılar, az danışdılar, Hacı hövsələdən çıxdı, oğlunun üstünə qışqırdı, elə qışqırdı ki, bu vaxta qədər Hacının bu cür güclü boğazı olduğunu heç kəs bilmirdi.

– Nə istəyirsən məndən?! Öldürməyəcəksən ki, məni. Əl çək! – deyib Hacı titrəyə-titrəyə həyətə gəldi, hovuzun yanında oturdu. Şahpələng pencəyini çiyninə ataraq:

– Yaxşı, olsun! – deyib yel kimi həyətdən çıxdı.

Bir az sonra Hacı açıq havada ağacların kölgəsində xanımın öz əlilə töküb gətirdiyi məxməri çayı içərək özünə gəlib otağına çəkildi və ikicə saniyə keçməmiş xanımı səslədi:

– Xanım, mənim saatım hardadır?

Artıq eyvanda olan xanım Güləbətini çağırdı!

– Güləbətin, Hacının saatını hara qoydun?

– Siz deyən yerə, mücrünün üstünə qoymuşam, xanım, – deyib Güləbətin həyətdən cavab verdi.

İçəridən Hacının əsəbi və təlaşlı səsi eşidildi:

– Mücrünün üstündə saat-zad yoxdur... Gəlin tapın görüm...

Xanım özü içəri getdi. Ora-bura baxdı, saatı tapa bilməyib Güləbətini çağırdı.

– Ay qızım, gəl gör, hara qoymusan, – dedi və əsəbiləşib özündən çıxmağa başlayan Hacını sakit etməyə çalışdı. – Qoy görək, ay kişi, saatı yemədilər ki, indi tapılar.

Güləbətin evi alt-üst elədi, mücrünün dörd dövrəsinə, taxtın, kresloların altına baxdı, xalıları çevirdi, saat tapılmadı ki, tapılmadı. Kənarda durub zəhərli gözlərlə, acımış, turşumuş pomidor kimi bürüş-bürüş olmuş acıqlı siması ilə onları süzən Hacı:

– Vallah dünyanı dağıdaram, saatı tapmasanız! – deyib hədələdi.

Rəngi ağarmış xanım Güləbətindən soruşdu:

– Qızım, bir yaxşı yadına sal, bəlkə başqa yerə qoymusan, köynəyinin cibinə-zada bax.

Bu gözlənilməz və pis hadisədən özünü itirmiş, çaşmış olan Güləbətinin hafizəsi bir anlığa dumanlandı. Saatı mücrünün üstünə qoyduğuna özü də şübhələnməyə başladı. “Bəlkə, doğrudan da, başqa yerə qoymuşam?” – deyib düşündü. Köynəyinin yaxasını axtardı, xanımla birlikdə o biri otaqlara baxdılar. Xəlvəti dəhlizdə Güləbətinin yatağını, paltarlarını yoxladılar. Saat bir quş olub göyə uçmuşdu, heç bir iz-əlamət yox idi.

Onların hər yeri axtarıb qurtardığını və bir də təzədən lap əvvəldən başladıqlarını görən Hacı Güləbətinin başının üstünü aldı:

– Düzünü de görüm, aparıb tində kimə verdin?!

Elə bil ki, Güləbətinin təpəsinə iri bir dəyənək vurdular. Qız yerindəcə donub qaldı. Elə bildi ki, dünyanın axırıdır və bundan belə ona həyat yoxdur. Xanım tənəli gözlə baxdı:

– Bəsdir, ay kişi!

Hacı bir az əvvəl Şahpələngə qışqırdığından da bərk qışqırdı:

– Nə bəsdir? Nə bəsdir?! Evinin içində oğru saxlayırsan! Gözlə, sənin nişan üzüyünü aparanda, ayılarsan!. – deyib Güləbətinə döndü. – Get, kimə vermisən, al gətir, yoxsa, ananı da, atanı da bura yığacağam. Nəslinizi Təbrizdən köçürdəcəyəm...

Dünya Güləbətinin gözlərində qaralmışdı. Yaz günəşi də, bağçanın gözəl ağacları və gülləri də qaranlığa bürünmüşdü. Qız danışmaq istəyir, qışqırmaq istəyirdi ki, “yalandır mən oğru deyiləm!” Lakin sözlər bir

parça palçıq olub boğazını tuturdu, nəfəs almağa qoymurdu. Qıza elə gəldi ki, indicə ürəyi də, ciyəri də ağzına gələcək, çölə töküləcək...

Lakin birdən gözlərindən yaş sel kimi axdı və o boğulmadı, yüngüllük hiss edib üzünü divara çevirdi, Hacı isə qışqırırdı, hədələyirdi:

– Göz yaşı kömək eləməz, get saatı gətir!

Bu zaman yumşaq mülayim bir əl Güləbətinin çiyninə toxundu, onun başını sinəsinə sıxdı:

– Dədə, yalvarıram sənə, mənim ürəyimi partlatma. Bilirsən ki, belə şeylərə dözə bilmirəm! – deyib Böyükxanım atasına müraciət etdi. Sonra hıçqıran Güləbətini qucaqladı və öz otağına apardı. Hələ içəri girməmiş onların qulağına Hacının səsi gəldi.

– Hamısı adamdır, bir məndən başqa! Hamısının ürəyi var, bir mənim yoxdur!.. Saat tapılmasa, rahat olmayacağam, arvad!..

Güləbətin ağzını açıb danışmaq, heç olmasa Böyükxanımı inandırmaq istədi ki, ölər, amma belə şey eləməz. Lakin o ağzını açmamış Böyükxanım dedi:

– Allah atamın insafını kəsib, Güləbətin! Ağlamaq, özünü öldürmək lazım deyil. Sən ağladıqca o elə biləcək ki, günahkarsan. Başa düşürsənmi? Heç ağlayıb eləmə. Axı, sən ki götürməmisən, sən niyə əzab çəkirsən? Niyə zəiflik göstərirsən?! Sən başa düş ki, nə qədər zəiflik göstərsən, o qədər artıq səni tapdalayacaqlar. Qızılın, sərvətin qanunu belədir. Onun kölgəsində ədalət, insaf axtarma!..

Böyükxanımın sözləri nə qədər qeyri-adi və maraqlı olsa da, Güləbətinə az təsəlli idi, onu bu bədnamçılıqdan qurtara bilmirdi. Alnına "oğru" damğası basılacağını düşünəndə qızı yenə hıçqırıq tutdu. O, üzünü divara çevirəndə Böyükxanımın nifrət dolu səsini eşitdi:

– Lənət olsun belə yaşayışa, adamın yediyi də zəhər olur!..

## ƏLVİDA UŞAQLIQ

Həyətdə isə Hacı kükrəyib daşırdı. Gözəl bahar havasını, güllərin ətrini, quşların nəğməsini, hamısını, hamısını unutmuşdu. Hamısı onun nəzərində bir heç idi. Gözünə yaxşı şey dəymirdi və hər şeydən də pis zavallı Güləbətin idi. O Güləbətin ki, neçə ildir öz balaca əlləri ilə Hacının çirkli köynəklərini yuyur, həyətini təmizləyir, qulluğunda durub; indi hamısı unudulmuşdu.

Hacı ilə xanım ikilikdə xeyli danışdılar, höcətləşdilər. Hacı təkid edirdi ki, saatı Güləbətin oğurlayıb, vəssalam! Xanım deyirdi ki, Güləbətin elə iş tutmaz. Hacı o qədər israr etdi ki, o qədər danışdı ki, axır xanımın inamını sarsıtdı. Hacı dedi: "İnsan çiy süd əmib, insandan nə desən çıxar!". Bu sözlər xanımı da qara fikirlərə saldı.

– Nə bilim vallah! – deyib təslim oldu. Hacı onun bu tərəddüdündən istifadə edib hücuma keçdi.

– Bunlardan nə gözləyirsən, atası – ac, anası – ac, gözdən tük qapırlar! Sən get dilə tut, boynuna qoy.

Xanım çar-naçar böyük qızının otağına gəldi. Güləbətini taxtın üstündə yanında oturtdu. Özü də nə etdiyini bilməyən, əzab və tərəddüd keçirən səslə:

– Güləbətin, qızım, – dedi, – bəlkə səni öyrədiblər, tamah güc gəlib, de mənə, mən birtəhər Hacını sakit edərəm, söz burda qalar...

Güləbətini elə bil ki, ilan çaldı. Elə bil xəyalında bir çıraq söndü, ümidi puça çıxdı:

– Xanım siz də belə... – deyib ağladı. Böyükxanım isə çılğın bir hərəkətlə anasına döndü:

– Bəs deyil, nənə, sizdə heç ürək yoxdur, adama da bu cür işgəncə verərlər?!

– Axı, mən başıma nə daş salım? Kor olsun belə həyat, belə güzəran! – deyib xanım kor-peşman çölə çıxdı.

İki dəqiqə keçməmiş Hacı yenidən kükrəyib coşdu. Qonşu uşağını çağırıb dürüşgəyə oturtdu, ünvan verdi:

– Get bu saat atasını da, anasını da, evlərində başı papaqlı, başı ləçəkli kim var oturt dürüşgəyə, gətir bura.

Yarım saat keçməmiş Narınc və Həmzə həyətə daxil oldular. Onların ikisi də meyit rəngində idi. Onlar gələnə qədər Hacı gah arvadının üstünə cumur, gah çığırıb həyətə çıxartdığı Güləbətini divara qısnayırdı. Böyük qız bu şivənə, qaraqışqırığa dözə bilməyərək kitablarını götürüb hara isə getmişdi. Hacının istədiyi kimi hay-küy qaldırmasına mane olan yox idi. Güləbətinin anası həyətə girən kimi:

– Amandır, xanım, deyin görüm qızımın başında nə iş var?! – deyib xanımın üstünə atıldı.

– Qorxmayın, qızınız ölməyib! – deyərək Hacı onları qarşıladı. Hovuzun qırağındaca oturub əhvalatı danışdı. Saatı dərhal geri qaytarmalarını tələb etdi.

Bir saatın ərzində arıqlamış, balacalanmış, ovurdları batmış, gözləri çuxura düşmüş Güləbətinə baxan ananın ürəyi tel-tel oldu, onu qucaqlayıb ovutmağa çalışdı. Güləbətinin isə gözü fikrə getmiş, dodaqları əsən və hey dırnaqlarını çeynəyən Həmzədə idi. Görəsən o, nə düşünür? O da Güləbətin barədə pis düşünsəydi, bundan belə dünyada yaşamağın mənası yox idi.

Hacı gah hədələyir, gah dilə tutur və saatın Güləbətin tərəfindən oğurlandığına heç bir şübhəsi olmadığını söyləyirdi. Nəhayət, üzünü Həmzəyə tutdu:

– Sən bundan böyüksən, qardaşsan, başına ağıl qoy, saatın yerini desin.

Güləbətin Həmzənin dodaqlarının daha sürətlə əsdiyinə, yumruqlarının düyünləndiyinə diqqət etdi. O, iki addım Hacıya tərəf irəliləyəndə qız qorxdu ki, əlindən xata çıxa, az qaldı qışqırsın. Lakin Həmzə dayandı və Hacının gözünün içinə baxdı:

– Həmzə, biz oğurluqla mal qazananlardan deyilik! – dedi, – biz halal süd əmmişik, halal çörək yemişik... Nə bacarırsınız, eləyin!..

Hacı “Boy, boy, boy!” eləyə-eləyə bir xanıma baxdı, bir Narınca, əlini Həmzənin üstünə qaldırıb yaxasından tutaraq “çıx burdan!” demək istəyən yerdə həyət qapısı açıldı və bayaq Həmzəgilin dalınca gedən qonşu uşağı içəri girdi, qaçaraq Hacının üstünə gəldi:

– Hacı ağa, – dedi – məni Şahpələng göndərdi, deyir bazar ağzında gözləyirəm. Dədəmə de, yüz tümən versin, gətir, qızıl saatı apar, yarım saat vaxt verirəm, göndərməsə satacağam yüz tümənə...

Hacı oğurluq üstündə tutulan adam kimi çaşıb qaldı, suya düşmüş qoca toyuq kimi büzüşdü. Xanımın rəngi ağardı. Sonra yavaş-yavaş üstünə gəldi. Sanki çiynindən ağır yük götürülmüşdü. Güləbətin, Narınc və Həmzə isə lal qaya kimi susub nifrət dolu tutqun gözlərini Hacıya dikmişdilər. Bu baxışların ağırlığını, bu qəzəbin gücünü hiss etmiş kimi Hacı silkindi.

– Südünə lənət, südü murdardır! – deyib üzünü o yana çevirdi. Əlləri əsə-əsə portmanatı çıxardıb yüz tümən sayaraq uşağa verdi: – Apar ver, tez saatı gətir. Geciksən min tümənlik saatı satacaq yüz tümənə... tez ha, – dedi və qara kölgə kimi öz otağına çəkildi.

Xanım da susub qalmışdı. Sanki üstünə bir qazan qaynar su tökmüşdülər. Saat söhbəti ortalığa çıxan dəqiqədən onun ürəyində bir səs deyirdi ki, bu Şahpələngin işidir. Lakin başqa bir səs heç cür bununla

razılaşmaq, bunu etiraf etmək istəmirdi. İndi özünü nəhayətsiz dərəcədə günahkar hiss edən Xanım Güləbətinə yaxınlaşdı.

– Gəl qızım, gəl gedək evə... Ananı da, qardaşını da çağır, çay içsinlər, – deyib qolundan yapışmaq istədi. Güləbətin qolunu çəkdi, yavaşdan və kədərli:

– Sağ olun, xanım! – dedi, – sizin yaxşılığınızı unutmaram, mənə çox şey öyrətdiniz.

Güləbətin anasının qolundan tutub qapıya tərəf yollandı. Həmzə isə onları müdafiə edər kimi dallarınca yeridi. Xanım yerində donub qalmışdı. Güləbətinin son sözləri qulağında səslənməkdə idi. Onlar uzaqlaşdıqca dərin təəssüf duyğusu varlığını sarsıtmaqda idi.

...Güləbətin xiyabanda xeyli gedəndən sonra dönüb bir də bu evə baxdı. Ona elə gəldi ki, uşaqlığını orada qoyub gedir. İndi həyatının başqa dövrü başlayır. Bilmədiyi, görmədiyi yollar onu gözləyir... Xeyli yan-yana, sakit getdikdən sonra anası onun fikrini dağıtmaq haqqında düşünərkən naməlum adamı xatırladı.

– İki gün qabaq bizə gəlmişdi. Sevindikdən kağız gətirib...

Güləbətin özünü o qədər yorğun hiss edirdi ki, heç bir söz deyə bilmədi, ancaq anasının çadranın altındakı soyuq və quru əlini tapıb sıxdı...

1965

# PƏRVİZİN HƏYATI

## BİRİNCİ FƏSİL

### 1

Çimnaz müəllimə evdə həll etmək üçün bizə hesabdan beş məsələ verib dedi:

– Uşaqlar, diqqətli olun ha! Səhv eləməyin, özü də lap aydın və təmiz yazın, məktəbimizin direktoru deyir ki, maarifdən adam gələcək, dəftərləri yoxlayacaqlar.

Mən bu fikirdə idim ki, məktəbdən çıxan kimi evə gedib məsələləri həll edər və arxayın olaram. Ancaq gedə bilmədim. Məktəbimizin böyük həyətində sinif yoldaşım Səfa məni tutub saxladı:

– Gəl bir az futbol oynayaq, bizim dəstənin mərkəz hücumçusu yoxdur.

Bu Səfa elə bicdir! Bilir ki, futbol meydançasında hücumçu olmaq mənim xoşuma gəlir, xüsusən mərkəz hücumçusu. Müdafiəçi və ya qapıçı olmağı təklif eləsəydi, qalmazdım.

Uşaqlar çantalarını havaxtdansa həyətin bir küncündə atılıb qalmış teleqraf dirəyinin üstünə yığmışdılar. Mən də çantamı və pencəyimi ora atıb meydana girdim. Oyun qızışdı. Gah biz rəqiblərimizi sıxışdırırdıq, gah rəqiblər bizi. Hesabı birinci açmaq mənim xoşuma gəlir. Elə ki, topu qabağıma qatıb rəqiblərin birini, ikisini aldadaraq onların cərimə meydançasına gətirirəm, gözümə heç şey görünmür, topu necə olsa qapıdan içəri salmaq istəyirəm. Lakin bu dəfə mənimki gətirmədi: topu cərimə meydançasına yaxşı çıxartmışdım, bizim dəstə axıb bura gəlmişdi, yoldaşlarım tez-tez "Pərviz! Pərviz!" – deyib qışqırırdılar ki, özümü itirməyim, bərk ayaqda topu onlara ötürüm. Lakin mən özüm vurmaq istəyirdim, rəqiblərin üçünü aldadıb qapıya yaxınlaşaraq sağ ayağımı qaldırıb zərbə ilə topu qapıya vurmaq istəyən yerdə üç müdafiəçi qabağımı kəsdi və topu məndən alıb irəli ötürdülər. Bizimkilər ha eləyib geri qayıdana kimi onların hücumçuları bizim müdafiə xəttini yarıb topu qapımızdan içəri keçirdilər. Səfa başda olmaqla bizim dəstədən beş-altı uşaq üzünü mənə tutub danladılar:

– Eqoistsən, yoldaş gözləyən deyilsən!

Mən acıq eləyib meydandan çıxdım. Çünki bu sözü birinci olaraq Səfa mənə demişdi: görəsən hardan eşidib? Əvvəlcə mən onu söyüş

bilib bərk incimişdim. Sonra atamdan öyrəndim ki, "eqoist" özünü hamıdan çox sevən adama deyirlər. İndi uşaqlar mənə gülmək, sataşmaq istəyəndə "eqoist" deyirlər. Mən çantamı, pencəyimi götürüb evə getdim. Bilirəm ki, yaxşı eləmədim. Ancaq özümü saxlaya bilmədim.

2

Evə gələn kimi çantamı açdım, hesab kitabını və dəftərimi çıxartdım, pəncərə qabağında durub elə ayaq üstdə məsələlərə baxmağa başladım. Həm futbol əhvalatını unutmaq istəyirdim, həm də bilmək istəyirdim ki, görüm necə məsələlərdir, çətindir, yoxsa asan. Başım məsələlərə qarışdığı yerdə anamın səsini eşitdim:

– Pərviz, nə yenə gözünü dikdin kitaba! Gəl çörəyini ye, atanın tapşırığı var, get yerinə yetir, sonra qayıt mənə kömək elə, mətbəxi ağardıram.

Anam həmişə belədir. Heç vaxt adama bir iş tapşırmaz, nə qədər iş gördürəcək gərək hamısını birdən deyə. Bir dəfə mən etiraz elədim, dedim ki, – "ay ana, o qədər tapşırıq verirsən ki, yadımdan çıxır, həvəsdən düşürəm", acığına gəldi:

– Adam böyüyə söz qaytarmaz, – dedi. – Yaxşı-yaxşı qulaq as, yadında qalsın, bir-bir əməl elə.

Mən anama etiraz eləmək istədim: "Böyüyə söz qaytarmaq niyə olur? Mən deyirəm ki, bir iş tapşır, görüm, qurtarım, sonra başqa bir iş de". Lakin bu zaman gözəm anamın gözlərinə sataşdı və bu sözləri dilimin ucundan qaytardım. Ona görə yox ki, anamı acıqlı görüb qorxdum, anam nə qədər acıqlansa da qaşqabaqlı olmaz, üz-gözünü turşutmaz, mənə baxanda gülümsər. Sözümü deməməyimə səbəb o oldu ki, anamın gözlərində kədər və narahatlıq gördüm. Elə bil ki, mənə bir bədbəxtlik üz verəcəkdi, yıxılıb əziləcəkdim, isti çayniki üstümə tökəcəkdim. Anam isə məni bu bədbəxtlikdən qoruya bilmədiyi üçün yanır, özünə dərd eləyirdi. Mən bilirəm, anam üstümdə tir-tir əsir, həmişə mənim gələcəyimi düşünür və istəyir ki, mən böyüyəndə yaxşı adam olum. Ona görə də mən ağılsız bir söz danışanda, dərslərimə pis baxanda, şuluqluq eləyəndə anam hamıdan çox inciyir, ürəyinə salıb fikir eləyir. Mən isə istəmirəm anam fikirli olsun. Çünki fikirli olanda ağ üzünə, qara, işıqlı gözlərinə kölgə qonur, gözəlliyi pozulur. Axı, mənim anam çox gözəldir. Dünyada bütün qadınlardan gözəldir!

Bir dəfə anam çağıran kimi mən həyətə çıxmadım. Sözün doğrusu onun məni çağırdığını belə unutdum, artıq birinci məsələ ilə məşğul idim. Çox maraqlı məsələ idi. Hələ pəncərə qabağında durduğum halda fikrimdə məsələni həll eləməyə başlamışdım. Siz elə bilməyin ki, mən yalan deyirəm, ya da özümü tərifləyirəm. Yox, mən hesabı hamı dərslərdən çox sevirəm və bütün sinfimizdə hesabdan birinci hesab olunuram. Hətta məktəbin dəhlizində Çimnaz müəllimə hər dəfə mənə rast gələndə mümkün deyil ki, əlini çiynimə qoyub məni o biri müəllimlərə tərifləməsin:

– Pərviz gələcəkdə böyük riyaziyyatçı olacaq!..

3

Mən hələ bilmirəm riyaziyyat nədir. Bir dəfə bu barədə Çimnaz müəllimədən soruşdum. O da bir xeyli çalışdı bizi başa salsın, ancaq heç şey başa düşmədiyimizi görüb dedi:

– Hesab riyaziyyatın lap aşağı pilləsidir. Sağlıq olsa, yuxarı siniflərdə riyaziyyat keçəcəksiniz, onda bilərsiniz.

– Müəllimə, yuxarı siniflərdə də bizə siz dərs deyəcəksiniz? – deyib Səfa yerindən soruşdu:

– Yox, mən ancaq ibtidai sinifləri aparıram, – deyib Çimnaz müəllimə gülümsədi. Fatma yerindən əlini qaldırdı:

– Nə sözün var, Fatma? – deyib Çimnaz müəllimə ondan soruşdu. Fatma ayağa durub başını aşağı salaraq yavaşdan dedi:

– Müəllimə, mən istəyirəm beşinci sinifdə də bizim müəllimimiz siz olasınız.

Müəllimə də güldü, bütün sinif də. Səfa Fatmanı ələ saldı:

– Sən çox şey istəyirsən.

– Bəs niyə ağlayırsan? – deyib kim isə əlavə etdi.

Fatma ağlamırdı, ancaq onun səsi çox nazikdir, özü də danışanda sıxılır, başını aşağı dikir, sözləri də çox yavaş-yavaş deyir, buna görə də adama elə gəlir ki, ağlayır. Fatma qayıdıb Səfaya baxdı və dilini çıxartdı.

– Müəllimə, deyin, Fatma dilini çıxartmasın! – deyib Səfa şikayətləndi. Sinifdə qar-qur düşdü, uşaqlar hamısı yerindən danışdı.

Müəllimə əlini stola döyüb sinfi sakit elədi:

– Bu nədir, uşaqlar? Belə eləsəniz dərs keçə bilmərik.

Səfa yenə nə isə demək istədi. Lakin müəllimə ona macal verməyib lövhənin qabağına çağırdı, vurğu cədvəlindən suallar verməyə başladı:

– De görüm, dörd dəfə səkkiz neçə edər?

O zaman Səfa şuluqçu oğlan idi, çox danışardı, bir dəqiqə yerində rahat otura bilməzdi. Elə bil ki, yel dəyirmanı idi, havada balaca külək oldu, o tərəf-bu tərəfə fırlanacaqdı. Müəllimənin sualına cavab verməyib gözünü sinfə dikdi, əlinin işarəsilə uşaqlardan cavabı soruşdu. Uşaqlar əllərini qaldırıb barmaqlarını açaraq havada cürbəcür şəkillər göstərdilər. Lakin Səfanı başa sala bilmədilər.

– Müəllimə, dörd dəfə səkkizi soruşursunuz? – deyib o vaxtı uzatmaq istədi.

Müəllimə başını sinif dəftərindən qaldırıb ona baxdı:

– Soruşuram dörd dəfə səkkiz neçə edər? Cavab ver. Bunu gərək fikirləşmədən deyəsiniz, vurğu cədvəlini əzbərdən bilmək lazımdır.

Səfa canını qurtarmaq üçün ağzına gələn rəqəmi dedi:

– Müəllimə, dörd dəfə səkkiz elər otuz dörd.

Müəllimə bir də Səfaya baxıb başını buladı və bizə tərəf döndü.

– Kim deyər?

Sinif əlini qaldırdı. Müəllimə mənə söz verdi. Cavabını söylədim. Bilmirəm nədənsə müəllimə yenə bir neçə sual verdi, sonra da bütün vurğu cədvəlini əvvəldən axıra mənə dedirtdi:

– Pərviz, bu gündən hesabdan səni özümə köməkçi təyin edirəm. Səfadan başla, onunla hər gün bir saat hesabı təkrar edərsən.

Mən ayağa durub dedim:

– Baş üstə, müəllimə!

Yerimə oturanda qızardığımı hiss etdim, mənə elə gəldi ki, bütün sinif mənə baxır. Mən isə heç kəsə baxmırdım. Gözüm ancaq Çimnaz müəllimədə idi. Birdən sinifdəki bütün şeylər və bütün uşaqlar gözümdə dumanlanıb itdi, o cümlədən Çimnaz müəllimə də. Duman seyrəkləşəndə nə görsəm yaxşıdır: anam dayanıb Çimnaz müəllimənin yerində, bizə dərs verir! Tez gözlərimi yumub açdım, bir də baxdım: ay, aman! Çimnaz müəllimə necə də mənim anama oxşayırdı! Necə də mən bu vaxta qədər bunu görməmişəm. Çimnaz müəllimə də heç vaxt üz-gözünü turşutmur, qaşqabağını sallamırdı. Gözləri anamın gözləri kimi qapqara və işıqlı idi, üzü də işıqlı və mehriban idi. Lakin yavaş-yavaş, bir az da diqqətlə baxdıqca görürdüm ki, Çimnaz müəllimənin üzü mənim anamın üzü kimi ağ deyil, gözləri də bir az balaca və girdədir. Ancaq üzündə elə mehriban bir şey vardı ki, onu mənim anama oxşadırdı.

## 4

O gündən gah Səfa bizə gəlir, gah mən onlara gedirəm. Hesabı bir yerdə hazırlayırıq. Yox, təkcə hesabı yox, indi biz onunla dost olmuşuq. Bir il bundan qabaq çeçələ barmaqlarımızı bir-birinə haçalayıb and içmişik ki, dost olaq, ölən günə kimi bir-birimizdən dönməyək. İndi Səfa sinifdə və məktəbdə özünü mənim kimi sakit aparmasa da, arada bir yerindən danışıb uşaqlara sualların cavabını desə də, dərslərinə yaxşı baxır, ikisi yoxdur, hesabdan dörd alır. Ancaq mən deyəndə ki, gərək sən də beşə oxuyasan, özünə inanmır, deyir ki:

– Oxuya bilmərəm, sən özünə baxma, səndə Allah vergisidir, anamgildən eşitmişəm.

Səfanın anası Allaha inanır, məscidə gedir, namaz qılır, oruc da tutur. Mənim də anam Allaha inanır, amma namaz qılıb, oruc tutmur, deyir ki, "Allah özü görür ki, işim çoxdur, vaxt eləyə bilmirəm, keçər günahımdan". Mən isə Səfanın sözünə inanmıram. İnanmıram ki, mənim hesabı yaxşı bilməyim Allah vergisidir. Səfa belə deyir, çünki anasından eşidib və mən bilən şeyi bilmir, bilmir ki, mən hesabdan nə üçün yaxşı oxuyuram. Yadımdadır ki, hələ məktəbə getməmiş atam mənə ona qədər saymağı öyrətmişdi, hətta üstə gəldən də bir az bilirdim. Çimnaz müəllimə bizimlə dərsə başlayandan bir qədər sonra məni lövhəyə çağırdı, ədədləri yazdırdı, sonra soruşdu:

– İki üstə gəl yeddi, neçə edər?

Mən birdən ona qədər bütün ədədləri bir-birinin üstünə gələ bilirdim, buna görə də tez cavab verdim. Çimnaz müəllimə yenə bir-iki şey soruşdu. Mənim cavablarımdan razı qalıb əlini başıma çəkdi:

– Sağ ol Pərviz, sən nə yaxşı oğlansan...

O gündən mən Çimnaz müəllimənin isti və yumşaq əlini, mehriban səsini unuda bilmirəm. O, ağ daşı balaca və bir az toppuş barmaqları arasına alıb lövhədə yazı yazanda mənə elə gəlir ki, başımı sığallayır, bizdən narazı olub bizi danlayanda da onun səsi mehriban və xoşdur. İki ilə yeddini cəmlədiyim gündən mən həm Çimnaz müəlliməni, həm də hesabı sevmişəm. Bəzən mənə elə gəlir ki, hesab olmasaydı, mən heç Çimnaz müəlliməni də sevməzdim.

Mənim atam qazmaçıdır, neft mədənlərində işləyir. O, axşamlar boş olanda neft barədə mənə qəribə söhbətlər edir. Mənə əvvəllər elə gələrdi ki, neft cansıxıcı şeydir. Bizim Şüvəlan quyularının suyu kimi

onu da yerin altından çıxardırlar və sonra da yandırırlar, maşınları işlədirlər. Atam məni başa saldı ki, nefti elə beləcə yandırmaq vəhşilikdir, çünki neftin içində çox maddələr var. Benzin, ağ neft, cürbəcür yağlar neftdən alınır. Atamın dediyinə görə bizim Bakının neftayıran zavodlarında indi neftdən alınan maddələrin sayı iki yüzdən çoxdur. Atamın bunları necə ürəkdən və şirin-şirin danışdığını oradan bilin ki, qabağındakı çay yadından çıxır, qalıb soyuyur, halbuki atam çay sevəndir. Özü də bir-birinin dalınca üç stəkan içməsə olmaz. Atam neftdən ona görə bu qədər danışır ki, öz qazmaçılıq sənətini çox sevir.

– Qazmaçılıq çox maraqlı işdir! – deyir. – Qazmaçı olmasa neft kimi qiymətli sərvət yerin altında yatıb qalar.

Hər dəfə atama qulaq asanda mənə elə gəlir ki, neft onun nəzərində canlı bir şeydir, sanki neft də yaşayır, nəfəs alır, deyib-gülür.

İndi hesabı da mən beləcə sevirəm – atam qazmaçılığı sevən kimi!

5

Hərdən mənə elə gəlir ki, ədədlərin özünün qəribə həyatı var. Elə sirləri var ki, onları hələ heç kəs açmayıb. Məgər, maraqlı deyilmi ki, bir yazırsan, sağ tərəfinə sıfır qoyanda olur on. Sıfır özü heçdir, amma birin yanına gələn kimi onu on dəfə artırır. Mən bu barədə bir dəfə atamla söhbət elədim. O mənə heç bir söz demədi. Bir az böyümüş gözlərlə üzümə baxıb susdu. Atam hesabı yaxşı bilsə də, sirlərini başa düşmür, o neftin sirrinə daha yaxşı bələddir. İkinci sinifdə olanda bu barədə mən Çimnaz müəlliməyə sual verdim. Onda uşaqlar mənə güldülər:

– Sən de görək doqquz dəfə on dörd neçə elər?! – deyib Səfa yerindən dilləndi, – boş söz soruşma.

Mən pul kimi qızarıb Səfaya heç bir cavab verə bilmədiyim halda Çimnaz müəllimə dedi:

– Pərviz boş söz soruşmur. Mən sevinirəm ki, onda düşünmək qabiliyyəti var, hesabın yuxarı dərəcələrini keçəndə görəcəksiniz ki, doğrudan da rəqəmlərin sirləri bitməz-tükənməzdir. Riyazi hesablamaların bir ucu gedib fəlsəfə ilə birləşir. Gələcəkdə görəcəksiniz.

Həmişə dərs zamanı ora-buradan düşmüş söhbətin uzanmasını istəyən Səfa nə isə soruşmaq istədi, lakin müəllimə onu saxlayıb barmağını qaldırmış Fatmaya söz verdi və balaca boyu ilə partadan güclə seçilən Fatma yenə ayağa durub başını aşağı saldı, cırıldayan səslə soruşdu:

– Müəllimə, fəlsəfə nədir?

– Uşaqlar, bir az yuxarı siniflərdə onu da biləcəksiniz. Ali məktəbdə isə xüsusi fəlsəfə dərsləri keçilir.

– Müəllimə, bəs azdan çoxu çıxmaq olar? – deyə Səfa yenə sual etdi.

Mən bilirdim ki, Səfa bu sualı yuxarı sinif şagirdlərindən eşidib, indi məzəlilik edərək müəllimdən soruşur. Ancaq Çimnaz müəllimə Səfanın bicliyini o saat başa düşsə də, onu sındırmaq istəmədi.

– Çıxmaq olar, Səfa. Bunu da bir az yuxarıda keçəcəksiniz, – deyib əlavə etdi, – yəqin yaşlı uşaqlardan eşitmisiniz, hə?

Səfa cavab vermədi. Kim isə yerindən dedi:

– Yox, müəllimə, öz başından çıxarıb...

Hamı güldü. Mən də özümü saxlaya bilməyib güldüm. Ancaq Səfa o birilərin gülməyindən çox, mənim gülməyimdən incidi.

– Gülmə! Yoldaşlıqda xainlik olmaz.

– Bəs sən mənə eqoist deyəndə yaxşı idi, mən də gülürəm!

Səfa mənə cavab vermək istəyəndə Çimnaz müəllimə bizə yaxınlaşdı:

– Nə üstdə mübahisə edirsiniz?

İkimiz də susduq. Çimnaz müəllimə qayıdıb yerinə getdi. Mən özümü onun qabağında günahkar bilib pərt olmuşdum. Ancaq heç bir şey olmamış kimi o məni lövhənin qabağına çağırdı və bir məsələ verdi ki, həll edim. Mən bu məsələni çox həvəslə həll etdim. Bunun bir səbəbi də o idi ki, orada söhbət qazmaçılardan gedirdi, yəni mənim atamdan! Müəllimə başımı sığallamasa da məni bütün sinfin qabağında təriflədi.

6

İndi mən hesaba xüsusi səy göstərirəm ki, Çimnaz müəlliməni peşman eləməyim. Səy göstərdikcə də hesabı sevirəm. O da öz sirlərini mənə açır. Səfa bütün bunlardan xəbərsiz olduğu üçün elə bilir ki, mənim yaxşı oxumağıma, xüsusən hesabdan əlaçı olmağıma səbəb Allah vergisidir. Bir gün mən bunların hamısını ona başa salacağam. İndi sala bilmirəm, çünki mən bu barədə danışan kimi şitliyi tutur, deyir ki, "mənə nəsihət verən azdır ki, sən də bu yandan başlamısan!"

– Pərviz, kiminnənəm, gələcəksən, ya yox? – deyib anam məni məsələdən ayırdı. Kitabı stolun üstünə qoyub çox könülsüz həyətə çıxdım.

Anam qollarını çirməyib kətilin üstünə çıxmışdı. Əlində çoxdan yeyilmiş iri şotka vardı. Onu kətilin yanına qoyduğu əhəng dolu vedrəyə basıb yavaşca silkir, sonra qaldırıb mətbəxin çöl divarını ağardırdı. Adətidir, anam hər yaz gərək mətbəxi, evin divarlarını, tavanını ağarda. Mənim gəldiyimi hiss edib əl saxladı, yuxarıdan aşağı mənə bir nəzər saldı:

– Keç mətbəxə, sənə qutab saxlamışam, ye, get bazara, atan deyirdi o Qulam Rzanı görsün, saat beşəcən səni gözləyəcək.

Qulam Rza adını eşidən kimi mənim kefim pozuldu. Üz-gözü həmişə tüklü və gözləri şorbalı olan bu kişi bazarın ortasındakı dükanda satıcıdır. Bu dükanda kələm, kartof, soğan: bir sözlə hər nə desən olur. Atam məni çox zaman ora kartof və soğan üçün göndərir. Qulam Rza kişi tanışıdır, tapşırır, seçməsini verir. Amma mən Qulam Rzanı sevmirəm. Birinci, ona görə ki, ondan iyrənirəm, mənə elə gəlir ki, onun üzü həmişə çirklidir, axı, tükləri anamın əhəng şotkasının da tüklərindən bərk və sıx olan bu üzü necə yumaq olar? İkinci də ona görə ki, Qulam Rza çox acıqlı kişidir. Anamın sözünü eşidən kimi mən ağ tut ağacının altındakı hovuz daşının içinə baxdım:

– Ana, kartofun da var, soğanın da, sabah gedərəm, dərsim çoxdur! – deyib birtəhər boyun qaçırmaq istədim.

– Soğan-kartof üçün getmirsən, ədə. Atan deyirdi ki, cücə gələcək, tapşırıb on beş dənə saxlasın.

Bu sözü eşidən kimi mən ruhlandım. Süstlük, tənbəllik bir anda üstümdən götürüldü, yerimdə oynadım.

– Ay can, ay can. Sağ olsun atamı!

Anam yenə əl saxlayıb, mənə baxdı. Ancaq bu dəfə elə təəccüblə baxırdı ki, elə bir göy üzünü bürümüş bulud-duman birdən-birə hara isə çəkilmişdi:

– Heç xoşuma gəlmirsən, Pərviz! Könlündən olmayan iş deyəndə qaşqabaq eləyirsən, o şey ki ürəyindəndir əldən-ayaqdan gedirsən. Yaxşı uşaq belə eləməz!

## 7

Anam düz deyirdi: cücələr ürəyimdəndir. Düzünə baxsan anam toyuq-cücəni sevmir. Əvvəla deyir ki, açıq buraxırsan eşələmədiyi, zibilləmədiyi yer qoymur, buraxmırsan bircə dən ilə saxlamaq olmur. Gərək göy-göyərti verəsən, elə şeylər yedirdəsən ki, qanadlarını sal-

layıb naxoşlamasın. Bu da böyük baş ağrısıdır. Anamın tərsinə olaraq mən cücələr üçün ölürəm. Balaca, tüklü, rəngarəng, mərcan gözlü cücələri oynatmaqdan doymuram. Odur ki, çox yalvarıb anamı razı salmışam, icazə versin, beş günlük hazır inkubator cücələri alaq, onları mən özüm saxlaram, elə baxaram ki, ölməsinlər, yaxşı artsınlar. Atam da mənim sözümdən keçməyib razı olub.

Mən tez mətbəxə keçdim, ayaqüstü iki ət qutabı yeyib bazara cumanda anam məni saxladı.

– Bəs cücələri nədə gətirəcəksən? Bəs pulunu vermək lazım deyil?

Mənə elə gəldi ki, hər söz anamın ağzından bir saata çıxır. Lap səbrim tükəndi.

– Yaxşı da, ana, nə verirsən, ver gedim gətirim.

Ancaq anamın tələsmək fikri yox idi. Yavaşca kətildən aşağı endi, şotkanı kətilin üstünə qoydu, gedib əllərini yudu. Asılqandakı dəsmalla sildi. Stolun üstündəki müşəmbəni qaldırıb bir neçə sarı və əzik-üzük manatlıq, iki də üçlük götürdü.

– Atan deyirdi, biri otuz üç qəpiyədir. On beşi nə qədər eləyir?

Mən tez hesablamağa başladım, lakin çox tələsdiyimdən əzbərdən eləyə bilmədim, qaçıb bir qurumuş meynə çubuğu götürdüm qumun üstündə yazanda anam güldü.

– Bəs belə hesab bilənsən? Al, gərək beş manata yaxın eləsin, – deyib bir üçlüyü və iki manatlığı mənə uzatdı. Lakin mən çölə tələssəm də pulu almadım, anamın hesabı yaxşı bilməyimə şübhə etməsi mənə toxunmuşdu. Ona görə də tez on beşi otuz üçə vurub yüzə bölərək cavabını tapdım:

– Beş manata yaxın yox, düz dörd manat doxsan beş qəpik eləyir! – deyib mənalı-mənalı anama baxdım. Cavabı qəpiyinə qədər düz tapmağım, görünür, anamın xoşuna gəldi. Çünki tələsikdə boynumu qucaqlayıb üzündən öpdü (Anamın bu hərəkəti həmişə məni acıqlandırırdı).

– Ağacın altındakı yeşiyi götür, elə yığ ki, əziləni olmasın! – dedi.

Mən pulları alıb cibimə qoydum. Balaca yeşiyi qapıb böyük sevinclə həyətdən çıxdım.

## İKİNCİ FƏSİL

### 1

Cücələrlə bərabər evimizə, həyatimizə böyük şadlıq gəldi. Mənim həyatım elə bil ki, tamamilə başqa şəklə düşdü. Mən yeşiyi mətbəx stolunun üstünə qoydum. Cücələri onun içinə yığdım. Onlar hey "cib-cib" eləyib civildəşirdilər. Bir-birinə qısılır, ayaq üstəcə gözlərini yumub mürgüləyirdilər, ağappaq ipək kimi yumşaq tüklü qanadlarını yığıb büzüşürdülər.

Sevincimin həddi yox idi. Onlara baxdıqca istəyirdim ki, sabah tez gəlsin, məktəbə gedib yoldaşlarıma cücələrim barədə danışım. Səfanı evimizə gətirib cücələrimi göstərim. Bu fikir xəyalımdan təzəcə keçmişdi ki, Səfa çantası çiynində bizə gəldi. Onu görən kimi nə üçün gəldiyini soruşmadan, futbol meydançasındakı küsünü də unudaraq tez qabağına getdim, əlindən tutub mətbəxə çəkdim.

– Gəl, bax, gör nə gözəl cücələrim var!

Səfa heç bilmədi ki, çantanı hara atdı. Gəlib başını yeşiyin içinə saldı. Bir-bir cücələri götürüb ovcunda tutaraq üzünə sürtüb oxşadı:

– Nə yaxşı cücələrdir, ay mənim əziz cücələrim!..

– Başını yuxarı qaldır, işıqlarını, havalarını kəsmə! – deyib mən cücələr üçün işığın, havanın çox vacib olduğunu bilən böyük adam kimi ciddi olaraq onu xəbərdar etdim. O başını yuxarı qaldırsa da hələ cücələrin birini götürüb, o birini qoymaqdan əl çəkə bilmirdi. Mən də danışmır, ürəyinə dəymək istəmirdim. Mən özüm də təzə gətirən də onların hamısını bir-bir əlimə alıb oxşamışdım. Elə indi də ürəyimdən keçirdi. Lakin özümü saxlayırdım, Səfa kimi səbirsiz görünmək istəmirdim.

Yeşiyin içi geniş olduğuna baxmayaraq, cücələr, hinin bir küncünə yığılır, az qalırdılar basıb bir-birini əzələr, mən yeşiyin divarına sıxışdırılan cücələri yavaşca götürüb bu yana qoyurdum. Lakin əlimi çəkməmiş onlar qaçıb yenə bir-birinə qısılır və bir-birini divara sıxırdılar. Yəqin yerləri narahatdır, taxtanın üstündə yata bilmirlər, – deyib düşündüm. Gedib anamın soğan yığdığı torbanı boşaltdım. Yerləri yumşaq olmaq üçün iki-üç qat büküb altlarına saldım. Yenə də bir-birini sıxmaqdan əl çəkmədilər.

Səfa dedi:

– Cücənin altına şey salmazlar!

– Necə salmazlar, xalamgildə görmüşəm, toyuq qırt düşəndə yeşiyin dibinə saman, quru ot yığırlar, yumurtaları onun üstünə düzüb toyuğu oturdurlar.

– O başqa məsələ!

– Necə başqa məsələ? Cücə çıxandan sonra yumurta qabıqlarını yığırlar, amma ota-samana dəymirlər.

– O başqa məsələ! – deyib Səfa öz fikrinin üstündə durdu, – sənin cücələrin üşüyür, istəyirsən altlarına döşək də sal, yenə bir-birinə qısılacaqlar.

Mənim yadıma düşdü, kitabda oxumuşam isti yer cücələr üçün yeməkdən də vacibdir. Yerləri soyuq olanda əmələ gəlmirlər, ölüb gedirlər, xüsusən anasız inkubator cücələri. Mən bilmək üçün ki, görüm Səfa da bu barədə kitabda oxuyub, ya özündən deyir, soruşdum:

– Hardan bilirsən ki, yerləri soyuqdur?

– Bir-birinə qısılırlar. Çünki üşüyürlər.

– Gəl peçə yaxın qoyaq! – dedim və biz iki yandan yeşiyi götürüb qaz pilətəsinin yanındakı kətilin üstünə qoyduq. Yenə də cücələr civildəşib bir-birinə qısılırdılar.

– Bir az sonra canları qızar, indi gəl yemək verək! – deyib mən pilətənin bir gözündə qaynamaqda olan balaca qazançanı götürüb suyunu boşaltdım, içindəki bişmiş yumurtaları soyuq suyun altında soyutdum və bir nəlbəki gətirdim. Səfa ilə yumurtaları sındırıb soymağa başladıq. Soyub qurtarandan sonra üçünü də ovub nəlbəkiyə tökdük, hətta bir çimdik duz da vurduq. Nəlbəkini yeşiyə qoyduq. Mən bilirdim ki, körpə cücələri yedirəndə gərək barmağını yemək olan yerə döyəsən, toyuq dimdiyilə cücələri yeməyə öyrədən kimi onları yeməyə öyrədəsən. Odur ki, barmağımın ucu ilə tez-tez nəlbəkinin dibinə döydüm. Cücələr o saat özlərini ora atıb yeməyə başladılar. Ancaq bu zaman məlum oldu ki, bir nəlbəki azdır, hamısına çatmır, indi bir-birini elə sürətlə basıb itələyirdilər az qalırdılar öldürsünlər. Xüsusən zəif cücələr nəlbəkiyə yaxın düşə bilmirdilər. Tez iki nəlbəki də gətirib yumurtanın üç yerə böldük və hər nəlbəkini yeşiyin bir tərəfinə qoyduq. İndi cücələr rahat yeyirdilər. Bu zaman evin tavanını ağardan anamın əhəngi qurtardığından bizim yanımıza gəldi.

– Bu nədir, bu nə həngamədir? – deyib kətilin üstündən yeşiyə, sonra yeşiyin içindəki torbaya və nəlbəkilərə baxdı, – bircə yığışdırın bunları buradan!

– Ana, gərək yerləri isti olsun, yoxsa əmələ gəlməzlər.

– Mətbəxdən çıxardın, harada saxlayırsınız, saxlayın, iki günə iyi aləmi basar, oturmaq olmaz, hava xoş olanda da milçək əlindən tərpənə bilmərik!..

Mən bilirəm ki, anam mətbəxin səliqə və təmizliyinə xüsusi fikir verir. Ona görə də heç vəchlə cücələri orda qoymayacağına inansam da, əl çəkmədim:

– Ana, yazıqdırlar, qoy bir az böyüsünlər, sonra Səfa ilə yaxşı hin qayırıb burdan çıxardaraq!..

– Özünüzə yaxşı iş tapdınız! – deyib anam narazı halda əhəng götürməyə getdi.

2

– Cücələrə su da vermək lazımdır! – deyib bir az sonra Səfa su qabını götürdü və su ilə doldurub yeşiyin bir küncünə qoydu. Məlum oldu ki, qab çox hündürdür, cücələr istəsələr də oradan su içə bilməzlər, boyları çatmır. Onda biz boşalmış nəlbəkilərdən birinə su töküb ortalığa qoyduq və barmağımızı yerə döydük, cücələri suya tərəf çağırdıq. Onlar eyni qayda ilə özlərini nəlbəkinin üstünə atdılar. Əvvəlcə bir-birini basıb nəlbəkinin içinə girir, suyu dağıdırdılar. İslananlar da oldu. Hətta başı kəkilli sarı cücəni itələyib suyun içinə yıxdılar. O durub qaçsa da tükləri islanıb dərisinə yapışmışdı:

– Qurutmasaq öləcək, cücəyə çox tez soyuq dəyir, xüsusən islanmış ola, adam da islananda tez üşüyür, – deyib mən kəkilli cücəni götürdüm, pambığa büküb oda yaxın tutdum. Səfa da bu zaman işsiz dayanmamışdı. O öz təklifi ilə göstərdi ki, həvəsi olanda başı lap yaxşı işləyir. Bilirsinizmi o neylədi? Gedib əl boyda hamar, gözəl bir qənbər, yəni çaylaq daşı tapıb gətirdi, nəlbəkinin ortasına qoydu. Beləliklə də indi cücələr nəlbəkinin bir tərəfinə yığışsa belə nəlbəki çevrilmirdi. İkinci də cücələr nəlbəkinin içinə girib suya batmırdılar. İstər-istəməz dövrələmə kənarda durub nəlbəkinin qıraqlarından su içirdilər.

Başımız cücələrə elə qarışmışdı ki, hesab məsələlərini də, başqa dərsləri də yadımızdan çıxartmışdıq. Anam da nə dərsləri yadımıza salır, nə də evi ağartmaq üçün bizi köməyə çağırırdı. Görünür ki, bizdən ümidini kəsmişdi, ya da istəyirdi ki, gözümüz cücələrdən doysun, özümüz ayrılıb başqa işlə məşğul olaq. Lakin bizə elə gəlirdi ki, hələ çox tezdir, cücələrə lazımi qədər qulluq etməmişik. Bir də ki,

mən kəkilli cücəni bu halda qoyub gedə bilməzdim. Yazıq indi-indi qurumağa başlayırdı. Ovcumun içində dartınıb cib-cib eləsə də, mən onun istidən xoşlandığını görürdüm. Mən onu oda nə çox yaxın tuturdum, nə də çox uzaq. Yaxın tutsam yanardı, uzaq tutsam qurumazdı. Biz cücələrlə məşğul ikən atam işdən qayıtdı, adəti üzrə əvvəlcə anamı səslədi, onun evi ağartdığını görüb məni soruşdu. Anam, tez işini yarımçıq qoyub döşlüyünü açdı, əllərini yuya-yuya atama dedi:

– Başım elə qarışıb ki, vaxtın necə keçdiyini bilməmişəm. Xörək hazırdır, indicə qızdıraram.

– Tələsmə, o qədər də ac deyiləm, ancaq bir stəkan çay içərəm! – deyib atam mətbəxə keçdi və bizi görüb dayandı. Nə etdiyimizi öyrənən gözlərlə bizi süzdü, yeşiyə və mənim əlimdəki cücəyə baxdı. Atam hər şeyi o saat başa düşür, onu inandırmaq üçün çox söz lazım deyil.

– Hə, belə olmaz! – dedi, – cücələri soyuğa verib öldürərsiniz, bir stəkan çay içim, çörək yeyək, cücələr üçün xüsusi yer hazırlarıq. İşıq çəkərik ki, yerləri isti olsun.

Biz sevincimizdən az qala atamı qucaqlayıb öpəcəkdik. Nə tez adamın ürəyindən keçəni bilir! Lakin biz hisslərimizi bildirməmiş atam dedi:

– İndi keçin dərslərinizi eləyin, bir saat sonra başlarıq.

Mən artıq tükləri xeyli qurumuş kəkilli cücəni yeşiyə, o biri cücələrin yanına qoydum. Səfa çantasını ağacın altında axtardı, lakin haçandan-haçana biz onu mətbəxdə tapdıq. Səfa dedi:

– Hesab məsələsinin birini həll edə bilmirəm, gəlmişəm mənə kömək edəsən.

– Yaxşı eləmisən, gəl hamısını başdan bir yerdə eləyək, – deyib mən onu otağa apardım. Ancaq bu gün məsələləri bir az gec həll elədik. Tez-tez çaşırdıq. Çünki bir fikrimiz mətbəxdə, cücələrin yanında idi.

## ÜÇÜNCÜ FƏSİL

### 1

Nahardan sonra cücələrə harda daimi yer düzəltmək barədə uzun mübahisə oldu. Atam yeşiyi mətbəxin bir küncündə qoymaq istəyirdi. Çünki bura işıq çəkmək asan idi. Hazır rozetka vardı. Anam qəti etiraz etdi:

– Mətbəxdə cücə olmaz, aparın hinə!
– Hələ körpədirlər. Soyuqda ölərlər.
– Özünüz bilin, mətbəxə qoyan deyiləm! – deyib anam mübahisəni kəsəndə atam fikrə getdi.
– Uşaqlar, bəri gəlin, – deyib üç dəqiqə sonra bizi aynabəndə apardı.
Bizim aynabənd cənuba baxdığından yayda çox isti olur, qışda isə o qədər də soyuq olmur. Buludsuz günəşli havalarda hamımız bura yığışırıq ki, böyük pəncərələrdən içəri axıb tökülən günəşin işıqlarından qızınaq. Aynabəndə girəndə atam bizdən soruşdu:
– Yeşiyi hara qoysaq yaxşıdır?
Mən onun sualına cavab verməmiş:
– Bəs, cücələri yeşikdən çıxarmayacağıq? – deyib səbirsizliklə soruşdum.
Atam səbirlə bizi başa saldı:
– Yeşiyin yanından balaca qapı açarsınız, istədikləri vaxt özləri çıxıb gəzərlər. Lampoçkanı isə yeşiyin içindən asarsınız, yerdən bir-iki qarış hündür olsa bəsdir, cücələr üşüyəndə gəlib onun altında qızınarlar. Yeşiyin üstünü dikt ilə örtərsiniz, yoxsa bu boyda aynabəndi lampoçka ilə qızdırmaq olmaz, cücələrə soyuq dəyər, zəhmətimiz də hədər gedər.
Hər şey aydın idi. Atam nə yaxşı düşünmüşdü! Mən fəxrlə ona baxıb fikirləşirdim ki, böyüyəndə mən də onun kimi ağıllı olacağam, heç vaxt uşaqlarıma acıqlanmayacağam. İndi atamın birinci sualına cavab vermək lazım idi. O durub cavab gözləyirdi ki, görək yeşiyi hara qoysaq yaxşıdır. Ona görə yox ki, o özü bu məsələni həll edə bilmirdi. Yox, o bizi yoxlayırdı, istəyirdi bilsin ki, bizim başımız necə işləyir, özümüz ağıllı-başlı bir şey düşünə bilirik, ya yox? Mən də, Səfa da aynabəndə göz gəzdirdik, fikrimizcə ən yaxşı bir guşə seçməyə çalışdıq.
– Bura yaxşıdır! – deyib mən tez qapıdan aralı küncü göstərdim. Deyəsən Səfanın da gözləri bu küncə zillənmişdi. O da bu küncü seçmişdi. Ancaq nədənsə o mənim kimi diri tərpənib fikrini birinci demədi. Qəribədir! Məktəbdə dilqəfəsə salmayan, hey yerində qurcalanıb danışan Səfa mənim atamın yanında elə fağırlaşır ki, tanımaq olmur. Deyəsən, atamdan utanıb çəkinir. Bir az açılışsa mənə macal verən deyil, mən birinci cavab verdiyimə baxmayaraq, atam Səfadan soruşdu:
– Niyə bura yaxşıdır? De görüm.
Səfa qızarsa da tez cavab verdi:
– Çünki həm əldən-ayaqdan kənardır, həm də gün tutan yerdir.

– Ay bərəkalla, bunlar nə ağıllı uşaqlardır! – deyib atam ikimizi də təriflədi: – İndi deyin görüm elektrik işindən başınız çıxırmı?

Biz ikimiz də birdən və yavaşca dedik: – “Yox!”.

– Olmadı ki! – deyib atam başını buladı,– bəs siz necə məktəblisiniz, birdən işığınız xarab oldu, deməli, oturacaqsınız qaranlıqda, hə?!

Aşağıda davam gətirə bilməyib atamın nə etdiyini, cücələr üçün haranı seçdiyini bilmək üçün aynabəndə çıxmış anam bu sözləri eşidib bizi müdafiə etdi.

– Nə vaxtlarıdır, elektrikdən başları çıxa?! Özün düzəlt, uşaqları tok-zad vurar.

– Bunların nəyi uşaqdır? – deyib atam güldü – yekə kişilərdir, bu gün-sabah dördüncü sinfi qurtarırlar. Bu yaşda mən anamı, körpə bacılarımı saxlayırdım.

Əlbəttə, atamın sözləri daha çox bizim ürəyimizdən idi. Çünki biz özümüzü uşaq hesab etmirdik. İstəyirdik ki, hamı bizimlə yekə adam kimi rəftar eləsin. Analar hamısı belədir, bağçaya gedəndə də bizə uşaq deyirlər, birinci sinifdə oxuyanda da, dördüncü sinfi qurtaranda da. Uşaq, uşaq!.. Elə bil ki, bizim necə böyüdüyümüzü görmürlər...

Atam aynabəndin orta pəncərəsinin altındakı rozetkanı və cücələri qoyacağımız küncü göstərib dedi:

– Burdan bura işıq çəkməliyik. İndi ölçün, gedin, məftil gətirin, məftilin bir başına lampoçka bağlayın, o biri başında ştepsel olsun, məftili pəncərə taxtasının altı ilə aparın, lampoçka bağlamağımız ucunu yeşiyin içinə salarsınız. Bu biri ucunu rozetkanın üstündə bərkidin. Bu biri ucunu rozetkanın üstündə bərkidin. Yandırmaq istəyəndə ştepseli salarsınız rozetkaya, söndürmək istəyəndə çıxararsınız. İndi işə başlayın. Mən getdim, yarım saat dincələcəyəm, ayağa duranda işi təhvil alacağam!

2

Hər şey aydın idi. Mən qaçıb elektrik məftili, ştepsel, rozetka, çəkic, mıx və sairə olan qutunu açdım. Lazım olan şeyləri gətirdim. Biz əvvəlcə rozetka ilə küncün arasını ölçərək lazım olan qədər ağ məftil kəsib ayırdıq. Özü də yarım metr artıq kəsdik ki, ehtiyat olsun, arxayın işləyək. Çünki məftil qısa kəsiləndən sonra calaq eləmək lazım gəlir. Calaq isə pis və çirkin görünür. Bir az uzun olanda isə eyib

etməz, artığı ya kəsirsən, ya da qatlayıb iplə bağlayırsan. Düzdür, bu da o qədər gözəl olmur, ancaq hər halda calaqdan yaxşıdır. İşimiz yaxşı getsin, vaxtında qurtaraq deyə biz hərəmiz işin bir hissəsini görməyi qərara aldıq. Pəncərə taxtasının altına hər metrdən bir qarqara vurmağı və ştepseli məftilin ucuna bağlamağı Səfa boynuna götürdü, mən də patronu məftilin bu biri ucuna bağlamağa başladım. Biz elə həvəslə, elə ürəklə işləyirdik ki, ikimizin də yanaqları qızarmışdı.

– Elektrotexnik yaxşı sənətdir! – deyib Səfa işləyə-işləyə danışdı. – Belə balaca bir iş bizə bu qədər ləzzət verir, gör indi Mingəçeviri tikənlər nə ləzzət alıblar!..

Mən tez-tələsik və ciddi səslə Səfanın səhvini düzəltdim:

– Mingəçeviri elektriklər tikməyiblər.

– Bəs kim tikib?

– İnşaatçılar! Bəli.

– Deməli, ikimərtəbəli evi tikən də inşaatçıdır, o boyda Mingəçeviri tikən də?! Bilmədiyin sözü danışma.

– Hamısı inşaatçıdır! – deyib mən qəti olaraq təsdiq etdim – elektriklər isə stansiya hazır olandan sonra işləyənlərə deyirlər! Bildin ki?

– Hər halda mən böyüyəndə elektrik mühəndisi olacağam. Xoşuma gəlir...

Doğrudan da, Səfa öz işilə sübut elədi ki, o gələcəkdə elektrik mühəndisi ola bilər. Mən patronu məftilin ucuna bağlayana qədər o, üç qarqaranı bərkitmiş və ştepseli də bağlamışdı. Mənə də kömək eləmək istəyəndə qoymadım:

– Yaxşısı budur süpürgəni gətir, döşəməni süpür, bilirsən ki, anam təmizlik sevir...

Doğrudan da, döşəmə məftil qırıntıları, xırda mıxlar, qarqaralar və sairə ilə dolu idi. Səfa onları yığışdırana və zir-zibili süpürüb təmizləyənə qədər mən də patronu bağlayıb lampoçkanı saldım. Biz atamın hələ yatdığından istifadə edib tez cücələri karton qutuya yığdıq, gətirib aynabəndə qoyduq, taxta yeşiyə atam deyən kimi yandan balaca bir qapı açdıq, üstünü diktlə örtdük, ancaq diktin ortasında patron keçə bilən bir deşik açdıq. Sonra gətirib yerinə qoyduq. Patronu içəri saldıq, lampoçkanı bağladıq. Məftilin uzun hissəsini yığıb bükərək iplə sarıdıq və yeşiyin üstündə möhkəmlətdik ki, açılmasın. Cücələri yeşiyə doldurduq.

– Ştepseli salıram? – deyib Səfa məni xəbərdar etdi.

– Sal görüm!

Yeşiyin içindəki lampoçka yananda bizim sevincimiz yerə-göyə sığmadı. İki dəqiqə keçməmiş lampoçka qızan kimi cücələr onun dövrəsinə yığışdılar. Biz hiss edirdik ki, isti onlara ləzzət verir. Çünki onlar bir-birini sıxaraq lampoçkaya yaxın olmağa çalışırdılar. Bir az sonra canları qızanda isə artıq bir-birini sıxışdırmaqdan əl çəkdilər, daha aralı və rahat dayandılar. Bəziləri ayaq üstəcə mürgüləyir, bəziləri də uzanaraq qolunu, qanadını açıb xumarlanırdı. Biz onlara tamaşa etməkdən doymurduq və gözümüzə başqa heç şey görünmürdü. Ona görə də atamın və anamın havaxt gəldiklərini bilmədik. Onlar aynabəndin qapısında duraraq gülən gözlərlə bizə baxırdılar. Anam heyrətini saxlaya bilmədi:

– Aa, doğrudan nə yaxşı düzəldiblər!..

– Sən də deyirsən ki, uşaqdırlar, bunlar yekə kişidir! – deyib atam işimizi təhvil aldı, – ancaq uşaqlar, cücələri burda çox saxlamaq olmaz. On beş, iyirmi gün sonra bir az ki, böyüdülər, havalar da qızdı, hinə keçirərsiniz, çünki aynabəndin döşəməsini xarab edərlər. Bir də ki, havada, qumun içində eşələnsələr yaxşıdır.

Biz Səfa ilə qərara aldıq ki, o zamana kimi həyətdə cücələrə təzə hin düzəldək. Çünki, köhnə hin çox dar və qaranlıqdır.

## DÖRDÜNCÜ FƏSİL

### 1

Aynabənddəki yeşiyin içində gecə-gündüz lampoçka yanır, cücələrim onun işığında qızınaraq getdikcə qol-qanad açırdılar. Onların yeməyinə özüm baxırdım. Atam on kiloqram çox narın dən tapmışdı. Bu dəni onlar yaxşı yeyirdilər, lakin mən kitabda oxumuşdum ki, ancaq dən azdır, gərək yeməklərinin içində göy-göyərti də olsun. Mən həyətimizdə divarların dibində, gün tutan tərəflərdə bitən cincilim, şüyüd, yonca, qazayağı və başqa göy-göyərti yığır, xırda-xırda doğrayıb onların qabağına tökürdüm. Bəzisini yeyir, bəzisini dimdikləyib atırdılar. Anamdan xahiş etmişdim ki, xörəkdən sonra qabları yumamış diblərini siyirib bir nəlbəkiyə yığsın və mənə versin. Çünki cücələr qabların dibində qalan tör-töküntü üçün özlərini öldürürdülər. Onlar mənim gözümün qabağında böyüyüb artır, canlanırdılar. Artıq ayna-

bənddə gəzib dolanmadıqları yer yox idi. Hətta mənə çox zəif görünən və öləcəyindən qorxduğum balaca kəkilli cücə də dirçəlib böyümüşdü. Artıq yemək-içmək zamanı onu itələyib sıxışdıra bilmirdilər.

Səfa mənim cücələrim barədə bütün sinfə səs salmışdı. Hətta söz gedib Çimnaz müəlliməyə də çatmışdı. Buna görə də mən bir az ondan incimişdim.

– Nə olub məgər, aləmə car çəkmisən?! – deyib bir dəfə mən onun qabağını kəsdim.

– Mən car çəkməmişəm, – dedi, – bir Fatmaya demişəm, bir Həsənə, bir də Hüseynə. Yəqin onlar yayıblar.

– Bundan sonra sənə heç bir söz deməyəcəm. Dilini saxlamırsan!

Səfa məndən incidi.

– Demirsən demə, çox ölürdüm sənin sözün üçün!

Mən dönüb getdim və ondan daha bərk incidim. Ürəyimdə dedim ki, "bu da özünü yoldaş hesab edir, hələ mənnən bir əhd də bağlayır ki, heç vaxt yoldaşlığa xəyanət eləməyəcək. Özü isə bircə sözdən inciyir!".

Ancaq elə həmin günün axşamı Səfa Fatmanı, Həsəni və Hüseyni götürüb bizə gəldi. "Cücələrini göstər!" deyib heç şey olmamış kimi mənə müraciət etdi. Belə düşündüm ki, onu acıqlı qarşılamağım yaxşı olmaz. Yoldaşdır, gəldi, gərək hörmət eləyəsən. Bir də ki, indi mənim özümün də ürəyim yumşalmışdı. Səhərki acıqlı danışığımız mənə mənasız görünürdü. Yəqin ki, Səfa da belə düşünür, ona görə də Fatmagili götürüb gəlib bizə.

Yoldaşlarım cücələrlə doyunca oynadılar. Mənim cücələrim onlara toyuq altından çıxan cücələrdən daha xoş gəlirdi. Birinci, ona görə ki, çox diribaşdılar, ikinci də, bunları istədiyin qədər oynada bilərsən; istədiyini tutub əlinə alırsan, o yan-bu yanına baxırsan. Analı cücələrə isə yaxın düşmək olmur, o saat toyuq özünü atır üstünə. Düzdür, bunların çoxu ağ olur, analılar isə rəngbərəngdir. Nə olar ki, mən ağ cücələri bəyənirəm, amma mənim cücələrimin içində bir ala-bəzəyi də var. Kəkilli cücəni deyirəm. Getdikcə onun kəkili böyüyür, at tükləri də sarı qırmızıya çalmağa başlayır. Əntiqə şeydir. Nə yaxşı ki, islandığı gün onu qurutdum, qoymadım soyuq dəysin!

Beləliklə, məktəbdə də, evdə də mənim işlərim yaxşı gedirdi. Çimnaz müəllimə də, atam-anam da məndən razı idi. Dərslərimi vaxtında hazırlayır, cücələrimə yaxşı baxır, anamın tapşırıqlarını yerinə yetirirdim. Doğrudur, hərdən məni mərkəzi hücumçu eləyəndə futbola

başım qızışırdı, vaxtında evə gəlmirdim, lap qaş qaralana qədər top vururdum. Ancaq belə hallarda da anam məni yüngülcə danlamaqla kifayətlənirdi. Mən də özümü yığışdırıb dərslərimi mütləq hazırlayırdım. Hazırlıqsız dərsə getmək mənim nəzərimdə bağışlanmaz günah idi. Mən belə öyrənmişdim və dərsə hazırlıqsız gələn uşaqları heç cür anlaya bilmirdim. Ancaq bir dəfə sinfimizdə bir hadisə baş verdi ki, o hadisəni mən unuda bilmirəm, çünki o bir yandan belə uşaqları anlamağıma kömək etsə də, o biri yandan məni çox kədərləndirdi.

Çimnaz müəllimə bizə əzbərləmək üçün bir şeir vermişdi, şeir pioner qalstuku haqqında idi. Şeirdə pioner qalstuku yaz səhərinin şəfəqi ilə müqayisə edilirdi. Deyilirdi ki, bu qalstukun rəngi ona görə qırmızıdır ki, həm azadlıq yolunda axıdılan qanlardan, həm də işıqlı gələcəkdən xəbər verir. Bu, inqilab, təmizlik və doğruluq deməkdir. Onu taxan gərək sözündə və işində doğrucul olsun.

Şeir xoşuma gəlirdi və sinifliklə qərara almışdıq ki, onu əzbərləməmiş bir şagird qalmasın. Müəllimə bu şeri bizə həftənin əvvəlində tapşırmışdı. Demişdi ki, yaxın dərslərin birində soruşacaq. Üç gün sonra isə müəllimə hesabdan evə iş verdi və dedi:

– Uşaqlar, keçən dəfə maarifdən gələn yoldaş dəftərlərinizi yoxlayıb, ümumiyyətlə sinifdən razıdır. Ancaq beş məsələdə iki və hətta üç səhv buraxanlar var. Bəziləriniz düz eləyib, amma çirkli yazıb. Bu dəfə daha diqqətli olun. Gərək elə edəsiniz ki, sizin sinifdə bir nəfər də dörddən aşağı qiyməti olan qalmasın. Söz verirsinizmi?

Hamımız bir səslə dedik:

– Söz veririk!

Dərsdən sonra çantalarımızı götürüb həyətə çıxdıq. Mənim fikrim evə verilən hesab işində və cücələrin yanında olduğundan birbaş evə getmək fikrində idim. Lakin həyət qapısından çıxan yerdə Səfa məni daldan səsləyib saxladı. Mən elə bildim ki, futbol oynamağa çağırır, ona qulaq asmamış dedim:

– Bu gün oynamaq istəmirəm, sən də get evə, dərslərini hazırla, gördün ki, müəllimə nə dedi.

– Əşi futbol nədir! – deyib Səfa həvəslə danışdı, – dənizə qayalar üstünə gedirik, balıq tutmağa. Gəl gedək!

Bu təklif əvvəlcə məni də həvəsləndirdi. Çünki bu gün çox gözəl hava idi. Gün çıxmışdı, nə xəzri əsirdi, nə gilavar, mart ayında belə sakit və günəşli hava Bakıda az-az olur.

– Bəs dərslər! – deyib mən tərəddüd içində soruşdum.

– Nə var ey, bir-iki saat balıq tutub dəniz qırağında oynarıq. Sonra gəlib dərsləri elərik! – deyib Səfa məni razı salmağa çalışdı. O, danışdıqca mən həm ona qulaq asır, həm də düşünürdüm, öz fikrimdə ölçüb-biçirdim ki, gedim ya getməyim. Yadıma düşdü ki, hələ şeri də əzbərləməmişəm, bu yandan da hesab məsələləri, cücələr... Qərara aldım ki, balıq tutmaq, sahildə yumşaq qumun üstündə o yan-bu yana qaçıb oynamaq nə qədər xoş olsa da getməyəcəyik. Bir dəstə uşaq kənarda durub mənim cavabımı gözləyirdi. Sanki fikrimdən keçənləri bilmiş kimi Hüseyn istehza ilə Səfaya dedi:

– Bu yana gəl, onu apara bilməzsən. Gərək həmişə nümunə olsun!

Həsən isə bir az da ucadan və bir az da istehzalı səslə:

– Eqoist! – deyib mənə baxdı.

Mən əvvəlcə bu hücumların qabağında pərt oldum. İstədim, onlara qoşulub gedəm, çünki, hiss edirdim ki, getməsəm inciyəcəklər. Lakin "eqoist!" sözü ağızdan-ağıza gəzib təkrar olunanda mən fikrimi dəyişdim. Öz-özümə dedim ki, getsəm elə bilərlər ki, mən zəifəm, xaraktersiz adamam. Bundan sonra hər nə oldu bu cür yersiz hücumlarla məni özlərinə tabe etməyə çalışarlar, ona görə də nəinki özüm getmədim, qərara aldım ki, Səfanı da qoymayım.

– Dəniz, balıq həmişə var! – dedim. – Gələn həftə də, o biri həftə də. Dərsləri isə müəllimə sabah yoxlayacaq.

– Yoxlasın, nə olar ki. Gec qayıtsaq, gəlib səndən üzünü köçürərəm.

– Mən verməyəcəyəm üzünü köçürəsən. Zəhmət çək özün həll elə!

– Verməzsən vermə, çox lazımdır! – deyib Səfa uşaqlara qoşulub balıq ovuna getdi.

2

Mən evimizə gəldim. Cücələrimi yemlədim, yerlərini təmizlədim, sularını təzələdim. Sonra anam dedi ki, iki tikə çörəyimiz qalıb, özü də boyatdır, get çörək al, atan gəlib təzə çörək yesin. Gedib məhəlləmizin tinindəki dükandan çörək alıb gətirdim. Hələ gün batmamış oturub hesab məsələlərini və başqa dərslərimi elədim, axırda da evin dal tərəfinə çəkilib qalstuk haqqındakı şeri əzbərlədim.

Səhər məktəbə gələndə Fatma məni dəhlizdə qarşıladı. Bir kənara çəkib həyəcanlı-həyəcanlı və yavaşca soruşdu:

– Ev işini eləmisən?

– Eləmişəm!

– Mən də eləmişəm, şeri necə, əzbərləmisən?

– Əzbərləmişəm!

– Mən də əzbərləmişəm. Səfagil deyir ki, gərək müəlliməyə deyək, bu gün heç kəs ev işini eləməyib.

Mən Fatmanı başa düşmədim, daha doğrusu onun dediyini birdən-birə qavraya bilmədim.

– Sən nə danışırsan, açıq de görüm, necə yəni eləməmişik?!

– Səfa məsələni eləyənlərin hesab dəftərini yığır. Deyir ki, dərsdən sonra qaytaracaq özlərinə. Gərək bütün sinif birağızdan desin ki, eləməmişik.

– Mən deməyəcəyəm! Bu nə sözdür?!

Bu zaman Səfa mənə yaxınlaşdı və əlini çantama uzatdı:

– De, hesab dəftərini bəri ver!

– Nə üçün? – deyib mən özümü bilməməzliyə vurdum.

– Yaxşı, yaxşı, bəs Fatma səhərdən sənə nə deyir!.. Ver dəftəri!..

Bu zaman başqa uşaqlar da başımıza yığışdılar. Məni səkə-çəkə sinfə apardılar.

– Dəftəri ver, – deyib hər tərəfdən üstümə düşdülər, – adam xain olmaz!

– Necə yəni xain? – deyib mən heyrətlə soruşanda Hüseyn qabağıma gəldi.

– Ada başa düş, yoldaşlarımızın çoxu nə şeri əzbərləyib, nə məsələləri həll edib. Onları satmamaq üçün qərara almışıq hamımız deyək ki, müəllimə, hazır deyilik. Nə olsa qoy hamımıza olsun!

Mən etiraz etmək istəyəndə uşaqlar yer-yerdən düşdülər üstümə. Gördüm ki, Səfagil bütün sinfi alıblar əllərinə, təkcə mən çıxıb cavab versəm və ya dəftərimi göstərsəm, yoldaşlarım hamısı məndən inciyəcək, üz döndərəcək. Mən onların dediyinə razı oldum və bütün bədbəxtlik də burdan başladı.

Sinfə girən kimi Çimnaz müəllimə uşaqları sakit edib qara, mehriban gözlərilə hamımıza nəzər saldı və oturub jurnalda "hazır-qayib" edəndən sonra ayağa durdu:

– Dəftərləri açın, hesab məsələlərini yoxlayacağam.

Uşaqlar qışqırdılar ki, "müəllimə, eləməmişik!" Müəllimə duruxsunub qaldı. Sonra soruşdu:

– Heç kəs eləməyib?!

– Heç kəs! – deyib Səfa, Hüseyn və Həsən yerindən qışqırdı.

Mənim ürəyim tappatap döyünürdü, qorxurdum ki, müəllimə üzünü mənə tutub soruşa, mən nə hə, nə yox, deyə bilməyəm. Müəllimәni aldatmaq mənə çox ağır gəlirdi. Bu yandan da yoldaşlarımı incitmək istəmirdim. Müəllimə məni görməsin deyə bu gün bir az qısılıb oturmuşdum və başımı aşağı dikmişdim. Ancaq hiss etdim ki, müəllimənin nəzərləri mənim üstümdən sürüşüb, yazıq Fatmanın üstündə durdu:

– Fatma, sən də eləməmisən?!

Fatma cavab verməyib başını aşağı dikdi, o qədər aşağı dikdi ki, biz çevrilib ona baxanda bilmədik ağlayır, yoxsa özünü saxlaya bilib.

– Pərviz, sən də eləməmisən? – deyib, nəhayət, müəllimə mənə müraciət etdi. Mən nə cavab verdiyimi, səsimin nə cür çıxdığını bilmirdim. O yadımdadır ki, müəllimə dedi:

– Aydın de görüm, nə deyirsən?

– Müəllim, deyir ki, eləməmişəm! – deyib Hüseyn mənim yerimə cavab verdi. Müəllimə başını bulayıb şeri soruşdu. Təqribən eyni sual-cavabın təkrarından məlum oldu ki, heç kəs şeiri əzbərləməyib.

– Bu məsələni gərək direktora çatdıram! – deyib Çimnaz müəllimə kədərli-kədərli bizi süzdü və sonra tez dərsə keçdi.

Lap axırıncı dərsdə direktorumuz sinfə gəldi və bugünkü hadisədən çox narazı olduğunu dedi:

– Belə şey görünməyib. Necə olur ki, iyirmi beş uşaqdan bir nəfər şüurlusu tapılmır, bu mümkün deyil! Yəqin əvvəlcədən yığılıb sözbirdilbir olmusunuz. Bu nə deməkdir? Bu o deməkdir ki, siz öz borcunuzu unutmusunuz, gələcəyinizi düşünmürsünüz, müəllimlərin, ata-ananızın əməyini yerə vurursunuz, yəni xalqın əməyini yerə vurursunuz. Axı, bu məktəb xalqındır, siz də xalqın balalarısınız!

Söhbət onunla qurtardı ki, sabah dərsin axırında bütün valideynlər məktəbə yığışsın. Məktəbdə oxuduğum gündən birinci dəfə idi ki, mənim başıma belə hadisə gəlirdi. Fikir məni aparmışdı. Bilmirdim əhvalatı ata-anama deyim... Ümumiyyətlə deyim, ya yox?

## BEŞİNCİ FƏSİL

### 1

Dərsdən sonra evə getməyə bir ayağım gəlirdi, biri yox. Məktəbin həyətindən çıxanda daldan Səfanın səsini eşitdim, dayandım. O gəlib çatan kimi soruşdum:

– İndi nə edək?

– Necə nə edək? – deyib o təəccüblə soruşdu. – Bərk durmaq lazımdır... Yoldaşları satmaq olmaz!..

– Heç bilmirəm atama nə deyəcəyəm?

– Bilirsən, gəl bu gün evdə heç bir söz deməyək. Elə ki sabah səhər atalarımız işə getdi, onda analara xəbər verərik məktəbə gəlsinlər.

– Bəs sonra?

– Onu mən özüm də bilmirəm. Baxarıq görək nə deyirlər?

– Günah səndədir! – deyib mən Səfaya qarşı ürəyimi dolmuş acığı bildirdim, – uşaqları balıq tutmağa aparmasaydın, belə də olmazdı.

– Balıq tutmağı birinci dəfə Hüseyn dedi. Mən də həvəsləndim. Özümü saxlaya bilmədim.

– Çox da həvəsləndin. Adam hər həvəsləndiyi şeyi eləməz. Gərək baxasan nə vacibdir, birinci onu eliyəsən, bəs ağıl adama nə üçün verilib?

– Mən özüm də bunların hamısını qanıram. Ancaq özümü saxlaya bilmirəm. Bəlkə ona görə ki, mənim qabiliyyətim yoxdur. Allah məni belə yaradıb?

Səfa şuluqçu olsa da, ürəyiaçıq oğlandır. Heç vaxt fikrini yoldaşından gizlətməz, nöqsanını da boynuna alandır. Elə buna görə də ondan ayrıla bilmirəm, neçə dəfə söz-sözə gəlmişik, neçə dəfə demişəm ki, bir də onunla dostluq eləməyəcəyəm, ancaq bu xasiyyətinə görə yenə barışmışam – ürəyi kinli deyil, gizlində söz saxlamaz. İki şeydə mənim ona yazığım gəlir, istəyirəm kömək eləyim: bir odur ki, özünü saxlaya bilmir, dərs zamanı danışmaq istəyir – danışır, dərsdən sonra evə getmək əvəzinə futbol oynamaq istəyir – oynayır, ürəyindən balıq tutmaq keçir – gedib tutur. Amma bunların heç birini eləmək olmaz, çünki hamısı ona zərərdir, dərslərinə mane olur. Müəllimləri də, anasını-atasını da incidir. Necə olsa gərək Səfaya bunu başa salam. İkinci də

odur ki, heç özünə inanmır. İnanmır ki, istəsə hesabdan əlaçı oxuya bilər. İstəsə gələcəkdə yaxşı mühəndis olar. Deyir ki, "adamın bəxtinə nə yazılıb o olacaq, bəxti yazan da Allahdır, çalışmaqla deyil. Mənim nə bəxtim var, nə qabiliyyətim". Deməli Səfanın iradəsini əlindən alan, çalışmağa qoymayan Allahdır. Odur ki, Səfa üçün mən Allahnan mübarizə etməli olmuşam.

– Bəs niyə Allah sənə nə bəxt verib, nə qabiliyyət? Neyləmisən Allaha? Amma səndən pislərinə bəxt də verib, qabiliyyət də.

– Bilmirəm, mənə heç birini verməyib.

– Görünür, Allah səninlə düşmənçilik eləyir. Sən də ona inanma!

– Elə söz demə, ağzın-gözün əyilər. Anam deyir ki, kim Allahın dalınca danışsa, o saat dilini ağzından çəkib çıxardır, eləyir lal... Neçə dəfə görüblər!

– Hamısı yalandır, atam deyir ki, Allah-zad yoxdur, hər şey insanın özündən asılıdır. Çalışsa hər şeyi bacarar...

– Allah yoxdur, bəs bizi kim yaradıb? – deyərək Səfa məni çətinə salmaq istədi, – anam deyir ki, dünyada hər şeyi, hər şeyi Allah yaradıb!

Mən də ona elə sual verdim ki, heç cavab tapa bilməsin.

– Allah var, bəs onda biz onu niyə görmürük?

– Çünki, Allah göydədir, lap, lap uca göydə ey, buludların üstündə!

– Düz demirsən. Mən keçən il atamla Moskvaya gedəndə təyyarəyə minib lap buludların üstünə çıxmışdım. Buludlar hamısı qalmışdı aşağıda. Şəhərlər, evlər heç biri görünmürdü. Yuxarıda mən hər tərəfə baxdım, Allah-zad görmədim... Heç şey görmədim. Bircə günəşin işıqlarından başqa heç şey yox idi!

– Allah olan yerə təyyarə gedib çıxa bilməz. Allah oradan da hündürdədir.

– Bəs kosmik gəmi necə? O ki lap hündürə uçub. Qaqarin də göydə Allah-zad görməyib!

Allah barədə nə o məni inandıra bildi, nə mən onu. Elə-belə də ayrıldıq. Mən fikir elədim ki, bu barədə pioner toplanışında söhbət salım, Allahın məsələsini həll edək. Çimnaz müəllimə də olsa lap yaxşı olar. Bu gün sinfimizdə baş verən hadisə barədə isə mən Səfanın dediyi kimi elədim. Axşam evdə heç bir söz demədim. Bilirəm ki, desəm, anam yatana qədər deyinəcək. Atamın isə qanı qaralacaq. Fikir eləyəcək ki, görəsən mənə nə olub, bəlkə pis uşaqlara qoşulmuşam, ona görə dərslərdən soyuyuram.

Evdə axşamımız yaxşı keçdi. Mən cücələrimə baxdım, anamın tapşırıqlarını yerinə yetirdim. Özümdən asılı olmayaraq bu gün anamın səsi çıxan kimi dərhal “bəli” ana!” – deyib cavab verirdim. Nə dedi, o saat əməl edirdim, elə bilirdim ki, bir balaca gec tərpənsəm başa düşəcək ki, nə isə olub, məni sıxışdıracaq, mən də deyəcəyəm, evdə qanqaralıq əmələ gələcək. Dərslərimi də vaxtında hazırladım. Həmişəkindən bir az da tez gedib yerimə girdim.

Səhər mən yerimdən duranda artıq atam yox idi. O, mədənə getmişdi. Atam Suraxanıda işlədiyindən səhər altıda durur, saat yeddidə evdən çıxır ki, vaxtında işində olsun. Adətən o getməmişdən on dəqiqə qabaq mən də yatağımdan qalxıram. Bu gün onunla göz-gözə gəlməmək üçün qəsdən yatıb qaldım, oyaq olsam da özümü yuxululuğa vurub durmadım, qorxurdum, gözümə baxanda bir şey başa düşə.

2

Günah nə pis şey imiş! Sən çalışırsan onun izini itirəsən, onu basdırasan, gizlədəsən, o bir az da böyüyür, yumurlanır, gözə soxulur. Bizimki də belə oldu. Anam məktəbə üzügülər gəlmişdi, oradan bulud kimi tutulub çıxdı. Çünki mən bilirəm, bu hadisə anam üçün gözlənilməz idi. O heç gözləmirdi ki, mən belə şey eləyə bilərəm. O elə bilirdi ki, həmişəki kimi olacaq, müdir bəzi valideynlərə uşaqlarının dərslərinə baxmağını tapşıracaq, mənim adımı isə təriflənənlərin sırasında çəkəcək, anam da fəxr ilə durub gələcək evə. Amma tərsinə olmuşdu. Həmişə yaxşı oxuyan uşaqlar barəsində bu gün daha çox danışmışdılar. Müdir də, müəllimə də təəccüb edirdilər ki, niyə sinifdə belə hadisə baş verib. Anam məktəbdən gələn kimi bütün bunları mənə danışıb dedi:

– Axı, o gün sən dərsini elədin, mən həmişə sənə fikir verirəm, neylədin, hamısını görürəm! Soruşmuram deyə elə bilmə ki, gözüm bağlıdır, baxmıram, baxıram, hamısını görürəm! Sən o gün dərsini eləmisən, bu nə işdir?!

Mən istədim açam hamısını anama deyəm. Çünki fikirdən anamın gözəl üzü qaranlıqlaşmışdı. Həmişəki kimi ağ və işıqlı görünmürdü. Bu da mənim ürəyimi sıxırdı. Lakin birdən xəyalıma gəldi ki, anam sabah gedib müəlliməyə deyəcək, müəllimə müdirə çatdıracaq, axırda da bütün sinfin qabağında mən yoldaşı satan, xain çıxacağam. Yox, mən istəmirəm, xain olmaq, yoldaşlarımı satmaq istəmirəm! İndi ki,

hamımız birlikdə günahı eləməyə razı olmuşuq, gərək cəzasını da birlikdə çəkək. Anam nə qədər çalışdı, mən şeri əzbərlədiyimi, hesab məsələlərini həll etdiyimi boynuma almadım. İstədim günahları yıxam cücələrin üstünə deyəm ki, onlara başım qarışıb. Sonra fikrimə gəldi ki, elə desəm atamın acığı tutar, dərhal cücələri rədd edər, onda qüssədən ürəyim partlar!.. Odur ki, dedim:

– Başım nağıl oxumağa qarışıb.

– Dəftərini mənə göstər, ver görüm! – deyib anam sakit olmadı.

– Yaxşıdır ki, dəftərim Səfada qalmışdı, yoxsa biabır olacaqdım. Anam mənim sözümə inanmayıb çantama baxdı, dəftər-kitabımı alt-üst elədi, lakin istədiyi dəftəri tapa bilmədi. Mən oturub dərslərimi hazırlasam da, fikrim həyətdə idi, atamın gəlməsini gözləyir, özümü daha əzablı imtahana hazırlayırdım. Anam ancaq çörəkdən sonra əhvalatı atama nəql etdi. Atam xeyli müddət danışmadı. Fikrə gedib mənə baxdı. Düzdür, atamın sükutu məni anamın uzun danlağından daha çox sıxsa da, onun az danışmağı, məni sorğu-suala çəkməməyi çox xoşuma gəlirdi, onu mənim nəzərimdə çox ucaldırdı. Nəhayət:

– Söz ver ki, bir də belə şey olmayacaq! – deyib atam ağır-ağır danışdı.

Mən söz verdim və ürəyimdə özümə dedim ki, heç vaxt bu dəqiqəni unutmayacağam, atama verdiyim sözü pozmayacağam!..

O hadisədən sonra Çimnaz müəllimə ev işlərini bir az da artırmışdı və tez-tez dəftərlərimizi yoxlayırdı. Direktorumuz da bir neçə dəfə sinfə gəlmiş, ev dəftərlərimizə baxmışdı. Mən artıq nə futbola, nə də başqa bir oyuna aldanıb dərsdən sonra evə gec gəlmirdim. Elə o günün sabahı Səfaya dedim:

– Gəl kişi kimi söz verək, hamı dərslərdən qiymətlərimiz əla olsun!

Bu dəfə Səfa həmişəki kimi birdən-birə “yaxşı” demədi.

– Əlaya söz vermirəm, amma dördə söz verirəm.

– Yaxşı, mən razıyam. Bu il çalış dörddən aşağı qiymətin olmasın. Gələn il beşə oxuyarsan. Axı, adam dərsin qabağını yaxşı biləndə dalı da asan olur.

Səfa razılaşdı və mənim canıma and içdi ki, nə olur olsun sözündən dönməyəcək. Beləliklə, biz hər gün dərsdən sonra görüşürdük. Bir yerdə oynayır və dərs hazırlayırdıq. Ya o bizə gəlirdi, ya mən onlara gedirdim. Əlbəttə, o daha çox gəlirdi, çünki bizdə cücələr vardı.

Aprel ayı qurtarmaqda idi. Bizim həyətdə qaysı, alma və armud ağacları gül açmışdı. Hər il bu vaxt ağaclar güldən düşər, yaşıl yarpaqların arasından noxud boyda meyvələr görünərdi. Bu il yaz gecikmişdi, havalar soyuq keçmişdi, ona görə də ağaclar gec gül açmışdılar. İndi bizim bir işimiz də artmışdı: güldən düşən kimi ayda iki dəfə ağaclara su vermək, gül vaxtı ağaclara su vermək olmaz. Müəllimə deyir ki, su ağacın canına səkkiz atmosfer təzyiqilə yeriyir. Çiçək zəif olduğundan su vurub onu atır. Ona görə də gül vaxtı su içən ağacların meyvəsi az olur.

Məktəbimiz və bütün Şüvəlan qəsəbəsi aprel və may bayramına hazırlaşırdı. Bizim sinif dəhlizin divarını plakat və şüalarla bəzəməli idi. Çimnaz müəllimənin rəhbərliyi ilə hərəmiz bir iş görürdük. Şüarları yazmaq Səfaya tapşırılmışdı. Bu iş onun heç də qabiliyyətsiz olmadığını göstərdi. Elə gözəl yazmışdı – lap şəkil kimi. Müəllimə baxıb onu təriflədi: “Səndən yaxşı rəssam olar!” – dedi. Mən də, Səfa da çox sevindik. Bu zaman onun qiymətləri də düzəlmişdi. Hamısı dörd idi. Bütün bunları görən Çimnaz müəllimə bizimlə daha mehriban rəftar edirdi. Hərdənbir dərs qabağı və ya dərs qurtarana yaxın bizim kənar sözlərimizə qulaq asır, suallarımıza cavab verir, başa düşmədiyimiz məsələləri başa salırdı. Bir dəfə aprel və may bayramından söhbət saldı. Bayramın havaxt əmələ gəldiyindən, mənasından danışdı. Çimnaz müəllimə elə aydın, elə gözəl danışır ki, biz hamımız maraqla ona qulaq asırıq. Həm sözləri aydın və gözəl deyir, həm də səsi gözəldir. Mənim ürəyimdə hamıdan gizlin bir neçə arzum var və biri də odur ki, Çimnaz müəllimə kimi gözəl və aydın danışım!

Bayram haqqındakı söhbətdən sonra Çimnaz müəllimə soruşdu:

– Kimin nə sualı var?

Fatma əlini qaldırdı:

– Müəllimə, bayramdan kənar sual vermək olar?

– Olar! – deyib müəllimə icazə verdi.

– Müəllimə, bəxtə inanmaq olar, olmaz? – deyib Fatma nazik səslə soruşdu.

– Niyə soruşursan, Fatma? Yəqin ki, kiminləsə mübahisəniz olub, hə? – deyərək müəllimə Fatmadan xəbər aldı. Fatma pörtüb qızardı, cavab vermədi.

Fatma da mənim kimidir. Yalan danışa bilmir, yalan danışanda özünü elə itirir ki, o saat yalan dediyi bilinir. Mənim yadıma Səfa ilə olan mübahisəmiz düşdü. Mənim yadıma Səfa ilə olan mübahisəmiz

düşdü. Mən hələ bəxt və Allah barədə pioner yığıncağında söz aça bilməmişdim. Bunun iki səbəbi vardı. Biri o idi ki, yığıncaqlarımız çox tələsik və səsli-küylü olmuşdu, ikinci də Səfa ilə bu barədə çox danışmışdıq. Mənə elə gəlirdi ki, Səfa özü də deyəsən indi əvvəlkindən artıq öz qüvvəsinə inanmağa başlamışdı.

Fatmanın susub qaldığını görən Səfa əlini qaldırdı. Müəllimə ona söz verdi:

– Müəllimə, bizim mübahisəmiz olub; mən deyirəm adamın gərək bəxti olsun, Fatma deyir ki, bəxt-zad boş sözdür!

Səfa oturmaq istədi. Lakin müəllimə qoymadı:

– Mən istəyirəm, hərə öz fikrini sübut eləsin, dəlil gətirsin – bəxtə inananlar da, inanmayanlar da. Odur ki, sən başla, de görək, nəyə əsasən bəxtə inanırsan?

– Ona əsasən inanıram ki, müəllimə, neçə dəfə sınamışam, məsələn, elə bu gün olub ki, mən də dərsimi hazırlamamışam, Hüseyn də, amma siz müəllimə, məndən soruşmusunuz, Hüseyndən yox. Nə üçün? Çünki Hüseynin bəxti var, mənim bəxtim yoxdur. Hər şeydə də belə.

– Yaxşı, Fatma indi sən də görək, niyə bəxtə inanmırsan?

– Çünki, bəxt olsaydı, müəllimə, Səfanın da köməyinə çatardı, sizi Səfadan dərs soruşmağa qoymazdı. Deməli bəxt yoxdur.

– Səfa buna nə deyirsən?

– Bilmirəm, müəllimə, mənim ki, bəxtim yoxdur, varsa da həmişə yatıb qalır.

Hamı güldü. Müəllimə özü də güldü. Lakin sonra sinfi sakit eləyib dedi:

– Uşaqlar, sizə bir hekayə danışacağam. Nəticəni özünüz çıxardın. Bir kolxozda iki briqadir var imiş: biri Əli, o biri Məhəmməd. Əli heç bir işini vaxtında görməzmiş, şumu gecikdirərmiş, torpağa toxumu gec səpərmiş, peyini-gübrəni gec verərmiş, suyun vaxtını ötürərmiş, Məhəmməd ağacların dibini mart ayında belləyib-boşaldanda o aprelin axırında ayılarmış, yayda və payızda onun sahəsi hamınınkından az məhsul verəndə deyərmiş: “Neyləyim, mənim bəxtim yatıb!”. Bir dəfə onun bu sözünü eşidən ağıllı və zirək Məhəmməd ona deyir: “Ay bədbəxt, sənin bəxtin yatmayıb, özün yatmısan!”. Buradan nə nəticə çıxarmaq olar?

Bir neçə uşaq əlini qaldırdı. Müəllimə isə sözü Səfaya verdi.

– Səfa, sən de görüm, nə nəticə çıxarmaq olar?

– Müəllimə, o nəticə çıxarmaq olar ki, bəxt insanın öz işi, öz zəhmətidir! – deyib, Səfa bir anlığa dayandı və tez əlavə etdi: – Müəllimə, axır zamanlar mən özüm də bunu başa düşmüşəm!..

## ALTINCI FƏSİL

### 1

Cücələrim gündən-günə artıb böyüyürdülər. İndi onlar aynabəndi bu başdan o başa gəzib dolanır. Qanadlarını açıb atılmadıqları yer qoymurdular. Əvvəllər heç yeşiyin üstünə də çıxa bilmədikləri halda indi pəncərə taxtasının üstünə sıçrayırdılar. Elələri vardı ki, döşəmədən birbaş ora atılırdı. Bir az balacaları isə əvvəlcə yeşiyin üstünə, burdan da pəncərəyə sıçrayırdı. Kəkilli cücəm də belələrindən idi. O, hələ birbaşa pəncərə qabağına atıla bilməsə də, asanlıqla yeşiyin üstünə, sonra istədiyi yerə tullanırdı. O, o qədər diribaş və gözəl olmuşdu ki, ümumiyyətlə toyuq-cücədən xoşlanmayan anam da onu bəyənirdi. Mən onu xüsusi yedirdib ələ öyrətdiyimdən adamdan qaçmırdı. Ancaq o qədər ağılsızdır ki, köynəyimin düyməsini də yemək bilir, hey atılıb ağ sədəf düyməni dimdikləyir.

Xüsusən hava xoş olub günəşin işıqları içəri dolanda cücələrim qanadlanıb pəncərənin qabağına çıxır və orada yan-yana yatıb özlərini günəşə verməkdən ləzzət alırdılar. Qəribədir! Mən fikir vermişəm qışda və yazda bizim sarı pişik də, Səfagilin balaca ağ itləri də səhər-səhər mənim cücələrim kimi özlərini günəşə verməyi sevirlər. Atam deyir ki, bu zaman günəşdə ultrabənövşəyi şüalar olur və bu da bütün canlılara çox xeyirdir. Əlbəttə, nə it, nə pişik, nə də cücələr bunu bilmirlər. Onlar sadəcə olaraq üşüyürlər və günəşin şüaları canlarını qızdırdığı üçün özlərini günəşə verirlər. Ancaq tamaşadır durub kənardan onlara baxasan! Qollarını, qanadlarını açıb günəşin altında bir böyrü üstdə uzanırlar. Bir xeyli qızdıqdan sonra, o biri tərəfi üstdə çönürlər. Bəzən dimdikləri ilə qanadlarının altını, boyunlarını qaşıyırlar, bir də görürsən ki, elə oradaca gözlərini yumub yatırlar. Belə günəşli günlərdə mən ştepseli rozetkadan çıxarmaqla lampanı söndürürəm. Çünki ona ehtiyac yoxdur, cücələrin biri də ora yaxın düşmür. Hava buludlu olanda, xəzri əsib soyuyanda isə gündüzlər də yandırıram, çünki bu

zaman cücələr pəncərə qabağına sıçramır, yeşiyin ətrafında fırlanır və tez-tez lampaya yaxın gəlib qızınırlar.

Onlar aynabəndi xeyli zibillədiklərindən son günlər anam çox tez-tez deyinirdi. "Bircə bunları burdan rədd eləyin!" – deyib dururdu. Mən anamı çox acıqlandırmamaq və cücələrimin taleyini pisləşdirməmək üçün, süpürgə və xəkəndazı götürüb aynabəndi tez-tez təmizləyirdim, ancaq neyləyəsən, sən çəkilməmiş görürsən onlar yenə də zibilləyiblər, hətta mən onların altına, yəni bütün aynabəndə qəzet də döşədim: kar aşmadı. Qəzeti dimdikləyir, eşələnib cırırdılar. Nəhayət, mayın əvvəllərində atam mənə dedi:

– Artıq cücələri hinə keçirə bilərsən, havalar qızıb.

Mənim onlara nə qədər yazığım gəlsə də, atamın dediyi kimi elədim. Səfa da gəldi, bir axşam onları yeşiyə yığıb bir yerdə həyətin o biri başında düzəltdiyimiz hinə apardıq. Biz tikən hin çox böyük deyildi. Cəmi metr yarım uzununda, bir metr enində idi. Ancaq hündür və işıqlı idi. Belə ki, bir divarı tamamilə daşdan idi. İki divarının hərəsinə isə bir pəncərə qoymuşduq. Üçüncü divarı setka idi. Bu setkanı çoxdan həyətin bir küncündə atılıb qalmış köhnə çarpayıdan çıxartmışdıq. Cücələri hinə keçirdiyimiz zaman bir neçə gün axşamlar yeşiyə yığır, yeşiyin üstünü və qapısını örtürdük ki, gecələr ayazıyanda onlara soyuq olmasın. Bizim gözlədiyimizin əksinə olaraq, cücələr hində özlərini daha yaxşı hiss edir, qumun içində hey eşələnirdilər. Qumda çimməkləri isə başqa bir tamaşadır! Bir də görürsən ki, cücənin hərəsi bir tərəfdə yatıb, qumu eşir, alt qanadı ilə qaldırıb su kimi bütün bədəninə səpələyir, orasını-burasını yuyub təmizləyir. Beləliklə, təzə hində cücələr vəziyyətlərindən sox razı idilər. Bir müddət sonra isə artıq axşamlar da biz onları tutub yeşiyə salmaqdan əl çəkdik. Qaranlıq düşənə yaxın özləri istədikləri kimi yeşiyin üstünə çıxıb bir-birinə qısılaraq yatırdılar.

Bir neçə gün belə keçdi. Bir axşam mən cücələri yoxlarkən kəkilli cücəm gözümə dəymədi. Ha o yan-bu yana baxdım, cücə tapılmadı. Görəsən buna nə olub? Səhər yemləyib dərsə gedəndə məndən xəbərsiz qapının arasından çıxmayıb ki? Cücələri saymağa başlayanda gördüm ki, ikisi əskik gəlir. Bir də saydım – yanılmamışdım, ikisi əskik idi. Mən bərk narahat oldum. Anamdan soruşdum. Bəlkə mən məktəbdə olanda o açıb buraxıb, həyətdə yad pişikdən-itdən olub tutub yeyib. Anam dedi:

– Sənin cücələrinlə mənim işim yoxdur, heç hinə yaxın düşməmişəm. Ədə, bəlkə hinin bir yeri açıqdır, çıxırlar xəbərin olmur?

Mən hinin hər tərəfini yoxladım, qapının və setkanın yanına daşlar düzdüm ki, it-pişik yaxın dura bilməsin. Sabahısı yenə iki cücə əskik çıxdı. Mən məsələni Səfaya bildirdim. Cücələrin yox olması barədə başımıza cürbəcür fikirlər gəlirdi. Ancaq axırını bir yerə çıxara bilmirdik.

– Bəlkə kim isə dadanıb, gəlir, oğurlayır! – deyib düşündük və belə qərara aldıq ki, hər axşam pusquda durub güdək. Çünki, anam inandırdı ki, gündüzlər bir məktəbdə olanda həyətə gələn olmur, cücələrin səsi də çıxmır, halbuki, onlara toxunan olsa bir-birinə dəyərlər. "Cib-cib"dən qulaq gedər, deməli, kim aparırsa axşam qaranlığında aparır. Yəni cücələrə nə olursa, axşam saat yeddi ilə gecə on, on bir arasında olur. Biz belə düşünürdük. Deyirdik ki, kimin nəyinə gərəkdir. İki cücə üçün gecəni yatmayıb, şirin yuxusuna haram qatsın. Heç ağlımıza da gəlmirdi ki, belə oğrular da var. Hamı şirin yuxuda olanda, lap gecənin tən ortasında gəlib cücələri aparan oğru!

2

Səfa anasından icazə alıb iki gün axşamdan bizə gəldi, dərslərimizi eləyib qurtarandan sonra saat səkkizdən on birə qədər tut ağacının altında qaranlıqda oturub qulağımızı hinə zillədik. Bir yarpaq tərpənəndə xəbər tuturduq. Biz bu iki axşamda bildik ki, gecə qaranlığının sükutu nə deməkdir? Bir də görürsən ki, gün batandan bir az sonra yavaş-yavaş ətrafdakı səslər azalır, getdikcə tamamilə kəsilir, quşlar yuvalarına dolub yatırlar. Adamların ayağı ordan-burdan yığılır, maşın səsi kəsilir. Hər yan sükuta qərq olur. Hər tərəf sükut içində, hər şey donub dayanır. Bir azdan sonra bütün aləm yatır. İnsanlar da, heyvanlar da, ağaclar da yatıb şirin yuxuya gedir. Bu zaman yarpaq titrəsə eşidərsən, hər şey sirli bir pərdəyə bürünmüş kimi olur. Bəzən bizi vahimə basırdı və belə hallarda bir-birimizə qısılıb dururduq. İki gecənin ikisində də anam çağırmasaydı, biz gedib yatmazdıq. Elə beləcə oturub sirli sükutu dinlədik.

– Bəsdir, gəlin yatın. Bu cücələr də başımıza bəla oldu. Sabah deyəcəyəm xalan gəlib aparsın, canımız qurtarsın!

Biz çar-naçar gedib yatdıq. Səhər isə ayılan kimi hinə qaçdıq. Bu dəfə cücənin biri yox idi. Biz böyük bir sirr qarşısında dayanmışdıq.

Hamımız çaşıb qalmışdıq, bilmirdik bu cücələrə nə olur. İkinci gecə yenə saat on birdə anam bizi çağırıb yatırtdıqda mənim fikrim cücələrin yanında qalmışdı. Elə yuxuda hey onları görürdüm. Gecədən nə qədər keçdiyini, nə qədər yatdığımı bilmirəm, bir də onda ayıldım ki, cücələr çox həyəcanla: "cib-cib" eləyib bir-birinə dəyiblər. Ayılıb yastığıma söykəndim və qulaq asdım, cücələrin cib-cibi gah kəsilir, gah da daha artıq həyəcanla qalxırdı. Mən yavaşca Səfanın çiyninə toxunub oyatdım.

– Eşidirsənmi, oğru gəlib!

Səfa dərhal dikəldi və qulaq asdı:

– Hinə girən var! – dedi və biz ikimiz də birdən yerimizdən qalxıb ehmalca otaqdan çıxmaq istədik, elə çıxaq ki, anamgil xəbər tutmasın. Lakin anam ayıldı:

– Səfa, hara?

– Hinə girən var!

Lakin hinin qapısı bağlı idi. Biz gələn kimi cücələrin də cib-cibi kəsildi, onlar rahat olub yatdılar. Biz kibrit çəkib hinə göz gəzdirdik: qəribədir, cücələr hinin içinə səpələnmişdilər. Hərəsi bir küncdə düşdüyü yerdə qalmışdı, yeşiyin üstündəki beş-altısı isə bərk-bərk bir-birinə qısılmışdı. Məlum idi ki, kim isə onları narahat edib, biz əlimizi atıb yerdəkiləri tutaraq yeşiyin üstünə yığmağa başladıq. Hansına yaxın dururduq, dəhşətli qorxu içində özünü daşa-divara çırpırdı. Axı, gecələr toyuq-cücənin gözü heç şey görmür, kor kimi özünü hara gəldi atır. Cücələri bir yerə yığıb yerimizə qayıtdıq. Lakin biz yatmamış, yenə onların cib-cibi eşidildi. Bu gecəni səhərə qədər narahat yatdıq. Səhər açılana yaxın cücələrimizin səsi kəsildi. Biz atamdan qabaq ayılmışdıq. Yerimizin içində uzanıb pıç-pıçla danışırdıq. – "Bu nə sirdir?" – deyib düşünürdük. Başımıza cürbəcür fikirlər gəlirdi. Atam duranda məsələni ona danışdıq. O fikirləşib:

– Həəə... bilmişəm, cücələrə siçovul dadanıb! – dedi və bizimlə hinə getdi. Diqqətlə hinin o yan-bu yanına göz gəzdirdi, ayağı ilə küncdəki azca çuxur yeri eşdi, oradan iki cücənin lələyi tapıldı. Mən rəngindən kəkilli cücəmin lələyini tanıyanda ürəyim titrədi. Atam qəti dedi:

– Siçovuldur, tələ qurun, cücələrə də hündür yer qayırın, yoxsa qoymaz biri salamat qalsın!

Biz məktəbdən sonra hinin içində divardan bir metr hündürdə balaca qutu qayırdıq ki, gecələr cücələri ora yığaq. Sonra da atam işdən gələndə

bizə tələ qayırmaq qaydasını öyrətdi. Balaca yay və taxta parçası və sairə tapdıq. Atamın göstərdiyi kimi tələ düzəltdik. Tələ qayırarkən məlum oldu ki, Səfa belə şeylərdə məndən zirək və əli işləkdir. Onun çox yaxşı taxta yonduğunu, yay düzəltdiyini görən anam dedi:

– Nə yaxşı əlin var, bala, səndən gözəl sənətkar olar!

Tələmiz hazır olanda gün təzəcə batmışdı. Bir tikə yağlı çörəyi məftilin ucuna keçirib tələni qurduq və aparıb hinə qoyduq. Cücələri də təzə yerlərinə yığıb qapısını bağladıq. Yatmamışdan qabaq tələyə bir şey düşüb-düşmədiyini yoxlamaq üçün hinə getdik. Nə görsək yaxşıdır? Uzun quyruq, balaca, pırtdaq gözlü kök bir siçovul tələdə idi. Tələnin yayı onun başından elə dəymişdi ki, elə oradaca ölmüşdü. Biz ona ən pis düşmənimiz kimi xeyli baxdıq.

– Nə də murdar görkəmi var, adamın ürəyi bulanır! – deyib mən əlimdəki taxta ilə onu o tərəf-bu tərəfə çevirdim.

– Gecə oğrusu! – deyib Səfa əlindəki taxta parçası ilə onun başından basdı.

– Neyləyirsiniz, aparın basdırın torpağın altına, gəlin yatın! – deyib anam bizi səslədi.

– Yaman ziyankardır, bunu harda gördünüz, məhv edin! – deyib atam kənd rayonlarında onun təsərrüfata vurduğu ziyandan, kolxozlarda onunla mübarizədən bizə maraqlı şeylər danışdı, dedi ki, adətən siçovul görünən yerlərə zəhərli buğda tökürlər. Lakin toyuq-cücə olan yerdə bu xətərlidir, ona görə də başqa tədbirlərə əl atırlar.

Beş gün hər gecə bizim tələmizə bir siçovul düşdü. Altıncı gün düşən olmadı. Görünür, ya qırılıb qurtarmışdılar, ya da ağızları cücələrə çatmadığına görə çəkilib getmişdilər.

Artıq gecələr cücələrimiz həyəcan qoparıb bizi köməyə çağırmırdılar. Biz də arxayın yatırdıq.

## YEDDİNCİ FƏSİL

### 1

Yay tətillərinə az qalırdı. Məktəbimizdə qeyri-adi bir canlanma vardı. Müəllimlər də, şagirdlər də elə görünürdülər, elə bil iş başlarından aşırdı. Sanki dərslər birə-iki artmışdı. Əslində isə təzə dərs keç-

mirdik. Köhnələri təkrar edirdik. Biz imtahanlara hazırlaşırdıq. Hamımız həyəcan keçirirdik. Xüsusən səkkizinci və on birinci sinif şagirdləri çox həyəcanlı idilər. Çünki onların bir çoxu texnikumlara və əli məktəblərə gedəcəkdi. Pis qiymətlə də bu mümkün deyildi. Ümumiyyətlə, pis qiymətlə məktəbdən ayrılmaq, görünür, çox ağır şeydir. Düzdür, bizim yanımızda özlərini çəkir, yekə adamlar kimi aparır və bizə bir söz demirdilər. Amma biz hər şeyi bilirdik: kimin əlaçı olduğunu, kimin imtahanlarda çətinlik çəkəcəyini, kimin hara gedəcəyini, hər şeyi, hər şeyi bilirdik. Əlbəttə, bizim də öz dərdlərimiz vardı. Axı, biz də imtahan verməli idik. Hamılıqla Çimnaz müəlliməyə söz vermişdik ki, ili yaxşı qurtaraq. Elə eləyək ki, nə biz utanıb qızaraq, nə də bizim sinifdən söz düşəndə Çimnaz müəllimə kədərlənsin. Buna görə də tez-tez köhnə dərsləri təkrar edir, müəllimənin verdiyi tapşırıqları vaxtında yerinə yetirir, bir-birimizə kömək edirdik. Səfa ilə mənim dostluğum lap möhkəmlənmişdi. İndi çox suallara o məndən tez cavab tapır və ev dəftərini səliqəli yazırdı. Bu zaman elə hadisə baş verdi ki, az qaldı yenə aramıza soyuqluq düşsün.

Çimnaz müəllimə bizə həm yazı işi, həm də hesab məsələləri vermişdi. Bundan başqa pioner təşkilatı məktəbimizdən iyirmi uşaq ayırmışdı ki, cümə axşamı rayon mədəniyyət sarayında Sosialist Əməyi Qəhrəmanı usta Baba ilə görüşdə onu təbrik etsinlər, gül dəstəsi versinlər, bir xor oxusunlar. Mən də, Səfa da, Fatma da bu dəstənin içində idik. Gül dəstəsini qəhrəmana Fatma verməli idi: "Sizi ürəkdən təbrik edirik, min yaşayın!" sözlərini deyəndə, mən sözümü başlamalı idim. Əlbəttə, biz bu gecəyə həyəcanla hazırlaşırdıq. Çünki, heç birimiz ömründə məktəbdən kənarda, ata-analarımızın qabağında çıxış eləməmişdik. Elə oldu ki, Çimnaz müəllimə də evə tapşırıq verdi. Ana dilindən və hesabdan ev işinin qəhrəmanla görüşün səhərisi üçün hazırlamalı idik. Səfa ilə belə danışdıq ki, dərsdən sonra hərə öz evinə getsin, çörək yesin, bir az dincəlsin, evin işlərinə baxsın, sonra görüşək, dərsləri eləyək – daha gecəyə, mədəniyyət sarayından qayıdana qalmasın. Kim kimin evinə getmək üstündə mübahisəmiz düşdü: mən dedim sən bizə, gəl, o dedi yox, həmişə mən gəlirəm, bu gün sən gəl!

– Mən də sizə çox gəlmişəm, bu gün sən gəl!

– Havaxt sən bizə çox gəlmisən? Gəl sayaq.

Biz saymağa başladıq. Mənim hesabımla belə çıxdı: Səfa bizə cəmi-cümlətanı on iki dəfə gəlib, Səfanın hesabı iləsə iyirmi beş dəfə!

Bu barədə də çox mübahisə etdik. O, mənə, mən ona haqlı olduğumu sübut eləməyə çalışdıq.

– Bu dəfə sən bizə gəl, gələn dəfə mən gələrəm! – deyib Səfa qəti cavab verdi. – Mən belə istəyirəm!

Səfada bu xasiyyət var. Bir də görürsən ki, hər sözü qurtaranda başlayır ki, "mən belə istəyirəm!" Bu isə mənim xoşuma gəlmir.

– Çox da sən istəyirsən, mən istəmirəm!

– Niyə istəmirsən, bizdə pis olur ki?

– Bəs sən niyə istəmirsən? – deyib mən soruşdum.

Səfa mənim yaxamdan tutub özümə tərəf çəkdi:

– Bilirsən, – dedi: – xarakterimi bərkidirəm ey, söz vermişəm özümü möhkəm olmağa öyrədəm. Bir şeyi ki, qərara aldım, dönməyəm, nə olur olsun o cür eləyəm, yoxsa mən niyə əvvəllərdə pis oxuyurdum? Çünki heç bir qərarımı yerinə yetirə bilmirdim. Deyirdim dərs hazırlayacağam, hazırlaya bilmirdim, çünki, oynamaq çıxırdı ortalığa – gedirdim oynamağa. İndi heç vaxt sözümdən dönən deyiləm. Demişəm bizə gələcəksən, vəssəlam.

Səfanın sözü açıq deməyi və xarakterini möhkəmlətmək qərarı mənim xoşuma gəldi. Ancaq fikrimdən bir şey keçdi: "Bəs mən niyə zəiflik göstərim?". Sonra gördüm ki, yox, bu yaxşı fikir deyil – çünki yoldaşlıqda belə şey yaramaz. Gərək bir dəfə sən güzəştə gedəsən, bir dəfə o, başqa cür eləsən tərslik olar.

Mən fikrimi Səfaya dedim və biz xeyli danışandan sonra qəti qərara gəldik ki, xarakter nədir, tərslik nədir.

O günü mən Səfagilə getdim, biz rahatca dərsləri hazırladıq. Sonra durub mədəniyyət sarayına yola düşdük. İkimiz də təmiz geyinmiş, qalstuklarımızı bağlamışdıq. Vaxtından yarım saat əvvəl mədəniyyət sarayına gəlib çatdıq. Yoldaşlarımızdan bir neçəsi də gəlmişdi. Mədəniyyət sarayının geniş foyelərində gəzdik, divarlardan asılmış şəkillərə baxdıq. Nəhayət, qəhrəmanla görüş başladı. Başında bir dənə də tükü olmayan bir əmi iclası açdı. Biz onun danışığından bir kəlmə də başa düşmürdük. Çünki cümləsinin əvvəli, axırı yox idi. Mübtəda nədir, xəbər nədir bilmirdi. Cümlələrinin gah xəbəri olurdu, mübtədası olmurdu, gah mübtədası olurdu, xəbəri olmurdu. Biz onun kimi danışıb yazsaydıq, Çimnaz müəllimə bizə ikidən artıq qiymət verməzdi. O, sözünü qurtaranda biz yaman bərk əl çaldıq. Ona görə ki, sevinirdik, mübtədasız-xəbərsiz cümlələrdən canımız qurtarmışdı. Ondan sonra,

bizim rayon komsomol komitəsinin katibi danışdı. Ona diqqətlə qulaq asdıq. Çünki, çox gözəl danışırdı, elə bil ki, şeir oxuyurdu.

Nəhayət, bizim növbəmiz gəlib çatdı. Çimnaz müəllimənin işarəsilə hamımız dəhlizdə səhnənin qapısına yığışdıq və axırıncı natiq kürsüdən düşəndə çəpik səsləri kəsilən kimi bizə söz verdilər. Biz nizamla içəri girdik. Cərgə ilə qəhrəmanın qabağında durduq. Elə bu zaman yadımızdan çıxdı ki, əvvəl xor oxumalıyıq, yoxsa danışmalıyıq. Lakin Çimnaz müəllimə tez zaldan Fatmaya işarə edib bildirdi ki, başla. Fatma başladı. Onun sinifdə cırıldayan səsi burada elə yaxşı çıxırdı ki! Düzdür, bərk həyəcan keçirirdi, üzü qıpqırmızı olmuşdu, amma sözləri bülbül kimi deyirdi. Fatmanın bülbül kimi və hərarətlə danışması mənim o qədər xoşuma gəlmişdi ki, gözümü onun ağzından çəkə bilmirdim. Buna görə də nə vaxt mənim danışmaq növbəm çatdığını bilmədim. Bir də onu gördüm ki, Səfa böyrümdən vurur ki, “nə durmusan, başla!”. Mən başladım, yaxşı da dedim, xoru da yaxşı oxuduq. Çaşanımız olmadı. Bizə çox əl çaldılar. Ancaq gec başladığım üçün mənim ürəyim sakit olmurdu, bir gözüm Çimnaz müəllimədə idi. Gözləyirdim ki, aşağı düşəndə məni danlayacaq. Lakin o mənim başımı sığalladı, Fatmanı isə öpüb dedi:

– Sağ olun, mənim əziz balalarım.

## 2

Buna baxmayaraq duruxub qaldığım dəqiqə mənim yadımdan çıxmırdı. Evdə anam da məni oxşayıb təriflədi ki, çox yaxşı çıxış elədiniz. Deyəsən bizim çaşmağımız da böyüklərə xoş gəlirdi. Çünki, belə hallarda da üzləri, gözləri gülürdü və bizə əl çalırdılar. Böyüklərə nə var ki? Bizim yerimizdə olalar, görələr necə çətindir! Yatana qədər evimizdə bugünkü görüş barədə söhbət oldu. Anam danışdıqca atam diqqətlə qulaq asır və gələ bilmədiyi üçün təəssüf edirdi. Gələ bilməmişdi, çünki onların özlərinin bilmirəm mədəndə nə iclasları olmuşdu, evə gec qayıtmışdı. Anam isə mədəniyyət sarayında gördüklərinin hamısını yadında saxlamışdı və hamısı barədə öz fikrini deyirdi: kimin danışığı xoşuna gəlmişdi, kiminki yox, hansı uşaq yaxşı oxudu, hansı yox, hamısını danışdı. Hətta mənim gec başlamağımı da dedi. Anam belədir heç şeyi gizli saxlamaz, xüsusən atamdan gizli bir şey ola bilməz. Bütün söhbət zamanı mən nigaran idim, bilmədim anam mənim

gec başlamağımı atama deyəcək, ya yox, özüm də qət eləyə bilmirdim. Atam bilsə yaxşıdır, yoxsa bilməsə? Amma elə ki, anam danışdı, elə bil mənim üstümdən dağ götürüldü. Yüngülləşdim və rahat oldum. Mən belə başa düşürəm ki, bir səhv eləyəndə gizlətməmək daha yaxşıdır. Səhv gizlin qalanda adam özü həmişə nigarançılıq çəkir, elə hey qorxursan ki, indicə üstü açılacaq və sən utanacaqsan, biabır olacaqsan. Gizlin qalan günah ağır yük kimi adamın çiynindən asılıb əzir, heç kəs bu yükü görmür, amma sən özün görürsən, hiss edirsən ki, bir şey səni sıxır, büzüşməyə məcbur edir, qol-qanad açmağa qoymur, amma elə ki, açıq-açığına deyilir, görürsən ki, yüngülləşdin, rahat oldun, daha heç kəsdən qorxub çəkinmirsən. Sabahısı baş verən bir hadisə mənim bu fikrimi bir daha sübut etdi və mən qəti qərara aldım ki, bundan sonra heç bir səhvimi, heç bir günahımı gizlətməyim, açıq-açığına boynuma alım və çalışım ki, bir də ona yol verməyim.

Yatmağa gedəndə mən sabah məktəbə aparacağım dəftər-kitabı hələ çantama yığmamışdım. Anam bunu görüb dedi:

– İndidən kitab-dəftərini hazırla, sonra yat.

– Səhər yığaram.

Məndə hərdən belə hallar olur. Heç özüm də bilmirəm, niyə? Bir də görürsən ki, dəftər-kitabımı yığıb, stolumun üstünü təmizləməyə həvəsim gəlmir, ərinirəm, deyirəm qalsın, bir az sonra elərəm. O qalan qalır, sabaha qədər. Sabah da duranda tələsdiyimdən heç bilmirəm nə götürürəm. Mən kitabda da oxumuşam, müəllimə də dönə-dönə deyib, anam da hey yadıma salır ki, sabah səhər geyəcəyin paltarları bu gün axşamdan hazırla, bir yerə qoy, məktəbə aparacağın dərs şeylərini axşamdan ayır, çantana yığ ki, səhər durub axtarmalı olmayasan. Buna baxmayaraq mən həmişə belə edə bilmirəm. Bir də görürsən, ərinmişəm, demişəm qalsın səhərə. Bu xasiyyət bir azar kimi mənim yaxamdan əl çəkmir. Səhər də duranda görürəm ki, gecikmişəm, vaxt keçir, dərsə çatmayacağam, odur ki, tələm-tələsik birtəhər geyinirəm, gah ayaqqabımın tayını, gah qalstukumu axtarıram, yer qalmır, baxmayam, axırda məlum olur ki, qalstukum stolun altına düşüb. Ayaqqabımın tayı qapının dalındadır, dəftər-kitabdan əlimə nə gəldi atıram çantaya. Sinifdə məlum olur ki, bir kitabın əvəzinə başqasını gətirmişəm.

Bu gün də belə oldu. Axşamdan çantamı hazırlamağa həvəsim gəlmədi, anam da çox təkid etmədiyindən gedib yatdım. Səhər elə durdum ki, heç çay da içə bilmədim. Tezcə əl-üzümü yudum. Əlimə

gələn dəftər-kitabı çantaya doldurub anamın verdiyi yaxmacı yeyə-yeyə məktəbə qaçdım. Elə zəng vurulanda içəri girdim. Nəfəsimi alıb dincəlməmişdim ki, Çimnaz müəllimə içəri girdi. "Hazır-qayib"dən sonra ev işlərini yoxlamağa başladı və birinci olaraq biz oturan partaya yaxınlaşdı. Mən tez çantamı açdım, bir dəstə dəftər-kitabın içindən son tapşırıqları olan dəftəri axtarmağa başladım. Bu zaman Çimnaz müəllimə mənim başımın üstündə durmuşdu. Dəftəri tapıb göstərmə-yimi gözləyirdi. Bir dəftəri açdım, istədiyim olmadı, ikincisini açdım – olmadı, üçüncüsünü açıb baxan kimi tələsik bükmək istədim. Çünki bu həmin dəftər idi ki, məşhur hesab məsələləri orada səliqə ilə həll olunmuşdu. Onu Səfa məndən alıb saxlamış, yalnız valideynlər icla-sından bir neçə gün sonra özümə qaytardığından, dəftəri davam etdir-məyib yarımçıq qoymuşdum. Dəftəri tələsik büküb kənara qoyandan Çimnaz müəllimə dedi:

– Onu mənə ver görüm...

– Müəllimə, dünənki tapşırığı bura yazmamışam! – deyib mən o biri dəftəri vermək istədim.

– Görürəm! – deyib Çimnaz müəllimə həmin dəftəri götürdü və açıb həll edilmiş, lakin yoxlanmadığından müəllimənin heç bir qeydi olmayan hesab məsələlərinə nəzər saldı. Xeyli baxıb dəftər əlində öz yerinə qayıtdı və məndən soruşdu:

– O zaman verdiyim məsələlər deyilmi?

– Bəli, müəllimə, yalan demişəm!

– Havaxt eləmisən?

Mən istədim deyəm ki, sonra eləmişəm, ancaq demədim: "Axı, niyə bu günahı yük eləyim, asım çiynimdən, bu gündən aparıb sabaha – deyib düşündüm. – Qoy müəllimə bilsin, mənim də vicdanım təmiz olsun!".

– Müəllimə, elə onda eləmişdim.

Sinfimizdəki uşaqlar hamısı başa düşmüşdü ki, söhbət nə barə-dədir və hamısı da diqqətlə gözləyirdi ki, bu iş nə ilə qurtaracaq. Səfa da gah mənə, gah müəlliməyə baxırdı.

– Deməli, o zaman mənə yalan demisən, eləmi?

– Bəli, müəllimə yalan demişəm!

– Bəs belə, bəs belə! – deyib müəllimə üzünü sinfə tutdu, – o za-man daha kim mənə yalan deyib?

Fatmanın cır səsi eşidildi:

– Mən də yalan demişəm, müəllimə.

– İndi deyin görüm, bu yalanın səbəbi nədir, kim sizi məcbur edib?

Heç kəsdən səs çıxmadı. Biz duruxub qalmışdıq. Bu zaman mənim ağlıma gəldi ki, əgər Səfa doğrudan istəyir ki, xarakteri olsun, gərək özü müəlliməyə həqiqəti deyə, onda bizim də dostluğumuz axıra qədər olacaq, yox, əgər deməsə, mən özüm açıb deyəcəyəm, onda da məndən küsür küssün. Müəllimə bir də soruşdu:

– Kim sizi yalan deməyə məcbur edib?

Səfa ayağa durdu:

– Mən, Hüseyn və Həsən məcbur etmişik, müəllimə! – deyib ayaq üstdə qaldı.

Müəllimə bir neçə sual da verdi, əhvalatı əvvəldən axıra qədər öyrəndi və Səfaya dedi, otursun.

– İndi deyin görüm, niyə belə hərəkət etmisiniz? Sən de, Fatma.

– Müəllimə, yoldaşlarımız dedi ki, bizi satmayın, biz də satmadıq.

– Yoldaşı satmaq nə deməkdir? O deməkdir ki, ona pislik edəsən. Siz onları satmısınız!

– Müəllimə, biz Səfagilə pislik etməmişik.

– Bəs bu pislik deyil nədir? Onlar dərslərini eləmək əvəzinə gediblər gəzməyə, balıq tutmağa. Özü də bir saat yox, iki saat yox, beş saat, altı saat! Siz də onların bu intizamsızlığını ört-basdır eləməyə çalışmısınız. Deməli, onlara yaxşılıq yox, pislik etmişsiniz. Düzdürmü, Pərviz?

Mən ayağa durdum:

– Düz deyirsiniz, müəllimə. Biz özümüz də o hərəkətin əzabını çəkirdik.

– Bəs onda niyə bu vaxta qədər açıb mənə deməmisiniz, direktorumuza deməmisiniz, ata-ananıza da deməmisiniz?!

– Utanmışıq, qorxmuşuq, müəllimə, acığınız tutar, bir də valideynləri yığarsınız.

– Belə olmaz, uşaqlar! Siz heç vaxt, heç bir günahınızı ata-ananızdan gizlətməyin. Bax görürsünüz ki, günah özü bir gün üzə çıxır. Onda daha çox utanmalı olursunuz. Hansı yaxşı olardı, siz özünüz gəlib bunu mənə desəydiniz, yoxsa, bu cür təsadüfdən bilməyim?

– Əlbəttə, biz desəydik!

– Onda gəlin qəti danışaq. Bir də belə şey olmasın!

– Söz veririk, müəllimə! – deyib biz hamımız bir ağızdan səsləndik.

– Mən çox şadam ki, biz köhnə günahları təzə dərs ilinə aparmırıq! – deyib müəllimə dəftərləri yoxlamağa başladı.

Tənəffüsdə biz hamımız bu barədə danışırdıq. İndi müəllimə ilə bizim aramızdakı mehribançılıq bir az da artmışdı. Bu da imtahanlara daha səylə hazırlaşmağımıza kömək etdi. Biz imtahanları yaxşı verib dördüncü sinfi qurtardıq. Sabah axırıncı gün məktəbə gələcəydik. Hamımız beşinci sinfə keçirdik, ikinci il dörddə qalanımız yox idi, deməli, hamımız bu il Çimnaz müəllimədən ayrılacaqdıq. Bu bizi bir qədər kədərləndirirdi:

– Gəlin sabah müəlliməyə bir dəstə gül gətirək! – deyib Fatma təklif etdi.

– Bir dəstə nədir, üç dəstə! – deyib Səfa əlavə etdi və uşaqları ad-baad çağırıb üç dəstəyə böldü, – hərə bir dəstə!

Sabahısı müəllimə dördillik işimizə yekun vurdu. Bizə yayda yaxşı dincəlməyi və gələcəkdə daha yaxşı oxumağı arzu etdi. Ayrılarkən biz axırıncı partanın dalında gizlətdiyimiz çiçək dəstələrini gətirib ona verəndə, onu dövrəyə alıb əl çalanda, az qala, gözləri yaşarmışdı. O:

– Sağ olun, balalarım! – deyib kiminin başından öpüb, kiminin əlini sıxdı. Mənim də başımdan öpüb üzümə baxanda gülümsədi. Doğrudan, Çimnaz müəllimə necə də mənim anama oxşayırdı!..

*1963*

## KƏNDÇİ QIZI

*3 pərdə, 10 şəkildə lirik komediya*

### İ Ş T İ R A K   E D Ə N L Ə R

B ə n ə f ş ə – kəndçi qızı, kolxozçu-mexanizator, həm də xalq teatrının artisti

S a r v a n – Bənəfşənin atası, kolxozçu

N i s ə x a l a – Bənəfşənin xalası

L e y l a – Bənəfşənin xalası qızı

A s l a n – xalq teatrının aktyoru və rejissoru

M a h m u d   S ə f a y i – professor

V a h i d   S ə f a y i – onun oğlu, istehlak kooperasiyası işçisi

R e y h a n   x a n ı m – Vahidin anası, evdar qadın

R ə ş i d – istehlak kooperasiyası işçisi

A y x a n ı m – ali məktəbi yenicə qurtarmış həkim

Ş ə k ə r l i n s k i – istehlak kooperasiyasının müdiri

G ö y ə r ç i n – evdar qadın, Şəkərlinskinin arvadı

A l ı ş o v – istehlak kooperasiyasının işçisi, Şəkərlinskinin yerlisi

Hadisə bizim günlərdə vaqe olur.

## BİRİNCİ PƏRDƏ

### BİRİNCİ ŞƏKİL

Səhnənin qabağında şəkilli bir pərdə asılmışdır. Şəkildə hardansa uzanıb gələn böyük bir yol, yolun kənarında yaşıl kolxoz tarlası, kiçik bir düşərgə təsvir olunmuşdur. Vahid və Rəşid əlində balaca çamadan olan Aslanı yola salırlar.

V a h i d. Yaxşı deyiblər: qızıl taxtım olunca, qızıl baxtım olsun. Nə işdən yarıdım, nə qızdan. Hansına yaxınlaşıram, iki həftə keçmir, gözümdən düşür, yoruluram. Faciədir dostlar, elə bir qız yoxdur ki, əbədi məhəbbətə layiq olsun.

A s l a n. Qız seçməyi məndən öyrən, peşə seçməyi dostumuz Rəşiddən. Gəlsənə mənim kimi sən də bir kəndçi qızı tapasan?!

V a h i d. Ehh, sən də söz danışdın – kəndçi qızı! Yəni əlvida mədəniyyət, əlvida zövq-səfa!

A s l a n. Yeməmisən qaz ətini, nə bilirsən ləzzətini. Kəndçi qızı – yəni yaşa məhəbbət, yaşa düzlük və sədaqət!

V a h i d. Yox, aşna, şəhərin yüksək cəmiyyətində böyümüş qızlar mənə səadət verə bilmədiyi halda, adi bir kəndçi qızı nə edə bilər? Bir də ki, indi gözüm Ayxanımdadır, görsən deyərsən ki, onu yüz kəndçi qızına dəyişmərəm. O ki qaldı işə, (*Rəşidi göstərir*). bunun kimi ola bilməyəcəyəm. Bu da peşədir – düş kənd-kənd mal al, heyvan al, yumurta al, əvəzində taxta-şalban sat. Cansıxıcı işdir!

R ə ş i d. Yekə səhv edirsən. Hər dəqiqə insanlara xidmət edən bir peşə cansıxıcı olarmı? Kəndi şəhərə, şəhəri kəndə yaxınlaşdıran, hər kəsin xeyrinə-şərinə yarayan bir peşə gözəldir. Bir kolxoz məktəb tikir, ona taxta verirəm, o biri mədəniyyət sarayı tikir, şiferlə təmin edirəm. Kəndin ətirli meyvəsini şəhərə, şəhərin maşınını, al-əlvan parçasını kəndə çatdırıram. Bunun nəyi pisdir?

A s l a n. Hər dəqiqə min-min adama sevinc gətirir... Doğrudan maraqlı işdir!

V a h i d. Sən ticarətdən şair kimi danışırsan. Az qala paxıllığım tutur. Sanki burada xəlvətcə açılıb-örtülən qapılar yoxdur; sanki əliəyrilər çoxdan məhv olub gedib.

R ə ş i d. Niyə ki, elə idarəmizin müdiri Şəkərlinski, onun quyruğu – Alışov. Mən yeldəyirmanıları ilə vuruşmuram ki! Ancaq onlar başqa,

insanın öz işinə olan məhəbbəti başqa şeydir... Məncə çaqqal var deyə heç kəs meşədən küsməz...

V a h i d. Bir az da belə danışsan, mənim də ürəyimdə ticarətə məhəbbət oyadacaqsan. Gələcəyəm sizin sahəyə... (*Aslana*) Sən şəhərə niyə gedirsən?

A s l a n. İki ildir ki, xalq teatrı düzəltmişik. Bir neçə tamaşa hazırlamışıq. Hətta Şekspirin "Hamlet"ini də. Gedirəm nazirlikdən icazə alam, Bakıda tamaşa göstərək...

R ə ş i d. Uğur olsun...

Avtobus siqnal verir.

A s l a n. Hələlik, dostlar!

V a h i d. Zəhmət olmasa anama zəng elə, de ki, bir həftəyə gəlirəm.

R ə ş i d. Zəng nədir, lap evinizə gedər.

A s l a n. Əlbəttə gedərəm. Bəs dost-dosta nə gündə lazım olar... (*Oxuyur*).

Bir baş ki, dost yolunda
Qurban verilməyəcək.
Çiyinlərin üstündə
Çürük qarpızdır demək...

Gedirlər. Vahid onları ötürüb dala dönəndə əlinin neftini silə-silə "Aslan! Aslan!" çağıraraq tələsik gələn Bənəfşə ilə toqquşur. Vahid az qalır yıxıla – həm də pencəyi çirkə batır.

B ə n ə f ş ə. Yaman gecikdim...

V a h i d. Cəhənnəmə gecikdin! Yaxşı baxsana, kor deyilsən ki?

B ə n ə f ş ə. Sənin gözün var, görəydin. Yeriyəndə canavardan qaçan at kimi dala niyə baxırsan?

V a h i d. Nə şirin dilin var, ey... sənə yoldaş deyim, ya nə deyim? Bilmirəm oğlansan, qızsan?

B ə n ə f ş ə. Dilin həncəri dönür, elə de.

V a h i d. Həncəri xanım, deyəsən geyimin necədirsə, tərpənişin də, danışığın da elədir: çəlimsiz, yaraşıqsız...

B ə n ə f ş ə (*sarsılmış halda*). Görürəm sən çox yaraşıqlısan.

V a h i d. Hələ siz bura gəlib çatmaq üçün əlli il lazımdır... Aslan da mənə deyir kəndçi qızı al. Beş gündə adamın ömrü çürüyər.

B ə n ə f ş ə. Yediyin, geydiyin kənddəndir. Adam pirinə xor baxmaz. Kəndçi qızı var ki, yüz sənin kimisini dəyirmana susuz aparar, susuz gətirər.

V a h i d. Get, get, əvvəl yerişini öyrən, sonra mənimlə ağız-ağıza ver... Çox incə əl-ayağın var ki, traktorçuluq eləyirsən, bir az da incələşsin!..

B ə n ə f ş ə (*kənara*). Bu hərzə mənim ciyərimi yandırdı! Ah, necə burnu ovulmalıdır? (*Vahidə*). Nə etməli, kiminin əli qabarlıdır, kiminin ürəyi...

V a h i d. Əl çəkməz ha!.. Burda deyiblər bulud altdan çıxan gün, yaşmaq altdan çıxan dil.

B ə n ə f ş ə. Dədəm deyir ki, kişinin yanşağı özü qiymətə minməz, sözü qiymətdən salar.

V a h i d. Bir sözə bax – yanşaq! Gərək yanında bu boyda lüğət gəzdirəsən ki, bunun danışığını başa düşəsən.

B ə n ə f ş ə. Lüğət nə gərək. Yadında saxla, sənin kimi ağzını boşuna qoyan adamlara yanşaq deyərlər.

V a h i d. Rədd ol, ay kəndçi qızı, əl çək yaxamdan! Adam gözləyirəm.

B ə n ə f ş ə. Mənim də gözləməm var, vədələşmişəm. Xoşun gəlmir, özün get.

V a h i d. Aman belə qızın əlindən, bu kənd xarabada mədəniyyət görmədim ki, görmədim... (*Gedir*).

B ə n ə f ş ə. Neyləyim, briqadamda traktorçu olaydın, gör necə rəndələyib düzəldirdim səni...

Ayxanım gəlir. O tərəf-bu tərəfə boylanır, kimi isə axtarır.

A y x a n ı m. Ah, Bənəfşə, sən də burdasan?! (*Boylanır*). Özün də tutqunsan.

B ə n ə f ş ə. Tutqunam, çünki keyfimə toxunublar. Adı Vahiddir, elə bilir, doğrudan da vahiddir, tayı-bərabəri yoxdur.

A y x a n ı m (*qeyri-adi həyəcan və maraqla*). Nə olub ki, sən Vahidi tanıyırsan?

B ə n ə f ş ə. Tanıyıram. İnstitutun qiyabi şöbəsində atası bizə dərs deyir. Oğlu ona oxşamayıb. Elə bilir ki, bütün qızlar bunun dərdindən ölür. Beləsini gərək həvəngdəstəyə salıb əzəsən!

A y x a n ı m. Bu qədər amansız olma, Bənəfşə, məncə, onu töhmətlə yox, məhəbbətlə sağaltmaq olar.

B ə n ə f ş ə. Yox, ona nə töhmət, nə məhəbbət kar eləmir, tövbələtmə dərsi gərəkdir.

Vahid gəlir. Ayxanımı görcək sevincindən çaşır. Bənəfşəni görmür kimi Ayxanıma müraciət edir.

V a h i d. Ah, əzizim Ayxanım. Səni bir ildir gözləyirəm.

B ə n ə f ş ə. Yenə ilan dilini işə saldı, yanasan səni! (*Gedir*).

A y x a n ı m. Xəstəm çox oldu, Vahid... Buraxıb gələ bilmədim!

V a h i d. Yəni sənin məndən ağır xəstən olacaq? Nə dərman bilirsən mənə elə...

A y x a n ı m. Bu sözlər ürəkdən gəlsə, mən dünyanın ən xoşbəxt qızı olurdum.

V a h i d. Görmürsənmi, Ayxanım. Yalnız gözlərim deyil, başımdakı hər tük də sənin eşqinlə alışıb-yanır.

A y x a n ı m. Mən ömrümdə birinci dəfədir belə sözlər eşidirəm, Vahid. Sən isə kim bilir neçə qıza bu sözləri demisən.

V a h i d. Məgər sənin kimi ikinci bir gözəl görmüşəm ki, deyəm də?!

A y x a n ı m. Elə məni qorxudan da odur ki, sən gözəlliyin əsirisən. Qorxuram sabah məndən gözəl bir qıza rast gələndə bundan da artıq alışıb-yanasan, məni od içində qoyub gedəsən.

V a h i d. Mən gözəlliyə qarşı kor olsaydım, səni də görməzdim. Sən bunu istərdinmi?

A y x a n ı m. Mən istərdim ki, sən bir gözəllikdə bütün gözəlliklərin mənasını tapasan. Bizim eşqimiz arının çiçəyə olan eşqindən seçilsin. Bu gülün şirəsini çəkməmiş o birisinin üstünə qonmaq arı üçün təbii isə, insan üçün dəhşətdir!

V a h i d. Bilirəm, sənə deyiblər ki, mən ehtiraslarımın əsiri olan bir adamam. Mən sənin qabağında and içib bu sözləri yalana çıxartmaq istəmirəm. Qoy sözlər yox, gözlər danışsın...

A y x a n ı m. Yeganə bir arzum var, Vahid, kaş ömrümüzün axırına qədər sənin məhəbbətin bu cür ehtiraslı olaydı.

V a h i d. And içirəm ki, elə də olacaqdır!

P ə r d ə

## İKİNCİ ŞƏKİL

Bakıda Mahmud Səfayinin evi. Ev sadədir, lakin zövq və səliqə ilə düzəlmişdir. Yalnız böyük divarın ortasından asılmış rəngli iri şəkil otağın səliqəsini pozur. Şəkildə müasir modern üçün xarakter olan mücərrəd qadın şəkli təsvir edilmişdir. Onun altında divara söykənmiş köhnə bir saz və saçı-saqqalı ağarmış bir qocanın çərçivə içərisindəki foto-şəkli görünür. Bu Mahmudun atasının şəklidir. Reyhan xanım mat-mat gah qocaya, gah divardakı şəklə baxıb başını bulayır.

Mahmud Səfayi çıxır.

M a h m u d S ə f a y i. Salam, Reyhan xanım, sabahın xeyir.

R e y h a n. Salam Mahmud, sabahın xeyir.

M a h m u d (*Vahidin otağından fişqırıq səsi eşidir*). Gecə nə vaxt gəldi?

R e y h a n. İkidən bir az keçmişdi. Deyir ki, yoldaşının xeyir işi varmış.

M a h m u d. O dedi, sən də inandın, hə?

R e y h a n. Cavandırlar, ay kişi, biz də cavan olmuşuq.

M a h m u d. Hər günahını doğrult. Biz belə qələtləri eləməmişik.

R e y h a n. Səhərdən halım özümdə deyil. Sən də bu yandan iynələmə (*Sözü dəyişmək istəyir*). Deyəsən gecəni pis yatmısan?

M a h m u d. Bir adamın ki, ürəyində çiban ola, necə yatar?

R e y h a n. Nə danışırsan, ay Mahmud, ürəkdə də çiban olar?

M a h m u d. Pis övlad ürəyin çibanı deyil, nədir! Davası yox, dərmanı yox, içəridən yeyib canını alır!

R e y h a n. O qədər də şişirtmə. Elələri var ki, bizimkinə şükür.

M a h m u d (*yenə acı söz demək istəyir, lakin özünü saxlayır*). İş yerini niyə dəyişib?

R e y h a n (*heyrətlə*). İş yerini?

M a h m u d. Bəli, çıxıb, indi də gedib istehlak kooperasiyasına, ticarətə...

R e y h a n. Nə olar, ticarət oldu, ya başqa sahə oldu, nə təfavütü, iş olsun.

M a h m u d. İş olsun, bir yer olsun, min yer yox! (*Divara baxır, köhnə sazın və atasının şəklini yerində oradan rəngli tablo asıldığını görür*). Bu nədir, arvad? Bu meymunu kim asıb burdan?

R e y h a n. Bilmirsən kim asıb? Deyirəm, sözümə baxmır.

M a h m u d. Mən instituta tələsirəm. Ona deyərsən ki, necə gətirib, götürsün elə də atsın çölə. Atamı və sazı qaytarsın yerinə. Axı, insan dünyada müqəddəs bir şey tanıyar!

R e y h a n. Elə özüm götürüb asaram.

M a h m u d. Yox, qoy kim çıxardıb, o da assın (*Nə isə xatırlayır. Siması işıqlanır*). O kəndçi qızı Bənəfşə zəng eləmişdi. Məni görmək istəyir. Evə gəlsə, gözləsin... Biləsən necə fərasətli qızdır, həm gözəl mexanizatordur, bütün kolxozda ad çıxardıb, həm də gəl gör bunda elmə nə həvəs var. Bir kitab deyirəm, beşini oxuyub gəlir üstümə. Bizimkinə bax, ona bax! Övlad da olanda eləsi olsun! (*Gedir*).

R e y h a n. Belə də dərd olar, oğul doğ, canını-ciyərini ver, böyüt, nə o sən deyəni başa düşsün, nə sən bil onun istəyi nədir.

Vahid əl-üzünü silə-silə içəri girir,
xüsusi keflə gəlib anasının boynunu qucaqlayır.

V a h i d. Maman, nə olub, acıqlanmısan?

R e y h a n. Elə hər sözümə belə əməl edirsən. Maman, maman! Sənə dedim ki, dəymə babanın şəklinə, qoy qalsın yerində (*Mücərrəd qadın şəklini göstərir*). Bunu da çıxart evdən. Biədəb, biqabiliyyət şeydir.

V a h i d. Anacan, sizinlə bizim aramızda əsrlər durmuşdur. Köhnə zövq, köhnə əxlaq, köhnə sənət bu gün yaramır.

R e y h a n. Ay bala, gərək təzə köhnədən bir az yaxşı olsun ki, deyəsən irəli gedirik. Axı, oğullar atalardan pis olanda, xalq nə cür tərəqqi edər?

V a h i d. Bilmirəm atam bu köhnə fotoda, bu sınıq sazda nə tapıb?

R e y h a n. Oğul, bu sənin babanın şəklidir, bu sazı da o, əlli il sinəsində gəzdirib. Atan üçün bunlar müqəddəsdir, canından keçər, bunlardan yox.

V a h i d. Yaxşı, keçməsin! Dəhlizdə, ya da mətbəxdə asaram.

R e y h a n. Necəə?! Gərək bunları sən ürəyində gəzdirəsən, ən əziz yerdən asasan.

V a h i d (*anasının boynunu qucaqlayır*). Mənim anam bir dənədir. Öl desə öləcəyəm, qal desə qalacağam... Razısanmı?

R e y h a n. Sən məni belə oxşayanda qorxuram; de görüm nə kələyin var?

V a h i d. Heç bir kələyim yoxdur, ana. Bu gün yanıma qız yoldaşlardan biri gələcək. Həm kitab aparacaq, həm də mövzusu ətrafında söhbət edəcəyik. Əminəm ki, onu gülərüzlə qarşılayacaqsan. Yaxşı qızdır.

R e y h a n (*həyəcan və iztirabla*). O kimdir, ay bala, harda tanış olmusan? Sən bir qıza yaxınlaşanda mənim ürəyim tir-tir əsir. Deyirəm, ilahi, nə özü bir xataya düşməsin, nə də başqalarını bədbəxt eləməsin.

V a h i d. Yaxşı, ana, bu sözünü də yadımda saxlaram. Bu vaxta qədər ki, bir şey eləməmişəm, məndən narazı olasan.

R e y h a n. Eləmisən, oğlum. Bir zaman o Göyərçinlə gəzirdin, nə oldu?

V a h i d. Özü mənə yaxınlaşmışdı.

R e y h a n. Hər nə, axırı ki, gəzirdin, əvvəllər xoşuna da gəlirdi.

V a h i d. Sonra isə gördüm ki, açıq-saçığın biridir, gələnin üzünə gülür, sözləşdik, o bir yana getdi, mən o biri yana.

R e y h a n. Kim bilir, yazıq bəlkə indi də dərd içindədir...

V a h i d. Onun fikrini eləmə... Özünə Şəkərlinski kimi vəzifəli-gəlirli bir ər tapıb, keyfi saz, damağı çağdır.

R e y h a n. Bəs, Ayxanıma nə sözün var? O ki gül kimi qızdır!

V a h i d. Oy, ana, heç onu demə. Gözəldir, təmizdir, düşüncəlidir, amma çox hikkəlidir, istəyir ki, həmişə o deyən olsun. Qız ki prinsipial oldu, heç nə. Adamı dığladar. Şölə isə ipək kimi yumşaqdır, lap sən xasiyyətdə! (*Zəng çalınır*). Ürəyindən deyilsə qapını aç, de ki, mən evdə yoxam.

R e y h a n. Yox, adam sözündən dönməz. İndi ki, söz vermisən, qəbul elə. Mən də çay hazırlayım.(*Mətbəxə keçir*).

V a h i d (*qapını açır*).

Bənəfşə tamamilə başqa, lakin kənd qızlarına məxsus sadə geyimdə qapıda görünür. O, Vahidi diqqətlə süzür, Vahid isə onu tanımır.

Kimi istəyirsən, ay qız?

B ə n ə f ş ə. Məni tanımadı. Yenə fikri özündə deyil.

V a h i d. Ay qız, orda nə mırt vurursan!

B ə n ə f ş ə. İndi ki, tanımadı, daha yaxşı. Bircə bu çalağanı çəngimə keçirə bilsəydim.

V a h i d. Ay qız, dua oxuyursan, nədir, dodağın tərpənir, səsin çıxmır?

B ə n ə f ş ə. Hə, səni ovsunlamaq üçün dua oxuyuram (Vahidə utancaq və məlahətli) Mahmud müəllim institutdan gəlmiyif?

V a h i d (*istehza ilə*) Xeyr, gəlmiyif... ay xanım, dişlərini niyə ağardırsan, yum ağzını!

B ə n ə f ş ə. Səni görmüşəm, gülməyim tutuf dana.

V a h i d. Niyə, mənim üzümdə qarpız bitif? Dişlərini ağartma. Mahmud müəllimi neyləyirsən? Özü çağırıb?

B ə n ə f ş ə. Yox, mən gəlmişəm. İşim var, istəyirəm dərsim barədə məsləhətləşəm.

V a h i d. Yaxşı eləyirsən, keç içəri... Deməli kənddən gəlmisən? (*Bənəfşə yazıq-yazıq başını tərpədib gülümsəyir*). Bu kəndçi qızları niyə belə sadə-saya olurlar?

B ə n ə f ş ə. Neyləsinlər, haranı görüblər ki, başqa cür olalar?

Vahid Bənəfşəyə yaxınlaşır. Cibindəki radionu çaldırır.
Bənəfşə diksinib heyrətlə ətrafa baxır. Vahid gülür.

V a h i d. Qorxma, al qulaq as (*Radionu ona verir. Bənəfşə qulaq asır*).

B ə n ə f ş ə. Nə yaxşı şeydir, eşitmişdim, görməmişdim... (*Gülümsəyir*).

V a h i d. Yenə hırıldadı. Demirəm dişlərini ağartma?! (*Əli ilə onun dodaqlarını qapayır*).

B ə n ə f ş ə (*onun əlinin üstündən vurur*). Bizim kənddə əli uzunluq eləyəni maşa ilə döyürlər.

V a h i d. Bizim şəhərdə də hırıldayanların dodağını tikirlər (*Reyhan xanım gəlir. Bənəfşəni görüb sevinir*).

R e y h a n. Hə, qızım, sənsən, xoş gəlmisən, həmişə sən gələsən, otur. Mahmud səni o qədər tərifləyib ki, deyir ağıllı qızdır, dilindən düşmürsən (*Bənəfşə başını aşağı salır*). Gəl bura, otur, gözlə (*Ona aynabənddə yer göstərir, özü isə mətbəxə gedir*).

Bənəfşə, ayağının birini götürüb o birini qoyur,
dönüb dala baxa-baxa aynabəndə tərəf yollanır.

V a h i d. Yaxşı yeri, yıxılarsan, qaz kimi suda üzmə...

B ə n ə f ş ə (*dayanır, uşaq kimi başını tərpədir*). Hi... hi... hi...

V a h i d. Adam bir qram dilini qoyub, bir put başını tərpətməz, bildin?

B ə n ə f ş ə (*başını tərpədə-tərpədə ona baxır*). Bildim. Bəs Şölə bura gəlmiyif?

V a h i d (*maraqla*). Gəlmiyif. Sən onu hardan tanıyırsan?

B ə n ə f ş ə. İnstitutda görmüşəm, deyirdi sizə gələcək.

V a h i d. Necə qızdır?

B ə n ə f ş ə. Necə yəni?

V a h i d. Yəni soruşuram gözəldir?

B ə n ə f ş ə. Nə bilim...

V a h i d. Ağıllıdır?

B ə n ə f ş ə. Yox!

V a h i d. Niyə?

B ə n ə f ş ə. Ağlı olan qız sənə yaxın durmaz... Bəri bax, şuluq adama oxşayırsan.

V a h i d. Guya mən istəsəm sən mənə yaxın durmazsan?!

B ə n ə f ş ə. Heç vədə!

V a h i d. Birdən vuruldum sənə, dedim gəl alım, gəlməzsən?

B ə n ə f ş ə. Hi, hi, hi... (*Başını elə tərpədir ki, "hə" və ya "yox" dediyini bilmək olmur*).

V a h i d. Bu kəndçi qızları da başqa aləmdir, ərə gedəndə də başını tərpədir, boşananda da... (*Bənəfşə gülə-gülə aynabəndə yollanır, Vahid daldan onu süzür*). Amma şəhər qızları kimi geyindirəsən, səliqəyə salasan, pis şey olmaz. Bir yerişinə bax. Aləmdir (*Zəng çalınır. Sevincək*). Aha, bu Şölə olacaq. Bu saat, bu saat Şöləcan (*Qapını açır. Lakin Şölə əvəzinə Ayxanım içəri girəndə Vahid donub qalır*). Ayxanım, sənsən?!

A y x a n ı m (*arxası Bənəfşə oturan aynabəndə tərəf olduğundan onu görmür*). Deyəsən məni gözləmirdin, kiminsə adını çəkdin?

V a h i d (*özünü ələ almağa çalışır*). Ad çəkdim? Mən a? Yox, yox, görünür sənin qulağın səsdədir (Bənəfşə bütün bu danışığa fikir verir. Vahidin son sözlərini eşidəndə qəsdən əsnəyir. Vahid ona yaxınlaşır, yavaşdan) Ay qız, ağzını yavaş aç! Yuxun gəlir, dur keç o biri otağa.

Bənəfşə gülümsəyib üzünü o tərəfə çevirir.

A y x a n ı m. Bilirsən Vahid, biz ciddi danışmalıyıq.

V a h i d. Nə barədə.

A y x a n ı m. O barədə ki, mən sənə birinci gün demişdim – yeldəyirmanllarından mənim xoşum gəlmir.

V a h i d. Mən heç vaxt razı ola bilmərəm ki, qız mənə hökm eləsin, xasiyyətim belədir!

A y x a n ı m. Bəs sənə necə qız lazımdır?

V a h i d. Elə qız ki, mənə arvad olsun.

B ə n ə f ş ə. Sənin dilin yansın. Sözünə bir bax! (*Ucadan əsnəyir, Vahid bu yana baxıb gözünü ağardır. Bənəfşə yalandan gülümsəyir*).

V a h i d (*Ayxanıma*). Başa düşdün? Elə qız ki, mənə arvad olsun.

A y x a n ı m. Arvad yox, yoldaş!

V a h i d. İkisi də birdir.

A y x a n ı m. Yox, bir deyil.

V a h i d. Birdir!

A y x a n ı m. Bir deyil.

V a h i d. Olmadı ki, belə getsə səndən adama nə arvad çıxar, nə də yoldaş. Ərin üstündə olarsan ictimai kontrol.

B ə n ə f ş ə. Sənə ictimai kontrol yox, ictimai kömək lazımdır.

A y x a n ı m. Çürük fikirlərlə yaşayırsan, Vahid, dəyişməlisən.

V a h i d. Yox, sən dəyişməlisən! (*Bənəfşə asqırır, Vahid ona yaxınlaşır*). Ay qız, sən də gah əsnəyirsən, gah asqırırsan. Bəs deyil?!

B ə n ə f ş ə. Mənim yuxum gələndə həmişə burnum geyişir...

V a h i d. Burnun geyişir, get su ilə yu.

A y x a n ı m. Deməli, qara məni basmamış, mən qaranı basdım, hə? Ürəyin qaradır, təmizlə ürəyini!

B ə n ə f ş ə. Dayan, onu bir girimə keçirim, gör ürəyini necə təmizləyirəm. Qiyamətəcən unutmasın!

V a h i d. Xeyr, zəhmət çək, sən dəyiş xasiyyətini!

A y x a n ı m. Deyəsən sən məni çox zəif bilmisən?

V a h i d. Qorxutma məni, mən də elə bilirəm bu peşman olub, gəlib üzr istəsin, barışaq, məndən əl çək, ay bacı!

B ə n ə f ş ə. Aman Allah, Ayxanım bu təhqirə necə dözsün?!

A y x a n ı m. Bacı! Deməli bu sənin son sözündür? Onu bil ki, mən üzr istəyib yalançı məhəbbətə sığınan qızlardan deyiləm. Mənim sənə yazığım gəlir. Heyifsən, görkəmin, bacarığın, qabiliyyətin var, amma iradən, ağlın...

V a h i d. Səndən ağıl öyrənməyəcəyəm! (*Qapının zəngi çalınır*). Keç, sən də keç o kəndçi qızının yanına.

Dəhlizə çıxır. Ayxanım yalnız indi Bənəfşəni görüb tutulur, iztirab, həyəcan və peşmanlıq oynayan gözlərlə ona baxır.

B ə n ə f ş ə. Nə nəcib ürəyin var, Ayxanım, sənin məhəbbətini ayaq altına atan adam gərək cəzalansın...

A y x a n ı m. Yox, Bənəfşə, mən ona cəza yox, şəfa diləyirəm (*Doluxsunur*). Sevirəm, heç özüm də bilmirəm nə bəlaya düşmüşəm, ha çalışıram, ürəyim dönmür ki, dönmür... (*Ağlayır*).

B ə n ə f ş ə (*onun başını sinəsinə sıxır*). Təəccüb edirəm, bunun nəyinə vurulmusan?

A y x a n ı m. Nə bilim... Məgər məndən asılıdır?

Hıçqırıq onu boğur, dönüb getmək istərkən içəri girən Aslanla üz-üzə gəlir. Baxışırlar. Ayxanım dayana bilməyib tez çıxır. Bənəfşə aynabəndə çəkilir. Aslan töhmət və sual dolu gözlərlə Vahidi süzür.

A s l a n. Nə olub?!

V a h i d. Heç nə! (*Yarı istehza ilə*) Sən yaxşı eləyirsən, bərk yapış o kəndçi qızından, adı nə idi?

A s l a n. Adını neyləyirsən, özündən danış. Yeməmisən qaz ətini, nə bilirsən ləzzətini!..

V a h i d. Ay rəhmətlik oğlu. Nə yaman qazlı gəlmisən?

A s l a n. Keyfim sazdır, işim düzdür, otur bir az danışaq.

V a h i d (*saatına baxır*). Bura bax, Aslan, gəl, söhbəti qoyaq sonraya.

A s l a n. De görüm nəyin nigarançılığını çəkirsən?

V a h i d. Heç nəyin... Elə-belə. Durmuşam, özüm üçün hava alıram.

A s l a n (*sazı götürür*). Onda qulaq as, ləzzət apar (*Çalır*).

V a h i d (*kənara*). Yaman qızıb gəlib üstümə, bilmirəm nə təhər başımdan eləyim (*Əlini sazın tellərinə qoyur*). Zəmanəyə yaxınlaş, saz çalıb oxumaq vaxtı çoxdan keçib...

A s l a n (*"Koroğlu" operasından "Səni gördüm aşıq oldum" havasının iki bəndini oxuyur*). Üzeyir Hacıbəyov, Bethoven, Çaykovski...

Bunlardamı köhnəlib?! Axı, sən hardan biləsən bunların qədrini? Eşitdiyin caz, oxuduğun Remark, onlarda da ki, başları dumanlandıran meyxanələrdən, sərxoş qadınlardan başqa bir şey görmürsən.

V a h i d. Yaxşı, yaxşı mənə ədəbiyyat dərsi demə.

R e y h a n gəlir.

A s l a n. Salam, Reyhan xala.

R e y h a n. Salam, oğlum! Ay bivəfa, bəs adam anasını belə yad edər? İncimişəm səndən.

A s l a n. Haqqın var, Reyhan xala. İş o qədər çoxdur ki, baş qaşımağa macal olmur. Gərək bağışlayasan.

R e y h a n. Daha əlacım nədir. Əyləş (*Vahidə*). Oğlum, gəl çay gətir.

Onlar mətbəxə keçir. Aslan sevinclə Bənəfşəyə yaxınlaşır.

A s l a n. Ay qız, sən burda nə edirsən?

B ə n ə f ş ə. Mənə yaxın durma, iş var...

A s l a n (*bu sözü tərs başa düşərək şübhə ilə*). İş var... Nə iş?! (*Vahidin dalınca işarə edir*). Yoxsa...

Bu işarə Bənəfşəyə toxunur.

B ə n ə f ş ə (*onun sözünü kəsir*). Siz kişilər hamınız bir yuvanın quşusunuz. Qara ürəkli! (*Danışmaq istəyən Aslana macal vermir*). Özüm bilərəm, məni sorğu-suala çəkmə.

A s l a n. Çəkmə, çəkmərəm, nə deyirəm ki (*Reyhan və Vahid çay, qənd, mürəbbə gətirirlər*).

R e y h a n. Oğlum, siz çalıb-oxumaqda olun, mən də bir bazara dəyim gəlirəm.

Gedir. Bənəfşə yenə aynabəndə çəkilir. Aslan sazı dınqıldadır.

V a h i d. Keyfin yaman sazdır...

A s l a n. Bəli, sazdır. Heç olmasa səbəbini soruş.

V a h i d. Yaxşı, soruşdum, cavab ver!

A s l a n. Teatrımız Bakıya gəlir, nazirlik icazə verdi. Sevinirsənmi?

V a h i d. Yaman sevinirəm.

A s l a n. Nəyə sevinirsən?

V a h i d. Ona ki, müxtəsər elədin.

Dəhlizdə telefon zəng çalır. Vahid ora keçir.

A s l a n (*Bənəfşəyə baxır*). Ehh, dünya-dünya. Yavaş-yavaş yoldaşlıq da heç olur, etibar da, vəfa da.

B ə n ə f ş ə. Mənə atırsan?!

A s l a n. Atmayım neyləyim, (*Vahidə işarə ilə*) bilmirsən necə çalağandır.

B ə n ə f ş ə. Deməli, mənə inanmırsan, ikinci də nə haqqın var məni qısqanırsan?

A s l a n. Niyə acıqlanırsan? Səndən belə sözlər gözləməzdim... Həmişə sakit, başıaşağı Bənəfşə...

B ə n ə f ş ə. Deməli sən də məni sadə-saya bir şey bilmisən, eləmi?

A s l a n. Sən bu gün dava-dava deyirsən (*İncik və istehza ilə*) Görünür doğrudan da iş var... Müvəffəqiyyət arzu edirəm (*Gedir*).

Bənəfşə təəssüflə dalınca cumur. Vahid gəlir. Dəhlizdə Aslanla üzləşir.

V a h i d. Sənə nə oldu, Aslan?!

Aslan gedir. Vahid onun dalınca çıxır. Lakin Alışovla qayıdır.
Alışovun çiynində böyük bir xurcun, əlində səbətçə var.

A l ı ş o v (*ucadan və şirin-şirin*). Salam, dadaş, salam.

V a h i d. Xoş görmüşük Alışov (*Əl uzadır*). Nə yaman yükləyiblər səni, lap köçəri ulağına oxşayırsan.

A l ı ş o v. Qoy desin, nə desə özündən çıxan deyiləm. Yağdır, pendirdir, hinduşkadır, qazdır. Dedim dost qapısını sovqatsız açmaq günahdır...

V a h i d. Gətirmisən, sağ ol, ancaq, xəbərdar edirəm, sabah quyruğun qapı arasına düşəndə, heç kəsdən xahiş eləyən deyiləm.

A l ı ş o v. Bıy, bu ağbatı xeyir nə danışır?! Alışov eləmi iş tutar, düyünə düşsün (*Zəng olur*).

V a h i d. Yaxşı, yaxşı, şeyləri apar mətbəxə. Özün də keç o biri otağa, qapını bərk bağla, qulağını bu yana tərəf şəkləmə. Bu dəfə yəqin Şölədir (*Alışovu o biri otağa salır*). Gəldim, Şölə (*Qapını açır. Atası ilə qarşılaşdıqda təşvişə düşür*). Ata... Salam ata, paltonu, şlyapanı mənə ver.

M a h m u d. Paltomu özüm də asaram. Sən əgər doğrudan da atanı istəyirsən, hörmətini-izzətini başqa cür saxla.

V a h i d (*zorla onun paltosunu alıb asır. Altına stul çəkir*). Əyləş, ata, nə olub ata?! (*Atasının acıqlı olduğunu hiss edib kənardan bu hərəkətlərə göz qoyan Bənəfşənin yanında danlanmamaq üçün sözü dəyişir*). Ata, tələbən səni gözləyir.

Bənəfşə Vahidin bu hərəkətinin mənasını anlayan
gözlərlə onu süzüb professora yaxınlaşır.

B ə n ə f ş ə. Salam, əziz müəllim.

M a h m u d (*səmimi sevinclə*). Salam, qızım (*Divardakı şəkli Vahidə göstərir*). Bu nədir? Gör nəyi nə ilə əvəz etmisən?

B ə n ə f ş ə. Hörmətli müəllim, icazə verin mən gedim, başqa vədə gələrəm (*Vahidə*) Çox pis vaxtda gəlmişəm.

M a h m u d. Yox, getmə, otur orda, məni gözlə.

B ə n ə f ş ə. Baş üstə (*Aynabənddə oturub kitab oxuyur*).

M a h m u d (*divardakı şəkilləri süzür, oğluna*). Səndən soruşuram, bu nədir?!

V a h i d. Həmişə deyirsən ki, zamanın övladı olmaq gərək. İndiki zamanın modası belədir.

M a h m u d. Moda! Paltarda – moda, əxlaqda – moda, musiqidə – moda, sevgidə – moda! Özü də eybəcər, zövqsüz, baxmaq olmur!

V a h i d. Avropadan gəlib ata. Avropaya məhəbbəti mənim ürəyimdə sən oyatmısan.

M a h m u d. Mənim dediyim Avropa bu deyil, hər iyrənc şeyə Avropa modası deyib əsir olmaq rəzalətdir!

Səbəti göy-göyərti ilə doldurmuş Reyhan gəlir.
Onların ciddi danışdığını görüb bir kənarda oturur.

V a h i d (*incik halda*). Ata, mən həmişə sənin hörmətini saxlamağa çalışmışam.

M a h m u d (*istehza ilə*). Çox razıyam ki, heç olmasa burada modaya əsir olmamısan. Axı sənin kimilərin ataları saymamağı, anaların üstünə qışqırmağı moddur. Aşıq səni görüb deyib oğullar atanı, qızlar ananı, gəlinlər də qayınananı bəyənməz.

V a h i d. Görürəm ki, mənim hərəkətlərim səni cana gətirmişdir. Sözün açığı, sənin də danlaq və nəsihətlərin məni yormuşdur. İcazə versən, sabahdan çıxıb gedərəm, bir yerdə özümə bir künc tapıb yaşaram.

R e y h a n (*kövrəlir*). Nə olub, ay kişi? Az danla bu yazığı! Hara gedirsən, bala? Evimizə-eşiyimizə nə gəlib... Camaat bizə nə deyər?!

V a h i d. Bilirəm ana, sənin üçün ağır olacaq... Lakin mən də dözə bilmirəm. Görürəm ki, hər hərəkətim atamı haldan çıxarır. Mən...

M a h m u d. Sən sən olsaydın, bir sənətin ucundan tutardın, gedərdin axıracan. Orta məktəbi pis qurtardın...

V a h i d. Səbəbi sənə məlumdur. Onda sən Sibirdə idin. Anam da tək, bir qohum-qonşu qapımızı açıb içəri girmirdi. Həm işlə, həm oxu.

R e y h a n. Getsin o günləri, bir də gəlməsin... Başımız nə bəlalar çəkdi.

M a h m u d. Mən səndən də pis şəraitdə oxumuşam. Tibb institutuna getdin, iki il oxuyub çıxdın... Dedim gəl yanıma, riyaziyyatçı ol, olmadın.

V a h i d. İstəmirəm sən yol açasan – mən yeriyəm, sən yazasan – mənim adım çıxa. Pomidor satacağam, özüm satacağam. Bəli, özüm satacağam! Bir də ki, riyaziyyat quru elmdir.

Mahmud istehza ilə oğlunu süzür. Sonra Bənəfşəyə dönür.

M a h m u d. Qızım, gəl, buna söylə ki, riyaziyyat necə maraqlı elmdir. İnsanın kosmik fəzalara uçmasında, elektron maşınların icadında necə böyük rol oynayır... Bəli, quru elmdir.

R e y h a n. Yaxşı, ay kişi...

M a h m u d. Tarix fakültəsini birtəhər qurtardın. Zərərvericilərlə mübarizə idarəsinə girdin. İndi də ticarət. Tarix hara, ticarət hara? Məgər aspiranturaya gedə bilməzdin?

V a h i d. Mən alim olmaq istəmirəm. Adi vətəndaş kimi işləyəcəyəm.

R e y h a n. A kişi, doğru deyir də, hamı alim olmaz ki...

V a h i d. Siz alimlər, yazıçılar, çalğıçılar işi o yerə gətirəcəksiniz ki, hökumət qanun verib qadağan edəcək oğul atasının peşəsinə getməsin, bir fəhlənin və kəndçinin uşağından başqa! Hökmdür gərək alimin oğlu – alim, yazıçının oğlu – yazıçı olsun?!

R e y h a n. Düz deyir də, ay kişi, qabiliyyəti var, yox – çəkirlər atasının peşəsinə. Bədbəxtlikdir ki, qabiliyyətli adamlar lazım olan yerdə biqabiliyyətlər otura, belə olsa cəmiyyət çürüyər ki...

Vahid qeyri-ixtiyari olaraq cibindəki radionu qurur.
Musiqi səsi otağı bürüyür. Bənəfşə heyrətlə Vahidi süzür.

B ə n ə f ş ə. Yanasan səni... Keyfindən qalmır ha...

M a h m u d. Buyur, bu da sənin böyük əsrlə ayaqlaşmağın, elə bil it boğuşdururlar. Kəs onun səsini!

Vahid ayılan kimi tez radionu susdurur. Musiqi kəsilir.

V a h i d. Doğrusu, ata, təzə idarəyə keçməyimin səbəbi o oldu ki, müdiri Şəkərlinski xoşuma gəlir, özü də səninlə görüşməyə can atır. Bu gün bəlkə bura gəldi. Bizi ürəkdən sevən adamdır.

M a h m u d. Sənə xoş gəlməyindən bilirəm necə adamdır. Yəqin professor balalarını, ministr uşaqlarını çıxardır başına, adamsızları adam yerinə qoymur!

V a h i d. Yox ata, Şəkərlinski istiqanlı kişidir.

M a h m u d. Tutaq ki, elədir. Adam da bəs müdirə görə iş yerini dəyişər? Sabah bir şey oldu, onu götürdülər, qoydular başqasını, onda neyləyəcəksən?

V a h i d. Arxayın ol, onun yeri möhkəmdir.

Zəng çalınır. Reyhan və Vahid çıxırlar. Mahmud Bənəfşəyə dönür.

M a h m u d. Hə, qızım, necəsən, kənddə nə var, nə yox? Yaxşı hazırlaşa bilmisənmi?

B ə n ə f ş ə. Çalışmışam, professor.

M a h m u d. Kibernetik maşınlar haqqındakı kitabçanı oxudunmu, bəyəndinmi?

B ə n ə f ş ə. Oxudum, professor, lakin bəyənmədim. Bəyənmədim də...

M a h m u d (*maraqla onu süzür*). Nə üçün? Sən elmin düşünən maşınlar icad edəcəyinə, üzvi maddələrdən beyni olan maşınlar yaradacağına şübhəmi edirsən?

B ə n ə f ş ə. Xeyr, professor, mən buna şübhə etmirəm. Lakin müəllif yazır ki, düşünən maşınlar guya insanı əvəz edəcək və daha kamil şüura malik olacaqdır. Bax, mən buna inanmıram. Axı kibernetik maşınlarda ürək olmayacaqdır. Ürəkdən qida almayan beyin isə yaradıcı şüura yox, ancaq ifaçı şüura malik ola bilər.

M a h m u d (*Şəkərlinski ilə içəri girən Vahidi göstərir*). Məsələn, bunun kimi...

V a h i d. Bəli, ata... Şəkərlinski gəlib...

Şəkərlinski əlində bir dəstə gül və bir bükülü içəri girir. Mahmud onu görən kimi sarsılır. Lakin hirsini boğub bir söz demir. Şəkərlinski özünü lap köhnə tanışlar kimi açıq və məhrəm aparır.

Ş ə k ə r l i n s k i. Vahid bala, al bunu (*Bükülünü Vahidə verib birbaş Mahmudun üstünə gedir. Qucaqlayıb bağrına basır*). Böyük alimə eşq olsun, mənim əziz həmyerlimə, köhnə dostuma salam.

M a h m u d. Bağışlayın, mən sizi... (*Xatırlayır*). Aha, sizsiniz...

V a h i d. Ata, sənə dediyim adamdır, bizim idarənin müdiri Şəkərlinski?

Ş ə k ə r l i n s k i. Qəzetdə orden aldığını oxuyan kimi durub qaçmışam bura, öpüm üzündən...

R e y h a n. Zəhmət çəkmisiniz, qardaş, sağ olun.

Ş ə k ə r l i n s k i. Bilirsən bacı, biz bu kişi ilə fəxr edirik. Bütün bizim mahal fəxr edir (*Vahidə dönür*). Bala, bəs Alışov hanı?

V a h i d. Bura gəlməyib.

Ş ə k ə r l i n s k i. Səni əkənə də lənət, doğana da Alışov! Necə gəlməyib! İki hinduşka, beş qaz, dörd ördək, bir bardaş kərə yağ, bir bardaq bal vermişəm ki, Alışov, apar professor qardaşıma... Piyaniskə köpək oğlu, görəsən hansı konyak butulkasının yanında yatdı qaldı.

A l ı ş o v (*o biri otaqdan çıxır*). Xeyr, yoldaş Şəkərlinski, Alışov qulluğunda hazırdır.

R e y h a n və M a h m u d (heyrətlə Vahidə baxırlar). Bəs deyirdin bura gəlməyib?

A l ı ş o v. Düz də deyirdi, Reyhan xala. Mənim üçün qapını qulluqçu qız açdı.

V a h i d. Sən də yalan danışma. Atam o qədər çaşdırdı ki, bu boyda adamı unutdum.

Ş ə k ə r l i n s k i. Ay maymaq, bəs səhərdən səsin niyə çıxmır?

A l ı ş o v. Başın üçün, kresloya oturmağımla yuxuya getməyim bir olub.

Ş ə k ə r l i n s k i. Ay bədbəxt, yata-yata bu günə qalmısan də. Tənbəl öküz kimi.

A l ı ş o v. Qoy desin, nə desə özündən çıxan deyiləm.

Ş ə k ə r l i n s k i. Alışov, bəs hinduşka hanı, ördək hanı?

A l ı ş o v. Hamısı mətbəxdədir.

Ş ə k ə r l i n s k i (*Reyhana*). Bacı, yadında saxla, bizim bu böyük alimimizə yaxşı bax. Nə qədər ki, bizim mahal durur, mən dururam, havaxt lazım oldu bu kişinin toyuğu, hinduşkası məndə, təzə qoyun əti də üstündə, bax, bu kişinin başı da, başının tükü də bizim üçün əzizdir.

M a h m u d. Nə bayağı, nə iyrənc sözlərdir!

R e y h a n. Kişi, səbir elə görək axırı hara çıxır.

M a h m u d (*Vahidi göstərir*). Bu başlayan işin axırı hara çıxar? Biabırçılığa, bədnamlığa.

Ş ə k ə r l i n s k i. Qardaş, eşitmişəm ki, o institutda qarabağlılar sənə dolaşırlar, heç qorxma, bütün mahalınnan durmuşuq dalında, küllərini göyə sovurunca varam onlarnan...

M a h m u d. Ay kişi, nə qarabağlı, nə kül göyə sovurmaq? Başa düşmürəm nə danışırsınız?

Ş ə k ə r l i n s k i. Bu saat Alışov sizi başa salar. De, Alışov, o qarabağlı gədəsi Rəşid nə gətirir başımıza. Danış, gic dana kimi gözünü döymə.

A l ı ş o v. Qoy desin, nə desə özündən çıxan deyiləm. Özün yaxşısan, yoldaş Şəkərlinski...

Ş ə k ə r l i n s k i. Bizim idarədə bir qarabağlı var, Rəşid...

M a h m u d. Yetər, canım, bu murdar yerliçilik xanlar-bəylər dövründə bizə od vurdu, üç yüz il Azərbaycanı dağıtdı, bəs deyil, indi də başlamısınız.

Ş ə k ə r l i n s k i. Dostum, alimliyinə sözüm yox, amma bu məsələdə mənə qulaq as. Necə olsa yerli yerlidir, dar gündə satmaz səni qarabağlılara... bu Alışovu niyə gəzdirirəm dalımca, hansı idarəyə gedirəm aparıram. Böyük qabiliyyəti var? Savadı var? İş bacarandır? Yox! Amma öz yerlimdir, dalımda hayandır. Odur ki, asmışam quyruq kimi buramdan...

A l ı ş o v. Qoy desin, nə desə özündən çıxan deyiləm.

Mahmud hirsindən üzünü yana çevirir.

R e y h a n. Ay qardaş, Mahmud əvvəldən bilməz yerli nədir, başqası nədir.

Ş ə k ə r l i n s k i. O bilməsin, o gərək özünü elə göstərsin ki, heç bilmir də, amma biz bilirik, qoymarıq qarabağlılar ona sataşalar... (*Vahidə*) Qardaşoğlu, Ayxanıma da hədiyyə gətirmişəm (*Bükülünü göstərir*). Götür, verərsən gəlinimizə...

V a h i d (*yavaşca*). Valı dəyiş...

Ş ə k ə r l i n s k i. Yox, dəyişən deyiləm. Siz cavanlara gərək biz rəhnüma olaq. Elə bilirsən bilmirəm?! Bir az qabaq rast gəlmişəm Ayxanıma, səni-soruşuram, başlayıb ağlamağa... İncitmək olmaz, elə qızı...

V a h i d (*hirsli*). Ay kişi, dedim ki, dəyiş valı. Mənim Ayxanım adlı tanışım yoxdur.

M a h m u d (*heyrətlə Reyhana baxır*). Bu da təzə xəbərdir?

R e y h a n. Sakit ol, ay kişi, səbir elə.

Ş ə k ə r l i n s k i. Al, bu hədiyyəni mənim adımdan verərsən ona, barışarsınız. Mədəni olmaq bizə çox vacibdir. Bu yerlimin, bu alim dostumun nə ki, qoşum-əqrəbası var, hamısına qulluq eləmək borcumdur. Sabah yeri düşər, o da yuxarıda məni yada salar. Yerlisini unutmaz.

M a h m u d (*yavaş, lakin ciddi*). Rica edirəm, bu cür təmənnalarla mənim qapımı açmayın. Özünüz də az yerli-yerli deyin, yoxsa məcbur olaram bəzi şeyləri yadınıza salam, onda qorxuram siçan deşiyini çatın alasınız. Xoş gəldiniz! (*Arxasını ona çevirir. Şəkərlinski təhqir olunuş halda ayağa durur*).

Ş ə k ə r l i n s k i. Yaxşı, eloğlu, gedirəm, amma bil ki, mən hələ ölməmişəm, məni hörmətsiz edənlərdən əvəz çıxaram (*Vahidə*) Əmrini verib çıxaracağam səni işdən!

Gedir. Reyhan Alışovu saxlayır.

R e y h a n. Gəl bala, nə gətirmisən, götür apar...

A l ı ş o v. Ayıb oldu ki, Reyhan xala... adətimiz var.

M a h m u d. Apar bala, apar, sövdalaşmaq niyyətilə pay gətirmək çürük adətdir.

V a h i d. Əə, yavaşca çıx əkil, çuğundur kimi qızarmısan...

A l ı ş o v. Qoy desin, nə desə özümdən çıxan deyiləm (*Gedir*).

M a h m u d (*tənəli və qəzəbli gözlərlə oğlunu süzür*). Deməli, Ayxanımı da atdın! Şəkərlinski, Alışov kimilərlə oturub-duran adamdan nə gözləmək olar? Belə düzəlirsən, hə? Biz cəhənnəm, heç olmasa özünə yazığın gəlsin! (*Özündən çıxır*). Bayaq getmək istəyirdin, hara istəyirsən rədd ol get, tərk elə mənim evimi!

R e y h a n. Başına dönüm, ay Mahmud, niyə belə hirslənirsən? Neylək, sözünü de, haqlısan, nə desən haqlısan! (*Danışmaq istəyən Vahidə susmaq işarəsi verir*). Bunu lap öldürə də bilərsən... Amma hirslənmə.

V a h i d (*paltosunu götürür*). İndi ki, doğma atam məni görə bilmir, tikan kimi gözünə batıram, çıxıb gedərəm. Heç kəs məni qınaya bilməz ki, oğulluq borcunu ayaqladım.

R e y h a n (*Mahmudun qabağına gəlir*). Otuz ildir sənə yoldaşlıq etmişəm. Bir sözümü yerə salmamısan. Bu xahişimə də əməl elə. Keç günahından. Bağışla... (*Vahidə*) Bir danış oğul, sən də bir söz de, üzr istə atandan, qoy kişi bilsin ki, başa düşmüsən...

V a h i d. Bilirəm ata, mən sizi çox incitmişəm. Ancaq həmişə günah məndə olmayıb. Mənim barəmdə hər deyilənə inanma. Axı, bizim kimilərin dalınca olanı da, olmayanı da danışmaqdan ləzzət alanlar az deyil, xüsusən qız barədə.

M a h m u d. Evlən, yüz dəfə demişəm, tap birini gətir, ayağın ordan-burdan yığılsın.

R e y h a n. Hə, qadan alım, gör atan nə yaxşı söz deyir. Mənim də arzum var, gəlin görüm, nəvə görüm.

V a h i d. Ancaq bu şəhər qızlarının içindən lap mələk də seçsən alan deyiləm. Bunlar kişinin üstündə ağa olmaq istəyirlər. Tapın mənə bir fağır, dilsiz-ağılsız kəndçi qızı.

M a h m u d. Bəs, bayaq Avropadan danışırdın? Arvada gələndə vəhşiyə dönürsən.

V a h i d. Avropadan da, Asiyadan da xoşuma gələni götürürəm.

M a h m u d. Yox, de ki, Avropanın da çürüyünü, Asiyanın da...

R e y h a n. A kişi, yenə uzağa getməyin... Uşaq kəndçi qızı istəyir, neylək, soraqlaşaram, nə çox dost-aşna, gedərəm, həyalı, göyçək, əl-ayağı təmiz birini seçərəm, baxar, bəyənər, alıb gətirərəm.

M a h m u d. Nə edirsiniz edin. Bir də bugünkü həngaməni görməyim (*Bənəfşəni çağırır*). Gəl qızım, bəlkə sən mənim dərdimi bir az yüngülləşdirəsən...

Kabinetinə keçir. Bənəfşə gedərkən mehriban gözlərlə Vahidə baxıb gülümsəyir; cib radiosunu qurur. Gözəl bir hava çalınır. Vahid cazibə ilə üstünə atılanda qoyub qaçır.

V a h i d. Ana, nə bir yerə getmək lazımdır, nə də soraqlaşmaq, gəl elə bu kəndçi qızını al mənə. Üzügülər, dilişirin.

R e y h a n. Gözünə qurban olum bala, gör nə tez çalıb. Qanacağı yerində, gözəlliyinə də söz yoxdur.

V a h i d. Orası yaxşıdır ki, xalis kəndçi qızıdır, – dikbaşlıq bilmir, üzüyoladır, tabe olmağa öyrənib, nə deyirsən – başını tərpədib hırıldayır, mənə arvad olacaq, sənə qulluqçu.

R e y h a n. Elə demə oğlum, mən qulluqçusuz da keçinərəm. Qoy sənə fərli-başlı yoldaşlıq eləsin, özüm duraram onun qulluğunda.

V a h i d. İndi ki atamın da xoşuna gəlir, sən də bəyənirsən, mən də, heç gecikdirmək lazım deyil, günü sabah get elçiliyə.

P ə r d ə

## İKİNCİ PƏRDƏ

### ÜÇÜNCÜ ŞƏKİL

Səhnənin qabağında yol kənarı çayxananı təsvir edən pərdə asılmışdır. Bənəfşə və Göyərçin söhbət edə-edə gəlir.

B ə n ə f ş ə. Sən mənim canım razı ol, Göyərçin bacı!

G ö y ə r ç i n. Ay Bənəfşə, bu fikir sənin başına hardan gəldi. – Mən hara, o cür iş hara?!

B ə n ə f ş ə. Bacı canı, əsil sənin işindir.

G ö y ə r ç i n. Niyə axı?

B ə n ə f ş ə. Ona görə ki, fikrin açıqdır, özün də iradəlisən. Bizə də belə adam lazımdır.

G ö y ə r ç i n. Eh, mənim iradəm olsaydı, indiyəcən özümə bir gün ağlardım. Nə isə... Məni salma dəftərə.

B ə n ə f ş ə. Salacağam, sənin adını eşidəndə qızlar hamısı bir ağızdan təsdiqlədilər. Traktor sürməyi də sənə özüm öyrədəcəyəm.

G ö y ə r ç i n. Qadan alım, get başqalarına öyrət, mənə yox.

B ə n ə f ş ə. Niyə axı, nə səbəbə?

G ö y ə r ç i n. İki səbəbi var. Birinci odur ki, traktor yanımdan keçəndə gurultusundan qulağım partlayır.

B ə n ə f ş ə. Professor Səfayi deyir ki, bu əsrin gurultusudur. Ona dözmək gərək. İkinci səbəb nədir?

G ö y ə r ç i n. Onu da ərə gedəndə özün biləcəksən. Mənə desən gəl klubda musiqi dərnəyi aç, bəlkə əlimdən gələ, traktorçuluq yox.

B ə n ə f ş ə. Bilirəm, yaxşı çalırsan. Evdə öyrənmisən, ya dərsini qurtarmısan?

G ö y ə r ç i n. Musiqi məktəbini qurtarmışam, hətta Ağdama müəllim təyin olunmuşdum.

B ə n ə f ş ə. Bəs niyə getmədin?

G ö y ə r ç i n. Ərim razı olmadı. Haqqı da var. O burda, mən orda, nə təhər olardı... Müxtəsər, məni traktorçuluqdan poz...

B ə n ə f ş ə. Amma sənə çox ümid bağlayırdım. Bir traktorçumuz çatmır.

G ö y ə r ç i n. Sən özün yüz traktorçunun işini görərsən. Birtəhər keçinərsiniz.

B ə n ə f ş ə. İndi birtəhər olmur, Göyərçin bacı. Briqadamız öhdəçilik götürüb, gərək yaz açılandan qış girənə kimi bir maşınımız dayanmasın, hamısından yüzə-yüz istifadə edək. Sən də ki, boyun qaçırırsan. Hə, bildim, yəqin qorxursan ərin icazə vermiyə. Baxma sözünə!..

G ö y ə r ç i n. Subay vaxtı mən də belə deyərdim. Amma ərə gedəndən sonra olmur.

B ə n ə f ş ə. Niyə, qorxursan?

G ö y ə r ç i n. Hə, qorxuram, amma Şəkərlinskidən yox, öz hayamdan-abrımdan qorxuram. Axı, ər-arvad ki oldun, təkcə öz həvəsinlə dolana bilməzsən, gərək onun da arzusunu nəzərə alasan.

B ə n ə f ş ə . Di sağ ol, mən getdim.

G ö y ə r ç i n. Get, amma məndən incimə...

B ə n ə f ş ə. İsinikli adamsan, səndən incimək olmaz. Sənə bir söz də deyəcəkdim. Hə... (*Pərdə dalından onu çağırırlar*). Qalsın sonraya... Gəldim qızlar, gəldim (*Gedir*).

G ö y ə r ç i n (*tək*). Bəs bizim bu qaragün harda qaldı? Aha, deyəsən budur kölgəsi gəlir. Özü də buralarda olar...

Alışov zümzümə edə-edə gəlir, havanı iyləyir.

A l ı ş o v. Amman eyy, yenə ətir iyi aləmi basıb... (*Göyərçini görür*). Bəh, bəh! Zalımın qızı ay kimi, gün kimi işıq verir. Eşq olsun Göyərçin xanıma!

G ö y ə r ç i n. Əleykəssalam, Alışov.

A l ı ş o v. Mən deyirəm eşq olsun.

G ö y ə r ç i n. Sən qələt eləyirsən. Ölülərə eşq olsun deyərlər, dirilərə yox.

A l ı ş o v. Qoy desin, nə desə özündən çıxan deyiləm. Onda sən mənə eşq olsun de.

G ö y ə r ç i n. Niyə, sən ölmüsən ki?

A l ı ş o v. Mənim dərdim kimdə olsa özünü diri saymağa haqqı yoxdur.

G ö y ə r ç i n. Nədir sənin dərdin?

A l ı ş o v. Dərdim odur ki, qazancım var, xərcləyənim yoxdur, gül kimi arvadlar özgələrdə, bacarıq məndə, qabiliyyət məndə.

G ö y ə r ç i n. Qadam özünə də, peşənə də. Yaxşı deyiblər ki, kişinin səfehi ya pəhləvan olar, ya da şaxseydə təbilçi.

A l ı ş o v (*kənara*). Bu saat səni yumşaldaram. Zəif damarını bilirəm. Göyərçin bacı, bilirsən nə var?

G ö y ə r ç i n. Deyərsən, bilərəm.

A l ı ş o v. Təzə ətir tapmışam. Fransız cövhərindən...

G ö y ə r ç i n. Sən mənim canım?! Yaman ağacdələnsən, Alışov.

A l ı ş o v. Qoy desin, nə desə özündən çıxan deyiləm... Mənim evimi yıxsa duxulu-ətirli arvad yıxacaq... Ölürəm... Göyərçin bacı...

G ö y ə r ç i n. Nə üçün?!

A l ı ş o v. Soruş ki, kimin üçün?

G ö y ə r ç i n. Yaxşı, kimin üçün?

A l ı ş o v. İndi ki, sözü açdın, öldürsən də deyəcəyəm. Göyərçin bacı, ölürəm sənin üçün... (*Diz çöküb sürünə-sürünə qıçını sığallamaq istəyir*).

G ö y ə r ç i n (*ayağı ilə onun çənəsindən itələyir*). Ay binamus, bacı dediyin nədir, öldüyün nədir? Bizim o külbaşın qabağına qaytağı oynayırsan, ağzından bal tökülür: yoldaşım, dostum, rəhbərim! Bu yandan da xəlvətə salıb arvadına eşqnamə oxuyursan?! Binamus!

A l ı ş o v. Qoy desin, nə desə özündən çıxan deyiləm (*Hi, hi ilə gülür*). Vallah səni sınayırdım, Göyərçin bacı. Sənin kimi sədaqətli arvad görməmişəm. Deyirəm ay yoldaş Şəkərlinski, Göyərçindən olmaz, deyir qısqanıram... Belə arvadı qısqanmaq olar, ay ağılsız kişi...

G ö y ə r ç i n. Mənimlə oyun oynayırsan, hə? Yığışdır özünü. Başına elə oyun açaram, özün də məəttəl qalarsan.

A l ı ş o v. Oyun oynamıram ey, sözüm odur ki...

G ö y ə r ç i n. Başımı qatma... De görüm bizim o maymaq hanı? Şəhərdən gəliblər, axtarırlar onu, deyirlər işlərini yoxlayacaqlar.

A l ı ş o v. Getdi Güneylilər sovetliyinə. Təzə mal gəlib, qəbul edəcək.

G ö y ə r ç i n. Bəs sən nə əcəb burda qalmısan! Axı, adətdir, külək hara, tüstü də ora (*Gedir*).

A l ı ş o v. Qoy desin, nə desə özündən çıxan deyiləm.

Tamarzı gözlərlə dalınca baxır, S a r v a n gəlir.

S a r v a n. Alışov, sənin o müdirin Şəkərli necə adamdır.

A l ı ş o v. Bilmirəm.

S a r v a n. Yenə olsun, necə adamdır?

A l ı ş o v. Sən, mən necə, o da elə – bir az yaxşı, bir az pis, bir az ağıllı, bir az gic.

S a r v a n. Yox a, mən sizə tay ola bilmərəm. Siz elə yaxşı tapışmısınız.

Ş ə k ə r l i n s k i (*pərdə dalından*). Harda qaldın, Alışov, gəl görək (*Çıxır*).

A l ı ş o v. Sarvan kişi səni axtarır, yoldaş Şəkərlinski.

Ş ə k ə r l i n s k i. Nə var, ay kişi. Nə düşmüsən kölgəmə?

S a r v a n. Necə düşməyim. Başına elə nadürüstlər yığmısan ki, bir işi yoluna qoyunca canımız gəlir boğazımıza.

Ş ə k ə r l i n s k i. Müxtəsər elə, görüm nə olub?

S a r v a n. O tədarükçünə de, bizi incitməsin.

Ş ə k ə r l i n s k i. Neyləyir ki, sizə?

S a r v a n. Erkəkləri yedirdib, kökəldib gətirmişik ətliyə, qəbul eləmir. Dərəcəsini salır aşağı.

Ş ə k ə r l i n s k i. İndi neyləsin, arıq malları kök yazsın, zərəri kimin üstünə salaq?

S a r v a n. Ağzımı açdırma, Şəkərli yoldaş... Sənin o tədarükçün düz adam deyil. Kim cibinə beş yüz manat qoyur, onun arıq-uruğunu birinci dərəcə ilə qəbul edir, mənim yağ içində işıldayan heyvanlarımı salır üçüncü dərəcəyə.

Ş ə k ə r l i n s k i (*birdən yumşalır*). Get, Sarvan kişi, arxayın ol. Özüm də o tədarükçünün əlindən cana doymuşam, sabah gələrəm, baxaram mallarına, lap birinci dərəcə ilə qəbul etdirərəm.

S a r v a n. Sağ ol, bu sözündən razı qaldım (*Alışova dönür, onu diqqətlə süzür*). Maşallah qıpqırmızısan, Alışov. Üç illik cöngəyə oxşayırsan.

A l ı ş o v. Qoy desin, nə desə özündən çıxan deyiləm.

Ş ə k ə r l i n s k i. Ay kişi, sənə də üz verəndə astarını istəyirsən, ha...

S a r v a n. Özünü nə vermisən kölgəyə. Ancaq çox da bu kölgədalda yerə etibar eləmə. Deyir it, sümüyü sevinə-sevinə udar, tamaşadı xirtdəyinə ilişəndə.

A l ı ş o v. Sən öz dərdini çək, motalpapaq yurist... Qızın Bənəfşənin dərdini... Gecə-gündüz artistlə mazaqlaşır.

S a r v a n (*sözünü kəsir*). Bənəfşəni yüz sənin kimi kişiyə dəyişmərəm, Allaha şükür şəhərin professorları da qapıma elçi gəlir (*Gedir*).

A l ı ş o v. Ha... ha... ha... Professorlar... Bir bunun iddiasına bax.

Ş ə k ə r l i n s k i . Fikir vermə, gəl görüm kababın nə oldu, acından öldüm.

A l ı ş o v. Kabab hazırdır. Ancaq Göyərçin bacı səni axtarırdı. Deyir şəhərdən gəliblər, yoxlama olacaq, reviziya.

Ş ə k ə r l i n s k i (*özündən çıxır*). Reviziya?! Deməli, material veriblər. Hamısı o qarabağlı gədəsi Rəşidin işidir. Neylək, qoy versin, mənə də Şəkərlinski deyərlər. Gör qazdığı quyuya onun özünü salıram, ya yox! Sən tədarükündə ol, görüm bəlkə o şəhərdən gələnləri də gətirdim bulaq başına... Gözünü döymə, ay maymaq...

A l ı ş o v. Qoy desin, nə desə özündən çıxan deyiləm.

Hərəsi bir tərəfə gedir.

P ə r d ə

## DÖRDÜNCÜ ŞƏKİL

Sarvan kişinin iki otaqdan, bir artırmadan ibarət evi. Evin yolu bağçadandır. Beləliklə hadisələr həm bağçada, həm də otaqlardan birində cərəyan edir. Pərdə açılanda Nisə xala, Leyla və Göyərçin qab-qacaq daşıyır. Otağı səliqəyə salırlar. Qonaq qarşılamağa hazırlaşdıqları bilinir.

N i s ə x a l a. Diri tərpənin bala, qonaqlar gəlməmiş hər şey hazır olsun.

L e y l a. Necə diri tərpənək, adamın bir əli gəlir, bir əli gəlmir.

G ö y ə r ç i n. Ay qız, ay Leyla, o Ayxanım deyil küçədən keçir?

L e y l a. Hə, özüdür ki var, görünür şəhərdən qayıdıb.

N i s ə x a l a. Çağırın onu da, bu şad gündə kənarda qalmasın.

G ö y ə r ç i n (*çağırır*). Ayxanım, Ayxanım!

L e y l a. Çağırmaqla gəlməz, gedim gətirim (*Çıxıb Ayxanımla qayıdır*).

A y x a n ı m. Salam, Nisə xala (*Nisə xala salamını alıb onu öpür*).

G ö y ə r ç i n. Bircə tez ol qolunu çırma, kömək elə.

A y x a n ı m. Nə danışırsan, Göyərçin, heç mən burada otura bilərəm?

G ö y ə r ç i n. Birdəfəlik de ki, gədədən dönə bilmirəm. Amma mənnən olsa, heç vecinə alma, o, sənin əlinə su tökməyə də yaramaz. Sənin ürəyin incədir, onunki daşdan da bərk.

N i s ə x a l a. Neyləyib sizə, ay balam? Niyə yazığın qarasına yanar kösöy atırsınız?

L e y l a. Yazıq demə ana, bilmirsən nə bəladır. Allaha inanmır, həqiqətə inanmır, insana inanmır, məhəbbətə inanmır.

A y x a n ı m. O cür də deyil, ay Nisə xala. Əslinə baxsan, yaxşı oğlandır, zirəkdir, gözüaçıqdır, kitab qalmayıb oxumasın, çalmaq bacarır, oynamaq bacarır, nə işdən yapışsa əlindən gəlir. Amma heyif ki, heç bir şeyə ürəkdən həvəs göstərmir. Öz qədrini bilmir.

L e y l a. Yenə başladı gədəni tərifləməyə. Göyərçin deyəndir, sənin ürəyin ondan dönmür. Heyif sənin bu eşqinə.

A y x a n ı m. Nahaq yerə heyifsilənmə. Mən sevgimdən peşman olmamışam, bir adamın da mənə yazığı gəlməsin, istəmirəm. Bənəfşə isə qoy xoşbəxt olsun! (*Gedir*).

L e y l a. Bunun da yanında biabır olduq. İndi nə ola Bənəfşə sözündən dönə, yox deyə, gədəni suyu süzülmüş halda qaytara geri...

G ö y ə r ç i n. Mən isə istəyirəm toyları tez olsun, doyunca çalıb-oynayaq...

N i s ə x a l a. Çox yaşayacaqsan, ay Göyərçin, özün da cavan qalacaqsan. Bir fikir, bir də kin adamı tez qocaldar.

G ö y ə r ç i n. Nə fikir, nə kin! İndi bax, gözümü yumam (*yumur*), Vahid girə içəri. Deyərəm təbrik edirəm, qucaqlayıb öpərəm.

Alışov içəri girir. Göyərçin bilmədən onu qucaqlayıb öpür.

A l ı ş o v (*Göyərçini bağrına basır*). Nə yaxşı yuxu görürəm, ay Allah (*Gözlərini yumur*). Ayılmayacağam!

G ö y ə r ç i n (*Alışovu itələyir*). Sən hardan çıxdın, ay imansızın nəvəsi! İt iyi verirsən.

A l ı ş o v. Qoy desin, nə desə özündən çıxan deyiləm.

L e y l a. Mən isə yapışaram yaxasından, tut ağacı kimi silkələrəm (*Alışovun yaxasından tutub silkələyir*). Deyərəm, ay külbaş, indi də Bənəfşəni alırsan?! Heç o sənin tayındır?!

A l ı ş o v. Qəribə işdir ha, biri gözünü yumanda bağrına basıb öpür, o biri yaxamı cırır... Sizə nə olub?

G ö y ə r ç i n. Sən Vahidsən, özünü soxursan irəli?! Görmürsən Vahiddən danışırıq?

A l ı ş o v. Elə mənə də Vahid lazımdır. Gəlib, gəlməyib?

L e y l a. Hələ təşrif gətirməyiblər.

A l ı ş o v. Gedim Şəkərlinskiyə deyim, kişinin bağrı partlayır ki, niyə gəlib çıxmadılar.

G ö y ə r ç i n. Daha onu idarədən qovmur ki?

A l ı ş o v. Ürəyi yumşalıb. Deyir atasıynan da, özüynən də dost olacağam (*Başını bulayır*). Elə hamınız Şəkərlinski kimi bir şeysiniz – gah elə, gah belə!

G ö y ə r ç i n. Kişinin qarasına az danış, gic maymaq!

A l ı ş o v. Qoy desin, nə desə özündən çıxan deyiləm (*Gedir*).

Sarvanın səsi eşidilir.

S a r v a n. Nisə bacı, evdəsənmi?

N i s ə x a l a. Siz işinizdə olun qızlar, görüm Sarvan qardaş nə deyir.

Qızlar hərəsi bir şey götürüb bağçaya çıxır. S a r v a n gəlir.

S a r v a n. Nisə bacı, atalar məsəlidir, qonağa görə süfrə açarlar. Elə elə ki, deməsinlər, kəndçidir, çoban bozartmasından başqa şey bacarmır.

N i s ə x a l a. Qorxma, bir süfrə açacağam ki, ağızları açıla qalsın, ocağın üstü doludur.

S a r v a n. Neyləyim, fələyin üzü qara olsun, qalmısan tək. Bacın rəhmətlik sağ olaydı, səni heç əl tərpətməyə qoymazdı.

N i s ə x a l a. Ay Sarvan, yenə qız gözümə birtəhər dəyir. Dünəndən nə dinir, nə danışır, heç kəsi də yaxına qoymur. Qorxuram elçiləri qapıdan naümid qaytara.

S a r v a n (*təəccüb və təlaşla*). Nə deyirsən, Nisə bacı, biabır olarıq. Bir çağır yanıma görüm (*O biri otağa baxıb çağırır*). Bənəfşə!

Səs verən olmur. Nisə xala çıxır.
Bənəfşə nimdaş geyimdə və kədərli halda içəri girir. Atasına baxır.

S a r v a n. Qızım, de görüm niyə bikefsən, bəs niyə paltarını dəyişməmisən? Qonaq qabağına belə çıxmazlar!

B ə n ə f ş ə. Atacan, mən çox razıyam ki, sən məni çağırdın, əgər başqa birisinin evinə getmək təbii bir qayda olmasaydı, mən ömrüm boyu sənin yanında oturardım. Çünki dünyada mənim üçün sənin üzündən gözəl üz, sənin səsindən gözəl səs yoxdur.

S a r v a n. Qızım, mən özüm ürəkdən arzu edirəm ki, sənin mənə olan məhəbbətin iki yerə bölünsün.

B ə n ə f ş ə. Bilirəm ata, beş yaşından sən mənə həm ata, həm də ana olmusan. Anamın vəfatından sonra evlənməmisən. Mən də sənə sadiq qalmaq istəyirəm. İzin ver oturum evimizdə.

S a r v a n. Mənim ceyran qızım, axı bu nə təhər ola bilər? Bir həftə əvvəl danışdıq, razı olduq, oğlanın adamlarına dedik ki, bu gün gəlib hə cavabı alsınlar. Bizdə adətdir – kişi oldu, arvad oldu verdiyi sözdən dönməz.

B ə n ə f ş ə. Gözəl adətdir, ata, o zaman ki, söz ağlın hökmülə ağızdan çıxmış ola. Adamın acıqlı vaxtında verdiyi söz – söz deyil. O zaman mən Aslandan acıqlı idim, Vahid barədə də başqa fikrim var idi. İndi isə... (*Düşünür*). Yox, mən ona gedə bilmərəm.

S a r v a n. Ürəyimi dağlayırsan, Bənəfşə. Ancaq yadında saxla, bilsəm ki, bu sözləri sənə dedirdən o artistdir, günahından keçmərəm. Qoymayacağam o artistə gedəsən!

B ə n ə f ş ə. Nə üçün ata, artist kimdən əskikdir?!

S a r v a n. Bilmirəm! Artistə mən qız vermərəm (*Yumşalır*). Başa düş, gözü yaşlı üstümə qayıtdığını görsəm orda ürəyim partlar.

B ə n ə f ş ə. Neylək, sən deyən olsun, ata – nə ona gedirəm, nə buna...

S a r v a n. İndi gəl qız ipiynən quyuya düş... (*Gedir. Göyərçin gəlir*).

G ö y ə r ç i n (*istehza ilə*). Ay qız, gözün aydın, yaxşı oğlana rast gəlmisən... Professor balası. Özü də gözəl, göyçək. Daha nə fikir eyləyirsən?

B ə n ə f ş ə. Mənə gülmə, Göyərçin!

G ö y ə r ç i n. Gülməli işə gülərlər: sən hara, Vahid hara?!

B ə n ə f ş ə. Göyərçin, mən əsil fikrimi ancaq sənə aça bilərəm. Çünki sən həyata sadə gözlə baxırsan, adamı tez başa düşürsən. Bir yandan mən sizin intiqamınızı – belə sənin, Ayxanımın intiqamını almaq, tövbələtmə dərsi vermək üçün Vahidə yaxınlaşmışdım. Bir yandan da...

G ö y ə r ç i n. Xoşuna gəlmişdi, indi də ərə gedirsən, nə olar, axıracan olsun.

B ə n ə f ş ə. Xoşuma gəlmişdi deyəndə ki, əvvəldən mən ona həm nifrət edirəm, həm də ürəyim yanır...

G ö y ə r ç i n. Elə məhəbbət belə başlanır da... gözlərindən görürəm. Fikirli olmağın da sevgidəndir.

B ə n ə f ş ə. Aldanırsan, Göyərçin. Fikirli olmağım ondandır ki, qorxuram bu yol ilə məqsədimə çata bilməyəm. Özüm isə tələyə düşəm.

G ö y ə r ç i n (*düşünür*). Heç qorxma. İndi ki, belə yaxşı niyyətin var, məni özünə yoldaş bil. Ürəyim ondan elə yanıqlıdır ki... Razısanmı?

B ə n ə f ş ə. Yaxşı, ittifaq bağlandı (*Əlini sıxır*). Ancaq heç kəsə bir söz demə.

G ö y ə r ç i n. Yəni Aslana da?! Yazığın ürəyi partlar ki.

B ə n ə f ş ə. Qoy ona da dərs olsun. İndi ki, qısqanclığı məhəbbətinə güc gəlib, qoy cəzasını çəksin...

Hənirti duyub gedirlər. Aslan və Rəşid gəlir.

A s l a n. Bayatıda deyilənlər mənim başıma gəlib, ay Rəşid (*Oxuyur*).

Şalını alma qara,
Başına salma qara.
Gəlmişdim yar sevməyə,
Düşmüşəm qalmaqala.

Ay dost, Bənəfşə əldən gedir, yanıram!

R ə ş i d. Qibtə edirəm sənə – hər şeyi zarafatnan keçirirsən.

A s l a n. Dərdin çoxluğundandır, başın üçün.

R ə ş i d. Fikir eləmə qardaş... Dərd mənimkidir ey... Nə sevgimdən bir şey çıxdı, nə işimdən, əyriliklə mübarizədə çox can yandırdım, qazandığım töhmət oldu!

A s l a n. Fikir eləmə. Doğrudan bu Şəkərlinskidə bacarıq var ha. Yoxlamada nələr tapılmadı!.. Necə çıxdı, o qədər əhvalatın içindən?!

R ə ş i d. Gülə-gülə, "bəli-bəli" – deyə-deyə, aktda göstərilmiş faktların hərəsinə bir bəhanə gətirdi.

A s l a n. Bəs o əskik gələn top-top mahuda, yun parçaya nə dedi?

R ə ş i d. Onu heç soruşma, yadıma düşəndə başımdan tüstü çıxır. Kağız çıxartdılar ki, guya həmin parçalar səhvən bazada ilişib qalıb, mən oldum günahkar, demaqoq! Yanıram, qardaş! Şəkərlinski dalını qayaya söykəyib!

A s l a n. Fikir eləmə, zamanın fırtınaları o qədər elə qayaları uçurub-dağıdıb ki, az görməmişik.

R ə ş i d. Deməli, gözləyək, fırtına nə vaxt bizə yol açacaq? Gözümün qabağında həqiqət tapdalananda mən tablaya bilmirəm!..

A s l a n. Fikir eləmə... Deyirlər rüşvət də alır. İnanırsan?!

R ə ş i d. Od olmasa tüstü çıxmaz. Əliəyriliyinə mənim şübhəm yoxdur, Alışov da yanında!

A s l a n. Deməli tutulmamış oğrudur, bəydən-xandan doğrudur...

R ə ş i d. Elə məni yandıran da odur də...

A s l a n. Fikir eləmə canım... Bura bax, indi ki, heç cür gücümüz çatmır, gəl bunlara bir Hamlet tələsi quraq. Hər ikisini – olduqları kimi çıxaraq səhnəyə, Göyərçin xanım da yanlarında.

R ə ş i d. Hamlet tələsi yaxşı fikirdir, tamaşanı mütləq göstərərik... Ancaq Göyərçin barədə haqsızsan, o çox təmiz və nəcib qadındır. Neyləməli, bəxti kor çıxıb.

A s l a n. Sən də bir az idealistsən, dostum. Elə hamıda yaxşılıq axtarırsan, hələ mən ömrümdə kişi qabağında bu cür əriyən arvad görməmişəm. Elə bil kərə yağ günün altında əriyir.

R ə ş i d. İnan ki, zahirdə elə görünür. Əslində isə çox təmiz arvaddır. Şəkərlinski kimi bir heyvərənin də evində pis hərəkətlərə yol vermir.

G ö y ə r ç i n, L e y l a və B ə n ə f ş ə gəlirlər.

A s l an (*Bənəfşəyə*). Ay insafsız, dünənəcən mən bu fikirdə idim ki, Bənəfşə bir qönçədir, oturub budağının üstündə, məni gözləyir.

B ə n ə f ş ə. Sən yenə köhnə havanı çalırsan. Deməli hələ də məni cansız, iradəsiz bir şey hesab edirsən, havaxt istəsən əl atıb götürəcəksən, hə?!

A s l a n. Səni şey yox, Bənəfşə, gül, qızıl gül bilmişəm!

B ə n ə f ş ə. Qızıl gülün də özünü qorumaq üçün tikanları var. Onu da çox asanlıqla dərmək olmur. Sən isə məni o qədər zəif, aciz, mənliksiz bilmisən ki, özümlə bir kəlmə kəsmədən, fikrimi belə soruşmadan hesab etmisən ki, artıq mən səninəm. İstədiyin vaxt əl atıb dərə bilərsən! Çox səhv edirsən!

A s l a n. Ay qızlar, ay Rəşid, bunu başa salın ki, qızıl gülü sözgəlişi dedim.

G ö y ə r ç i n. Bundan sonra əvvəl düşün, sonra danış...

B ə n ə f ş ə. Vahid açıq deyir ki, ona fikirsiz, iradəsiz, mənliksiz bir kəndçi qızı lazımdır – özünə arvadlıq eləsin, anasına qulluqçuluq. Sən bunu sözdə deməsən də, görünür eyni fikirdəsən. İndi ki belədir, mən sözü açıq deyən adamı, fikrini pərdələyən adamdan üstün tuturam (*Üzünü otağa tərəf çevirib çağırır*). Ata, atacan...

N i s ə xala gəlir.

N i s ə x a l a. Nədir qızım, atan bir azdan gələr.

B ə n ə f ş ə. Nisə xala, atama de ki, mən razıyam. Elçiləri geri qaytarmasın (*Qəhərlənmiş halda, əsəbi hərəkətlə səhnəni tərk edir*).

A s l a n. Daha adamı bədbəxtlik necə basar...

N i s ə x a l a. Allaha şükür, kişinin üstündən dağ götürüləcək (*Gedir*).

G ö y ə r ç i n (*Aslana*). Mən də olsam onu seçərdim. Səndə nə var axı?

A s l a n. Mənə gülmə, Göyərçin, yanıram.

R ə ş i d. Yaxşı, qızlar, indi mən Vahidi fikrindən döndərsəm neylərsiniz?

G ö y ə r ç i n. Dünyasında elə şey olmaz.

L e y l a. Qoy danışsın, bəlkə oldu...

A s l a n. Axı Vahid mənim dostumdur, bilsə ki, Bənəfşə sevgilim olub.

G ö y ə r ç i n. Sən Vahidi tanımamısan. Onun necə adam olduğunu məndən soruş. Bu gün gözü nəyə düşdü, onun əsiri olacaq... (*Maşın səsi eşidilir*). Baxın, özü də gəlir, inanmırsınız, yoxlayın, dünyasında əl çəkməz.

Vahid gözəl geyinmiş halda, barmağında maşının açarını fırlada-fırlada gəlir.

V a h i d. Salam, dostlar.

A s l an və R ə ş i d. Salam, Vahid...

V a h i d (*ucadan*). Hanı mənim adaxlım kəndçi qızı?

G ö y ə r ç i n. Ürəyin çox darıxıb, bir az səbir elə...

R ə ş i d. Bura bax, Vahid, elə biz də o barədə danışırdıq. Sən gəl bu fikirdən daşın.

V a h i d. Hansı fikirdən?!

R ə ş i d. Bənəfşə fikrindən...

V a h i d (*gülür*). Ha... ha... ha... Zarafatı burax (*Aslana*). Gör nə deyir, ey?!

A s l a n. Daşınsan yaxşıdır. Vicdanın varsa danış.

R ə ş i d. Heç bilirsən kimi alırsan?

V a h i d. Necə bilmirəm, kəndçi qızı Bənəfşəni, dili şirin, üzü yola Bənəfşəni, nə desən başını tərpədən Bənəfşəni...

L e y l a. Amma nə yaxşı tanıyıb Bənəfşəni...

R ə ş i d. Bilirsən, Aslan ona vurulub ey.

V a h i d (*heyrətlə*). Aslan? Ay canım, elə şey olmaz?! Ha... ha... ha... Nə qəribə hadisə baş verib (*Aslana*). Nə etməli, olub keçib. Əvvəldən bilsəydim yaxın durmazdım, indi get, başqasına vurul. Ay canım, ölkədə səkkiz milyon qadın artıqdır, seç birini al. Mənim Bənəfşəmdən gözünü çək... Hanı mənim adaxlım kəndçi qızı!.. (*İçəri gedir*).

L e y l a. Gör necə də hind toyuğu kimi özünü çəkir...

A s l a n. Yaxşı, Vahid, nə demişəm, fürsət düşə sənə də bir Hamlet tələsi quram.

R ə ş i d. Buna nə tələ quracaqsan, Şəkərlinski deyil, Alışov deyil.

A s l a n. Əslinə baxsan, bu da onların tayıdır. Onlar xalqın malına ət atır, bu ürəyinə, onlar camaatın pulunu oğurlayır, bu ömrünü, səadətini...

R ə ş i d. Lakin bunu ifşa etmək, onlardan çətindir.

G ö y ə r ç i n (*mənalı*). Fikir eləməyin, buna da bir çarə tapılar. Zirək quş dimdiyindən tələyə düşər.

A s l a n. Kaş elə olsun.

Leyla ilə gedir. Rəşid Göyərçinlə danışa-danışa ağacın altına çəkilir. Şəkərlinski və Alışov çıxır. Onları görüb dayanırlar.

Ş ə k ə r l i n s k i. Alışov, mürgüləmə, gözün dörd olsun, o qarabağlı gədəsi deyəsən bizə tərəf qurmaq atır! İlişmək fikri var, bir bax, tutub Göyərçini söhbətə. Yaman maymaqsan, Alışov.

A l ı ş o v. Qoy desin, nə desə özündən çıxan deyiləm. Onun özünü elə qarmağa keçirərəm ki, tordakı balıq kimi çapalaya-çapalaya qalar.

Ş ə k ə r l i n s k i. Bizim arvad bir az şirnikəndir, Alışov, gözlə... namus məsələsi zarafat deyil!

A l ı ş o v. Özümü öldürərəm sizin yolunuzda... yoldaş Şəkərlinski...

Ş ə k ə r l i n s k i. Ürəyimə yaman şübhə damıb, Alışov, Göyərçini sənə tapşırıram. Qoyma gözdən...

A l ı ş o v. Baş üstə, mənim əziz rəhbərim (*Rəşidgilə yaxınlaşır, qəsdən onların arasında oturur*).

Ş ə k ə r l i n s k i. Hə, necəsiniz, camaat? (*Rəşidə*). Daha akt bağlamaq fikrin yoxdur ki? Necə gördün Şəkərlinskini? Adamın xışını belə verərlər yerə!

R ə ş i d. Hələ şum indi başlanır, kimin xışının yerə veriləcəyi məlum deyil.

Ş ə k ə r l i n s k i. Zarafatı ciddiyyətə salma, ay qarabağlı gədəsi, fikrin işdə olsun!

G ö y ə r ç i n. Ay kişi, özün oxu atırsan, özün də yayını gizlədirsən, nə dava-dava de, nə də meydandan qaç.

Ş ə k ə r l i n s k i. Sən onun tərəfinə keçmə, arvad (*Rəşidə*). Belə məsəl var, deyərlər, havaxt tülkü olsan gəl mənim çarığımın şirisini çeynə...

R ə ş i d. O biri məsəli eşitməmisən ki, deyərlər, heç şeydən başı çıxmayan adam başa keçəndə başını bəlaya salar.

V a h i d (*otaqdan çıxır*). Bənəfşə, ay Bənəfşə! (*Şəkərlinskini görüb yaxınlaşır*). Ay dostlar, gəlin içəri, mənim bu xoş günümdə yeyin-için, keyfinizi şad eləyin.

Ş ə k ə r l i n s k i. Xoş gördük, mübarəkdir. Atanın xatirinə keçdim sənin günahından. Sənin də xatirinə atanın günahından... Hanı bəs kişi?

V a h i d. Nə qədər elədim maşına oturmadı, deyir sən sürən maşına etibarım yoxdur. Anamı da götürüb qatarla gəlir.

Ş ə k ə r l i n s k i. Sazla maşını, oturaq, sür, Tiflisə, kef çəkək...

G ö y ə r ç i n. Gözünü oyaram mənsiz bir addım kənara atsan!

Ş ə k ə r l i n s k i. Arvad, zalım olma. Adamın azadlığını əlindən almazlar.

G ö y ə r ç i n. O azadlıqdan bizim üçün də var, ya yox?

R ə ş i d. Yaxşı deyirsən Göyərçin, varam sənin dilinə, bıçaq kimi kəsir!

Ş ə k ə r l i n s k i (*yavaşca Alışova*). Alışov, gədə qarmağını atdı, ayıq ol, yuxulama tənbəl öküz kimi...

A l ı ş o v. Qoy desin, nə desə özündən çıxan deyiləm (*Rəşidə*). Göyərçin bacı hörmətli Şəkərlinskini bıçağın dalı ilə kəsir, vay ondadır ağzını çevirə, görəsən necə doğrayıb-tökür (*Şəkərlinskiyə*) Yandırdım atasını!

G ö y ə r ç i n. Yox, ağlım olmayıb ki, bu vaxtacan dalını işlətmişəm. Arvadına fırıldaq gələn, arvadını adam yerinə qoymayan kişilərin başına gərək elə oyun açasan ki, qiyamətəcən yadından çıxmaya.

R ə ş i d. Ağıllı söz budur, Göyərçin, qanmazı yerində oturtmasan, elə bilər qorxaqsan...

Ş ə k ə r l i n s k i. Ayıq ol, Alışov. Yenə qarmağı atdı. Arvad, görürəm bəzi adamlar sənin başını xarab eləyiblər. Başlamısan cür-bəcür şeylər düşünməyə. Mən bilirəm, yağış qayanı dibindən yeyən kimi fikir-düşüncə də adamı puç elər. At fikri, düşüncəni bir kənara. Mən düşünürəm. Bəsdir.

R ə ş i d (*istehza ilə*). Əlbəttə, arvad nədir, düşünmək nədir. Xüsusən kişinin işləri barədə!

V a h i d. Bəs mən niyə şəhər qızlarından üz döndərdim, ona görə ki, başlayırlar mühakiməyə. Hamısı olub ictimaiyyətçi, natiq! Heyif deyil kəndçi qızı – başıaşağı, üzüyola.

A l ı ş o v. Ürəyinə dəyməsin, sənin o kəndçi qızın bir az çirkindir, özü də qaraqabaq.

V a h i d. Elə o yaxşıdır, arvadın çirkini çox işlər. Bir adam da dönüb gözünün ucuyla ona baxmaz. Göyçək arvad gözəgəlim olar, gözəgəlim arvad barəsində də həmişə söz çaxar (*Yavaşca*). Elə biri bizim bu Göyərçin xanım...

G ö y ə r ç i n. Sən öz dərdini çək.

Ş ə k ə r l i n s k i. Nə oldu orda, Alışov?

A l ı ş o v. Heç nə, balaca atışdılar. Eh, heyif deyil, mənim aləmimdə arvadı göyçək al, işlək çıxdı bəxtinə.

R ə ş i d. Əgər Göyərçin kimilər qollarını bağlamış gözə görünməyən zəncirləri qırsalar, dağı-dağ üstə qoyarlar.

Ş ə k ə r l i n s k i (*Alışova*). Qoyma, atdı qarmağı... Mən danışsam, gərək ağzını əzəm.

A l ı ş o v. Göyərçin bacı heç vaxt ipə-zəncirə gələn arvadlardan olmayıb (*Şəkərlinskiyə*) Yandırdım atasını!

Ş ə k ə r l i n s k i. Yalansa atana lənət!

A l ı ş o v . Qoy desin, nə desə özündən çıxan deyiləm.

Ş ə k ə r l i n s k i. Göyərçin, özgə arvadına dərs deyən bu avaralardan nə qədər uzaq olsan o qədər yaxşıdır.

R ə ş i d. Yaxşı danışın, ha!..

A l ı ş o v. Lap yaxşı danışır, nə deyirsən?

Qalmaqal düşəndə S a r v a n gəlir.

S a r v a n. Ay yoldaşlar, deyəsən elçilər gəlir, düşün qabağa, qarşılayın.

Hamı o tərəfə hərəkət edir.

P ə r d ə

## BEŞİNCİ ŞƏKİL

Sarvan kişinin bağçasında xəlvəti bir guşə. Bir qədər hallı olan Vahid ağaca söykənib, yaxası açıqdır. Bənəfşə məzlum-məzlum kənarda durub qaşqabaqlıdır.

V a h i d. Yanıma gəl görüm, mənim kəndçi qızım.

Bənəfşə iki addım atıb dayanır. Kənara baxır, işarə ilə bildirir ki, yaxşı deyil.

B ə n ə f ş ə (*şirin və kədərli*). Ayıfdır, gələn olar...

V a h i d. Yaxşı, iki addım da gəl qabağa. Bizdə hey dişlərini ağardırdın, indi niyə qaşqabağını sallamısan?

B ə n ə f ş ə (*eyni ahənglə*). Sən dedin ki, dişlərini ağartma, xoşuma gəlmir, mən də ağartmıram.

V a h i d. Ay sağ ol, bax beləcə. Hər sözümü yadında saxla. Arvad ərin sözünü yadından çıxartmaz (*Bənəfşə başını aşağı salıb üzünü yana çevirir*). Yaxşı, yaxşı, utanma... Yaxına gəl, mənim adaxlım... Yox, bu köhnə sözdür, xoşuma gəlmir. Mənim gülüm, mənim ceyranım. Bunlar hamısı köhnəlib, feodalizmdən qalma sözlərdir. Feodalizm bilirsən nədir?

B ə n ə f ş ə (*başını tərpədir*). Hardan bilim.

V a h i d. Yaxşıdır ki, bilmirsən, bütün həyatımızı korlayan odur, hə, təzə söz tapmışam, gəl mənim həyatım, mənim varlığım, varlıq bilirsən nədir?

B ə n ə f ş ə (*başını tərpədir*). Hardan bilim.

V a h i d. Bəs sən fəlsəfə oxumamısan? Bilmirsən fəlsəfə nədir? Bir az yaxına gəl, başa salım (*Bənəfşə başını tərpədir ki, gələn deyiləm*). Varlıq obyektdir. Bir obyekt var, bir də subyekt. Bax, bu nədir?

B ə n ə f ş ə. Tiraxtır.

V a h i d. Hə, bunu yaxşı bilərsən. Traxtır. Traktor torpağı sürür, traktor oldu obyekt, torpaq oldu subyekt... Niyə? Çünki traktor aktivdir, torpaq passiv. Başa düşdün? (*Bənəfşə başını tərpədir ki, düşdüm*). Gülnən bülbül də onun kimi. Gül nədir?

B ə n ə f ş ə. Subyext.

V a h i d. Yox, gül obyektdir, bülbül subyekt. Niyə? Çünki bülbül aktivdir, gül passiv. Yadında qalsın, qadın həmişə gərək kişinin sözünə baxsın. Niyə? Çünki qadın...

B ə n ə f ş ə. Subyextdir.

V a h i d. Yox, qadın obyektdir. Kişi isə subyektdir. Bildin?

Bənəfşə başı ilə təsdiq edir.

V a h i d. Qadın gərək nə olsun?

B ə n ə f ş ə. Axtiv...

V a h i d. Yox, passiv... Çünki obyektdir... Yaxın gəl, görüm, mənim obyektim (*Üstünə yeriyir, qolundan yapışmaq istəyir, Bənəfşə onu itələyir*).

B ə n ə f ş ə (*oynaq əda ilə*). Nə qədər ki, evlənməmişik, qoymaram yaxına gələsən.

V a h i d (*acıqlanır*). Yaxın gəl! (*Bənəfşə qəsdən qorxar kimi yanına gəlir*) Əlini mənə ver (*Əlindən tutur, barmağına üzük taxır*). Al, bunu sənə bağışlayıram. Xalis brilyantdır. Xoşuna gəlirmi?

Bənəfşə başı ilə təsdiq edir. Vahid qucaqlamaq istəyəndə qoyub qaçır. Pilləkənin ağzında dönür.

B ə n ə f ş ə. Bəri bax, çox tələsmə, hər şeyin öz vədəsi var. Dədəm deyir – yüz ölç, bir biç.

V a h i d. Sağ ol belə adaxlı... Bu ki başdan-ayağa nazı-qəmzədir! Qara lampaya razı olan yerdə bəxtimə çıraq çıxıb...

P ə r d ə

## ALTINCI ŞƏKİL

Bağın içində yay teatrı. Yanlarda üzbəüz lojalar, ortada kiçik bir səhnə. Lojanın birində Vahid, Bənəfşə, Sarvan və Nisə xala, o birində Rəşid, Şəkərlinski, Göyərçin və Alışov oturmuşdur. Pərdə açılmamış çəpik səsləri eşidilir. Aslan səhnəyə çıxır, əlini qaldırıb camaatı sakit edir.

A s l a n. İndi də xahiş edirik Vahid Səfayi bir şey oxusun.

V a h i d. Deyirsiniz oxu, oxuyum də (*Pərdə dalına yollanır*).

A s l a n. Burdanca birbaş səhnəyə gəl...

Vahid səhnəyə qalxıb oynaq bir hava oxuyur və alqış səsləri altında qayıdıb yerində oturur.

A s l a n. Hörmətli tamaşaçılar. Bununla da bədii gecənin birinci hissəsi qurtardı. İkinci hissədə xalq teatrının artistləri sizə “Hamlet tələsi” adlı kiçik bir məzhəkə göstərəcək. On dəqiqəlik fasilə.

Durub gəzərək söhbət edirlər.

A l ı ş o v. Artistin sözləri məni qorxudur... Tələ niyə?!

Ş ə k ə r l i n s k i. Yaman ağciyərsən Alışov, dovşan kimi bir şeysən.

A l ı ş o v. Qoy desin, nə desə özündən çıxan deyiləm.

V a h i d (*Bənəfşənin kəlağayısının saçaqlarını oynadır*). Nə yaxşı kəlağayın var. Əvvəllər belə şeylərdən zəhləm gedərdi. Sənin başında görəndən bəyənirəm. Yaraşır sənə... (*Stulunu ona yaxınlaşdırır*).

B ə n ə f ş ə (*stulunu yana çəkir, kəlağayını yavaşdan dartır*). Üç ay qabaq atam getmişdi Şəkiyə, ordan alıf, gətirif...

V a h i d. Ay dilini yeyim sənin – alıf, gətirif...

B ə n ə f ş ə (*nazlı və həm də incik kimi*). Bizi ələ salma. Duruf gedərəm evimizə...

V a h i d. Ələ salmıram, ay qız, şirin danışırsan, xoşuma gəlir. Əlini ver əlimə, bir az yaxın gəl, qulağına söz deyəcəyəm.

B ə n ə f ş ə. Ağlaram, mənə əl vurma (*Doluxsunur*).

V a h i d. Yaxşı, yaxşı, qələt elədim kəlağayına toxundum. Qaşqabağını bir az aç, adam qaraqabaq olmaz. Bir balaca da, bir az da, bir az da... Bax belə... (*Uzun hörüklərindən tutur*). Nə yaxşı hörüklərin var.

B ə n ə f ş ə (hörüyü çəkib dala atır). Əlini dinc qoy, ayıfdır.

V a h i d. Bilirsən Bənəfşə, indi sən mənim adaxlımsan. Gərək məndən çəkinməyəsən, mənə mehriban olasan. Yoxsa kəlağayıma dəymə, hörüyümə əl vurma, yaxınıma gəlmə!..

B ə n ə f ş ə. Biz gözümüzü açıf belə görmüşük. Başqa cür bacarmırıq.

V a h i d. Səbir elə, mən sənə şəhər mədəniyyətini öyrədəcəyəm (*Qucaqlamaq istəyir*).

B ə n ə f ş ə (*birdən ayağa durur*). Mən gedirəm.

V a h i d. Hara gedirsən, otur ağız! Tamaşa qurtarmayıb.

B ə n ə f ş ə. Yox, gedirəm, qatıq çalmaışam, vaxtdır, gərək üstünü açam, qalar qıjqırar... Hinin də ağzını bağlamamışam...

V a h i d. Get, Bənəfşə, get, iş hər şeydən vacibdir (*Bənəfşə gedir*). Ay sağ ol, belə adaxlı, xalis mənim malımsan. Qatıq çal, toyuq yumurtlat, ev süpür. Mən də papağımı yan qoyum, gəzim özüm üçün. Nə tapmışam!..

Ş ə k ə r l i n s k i, S a r v a n kişi və Alışov gəlir.

Ş ə k ə r l i n s k i. Ay kişi, mənə inanmırsan, bax budur, yeznəçədən soruş. İki aydır şifer deyilən şey almırıq.

S a r v a n. Böyük sənsən, mən səndən şifer istəyirəm. Məni dağa-dərəyə salma. Altı aydır tövləni tikmişik, üstünü örtə bilmirik. Bu gün-sabah payız gələcək, başlayacaq göydən yağış tökməyə. Taxtalar da çürüyəcək, mal-heyvan da qalacaq soyuqda.

A l ı ş o v. Sarvan əmi, and olsun Allaha...

S a r v a n (*onun sözünü kəsir*). Alışov, soxulma ortalığa, ələkçinin qıl verəni kimi.

A l ı ş o v. Qoy desin, nə desə özündən çıxan deyiləm.

S a r v a n. İki gündür bu kişini axtarıram, axır eşitmişəm ki, axşam burda olacaq. İşimi-gücümü buraxıb gəlmişəm, şifer almayınca əl çəkən deyiləm.

Ş ə k ə r l i n s k i. Ay çöllü, elə elə ki, qapıya bir də şor satan gəlsin. Bir dəfə sözünü yerə salmadım, deyəsən şirnikdin. Şifer yoxdur!.. Altı ay sonra gələcək, on ay sonra gələcək bilmirəm.

S a r v a n. Dal qapıdan bu Alışovu görənlərə olur, bizə olmur, hə?!

A l ı ş o v. Böhtana salma bizi, Sarvan kişi! Belə elərsən, on ay sonra da şifer görməzsən.

S a r v a n. Əə, yavaş danışsana, nə örüşdən qayıdan mal kimi mələyirsən!

A l ı ş o v. Qoy desin, nə desə özündən çıxan deyiləm.

S a r v a n. Dəvədən böyük fil var, elə bilirsən, bütün iplər gəlib sizin doğanaqdan keçəcək? (*Gedir*).

Ş ə k ə r l i n s k i. Alışov, bu kişi səndən də sürtükdür.

A l ı ş o v. Qoy desin, nə desə özündən çıxan deyiləm.

Rəşid Göyərçin söhbət edə-edə gəlir. Şəkərlinski onları görüb qızışır.

Ş ə k ə r l i n s ki. Aha, Alışov, yenə bu qarabağlı gədəsi yanlayıb bizim arvadı... Ayıq ol, adamın gözünə özgə zəmisi düz görünər, özgə arvadı qız. Gizlən burda, gör nə danışırlar (*Gedir*).

Alışov skamyanın altında bükülüb yatır. Göyərçin və Rəşid yaxınlaşır.

G ö y ə r ç i n. Sizinlə danışanda dünya gözümdə işıqlanır. O şeylər ki əvvəl mənə dumanlı, dolaşıq gəlirdi, onları da aydın görməyə başlayıram. Amma elə ki sizdən ayrılıram, dövrəmdəkilərə baxıram, yenə fikrim çaşır. Bilmirəm siz deyən kimi yaşamaq yaxşıdır, yoxsa...

R ə ş i d. Həyat haqqında insanın aydın təsəvvürləri olmalıdır, Göyərsin! Nə üçün yaşadığını, nə istədiyini bilən adam hələ-hələ çaşmaz.

G ö y ə r ç i n. Çaşdırırlar, Rəşid yoldaş. Biri şirin dili ilə, o birisi təkəbbürlü və məğrur görkəmi ilə, başqa birisi şöhrəti ilə adamı elə çaşdırır ki, heç bilmirsən havaxt başın gicəllənib.

R ə ş i d. Nə üçün gərək o qədər zəif olasan ki, aldanasan; mənlik, iradə, nəhayət, şüur...

G ö y ə r ç i n (*onun sözünü kəsir*). Bax siz özünüz də məni çaşdırmağa başlayırsınız. Sizinlə danışdıqca elə bilirəm ki, yuxudan ayılıram, eyni zamanda sanki bir şey itirirəm. Axı mən yaşayışımdan narazı deyiləm. Nəyim yoxdur! Evim, paltarım, ayda bir cüt tufli dəyişirəm.

R ə ş i d. Məgər səadət onlardadır?!

G ö y ə r ç i n (*oynaq əda ilə*). Bəs nədədir?

R ə ş i d. Mən də bilmirəm nədədir. Yaşamaq barədə düstur verən adamları bəyənirəm.

G ö y ə r ç i n. Yenə olsun... sizcə...

R ə ş i d. Məncə, siz gözəl piano çalırsınız... Bu rayon yerində beş-üç uşağı kluba yığıb öyrədə bilərsiniz.

G ö y ə r ç i n. Elə bu?! Bunu mənə Bənəfşə də deyib və bilin ki, artıq şənbə günü dərsə başlayırıq. Sizcə, mən şənbə günündən özümü xoşbəxt saya bilərəmmi?

R ə ş i d. Hər halda bu yaxşı addımdır, kim bilir bəlkə də böyük səadətə doğru atılan kiçik bir addımdır.

G ö y ə r ç i n (*xəyalən*). Böyük səadətə doğru kiçik bir addım. A, a, bu nədir mənim ayağıma dəyir? (*Skamyanın altına baxır*). Rəşid, görün bu nədir tərpənir? (*Qışqırıb ayağa durur*).

R ə ş i d. Burda nə edirsən, Alışov?!

G ö y ə r ç i n (*qəzəbli*). Bizi güdürsən, hə?! Şpion!

A l ı ş o v. Qoy desin, nə desə özündən çıxan deyiləm.

Göyərçin və iki başqa qız onu araya alıb hədələyir.

G ö y ə r ç i n. Utanmaz.

A l ı ş o v. Çinlilər yaxşı eləyir qalmaqal sözü yazanda üç arvad şəkli çəkirlər! Buraxın yaxamı!..

A s l a n (*səhnəyə çıxır*). Oturun yoldaşlar, tamaşa başlanır.

Vahid, Şəkərlinski, Nisə xala və başqaları keçib yerində oturur.

Yoldaşlar, xalq teatrının artistlərindən sığorta işçisi Kərimli kəndlərdən qayıtmadığı və poçtalyon Nəsirli naxoşladığı üçün onların oynadığı kişi rollarını aktrisalarımızdan Ayxanım və Leyla xanım ifa edəcəkdir (*Çəkilir*).

Pərdə açılır. Kabinet təsəvvürü verən otaqda Aslan Ş ə h ə r l i y e v i n rolunda stolun dalında oturub nə isə hesablayır, Ş ə h ə r l i y e v i n köməkçisi Aldiyev rolunda çıxış edən R ə ş i d qapını açıb boylanır.

A l d i y e v. Nərgiz müəllimə gəlib, yoldaş Şəhərliyev.

Ş ə h ə r l i y e v. Aldiyev, yüz dəfə demişəm ki, müəllim gəldi, həkim gəldi, sorğusuz-sualsız burax içəri. Xüsusən Nərgiz müəlliməni!

Aldiyev çəkilir. B ə n ə f ş ə N ə r g i z müəllimə rolunda daxil olur. O son dərəcə səliqə ilə və gözəl geyinmişdir. Qara hörüklər əvəzinə gözəl vurulmuş xurmayı saçlar ağ boynunu yalayır. Elə dəyişilib ki, birdən-birə tanımaq qeyri-mümkündür. Onu görən kimi Vahidin gözləri işıqlanır.

V a h i d (*yanında oturmuş Şəkərlinskini və Göyərçini hiss etmədən*). Bu mələk kimdir?

G ö y ə r ç i n (*bicliklə*). Nə dedin?

V a h i d. Deyirəm nə gözəl aktrisadır! Kimdir belə, adı nədir?

G ö y ə r ç i n. Xəstəxanada can həkimidir. Hələ bu vaxta qədər görməmisən? Adı da Nərgizdir, özü də Nərgiz rolunu oynayır.

V a h i d. Birinci dəfədir gözümə dəyir. Bu ki afətdir!

G ö y ə r ç i n. Onu görəndə ürəyi gedən bir sən deyilsən ha... Hələ oyununa bax, gör necə oynayır.

Baxırlar, Nərgiz yavaş və təmkinli addımlarla irəlilədikcə Şəkərlinski və Vahid tamarzı gözlərlə onu yeyir.

Ş ə h ə r l i y e v (*qabağına çıxır*). Xoş gəlmisən, Nərgiz müəllimə. İşıqlandırdın bizim bu qaranlıq idarəni.

N ə r g i z (*açıq və təmiz təbəssümlə*). Yoldaş Şəhərliyev gərək hər dəfə qəribə bir söz desin...

Ş ə h ə r l i y e v. Nərgiz müəllimə, vallah burdakıları (*əlini sinəsinə qoyur*) sözünən deyə bilsəydim, yazın gülləri ətrini itirərdi, göyün ulduzları qaralardı.

N ə r g i z. Şübhə etmirəm ki, qadınınız Durna xanıma bundan da şairanə sözlər deyirsiniz.

Ş ə h ə r l i y e v. Yaralı yerimə toxunmayın, Nərgiz xanım! Bir arvad ki, əzrayıldan pis ola, ona nə şairanə söz tapacaqsan?

Ş ə h ə r l i n s k i. Bizim arvad kimi...

Ş ə h ə r l i y e v. Mənim müsibətimi başa düşən yoxdur. Arvad deyil, əzrayıldır. Siz isə mələksiniz, yolunuzda canımdan keçərəm.

N ə r g i z (*naz ilə*). Durna xanım üçün keçin canınızdan!

Ş ə k ə r l i y e v. Siz hə deyin, günü sabah boşayaram onu!

N ə r g i z (*eyni naz ilə*). Bəs uşaqlarınız?

Ş ə h ə r l i y e v. Uşaqları verərəm internata!

N ər g i z. Zəhmət çəkməyin, mən sizə gəlmərəm, onsuz da üç dəfə evlənmisiniz...

Ş ə h ə r l i y e v. And olsun Allaha, sizdə nöqtə qoyacağam.

N ə r g i z (*əzilib-büzülür*). Sizin eşqinizə inana bilmirəm...

V a h i d. Bir işvəyə, naza bax. Mələkdir, mələk!

Ş ə h ə r l i y e v. Sizi çiçək kimi bəslərəm.

N ər g i z (*ciddi*). Mən bura başqa şey üçün gəlmişəm. Məktəbi təmir edirik. Bir az material lazımdır (*Kağızı qabağına qoyur*).

Ş ə h ə r l i y e v (*baxır*). Çox yaxşı, çox yaxşı... Ancaq icrakomun icazəsi olmasa buraxa bilməyəcəyəm, Nərgiz xanım.

N ə r g i z. Özləri sizin üstünüzə göndəriblər.

Ş ə h ə r l i y e v. O saat başa düşdüm. Əgər birbaş bura gəlsəydiniz, buraxardım, istəyir sonra məni dardan assınlar, baxmazdım, indi ki, onlara demisiniz, onlar da bura göndərib, qoy bir barmaq kağız yazsınlar.

N ə r g i z (*ayağa durur*). Yaxşı, bu saat gedib kağız da gətirərəm.

Ş ə h ə r l i y e v. İnciməyin, Nərgiz müəllimə!

N ə r g i z (*istehza ilə*). Nə deyirsiniz, sizdən incimək olar?! (*Gedir*).

Şəhərliyev yenə oturub hesablamaqla məşğul olur. Aldiyev qapıda görünür.

Ş ə h ə r l i y e v (*başını qaldırmadan*). Hə, Aldiyev, nə var yenə dilənçi kimi yaxamdan əl çəkmirsən? (*Aldiyev susub ona baxır*).

A l ı ş o v. Qoy desin, nə desə özündən çıxan deyiləm.

Ş ə k ə r l i n s k i. Sus, maymaq! Səni dindirən var?!

A l ı ş o v (*yerində qurcalanır, Şəkərlinskinin qulağına deyir*). Bizi yazıblar, Şəhərliyev sənsən, Aldiyev mən, sinəmizə dağ çəkib bu artist!..

Ş ə k ə r l i n s k i. Özünü o yerə qoyma, axmaq, zırrama. Hamıdan artıq gül, hamıdan da artıq əl çal.

Diqqətlə və süni təbəssümlə səhnəyə baxırlar. Aldiyev hələ də başını kağızdan qaldırmayan Şəhərliyevə yaxınlaşır.

A l d i y e v. Əziz yoldaş Şəhərliyev, gəlib.

Ş ə h ə r l i y e v (*eynəyin altından baxır*). Kim gəlib, əəə?

A l d i y e v. “Şəfəq” kolxozunun sədri.

Ş ə h ə r l i y e v (*birdən açılır*). Göndər cəhənnəmə...

A l d i y e v. Göndərdim, getmədi.

Ayxanım “Şəfəq” kolxozunun sədri rolunda hirslə içəri girir.

“Ş ə f ə q”i n s ə d r i. Cəhənnəm buradır ki, gəlmişəm, yoldaş Şəhərliyev!

Ş ə h ə r l i y e v. Ay kişi, xoş gəlmisən, səfa gətirmisən, keç otur... Burda, burda. Aldiyevə başqa söz deyirdim. Nə əcəb səndən belə?

“Ş ə f ə q” i n s ə d r i. Əcəbsiz-zadsız gəlmişəm. Əlli kubmetr taxta lazımdır. Klubumuz yarımçıq qalıb.

Ş ə h ə r l i y e v. Ay gəlmisən ha, bura gəlməmiş hara gedəcəkdin? Biz sənin kimi xeyrə-şərə yaramaz deyilik ki. Əliboş, üzüqara cumasan üstümüzə... (*Aldiyevə baxıb gülür*).

A l d i y e v. Deyəsən bu dəfə əlidolu gəlib.

“Ş ə f ə q” i n s ə d r i (*işarəni başa düşmür*). Başın üçün, əlidolu gəlmişəm. İcrakomdan kağız gətirmişəm (*Kağızı verir*).

Ş ə h ə r l i y e v (*istehza ilə*). Bəh, bəh! Nə əlidolu gəlmisən... Aldın taxtanı... Dur get.

“Ş ə f ə q”i n s ə d r i. Nə vaxt aparım?

Ş ə h ə r l i y e v. Taxtanı kolxozun həyətində bil. On günə, on beş günə, bir aya taxta sənin cibində (*Yumşaqca oxşaya-oxşaya itələyib kabinetdən çıxarır. Aldiyevə*). Evin yıxılsın qanmaz yiyəsi.

A l d i y e v. Çox yonulmamış şeydir, yoldaş Şəhərliyev, elə bilir ki, biz burda onun dədəsinin nökəriyik. Özümüz də hava ilə dolanırıq, arvad-uşağımız yoxdur.

Qapı açılır. L e y l a “Ulduz” kolxozunun sədri rolunda içəri girir.

“U l d u z” u n s ə d r i. Salam, yoldaş Şəhərliyev.

Ş ə h ə r l i y e v (*ayağa durur, onu qarşılayır*). Salam, salam, həmişə sən gələsən. Hardasan ay kişi, bizləri lap yaddan çıxarmısan?..

“U l d u z” u n s ə d r i. Allah eləməsin, qadan canıma. Sən bəyəm yaddan çıxarmalı adamsan? (*Aldiyevi kənara çəkir, guya ona Şəhərliyevdən gizlin söz deyir. Amma Şəhərliyev eşidir, özünü vurur eşitməməzliyə*). Aldiyev, maşında iki motal, iki də toğlu cəmdəyi var. Zəhmət çək, onları göndər yoldaş Şəhərliyevin evinə.

Ş ə h ə r l i y e v. Nə pıçıldaşırsınız elə, Aldiyev? (*Cavab gözləmədən*) Apar bu kişini o təzə aldığımız taxtadan, şiferdən gör nə qədər lazımdır, ver aparsın. Qabaqcıl kolxoza gərək kömək edəsən.

“U l d u z” u n s ə d r i. Sağ olun, yoldaş Şəhərliyev (*Dolu bir konvert qoyur stolun üstünə. Konvertdən əlliliklərin ucu görünür*).

Ş ə h ə r l i y e v. Bu nədir, ay kişi?

“Ulduz”un sədri utanar kimi başını salır aşağı, cavab vermir.

V a h i d. Nə bicdir, bu! Gör nə özünü vurur tülkülüyə?!

Ş ə k ə r l i n s k i. Səliqəsi yerində olan adamdır. Çörəyi də beləsiynən yeyəsən.

Ş ə h ə r l i y e v. Niyə cavab vermirsən?

"U l d u z" u n s ə d r i. Bekara kağız-kuğuzdur, lazım olan malların siyahısı.

Ş ə h ə r l i y e v. İşini sənin kimi səliqəli tutan adam görməmişəm. Hamı belə olsaydı, nə dərdimiz...

Aldiyevin bir gözü konvertdədir. Bunu duyan Şəhərliyev ona acıqlı baxır, o tez çıxır. Şəhərliyev konverti götürüb gizlədir. Aldiyev qayıdır, konverti yerində görmür.

A l d i y e v. Kağızları vermirsiniz işə tikəm, yoldaş Şəhərliyev?

Ş ə h ə r l i y e v. Narahat olma, Aldiyev, kağızlar yerindədir. Sənin də payın çatacaq (*Yavaşca*) Rəşid, bir Şəkərlinskiyə bax, Alışova bax, heç veclərinə deyil. Nə utanır, nə də qızarırlar, deyəsən Hamlet tələsi də bunlara təsir etməyəcək (*Ucadan*) Başa düşdün, Aldiyev?

A l d i y e v. Bilirəm ki, siz insaflı adamsınız, (*yavaşca*) sən də söz danışırsan, ay Aslan. Bunlar elə sürtülmüyüb ki, üzlərində həya qalsın. Qanunun məhkəməsindən qorxmurlar, deyirsən sənətin məhkəməsindən qorxacaqlar... (*Ucadan*) Başa düşdüm yoldaş Şəhərliyev, sağ olun!

Ş ə h ə r l i y e v. Mən səni heç vaxt incitmərəm Aldiyev, öz itimsən...

A l ı ş o v. Qoy desin, nə desə özündən çıxan deyiləm.

Ş ə h ə r l i y e v. İncitmərəm, Aldiyev (*Yavaşca*). Qanun bu gün cəzalandırıb, sabah bağışlaya bilər. Sənət isə insanın başına şöhrət tacını da əbədilik qoyur, alnına lənət damğasını da əbədilik basır.

A l d i y e v (*ucadan*). Qiyamətəcən sənnən dönəsi deyiləm... (*Yavaşca*). Bunlar nəinki əbədiyyəti, heç sabahı da düşünmürlər. Bu gün yaxşı yaşasınlar, vəssalam (*Ucadan*). Yoldaş Şəhərliyev, mənim payımı ver özümə...

Ş ə h ə r l i y e v. Al, bala, (*yavaşca*) Rəşid, sən öl, ha baxıram üzlərinə, bir əzələ də tərpənmir.

A l d i y e v. Sağ olun (*Sayır, yavaşca*). Ora bax, Şəkərlinski Alışova baxıb göz vurur.

Ş ə h ə r l i y e v. Ə, niyə sayırsan. Qoy cibinə (*Yavaşca*). Ay Rəşid, deyəsən Hamlet tələsi boşa çıxdı.

A l d i y e v (*pulu cibinə qoyur*). Dövlətin artıq olsun (*Yavaşca*) Sən də xam xəyala düşmüsən. İyirminci əsrin Şəkərlinskisini on altıncı əsrin tələsinə salmaq istəyirsən.

Ayxanım Həsənqulu rolunda gəlib qapıda durur.
Tərəddüd edir, bilmir içəri girsin, ya yox.

Ş ə h ə r l i y e v. Gəl içəri, utanma bala (*Həsənqulu içəri gəlir. O, sadə geyimli utancaq bir oğlandır*). Nə istəyirsən, bala?

H ə s ə n q u l u. İşə girmək istəyirəm, əmi, dükana, satıcı.

Ş ə h ə r l i y e v. Papiros çəkirsən?

H ə s ə n q u l u (*əvvəlcə təəccüb edir. Sonra sevincək cavab verir*). Xeyr, papiros-zad çəkmirəm!

Ş ə h ə r l i y e v. Çox yaxşı, çox yaxşı. Bunnan necəsən? (*Barmağını boğazına vurur. Həsənqulu qızarır, sualı başa düşməyib mat-mat baxır*). Araq-çaxır deyirəm ey, içirsən, yox?

H ə s ə n q u l u (*yenə sevincək*). Xeyr, xeyr, dilimə dəyməyib!

Ş ə h ə r l i y e v. Çox yaxşı, çox yaxşı. Arvad tayfasına necə baxırsan? (*Yenə Həsənqulu mat-mat baxır*). Arvadları deyirəm ey, arvadlarla necəsən?

A l d i y e v. Yoldaş müdir soruşur ki, arvadların dalına düşmürsən ki, arvad görəndə ürəyin birtəhər olmur?

H ə s ə n q u l u. Xeyr, xeyr. Mən elə adam deyiləm. Hələ bir qızınan gəzməmişəm (*Utanır*).

Ş ə h ə r l i y e v. Çox yaxşı, çox yaxşı. Get bala, on gündən sonra gəl (*Həsənqulu başı ilə sağ ol eləyib utana-utana çıxır. Aldiyev onu yola salıb qayıdır*). Aldiyev, başa sala bildin? Əə, bu maymağı hardan tapmısan? Papiros çəkmir, çaxır içmir, arvad tanımır, zırrama heyvan! Bundan biz nə xeyir görəcəyik... Bizə cəld, zirək, əlindən iş gələn adam lazımdır ki, özü də bir şey götürsün, bizi də məğmun eləməsin...

Qapı açılır. Hüseynqulu rolunda Leyla içəri girir.

H ü s e y n q u l u. Salam, yoldaş Şəhərliyev (*Keçib əl verir, oturur*).

Ş ə h ə r l i y e v (*Aldiyevi göstərir*). Bəs onnan görüşmədin?

H ü s e y n q u l u. Mən idarələrin başçılarını tanıyıram, xırda-xuruşnan işim yoxdur.

Ş ə h ə r l i y e v (*Aldiyevə göz vurur*). Hərifə oxşayır (*Hüseynquluya*) Nə istəyirsən?

H ə s ə n q u l u (*kənara baxır, işarə ilə soruşur ki, Aldiyevin yanında açıq danışmaq olar, Şəhərliyev başı ilə olar deyir*). Deyin siz nə istəyirsiniz?

Ş ə h ə r l i y e v (*heyrətlə*). Başa düşmürəm?!

H ü s e y n q u l u. Nə qədər, nə qədər lazımdır?

Ş ə h ə r l i y e v. Hə, hə, başa düşdüm. Papiros çəkirsən?

H ü s e y n q u l u. Gündə üç paçka! (*Ona papiros təklif edir*). On yaşından başlamışam.

Ş ə h ə r l i y e v. Araq-çaxırnan necəsən?

H ü s e y n q u l u. Konyaknan pivəni də üstünə gəlsən gül elərsən (*Cibindən bir şüşə konyak çıxarır*).

Ş ə h ə r l i y e v (*təəccüblə*). Hamısını birdən?!

H ü s e y n q u l u. Bala-bala vuranda heç şey olmaz. Hərəsinin öz norması var. Sağlıq olsun, bir oturarıq göstərərəm.

Ş ə h ə r l i y e v. Arvad tayfasıynan aran necədir?

H ü s e y n q u l u. Oxqayyy!!! Onlarsız dünyanın nə ləzzəti (*Əlini uzadır*). Çək bura. Onlara canım qurban (*Şəhərliyevi öpür*).

Ş ə h ə r l i y e v (*ayağa durur*). Aldiyev, bu Hüseynqulu çox zirək oğlana oxşayır. On beş gün sonra əmrini ver...

H ü s e y n q u l u (*ayağa durur, Aldiyevi kənara çəkir*). Sizdə məzəndə neçədir? Köhnə pulunan günü yüz manat, ya min manat?

A l d i y e v. Ayıbdır ki, yüz manat nədir, dilənçi zad deyilik ki!.. Günü min manat!

H ü s e y n q u l u (*konverti çıxarır*). Yoldaş Şəhərliyev, mənim on beş günüm qurtardı, əmrimi verin.

Ş ə h ə r l i y e v (*konverti almır. Aldiyevi göstərir*). Kağız-kuğuz söhbətini onunla elərsən. Gedin, əmri hazırlayın. Nə mən deyən oğlansan!..

Onlar çıxanda Nərgiz müəllimə və Həsənqulu ilə üz-üzə gəlirlər.
Konvert Abdiyevin əlindən yerə düşür. Nərgiz tez ayağını onun üstünə qoyur.

N ə r g i z. Getmə, Aldiyev!

Ş ə h ə r l i y e v. Kağızı gətirdin, müəllimə? Ver qol çəkim (*Həsənquluya*) Çıx çölə bala, sənə demədim on gün sonra gəl?!

N ə r g i z. Onu mən gətirmişəm. On gün – min manat, hə?

Ş ə h ə r l i y e v. Nə danışırsınız, müəllimə, bu kimdir? Mən ondan pul-zad istəməmişəm.

N ə r g i z. Sənin əlaltın (*Aldiyevi göstərir*) öz işini yaxşı bilir (*Həsənqulunu göstərir*). Bu mənim şagirdim olub. Atası Vətən müharibəsinə gedib qayıtmayıb. Anası iki uşağı yüz çətinliklə böyüdüb, oxudub. İndi o hardan tapsın, sənə min manat versin? Xalqın əxlaqını, mənəviyyatını pozan rüşvətxorlar, alçaqlar, tufu sizin üzünüzə!

Tüpürüb çıxır. Şəhərliyev, Aldiyev büzüşüb qalırlar. Pərdə düşür, Vahid, Alışov, Şəkərlinski əl çalır. Vahid artist paltarında səhnəyə çıxan Rəşidə, Aslana yaxınlaşır. Söhbət edirlər, Şəkərlinski Alışovu kənara çəkir.

Ş ə k ə r l i n s k i. Əə, niyə pərtsən?

A l ı ş o v. Görmədin nə giliz vurdular?

Ş ə k ə r l i n s k i. Dədəmizi yandırıblar, səsini çıxarma. Qapımızı bu qarabağlı gədəsinə tanıdanın atasına lənət. Özləri, Qarabağ kolxozlarında toğlu qalmadı şişə çəkmiyələr, bizə sataşırlar.

A l ı ş o v. Bular ki, bizim haqqımızda bu fikirdədirlər, dinc oturmayacaqlar.

Ş ə k ə r l i n s k i. Fikir eləmə, sağ olsun dayının canı! (*Yuxarı işarə edir*). Bir-iki ay keçər, deyərəm, əmrini verər, atar Kürdəmirin səhrasına. İndi gəl kişiləri təbrik edək (*Aslana yaxınlaşıb əlini sıxır*) Sağ olun, sağ olun, gərək belə tənqid eləyəsən ki, camaat tərbiyə oluna!

Danışa-danışa çıxırlar. Göyərçin və Leyla əlində bir dəstə qızıl gül aktrisa paltarında olan Bənəfşəni dövrəyə aldıqları halda gəlirlər.

G ö y ə r ç i n (*Bənəfşəyə*). Ay qız, gözün aydın, adaxlın səni tanımadı. Çox da xoşuna gəlmisən. Oyunun yox ey, özün. Özün yox ey, aktrisa Nərgiz. Soruşdu kimdir, dedim can həkimi.

B ə n ə f ş ə. Nə mən istəyən oldu! Qızlar, oyun var.

G ö y ə r ç i n (*Bənəfşəyə*). Çalış Nərgiz olanda nə qədər bacarırsan özünü şirin göstər, çıxart huşunu başından.

L e y l a. Gözləmədiyin yerdən gün çıxar burda deyiblər. Əlimizə yaxşı girəvə düşüb!

B ə n ə f ş ə. Onunla bir az ibarə ilə danışacağam. Ara-sıra səsimi də dəyişəcəyəm. Elə edin ki, heç şey başa düşməsin.

G ö y ə r ç i n. Sözü dəyişin, odur gəlir (*Ucadan*) Ay Nərgiz, sən ağıllı-başlı artistsən. Nə yaxşı oynadın! Bəs anan tamaşaya gəlməyib?

N ə r g i z (*Vahidə eşitdirmək üçün ucadan danışır, qəsdən səsinin ahəngini dəyişir*). Anam teatra gəlitdi də, geditdi də.

V a h i d (*kənara*). Əə, bunun səsi özündən də gözəldir, nə də şirin dili var!..

G ö y ə r ç i n. Nə danışırsan, Vahid?

V a h i d. Deyirəm bu gün bayramdır. O qədər ləzzət aldıq ki (*Nərgizə*) İcazə verin sizi ürəkdən təbrik edim, Nərgiz xanım, həm də tanış olaq (*Əl verir*). Vahid.

N ə r g i z (*incə bir əda ilə, xoş təbəssümlə əl verir. Məxməri səslə danışır*). Tamaşamızı bəyəndinizmi!

Vahid onun əlini öpür. Qızlar bir-birini dümsükləyib gülümsəyirlər.

V a h i d. Çox gözəl tamaşadır. Doğrusu, gözləməzdim. Siz isə səhnədə ulduz kimi yanırdınız. Mən mərkəzi teatrlarda da bu cür incə, bu cür zərif aktrisa görməmişəm.

N ə r g i z. Sizə bu qədər xoş gəldiyim üçün xoşbəxtəm. Ancaq deyəsən siz məni hədsiz dərəcədə tərifləyirsiniz.

V a h i d. Mən duyduqlarımın yüzdə birini demirəm. Sizə baxanda adam valeh olur. Səsinizdəki məlahət insanı bihuş edir. İndi mən sizin doğrudan da can həkimi olduğunuza inandım – həm müstəqim, həm də məcazi mənada – can həkimi!

N ə r g i z. Ooy, siz məni utandırırsınız.

V a h i d. Qoy qızlar desinlər, siz səhnəyə gələndə sanki zal işıqlandı. Mən elə bir hərarət duydum ki...

G ö y ə r ç i n və L e y l a. Doğru deyir, Nərgiz, bizə də elə isti oldu, elə isti oldu...

N ə r g i z. Məni o qədər sevindirdiniz ki... Sağ olun (*İncə və cazibədar hərəkətlə vidalaşıb qızlarla birlikdə getmək istəyir. Lakin nə isə xatırlayıb Göyərçinə dönür*). Az qalmışdı unudam. Şəkərlinskiyə deyin ki, atam şəhərdən gəlitdi də geditdi də...

G ö y ə r ç i n (*süni ciddiyyətlə*). Heyif, heyif. Bilmirəm kişinin nəyinə lazımdır, atanı bərk axtarır...

N ə r g i z (*incə əda ilə Vahidə*). Ha salamat qalın...

Gedirlər.

V a h i d (*vəcdlə onların dalınca boylanır*). Yeni görüşə qədər, Nərgiz! Gəlitdi də, geditdi də deyən dilini yeyim, baldan şirin dilini! Qız deyil ki, çıraq kimi yanır. Mən qafil də az qala qara lampanı çıraq bilmişdim.

P ə r d ə

## ÜÇÜNCÜ PƏRDƏ

### YEDDİNCİ ŞƏKİL

Səhnənin qabağında kəndi təsvir edən şəkilli bir pərdə asılmışdır. Aslan əlində qəzet, sevincək oxuya-oxuya gəlir. Bənəfşə qarşı tərəfdən çıxır. Aslanı görüb küskün görkəm alır. Aslan, ona yaxınlaşır.

A s l a n (*qəzeti göstərir*). Məktubunuz çap olunub, təbrik edirəm.

B ə n ə f ş ə (*soyuq və incik*). Sağ ol.

A s l a n. Ürəkdən arzu edirəm qalib gələsən, Bənəfşə, qoçaqsan! Bir gör necə də iri hərflərlə çap ediblər, (*oxuyur*) briqadamız söz verir vicdanla işləsin, maşınlara yaxşı baxsın, xarab olmağa qoymasın, onlardan səmərəli istifadə etsin, planı yüz əlli...

B ə n ə f ş ə (*sözünü kəsir*). Bəsdir, Aslan, kimə oxuyursan? Axı onları mən yazmışam.

A s l a n. Burda nə qədər isti yazmısansa, mənnən o qədər soyuq danışırsan, Bənəfşə.

B ə n ə f ş ə. Əvvəla bacardığım budur, bu cür də danışıram. İkinci də mən indi Bənəfşə deyiləm, Nərgizəm.

A s l a n. Sənin Nərgizə çevrildiyini və Vahidin sənə yaxınlaşdığını fikrimə gətirəndə dəli oluram.

B ə n ə f ş ə. Başa düşmürəm, nə üçün dəli olursan?

A s l a n. Qorxumdan! Vahid Bənəfşənin xoşuna gəlmir, birdən Nərgizin xoşuna gəlsə neylərəm?

B ə n ə f ş ə. İndi ki, məni bu qədər yüngül bilirsən, xoş gəldin! (*Gedir*).

A s l a n (*dalınca*). İncit məni, Bənəfşə, nə qədər bacarırsan, incit, amma bil ki, səndən əl çəkəsi deyiləm... (*Gedir*).

V a h i d (*bir vərəq naxışlı kağızı öz-özünə oxuyaraq gəlir*). Nərgiz, əzizim! Hər kəsin həyat yolunun üstündə bircə səadət badəsi var. Kim onu vaxtında götürdü, biləcək yaşamaq nədir. Kim ötdü, keçdi, daima həsrət içində qalacaq (*Oturur, düzəldir*). Yox cümlələr xoşuma gəlmir. Belə yaxşıdır: "Nərgiz, əzizim! Deyirlər ki, bir dərviş ömrü boyu dünyanı gəzib həqiqət axtarıb. Lakin gəncliyi əldən gedəndən sonra, saçı-saqqalı ağaranda qayıdaraq həqiqəti öz daxmasında tapıb... Mən də o dərvişin günündəyəm. Uzun axtarışlardan sonra ilahi gözəlliyi gəlib burada tapmışam. O gözəllik sənsən, Nərgiz!" (*Başını qaldırır*). İndi yaxşıdır.

G ö y ə r ç i n gəlir.

G ö y ə r ç i n. Hanı bizim o maymaq... Sənnənəm, hanı bu gic başını qarğalar yemiş?

V a h i d. Qorxma, hara getsə axır gəlib səni tapacaq. Göyərçin, axı yaman işim düşüb sənə.

G ö y ə r ç i n. Qələt elərəm mən sənin işinə qarışaram.

V a h i d. Bu işi düzəltsən, qiyamətə qədər sənin qulluğunda varam (Kağızı uzadır). Bunu çatdır Nərgizə.

G ö y ə r ç i n. Ay balam, mən poçtalyon-zadam? Odur, hökumətin poçtu – göndər apar özün ver.

V a h i d. Özümü yaxına qoymur. Poçtla da göndərməyə qorxuram. Ələ-zada düşər.

G ö y ə r ç i n. Yaxşı, bəri ver görüm (*Alır*). Heç bilmirəm məni nə üzlə yola salacaq. Fikrin bizlərə getməsin ey, yaman qızdır, bir adamdan bir yumşaq söz, bir kompliment eşidən deyil. Qorxuram kağızı çırpa başıma.

V a h i d. Gör də Göyərçin, deyinən oxusun. Beşcə sətir yazsın. Ya da onca dəqiqəliyə görüşək.

G ö y ə r ç i n. Yəni belə xoşuna gəlib?

V a h i d. Sənin canın üçün, Göyərçin, huşum başımda deyil. İndi başa düşmüşəm ki, əsil məhəbbət nədir... Yuxum, istirahətim qaçıb, elə bir ki, göylərdəyəm!

G ö y ə r ç i n. Yazıq, qaragün. Deginən kosmonavt olmuşam... Gedim görüm neylirəm. Sən elə burada otur, məni gözlə (*Gedir*).

P ə r d ə

## SƏKKİZİNCİ ŞƏKİL

İç–içə iki otaq. Böyük otağın qapısı bağçaya açılır. Bu Şəkərlinskinin kabinetidir. Qapıdan qalın məxmər pərdə asılmışdır. Alışov öz stolunun dalında oturaraq başını kresloya söykəyib yuxulamışdır. Yuxuda gah milçək tutur, gah kiminləsə danışır. Şəkərlinski pərdəni qaldıraraq bağçadan birbaş kabinetə daxil olur. Xorna çəkən Alışova baxıb başını bulayır.

Ş ə k ə r l i n s k i. Evin yıxılsın ayı yiyəsi, tfu! (*Çırtma ilə vurur, Alışov diksinir*).

A l ı ş o v. Qoy vursun, neyləsə özündən çıxan deyiləm.

Ş ə k ə r l i n s k i. Alışov, başın qaz yumurtasına oxşayır.

A l ı ş o v. Qoy desin, nə desə özündən çıxan deyiləm...

Ş ə k ə r l i n s k i. Yaxşı yadıma düşdü, əhalidən nə qədər yumurta alınıb? (*Cavab gözləmədən durub pərdəli qapıdan çıxmaq istəyir. Lakin qayıdıb bu biri otağa yollanır*).

V a h i d (*oxuyur*). “Nərgiz, əzizim, indi sənin bircə sözün mənə əbədi səadət verə bilər. Nərgiz!..”.

Ş ə k ə r l i n s k i (*Vahidə*). Sərxoş deyilsən ki, nə mırt vurursan ədə?

V a h i d. Yumurtaların hesabını çəkirəm... Əhalidən alınan yumurtaların...

Ş ə k ə r l i n s k i. Tez elə ha, gərək sabaha plan dola... Otuz min yumurta...

V a h i d. Dolacaq, dolacaq, arxayın ol.

Ş ə k ə r l i n s k i (*Rəşidə*). Sən nə qayırırsan, qarabağlı balası?

R ə ş i d. İnşaat materiallarına daha çox ehtiyacı olan kolxozların siyahısını hazırlayıram, təzə gələn taxta, şifer...

Ş ə k ə r l i n s k i. Özüm bölmüşəm, siyahını Alışov sənə verər (*Alışova*) Dalımdan asılma quyruq kimi, çəkil.

A l ı ş o v. Qoy desin, nə desə özündən çıxan deyiləm.

Şəkərlinski gedir.

V a h i d (*Rəşidə*). Nahaq zəhmət çəkmə, özü bölüb...

R ə ş i d. Mən də təklifimi hazırlayıb aparacağam raykoma. O elə bilir ki, hamı Alışovdur – düyməçə ilə idarə olunan maşın: istəyirsən işləsin – düyməçəni bas, istəyirsən dursun – düyməçəni bas!

A l ı ş o v. Qoy desin, nə desə özündən çıxan deyiləm (*Gedir*).

V a h i d. Qərəz, daş qayaya rast gəlib. Yaman buynuzlaşırsınız. Rəşid, bir qaldır başını o kağızlardan, söhbət edək qızdan, arvaddan danışaq. Nə tapmısan kağız-kuğuzda bilmirəm, axır səni qurudub qaxa döndərəcəklər.

R ə ş i d. Sən yumurta məsələsini zarafata salma, Şəkərlinski tutacaq boğazından.

V a h i d. Bu saat heç mənim qulağıma yumurta girir? Mən ölüm ruhun olsun, başını qaldır...

R ə ş i d. Qoy işimi görüm.

Vahid yerində oturub şeri əzbərləyir. Göyərçin gəlir.

G ö y ə r ç i n. Hə, hazırlaş gəlir, bir bəlayi-müsibətnən razı salmışam, gəl görəsən.

V a h i d. Göyərçin, Göyərçin! Doğrudan sən sülh quşusan, səadət quşusan. Xoş müjdələr carçısısan... Gör necə çıxacağam yaxşılığından?!

G ö y ə r ç i n. Amma bu gün inandım ki, səndə ovçu gözü var. Ay Vahid. Qız, nə qız! Bir bəzəkli kukla! Gözü-qaşı qələmlə çəkilib, səsi – bülbül səsi, hələ geyimi-kecimi, mən bu cür gözəl qız görməmişəm (*Pəncərədən baxır*). Aha, gəlir, qoy gedim qarşılayım.

V a h i d. Yox, yox, özüm qarşılaram (*Çıxır*).

R ə ş i d. Vallah Göyərçin, sən dram teatrı üçün hazır aktrisasan. Özün də deyirsən harda işləyim, əlimdən bir iş gəlmir.

G ö y ə r ç i n. Rəşid qardaş, səsini çıxarma. Yaman keçib girimizə. Bu Vahidi söyüd budağı kimi elə də əyəcəyəm; belə də.

Göyərçin və Rəşid çıxır. Vahid, Nərgizlə qayıdır. Qız elə geyinib, üz-gözünü elə düzəldib ki, onda Bənəfşədən əsər-əlamət yoxdur.

V a h i d. Nərgiz, inana bilmirəm ki, gələn sizsiniz, elə bilirəm göydən yerə mələk enib, ya da mən yeddinci göydəyəm, uçuram.

N ə r g i z (*məxməri səslə*). Tufan dəryanı çalxalandıran kimi siz də mənim hisslərimi alt-üst etmişsiniz. Ürəyimdə heyrət, təəccüb, şübhə, tərəddüd bir-birinə qarışmışdır.

V a h i d. Mən istərdim ki, onların hamısını bircə duyğu əvəz etsin – sevgi! Qəlbinizdə bircə fırtına baş qaldırsın – məhəbbət fırtınası!

N ə r g i z. Ah, bu sözlər nə qədər gözəldir! Lakin mən onlardan qorxuram. Deyirlər ki, şərab da şirin olur, amma içdikcə insanın ağlını başından çıxarır.

V a h i d. Məhəbbət badəsi əbədi səadətlə doludur, Nərgiz. Qorxma, iç. Onsuz insanın həyatı quru bir nəfəsdir.

N ə r g i z (*boynundakı boyunbağını göstərir*). Bax, görürsünüzmü necə də yaxşı parıldayır?! Güman edirsiniz ki, əsil mirvaridir. Yox! Mənə deyiblər ki, bir çox adamların özləri də, sözləri də beləcə saxta parıltı ilə qızların gözünü qamaşdırır, onları yoldan çıxarır.

V a h i d. Məgər siz mənim hər sözümdə ürəyimin döyüntüsünü, qanımın atəşini hiss etmirsiniz?! Məni sizə yaxınlaşdıran yalançı cazibələr, saxta məhəbbət oyunları, ac canavar kimi körpə quzunu parçalayıb yedikdən sonra soyuyan ötəri ehtiraslar deyil, əsil məhəbbətdir.

N ə r g i z. Doğrusunu deyin, bu cür sözləri siz başqa qızlara da demisinizmi? (*Vahid özünü itirir. Pauza*) Mən bunu da sizə bağışlayıram. Çünki insan yanıla bilər, bir şərtlə...

V a h i d. Tez deyin, o şərt nədir?

N ə r g i z. Heç olmazsa indi səmimi olasınız, bir daha dönüklük etməyəsiniz...

V a h i d. And içirəm nəyə desəniz, bütün varlığım sizin eşqinizlə çırpınır və bu əbədi məhəbbətdir!

N ə r g i z. Bəs o gün teatrda yanınızda oturmuş o xanım kim idi?

Vahid özünü itirir. Əlində oynatdığı qələm yerə düşür. Əyilib onu axtarır. Nəhayət, götürərək qalxır.

V a h i d. Hə, hə, hə... o teatrdakı qızı deyirsiniz?! O kəndçi qızıdır də, Bənəfşədir də...

N ə r g i z. Başa düşmürəm, necə yəni kəndçi qızıdır də, Bənəfşədir də? Olmaya deyiklinizdir?

V a h i d. Yox, canım! Anamın işləridir də, qapı-qapı düşüb gəzib, bunu tapıb ki, gərək alasan... Bilirsiniz də, anadır, ürəyi davam gətirmir, istəyir gəlini olsun, çağa olsun, qucağına alıb oynatsın.

N ə r g i z. Deməli, Bənəfşəni siz istəmirsiniz?

V a h i d (*gülür*). Onun nəyini istəyim? Dil yox – danışsın, zövq yox – geyinsin, baş yox – düşünsün.

N ə r g i z. Yəni o qədər kütdür?!

V a h i d. Bax, bu taxta parçası, ya o – fərqi yoxdur. Düşmüşəm atamın-anamın kələyinə, köhnə qalğılar bilmirsiniz bizim həyatımızı necə korlayır!

N ə r g i z. Sizə lap yazığım gəldi... Amma fikir vermişəm, üz-gözündən pis qız deyil...

V a h i d. Yox canım, qarayanıq şeydir. Burnu da ki, Allah göstərməsin, elə bil qırmızı turpdur, gətirib yapışdırmısan üzünün ortasına...

N ə r g i z. Yəqin bir az sonra mənim du burnumu xiyara oxşadacaqsınız?

V a h i d. Nə deyirsiniz, Nərgiz! Dünyada yaxşı burun azdır, tək-tək adam tapılar ki, yaraşıqlı burnu olsun. Siz birinci qızsınız ki, mən görürəm belə zərif, hamar, dümdüz burnu var.

N ə r g i z. Mənim eybim ondan çoxdur (*Üzündəki xalı göstərir*). Heç bu xalın yeridir?

V a h i d. Elə deməyin, rica edirəm! Gör sizə necə yaraşır?!

N ə r g i z. Bəs Bənəfşənin hörükləri? Hörüklərinə ki, söz ola bilməz?..

V a h i d. O nə hörükdür? At quyruğu kimi sallanıb dalından. Mənim zövqümdə deyil. Baxanda ürəyim bulanır... İndi heç hörük zamanıdır?!

N ə r g i z. Danışığına ki, bir eyib tuta bilməyəcəksiniz, danışanda elə bil musiqiyə qulaq asırsan.

V a h i d. Nə, musiqi? Gedifdi... eşidəndə adamın qulağı qaşınır...

N ə r g i z. Mən də çox sözü düz demirəm. Ləhcəmdəki...

V a h i d. Əsil musiqidir. Dodağınızda söz çox incə səslənir. Valehəm danışığınıza...

N ə r g i z. Mən inandım ki, doğrudan da Bənəfşə sizin tayınız deyil. Axı gərək insan bir-birinə yaraşsın, bir-birini bəyənsin, sevsin ki, bir yerdə yaşaya bilsin.

V a h i d. Nərgiz, siz mənə həyat verirsiniz... Görün necə tez mənim faciəmi anladınız, mənim ürəyimi gəmirən həyəcanların səsi qulağınıza çatdı. Ümid edə bilərəmmi?

N ə r g i z. Hələ ki, mən sizə heç bir söz deyə bilmərəm. Ürəyimdə oyanan ilk duyğu budur ki, sizə yazığım gəlir... Başqa şeyləri gələcək göstərər.

V a h i d. Heç olmazsa sizinlə görüşməyə icazə verin.

N ə r g i z. Bircə şərtlə. Görüş yerini və vaxtını ancaq mən təyin edəcəyəm. Siz mənim iş yerimə gəlmək, evimizin ətrafına fırlanmaq, mənim görüşmək təşəbbüsündə belə olmamalısınız.

V a h i d. Söz verirəm, nə qədər ağır olsa da mən buna dözəcəyəm, gözümü qapıya, qulağımı telefona tutub səbirsizliklə işarənizi gözləyəcəyəm.

N ə r g i z. Şərtimi pozsanız, bir daha mənim üzümü görməzsiniz (*Saatına baxır*). Artıq mən getməliyəm.

Vahid qapını açmaq üçün dönəndə Nərgiz kiçik ipək dəsmalını pəncərənin dalına qoyur, qapıdan çıxmaq istəyəndə G ö y ə r ç i n gəlir.

G ö y ə r ç i n. Nərgiz bacı, burdan getsək yaxşıdır (*Onu pərdəli qapıya tərəf çəkir*).

V a h i d. İcazə verin sizi ötürüm.

N ə r g i z. İcazə vermirəm bir addım da atasınız (*Çıxır*).

Vahid dəsmalı götürüb sevinir, iyləyir, bağrına basır, Nərgizin dalınca baxır.

V a h i d. Çətinliklə də olsa səni ələ gətirəcəyəm, Nərgiz! Elə ləzzət də ondadır ki, çətinliyi aradan qaldırasan, müqaviməti qırasan, daşlı-kəsəkli yollardan keçib istədiyinə nail olasan!

Dəsmalı öpüb oynayır. R ə ş i d, A y x a n ı m və L e y l a gəlir.

L e y l a. Vahid, sənə nə olub belə çalıb-oynayırsan?

Vahid dayanır, onlara baxır, cavab verməyib yenə oynayır.

V a h i d. Özüm bilərəm, mənim işlərimə qarışmayın...

R ə ş i d. Belə ki, keyfin yuxarıdır, görünür Nərgizin ürəyini almısan...

L e y l a (*təəccüblə*). Heç elə şey olmaz! Nərgiz elə qız deyil ki, bircə dəfə görüşməklə adama yaxınlıq göstərə.

V a h i d. Hə, hə, siz gülün, uzaq başı bircə həftə sonra görərsiniz Nərgiz ovcumun içindədir. Mən romalıların düsturu ilə hərəkət edirəm. Veni, vidi, vici, yəni gəldim, gördüm, qələbə çaldım.

A y x a n ı m. Vahid, qorxuram sənin bu qələbən ən pis məğlubiyyət ola. Sənə mənim yazığım gəlir.

V a h i d. Elə Nərgizin də mənə yazığı gəlir. Görünür qızların məhəbbəti adamın halına yanmaqdan başlayır. Axı Dezdemona da Otellonu çəkdiyi iztirablara görə sevmişdi...

A y x a n ı m. Ayıl, başa düş, sən özünü gülünc vəziyyətə salırsan. Bil ki...

L e y l a (*sözünü kəsir*). Bəsdir Ayxanım, sən bütün işləri xarab edəcəksən.

V a h i d. Xahiş edirəm, heç kəs mənim işimə qarışmasın. Mənim məsləhətçim bax budur (*Dəsmalı göstərir*).

L e y l a. Yaxşı məsləhətçin var, bərk saxla.

R ə ş i d. Ay Vahid! Bəs Bənəfşə?! Qızın evində gözləyirlər ki, bu gün-sabah böyük nişan gələcək, bu nə həngamədir başlayırsan?

V a h i d. Bənəfşə ilə özüm bilərəm. Sizlik iş yoxdur.

A y x a n ı m. Bu fikirdən əl çəkməsən, atana yazacağam.

V a h i d. İstəyirsən teleqram vur. Atam tərpənib gəlincə, görəcək iş-işdən keçib. Diplomatlar demişkən, defakto!..

A y x a n ı m. Sənə baxıram, qəzəbdən az qalıram ağlayam, özünü necə də gülünc və axmaq vəziyyətə salırsan. Axı sən bu deyilsən, sənin istedadın, qabiliyyətin var. Amma, ağlın, iradən...

V a h i d. Mənə az dərs deyin, canım!

A y x a n ı m. Heyif ki, sən korsan, axı sən tamamilə başqa cür ola bilərsən. Heyif sənə!..

B ə n ə f ş ə gəlir.

A y x a n ı m və L e y l a. Bənəfşə, gözün...

V a h i d (*sözlərini kəsir, dəsmalı yaxa cibinə qoyur*). Mən ölüm çıxın bayıra! Bənəfşəyə xüsusi sözüm var (*Üçünü də otaqdan çıxarır*).

B ə n ə f ş ə. Nə var, Vahid, mənə nə deyəcəksən?

V a h i d. Ay qız, bu gün bu idarənin yolunu niyə döndərmisən dəyirman yoluna?! O tərəfə, bu tərəfə! İşin-gücün qurtarıb?

B ə n ə f ş ə. Səni görməyə gəlirəm, Vahid. Bəs niyə acıqlanırsan?

V a h i d. Bura idarədir, başa düşürsən? Qoy işimizi görək.

B ə n ə f ş ə (*utancaqlıqla*). Sənsiz darıxıram ey...

V a h i d. Darıxmağa bax! Boynuna o boyda vəzifə götürmüsən, dünyaya car çəkmisən, qəzetlər yazıb, maşınlardan səmərəli istifadə

etmək, nə bilim, planı bu qədər yerinə yetirmək! Get, get, işində ol, yoxsa sabah biabır olarsan!

B ə n ə f ş ə. Qorxma, biabır olmaram. İş öz yerində, görüş öz yerində.

V a h i d. Görüş-mörüş feodalizmdir. Başa düş, əsrimiz iş əsridir.

B ə n ə f ş ə. Bəs o qız kim idi, bayaq burda səninlə söhbət edirdi?

V a h i d. Nə qız, ay balam? Burda qız-zad olmayıb... Səni qara basır.

B ə n ə f ş ə. Günün günorta çağı adamı qara basmaz. Akuşkadan görmüşəm. Burda durmuşdu. Bir suyu o teatrda oynayan aktrisaya oxşayırdı... (*Cibindən dəsmalı götürür*). Buy, bu nədir, olmuya o aktrisa qoyub gedib?

V a h i d. Həəə... bildim, Nərgizi deyirsən. Bayaq bura gəlmişdi. Şəkərlinskini axtarırdı. Deyir damımızın üstü damır, material lazımdır.

B ə n ə f ş ə. Mən o aktrisadan qorxuram, Vahid, səni yoldan çıxaracaq... Bu dəsmalı beca qoyub getməyib.

V a h i d. Bəri ver (*Dəsmalı dartıb alır*). Az danış ay qız, adam qara ürəkli olmaz. Onun oyunu xoşuma gəlib. O barədə söhbət edirdik!..

B ə n ə f ş ə. Axı qorxuram o, çox göyçəkdir.

V a h i d. Qorxma, nə qədər göyçək olsa sənə çatmaz...

B ə n ə f ş ə. Mənim nəyim göyçəkdir, qarayanığam.

V a h i d. Qarayanıq deyilsən, qarabuğdayısan, qara kişmişi cibə tökərlər.

B ə n ə f ş ə. Burnum yekədir.

V a h i d. Sənin üzünə çox yaraşır. Mən heykəltəraş olsaydım sənin burnuna baxıb yaradardım... Dur get, artistka-martistka fikrini başından çıxart. Mənim üçün varsan, yoxsan, sənsən...

B ə n ə f ş ə. Deynən dədəm canı...

V a h i d. Dədəm canı, dədəm canı...

B ə n ə f ş ə. Ürəyimi elə sakit elədin, Vahid, indi rahat gedə bilərəm (*Qapıya yollanır*).

Rəşidin, Alışovun və Sarvanın səsi eşidilir.

V a h i d. Burdan çıx, burdan (*Onu dal qapıdan yola salır*).

R ə ş i d, A l ı ş o v, S a r v a n daxil olur.

R ə ş i d. Sarvan əmi, mən sənədlərlə tanış olmuşam və sizin kolxoza şifer buraxmağı vacib bilirəm.

S a r v a n. Ay oğul, səni xoşxəbər olasan... Fermaya Latviyadan kəhrəba kimi sapsarı cins inəklər gətirmişik... Adam baxmaqdan doymur. İnsaf deyil ki, sabah qışda qoyaq qaranlıq, bekara damlarda əldən gedələr.

R ə ş i d (*stolun gözündən kağızları çıxarıb verir*). Bilirəm, Sarvan əmi, hamısından xəbərdaram. Al, get, şiferi apar...

A l ı ş o v. Bir az yavaş ha, yoldaş Rəşid. Mənim borcum deməkdir, Şəkərlinski yoldaş gələn şiferin hamısını bölüb.

S a r v a n. İşimizə pəl vurma, Alışov, qara pişikdən bəduğursan.

A l ı ş o v. Qoy desin, nə desə özündən çıxan deyiləm.

Sarvan qapıdan çıxanda Şəkərlinski ilə toqquşur.
Şəkərlinski çəp-çəp ona baxıb içəri girir.

Ş ə k ə r l i n s k i. Yaxşı ki, mənsiz yola salmısınız, bu kişinin üzünü görəndə elə bilirəm əzrayıl qabağıma çıxıb.

A l ı ş o v. Əzrayıldan da hər dəfə bu cür yaxa qurtarsaq, qorxuram yaşamaq bizə çox baha otura! Şiferi alıb getdi...

Ş ə k ə r l i n s k i. Necə?! Şiferi?! Mənsiz?! Aldı, getdi?! (*Oturur, üzünü Rəşidə tutur*). Ay yoldaş, ay qarabağlı gədəsi, nə istəyirsən məndən? Bizdən ey, bizdən! Gəl xoşluğunan razı ol, xahiş edim, başqa bir rayona səni irəli çəkdirim, ol müdir, otur stol dalında. Qardaş kimi qucaqlaşaq, öpüşək, ayrılaq.

R ə ş i d. Zəhmət çəkməyin, mənim yerim yaxşıdır. Müdir də olmaq fikrim yoxdur.

Ş ə k ə r l i n s k i. Əlbəttə, yerin yaxşı olar! Yığmısan dost-aşnanı başına, düzəltmisən burda ailəni. Hanı o avara, hanı professorun oğlu. Adı da yadımdan çıxdı...

A l ı ş o v. Vahid Səfayi... Bu saat çağırım (*Çıxıb çağırır. Vahid gəlir*).

Ş ə k ə r l i n s k i. Onu elə Vahid qalsın! Məni arxayın salır ki, camaatdan iyirmi min yumurta alınmışdır. Demə heç iyirmisi də alınmayıb. Çağırıblar, belimə bir töhmət! Şəkərlinski – töhmət! Yandım, cızdağım çıxdı (Vahidə) Sənin cızdağın çıxsın, hanı yumurtalar?!

V a h i d. Ay kişi, yumurta nədir ki, onun üçün qanını qaraldırsan. Bu boyda yumurtadan ötəri dağ boyda kişi gör nə hala düşür... Bu gün olmasın bir həftə sonra olsun, yumurtalar qaçmır ha...

Ş ə k ə r l i n s k i. Hə, bu da bunun cavabı! (*Rəşidə*) Sən xarab eləmisən, almısan qanadının altına dostunu... Dağıt yaltaqlarını bu idarədən, fitdərəm mənim yaltaqlarımı ha... Sənin də, sənin yaltaqlarının da külünü göyə sovurarlar ha!..

R ə ş i d. Mən nə yaltaq saxlayıram, nə də yaltaqlar müharibəsinə qoşuluram.

Ş ə k ə r l i n s k i. Bəs o Sarvan kişiyə niyə taxta buraxmısan. Çünki qızı rayonda ad çıxarıb (*qəzeti havada silkələyir*), adı dillərə düşüb.

R ə ş i d. Çox yaxşı eləyib, amma onların yaltaqlığa dəxli yoxdur.

Ş ə k ə r l i n s k i. Ağzımı açır ha! Ay balam, Sarvan kişi bunun (*Vahidi göstərir*) qayınatası olacaq, bu da sənin sağ əlindir. Mən də "Varlıq" kolxozunun sədriynən danışmışam ki, gəl şiferi apar, iyirmi min yumurta göndər, verim getsin, dolsun plan, canım qurtarsın. İndi neyləyim, axı? Sabah gərək raport verəm?!

V a h i d. Qoy mən sənə deyim neylə – raportu yaz getsin. Ta onlar tərpənincə, gəlib yoxlayınca azı on gün çəkər, on günə qədər də bir yerdən iyirmi min yumurta taparıq...

Ş ə k ə r l i n s k i. Görə nə rahat danışır?! Elə bil iyirmi min yumurtanı oturub özüm yumurtlayacağam... Alışov, yandım, sən də bir söz de, ay malbaş!

A l ı ş o v. Qoy desin, nə desə özündən çıxan deyiləm. Mən çoxdan yanıb qurtarmışam, yoldaş Şəkərlinski. İndi tüstüləyirəm...

Ş ə k ə r l i n s k i. Gedək, gedək alovumuzu söndürək, Alışov! Bunlara baxdıqca elə bil körüyümü basırlar, təpəmdən od çıxır (*Gedirlər*).

V a h i d. Əbləhin ağlına bax ki, mənə deyir get qapı-qapı gəz, ondan-bundan bir-bir yumurta yığ ki, nə var, nə var, plan dolduracağam... Gör kimə iş tapşırar!

R ə ş i d (*istehza ilə*). Düz deyirsən, işi işçiyə tapşırarlar...

Telefon zəng çalır. Vahid dəstəyi götürür.

V a h i d. Alloo... (*vəcdlə*). Can, can, Nərgizcan... Qulaq asıram... Dilimdə Nərgiz, qəlbimdə Nərgiz, telefon tellərində Nərgiz, efirdə Nərgiz, qulaq asıram. Bəli, bəli dəsmalınız burdadır. Ürəyimin başında saxlayıram. Sizdən mənə yadigar... Bənəfşə? Nə Bənəfşə canım,

artıq o mənim üçün yoxdur! Üzük? Barmağında üzük? Hə, hə, üzük! O üzük onun barmağından çıxmasa, mənə yaxın duran deyilsən? Mənim gözlərim üstə. Günü sabah o üzük sizin barmağınızda olacaq... (*Dəstəyi asıb getmək istəyir, Rəşidi qabağını kəsir*).

R ə ş i d. Otur, heç yerə getməyəcəksən! Üzüyü də Bənəfşənin barmağından çıxarmayacaqsan!

V a h i d (*heyrət, çaşqınlıq və istehza ilə*). Yox, canım?! Çəkil kənara, üzük mənimdir, özüm bilərəm.

R ə ş i d. Deyirəm otur, işinlə məşğul ol, gör yumurtaları necə yığacaqsan.

V a h i d. Əə, insafın olsun, məgər mən o haldayam ki, yumurta yadıma düşsün?!

R ə ş i d. Onda əvvəldən boyun verməyəydin. İndi ki, razı olmusan, gərək yerinə yetirəsən...

V a h i d. Mən sənin kimi səliqəli-nizamlı ola bilmərəm, əl çək!..

R ə ş i d. Yox, əl çəkən deyiləm, köhnə dostluğumuz xatirinə sənə məsləhət görürəm – qayıt öz sənətinə, get ya dərs de, ya da kolxoz mədəniyyət evlərindən birində işlə...

V a h i d. Kim, mən gedim kolxoza?!

R ə ş i d. Niyə getməyəsən, camaata da xeyrin dəyər, özün də bir şey öyrənərsən.

V a h i d. Şəhəri buraxdım gəldim bura, indi də gedim kəndə?! Hə?! (*Gülür*). Bir məsəl var deyir ki, adamın başı kəndə tərəf, ayağı şəhərə tərəf olsa, ayağı başından qiymətlidir.

R ə ş i d. Mən isə sənə deyirəm, başın işini ayağa tapşırmaq olmaz. Gələcəyini düşünsən yaxşıdır.

V a h i d. Sənə baxıram, ay Rəşid, ürəyim yanır, ölən günə kimi dünyanın ləzzətini bilməyəcəksən. Çünki quru adamsan, həyatın işdən, qayda-qanundan, səliqədən başqa min cür ləzzətləri var ki, sən onların hamısından bixəbərsən.

R ə ş i d. Sənin bu sözlərin qarğa ilə qartalın danışığını mənim yadıma salır. Qarğa çox yaşadığı ilə öyünəndə qartal ona deyib yüz il peyinlikdə eşələnməkdənsə bircə gün uca dağların başında, mavi göylərin qucağında yaşamaq yaxşıdır!

P ə r d ə

## DOQQUZUNCU ŞƏKİL

Mədəniyyət evinin bağçası.
Vahid əllərini öpə-öpə irəlilədiyi yerdə Göyərçinlə qarşılaşır.

G ö y ə r ç i n. Sənə nə olub Vahid, yenə gözün ayağının altını görmür?

V a h i d. Huşum başımdan çıxıb, Göyərçin.

G ö y ə r ç i n. Görürəm, sevincin qanadlarında uçursan... Başqasını xoşbəxt görəndə adam özü də sevinir. Axıracan olsun!

V a h i d. Axır sözünü dilinə gətirmə, çünki mən çox da əbədiyyətə inanan deyiləm.

G ö y ə r ç i n. Bəs sən nəyə inanırsan?

V a h i d. Mən inanıram ki, insan ləzzət çəkməyə doğulub. Ləzzət isə sabahda yox, bu gündədir.

G ö y ə r ç i n. Mən başqa bir oğlan tanıyıram. O həyatın bütün ləzzətini sabah üçün mübarizədə görür. Sabah yaxşı olsun deyə çalışır, vuruşur, arı kimi əlləşir.

V a h i d. Bilirəm kimdir. İstəyirsən adını da deyim – Rəşid! Özünün də qabağında Göyərçin kimi bir afət durub!

G ö y ə r ç i n (*süni naz ilə*). Sənin mənə afət deməyə haqqın yoxdur...

V a h i d (*şirnikmiş*). Niyə ki! Afətə afət deməyə hamının haqqı var.

G ö y ə r ç i n. Bəs qorxmursan?

V a h i d. Kimdən?

G ö y ə r ç i n. Adaxlın Bənəfşədən!

V a h i d. O heç, onu dəftərdən sil.

G ö y ə r ç i n. Artistka Nərgizdən.

V a h i d. Sənin yanında Bənəfşə də, Nərgiz də ətrini itirir.

G ö y ə r ç i n. Mənim ərim var, özü də çox qısqancdır.

V a h i d. Aristotel deyib ki, qısqanc adamların evi məhəbbətə zindan olur.

G ö y ə r ç i n. Aristotel yaxşı söz deyib, amma yadından çıxarıb ki, zindanın keşikçisi var.

V a h i d. Keşikçi barədə də Əflatun deyib. O deyib ki, atom bombası da dağıda bilməyən zindanı məhəbbət dağıdar. Keşikçini yuxuya verib qaçar, sevgilisinin yanına.

G ö y ə r ç i n. Bəs yolda keşikçinin qohumları qabağını kəssə neyləsin?

V a h i d. Hegel deyib ki, məhəbbət qəhrəmanlıqdır, qorxu bilməz, ya ölər, ya da vüsala çatar...

G ö y ə r ç i n. Vüsal badəsi zəhərlə dolu olsa necə?

V a h i d. Füzuli deyib ki, cananın əlindən zəhər də içsən şərbətdir.

G ö y ə r ç i n. Bu yazıçıların hamısını oxumusan, hə?

V a h i d. Özün bilirsən ki, kitab mənim qabağımda bir içim su...

G ö y ə r ç i n. Bəs o Aristotel, Platon, Hegel, Füzuli vicdan barədə bir söz deməyiblər?! Adam vicdanının səsini necə boğsun?!

V a h i d. Vicdan hayalı, üzüyola bir qızdır – bizim Bənəfşə kimi, qapazı vur başına, otursun yerində...

G ö y ə r ç i n. Hegel elə deyib, ya Aristotel?

V a h i d. Yox, bunu mən deyirəm, öz fikrimdir. Bir sözlə, bizim vicdanımız rahat yata bilər.

G ö y ə r ç i n. Niyə?!

V a h i d. Ona görə ki, bir zaman əbədi məhəbbətə and içmişdik.

G ö y ə r ç i n. O zaman nə Bənəfşə var idi, nə Nərgiz...

V a h i d. Dedim ki, Bənəfşəni sil dəftərdən, qoyun kimi bir şeydir.

G ö y ə r ç i n. Kim, Bənəfşə? Biz onunla fəxr edirik, sənin dilin necə də dönür?! (*Üzünə bir şapalaq vurur*).

V a h i d. Nə edirsən, yırtıcı quş!

G ö y ə r ç i n. Utanmaz, həyasız! Gör Bənəfşə kimi qız barədə nə danışırsan!

V a h i d. Sən dəli olmusan!

G ö y ə r ç i n. Yox, dəli olmamışam. Sənin vicdanını oyatmaq istəyirəm. Bərk yatıb. Aristotel deyib ki, vicdanı yuxuya gedənlər üçün ən yaxşı dərman şapalaqdır. Hələ bir utanmayıb mənə təzədən eşqnamə də oxuyursan?! (*Üstünə yeriyir, Vahid dalı-dalı geri çəkilir*).

V a h i d. Nə olub, ay qız, kim öyrədib səni göndərib üstümə?!

G ö y ə r ç i n. Özüm gəlmişəm və sənə deyirəm: ya Nərgiz, ya Bənəfşə, seç, qurtar! Hansını seçsən, ölən günə qədər ondan başqa qız görməyəcəksən, onları da aldatmaq fikrində olsan, nə yerdə, nə suda, nə də havada sənə nicat yoxdur! (*Gedir*).

V a h i d (*təlaş içində*). Deyəsən işləri yaman dolaşdırdım. Ancaq bircə yol qalıb – Nərgizdən bərk yapışmaq! (*Gedir*).

P ə r d ə

## ONUNCU ŞƏKİL

Hadisə idarənin həyət bağçasında vaqe olur. 6-cı şəkildəki otaqlar və pərdəli qapı çöl tərəfdən görünür. Bağçada hovuz və kölgəlik var. Vahid saçları dağınıq halda hovuzun ətrafında gəzinir və nə isə əzbərləyir.

V a h i d. Kuzəmiz su ilə... kabab yanmışam... yox, yox, düz demirəm (*Kağıza baxır*).

Kuzəmiz su ilə doludur, fəqət
Köz üstə kabab tək susuz yanırıq.
(*Kağızı bükür, əzbərdən deyir*).
Kuzəmiz köz üstə su ilə dolu...

Dəli şeytan deyir bu zəhrimar kuzəni çırp daşa sındır, canın qurtarsın. Nahaq özümü incidirəm. İndi kağızdan oxumaq moddur, oxuyaram gedər (*Oxuyur*).

Kuzəmiz su ilə doludur, fəqət,
Köz üstə kabab tək susuz yanırıq.
Yar öz evimizdə oturub amma
Yar deyib dünyanı dörd dolanırıq...

Alışov əlində açıq qəzet danışa-danışa gəlir.

A l ı ş o v. Yıxıldı, canına qurban olduğum Şəkərlinskinin evi yıxıldı.

V a h i d. Alışov, sən də sarsaq xoruzlar kimi vaxtsız banlamağa adət etmisən. Şəkərlinski cəhənnəmə yıxıldı, qara gora. Gör mən harda at çapıram, sən harda sürünürsən... Mən eşq səmalarında, sən də başlamısan Şəkərlinski. Kuzəmiz su ilə...

A l ı ş o v. Necə yəni cəhənnəmə ki? O Rəşid nə səni, nə məni bir gün bu idarədə saxlamaz. Şəkərlinski böyüyümüzdür, başımızdır.

V a h i d. İstəmirəm mən, elə başdansa başsız yaşamaq yaxşıdır. Mane olma! Çünki zirəksən, həssassan...

A l ı ş o v. Təriflə məni, qadan alım...

V a h i d. Tükü tükdən seçənsən.

A l ı ş o v. De, dilini yeyim.

V a h i d. Böyüyün üzünə baxan kimi ürəyindən keçəni bilənsən...

A l ı ş o v. Ay sağ ol, başına dönüm.

V a h i d. Əqidəsizsən...

A l ı ş o v. Ay sağ ol... necə, necə?!

V a h i d. Simasızsan, yaltaqsan.

A l ı ş o v. Qoy desin, nə desə özündən çıxan deyiləm.

V a h i d. Sənin kimisinə həmişə başçı tapılar, heç ürəyini sıxma, nə qədər sən varsan, Şəkərlinskilər də olacaq...

A l ı ş o v. Buna bax ey!... Şəkərlinski bəyəm çox böyük balqabaqdır?! Bacarığı yox, qabiliyyəti yox... Mən olmasam iki eşşəyin arpasını bölə bilməz.

V a h i d. Yıxılana gülməzlər. Alışov, yaman namərdsən...

A l ı ş o v. Düzünü deyirəm, Allah bilir hansı yel qaldırıb gətirib bu stolun dalına... Yel gətirəni, sel aparar... Yıxılır, qoy yıxılsın, cəhənnəmə ki...

V a h i d. Kuzəmiz köz üstə...

Kuzəmiz su üstə... canan evdədir.

A l ı ş o v. Sən də hansı canandan danışırsan? Budur, biri gəlir, təhvil al (*Alışıov gedir, Bənəfşə içəri girir*).

V a h i d. Kuzəmiz su ilə doludur, fəqət...

B ə n ə f ş ə. O nədir oxuyursan, Vahid?

V a h i d. Canan evimizdə oturub... amma...

B ə n ə f ş ə. Şeir əzbərləyirsən, hə? Olmuya, o artistka üçündür, bəri ver... (*Dartıb alır*).

V a h i d. Ay qız ey, əl-ayağını yığışdır! (*Dartıb alır*). Burada deyiblər ha, suyun yavaş axanından qorx, adamın yerə baxanından, yeri get evə...

B ə n ə f ş ə (*qorxaq*). Niyə acığın tutur, Vahid! Gedərəm (*Yaylığı düşür yerə, gözləyir ki, Vahid qaldırıb verəcək*).

V a h i d (*ayağı ilə yaylığı itələyir*). Götür yaylığını.

B ə n ə f ş ə. Bəs deyirlər ki, şəhərin oxumuşları qızlara hörmət edir, paltosunu tutur. Yaylığı yerə düşəndə qaldırıb verir?!

V a h i d. Mən ölüm, bir buna bax ey? Bu da kəndçi qızı! Yox, bir elə o qalmışdı ki, qızın ayaqlarını da yuyaq, tuflisini də geydirək!.. Dur, get xarabana. Türmə çırağı kimi nə asılıb durmusan başımın üstündə, getsənə!..

B ə n ə f ş ə. Hirsin tutmasın, gedərəm, atan-anan havaxt gəlir?

V a h i d (*nə isə xatırlayır*). Bura bax, Bənəfşə, bir əlini mənə ver (*Bənəfşə yaxınlaşır, əlini ona verir*). Bəh, bəh, o qədər mal qaşovlamısan, pambıq yığmısan, traktor sürmüsən, əlin taxtaya dönüb, barmağın da keçi buynuzuna oxşayır (Barmağından üzüyü çıxarır). Bilirsən Bənəfşə, bu əsil brilyant deyil, əldəqayırmadır, sənə əslini alacağam.

B ə n ə f ş ə. Bəri ver, hər nədir xoşdur... Barmaqdan üzük çıxarmazlar. Axırı pis olar... İş pozular.

V a h i d (*qeyri-ixtiyari*). Pozular, pozulsun, daha yaxşı!

B ə n ə f ş ə. Necə yəni pozular, pozulsun, daha yaxşı! Bu saat gedəcəyəm, atana-anana zəng eləyəcəyəm, tel vuracağam. Qoy gəlsinlər görüm bu nə oyundur mənim başıma açırsan! (*Gedir*).

V a h i d. İt əl çəkdi, motal əl çəkmədi burda deyiblər ha! Kuzəmiz su ilə doludur...

A s l a n və R ə ş i d gəlir.

A s l a n . Vahid, boşalt kuzənin suyunu, qabağı qışa gedir.

V a h i d. Bəh-bəh, nə yaxşı gəlmisiniz. Elə sizi axtarırdım, oturaq bir ürəkdən söhbət edək. Axı məsəl var, hər şeyin təzəsi, dostun köhnəsi!

A s l a n. Yenə havanı dəyişmisən, xeyir ola?

R ə ş i d. Deyəcək gəl sahib dur kəndçi qızına....

V a h i d. Vallah peyğəmbərsən, Rəşid! Bir də bilirsən, o gündən ki, bilmişəm Aslanın onda gözü var.

A s l a n. Sağ ol Vahid. Ancaq indi mən də Bənəfşədən dönmüşəm... Teatrımızda biri var, deyəsən ona vurulmuşam. Adı da Nərgizdir.

V a h i d. Necə, necə? Nərgiz?! Göz çək, göz çək ondan!

A s l a n. Üz vurma, göz çəkən deyiləm.

V a h i d. Sən öləsən, dostluq pozular, araya ədavət düşər, gözünü çək!

A s l a n. Ədavət düşər düşsün. Dostların bir-birinə düşmən olması birinci dəfə deyil ha.

V a h i d. Elə edərəm ki, adın yadından çıxar!

N ə r g i z gəlir.

A s l a n. Yadında saxla, Vahid, kəndçi qızını atasının gücünə sevgilisindən ayırıb buxovlaya bildin, Nərgizi bacarmayacaqsan. Çünki o bilir həqiqi məhəbbət nədir, saxta hərəkətlər nə.

V a h i d (*Nərgizə*). Gəl əzizim, sən bunu başa sal ki, mənim sevgidən başqa heç bir buxovum yoxdur.

N ə r g i z (*Aslana*). Mübahisənizi eşitdim. Mən sizi anlamıram, kəndçi qızını necə buxovlamaq olar? Məgər onun ürəyi yoxdur?

A s l a n. Mən tanıdığım kəndçi qızının çox gözəl ürəyi var. Kaş işıq saçan neylon parçalara bürünmüşlərin çoxunda o cür təmiz və həssas ürək ola idi... Lakin bəzi vicdansızlar...

N ə r g i z. İndi ki, o qız bu cür təriflərə layiqdir, demək ağlı yerində olan qızdır və sevgilisindən uzaqlaşıbsa, deməli ona inanmırmış...

V a h i d. Sağ ol Nərgiz! Bunun məntiqsiz sözlərini yaxşı puça çıxarırsan.

A s l a n. Bəli, onlar ikisi də səhv etmişlər. Oğlan özünə çox inanıb, deyilməli sözləri də deməyib, qız isə həddindən artıq şübhələrə yol verib. Kəndçi qızı unudub ki, saf ürəklə sevən adamlar çox zaman sözdə kasıb olur, əlvan boyalı hərəkətləri bacarmırlar.

N ə r g i z. Mən görürəm ki, siz o kəndçi qızını doğrudan da sevirsiniz. Gedin, mən onunla sizin aranızda könüllü qasid olacağam. Sizin məhəbbətinizi bakir halda ona çatdıracağam, onu yanlış fikirdən döndərməyə çalışacağam.

A s l a n. Qasidi siz olan bir adam xoşbəxtdir. Elə buna görə də mən buradan rahat gedirəm. Səbirsizliklə sizin "hə" cavabı gətirəcəyiniz dəqiqəni gözləyirəm. Gedək Rəşid (*Gedirlər*).

N ə r g i z. Dünya belədir, Vahid! Birinin bəyənmədiyini başqası ilahi bir məhəbbətlə sevir.

V a h i d. Bəli, döv qurbağaya aşiq olub.

N ə r g i z. Bənəfşə barədə bir də belə desəniz sizdən inciyərəm. Bir zaman sevdiyi adamı qəzəblə yad edənlərin sədaqətinə mən inanmıram. Bir gün mənim barəmdə də belə danışa bilərsiniz.

V a h i d. Yer kürəsi gedib ayə dəyə bilər. Xəzər dəryası quruyar, Kür səmtini dəyişər, amma mən heç vaxt sizin haqqınızda pis söz demərəm.

N ə r g i z. Onda Bənəfşəni qurbağaya oxşatmayın.

V a h i d. İnsafa qalanda pis qız deyil, moda ilə geyindirəsən davranış qaydalarını öyrədəsən, cazibədar olar... Bir suyu da sizə oxşayır, xoş təbəssüm, sadə ürək...

N ə r g i z. İndi də çox tərifləndiniz, – qısqanıram, bəlkə ürəyinizdən tamamilə çıxmayıb?

V a h i d. Ürəyimə heç girmişdi ki, çıxmasın da. Gəl onun sözünü qurtaraq. Nərgiz, əzizim, əlini mən ver.

N ə r g i z. Bu mənim əlim, nədir ki?

V a h i d. Aman Allah, nə yumşaq, nə isti, nə gözəl əldir! (*Üzüyü barmağına taxır*). Xoşunuza gəlirmi?

N ə r g i z. Bu nədir? Aha, Bənəfşəyə bağışladığınız üzükdür?! Çıxartdınız barmağından, hə?! Necə də ürəyiniz gəldi?!

V a h i d. Getdikcə mən sizi daha şiddətlə sevirəm, Nərgiz!.. Necə elektrik artdıqca lampa işıqlanar, sizi görəndə ürəyim eləcə işıqlanır və qızır. Siz çox rəhmdilsiniz... Elə qızlar var ki, uf da demədən uşaqlı arvadların ərini əlindən alır. Siz isə əlinə də toxunmadığım bir kəndçi qızına yanırsınız.

N ə r g i z. Hər halda məncə, çıxarmağa haqqınız yoxdur.

V a h i d. Mən sizin arzunuzu yerinə yetirdim.

N ə r g i z. Çox da mən arzu etmişdim. Heç kəsin iradəsi haqsız işə bəraət qazandıra bilməz.

V a h i d. Haqsız niyə olur? Özümündür, özüm taxmışdım, özüm də çıxarmışam.

N ə r g i z. Çox zaman taleyin ağır faciələri elə bu meydanda oynanır – mənimdir, özümündür, taxa da bilərəm, çıxara da bilərəm. Bəs vəfa, bəs etibar, bəs sədaqət?! Bəs onun ürəyi, o ki sənin malın deyildir?!

V a h i d. Bunların hamısına bais sizə olan məhəbbətimdir. Görürsünüz, mən də vəfa, sədaqət, etibar naminə belə etmişəm...

N ə r g i z. Deməli, mənə olan məhəbbət, sədaqət, etibar naminə. Onda keçirəm günahından! Elə şitdiyim tutub ki, istəyirəm səninlə gizlənqaç oynayam.

V a h i d. Gəl oynayaq.

N ə r g i z. Gözünü yum.

V a h i d (*gözünü yumur*). Yumdum.

N ə r g i z. Yox... Gözünün ucu ilə baxırsan, dayan bağlayacağam (*Dəsmalını çıxarır, gözünü bağlayanda, əlindən yerə salır, əyilib götürmək istəyəndə Vahid tez onu qabaqlayır*).

V a h i d. Buyurun.

N ə r g i z. Yox, atın yerə, atın yerə. Bu nəzakət, elə bil ki, məni təhqir edir, məni alçaldır: yəni mən o qədər zəifəm ki, dəsmalımı da qaldıra bilmirəm? Atın yerə!..

V a h i d. Baş üstə, baş üstə (*Yavaşca əyilib dəsmalı yerə qoyur*).

N ə r g i z. İndi götürün verin mənə... Lakin unutmayın ki, özüm də qaldıra bilərəm (*Onun gözünü bağlayır, "Haray, haray" deyərək gizlənqaç oynayırlar. Nərgiz qaçanda qəsdən elə edir ki, tufli ayağından çıxır. Vahid tez götürür, gətirib ayağının yanına qoyur*).

V a h i d. Buyurun, geyin.

N ə r g i z. Hələ mədəniyyətdən də danışırsınız... Əyilə bilmirəm. Geydirin tuflini ayağıma.

V a h i d. Baş üstə, baş üstə (*Əyilir geydirsin*).

N ə r g i z. Yox, lazım deyil, qalxın ayağa, özüm geyərəm (*Tuflisini geyəndə yerdən yumru bir çay daşı götürüb baxır*) Görürsünüzmü suların axını bu qaya parçasını burdan ora çırparaq necə də hamarlayıb. Behbud müəllim deyir ki, həyat da belədir – xalqından ayrılanları beləcə çalxalayır, əzir, simasızlaşdırır...

V a h i d. Nə şirin danışırsınız, Nərgiz!

N ə r g i z. Atıram, havada tutun!

Daşı hovuza tərəf atır. Vahid qaçır.
Tuta bilməyib hovuzun kənarında dayanır, daş hovuza düşür.

V a h i d. Çatdıra bilmədim.

N ə r g i z. Yox, düşün hovuzdan çıxarın!

V a h i d. Baş üstə, bu saat! (*Ayaqqabılarını çıxarmaq istəyəir*).

N ə r g i z. Yox, ayaqqabılı-paltarlı düşün çıxarın.

V a h i d. Baş üstə, mənim əzizim! (*Hovuza düşmək istəyir*).

N ə r g i z. Yaxşı, dayanın imtahandan yaxşı çıxdınız. İndi görürəm ki, həqiqətən məni sevirsiniz və heç vaxt sözümü yerə salmayacaqsınız...

V a h i d. Heç vaxt, heç bir sözünüzü!..

N ə r g i z. İndi bu üzüyü alın, mən belə oğurluqla qoymaram barmağıma üzük taxsınlar. Vaxtı gələndə hamının gözü qabağında onun barmağından çıxarıb taxarsınız mənim barmağıma. Bu mənim axırıncı şərtimdir. Sağ olun! (*Gedir*).

V a h i d. Bu şərti yerinə yetirməyə nə var, mənim ceyranım... Ha bir, ha iki...

Şəkərlinski gəlir.

Ş ə k ə r l i n s k i. İşin qurtarıb, özünü günə verirsən? Bu nədir, yoxsa soyunub çimmək istəyirsən? Çim, çim, tezliklə səni də, lap o Alışovu da hovuzda yox, qır tiyanında çimdirəcəyəm, buğun-buxarın içində, dayan bir! Alışov hanı? (*Otağa keçir*).

A l ı ş o v, əlində qəzet gəlir.

V a h i d. Şəkərlinski səni soruşurdu.

A l ı ş o v. Hökmlü soruşdu, ya yumşaq?

V a h i d. Hələ bu cür hökmlü olduğunu görməmişəm.

A l ı ş o v. Yəqin qəzeti oxumayıb, bilmir ki, dayısı yıxılıb, özü də bu gün-sabahdadır.

Ş ə k ə r l i n s k i (*içəridən çağırır*). Alışov, Alışov!..

V a h i d. Yeri də, səni çağırır. Heç olmasa bazar iti qədər sədaqətin olsun...

A l ı ş o v. Qoy desin, nə desə özündən çıxan deyiləm... (*Şəkərlinski çağırır*). Zəhrimar! (*Yamsılayır*). Alışov... Səsi elə bil qəbirdən gəlir. Bundan sonra kim sənin sözünə baxacaq, ay bədbəxt (*Əks tərəfə çıxıb gedir*).

V a h i d (*Alışovun dalınca*). Buna baxanda vallah mən adamam. Zalım oğlunun çörəyi dizinin üstündədir.

Dönüb çıxmaq istərkən yoldan keçən Ayxanımla rastlaşır. Hər ikisi duruxur.

A y x a n ı m. Salam, Vahid.

V a h i d. Salam, Ayxanım. Doğrusu, sizi görəndə əzab çəkirəm, salam da verməyə cəsarətim çatmır. Yəqin siz mənə nifrət edirsiniz.

A y x a n ı m. Sən yenə də məni tanımamısan, Vahid. Axı, mənim nifrətim də məhəbbətim kimi güclü olar. Ürəyimdə sənə nifrət bəsləsəydim, uzaqdan yaxıb yandırardı. Halbuki indi də sənin səadətin mənim ən şirin arzumdur.

V a h i d. Bu vaxta qədər mən elə bilərdim ki, Leyli-Məcnun məhəbbəti bir uydurmadır, mümkün olmayan bir xəyaldır.

A y x a n ı m. Yüksək, ilahi məhəbbətin susduğu bir zəmanə olmamış və olmayacaq, Vahid.

V a h i d. Zəmanə qızına oxşamırsınız. Nə qədər ümidlə yaşamaq olar?!

A y x a n ı m. Bu insanın xasiyyətindən, tərbiyəsindən, iradəsindən asılıdır.

V a h i d. İnanın ki, mən sizə layiq deyiləm. Siz məndən çox-çox ucasınız. Mən heç vaxt o ucalığa qalxa bilməyəcəyəm. Buna görə də sizi görəndə qaçmaq istəyirəm. Çünki siz bir ayna olub mənə vicdanımı göstərirsiniz. Çoxlarının yanında mən özümü adam bilib öyündüyüm halda, sizin yanınızda kiçilirəm, öz gözümdən düşürəm. Uzaq olun məndən, yoxsa sizə nifrət edərəm (*Gedir*).

A y x a n ı m. Sənin nifrətin mənim ümidimi artırır, Vahid. Çünki yazın əvvəlində axar sular bulanar... Dalınca güllər, çiçəklər açar (*Gedir*).

Ş ə k ə r l i n s k i çağıra-çağıra gəlir.

Ş ə k ə r l i n s k i. Alışov. Ay atası gorbagor olmuş, harda ölmüsən? Alışov, ay Alışov...

A s l a n, L e y l a, G ö y ə r ç i n, R ə ş i d, B ə n ə f ş ə gəlir.

A s l a n. Qışqırma, yoldaş Şəkərlinski. İndi daha Alışov sənin səsini eşitməz, bu tərəfə gəl.

G ö y ə r ç i n (*bir dəstə qızılgülü Bənəfşəyə təqdim edir*). Bənəfşə, icazə ver səni ürəkdən təbrik edək!

R ə ş i d. Bütün rayonumuz sevinir, Bənəfşə, üzümüzü ağ elədin!

L e y l a (*əlini sıxır*). Sağ ol, xalaqızı, anam şadlığından yerə-göyə sığmır...

Ş ə k ə r l i n s k i. Nə olub, balam, bayram-zaddır?

A s l a n. Bəs nədir, ay yoldaş Şəkərlinski. Başın Alışova o qədər qarışıb ki, qəzetləri də oxumağa macalın olmur. Budur, bax, Bənəfşənin şəklini vurublar, briqadasına fəxri fərman veriblər...

Ş ə k ə r l i n s k i. Təbrik edirəm, ay qız. Atanla aram yoxdur, amma özün yaxşı qızsan. Gedim Alışovu tapım... (*Gedir*).

A s l a n. Biz də gedək, Sarvan əmini təbrik edək.

G ö y ə r ç i n. Siz gedin, mən də gəlirəm (*Aslangil gedir*). Kişiyə deyiləsi sözüm var (*Şəkərlinskini çağırır*). Ay kişi, ay kişi!

Alışov ağacın dalından çıxır.

A l ı ş o v. Mən kişi! Buyur Göyərçin xanım, qulluğunda olaq. Aman ay, yenə ətir iyi huşumu başımdan çıxardı...

G ö y ə r ç i n. Nə var, Alışov, niyə gözünü zilləmisən üzümə? Özün də özünə oxşamırsan. Məğrurlaşmısan...

A l ı ş o v. Səni görəndə nərə dönürəm Göyərçin, deyirəm ay Allah, bu nə ədalətsiz işlərdir düzəltmisən – Göyərçin kimi xanım gedib qismət olub kimə – meşənin ayısı Şəkərlinskiyə...

Şəkərlinski görünür və tez ağacın dalında gizlənir.

G ö y ə r ç i n. Ürəkdən deyirsən?

A l ı ş o v. And olsun Allaha, başımı yolunda sadağa verərəm.

G ö y ə r ç i n. Yəqin ona görə ki, ərim sənə çox yaxşılıq eləyib, öz yerlisi, öz adamı bilib, hə?

A l ı ş o v. Nə eləyib öz xeyri üçün eləyib. O elə köpəkdir ki, iy duymadığı yerə hürməz.

Ş ə k ə r l i n s k i (*qalxır-yatır*). Ay atası itnən yatmış, bir dayan!

G ö y ə r ç i n. Bəs niyə mənim yolumda başını sadağa verirsən?

A l ı ş o v. Özün bilirsən niyə. Bir dəfə demişəm, bir də deyirəm, dünya bir yana, sən bir yana, Göyərçin bacı. Hara desən, hansı kurorta, hansı yaylağa desən apararam səni... Lap Avropaya...

G ö y ə r ç i n. Başa düşmürəm. Deməli ərim qalsın burda, sənnən düşüm dünyanı gəzməyə, xalq mənə nə deyər?!

A l ı ş o v. Nə tapmısan ey o çaxır tuluğunda – ərim, ərim! Sənin kimi arvada inanmır, mənə tapşırmışdı güdüm səni, gəl onnan boşan, qaydasınca alım, ol mənim xanımım, halalca arvadım. Razısan?

G ö y ə r ç i n. Razıyam, bəri gəl! (*Üstünə gələndə yaylığı boğazına salıb boğur*). İtə bax, qaysavadan pay umur!

Şəkərlinski ağacın dalından çıxır.

A l ı ş o v. Qoy desin, nə desə özündən çıxan deyiləm.

Ş ə k ə r l i n s k i. Ay binamus, ay şərəfsiz! Mənim arvadımı alırsan?!

Üstünə cumur. V a h i d, R ə ş i d, A s l a n və başqaları gəlir.
Aslanın əlində zərf var.

R ə ş i d. Nə olub ay yoldaş Şəkərlinski, deyəsən yaltaqların üzünə durub?

Ş ə k ə r l i n s k i. Bu yer eşən mənim arvadımı alır (*Göyərçinə*) Gəl, mənim arvadım!

G ö y ə r ç i n (*kinayə ilə*). Arvadım, arvadım!!! Mənə yaxın durma! Bir buna baxın, mənim dalımca adam saldırır. Yaxşı deyiblər: xain xoflu olar.

R ə ş i d. Oğru elə bilər hamı oğrudur.

Ş ə k ə r l i n s k i. Arvad, bunlara qulaq asma.

G ö y ə r ç i n. Mən indiyə qədər hayama-abrıma qısılıb səninlə yaşamışam. Lakin artıq dözə bilmirəm. Sənin kimi ərdənsə gor yaxşıdır! (*Gedir*).

Ş ə k ə r l i n s k i (*Rəşidə*). Yaxşı, qarabağlı gədəsi! Arvadı sən yoldan eləmisən. Mən bu dağı yerdə qoymaram!

A l ı ş o v. Sən buna nə eləyəcəksən, gül kimi adamdır (*Rəşidin yaxasını təmizləyir*).

Ş ə k ə r l i n s k i. Yaltaqlanma ona Alışov, peşman olarsan (*Vahidə*) Ey, balaca avara, kağız-qələm götür!

V a h i d. Buyurun, mən hazır...

Ş ə k ə r l i n s k i. Əmr nömrə bir. Alışov Alış hansı ki, vəzifəsinə xəyanət edib, ət planını doldurmayıb, yalandan məlumat verib, tərbiyəsizlik göstərib qovulur işdən.

A l ı ş o v. Qoy nə yazır yazsın, özündən çıxan deyiləm.

V a h i d. Belə olmaz, əmrin dili pisdir.

Ş ə k ə r l i n s k i. Mən hələ bundan yaxşı dildə əmr görməmişəm; yaz: əmr nömrə iki, Vahid Səfayi işdən götürülür, o səbəbə ki, yumurta hazırlığını pozub, daha doğrusu bu vaxtacan bilmir iş nə olan şeydir.

V a h i d. Yazdım, dalını deyin.

Ş ə k ə r l i n s k i. Rəşid Məmmədli, bəh, bəh... Götürülür işdən! O səbəbə ki, mənim sözümə baxmır, özbaşınalıq eləyir...

İmza: mən, müdir Şəkərlinski!

A s l a n (*cibindəki zərfi çıxarır*). Al, poçtun yanından keçirdim, bu kağızı verdilər, sənə çatdırım (*Şəkərlinskiyə verir*).

Ş ə k ə r l i n s k i (*açıb baxır*). Eynəyim yanımda deyil. Ay artist, sən oxu, görüm nə yazılıb...

A s l a n (*oxuyur*). "Şəkərlinski yoldaşa, sistemi natəmiz və avara adamlardan təmizləmək məqsədi ilə nazirlik sizə təklif edir. Bu kağızı alan kimi Alışov Alışı və Vahid Səfayini işdən azad edəsiniz. Alışov haqqında olan materiallar məhkəməyə göndərilir. Vahid Səfayi isə Maarif Nazirliyinin sərəncamına verilir".

A l ı ş o v. Deyəsən özümdən çıxıram axı.

Ş ə k ə r l i n s k i. Hə, indi tanıyın məni. Mən nə fikirdəyəm, mərkəz də o fikirdədir...

A s l a n. Hələ qurtarmayıb, dalını oxuyuram: "Özünüz də beş günün ərzində yerinizi Rəşid Məmmədliyə təhvil verib idarənin sərəncamına gəlin".

R ə ş i d. Burda deyiblər ki, sən saydığını say, gör fələk nə sayır...

Ş ə k ə r l i n s k i (*dizləri əsə-əsə yerə oturur*). Evim yıxıldı!

A l ı ş o v. Bəli, stol da getdi, üstəlik arvad da.

Ş ə k ə r l i n s k i. Bu toxmağı qarabağlılar vurdu mənim başıma. Allah evlərini yıxsın. Alışov, bir stəkan su gətir, boğazım qurudu. Su gətir, ay avara oğlu avara!..

A l ı ş o v. Avara sənsən ki, bizi bu günə qoydun.

Ş ə k ə r l i n s k i (*Vahidə*). Qardaş oğlu, indi bizi qurtarsa, sənin atan qurtaracaq. Sən kişini çək bu işə, mən də səni qaytararam yerinə.

V a h i d. Ona belə söz desəm, məni evdən qovar.

Ş ə k ə r l i n s k i. Qorxma, qovmaz. Ahaaa, deyəsən özü də gəlir. Yeri qabağa.

M a h m u d S ə f a y i, R e y h a n x a n ı m və S a r v a n gəlir.

M a h m u d. Salam, hamını xoş görmüşük.

R e y h a n (*Vahidi qucaqlayıb öpür*). Necəsən bala. Qabağa niyə çıxmamışdın?

R ə ş i d. Qabağa çıxmağa üz var ki, çıxsın...

M a h m u d S ə f a y i. Niyə dinmirsən, oğul, bəs mənim gəlinim hanı?

B ə n ə f ş ə (*gəlir*). Burdayam, Mahmud əmi...

M a h m u d (*onun başından öpür*). Bəh, bəh, belə də qız olar, gül dəstəsidir. Al, farslar yaxşı deyib: gül bə dəsti gül başəd... (*Gül dəstəsini ona verir*).

B ə n ə f ş ə. Əziz müəllim, icazə verin bu gül dəstəsini sizin əlinizdən bir müəllim və ata hədiyyəsi kimi qəbul edim, qaynata hədiyyəsi kimi yox!

M a h m u d (*heyrətlə*). Bu nə deməkdir, qızım?!

B ə n ə f ş ə. Səbəbini ondan soruşun (*Vahidi göstərir. Köyrəlir kimi olur və dayana bilməyib çıxır*).

R e y h a n. Nə olub, ay oğul?

Şəkərlinski irəli gəlir.

Ş ə k ə r l i n s k i. Elə bir şey olmayıb, ay bacı, qızdı, oğlandı, bu gün dalaşar, sabah barışar. Dərd bizim dərddir (*Üzünü Mahmud Səfa-yiyə tutub Vahidi, özünü, Alışovu göstərir*). Əlac elə.

M a h m u d S ə f a y i. O nə dərddir elə, nə olub?

Ş ə k ə r l i n s k i. Nə olacaq, qarabağlı gədəsi yıxıb evimizi, Bakıdakı qarabağlılarla əlbir olub üçümüzü də qovdurub işdən.

M a h m u d S ə f a y i (*təngimiş halda*). Bəli, məlum oldu. İndi mənim vəzifəm nədir?!

Ş ə k ə r l i n s k i. Yuxarıda bir dil tərpət.

M a h m u d S ə f a y i. Bir dəfə sizə dedim ki, bu cür təmənnalarla mənə müraciət etməyin!

Ş ə k ə r l i n s k i. Bəs yerli yerliyə nə gündə lazım olar?!

M a h m u d. Ay kişi, nə yerli-yerli deyib durursan? Mən sənin üzünə vurmaq istəmirdim, amma məcbur edirsən. Otuz yeddinci ildə mənim evimi yıxan sən olmadın? (*Üzünü başqalarına tutur*). O zaman mənim bu yerlim üzümə də baxmadan gözünü kağıza dikib, on dəqiqədə mənə on beş il iş verdi.

A l ı ş o v. Sağ ol, yoldaş Şəkərlinski.

Ş ə k ə r l i n s k i. Sən mırıldama, Alışov.

M a h m u d. Yalvardım, vətəndaşlıq vicdanına müraciət etdim, mənə qulaq asmadı. "Boynuna alsan – on il, almasan – on beş il, key-finə bax!" "Nəyi boynuma alım? Mən iyirmi ildir xalqın balalarına inteqral, diferensial öyrədirəm!". "Hə, inteqral, diferensialla da uşaq-ların başına əks-inqilabi doldurmusan!" Əli də titrəmədən hökmü yazdı, verdi qol çəkdilər, getdim sürgünə.

R e y h a n (*Şəkərlinskiyə*). Necə də utanmayıb adam üzünə çıxır-san?! Haram olsun sənə bu insanların təbəssümü, bu torpağın çörəyi, bu günəşin işığı!

V a h i d. Atamdan xahiş edirəm heç bir günahımdan keçməsə də, bu günahımdan keçsin! (*Vurmaq istəyir, qoymurla*r).

A l ı ş o v. Mən çoxdan deyirəm bu kişi qoyun cildində canavardır. Sağ ol yoldaş Şəkərlinski, on beş il!

M a h m u d. Bəli, on beş il! Onda heç yadına da düşmədi ki, yerlisiyəm.

Ş ə k ə r l i n s k i. O zaman elə idi, ay yoldaş müəllim, indi də belədir. Allaha şükür, özün alim adamsan, hər şeyi başa düşürsən! Kinli olma, indi bizi yığ başına, bizə arxa ol, kömək ol.

M a h m u d. Deməli sən bir dövranda cəllad olursan, o biri dövranda mələk. Mənim isə alçaqlıq edən və sonra da bunun səbəbini zəmanədə axtaran simasızlardan zəhləm gedir.

Ş ə k ə r l i n s k i. Bu da həmyerlimin cavabı, yıxıldı evim (*Kənara çəkilir*).

V a h i d. Dayan bir, hələ sənin evini sonra yıxacağam.

M a h m u d (*Vahidə*). Sən öz əməlinin cavabını ver. De görüm, neyləmisən ki, gül kimi qız burada dayana bilmədi, ağlaya-ağlaya çıxıb getdi?!

V a h i d. Atacan, rica edirəm əsəbiləşmədən və mənim haqqımda pis fikrə qapılmadan mənə qulaq asasınız. Kəndçi qızı ilə evlənməyə hansı vəziyyətdə razı olduğum sizə məlumdur. Mən gəncəm. Hissə qapıla bilərəm (*Atasına, anasına, Sarvana müraciət edir*). Axı, siz ki, dünya görmüş adamlarsınız, siz gərək biləydiniz ki, o vəziyyətdə çıxarılan qərara inanmaq olmaz.

R e y h a n x a n ı m. Vaxsey, ağbatım xeyir, biabır olduq...

M a h m u d. Günahın azdır ki, hələ bizi də günahlandırırsan?!

V a h i d. Bu işdə mənim günahım yoxdur, ata. Bütün günahlar təbiətdədir, təbiət insanı elə yaratmışdır ki, ürəyi var, ehtirasları var. Ürək birisinə meyl salanda hökm ilə qabağını almaq olmur.

R e y h a n. Nə danışırsan, ay bala?!

M a h m u d. Sən məni iflic eləməsən, rahat olmayacaqsan. İndi kimə meyl salmısan?!

Nərgiz gözəl geyinmiş halda çıxır.

V a h i d. Budur ata, indilik və həmişəlik mənim ixtiyarımı əlimdən alan gözəl budur. Əgər belə bir gözəli sevmək günahdırsa, mən hər bir cəzaya layiqəm. Yer üzündəki cəzaların hamısından ağır olan ata-ana lənətinə də layiqəm!

M a h m u d (*Nərgizə*). Yaxın gəl, qızım, de görüm bunun səni sevdiyini bilirsənmi?

N ə r g i z. Bəli, müəllim, yüz kərə and içib deyib ki, məni sevir.

M a h m u d. Bilirsənmi ki, onun andına inanmaq olmaz?

V a h i d. Atacan, axı mən...

M a h m u d. Sən kəs səsini! Mən bilirəm, nə danışıram (*Nərgizə*) Cavab gözləyirəm, qızım?!

N ə r g i z. Hörmətli müəllim, tutaq ki, mən bunu da bilirəm, lakin məhəbbət belə şeylərlə hesablaşmır. Burada bir qız var. Vahidin vəfasız və dönük əməllərindən hədsiz əzablara düşdüyü halda yenə də onu sevir, həyatını ona verməyə hazırdır.

M a h m u d. Və o fədakar qız sənsən, deyilmi?

N ə r g i z. Xeyr, hörmətli müəllim, mən deyiləm.

A y x a n ı m. O qız mənəm, əziz müəllim!

M a h m u d. Gözəl qızlar, mənim sizə yazığım gəlir, axı bu sizin bir dırnağınıza dəyməz. Bunun nəyinə aşiq olursunuz?

S a r v a n. Özləri də bilmir. Qızın ər seçməyi ki var, lotereya kimi bir şeydir, kimin bəxtinə nə çıxdı...

M a h m u d (*Nərgizə*). Səndəmi bunu sevirsən?

N ə r g i z. Əziz müəllim, siz üzünüzü oğlunuza tutun və soruşun ki, o məni doğrudanmı sevir?

V a h i d. Nərgiz, hələdəmi mənim məhəbbətimə şübhə edirsən?

N ə r g i z. Bəli, şübhə edirəm! Çünki sən aktrisa Nərgizi sevirsən, mən isə kəndçi qızı Bənəfşəyəm (*Rübəndi və üst paltarın atır, Bənəfşə şəklinə düşür*).

V a h i d. Yox, yox bu ola bilməz! Sən sehirkarsan, cadugərsən, kibernetik maşınsan.

B ə n ə f ş ə. Həncəri cadugər, həncəri kibernetik maşın. Yaxşı baxsana, kor deyilsən ki! (*Bu paltarını da atır. İlk görüşdəki şəklinə düşür*).

V a h i d. Sən qız deyilsən, şeytansan!

M a h m u d. Boş söz danışma. Şeytan sən özünsən... Mənim özümün də sənə gülməyim tutur!

Ətrafdakılar gülür.

V a h i d. Gülün, gülün. Mən doğrudan da axmaq vəziyyətə düşmüşəm. Hamınız mənə gülün.

B ə n ə f ş ə. Yox, gülməyin! Mən üzümü sizə tutub (*zala müraciət edir*) soruşuram, məgər hamınızın Vahidə gülməyə haqqı var? O keyfə qapılanda aranızda əlini kürəyinə vurub hallı oğlansan, kişisən deyərək sağlığına badə qaldıranlar yox idimi? O əyri yola qədəm qoyanda hamınız bir adam kimi qabağını kəssəydi, bir ağızdan desəydi "Olmaz! Dayan!" Vahid bu günə qalardımı? İndi sənə mənim də ürəyim yanır, Vahid!

V a h i d. Sinəmə çal-çarpaz dağ çəkmisən, kəndçi qızı!

B ə n ə f ş ə. Görürsən ki, Vahid, sən bir Bənəfşəni sevmisən, o biri iki Bənəfşəyə isə nifrət edirsən. Sən bənəfşələrin üçünü də bir yerdə sevə bilməzsən. Bəlkə üç Bənəfşəni birdən qəbul edən başqa bir adam tapıldı?

A s l a n. Bənəfşə, hər şəkildə, hər görkəmdə sən mənim üçün əzisən! Sarvan əmi, bizim sözümüzə inan, bizə xeyir-dua ver!

S a r v a n. Mən siz artistlər barədə çox səhv etmişəm, oğlum. Ancaq mənim də bir şərtim var: gedin; qəti razılığı Nisə xaladan alın, o Bənəfşəyə analıq eləyib!

M a h m u d (*Vahidə*). Sənə bu da azdır. Həyat oyunbazların başına elə oyun açır ki, özləri də mat qalırlar. Cəzandır, çək (*Bənəfşə və Aslana*) Sizə mən də xeyir-dua verirəm, övladlarım!..

P ə r d ə

*1962, Kislovodsk–Bakı*

# KİTABIN İÇİNDƏKİLƏR

